ÖYRƏN - ÖYRƏT

# YARADICININ DƏLİLLƏRİ

## PALEONTOLOGİYA və ARXEOLOGİYA

**De: “Yer üzünü gəzib dolaşın və Allahın məxluqatı ilk dəfə necə yaratdığına baxın...” (Ənkəbut, 20)**

**De: “Yer üzünü gəzib dolaşın və əvvəlkilərin aqibətinin necə olduğuna baxın. Onların çoxu Allaha şərik qoşanlar idi.” (Rum, 42)**



Kitab silsiləsi - 2

# GİRİŞ

İnsan sonsuz böyüklükdəki bir kainatda yaşayır. Gözünü açdığı andan etibarən milyonlarla təfərrüat və tarazlıq üzərində qurulmuş bir dünya ilə qarşı qarşıyadır. Eyni zamanda, bu dünyada yaşamasını təmin edən, ona saysız zövq və xoşbəxtlik verə bilən bir bədənə sahibdir. Bu bədənin mükəmməl xüsusiyyətləri sayəsində xaricindəki dünyanı görə bilir, hiss edə bilir, dada bilir.

Buna görə də həyatın, kainatın və təbiətin mənbəyinin nə olduğunu anlamaq hər insan üçün şərtdir. Bəlkə, insanların böyük əksəriyyəti bu mövzu haqqında düşünmədən yalnız kiçik hesablar arxasınca qaçaraq, məsələn, yalnızca yeyəcəyi yeməyi, ya da qazanacağı pulu düşünərək yaşayır. Ancaq həyatın mənasını düşünmədən, yalnız keçici və gündəlik mövzular üzərində düşünülərək yaşanan bir həyat mənasız bir həyatdır. Çünki insan ölümlüdür və yemək, pul kimi mövzuların hamısı ölümlə birlikdə öz dəyərini itirəcək. Ömrünü yalnız belə mövzularla xərcləmiş və həyatın mənası üzərində düşünmədən yaşayıb ölən insan isə heyvanlara bənzəyən bir həyat yaşamış olur.

Buna görə də insanın izzətinə yaraşan rəftar düşünməkdir. Düşünmək “Mən kiməm?”, “necə yaradıldım?”, “yaşadığım kainat necə var oldu?”, “həyatımın məqsədi nədir?”, “yaşamağımı və mənə milyonlarla zövq verən gözəlliyi kimə borcluyam?” kimi suallarına cavab axtarmaqdır.



Bu suallar üzərində təmiz ağıl və vicdanla düşünən insan isə Allahın varlığını asanlıqla hiss edə bilər. Anlayar ki, həyat kainatdakı mükəmməl tarazlığın qurucusu Allah tərəfindən yaradılmış, hər canlı özünə xas

xüsusiyyətlərlə təmin edilərək xüsusi dizaynla var edilmişdir. İlk insanı (Hz. Adəmi) yaradan Allah onun nəslindən bütün insan nəslini yaratmışdır.

Ancaq müasir dövrün insanı açıq-aşkar yaradılış həqiqəti ilə yanaşı, ona alternativ olaraq önə sürülən ikinci bir iddia ilə də qarşılaşır. Bu iddiaya görə, insan və digər bütün canlılar şüurlu bir yaradılışın nəticəsində deyil, milyonlarla təsadüfün ard-arda gəlməsi ilə ortaya çıxmışdır. Bu iddianın adı təkamül nəzəriyyəsidir.




Lakin müasir elm göstərir ki, təkamül nəzəriyyəsi nəinki yaradılışı açıqlamır, hətta bu, ən kiçik bir doğru cəhəti belə olmayan doqmatik inancdan başqa bir şey deyildir. Elmi məlumatlar davamlı olaraq təkamül nəzəriyyəsinin yanlış olduğunu sübut edirlər.

Qədim Yunanistandan dövrümüzə qədər materialistlər tərəfindən həyatın mənşəyini izah etmək üçün istifadə edilən təkamül düşüncəsi, elm aləminə 19-cu əsrdə Çarlz Darvinin "Növlərin Mənşəyi" adlı kitabı ilə daxil oldu. 19-cu əsrdə xeyli inkişaf edən materialist fəlsəfəni müdafiə edənlər, canlıların necə ortaya çıxdığı sualına cavab olaraq təkamül nəzəriyyəsinə yiyələndilər, ancaq bu nəzəriyyənin elmi əsaslarını araşdırmadılar. Darvin də kitabında bəzi bioloji faktlardan çıxarışlar etməkdən başqa, nəzəriyyəsini sübut edən qəti bir elmi dəlil təqdim etmirdi; dəlillərin tapılmasını isə zamana buraxmışdı. Xüsusilə də nəzəriyyəsini dəstəkləyəcəyinə ümid etdiyi fosillərin gələcəkdə aşkar ediləcəyini irəli sürmüşdü.




ÇARLZ DARVİN

Canlıları Allahın yaratdığı həqiqətini inkar edənlərin elmi zəifliyinə baxmayaraq, dörd əllə yapışdıqları təkamül nəzəriyyəsi qısa müddətdə elm aləminə hakim oldu. Elmi jurnallardan məktəb dərsliklərinə qədər təkamül nəzəriyyəsi elmi olaraq sübut edilmiş və həyatın mənşəyinə dair tək etibarlı şərh kimi insanlara izah edildi. Nəzəriyyənin səhvlərini və məntiqsizliklərini göstərən elm adamlarını isə, ya akademik kariyeralarına istiqamətli təhdidlərlə susdurdular, ya da "doqmatik" və ya "elmə zidd" olan şeylər dedikləriylə günahlandıraraq zərərsizləşdirməyə çalışdılar. Materialist ideologiyaların müdafiəçiləri 150 il ərzində təkamül nəzəriyyəsini əllərində heç bir dəlil olmadan, təbliğat metodlarıyla kütlələrə təlqin etdilər.

Ancaq 20-ci əsrin ikinci yarısından etibarən təkamül nəzəriyyəsinin elm aləmində tutduğu yer tərpənməyə başladı. Paleontologiyadan biologiyaya, anatomiyadan genetika elminə qədər bir çox elm sahəsində aparılan müşahidə və təcrübələr təkamül nəzəriyyəsinin əleyhində nəticə verməyə başladı. Təkamülçülər bir anda özlərini və nəzəriyyələrini yeni elmi tapıntılara qarşı müdafiə edən vəziyyətdə gördülər. 21-ci əsrə qədəm qoyduqda təkamül nəzəriyyəsi bütün dünyada çox müzakirə olunan, etibarını böyük dərəcədə itirdi, hər an çökməsi gözlənilən bir nəzəriyyə halına gəldi. “Nature”, “Science”, “New Scientist”, “Scientific American” kimi dünya səviyyəsində məşhur olan elm jurnalları da, sətir aralarında təkamül nəzəriyyəsi ilə əlaqədar şübhə və problemləri daha sıx dilə gətirdilər.



Bəs təkamül nəzəriyyəsinin bir anda sürətlə çökməsinə səbəb olan tapıntılar hansılar idi? Bunları üç əsas başlıq altında cəmləşdirmək mümkündür:

*1. Bioloqlar canlıların ən mürəkkəb quruluşlardan meydana gəldiyini kəşf etdilər. Zülalların, DNT və hüceyrənin sadələşdirilə bilməz mürəkkəbliyə sahib olduğu, təkamül nəzəriyyəsinin iddia etdiyi kimi təsadüfən meydana*

*gəlmələrinin qeyri-mümkün olduğu aydın oldu. Bu qeyri-mümkünlüklər riyazi olaraq da hesablandı.*

*2. Təkamülün mexanizmləri olaraq irəli sürülən təbii seleksiya və mutasiyaların canlıları təkamülləşdirici gücləri olmadığı aydın oldu. Təbii seleksiya canlılara yeni bir genetik məlumat əlavə etmir, mutasiyalar isə ancaq genetik məlumatı korlayırdılar.*

*3. Fosil qeydlərində təkamülçülərin tapmağı ümid etdikləri növlərin bir-birlərindən təkamül prosesindən keçərək meydana gəldiklərinin dəlili hesab olunacaq "ara keçid formalarına" rast gəlinmədi. Canlı növləri fosil qeydlərində qəfildən və özlərinə məxsus əskiksiz quruluşlarıyla ortaya çıxır və fosil qeydlərindən itənə qədər heç bir dəyişikliyə məruz qalmırdılar.*



Bu kitabın mövzusu, təkamül nəzəriyyəsini çökdürən yuxarıdakı elmi tapıntılardan üçüncüsü, yəni fosil qeydləridir.

Kitabı oxumağa keçmədən əvvəl bunu xatırlatmaq lazımdır ki, "ara keçid formalarının" fosil qeydlərində olmaması təkamül nəzəriyyəsinin çökməsi üçün kifayətdir. Nəzəriyyənin banisi Darvin də bu həqiqəti qəbul etmiş və kitabında ara keçid formalarının niyə olmadığı barədə suallara yer verdikdən sonra, **"bəlkə də bu mənim nəzəriyyəmə qarşı irəli sürüləcək ən böyük etiraz olacaq"** (Charles Darwin, The Origin of Species: A Facsimile of the First Edition, Harvard University Press, 1964, s. 172, 280.) demişdir.

Həqiqətən də bu gün, Darvinin təkamül nəzəriyyəsinə qarşı ən böyük etirazlardan biri fosil qeydləri ilə əlaqədardır. Təkamülçülər belə tapılan fosillərin şərh olunması haqqında öz aralarında böyük bir ixtilaf içindədirlər. Həyatın tarixinə dair elmi məlumat əldə edə biləcəyimiz əhəmiyyətli bir mənbə olan fosillər, çox açıq şəkildə təkamül nəzəriyyəsini rədd edir, canlıların yer üzündə qəfildən, heç bir təkamül prosesindən keçmədən ortaya çıxdığını, yəni yaradıldığını göstərir.

# FOSİL NƏDİR?

Fosil uzun müddət əvvəl yaşamış canlıların qalıqlarının təbii şərait nəticəsində qorunaraq dövrümüzə qədər çatan izidir. Fosillər bəzən canlının bir hissəsinin, bəzən də canlının həyatda ikən qoyduğu izlərin (bunlar iz fosil adlanır) dövrümüzə qədər gəlib çatmasıdır. Ölən heyvan və bitkilərin çürümədən, qorunaraq yer qabığının bir hissəsinə çevrilməsi ilə fosil əmələ gəlir. Fosilləşmənin baş verməsi üçün heyvan və ya bitki, əsasən, palçıq təbəqəsi ilə örtülərək ani şəkildə sürətlə gömülməlidir. Bu gömülmədən sonra kimyəvi proses başlayır. Bu prosesdə baş verən mineral dəyişikliyi ilə fosil qorunur.



Montanada tapılmış və Paleosen dövründən (65,5-55 milyon il) qalma bu ağcaqayın ağacı fosili üçölçülüdür.



**50 MİLYON İLLİK QURBAĞA FOSİLİ**

50 milyon il əvvəl yaşamış qurbağalarla dövrümüzdə yaşayanlar arasında fərq yoxdur.

Fosillər canlılar tarixinin ən mühüm dəlillərindəndir. Dünyanın müxtəlif bölgələrindən əldə edilmiş yüz milyonlarla fosil var. Fosillər canlıların tarixi və quruluşu haqqında əsaslı məlumat verir. Milyonlarla fosil canlıların ani surətdə, kompleks quruluşda və tam şəkildə ortaya çıxdığını və milyon illər boyu heç bir dəyişikliyə məruz qalmadığını göstərir. Bu isə canlıların yaradıldığının mühüm dəlilidir. Canlıların mərhələ-mərhələ əmələ gəldiyini, yəni təkamül keçirdiyini göstərən heç bir fosil yoxdur. Təkamülçülərin keçid fosili olduğunu iddia etdikləri fosil nümunələri bir neçə ədəddir və bunların əsassızlığı da elmi cəhətdən sübut edilmişdir.

Eyni zamanda darvinistlərin ara fosil kimi dünyaya tanıtdığı bəzi nümunələrin saxta çıxması bu sahədə saxtakarlıq edəcək qədər çarəsiz olduqlarını göstərir. 150 ildən çoxdur ki, dünyanın hər tərəfində aparılan qazıntılarda əldə edilən fosillər balıqların daima balıq, həşəratların həşərat, quşların quş, sürünənlərin də sürünən olduğunu sübut etmişdir. Canlı növləri arasında keçid olduğunu, yəni amfibiyaların sürünənlərə, sürünənlərin quşlara çevrildiyini göstərən heç bir fosil tapılmamışdır. Qısası, fosillər təkamül nəzəriyyəsinin əsas iddiası olan növlərin uzun proseslər nəticəsində dəyişikliyə məruz qalaraq bir-birindən törəməsi iddiasını tamamilə təkzib edir.




**1. Canlının ölümündən sonra ilk mərhələdə yumşaq toxumaları deformasiya olmağa başlayır, geridə yalnız sümüklər və dişlər kimi sərt hissələr qalır. Sümüklərin deformasiya olmaması üçün isə gömülmə çox sürətli olmalıdır.**

**2. Aradan keçən uzun dövrlərdən sonra sümüklər çöküntünün alt laylarına gömülür. Sümüklər yeraltı sularda tapılan minerallarla yerini dəyişdirməyə başlayır və canlının cəsədi fosilləşir.**

**3. Ərazinin yavaş-yavaş hərəkət etməsi ilə fosilin yarandığı qaya qatı yer üzünə doğru çıxmağa başlayır.**

**4. Səthə yaxınlaşan fosil ya öz-özünə üzə çıxır, ya da paleontoloqların tədqiqatları nəticəsində tapılır.**

Fosillər canlılar haqqında məlumatla yanaşı, materik təbəqələrinin hərəkətinin Yer kürəsinin səthini necə dəyişdirməsi, Yer kürəsində tarixən hansı iqlim dəyişikliklərinin baş verməsi haqqında da mühüm məlumatlar verir.





**38-23 milyon il əvvələ aid yengəc fosili (üstdəki şəkil).**

**490-443 milyon illik dəniz ulduzu fosili yüz milyonlarla ildir eyni olan bu canlıların təkamül keçirmədiklərini söyləyir (sağdakı şəkil).**

Fosillər qədim yunan dövründən bəri tədqiqatçıların diqqətini cəlb etmiş, ancaq XVII əsrin ortalarından etibarən fosillərin tədqiq olunması bir elm sahəsi kimi formalaşmışdır. Tədqiqatçı Robert Hukun (Robert Hook) əsərləri ("Micrographia" (Mikroqrafiya), 1665; **"Discourse of Earthquakes"** (Zəlzələdən mühazirələr), 1668), Nils Stensenin (Nikolay Steno kimi tanınır) fəaliyyətləri ilə davam etmişdir.

Huk və Stenonun fosillər üzərində tədqiqat apardığı dövrlərdə mütəfəkkirlərin böyük əksəriyyəti fosillərin, həqiqətən, yaşamış canlıların izləri olduğuna inanmır, təbiətin canlıları təqlid etdiyini iddia edirdilər.

Fosillərin həqiqi canlıların izi olub-olmadığı ilə bağlı mübahisənin kökündə fosillərin yerləşdiyi bölgələrin həmin dövrün geoloji məlumatı ilə açıqlana bilməməsi dururdu. Fosillər, əsasən, dağlıq bölgələrdə yerləşir, lakin balığın su səviyyəsindən bu qədər yüksək yerdə necə fosilləşməsi açıqlana bilmirdi. Steno eynilə keçmişdə Leonardo da Vinçinin irəli sürdüyü kimi, tarix boyu su səviyyəsində geri çəkilmələr olduğunu iddia edirdi. Huk isə dağların okean təbəqələrindəki zəlzələlər və daxili isinmə nəticəsində əmələ gəldiyini deyirdi.

Huk və Stenonun fosillərin keçmişdə yaşamış canlıların izləri olduğunu göstərən açıqlamalarından sonra 18 və 19-cu əsrlərdə geologiyanın formalaşması ilə fosil yığma və araşdırma sistemli elm sahəsinə çevrilməyə başladı. Fosillərin təsnif edilməsi və şərh edilməsində Stenonun müəyyən etdiyi prinsiplər əsas götürüldü. Xüsusilə 18-ci əsrdə dağ-mədən sənayesinin inkişaf etməsi və dəmiryol inşaatının artması yer altının daha çox və dərindən tədqiq edilməsinə imkan yaratdı.

Müasir geologiya yer səthinin "təbəqə" adlanan qatlardan təşkil olunduğunu, bu təbəqələrin qitələri və okean dibini daşıyaraq Yerin üzərində hərəkət etdiyini, təbəqələr hərəkət etdikcə Yerin coğrafiyasında dəyişikliklər baş verdiyini, dağların da böyük təbəqələrin hərəkəti və toqquşması nəticəsində meydana gəldiyini ortaya qoydu. Yerin coğrafiyasında uzun dövrlər ərzində meydana gələn dəyişikliklər indi dağlıq olan bəzi bölgələrin bir zamanlar su ilə örtülü olduğunu da göstərirdi.

Beləliklə, məlum oldu ki, qaya təbəqələrində tapılan fosillər yer üzünün müxtəlif dövrləri haqqında məlumat əldə etmə vasitələrindən biridir. Geoloji məlumatlar öldükdən sonra çöküntü içində qorunan canlı izlərinin, yəni fosillərin çox uzun dövrlər ərzində süxurlar əmələ gələrkən yer qabığına doğru qalxdığını göstərirdi. Fosillərin tapıldığı süxurların bəzilərinin yüz milyon il yaşı var idi.



**20-15 MİLYON İLLİK QANADLI QARIŞQA**

**Canlıların üzərini ağac şirəsinin örtməsi ilə yaranan kəhrəba içindəki fosillər də təkamül nəzəriyyəsini təkzib edir.**

Tədqiqatlar zamanı müəyyən fosil növlərinin ancaq müəyyən təbəqələrdə və süxurlarda olduğu müşahidə edildi. Üst-üstə yığılmış süxurların hər birində həmin süxurun bir növ özünəməxsus imzası olan fosil qrupları olduğu məlum oldu. Bu "imza fosillər" həm geoloji dövrlərə, həm də əraziyə görə fərqlənirdi. Məsələn, eyni dövrə aid fosil yatağında biri qədim göl yatağı, digəri mərcan süxuru olan iki müxtəlif mühitə və çöküntüyə rast gəlinirdi. Yaxud əksinə, bir-birindən kilometrlərlə uzaqda iki müxtəlif süxurda eyni fosil imzasına rast gəlinirdi. Bu izlərdən əldə olunan məlumatlarla dövrümüzdə hələ də istifadə edilən geoloji dövrlər cədvəli tərtib edildi.



**250-70 milyon il əvvəl yaşayan krevetlərlə dövrümüzdə yaşayan krevetlər eynidir. Milyonlarla ildir dəyişməyən krevetlər təkamülün heç vaxt baş vermədiyini göstərir.**

**490-443 milyon illik dəniz ulduzu fosili yüz milyonlarla ildir eyni olan bu canlıların təkamül keçirmədiklərini söyləyir.**



**Avstraliyadakı Ediakara fosil araşdırmasında çalışan tədqiqatçı**





(Soldakı şəkil) Yer üzünün peykdən görünüşü.

(Sağdakı şəkil) Süxurların yaranma tarixini təyin etmək üçün istifadə edilən, müəyyən yaşda olan fosillərə indeks fosilləri deyilir. Bu fosillərin əksəriyyəti, sadəcə müəyyən bir dövrdə yaşayan, geniş yayılmış olaraq qarşılaşılan və asanlıqla müəyyən edilən fosillərdir.




A) Hindistan, B) Avrasiya, C) Hindistan, D) Avrasiya, E) Dənizin quru altına girməsi, F) Hindistan, G) Dəniz Layları, H) Himalay Dağları, I) Toqquşmanın Layları Yuxarı İtələməsi.

Geoloji araşdırmalar yer üzü təbəqələrinin hərəkət etdiyini və dağların böyük təbəqələrin hərəkətləri və toqquşmaları nəticəsində yarandığını sübut etmişdir. Yuxarıdakı şəkildə Himalay dağlarının tarixən yaranması izah olunur. Bundan təxminən 145 milyon il əvvəl Avrasiyaya doğru hərəkət etməyə başlayan Hindistan bölgəsinin Avrasiyaya çatması ilə birlikdə dəniz torpağı Avrasiyanın altına girmişdir. Avrasiya ilə tam qovuşan Hindistan dəniz dibi laylarının qitələr arasında sıxılmasına səbəb olmuş və sıxılan laylar yuxarı doğru itələnərək bugünkü Himalay dağlarının yer üzünə çıxmasına səbəb olmuşdur.



**KEÇİD FOSİLİ YOXDUR**

**Fosil tapıntıları bu şəkillərdəki xəyali canlıların heç vaxt yaşamadığını göstərir. Canlılar malik olduqları bütün xüsusiyyətlərlə birlikdə fosil qeydlərində birdən-birə üzə çıxır və o növün həyatı davam etdiyi müddət ərzində heç bir dəyişikliyə məruz qalmır.**

**Darvinistlər canlıların milyonlarla il ərzində kiçik dəyişikliklər keçirərək bir-birlərindən törədiyini iddia edirlər. Elmi tapıntıların alt-üst etdiyi bu iddiaya əsasən, balıqlar amfibiyalara, sürünənlər quşlara çevrilmişdir. Bu vəziyyətdə milyonlarla il davam etdiyi hesab edilən həmin dəyişiklik dövrünün fosil qeydlərində bir çox dəlili olmalıdır. Yəni yarı balıq, yarı amfibiya; yarı hörümçək, yarı milçək; yarı kərtənkələ, yarı quş olan bir çox qəribə varlığın fosilləri yüz illərdir davam edən intensiv çalışmalar nəticəsində ortaya çıxmalıdır. Lakin yer üzünün, demək olar ki, hər tərəfinin qazılmasına baxmayaraq, darvinistlərin növlər arasında keçid mərhələsini göstərə biləcəkləri tək bir fosil belə yoxdur. Digər tərəfdən, hörümçəklərin həmişə hörümçək, milçəklərin həmişə milçək, balıqların həmişə balıq, timsahların həmişə timsah, dovşanların həmişə dovşan, quşların həmişə quş olaraq mövcud olduqlarını göstərən saysız-hesabsız fosil nümunəsi vardır. Yüz milyonlarla fosil canlılar aləminin təkamül keçirmədiyini, yaradıldığını sübut edir.**

# FOSİLLƏRİN ƏMƏLƏ GƏLMƏSİ

Bir canlı öldükdən sonra sümükləri, dişləri, qabığı, dırnaqları kimi bərk hissələrinin eynilə qorunması və ya bunların izinin qalması ilə fosillər meydana gəlir. Fosil, əsasən, canlının həmin hissələrinin daşlaşmış formasına deyilir. Ancaq fosil sadəcə daşlaşma ilə meydana gəlmir. Buz kütləsinin içində donmuş mamontlar, ağac şirəsi içində qalmış həşərat və kiçik sürünən növləri kimi canlıların quruluşunun dəyişilmədən dövrümüzə qədər çatdığı fosillər də var.



**Kəhrəba içində fosilləşmiş 54-28 milyon illik eşşəkarısı.**



**20-15 milyon illik mığmığa kəhrəbası.**

Bir canlı öldükdə bədənini təşkil edən yumşaq toxumalar bakteriyaların və ətraf mühit amillərinin təsiri ilə çürüməyə başlayır (çox nadir hallarda çürümə baş vermir). Canlının daha möhkəm hissələri (sümüklər, dişlər və qabıq kimi tərkibində minerallar olan hissələr) bəzi fiziki və kimyəvi proseslərdən keçərək uzun müddət dəyişilmir. Bu proseslər fosilləşməyə səbəb olur. Fosilləşən hissələr, əsasən, onurğalıların sümükləri və dişləri, braxiopodların (çiyinayaqlılar) və molyuskların qabıqları, bəzi xərçəngkimilərin və trilobitlərin xarici skeletləri, mərcankimilərin və süngərlərin ümumi quruluşları və bitkilərin oduncaq hissələridir.

Canlının yerləşdiyi mühitin və ətraf mühit amillərinin fosilin əmələ gəlməsində böyük rolu var. Canlının yerləşdiyi mühitə görə fosilləşmə baş verib-verməyəcəyini təxmin etmək mümkündür. Məsələn, sualtı mühit quruya nisbətən fosilləşmənin baş verməsi üçün daha əlverişlidir.



**Palçığa batmış bu iynəcə çox böyük ehtimalla fosilləşəcək və gələcək nəsillərə əsla təkamül baş vermədiyinin dəlili olaraq çatacaq.**

Ən çox yayılmış fosilləşmə prosesi minerallaşmadır. Bu prosesdə orqanizmin yerini cəsədin gömüldüyü çöküntüdəki minerallar tutur. Minerallaşma prosesində bu mərhələlər baş verir:

Əvvəlcə, ölən heyvanın bədəni anidən torpaq, lil və ya qumun altında qalaraq hava ilə təması kəsilir. Bundan sonra aylar ərzində heyvanın gömüldüyü yerin üstünü yeni torpaq təbəqələri örtür. Bu təbəqələr heyvanın bədənini xarici amillərdən və fiziki aşınmalardan qoruyan xüsusi qalxan rolunu oynayır. Getdikcə daha çox təbəqə üst-üstə toplanır və bir neçə əsr ərzində canlının bədəni yer səthinin və ya dəniz dibinin bir neçə metr dərinliyində qalır.

Zaman keçdikcə heyvanın sümük, qabıq, pulcuq, qığırdaq kimi toxumaları yavaş-yavaş parçalanır. Parçalanan toxumaların içinə yerin altındakı sular sızır və bu suların tərkibindəki minerallar zaman ərzində toxumalardakı kimyəvi maddələrin yerini tutur. Toxumalardakı kimyəvi maddələrin yerində yerləşən bu minerallar aşınmaya və parçalanmaya qarşı davamlı olan kalsit, pirit, silisium oksidi, dəmir kimi süxurların tərkib hissələridir. Beləliklə, milyon illər ərzində bu minerallar canlının bədənindəki toxumaların yerini tutaraq canlının bir növ daş surətini çıxarır. Nəticədə, fosil orijinal canlı ilə eyni formada qalır, tərkibi isə süxur olur.

Minerallaşma yolu ilə fosilləşmədə müxtəlif hallara rast gəlinir:

◉ *Əgər skelet çöküntü ilə tamamilə dolub və daha sonra parçalanmayıbsa, daxili qəlib fosilləşir.*

◉ *Orijinal skelet tamamilə fərqli minerralla əvəz olunubsa, qabığın tam surəti əmələ gəlir.*

◉ *Əgər təzyiq nəticəsində skeletin çöküntüdə tam qəlibi çıxıbsa, skeletin xarici səthinin izi əldə edilir.*

Bitki fosillərində isə bakteriyaların təsiri ilə karbonlaşma baş verir. Karbonlaşmada oksigen və azotun yerini karbon və hidrogen tutur. Karbonlaşmada bakteriyalar təzyiq və temperatur dəyişiklikləri və ya müxtəlif kimyəvi proseslərin təsiri ilə toxumaların molekullarını parçalayır, ancaq karbon lifləri qalır, zülal və sellüloza quruluşunda kimyəvi dəyişiklik baş verir. Karbon 4-oksid, metan, hidrogen sulfat və su buxarı kimi digər maddələr yox olur. Bu proses nəticəsində Daş kömür dövründə (354–290 milyon il) mövcud olan bataqlıqlardan ibarət meşələrdə təbii kömür yataqları meydana gəlmişdir.

Fosillər bəzən kalsiumla zəngin sulara gömülmüş orqanizmlərin travertin kimi minerallarla örtülməsi ilə meydana gəlir. Orqanizm çürüyərkən mineral yataqlarının üstündə izi qalır.

Canlının yumşaq hissələrinin -saçları, tükləri və ya dərisi də daxil olmaqla- tam fosilləşməsi isə çox nadir rast gəlinən haldır. Kembriyəqədərki dövrə (4,6 milyard – 543 milyon il) aid yumşaq toxumalı canlıların qalıqları çox yaxşı qorunmuşdur. Kembri dövründən (543–490 milyon il) dövrümüzə qədər bir çox canlıların bərk toxuma qalıqları ilə yanaşı, daxili quruluşunun tədqiq olunmasına imkan verən yumşaq toxuma qalıqları da mövcuddur. Kəhrəba və fosil qalıqlarının içində qorunmuş təqribən 150 milyon il əvvələ aid heyvan tükləri və müxtəlif tüklər də fosil qalıqlarının hərtərəfli tədqiq edilməsinə imkan verən nümunələrdəndir. Sibir buzlaqlarının içində qalmış

mamontlar və ya Baltik meşələrində ağac şirəsinin içində qalaraq fosilləşən həşəratlar və sürünənlər də yumşaq orqanları ilə birlikdə fosilləşmişdir.




1. **Mərcanlar: rif əmələ gətirən əhəngdaşılı dəniz heyvanlarıdır.**
2. **Şüalılar: silisdən skeleti olan mikroskopik planktondur.**
3. **İkitaylı molyusk: kalsium karbonat qabıqlı. Bu kimi sərt üzvlər heç bir dəyişikliyə məruz qalmadan mühafizə edilə bilir.**
4. **Qraptolit: sürü halında yaşayan, üzvi skeletli, ən çox qara şistlərdə izlərinə rast gəlinən fosillərdir.**
5. **Köpək balığı dişi: sümüklər və dişlər fosfat tərkiblidir, bu səbəbdən bir çox orqanla müqayisədə daha dayanıqlıdır.**
6. **İz fosilləri: çöküntülərdə rast gəlinən izlərdən ibarət fosillərdir.**
7. **Ammonit: qabığı dəmir piritləri ilə əvəz olunaraq fosilləşmiş nümunə görünür.**
8. **Daşlaşaraq fosilləşmiş ağac: ağac hüceyrələri vaxt keçdikcə silislə əvəz olunur və fosilləşir.**
9. **Kəhrəba: kiçik orqanizmlər ağac şirəsi içində həbs olunaraq fosilləşir.**
10. **Karbonlaşmış yarpaqlar: bitkilər karbon liflərinə çevrilir.**



**50 milyon il yaşındakı bu balıq fosili balıqların həmişə balıq kimi mövcud olduqlarının bir dəlilidir.**





**Elə olur ki, zərif orqanizmlər də qeyri-adi şərtlərdə fosilləşə bilirlər. Şəkildə görünən Yura dövrünə (206-144 milyon il) aid dəniz ulduzu fosili ilə dövrümüzdə yaşayan nümunəsi arasında heç bir fərq yoxdur.**



**Trias dövrünə aid 250-203 milyon illik bu balığın dərisi və pulcuqları ən incə təfərrüatına qədər fosilləşmişdir. Bu nümunə balıqların dövrümüzdən 250 milyon il əvvəl də eyni pulcuq formasına malik olduqlarını göstərir.**

Fosillərin ölçüsü də müxtəlifdir. Mikroorqanizmlərin fosillərindən sürü şəklində yaşayan heyvanların böyük fosillərinə qədər çox müxtəlif fosillər əldə edilmişdir. Böyük fosillərin ən təəccüblü nümunələrindən biri İtaliyada böyük təpə şəklindəki süngər rifidir.



**Dünyanın Ən Böyük Süngər Rifi**

**145 milyon illik bu süngər qayası Avropada bir neçə göl xaricində izi qalmayan Tetis dənizinin dibindən dövrümüzə qalan bir izdir. Dövrümüzdə yaşayan süngərlərin bu təpəni meydana gətirən süngərlərdən heç bir fərqi yoxdur. Bu süngərlər təkamül keçirmədiklərini söyləyir.**

Yer üzünün ən böyük canlı zirvəsi olan bu rif 145 milyon illik əhəngli süngərlərdən təşkil olunmuşdur. Qədim Tetis okeanının dibində formalaşan bu süngər rifi tektonik təbəqələrin hərəkəti nəticəsində yüksəlmişdir. Üstündə Trias dövrünə aid süngər riflərində yaşayan canlı nümunələri də var. Kembri dövrünə aid minlərlə canlının fosilləri yerləşən Kanadadakı Börcess Şeyl (Burges Shale) və Çindəki Çentszyan (Chengjiang) fosil yataqları böyük fosil sahələrindəndir. Dominikan Respublikasında və Baltik dənizinin qərb sahillərində yerləşən kəhrəba yataqları mühüm fosil mənbələridir. Amerikanın Vayominq əyalətində yerləşən Qrin-River (Green River) fosil yataqları, Mərkəzi Amerikada yerləşən Uayt-River (White River) fosil yataqları, Almaniyadakı Ayxştatt (Eichstatt) və Livandakı Hacula (Hajoula) fosil yataqları buna misaldır.




**İngilis geologiyasının banisi kimi qəbul edilən Uilyam Smitin çəkdiyi bu geoloji xəritələr müasir geologiya elminin inkişafına böyük töhfələr vermişdir.**

**1. Üst daş kömür dövrü**
**2. Alt daş kömür dövrü**
**3. Trias dövrü**
**4. Yura dövrü**
**5. Orta Yura dövrü**

## FOSİLLƏR NEÇƏ QRUPA BÖLÜNÜR?

Eynilə canlılar aləmi kimi fosillər də aləm adı altında qruplar şəklində tədqiq olunur. Fosillər 19-cu əsrdə bitkilər və heyvanlar olmaqla iki əsas qrupda toplanırdı. Sonrakı tədqiqatlar və əldə edilən fosillər göbələklər və bakteriyalar kimi canlıların da daxil olduğu qrupları meydana gətirdi. 1963-cü ildə tərtib olunan fosil cədvəlinə əsasən, fosillər 5 aləmə bölünərək tədqiq edilməyə başlandı:

- **Animalia** – **Heyvanlar aləmi fosilləri** - Ən qədim nümunələri 600 milyon ildir.
- **Plantae** – **Bitkilər aləmi fosilləri** - Ən qədim nümunələri 500 milyon ildir.
- **Monera** – **Nüvəsiz bakteriya hüceyrəsi fosilləri** - Ən qədim nümunələri 3,9 milyard ildir.
- **İbtidailər** – **Birhüceyrəli canlıların fosilləri** - Ən qədim nümunələri 1,7 milyard ildir.
- **Göbələklər** – **Çoxhüceyrəli canlıların fosilləri** - ən qədim nümunələri 550 milyon ildir.

# GEOLOJİ DÖVRLƏR VƏ PALEONTOLOGİYA

18-ci əsrin sonu, 19-cu əsrin əvvəllərində dəmiryolu və tunel inşaatı zamanı yer qabığı haqqında əsas məlumatlar əldə edildi. Məsələn, tunel inşa edən ingilis Uilyam Smit (William Smith) inşaat zamanı Somersetdə yerin altından çıxan Yura dövrünə (206-144 milyon il) aid süxurların bənzərinin Şimal dənizi sahillərində olduğunu da gördü. Ölkənin bir ucundan digərinə qədər topladığı süxur və fosil nümunələri ilə İngiltərənin ilk geoloji xəritəsini tərtib etdi. Habelə əlindəki süxur nümunələrinə əsaslanaraq bəzi bölgələrdə geoloji yeraltı xəritələr də çəkdi. Bu xəritələrin müasir geologiya elminin inkişafında və yer üzünün geoloji dövrlər cədvəlinin tərtib edilməsində böyük rolu oldu. Xəritələrdəki məlumatlar sayəsində süxurların üstü bitki örtüyü ilə örtülü olsa belə, altda hansı təbəqənin yerləşdiyi, tərkibində nələr olduğu (dəmir filizi, kömür və s.) bilinirdi.

Bütün bu məlumatların əldə edilməsində fosillər əhəmiyyətli rol oynamışdı. Bu gün hələ də istifadə edilən Kembriyəqədərki (Arxey və Proterozoy eraları) dövrdən IV dövrə qədər geoloji dövr cədvəli fosil yataqlarının və süxur quruluşlarının işarə etdiyi məlumatlardan istifadə edilərək hazırlanmışdır. Süxurlar üzərində aparılan tədqiqatlar nəticəsində yer üzünün hansı dövrlərdə hansı mərhələlərdən keçdiyi müəyyən edilmiş, süxurlardakı fosillər sayəsində isə müxtəlif dövrlərdə yaşayan canlılar haqqında məlumat əldə edilmişdir. Bu iki məlumat birləşdirilərək cədvəl tərtib olunmuşdur. Bu cədvələ görə, yer qabığının tarixi eonlara, eonlar eralara, eralar da dövrlərə bölünür.





**Qrenlandiyadakı Kembriyəqədərki dövrə aid qayalar (4,6 milyard – 543 milyon il) (soldakı şəkil)**

**Avstraliyada, Ediakara təpələrində Kembriyəqədərki dövrə aid qayalar mövcuddur. Şəkildə görünən meduza fosilləri də Ediakarada tapılmışdır və 570-543 milyon il əvvələ aiddir. Yüz milyonlarla illik bu fosil qeydləri təkamül mərhələsi iddiasını təkzib edir. Təkamülçülərin elmdən kənar iddialarına görə, fosil qeydləri bizə: 1. Çox sayda keçid forması təqdim etməli; 2. Bu qeydlərdəki dəyişiklik yavaş və mərhələli olmalı, sadədən mürəkkəbə doğru inkişaf görünməli; 3. Xəyali ilk hüceyrə inkişaf etdikcə yeni növlər ortaya çıxmalıdır. Bu növlərin izləri də fosillərdə görünməlidir. Ancaq təkamülçülərin bu iddiaları fosil qeydləri tərəfindən heç vaxt təsdiq edilməmişdir. Fosillər sübut edir ki, canlı növləri özlərinə xas xüsusiyyətləri ilə bir-birlərindən fərqli və ayırd edilə bilən xüsusiyyətlərə malikdir. Bu xüsusiyyətlər isə zaman içində mərhələli şəkildə qazanılmamışdır və canlı qrupları arasında təkamül əlaqəsi yoxdur. Bu da bütün canlıları sahib olduqları xarakteristik xüsusiyyətlərlə, qüsursuz şəkildə Allahın yaratdığını göstərən mühüm dəlillərdən biridir. (sağdakı şəkil)**




**Geoloqlar və paleontoloqlar dünya və təbiət tarixinin anlaşılmasını asanlaşdıra bilmək üçün dünya tarixini geoloji dövrlərə ayırıblar. Bu dövrlərin müəyyən olunmasında qayaların formalaşması, yaşları və tərkiblərindəki fosillər mühüm rol oynamışdır.**

**A) PREKEMBRİ (4,6 milyard – 543 milyon il), B) PALEOZOY, C) MEZOZOY, D) KAYNOZOY**

**1. Kembri dövrü (543 – 490 milyon il)**
**2. Ordovik dövrü (490 – 443 milyon il)**
**3. Silur dövrü (443 – 417 milyon il)**
**4. Devon dövrü (417 – 354 milyon il)**
**5. Daş kömür dövrü (354 – 290 milyon il)**
**6. Perm dövrü (290 – 248 milyon il)**
**7. Trias dövrü (248 – 206 milyon il)**
**8 .Yura dövrü (206 – 144 milyon il)**
**9. Tabaşir dövrü (144 – 65 milyon il)**
**10. Üçüncü dövr**
**11. Dördüncü dövr**
**12. (65 milyon yıl - günümüz)**

# 1. PREKEMBRİ (KEMBRİYƏQƏDƏRKİ) TARİXİ
## (4,6 milyard – 543 milyon il)

Kembriyəqədərki tarix yerin tarixinin ən qədim və ən uzun mərhələsi hesab edilir. Bu uzun tarix də eralara bölünür. 4,6–3,8 milyard illik mərhələ *Hadey eonu* adlandırılır. Bu, yer qabığının təzəcə formalaşdığı dövrdür. *Kriptozoy eonu* 3,8 milyard il – 543 milyon illər arasını əhatə edir. Fosil qeydlərində bu dövrlərə aid birhüceyrəli və çoxhüceyrəli mikroorqanizmlərin müxtəlif izləri var.

# 2. FANEROZOY EONU
## (543 milyon il əvvəldən dövrümüzə qədər)

"Fanerozoy" sözünün hərfi mənası görünən və ya aşkar həyat deməkdir. Fanerozoy eonu 3 eraya bölünür: Paleozoy, Mezozoy, Kaynozoy.

## 2A. PALEOZOY ERASI (543 – 251 milyon il)

Təqribən 300 milyon il davam edən Paleozoy Fanerozoy eonunun ilk və ən uzun erasıdır. Paleozoy erasında iqlim, əsasən, rütubətli və mülayim idi. Vaxtaşırı buzlaşma mərhələləri olmuşdur.

Paleozoy erası Kembri, Ordovik, Silur, Devon, Daş kömür və Perm olmaqla 5 dövrə bölünür.

## KEMBRİ DÖVRÜ (543 – 490 milyon il)

Kembri dövrü dövrümüzdə yaşayan əsas canlı tiplərinin, hətta nəsli kəsilmiş bir çox canlıların ani surətdə üzə çıxdığı geoloji dövrün adıdır. (Tip canlıların təsnifatında aləmdən sonra gələn ən böyük kateqoriyadır. Tiplər canlıların orqanlarının və toxumalarının sayı və müxtəlifliyi, bədən simmetriyası və digər daxili quruluş formalarına görə müəyyən edilir. Dövrümüzdə 35 tip müəyyən edilib. Kembri dövründə isə 50-yə yaxın canlı tipi yaşamışdır.) Kembri dövründə canlı tiplərinin ortaya çıxması o qədər ani olub ki, elm adamları bunu "Kembri partlayışı" adlandırıblar. Təkamülçü paleontoloq Stiven Cey Quld (Stephen Jay Gould) bu hadisəni həyat tarixindəki ən nəzərə çarpan və təəccüblü hadisə adlandırmış, təkamülçü zooloq Tomas S. Rey (Thomas S. Ray) çoxhüceyrəlilərin mənşəyinin həyatın başlanğıcı qədər qeyri-adi olduğunu yazmışdır.



Paleontologiya elminin Kembri partlayışı haqqında verdiyi məlumatlara baxdıqda bu məlumatların açıq - aşkar yaradılışı sübut etdiyini, təkamül nəzəriyyəsini isə təkzib etdiyini görürük. Çünki Kembriyəqədərki dövr, əsasən, birhüceyrəlilərin, nadir hallarda da əsas nəzərə çarpan xüsusiyyətləri və göz,

ayaq kimi kompleks orqanları olmayan çoxhüceyrəli canlıların yaşadığı dövrdür. Odur ki, Kembri canlılarının fantastik təkamül prosesini göstərən bir dəlil və ya bu canlıların əcdadı kimi heç bir fosil göstərilə bilmir. Birhüceyrəlilərin yaşadığı bu mühitdə birdən-birə kompleks xüsusiyyətləri ilə heyranedici canlı müxtəlifliyi meydana çıxır. Bu partlayışla bir-birindən nəzərə çarpan xüsusiyyətləri ilə fərqlənən canlılar ortaya çıxmışdır. Bu vəziyyət Kembriyəqədərki dövrdə yaşamış canlılar və Kembridə yaşamış canlılar arasında həm nəsil əlaqəsi cəhətdən, həm də komplekslik cəhətdən dərin boşluqlar meydana gətirmişdir. Bu boşluqlar o qədər diqqətçəkəndir ki, canlı tipləri arasında davamlılıq göstərmək istəyən təkamülçülər bu canlılar arasında nəzəri cəhətdən belə qohumluq əlaqələri qura bilmirlər.



Kembri dövrü canlılar tarixinin ilk anından etibarən çox fərqli canlıların olduqca kompleks quruluşları ilə ani surətdə ortaya çıxdığını göstərir ki, bu, yaradılışa işarə edir. Canlıların mükəmməl quruluşlarının mənşəyi Allahın yaratmasıdır. Bu mükəmməl canlılar təsadüfən, təkamül nəzəriyyəsinin iddia etdiyi kimi natamam, yarımçıq, qeyri-funksional mərhələlərlə deyil, qüsursuz şəkildə fosil qeydlərində üzə çıxırlar.

## ORDOVİK DÖVRÜ (490 – 443 milyon il)

Bu dövrdə çoxlu sayda müxtəlif onurğasız dəniz canlıları yaşamışdır. Fosil qeydləri Ordovik dövründə zəngin dəniz heyvanları fəsilələrinin olduğunu göstərir. Bu dövrə aid quru bitkilərinin fosilləri də var. Ordovik dövründə baş verən qlobal iqlim dəyişiklikləri bəzi növlərin nəslinin kəsilməsi ilə nəticələnmişdir. Ordovik dövründə baş verən buzlaşmanın səbəb olduğu bu hadisə “Ordovik nəsilkəsilmələri” adlanır.

Ordovik dövründə yaşayan canlıların bəzilərinin dövrümüzdə hələ də nəsli davam edir. Bu canlılardan biri qılıncquyruq xərçəngdir. 450 milyon illik qılıncquyruq xərçəng fosili bu canlıların dövrümüzdən təqribən yarım milyard il əvvəl də eyni xüsusiyyətlərə və kompleks quruluşa malik olduğunu göstərir.





Nyufaundlend adasındakı bu qayalıqlar Kembri dövrü ilə Ordovik dövrü arasındakı keçidi göstərən dağılmamış sahələrdən biridir.

450 milyon illik qılıncquyruq fosili. Bu fosilin şəkildə görünən, dövrümüzdə yaşayan nümunəsindən heç bir fərqi yoxdur.

## SİLUR DÖVRÜ (443 – 417 milyon il)

Temperaturun artması ilə buzlaqların əridiyi və bəzi qitələrin su altında qaldığı bu dövrə aid külli miqdarda quru bitkisi fosili var. Bundan əlavə, Silur dövrünə aid dəniz laləsi kimi dərisitikanlıların, dəniz əqrəbləri kimi buğumayaqlıların, çənəsiz balıqlar və zirehli balıqlar kimi bəzi balıq növlərinin, habelə bəzi hörümçək növlərinin müxtəlif fosilləri var. Ən qədim və qüsursuz dəniz hörümçəyi fosili də Silur dövrünə (425 milyon il) aiddir və canlıların milyon illərdir dəyişilmədən qaldığını sübut edir. Bu faktlar darvinistlərin ssenarilərinin əksinə, canlıların heç bir dövrdə təkamül keçirmədiyinin dəlilidir.



Silur dövründə yaşamış dəniz lalələri.

## DEVON DÖVRÜ (417 – 354 milyon il)

Bu dövrə aid saysız-hesabsız balıq fosili var. Devon dövründə də kütləvi məhvolma baş vermiş və bəzi növlərin nəsli kəsilmişdir. Bu kütləvi məhvolma mərcan riflərinə təsir etmiş, stromatoporoidlər (rif əmələ gətirən mərcan növləri) rifləri tamamilə məhv olmuşdur.

Devon dövründə yaşamış minlərlə balıq fosilinin dövrümüzdə yaşayan bir çox balıq növlərindən heç bir fərqi yoxdur. Bu isə yüz milyon illərdir canlıların dəyişilmədiyini, mərhələli təkamül prosesinin baş vermədiyini sübut edir.

## DAŞ KÖMÜR DÖVRÜ (354 – 290 milyon il)



355-295 milyon illik hörümçək fosili.

Daş kömür dövrü alt və üst Daş kömür dövrlərinə bölünür. Qitə toqquşmaları nəticəsində quru ərazilərin yüksəlib-alçalması və qütb buzlaqlarından asılı olaraq dənizlərin yüksəlib-alçalması bu dövrdə yer üzünü və canlıların həyatını formalaşdıran mühüm hadisələrdir. Daş kömür dövrünə aid çoxlu sayda quru və dəniz canlısı fosili var. Bu fosillərin ən məşhuru selakant (coelacanthus) fosilidir. Uzun illər boyu darvinistlər tərəfindən keçid forma kimi təqdim edilən və daha sonra bu iddialarının doğru olmadığı elə selakant tərəfindən sübut edilən bu canlı dövrümüzdə hələ də yaşayır. Milyon illərdir heç bir dəyişikliyə məruz qalmayıb və əsla təkamül keçirməyib. Selakant darvinistlərin təkamülü dəstəkləyən keçid fosili iddialarının əksinə, təkamülü tamamilə təkzib edən yaşayan fosil nümunəsidir. Təkamülü təkzib edən milyonlarla yaşayan fosil nümunəsi var. Təkamülçülərin keçid fosili kimi təqdim etdikləri selakantın yaşayan fosil kimi ortaya çıxması onlara böyük zərbə olmuşdur.



Müasir dövrdə dənizlərdə yaşayan selakant.



410 MİLYON İLLİK selakant fosili.

## PERM DÖVRÜ (290 – 248 milyon il)

Paleozoy erasının son dövrü olan Permin sonunda da böyük kütləvi məhv olma baş vermişdir. Bu kütləvi məhv olma Paleozoy dövrünün də sonu olmuşdur. Fosil qeydləri bu böyük məhv olma zamanı canlı növlərinin 90-95%-inin nəslinin kəsildiyini göstərir. Buna baxmayaraq, Perm dövründən dövrümüzə qədər nəsli davam edən canlılar da var. İynəcə, hörümçək kimi Perm dövrü canlılarının fosil nümunələri heç bir dövrdə təkamülün baş vermədiyini sübut edir.

## 2B. MEZOZOY ERASI (248 – 65 milyon il)

Mezozoy erası Trias, Yura və Tabaşir dövrlərinə bölünür. Dinozavrlar Mezozoy erasında yaşamış və məhv olmuşlar.

### TRİAS DÖVRÜ (248 – 206 milyon il)

Trias dövrü ilə Mezozoy adlanan yeni era başlayır. Trias dövründə yaşayan canlılara aid dünyanın hər tərəfindən çoxlu sayda fosil əldə edilmişdir. Fosil qeydləri bu dövrdə həm quru, həm də dəniz canlılarının böyük müxtəlifliyə malik olduğunu göstərir. Digər dövrlərdə olduğu kimi, bu dövrə aid, təkamülçülərin olmasını umduğu bircə dənə də keçid fosili yoxdur.



**Trias dövrünün fosilləri üzərində tədqiqat aparan alimlər.**

**Trias dövrü bitkilərinə aid ən məşhur tapıntılardan biri də Arizonada tapılan daşlaşmış fosil meşəsidir. Çili araukariyası kimi tanınan ağaclardan meydana gələn bu meşə bitkilərin təkamül keçirmədiyinin sübutlarından biridir. 248-206 milyon il əvvəl yaşayan bu ağacların dövrümüzdəki nümunələrindən fərqi yoxdur.**

### YURA DÖVRÜ (206 – 144 milyon il)

Mezozoy erasının bu dövrü dinozavrların sayca və növ baxımından çox olduğu dövrdür. Yura dövrünün sonunda ammonitlərin, dəniz sürünənlərinin, ikitaylı molyuska və istridyə növlərinin bəzilərinin nəsli kəsilib.

Yura dövründən bəri dəyişilmədən, təkamül keçirmədən nəsillərini davam etdirən bir çox canlılar var. Fosil qeydləri bu canlıların nümunələri ilə doludur. Məsələn, ən qədim timsah fosillərindən birinin təqribən 200 milyon

il yaşı var. Hatteriya kərtənkələsinin də 200 milyon il əvvələ aid fosil nümunələri var. Krevetlərin Yura dövrünə aid çoxlu fosilləri var. Bu canlıların dövrümüzdəki mükəmməl sistem və kompleks quruluşları milyon illər əvvəl də eyni idi.




**150 milyon illik iynəcə fosili dövrümüzün iynəcələri ilə eynidir.**




**206-144 milyon il əvvələ aid krevet fosili. Dövrümüzün dənizlərində yaşayan krevetlərdən heç bir fərqi yoxdur.**

## TABAŞİR DÖVRÜ (144 – 65 milyon il)

Mezozoy erasının son dövrü olan Tabaşir dövrü dinozavrların nəslinin kəsildiyi dövr kimi tanınır. Dinozavrlarla yanaşı, bir çox quruda yaşayan sürünən və bitki növləri də bu dövrdə məhv olmuşdur.

Digər tərəfdən, bu dövrdə yaşayan dəniz ulduzları, yengəclər, bəzi balıq növləri, su əqrəbləri, hörümçəklər, iynəcələr, su tısbağaları, timsahlar kimi bir çox heyvan növləri və müxtəlif bitkilər dövrümüzə qədər nəslini davam etdirmişdir. 135 milyon illik dəniz ulduzu fosili, 140 milyon illik qılıncquyruq fosili, 125 milyon illik ginkqo yarpağı fosili kimi fosil nümunələri bu həqiqəti sübut edən dəlillərdəndir. Milyon illər keçməsinə baxmayaraq, eyni kompleks sistemlərə malik olan bu canlılar darvinistlərin təbiət tarixinə dair iddialarını təkzib edir.

## 2C. KAYNOZOY ERASI (65 milyon il – dövrümüz)

Tabaşir dövrünün sona çatması ilə dövrümüzə qədərki zamanı əhatə edən Kaynozoy erası başlayır. Geoloq və paleontoloqlar yaxın dövrə qədər Kaynozoy erasını iki alt hissəyə bölüblər: III dövr və IV dövr. III dövr 65 milyon il əvvəldən 1,8 milyon il əvvələ qədərki zamanı əhatə edir. IV dövr isə son 1,8 milyon illik dövrü əhatə edir. Yaxın zamanda isə Kaynozoy erası 3 dövrə bölünərək tədqiq olunmağa başladı. Yeni sistemə görə, Kaynozoy

erasının 3 dövrü bunlardır: **Paleogen, Neogen və IV dövr.**



**56-35 milyon illik bu timsah fosili Almaniyada tapılmışdır.**

Eynilə digər dövrlərdə olduğu kimi, Kaynozoy erasına da xeyli fosil aiddir. Bu fosil nümunələri canlıların bir ortaq əcdaddan törədiyini iddia edən təkamül nəzəriyyəsini təkzib edir.

Bütün bu geoloji dövrlərə aid əldə edilən fosil nümunələrinin ən əsas xüsusiyyətlərindən biri canlıların geoloji dövrlər boyu dəyişilməməsidir. Başqa sözlə, bir canlı növü fosil qeydlərində necə üzə çıxıbsa, nəsli kəsilənə qədər və ya dövrümüzə qədər on milyon, hətta yüz milyon illər boyu heç bir dəyişikliyə məruz qalmamış, quruluşunu qoruyub saxlamışdır. Bu, canlıların təkamül keçirmədiyinin açıq-aydın dəlilidir.

Canlılar tarixi təkamül nəzəriyyəsini qəti şəkildə təkzib edir. Bir-birindən tamamilə fərqli canlı növlərini yoxdan yaradan, yer üzünü canlılar üçün əlverişli edən üstün güc və sonsuz elm sahibi uca Allahdır.

Fosillərə ən çox haralarda rast gəlinir?

Fosillər Yer kürəsinin, demək olar ki, hər yerində var. Bəzi süxur növlərində heç bir fosilə rast gəlinmir, bəzilərində çoxlu sayda fosil olur. Geoloqlar süxurları 3 növə bölürlər:



**144-65 milyon illik balıq və yarasa fosili. Fransada tapılmışdır.**

- Maqmatik süxurlar
- Çökmə süxurlar

◉ Metamorfik süxurlar

Maqmatik süxurlar yer üzünün dərinliklərində yerləşən və ya vulkanla yer üzünə çıxan lavaların və ərimiş maddələrin soyuması ilə əmələ gələn qranit və ya bazalt tipli süxurlardır. Çökmə süxurlar qum, allüvium və s. suda həll olmuş maddələrin üst-üstə yığılması ilə əmələ gəlir. Metamorfik süxurlar isə yer üzünün alt təbəqələrindəki yüksək temperatur və təzyiq altında quruluşu dəyişikliyə məruz qalan maqmatik və ya çökmə süxurlardır.





**Dünyanın məlum olan ən qədim qayaları Qrenlandiyadadır. Bu qayalar 3,9-3,8 milyard yaşındadır.**

**Qayaların yaşı radioaktiv izlərin müşahidə edilməsi yolu ilə də müəyyən edilir.**

Əsasən, maqmatik süxurlarda fosilə rast gəlinmir. Bu süxurlarda olan nadir nümunələr isə bitki və ya heyvanların lava ilə örtülməsi ilə meydana gəlir. Metamorfik süxurları meydana gətirən yüksək temperatur və təzyiq altında da çox az canlı fosilləşir, fosilləşənlər isə ciddi zədələnmiş və ya deformasiyaya məruz qalmış olur. Fosillərin, demək olar ki, hamısı çökmə süxurlarda və ya çöküntülərdə tapılır.

Çökmə süxurların, demək olar ki, hamısı külək və ya su ilə daşınan maddələrdən və ya digər süxurların aşınmasından meydana gəlir. Kömür kimi bəzi süxur növləri də bitki və heyvan qalıqlarından əmələ gəlir. Kiçik qırıntılardan və dənəciklərdən ibarət çökmə süxurlar qırıntı mənşəli çökmə süxurlar adlanır. Qumdaşı, şist qırıntı mənşəli çökmə süxurlara nümunədir. Əgər maddələr suda həll olubsa, kimyəvi mənşəli çökmə süxurlar və ya buxarlanma nəticəsində qırıntısız çökmə süxurlar əmələ gəlir. Əhəngdaşı və dolomit qırıntısız çökmə süxurdur. Əsasən, çökmə süxurlar qırıntı mənşəli və qırıntısız süxurların qarışığından ibarət olur. Fosillər isə ən çox şistlərdə, qumdaşında və kalsium-karbonatdan əmələ gələn əhəngdaşında tapılır.

# FOSİLLƏR NECƏ TAPILIR VƏ ÇIXARILIR?

Fosil axtarışında geoloqlar süxur növləri toplamaq üçün çəkic, mala, müxtəlif kəsici alətlər, kompas, fırça, süzgəc kimi sadə alətlərdən istifadə edirlər.



**Turşularla Fosil Təmizləmə**

**Fosilin bütövlükdə üzə çıxması üçün istifadə edilən təmizləmə üsullarından biri də turşulu təmizləmədir. Fosili əhatə edən qayanın fosilə zərər vermədən təmizlənməsi üçün effektiv üsuldur.**

- **Fosili əhatə edən qaya fosilin kiçik bir qismi üzə çıxana qədər müvafiq turşuya batırılır.**
- **Fosilin üzə çıxan qismi yuyulur və turşuya qarşı müqavimətli bir maddə ilə örtülür.**
- **Fosil təkrar turşuya batırılır və bu proseslər uzun müddət ərzində bir neçə dəfə təkrarlanır.**
- **Fosilin zərər görməməsi üçün görünən qisminə tez-tez qoruyucu sürtülməlidir.**
- **Axırda fosil özünü əhatə edən qayadan tamamilə xilas olur. İstifadə edilən kimyəvi maddənin və qoruyucunun tamamilə təmizlənməsi üçün fosil təkrar yuyulur.**

Fosillər bəzən ətrafdakı yumşaq süxur təbəqəsindən sıyrılaraq səthə çıxır. Belə hallarda fosili təkcə fırça ilə təmizləmək kifayətdir. Ancaq çox vaxt fosillərin toplanması bu qədər asan olmur. Fosilin gömüldüyü süxur, adətən, bərk olur və süxurdan fosili ayırmaq saatlar aparır. Əvvəla, fosil axtarılacaq sahədə süxurun hansı nöqtədən qırılacağı müəyyən edilməlidir. Süxurun üfüqi lay səthinə görə qırılma nöqtələri müəyyən edilir. Hər süxur növü müxtəlif şəkildə parçalanır. Məsələn, şistlərin qırılma nöqtəsi müəyyən edilən üfüqi laylı səthi var. Tabaşir süxurlarının isə səthi belə deyil. Bu zaman fosilin zədələnməməsi üçün qırılan nöqtələrdəki rəng dəyişikliyi və ya

toxuma fərqi kimi işarələri düzgün izləmək lazımdır.

Fosil süxurdan çıxarıldıqdan sonra müxtəlif proseslərdən keçir. Əvvəlcə, fosil çıxarıldığı sahədən laboratoriyaya aparılmaq üçün qorunmalı və möhkəmləndirilməlidir. Bunun üçün istifadə olunan metodlardan biri kimyəvi yapışqanlarla fosili stabilləşdirməkdir. Böyük fosillərdə isə gips qəliblərdən istifadə olunur. Fosil daşınarkən risk altında olan hissələri nəm kağıza bükülür və sonra gipsə batırılır.

Bundan sonra fosilin bütün detallarının tam üzə çıxması üçün fosil təmizlənməlidir. Əgər fosil onu əhatə edən daşdan bərkdirsə, təmizləmə prosesi daha asan olur. Fosil daha yumşaq quruluşdadırsa, təmizlənmə üçün kimyəvi maddələrdən istifadə edilməlidir. Ən çox istifadə edilən metodlardan biri isə fosilin turşu ilə təmizlənməsidir. Beləliklə, fosilin bütün detalları üzə çıxır. Bəzi hallarda, xüsusilə, fosil çox həssas olduqda və onu əhatə edən süxurla eyni quruluşda olduqda rentgen şüaları və kompüter tomoqrafiyası cihazları vasitəsilə tədqiq olunur. Beləliklə, fosil yerindən çıxarılmadan əvvəl quruluşunun necə olduğu müəyyən edilir.

## FOSİLLƏRİN GÖSTƏRDİYİ HƏQİQƏT: YARADILIŞ

Bu günə qədər əldə edilən fosil qeydlərinin iki əsas xüsusiyyəti var və hər iki xüsusiyyət təkamül nəzəriyyəsinin iddialarına ziddir:

◉ Sabitlik. Növlər yer üzündə mövcud olduqları müddət ərzində heç bir dəyişikliyə məruz qalmamışdır. Fosil qeydlərində ortaya çıxdıqları anda quruluşları necə olubsa, yox olduqları anda da quruluşları eynidir. Morfoloji (quruluşca) dəyişiklik, əsasən, məhduddur və müəyyən istiqaməti yoxdur.

◉ Ani surətdə üzə çıxma. Hər hansı bölgədə bir növ əcdadlarından mərhələli dəyişikliyə məruz qalaraq ortaya çıxmır, bir anda və “tamamilə formalaşmış” şəkildə üzə çıxır.

Yuxarıdakı iki maddə bunu göstərir: hər hansı təkamül prosesi və keçid mərhələsi keçməyən canlılar yaradılıblar. Xüsusiyyətlərini sonradan qazanmamış, yaradıldıqları gündən etibarən bu xüsusiyyətlərə malik olublar.

Fosil qeydlərinin təkamül nəzəriyyəsini təkzib etməsi Darvinin də bildiyi, ancaq təkamülçülərin qəbul etmək istəmədiyi həqiqətdir. Darvin fosil qeydlərini təkamül nəzəriyyəsi ilə açıqlamağın qeyri-mümkün olduğunu “Növlərin mənşəyi” kitabında “Nəzəriyyənin çətinlikləri” başlığı altında etiraf etmişdir:

*“Əgər növlər digər növlərdən hiss edilməyəcək dərəcədə kiçik tədrici dəyişikliklərlə törəmişsə, nə üçün hər yerdə saysız-hesabsız keçid formalar görmürük? Nə üçün bütün təbiət qarma-qarışıqlıq içində deyil, bunun əvəzinə, gördüyümüz kimi tam nizamlanmış növlər vardır? ... Keçmişdə yer üzündə yaşamış keçid formalar olduqca nəhəng sayda olmalıdır. Bəs nə üçün hər geoloji formasiya və hər təbəqə bu cür keçid həlqələri ilə dolu deyil? Geologiya, düzü, heç belə bir dəqiqliklə dərəcələndirilmiş üzvi zəncir ortaya qoymur və bu, bəlkə də, mənim nəzəriyyəmə qarşı irəli sürülə biləcək ən bariz və ən ciddi etiraz olacaqdır”.*

(Charles Darwin, “The Origin of Species”, 1-ci nəşr, səh. 171, 280)

Keçid forma fosillərinin olmamasına qarşı Darvinin 140 il əvvəl gətirdiyi “keçid formalar hazırda yoxdur, ancaq yeni tədqiqatlarda tapıla bilər” arqumenti isə bu gün artıq qüvvədə deyil. Dövrümüzdəki paleontoloji faktlar fosil qeydlərinin çox zəngin olduğunu göstərir. Dünyanın müxtəlif bölgələrindən əldə edilmiş milyardlarla fosil nümunəsi əsasında 250 min fərqli canlı növü müəyyən edilmişdir. Bu növlər hal-hazırda yaşayan təqribən 1,5 milyon növə çox bənzəyir. Bu qədər zəngin fosil mənbəyinə baxmayaraq, heç bir keçid forma tapılmayıb, yeni qazıntılarda da keçid formalar tapılmır.



**Trias dövründən (248-206 milyon il) bəri quruluşlarında heç bir dəyişiklik olmamış bir çox bitki növü vardır. Bunlardan biri də Ginqko ağacıdır. Şəkildə görünən fosil isə Yura dövrünə (206-144 milyon il) aiddir.**

**Şəkildə görülən budaq, dövrümüzdə yaşayan Ginkqo ağacının budağıdır.**

Fosil qeydlərində təkamülçülər üçün dəlil olan heç bir keçid forma yoxdur, əksinə, təkamül nəzəriyyəsini təkzib edən milyonlarla nümunə var. Bunlardan ən mühümü yaşayan fosillərdir. Dövrümüzdə canlı nümunələri olan, fosil qeydlərində isə müxtəlif geoloji dövrlərdə yaşadığı görünən və “yaşayan fosillər” deyə adlandırılan bu fosillər təkamülsüzlük dəlilləridir. Yüz milyon illər əvvəl yaşamış canlıların fosilləri ilə dövrümüzdəki nümunələri arasında heç bir fərq yoxdur. Darvinistlər bu vəziyyət qarşısında çarəsizdirlər.



**54-37 milyon illik arı fosili.**

**Şəkildə görünən ilbiz növünün məlum olan ən qədim fosil nümunələri Yura dövrünə (206-144 milyon il) aiddir. Bu növün daxil olduğu sinfin ilk nümunələri isə Kembri dövründən (543-490 milyon il) etibarən varlıqlarını davam etdirir. Yüz milyonlarla ildir eyni qalan ilbizlər təkamülün yanlış olduğunu göstərir.**

Təkamülçü Nils Eldric (Niles Eldredge) yaşayan fosillərlə bağlı darvinistlərin heç bir açıqlaması olmadığını belə etiraf edir:

*"Yaşayan canlı ilə uzaq geoloji keçmişdəki fosilləşmiş əcdadları arasında -müqayisə edəcəyimiz hər hansı qalıqda- demək olar ki, heç bir dəyişiklik yoxdur. Yaşayan fosillər təkamül sabitliyinin ən konkret nümunələridir... Yaşayan fosillərin sirrini tam aça bilməmişik".*

(Niles Eldredge, "Fossils", 1991, səh. 101, 108)

Nils Eldricin açmağa çalışdığı sirr, əslində, aşkar həqiqətdir. Yaşayan fosillər canlıların təkamül keçirmədiyini, yaradıldığını sübut edir. Ancaq darvinistlər ideologiyalarına görə bu həqiqəti görmək istəmir, 150 il əvvəlki doqmalarına dəstək vermək üçün müqavimət göstərirlər. Halbuki indi həqiqətlər Darvinin dövründən daha çox göz qarşısındadır. Həqiqətləri görən və həqiqətə inanmağı seçən insanların sayı artır, nağıllara inanıb bunları sorğu-sual etmədən qəbul edən insanların sayı isə azalır. Həqiqətlər artıq Darvinin dövründəki kimi gizlədilə bilmir. Genetika, mikrobiologiya, paleontologiya, geologiya və digər elm sahələri Darvinin və onun tərəfdarlarının istəmədiyi, bəlkə də, heç gözləmədiyi həqiqəti aşkar etmişdir. Bu həqiqət yaradılış həqiqətidir.

Darvinistlərin ortaya atdığı ağılsız, elmdənkənar iddialar, cəmiyyəti aldatmaq üçün etdikləri saxtakarlıqlar, insanları istiqamətləndirmək üçün istifadə etdikləri təbliğat üsulları ümidsiz çırpınışlarını göstərir. Gələcək nəsillər insanların bir vaxtlar darvinizm nağılına necə inandığını heyrətlə qarşılayacaq. Çünki bütün elmi kəşflər təkamülün heç vaxt baş vermədiyini, kainatı və bütün canlıları Allahın yaratdığını göstərir.



**Əgər yəqinliklə inanırsınızsa, bilin ki, Allah göylərin, yerin və onların arasında olanların Rəbbidir. Ondan başqa ibadətə layiq olan məbud yoxdur. O həm dirildir, həm də öldürür. O həm sizin Rəbbiniz, həm də əcdadlarınızın Rəbbidir. Lakin onlar şəkkə qapılıb əylənirlər.** (Duxan surəsi, 7-9)

## QAZINTI HALINDA TAPILAN QALIQLAR TƏKAMÜL NƏZƏRİYƏSİNİ TƏKZİB EDİR

Təkamül nəzəriyyəsinə görə, bütün canlı orqanizmlər bir-birindən törəyiblər. Əvvəllər mövcud olmuş canlı orqanizmin bir növü vaxt keçdikcə başqa bir növə çevrilmişdi. Beləliklə, bütün növlər əmələ gəlmişlər. Həmin nəzəriyyəyə müvafiq olaraq bu çevrilmə bir neçə yüz milyon illər sürmüş və

canlılar addım-addım inkişaf etmişdi.




**Sütun: 1 - Fosilləri olan qüsursuz canlılar**
**Sütun: 2 - Heç vaxt mövcud olmayan, yalnız təkamülçülərin xəyallarında yaşayan ara-keçid canlılar**
**Sütun: 3 - Fosilləri olan qüsursuz canlılar**

Belə olan halda bu cür uzun sürən formalaşma prosesi nəticəsində ara keçid formaları əmələ gəlməli idi. Məsələn, özündə həm balıqların, həm də sürünənlərin keyfiyyətlərini daşıyan məxluqlar mövcud olmalı idi. Və yaxud quşların və sürünənlərin xüsusiyyətlərinə malik olan məxluqlar mövcud olmalı idi. Bu canlı varlıqlar keçid mərhələsində olduqlarına görə şikəst, qüsurlu, natamam və aşkar nöqsanlarla olmalı idilər. Təkamülçülər belə xəyali canlıların keçmiş zamanlarda mövcud olduğuna inanır və onları "ara keçid formaları" adlandırır.

Əgər belə canlılar keçmişdə həqiqətən də yaşamışdısa, bu halda onların sayı, növ tərkibi milyonlarla və hətta milyardlarla hesablanmalı idi. Çünki bu keçid formalarının sayı bu gün bizlərə məlum olan heyvan növlərinin sayından çox və dünyanın bütün qitələrində bu keçid formalarının qalıqları mövcud olmalı idi. Darvin "Növlərin mənşəyi" kitabında bunu belə izah edir: *"Əgər mənim nəzəriyyəm düzgündürsə, onda növləri bir-birinə bağlayan keçid formaları mütləq aşkar olunmalıdır. Onların mövcudluğunu yalnız qazıntı halında tapılan skelet qalıqları ilə sübut etmək olar"*

(Charles Darwin, *The Origin of Species: A Facsimile of the First Edition*, Harvard University Press, 1964, s. 179)

Ancaq bu sətirləri yazan Darvin belə qalıqların tapılmadığını bilir, bu isə onun nəzəriyyəsini çıxılmaz vəziyyətə salırdı. Buna görə də Darvin "Növlərin mənşəyi" kitabının "Nəzəriyyənin çətinlikləri" fəslində belə yazır:

*"Əgər həqiqətən də növlər tədricən inkişaf edərək bir-birindən törəyibsə, **onda biz saysız-hesabsız keçid formalarının qalıqlarına niyə rast gəlmirik?** Niyə təbiətdə hər şey xaos halında yox, öz yerindədir? Yerin çoxsaylı qatlarında saysız - hesabsız keçid formaları olmalıdır... Niyə hər*

*geoloji qat və hər lay belə bir-birinə bağlanan ara keçid forma qalıqları ilə dolu deyil? Geologiya elmi mərhələli proses irəli sürə bilmədi, keçid formalarını aşkar edə bilmədi və ola bilər ki, bu, gələcəkdə mənim nəzəriyyəmə qarşı ən tutarlı dəlil olacaq".* (Charles Darwin, *The Origin of Species*, s. 172, 280)

Bu vəziyyətdə Darvinin yeganə izahı həmin anda arxeoloji tapıntıların çatışmazlığı ilə bağlı idi. O, belə iddia edirdi ki, "keçid formalar qalıqların daha ətraflı öyrənilməsindən sonra mütləq tapılacaq".

Darvinin gələcəyi görmə qabiliyyətinə inanan təkamülçülər XIX əsrin ortalarında keçid formalarını tapmaq niyyəti ilə dünyanın bütün qitələrindəki heyvan qalıqlarını böyük həvəslə tədqiq edirdilər.





Lakin bütün axtarışlar boşa çıxdı. Qazıntı nəticəsində tapılan heyvan qalıqları təkamülçülərin gözlədiklərinin əksinə olaraq canlı orqanizmlərin nöqsansız, eyibsiz, qüsursuz və bir anda əmələ gəldiyini göstərirdi. Öz nəzəriyyələrini sübut etməyə çalışan təkamülçülər onu elə öz əlləri ilə də dağıtdılar.

Məhşur ingilis paleontoloqu Derek Aqer təkamülçü olsa da bu faktı belə etiraf edir:

*"Bizim problemimiz bu məsələdən ibarətdir: heyvan qalıqlarının sinif və yaxud növ səviyyəsində aparılan müfəssəl araşdırılması zamanı biz daim eyni həqiqətlə üzləşir və Yer üzündə qrupların təkamül prosesi yolu ilə mərhələli şəkildə deyil, ani surətdə yarandığını görürük".* (Derek A. Ager, "The Nature of the Fossil Record", *Proceedings of the British Geological Association*, cilt 87, 1976, s. 133)

Başqa təkamülçü paleontoloq Mark Çarneki isə bunu belə şərh edir:

*"Skelet qalıqları təkamül nəzəriyyəsinin sübut olunmasına həmişə əngəl törədib. Onlar arasında Darvinin fərz etdiyi ara keçid formaları heç vaxt olmamışdır. Növlər ani surətdə əmələ gəlmiş və eləcə də ani surətdə yox olmuşlar. Bu gözlənilməz vəziyyət canlıların Allah tərəfindən yaradılması haqqında olan düşüncəyə dəstək olmuşdur".*

(Mark Czarnecki, "The Revival of the Creationist Crusade", *MacLean's*, 19 Ocak 1981, s. 56)

*Bu arxeoloji "boşluqlar" gözəl günlərin birində gərəkli heyvan qalıqlarının mütləq tapılacağı haqqındakı təsəlli ilə də doldurula bilməz. Qlazqo Universitetinin paleontologiya professoru T.Corc bunun səbəbini belə izah edir:*

*Artıq heyvan skeleti qalıqları sahəsində olan təkamül boşluğunu*

*doldurucaq bir izah vermək mümkün deyil, çünki bizdə olan tapıntılar çox zəngindir və deyəsən, yeni tədqiqatlar heç nəyi dəyişməyəcək".* (T. Neville George, "Fossils in Evolutionary Perspective", *Science Progress*, c. 48, no. 189, yanvar 1960, səh. 1, 3)

## YER ÜZÜNDƏKİ BÜTÜN CANLI ORQNİZMLƏR BİR ANDA və ƏN MÜKƏMMƏL FORMADA ƏMƏLƏ GƏLİBLƏR

Yer qabığı qatlarını və skelet qalıqlarını tədqiq edərək bu nəticəyə gəlmək olar ki, yer üzündə bütün canlı aləm anidən meydana çıxıb. Kompleksli canlı məxluqların qalıqları tapılan yer qabığının ən dərin qatının yaşı 520-530 milyon il təşkil edir və "kembri" adlanır. Bu layda tapılan qalıqlar ilbizlər, trilobitlər, süngərlər, yastıcalar, dəniz ulduzları, üzən xərçəngkimilər və dəniz zanbaqları kimi mürəkkəb onurğasızlara məxsus idi. Bir fakt maraq doğurur ki, bir-birindən fərqlənən bütün bu növlər eyni vaxtda əmələ gəliblər və ondan törəyə biləcək ümumi əcdada malik deyillər. Ona görə də bu maraqlı hadisə geologiya elmində "kembri partlayışı" adlandırılır.

Bu qatda tapılan canlı orqanizmlər eyni zamanda müasir orqanizmlərdən heç nə ilə fərqlənməyən gözlər, qəlsəmələr və qan dövranı sistemi kimi kompleks fizioloji sistemlərə malikdir. Məsələn, arı pətəklərini xatırladan trilobitin ikilinzalı göz quruluşu inanılmayacaq dərəcədə böyük maraq doğurur.




**1 - Trilobit Fosili** **A - Trilobitin Gözü**

Harvard, Roçester və Çikaqo universitetlərinin geologiya professoru Devid Raup belə deyir:

*"Trilobit hazırkı zamanda yalnız istedadlı, zəkalı və yaxşı təhsil almış optika mühəndisinin yarada biləcəyi göz quruluşuna malikdir".* (David Raup, "Conflicts Between Darwin and Paleontology", Bulletin, Field Museum of Natural History, Cilt 50, Ocak 1979, s. 24)

Bu mürəkkəb onurğasızlar onlardan əvvəl yaşamış yeganə canlı orqanizmlər olan təkhüceyrəlilərlə bağlı deyillər və onlar birdən, keçid formaları olmadan orqanizmlərinin müasir quruluşu ilə əmələ gəliblər. Təkamülçülər arasında populyar olan "Earth Science" jurnalının redaktoru Riçard Monestarski təkamülçüləri heyrətləndirən "kembri partlayışı"

haqqında belə məlumat verir:

*"Heyvanların bu gün gördüyümüz kifayət qədər mürəkkəb forması ani surətdə əmələ gəlib. Bu vaxt təkamül partlayışının nəticəsində dəniz və qurunun mürəkkəb canlı orqanizmlərlə dolmasına, yəni kembri dövrünün əvvəllərinə təsadüf edir. Müasir onurğasızlar artıq kembri dövründə mövcud idilər və hazırki vaxtda olduğu kimi də bir-birindən fərqlənirdilər".*

(Richard Monestarsky, "Mysteries of the Orient", *Discover*, Nisan 1993, s. 40)

Bəs necə oldu ki, ümumi əcdadı olmayan və bir-birindən fərqlənən bu qədər növ onurğasız Yer kürəsində birdən-birə meydana çıxdı? Təkamülçülər bu tipli suallara heç vaxt cavab verməyəcəklər. Təkamülün tərəfdarından biri, ingilis bioloqu Riçard Doukins dissertasiyasının mövzusunu əsaslı şəkildə təkzib etmiş bu faktla bağlı belə fikir söyləmişdir:

*"Kembri təbəqəsi onurğasızların tapıldığı ən qədim qatdır. İlkin yaradılış görkəmində, kifayət qədər inkişaf etmiş, onlar sanki heç təkamül təsiri altına düşməmiş əmələ gəliblər və əsla dəyişməyiblər. Təbii ki, bu fakt canlıların yaradıldığını iddia edənləri, kreasinistləri çox sevindirmişdi".*

(Richard Dawkins, *The Blind Watchmaker*, London: W. W. Norton 1986, s. 229)

Doukinsin də etiraf etdiyinə görə, kembri partlayışı Allah tərəfindən xəlq olunmanın aşkar sübutudur, çünki ümumi əcdadları olmayan canlı orqanizmlərin ani surətdə əmələ gəlməsi yalnız yaradılışla izah olunur. Təkamülçü-bioloq Duqlas Futuyma da bunu öz sözlərində təsdiq edir:

*"Canlılar yer üzündə ya birdən mükəmməl formada əmələ gəliblər, ya da əvvəllər mövcud olmuş bəzi növlərdən təkamül yolu ilə törəyiblər.* ***Əgər canlılar qüsursuz, nöqsansız, mükəmməl formada birdən əmələ gəliblərsə, onda onları yaradan Zəka mövcud olmalıdır"***.

(Douglas J. Futuyma, Science on Trial, New York: Pantheon Books, 1983. s. 197)

*Çarlz Darvin yazır: "Əgər bir sinfə aid olan çoxsaylı növlər eyni vaxtda mövcud olubsa, bu hal təkamülün ümumi əcdaddan təbii seçmə yolu ilə həyata keçməsini iddia edən nəzəriyyə üçün öldürücü zərbə olar". (Charles Darwin, The Origin of Species: A Facsimile of the First Edition, Harvard University Press, 1964, s. 302) Kembri dövrü Darvinin adını çəkdiyi həmin öldürücü zərbədir. Buna görə də kembri dövrü haqqında söhbət düşəndə İsveç təkamülçüsü Stefan Benqston keçid formalarının olmamasını etiraf edib deyir:* ***"Darvini təəccübləndirib heyrətləndirən bu hadisə bizi də indiyədək heyrətləndirməkdə davam edir"*** (Stefan Bengston, *Nature*, Vol. 345, 1990, s. 765)

Heyvanların daşlaşmış qalıqları göstərir ki, canlılar təkamülçülərin iddia etdiyi kimi, sadədən mürəkkəbə doğru inkişaf etməklə yox, bir anda mükəmməl formada əmələ gəlmişlər. Bir sözlə, canlı orqanizmlər təkamül etməmiş, yaranmışlar.

# GERÇƏK TƏBİƏT TARİXİ -I-
# (ONURĞASIZLARDAN SÜRÜNƏNLƏRƏ)

Təbiət tarixi anlayışı bəzi insanlara təkamül nəzəriyyəsini xatırladır. Bunun səbəbi bu istiqamətdə aparılan təbliğatdır. Bir çox ölkədə təbiət tarixi muzeyləri materialist təkamülçü bioloqların nəzarətindədir və bu muzeylərdəki materiallar da onlar tərəfindən şərh edilir. Tarixən yaşamış canlılar və bu canlılara aid fosil izləri daima darvinist məfhumlarla birlikdə xatırlanır. Bunun bir nəticəsi kimi, bir çox insan təbiət tarixini nəzərdən keçirdikdə "təkamül" adlanan anlayışla qarşılaşacağını düşünür.

Lakin həqiqətlər çox fərqlidir. Təbiət tarixi bizlərə müxtəlif canlı siniflərinin yer üzündə heç bir "təkamül" olmadan bir anda və kompleks formaları ilə birlikdə meydana gəldiyini göstərir. Müxtəlif canlı növləri müstəqil şəkildə, aralarında heç bir "ara forma" olmadan üzə çıxmışlar.

## CANLILARIN TƏSNİFATI

Canlılar bioloqlar tərəfindən təsnif olunurlar. "Taksonomiya" və ya "sistematika" adlanan bu təsnifatın tarixi Linney kimi tanınan XVIII əsrin isveçli elm adamı Karl von Linneyə qədər gedib çıxır. Linneyin tərtib etdiyi təsnifat sistemi dövrümüzə qədər təkmilləşdirilərək davam etmişdir.

Bu təsnifatda iyerarxik kateqoriyalar var. Canlılar əvvəlcə "aləm"lərə ayrılırlar, bitkilər və ya heyvanlar aləmi kimi. Sonra bu aləmlər öz daxilində şöbələrə bölünür. Şöbələr də alt qruplara ayrılır. Təsnifat yuxarıdan aşağıya doğru belədir:

**Aləm (Kingdom)**
**Şöbə/ tip (filum)**
**Sinif (Class)**
**Dəstə (Order)**
**Fəsilə(Family)**
**Cins (Genus, cəmi Genera)**
**Növ (Species)**

Bu gün bioloqların əksəriyyəti beş (və ya altı) ayrı aləm olduğunu qəbul edir. Bitkilər və heyvanlardan başqa göbələklər, protista (yosun və amöb kimi hüceyrə nüvəsi olan təkhüceyrəlilər) və monera (bakteriyalar kimi hüceyrə nüvəsi olmayan təkhüceyrəlilər) hər biri ayrı aləm hesab edilir. Bəzən bakteriyalar eubakteriya və arxeobakteriya adlanan iki yarımqrupa ayrılırlar, bəzən də eubakteriya, arxeobakteriya və eukariot şəklində üç aləmə bölünürlər. Bu aləmlərin ən mühümü, şübhəsiz, heyvanlar aləmidir. Heyvanlar aləminin öz daxilindəki ən böyük təsnifat isə, əvvəldə də bildirdiyimiz kimi, müxtəlif şöbələrdir. Bu şöbələr müəyyən edilərkən hər birinin tamamilə fərqli bədən quruluşlarına malik olduqları nəzərə alınmışdır. Məsələn, *artropodlar* (həşəratlar, hörümçəklər və digər buğumayaqlılar) ayrıca bir şöbədir və şöbəyə daxil edilən bütün canlılar, əsasən, bənzər bədən quruluşuna malikdirlər. *Chordata* (xordalılar) adlandırılan şöbə isə *notochord* (embrionun arxa tərəfində onurğanı təşkil edən hüceyrə

yığınının əmələ gətirdiyi uzun xorda) və ya daha çox onurğaya malik olan canlıları əhatə edir. Bizim üçün tanış olan balıqlar, quşlar, sürünənlər, məməlilər kimi onurğaya malik olan heyvanların hamısı *Chordata*nın yarımsinfi olan onurğalılar yarımtipinə daxildir.

Təqribən 35 fərqli canlı şöbəsi arasında osminoqlar kimi yumşaqbədənli canlıları əhatə edən molyusklar şöbəsi və ya girdə soxulcanların daxil olduğu *nemotada* şöbəsi kimi çox fərqli kateqoriyalar var. Bu kateqoriyaların ən mühüm xüsusiyyəti isə, əvvəldə də bildirdiyimiz kimi, tamamilə fərqli bədən quruluşlarına malik olmalarıdır. Şöbələrin yarımkateqoriyaları əsasən bənzər bədən quruluşlarına malikdir, amma şöbələr bir-birlərindən çox fərqlidir.

Bioloji təsnifat haqqındakı bu ümumi məlumatdan sonra indi də bu şöbələrin necə və nə zaman yer üzündə üzə çıxdıqları sualına cavab verək.

## FOSİLLƏR "HƏYAT AĞACINI" TƏKZİB EDİR...

Əvvəlcə, darvinizmin bu mövzudakı fərziyyəsini nəzərdən keçirək. Məlum olduğu kimi, darvinizm canlıların bir ortaq əcdaddan törədiyini və kiçik dəyişikliklərlə müxtəlifləşdiyini irəli sürür. Bu təqdirdə canlılar lap əvvəldən bir-birinə çox bənzər və ibtidai formalarda ortaya çıxmış olmalıdır. Yenə eyni iddiaya əsasən, canlıların bir-birlərindən fərqlənməsi və komplekslіklərinin artması da zaman ərzində paralel baş verməlidir.

Qısa desək, darvinizmə əsasən, canlılar bir kökdən gələn, ancaq sonra budaqlara ayrılan ağac kimi olmalıdır. Belə ki, bu fərziyyə darvinist mənbələrdə israrla vurğulanır və "həyat ağacı" (tree of life) anlayışı tez-tez işlədilir. Bu həyat ağacına əsasən, canlılar arasındakı ən əsas təsnifat vahidi olan şöbələr də şəkildəki sxemdə göründüyü kimi, mərhələli şəkildə ortaya çıxmış olmalıdır. Darvinizmə əsasən əvvəlcə bir şöbə əmələ gəlməli, sonra digər şöbələr kiçik dəyişikliklərlə və uzun zaman




**Təkamülçü bioloq Ernst Hekel tərəfindən 1866-cı ildə çəkilən "həyat ağacı"**

kəsikləri ərzində yavaş-yavaş meydana çıxmalıdır. Darvinizmin bu fərziyyəsinə əsasən, heyvan şöbələrinin sayında da mərhələli artım baş verməlidir. Şəkil darvinist fərziyyələrə əsasən, heyvan şöbələrində nəzərdə tutulan mərhələli say artımını göstərir.

Darvinizmə əsasən, canlılar bu şəkildə inkişaf etməlidirlər. Yaxşı, bəs, həqiqətən bu, belə olub?

Qətiyyən yox. Əksinə, heyvanlar ilk dəfə üzə çıxdıqları dövrdən etibarən çox fərqli və çox kompleksdirlər. **Bu gün məlum olan bütün heyvan tipləri yer üzündə eyni anda Kembri dövrü kimi tanınan geoloji dövrdə üzə çıxmışlar**. Kembri dövrü yaşı 570-505 milyon il kimi hesablanan 65 milyon illik geoloji dövrdür.

Əsas heyvan qrupları Kembri dövrünün "Kembri partlayışı" adlandırılan daha qısa yarım dövründə ani surətdə üzə çıxmışdır. Stefen C.Meyer, Pol A.Nelson və Pol Çien dərin elmi-ədəbi tədqiqata əsaslanan 2001-ci il tarixli məqalələrində "Kembri partlayışı geoloji dövrün 5 milyon ildən artıq davam etməyən, çox dar zaman intervalında əmələ gəlmişdir" yazırlar.

(Stephen C. Meyer, P. A. Nelson and Paul Chien, *The Cambrian Explosion: Biology's Big Bang*, 2001, səh. 2.)

Bu dövrdən əvvəlki fosil qeydlərində təkhüceyrəli canlılar və çox bəsit bir neçə çoxhüceyrəlidən başqa heç bir canlı izinə rast gəlinmir. Kembri dövrü kimi olduqca qısa dövr ərzində isə (5 milyon il geoloji cəhətdən çox qısa zaman kəsiyidir) bütün heyvan tipləri heç bir çatışmazlıq olmadan bir anda üzə çıxmışlar!

Kembri qayalıqlarında tapılan fosillər ilbizlər, trilobitlər, süngərlər, soxulcanlar, meduzalar, dəniz ulduzları, qabıqlı dəniz canlıları və dəniz zanbaqları *(crinoidea*) kimi çox fərqli canlılara aiddir. Bu təbəqədəki canlıların əksəriyyətində dövrümüzdə yaşayan nümunələrindən heç bir fərqi olmayan göz, qəlsəmə, qan dövranı kimi kompleks sistemlər, təkmil fizioloji formalar nəzərə çarpır. Bu formalar həm çox kompleks, həm də çox fərqlidir. "*Science news"* yazıçılarından biri olan Riçard Monestarski Kembri partlayışı haqqında belə məlumat verir:

*Yarım milyard il əvvəl... Bu gün gördüyümüz olduqca **kompleks heyvan formaları ani surətdə üzə çıxmışlar.** Bu an 550 milyon il əvvəl Kembri dövrünün məhz başlanğıcına uyğun gəlir ki, dənizlərin və yer üzünün ilk kompleks məxluqlarla dolması bu təkamül xarakterli partlayışla başlamışdır.*

*Dövrümüzdə dünyanın hər tərəfinə yayılmış onurğasız heyvan qrupları erkən Kembri dövründə artıq mövcud idi və dövrümüzdə olduğu kimi, bir-birlərindən çox fərqli idilər.*

(Richard Monestarsky, "Mysteries of the Orient", *Discover*, aprel 1993, səh. 40. )

# FOSİL QEYDLƏRİ TƏKAMÜL NƏZƏRİYYƏSİNİN ƏLEYHİNƏ




TƏKAMÜL NƏZƏRİYYƏSİNƏ GÖRƏ YAŞANMIŞ TƏBİƏT TARİXİ




FOSİL QEYDLƏRİNİN GÖSTƏRDİYİ ƏSL TƏBİƏT TARİXİ

***Təkamül nəzəriyyəsi əsas canlı qruplarının (tip və ya şöbələrinin) eyni ortaq kökdən törəyib və uzun zaman ərzində müxtəlifləşib inkişaf etdiklərini iddia edir. Yuxarıdakı SXEM:1 bu iddianı ifadə edir: Darvinizmə görə canlılar getdikcə şaxələnən ağac kimi bir-birindən müxtəlifləşməli idi. Fosil qeydləri isə bunun tamamilə əksini göstərir.***

***Aşağıdakı SXEM:2 - də göründüyü kimi müxtəlif canlı qrupları yer üzündə anidən və fərqli quruluşları ilə ortaya çıxmışdır. Kebri dövründə 100-ə yaxın təməl canlı tipi bir anda meydana çıxmışdır. Daha sonra isə bu canlı qruplarının sayı artmamışdır, əksinə azalmışdır. (Çünki bəzi canlı tiplərinin nəsli kəsilmişdir.)***

Eyni məqalədə Çinin Çenqcianq ərazisindəki Kembri təbəqələrini tədqiq edən paleontoloq Jan Berqstrom belə deyir: "Çenqcianq faunası dövrümüzdəki böyük heyvan tiplərinin erkən Kembri dövründə artıq mövcud olduğunu və bu gün olduğu kimi bir-birlərindən çox fərqli olduğunu üzə çıxarır". (Richard Monastersky, "Mysteries of the Orient", *Discover*, aprel 1993, səh. 40.)

Dünyanın anidən bir-birindən çox fərqli canlı tipləri ilə necə dolub-daşması, heç bir ortaq əcdada malik olmayan fərqli canlıların necə meydana gəlməsi təkamül nəzəriyyəsinin heç vaxt cavablandıra bilmədiyi suallardır. Darvinizmin dünya səviyyəsində ən qabaqcıl tərəfdarlarından biri olan ingilis bioloq Riçard Dokinz bu həqiqət haqqında belə deyir:

*... Kembri təbəqələri əsas onurğasız canlı qruplarını tapdığımız ən qədim təbəqələrdir. Bunlar ilk dəfə ortaya çıxdıqları kimi həddindən artıq təkamül keçirmiş şəkildədirlər.* **Sanki heç bir təkamül tarixinə malik olmadan, o vəziyyətdə orada meydana gəliblər.**

(Richard Dawkins, *The Blind Watchmaker*, London: W. W. Norton 1986, səh. 229.)



**Bu şəkil Kembri dövründəki mürrəkəb quruluşa sahib canlıları təsvir edir. Belə fərqli canlıların heç bir əcdadları olmadan meydana çıxması darvinst nəzəriyyəni elə ilk mərhələdə mənasız edir.**

Darvinizmin dünya səviyyəsindəki ən məşhur tənqidçilərindən biri olan Berkeley və Kaliforniya Universitetinin professoru Filip Conson paleontologiyanın üzə çıxardığı bu həqiqətin darvinizmlə açıq-aşkar ziddiyyət təşkil etdiyini belə açıqlayır:

*Darvinist nəzəriyyə canlıların bir növ "getdikcə genişlənən fərqlilik*

*üçbucağı" çərçivəsində inkişaf etdiyini irəli sürür. Bu nəzəriyyəyə əsasən, canlılar ilk canlı orqanizmdən və ya ilk heyvan növündən başlayaraq getdikcə müxtəlifləşmiş və bioloji təsnifatın daha yuxarı kateqoriyalarını əmələ gətirmişdir. Amma heyvan fosilləri bizə bu üçbucağın əslində başıaşağı dayandığını göstərir:* ***şöbələr elə ilk anda birlikdə var olmuşlar, sonra getdikcə sayları azalmışdır.*** (Phillip E. Johnson, "Darwinism's Rules of Reasoning", *Darwinism: Science or Philosophy, Foundation for Thought and Ethics*, 1994, səh. 12.)



**Burqes Şeyl fosil yatağında tapılan canlı fosillərindən biri: Marrella**

Filip Consonun qeyd etdiyi kimi, canlı tiplərinin mərhələli şəkildə əmələ gəlməsi bir tərəfə qalsın, bütün tiplər bir anda mövcud olmuşdur, hətta sonrakı dövrlərdə bəzilərinin nəsli kəsilmişdir. 12-ci səhifədəki qrafiklər fosil qeydlərinin tiplərin mənşəyi haqqında üzə çıxardığı bu həqiqəti göstərir:

Göründüyü kimi, Kembridən əvvəlki (Prekembri) dövrdə ancaq təkhüceyrəli canlılardan təşkil olunmuş üç fərqli tip var. Kembri dövründə isə 60-100 arasında fərqli heyvan tipi bir anda ortaya çıxmışdır. Sonrakı dövrlərdə isə bu tiplərin bir qisminin nəsli kəsilmiş, dövrümüzə qədər sadəcə bəzi tiplər gəlib çıxmışdır.

**Kembri Dövrünə Aid Bir Fosil**



Elmi yazıçı Rocer Levin darvinizmin həyatın tarixi haqqındakı bütün fərziyyələrini məhv edən bu qeyri-adi vəziyyətdən belə bəhs edir:

*"Heyvanların ümumi tarixindəki ən mühüm təkamül xarakterli hadisə" kimi tanınan Kembri partlayışı daha sonra da varlıqlarını qoruyacaq bütün əsas canlı formalarını (tiplərini) üzə çıxarmışdır. Bunların bir qisminin daha sonra nəsli kəsilmişdir. Hal-hazırda* ***mövcud olan 30 fərqli heyvan tipi ilə müqayisə edildikdə Kembri partlayışının təqribən 100-ə qədər fərqli tipi üzə çıxardığı təxmin edilir.*** (R. Lewin, *Science*, vol. 241, 15 July 1988, səh. 291.)





***Maraqlı tikanlar: Kembri dövründə anidən meydana çıxan canlılardan biri Hallucigenia. Bunlar kimi xeyli Kembri canlısına aid fosillərdə hücümlara qarşı qorunmaq üçün tikanlar və ya sərt qabıqlar mövcuddur. Heç bir "ovçu" canlının olmadığı bir dövrdə bu heyvanlar necə olur ki, bu cür müdafiə sisteminə sahib oldular? Ovçu heyvanın mövcud olmaması bu məsələni təbii seçmə ilə açıqlamağı imkansız edir. Bu da təkamül nəzəriyyəsinin cavabsız qaldığı məqamlarından biridir.***

## BURQES ŞEYL FOSİL YATAĞI

Levin darvinizmə olan sədaqəti naminə Kembri dövründəki bu qeyri-adi hadisəni "təkamül xarakterli hadisə" kimi tanıtmağa davam edir, amma əldə olan tapıntıların təkamüllə heç bir əlaqəsi yoxdur. Maraqlısı budur ki, yeni fosil tapıntıları təkamül nəzəriyyəsinin Kembri problemini getdikcə daha da böyüdür.

Məşhur elmi jurnal olan "Trends in genetics" (TİG) 1999-cu il fevral tarixli say ında bu mövzudan bəh s edir. Kanadanın Britiş Kolumbiya əyalətində yerləşən Burqes Şeyl adlı fosil yatağındakı Kembri dövrü fosillərindən bəhs edilən məqalədə bu ərazidəki fosil tapıntılarının təkamül nəzəriyyəsinin iddialarını heç cür təsdiqləmədiyi qəbul edilir.

Burqes Şeyldəki sözügedən fosil yatağı dövrümüzün mühüm paleontoloji tapıntılarından biri hesab edilir. Kembri dövrünə adi bu canlı fosillərinin xüsusiyyəti çox fərqli şöbələrə aid olmaları və əvvəlki təbəqələrdə heç bir əcdadları olmadan bir anda ortaya çıxmalarıdır. "TİG" jurnalı darvinizmin qarşısındakı bu böyük paleontoloji problemi belə ifadə edir:

*Kiçik bir məkanda tapılmış bu fosillərin təkamül biologiyasındakı bu böyük problemlə əlaqədar qızğın mübahisənin tam mərkəzində yer alması olduqca qəribə görünə bilər. Lakin bu mübahisələrə səbəb olan şey Kembri dövründə yaşayan heyvanların fosil qeydlərində təəccüblü dərəcədə çox və birdən-birə üzə çıxmalarıdır. Radiometrik tarixləndirmənin qəti nəticələri və*

*ya getdikcə artan yeni fosil tapıntıları isə bu bioloji inqilabın aniliyini və sahəsini kəskinləşdirmişdir. Canlılar aləmindəki bu böyük dəyişiklik bir açıqlama tələb edir. İndiyə qədər bir çox tezis irəli sürülsə də, heç biri inandırıcı olmamışdır.* (Gregory A. Wray, "The Grand Scheme of Life", *Review of The Crucible Creation: The Burgess Shale and the Rise of Animals by Simon Conway Morris, Trends in Genetics*, February 1999, vol. 15, no. 2.)

"Heç biri inandırıcı olmayan" bu fikirlər təkamülçü paleontoloqlara aiddir. "TİG" jurnalı bu mövzuda iki məşhur nüfuzlu şəxsdən bəhs edir: Stefen J.Quld və Saymon Konvey Moris. Hər ikisi də Burqes Şeyldəki "ani surətdə üzə çıxmanı" təkamüllə açıqlamaq üçün kitab yazmışdır. Quldun kitabı "Qəribə həyat" (Wonderful life), Morisin kitabı isə "Yaradılış küpü: Burqes Şeyl və canlıların meydana gəlməsi" (The crucible of greation: The Burgess Shale and the rise of animals) adlanır. Ancaq bu iki müəllifin heç biri "TİG" jurnalının vurğuladığı kimi, nə Burqes Şeyl fosillərini, nə də ümumiyyətlə, Kembri dövrünə aid digər fosil qeydlərini heç cür açıqlaya bilmir.

## BÜTÜN CANLI TİPLƏRİNİN EYNİ ANDA ÜZƏ ÇIXMASI

Kembri partlayışı tədqiq edildikcə onun təkamül nəzəriyyəsi üçün nə qədər çətin, çıxılmaz vəziyyət olduğu açıq-aşkar üzə çıxır. Son illərdəki tapıntılar ən əsas heyvan sinifləri olan şöbələrin, demək olar ki, hamısının Kembri dövründə ani surətdə ortaya çıxdığını göstərir. "Science" (Elm) jurnalında 2001-ci ildə dərc edilən bir məqalədə "təqribən 545 milyon il əvvəl yaşanmış Kembri dövrünün başlanğıcı bu gün hələ də canlılar aləminə hakim olan, demək olar ki, bütün heyvan növlərinin (filumların) fosil qeydlərində ani surətdə ortaya çıxmasına səhnə oldu" deyilir. (Richard Fortey, "The Cambrian Explosion Exploded?", *Science*, vol. 293, no. 5529, 20 July 2001, səh. 438-439.) Eyni məqalədə bu cür kompleks və bir-birindən tamamilə fərqli canlı qruplarının təkamül nəzəriyyəsinə görə açıqlanması üçün əvvəlki dövrlərə aid çox zəngin və mərhələli inkişafı göstərən fosil yataqlarının olmasının lazım gəldiyi, amma bundan əsər-əlamət olmadığı belə açıqlanır: "Bu müxtəlifləşən təkamül və yayılma da özündən daha əvvəl yaşamalı olan bir qrup canlının mövcud olmasını tələb edir, amma buna dair bir fosil dəlili yoxdur."

(Richard Fortey, "The Cambrian Explosion Exploded?", *Science*, cild 293, no. 5529, 20 iyul 2001, səh. 438-439.)



**Kembri dövrünə aid canlılarını təsvir edən digər xəyali rəsm**

Kembri dövrü fosillərinin ortaya qoyduğu bu mənzərə təkamül nəzəriyyəsinin fərziyyələrini təkzib edərkən bir tərəfdən də fövqəltəbii yaradılışla var olduqlarını göstərən çox önəmli bir dəlildir. Təkamülçü bioloq

Duqlas Futuyma bu həqiqəti belə açıqlayır:

Canlılar dünyada ya tamamilə mükəmməl və tam şəkildə üzə çıxmışdırlar, ya da özlərindən əvvəl mövcud olan bəzi canlı növlərindən təkamül yolu ilə meydana gəlmişlər. Əgər tam və mükəmməl şəkildə ortaya çıxmışlarsa, deməli, üstün bir Ağıl tərəfindən yaradılmışdırlar.

(Douglas J. Futuyma, *Science on Trial*, New York: Pantheon Books, 1983, səh. 197.)

Göründüyü kimi, fosil qeydləri canlıların təkamülün iddia etdiyi kimi ibtidaidən aliyə doğru bir proses keçirdiyini deyil, bir anda və ən mükəmməl şəkildə üzə çıxdıqlarını göstərir. Bu isə canlıların şüursuz təbii proseslərlə deyil, şüurlu yaradılışla var olduğuna dəlildir. Nyu York Steyt Universitetindən ekologiya və təkamül professoru Cefri S.Levinton "Elmi amerikan" (Scientific american) jurnalında yazdığı "Heyvan təkamülünün Biq bənqi" adlı bir məqaləsində bu həqiqəti istəmədən də olsa, qəbul edir və "Kembri dövründə çox xüsusi və sirli yaradıcı gücün varlığını görürük" deyir. (Levinton, Jeffrey S.; "The Big Bang of Animal Evolution", *Scientific American*, 267:84, noyabr 1992.)

## MOLEKULYAR MÜQAYİSƏLƏR TƏKAMÜLÜN KEMBRİ MÜƏMMASINI DƏRİNLƏŞDİRİR

Təkamül nəzəriyyəsini Kembri partlayışı ilə əlaqədar çıxılmaz vəziyyətə salan digər həqiqət isə fərqli canlı kateqoriyaları arasında aparılan genetik müqayisələrdir. Bu müqayisələrin nəticələri təkamülçü bioloqların yaxın dövrə qədər "yaxın qohum" hesab etdikləri heyvan kateqoriyalarının genetik cəhətdən çox fərqli olduqlarını üzə çıxarır, beləliklə, onsuz da yalnız nəzəriyyə şəklində mövcud olan "ara forma" fərziyyələrini kökündən məhv edir.

"Proceedings of the National Academy of Sciences" jurnalında 6 elm adamının imzası altında dərc olunmuş 2000-ci il tarixli bir məqalədə DNT analizlərinin "əvvəllər ara forma hesab edilən" kateqoriyaları bu siyahıdan çıxardığı belə açıqlanır:

DNT ardıcıllığı analizləri filogenetik ağaclar haqqında yeni izahlar verir. Metazoa (çoxhüceyrəli canlılar) ağacının ən aşağısında yer alan və daha əvvəl bir-birini təqib edən kompleksklik dərəcələrini təmsil edən canlı sinifləri ağacın daha yuxarı hissələrinə doğru yerlərini dəyişdirirlər. Bunun nəticəsində geridə heç bir "ara forma" qalmır və bizi bilateria (hər iki tərəfi simmetrik orqanizmə malik canlıların) kompleksliyinin mənşəyi haqqında yenidən düşünməyə vadar edir. (André Adoutte, Guillaume Balavoine, Nicolas Lartillot, Olivier Lespinet, Benjamin Prud'homme ve Renaud de Rosa, "The New Animal Phylogeny: Reliability And Implications", *Proceedings of the National Academy of Sciences*, 25 aprel 2000, vol 97, no. 9, səh. 4453-4456.)

Eyni məqalədə təkamülçü müəlliflər daha əvvəl süngərlər, cnidaria, ctenophora kimi onurğasız dəniz canlıları qrupları arasında "ara forma" hesab etdikləri bəzi kateqoriyaların yeni genetik məlumatlar səbəbi ilə artıq belə hesab edilməyəcəklərini bildirir və bu cür təkamül ağacları uydurma məsələsində artıq "ümidlərini itirdiklərini" belə ifadə edirlər:

Yeni molekulyar əsaslı filogeniyanın bəzi mühüm nəticələri var. Bunlardan ən mühümü süngərlər, cnidaria və ctenophora arasındakı "ara

forma" siniflərinin və bilaterial canlıların son ortaq əcdadının, yəni "urbilateria"nın aradan qalxmasıdır... Bunun təbii nəticəsi olaraq urbilateriyaya gedən nəsil ağacında çox böyük boşluğumuz var... Mərhələli şəkildə getdikcə artan komplekslik ssenarisi vasitəsilə "boşluqdakı əcdadı" yenidən inşa etməklə bağlı ümidimizi (klassik təkamül məntiqində bu vasitəyə çox müraciət olunub) itirmişik. (André Adoutte, Guillaume Balavoine, Nicolas Lartillot, Olivier Lespinet, Benjamin Prud'homme ve Renaud de Rosa, "The New Animal Phylogeny: Reliability And Implications", *Proceedings of the National Academy of Sciences*, 25 aprel 2000, vol 97, no. 9, səh. 4453-4456.)

## TRİLOBİTLƏR VƏ DARVİN

Kembri dövründə ani surətdə üzə çıxan müxtəlif canlı tiplərinin ən maraqlılarından biri sonradan nəsli kəsilmiş trilobitlərdir. Artropodlar (buğumayaqlılar) tipinə daxil olan trilobitlər bərk qabıqları, buğumlu bədənləri və kompleks orqanları ilə çox mürəkkəb canlılardır. Fosil qeydləri trilobitlərin gözləri haqqında da çox ətraflı məlumatlar əldə edilməsini təmin etmişdir. Bir trilobit gözü yüzlərlə kiçik pətək gözdən ibarətdir və bu pətək gözlərdən hər birinin içində cüt göz bülluru var. Bu göz quruluşu əsl yaradılış möcüzəsidir. Harvard, Roçester və Çikaqo universitetlərindən geologiya professoru Deyvid Roup "450 milyon il əvvəl yaşamış trilobitlərin gözündə ancaq dövrümüzdə yaxşı təhsil almış və təxəyyülü olduqca güclü olan optika mühəndisi tərəfindən təkmilləşdiriləcək qədər mükəmməl dizayn vardır" deyir. (David Raup, "Conflicts Between Darwin and Paleontology", *Bulletin, Field Museum of Natural History*, cild 50, yanvar 1979, səh. 24.)





**Trilobitlərin gözü hər birində cüt göz bülluru olan yüzlərlə kiçik pətək gözdən ibarət olan yaradılış möcüzəsidir.**

Budur, sadəcə trilobitlərin bu qeyri-adi kompleks quruluşu belə darvinizmi tək başına əsassız edir. Çünki daha əvvəlki geoloji dövrlərdə bu canlılara bənzər heç bir kompleks canlı yaşamamışdır və bu da göstərir ki, trilobitlər heç bir təkamül prosesi olmadan üzə çıxmışdırlar. "Elm" (Science) jurnalındakı 2001-ci il tarixli bir məqalədə belə deyilir:

Buğumayaqlı filogeniyalarının kadist təhlilləri (müqayisəli anatomiyaya

əsaslanan üsullarla aparılan təhlillər) trilobitlərin eucrustacea kimi artropod ağacındakı olduqca təkmil "budaqlar" olduğunu göstərir. Bu iddia edilən təkmil buğumayaqlı əcdadların varlığına dair isə heç bir fosil yoxdur... (Trilobitlərin) daha qədim mənşəyi olduğu kəşf edilsə belə, yenə də Kembri dövrünün əvvəlindəki bu qısa zaman kəsiyində nə üçün bu qədər çox heyvanın bədən ölçüsü baxımından böyüdüyünü və qabıq qazandığını açıqlamaq problem olaraq qalacaqdır.

(Richard Fortey, "The Cambrian Explosion Exploded?", *Science*, cild 293, no. 5529, 20 iyul 2001, səh. 438-439.)

Kembri dövründəki bu qeyri-adi vəziyyət Çarlz Darvin "Növlərin mənşəyi"ni qələmə alarkən də az-çox məlum idi. O dövrün fosil qeydlərində də Kembri dövründə canlıların birdən-birə ortaya çıxdığı müşahidə edilmiş, trilobitlərin və digər bəzi onurğasızların ani surətdə üzə çıxdıqları müəyyən edilmişdi. Buna görə Darvin "Növlərin mənşəyi" adlı kitabında bu mövzuya toxunmaq məcburiyyətində qaldı. O dövrlərdə Kembri dövrü Silur dövrü adlandırılırdı. Darvin isə "məlum olan qədim fosil qeydlərində fərqli növlərin ani surətdə üzə çıxmasına dair" başlığı altında bu mövzuya toxunmuş və Silur dövrü haqqında belə yazmışdı:

Beləliklə, əgər mənim nəzəriyyəm doğrudursa, ən qədim silur təbəqəsinin əmələ gəlməsindən əvvəl çox uzun zaman kəsikləri keçməlidir, Silur dövründən bu günə qədər keçmiş zaman qədər uzun zaman kəsikləri. Lakin hələ də məlum olmayan bu zaman kəsikləri ərzində dünya canlı məxluqlarla dolub-daşmış olmalıdır. Bu böyük zaman kəsiklərinə aid fosil qeydlərini nə üçün tapa bilməməyimiz sualına isə verəcək qənaətbəxş cavabım yoxdur. (Charles Darwin, *The Origin of Species*, 1859, səh. 313-314.)


ÇARLZ DARVİN

**DARVİN:**

**"Əgər nəzəriyyəm doğrudursa, trilobitlərdən əvvəlki dövrlər bu canlıların əcdadları ilə dolub daşmalı idi."**

Amma Darvinin xəyal etdiyi bu canlılardan biri belə tapılmamışdır.

Darvin "əgər nəzəriyyəm doğrudursa, dünya Silur (Kembri) dövründən əvvəl yaşayan canlılarla dolub-daşmalıdır" demişdi. Bu canlıların nə üçün heç bir fosili olmaması sualına isə bütün kitabı boyu təkrarladığı "fosillər çox

azdır" bəhanəsilə cavab tapmağa çalışmışdı. Amma bu gün fosil qeydlərinin kifayət qədər olduğu və Kembri dövrü canlılarının əcdadları olmadığı üzə çıxmışdır. Bu isə Darvinin "əgər nəzəriyyəm doğrudursa" deyə başladığı cümləsini əksinə çevirməyimizi tələb edir; Darvinin fərziyyələri əsasını tapmamışdır və ona görə də nəzəriyyəsi doğru deyil.

Kembri dövrünə aid qeydlər həm trilobitlər kimi kompleks canlı orqanizmlərlə, həm də çox fərqli canlı orqanizmlərinin eyni anda ortaya çıxması ilə darvinizmi təkzib edir. Darvin kitabında "əgər eyni sinifə aid çox saydakı növ həqiqətən həyata bir anda və birlikdə başlayıbsa, bu təbii seçmə ilə ortaq əcdaddan təkamül keçirmə nəzəriyyəsinə öldürücü zərbə olar" deyə yazmışdır. (Charles Darwin, *The Origin of Species: A Facsimile of the First Edition*, Harvard University Press, 1964, səh. 302.) Kembri dövründə isə əvvəlcədən də bildirdiyimiz kimi, növlər kimi bənzər kateqoriyalar bir tərəfə, 60-100 müxtəlif fərqli heyvan tipi həyata bir anda və birlikdə başlamışdır. Bu tam mənada Darvinin "öldürücü zərbə" kimi tərif etdiyi mənzərəni sübut edir. Buna görə isveçli paleontoloq Stefan Benqston Kembri dövründən bəhs edərkən "Darvini təəccübləndirən və utandıran bu hadisə bizi də təəccübləndirir" deyir.

(Stefan Bengston, *Nature*, vol. 345, 1990, səh. 765.)

Trilobitlər haqqında digər məsələ də bu canlılardakı 530 milyon illik pətək göz sisteminin bu günə qədər heç dəyişmədən gəlib çatmasıdır. Arı və ya cırcırama kimi dövrümüzdə yaşayan bəzi həşəratlar da eyni göz quruluşuna malikdir. (R. L. Gregory, *Eye and Brain: The Physiology of Seeing*, Oxford University Press, 1995, səh. 31.) Bu tapıntı təkamül nəzəriyyəsinin canlıların ibtidaidən aliyə doğru inkişaf etməsi iddiasına da "öldürücü zərbə" vurur.

## ONURĞALI CANLILARIN TƏKAMÜLÜ İDDİASI

Kembri dövründə ani surətdə üzə çıxan heyvan tiplərindən biri əvvəldə bildirdiyimiz kimi, mərkəzi sinir sisteminə malik olan *chordata* (xordalılar) tipidir. *Chordata* və ya dilimizdəki qarşılığı ilə xordalıların yarımtipi isə onurğalılardır. Balıqlar, amfibiyalar (suda-quruda yaşayanlar), sürünənlər, quşlar və məməlilər kimi əsas siniflərə ayrılan onurğalılar, şübhəsiz, heyvanlar aləminin ən mühüm canlılarını təşkil edirlər.

**Elmə məlum olan ən qədim xordalı canlı - Pikaia fosili və canlının təxmini anatomik strukturu**



Təkamülçü paleontoloqlar hər canlı şöbəsini başqa bir şöbənin təkamül xarakterli davamı kimi görməyə çalışdıqları üçün xordalıların başqa bir onurğasız şöbəsindən təkamül yolu ilə əmələ gəldiyini iddia edirlər. Ancaq bütün şöbələr kimi, *chordata* şöbəsinin üzvlərinin də Kembri dövründə üzə çıxması bu iddianı elə başından əsassız hala salır.

1999-cu ildə 530 milyon illik Kembri balıqları tapılmışdır və bu tapıntı təkamül nəzəriyyəsinin bu mövzudakı bütün iddialarının yanlış olduğunu isbat etmək üçün kifayətdir.

## BALIQLARIN MƏNŞƏYİ

***Fosil qeydləri digər canlı növləri kimi balıqların da yer üzündə anidən və müxtəlif quruluşlarda meydan çıxdıqlarını göstərir. Balıqlar heç bir təkamül prosesi keçirmədən, qüsursuz anatomiyaları ilə bir anda yaradılıblar.***





***Şotlandiyada tapılan və Birkenia adlandırılan balıq fosili. Yaşı 420 milyon il olaraq hesablanan bu canlının ölçüsü təxminən 4 sm-dir.***

***Mezozoy dövrünə aid bir qrup balıq fosili***





***Stethacanthus növünə aid 330 milyon illik köpək balığı fosili***

***Devon dövrünə aid təxminən 360 milyon illik balıq fosili. Osteolepis panderi adlandırılan canlının ölçüsü təxminən 20 sm-dir və dövrümüzdə yaşayan balıqlara cox oxşayır.***

Kembri dövründə müəyyən edilən ən qədim xordalı isə *pikaia* adlandırılan, uzun bədənə malik olan və ilk baxışda soxulcanları xatırladan dəniz canlısıdır. (Douglas Palmer, *The Atlas of the Prehistoric World*, Dicovery Channel, Marshall Publishing, London, 1999, səh. 66.) *Pikaia* əcdadı kimi, irəli sürülən bütün digər

şöbələrdəki növlərlə eyni anda və heç bir ara forma olmadan ortaya çıxmışdır. Təkamülçü bioloq prof. Mustafa Kuru "Onurğalı heyvanlar" adlı kitabında bu ara forma yoxluğunu belə ifadə edir:

*Xordalıların onurğasız heyvanlardan əmələ gəlməsinə şübhə yoxdur. Ancaq onurğasızlarla xordalılar arasındakı keçidi işıqlandıran bir fosilin tapılmaması bu mövzuda bir çox fərziyyənin irəli sürülməsinə səbəb olmuşdur.* (Mustafa Kuru, *Omurgalı Hayvanlar*, Gazi Üniversitesi Yayınları, Ankara, 1996, səh. 21.)

Əgər ortada bir ara keçid forma yoxdursa, necə olur ki, "bu təkamülün baş verdiyinə şübhə yoxdur" deyilə bilir? Bir fərziyyəni onu dəstəkləyən dəlil olmadığı halda, heç şübhə olmadan qəbul etmək elmi deyil, doqmatik davranışdır. Belə ki, cənab prof. Kuru yuxarıdakı ifadəsindən sonra onurğalıların mənşəyi haqqındakı təkamülçü fərziyyələrdən uzun-uzadı bəhs etdikdən sonra ortada bir dəlil olmadığını bir daha qəbul etmək məcburiyyətində qalır:

*Xordalıların mənşəyi və təkamülü məsələsində yuxarıda bildirilən fikirlər hər hansı bir fosil qeydinə əsaslanmadığına görə, həmişə şübhə ilə qarşılanmışdır.* (Mustafa Kuru, *Omurgalı Hayvanlar*, Gazi Üniversitesi Yayınları, Ankara, 1996, səh. 27.)

Təkamülçü bioloqlar bəzən "xordalıların və digər onurğalıların mənşəyilə bağlı fosil tapılmamasının səbəbi onurğasız canlıların yumşaqtoxumalı olmaları və ona görə də fosil izi qoymamalarıdır" kimi açıqlama verirlər. Lakin əslində bu açıqlama doğru deyil, çünki onurğasız canlılara aid də çox sayda fosil qalığı var. Kembri dövrü canlılarının hamısı onurğasızdır və bu növlərə aid on minlərlə fosil nümunəsi tapılmışdır. Məsələn, Kanadadakı Burqes Şeyl yatağında yumşaqtoxumalı bir çox canlılnın fosili var, elm adamları Burqes Şeyl kimi bölgələrdə canlıların oksigen faizi çox aşağı olan palçıq təbəqələri ilə birdən-birə örtüldüklərini və bu sayədə yumşaqtoxumalıların dağılmadan fosilləşdiyini düşünürlər.
(Douglas Palmer, The Atlas of the Prehistoric World, *Dicovery Channel*, Marshall Publishing, London, 1999, səh. 64.)

Təkamül nəzəriyyəsi *pikaia* kimi ilk xordalıların da zaman ərzində balıqlara çevrildiyini güman edir. Ancaq "xordalıların təkamülü" iddiasını dəstəkləyən hər hansı ara forma fosili tapılmadığı kimi, "balıqların təkamülü" iddiasını dəstəkləyən fosil də yoxdur. Əksinə, bütün fərqli balıq kateqoriyaları fosil qeydlərində bir anda və heç bir əcdadları olmadan üzə çıxmışdırlar.

Robert Karol təkamülçülərin qədim dövr onurğalıları arasındakı müxtəlif siniflərin mənşəyi ilə əlaqədar düşdükləri çıxılmaz vəziyyəti belə etiraf edir:

*Hələ də başıxordalılar və kəllələlilər arasındakı keçidlə bağlı heç bir dəlilimiz yoxdur. Onsuz da kəllələlilərin fosillərdə saxlamasını gözlədiyimiz bütün əyani xüsusiyyətləri kifayət qədər məlumatımız olan ən qədim dövrə aid olan onurğalılar sərgiləyir. Çənəli onurğalıların mənşəyini üzə çıxaracaq məlum heç bir fosil yoxdur.*
(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 296.)

Başqa bir təkamülçü paleontoloq Cerald T.Tod "Sümüklü balıqların təkamülü"adlı məqaləsində bu həqiqət qarşısında bu cür çarəsiz sualları sıralayır:



Brazilyadakı Santana fosil yatağında tapılan 110 milyon illik balıq fosilləri

*Sümüklü balıqların hər üç sinfi də fosil təbəqələrində eyni anda və ani surətdə ortaya çıxırlar... Bəs bunların mənşəyi nədir? Bu cür fərqli və kompleks məxluqları ortaya çıxaran nədir? Nə üçün onların əcdadları olan canlıların izlərindən əsər-əlamət yoxdur?* (Gerald T. Todd, "Evolution of the Lung and the Origin of Bony Fishes: A Casual Relationship", *American Zoologist*, cild 26, no. 4, 1980, səh. 757.)

## QURUDA YAŞAYAN CANLILARIN TƏKAMÜLÜ İDDİASI

Dördayaqlılar (tetrapodlar) quruda yaşayan onurğalı canlılara verilən ümumi addır. Bu təsnifata amfibiyalar, sürünənlər və məməlilər daxildir. Təkamül nəzəriyyəsinə əsasən, dördayaqlılar suda yaşayan balıqlardan təkamül yolu ilə törəyiblər. Lakin bu iddia həm fizioloji və anatomik cəhətdən ziddiyyətlidir, həm də fosil qeydləri baxımından əsassızdır.




**Təkamülçü nəşrlərdə yuxarıdakı şəkilə oxşar xəyali rəsimlərlə müdafiə edilən sudan quruya keçid rəvayətləri əslində təkamülçülərin özlərinin də qəbul etmədikləri Lamarkist məntiqə əsaslanır.**

Bir balıq quruda yaşamağa uyğunlaşmaq üçün tənəffüs sistemi, ifrazat mexanizmi, skelet quruluşu kimi fərqli yerlərində çox böyük dəyişikliklər keçirməlidir.

Qəlsəmələr ağciyərə çevrilməli, üzgəclər bədən ağırlığını daşıyacaq şəkildə ayaq xüsusiyyəti qazanmalı, orqanizmin artıqlarını təmizləmək üçün böyrəklər əmələ gəlməli, dəri maye itirməsinin qarşısını alan forma qazanmalıdır. Bütün bu dəyişikliklər baş vermədikcə bir balıq quruya çıxdıqda ən çox bir neçə dəqiqə yaşaya bilər.

Bəs quruda yaşayan canlıların mənşəyi təkamül nəzəriyyəsinə əsasən necə açıqlanır? Təkamülçü ədəbiyyata baxdıqda bu mövzuda bəzi səthi şərhlərin **lamarkist məntiq** daşıdığını görə bilərik. Məsələn, üzgəclərin ayaqlara çevrilməsi haqqında "üzgəclər balıqların quruda sürünməyə çalışması ilə yavaş-yavaş ayaq formasına çevrildi" kimi izahlar verilir. Türkiyənin qabaqcıl təkamülçü elm adamlarından biri olan prof. Əli Dəmirsoy belə yazır: "Bəlkə palçıqlı sularda sürünə-sürünə bu ağciyərli balıqların üzgəcləri bir müddət sonra amfibiya ayağı kimi formalaşmışdır." (Prof. Ali Demirsoy, *Kalıtım ve Evrim*, Ankara: Meteksan Yayınları 1984, səh. 496.)

Bu izahlar əvvəldə də bildirdiyimiz kimi, lamarkist məntiqə əsaslanır. Çünki izahın əsasında "istifadəyə yararlı orqanın təkmilləşməsi" və bunun sonrakı nəsillərə ötürülməsi anlayışları durur. Lamarkın bir əsr əvvəl elmdən kənarlaşdırılmış nəzəriyyəsi göründüyü kimi, hələ də təkamülçü bioloqların şüurunda böyük təsirə malikdir.

Sözügedən lamarkist və dolayısı ilə, elmdənkənar ssenariləri bir kənara qoysaq, təbii seçmə və mutasiyaya əsaslanan ssenariləri təhlil etməliyik. Bu mexanizmləri düşündükdə isə sudan quruya keçid iddiasının tamamilə çıxılmaz vəziyyət olduğunu görürük.

Sudan quruya çıxan bir balığın quruya necə uyğunlaşdığını düşünək: əgər bu balıq tənəffüs sistemi, ifrazat mexanizmi, skelet quruluşu kimi fərqli cəhətlərdən çox sürətlə dəyişiklik keçirməsə, heç şübhəsiz, öləcəkdir. Elə bir mutasiya zənciri olmalıdır ki, bu, balığa dərhal bir ağciyər qazandırmalı, üzgəclərini ayaqlara çevirməli, ona böyrək əlavə etməli, dərisini su saxlayacaq formaya salmalıdır. Bu mutasiya zəncirinin bir heyvanın həyatı ərzində baş verməsi də labüddür.





**Qurbağaların da mənşəyində təkamül yoxdur. Bilinən ən qədim qurbağalar balıqlardan tamamilə fərqli özünəməxsus quruluşları ilə meydana çıxmışdır. Bugünkü qurbağalarla eyni xüsusiyyətlərə sahibdirlər. Dominikan Respublikasında tapılan kəhrəba içindəki qurbağa fosili ilə yaşayan nümunələri arasında heç bir fərq yoxdur.**

Belə bir mutasiya zəncirini heç bir təkamülçü bioloq müdafiə etmir, çünki bu düşüncənin cəfəngliyi və qeyri-mümkünlüyü ortadadır. Bunun əvəzində təkamülçülər "ön adaptasiya" (pre-adaptation) anlayışını işlədirlər. Bunun mənası balıqların quruda yaşamaq üçün lazım olan dəyişiklikləri hələ suda yaşayarkən əldə etmələridir. Yəni bu nəzəriyyəyə əsasən, bir balıq növü hələ suda yaşayarkən və heç ehtiyacı yox ikən quruda yaşamasını təmin edən xüsusiyyətləri qazanmışdır. "Hazır" formaya düşdükcə isə quruya çıxıb burada yaşamağa başlamışdır.

Ancaq belə bir ssenarinin təkamül nəzəriyyəsinin öz fərziyyələri daxilində belə məntiq yoxdur. Çünki dənizdə yaşayan bir canlının quruda yaşamağa uyğun xüsusiyyətlər qazanması onun üçün bir üstünlük olmaz. Ona görə də bu xüsusiyyətlərin təbii seçmə tərəfindən seçilib əmələ gəldiyini irəli sürməyin heç bir məntiqli əsası yoxdur. Əksinə, təbii seçmə "ön adaptasiya" keçirən bir canlını aradan çıxarmalıdır, çünki bu canlı quruda yaşamağa uyğun xüsusiyyətlər qazandıqca dənizdə yaşamaq üçün qeyri-uyğun formaya düşəcəkdir.

Qısa desək, "dənizdən quruya keçid" ssenarisi tamamilə çıxılmaz vəziyyətdədir. "Təbiət" (Nature) jurnalının redaktoru Henri Cinin bu ssenarini qeyri-elmi hekayə hesab etməsinin səbəbi budur:

*Təkamüllə bağlı "itmiş halqalarla" bağlı ənənəvi hekayələr də bir-birilə ziddiyyət təşkil edir, çünki hadisələrin yeganə ehtimal olunan gedişatı var – hekayədə ifadə edilən. Əgər hekayənizdə bir qrup balığın necə quruya doğru imәklədiyi və ayaqlarının necə təkamül keçirdiyindən bəhs edilirsə, bunu ancaq bir dəfə baş verəcək hadisə kimi görməkdə çətinlik çəkirik, çünki hekayənin gedişatı budur. Hekayəyə ya etibar edəcəksiniz, ya da etməyəcəksiniz, başqa alternativ yoxdur.*

(Henry Gee, *In Search Of Deep Time: Going Beyond The Fossil Record To A Revolutionary Understanding of the History Of Life*, The Free Press, A Division of Simon & Schuster Inc., 1999, səh. 7.)

Təkcə təkamülün "mexanizmləri" deyil, fosil qeydləri və yaşayan tetrapodlar üzərində aparılan tədqiqatlar nəticəsində əldə edilən tapıntılar da təkamül nəzəriyyəsinin çıxılmaz vəziyyətdə olduğunu açıq şəkildə göstərir. Robert Karol "nə fosil qeydləri, nə də müasir familiya cinslərindəki irəliləyişlər üzərindəki elmi fəaliyyətlər hələ də tetrapodların bədəninə oynaqlarla bağlanan orqan cütlərinin necə təkamül keçirdiyinə dair tam fikir söyləyə bilmir" deyə etiraf etmək məcburiyyətində qalır.

(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 230.)



**Devon dövrünə aid Kanadada tapılan Eusthenopteron foordi fosili**

Balıqlarla quruda yaşayan canlılar arasındakı keçidi göstərdiyi iddia edilən canlılar isə əslində müxtəlif balıq və suda-quruda yaşayan canlı növləridir, bunların heç birində ara keçid forması xüsusiyyəti yoxdur.

Təkamülçü təbiət tarixçiləri, əsasən, *rhipidistian* və ya *selakant* siniflərinə aid balıqları dördayaqlıların əcdadı hesab edirlər. Bunlar *crossopterygian* dəstəsinə aid balıqlardır və təkamülçüləri ümidləndirən yeganə xüsusiyyətləri üzgəclərinin digər balıqlara nisbətən "ətli" olmasıdır. Lakin bu balıqların heç biri ara keçid forması deyil və suda-quruda yaşayanlarla aralarında anatomik və fizioloji cəhətdən uçurumlar var.

Balıqların suda-quruda yaşayanların təkamül əcdadı hesab edilməməsinin ən mühüm səbəblərindən biri aralarındakı çox böyük anatomik fərqlərdir. Bunun iki nümunəsi tetrapodların mənşəyi ilə bağlı təkamül ssenarilərinin çoxunda istifadə edilən *eusthenopteron* (nəsli kəsilmiş balıq) və *aconthostega*dır. (nəsli kəsilmiş suda-quruda yaşayan). Robert Karol "Onurğalıların təkamül modelləri və prosesləri" (Patterns and processes of vertebrate evolution) adlı kitabında aralarında təkamül xarakterli əlaqə olduğu iddia edilən bu canlılar haqqında belə şərh verir:

*Eusthenopteron və acanthostega* balıq və suda-quruda yaşayanlar arasındakı keçidin son mərhələsi hesab edilə bilər. Bu iki cins arasında müqayisə ediləcək 145 anatomik xüsusiyyətdən 91-i quruda yaşamağa uyğunlaşmağa meyilli dəyişikliklər göstərmişdir... Bu, paleozoik tetrapodların on beş əsas qrupunun mənşəyi ilə bağlı keçidlərin hər hansı birində üzə çıxan dəyişikliklərin sayından daha çoxdur.
(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 301.)

145 anatomik xüsusiyyət üzərində 91 dəyişiklik... Təkamülçülər bütün bunların təqribən 15 milyon illik proses ərzində bir sıra təsadüfi mutasiya nəticəsində əmələ gəldiyinə inanırlar. (Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 304.) Bu cür qeyri-mümkün bir ssenariyə inanmaq təkamül nəzəriyyəsini xilas etmək üçün lazım ola bilər, ancaq bu elmə və məntiqə zidd inancdır. Eyni vəziyyət digər balıq-amfibiya (suda-quruda yaşayan) ssenariləri üçün də keçərlidir. "Təbiət" (Nature) jurnalının redaktoru Henri Ci *ichthyostega* (*acanthostega*ya çox bənzəyən xüsusiyyətləri olan nəsli kəsilmiş suda-quruda yaşayan) üzərində qurulmuş başqa bir ssenari haqqında belə şərh verir:

*İchthyosteganın balıqlar və daha sonrakı dövr tetrapodları arasındakı itmiş halqa olduğuna dair açıqlama daha çox ön mühakimələrimizi ortaya qoyur. Həqiqət bizim təsəvvür etdiyimizdən daha böyük, daha əcaib və daha fərqli olduğu zaman həqiqətin üzərində öz məhdud təcrübəmizi əsas götürərək məhdudlaşdırılmış fikri nə cür qəbul etdirdiyimizi göstərir.* (Henry Gee, *In Search Of Deep Time: Going Beyond The Fossil Record To A Revolutionary Understanding of the History Of Life*, The Free Press, A Division of Simon & Schuster, Inc., 1999, səh. 54.)

Suda-quruda yaşayanların mənşəyi ilə başqa diqqətçəkən digər bir xüsusiyyət isə üç suda-quruda yaşayan kateqoriyanın ani surətdə üzə çıxmasıdır. R.Karol "qurbağalar, əsl ayaqsızlar (*caecilidae*) və salamandrların ən qədim fosillərinin hamısı Erkən Yura dövründən Orta

Yura dövrünə qədər görünür. Hamısı hal-hazırda yaşayan xələflərinin mühüm xüsusiyyətlərindən çoxunu daşıyır" (Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 292-93.) deyir. Başqa sözlə, bu heyvanlar ani surətdə üzə çıxmışlar və o dövrdən bəri heç bir "təkamülə" məruz qalmamışdırlar.

## SELEKANT (COELACANTH) HAQQINDAKI TƏKAMÜLÇÜ FƏRZİYYƏLƏR

*Selakant* sinfinə aid olan balıqlar bir zamanlar balıqlar və suda-quruda yaşayanlar arasında ara keçid forma dəlili hesab edilirdi. Təkamülçü biolqolar bu canlının fosillərinə əsaslanaraq canlının bədənində ibtidai (tam funksiya yerinə yetirməyən) ağciyər olduğunu irəli sürmüşdülər. Bu bir çox elmi mənbədə verilir, hətta *selakantı* dənizdən quruya çıxarkən göstərən rəsmlər də dərc edilmişdi. Bütün bunlar canlının nəsli kəsilmiş növ olması fərziyyəsinə əsaslanırdı.

Ancaq 22 dekabr, 1938-ci ildə Hind okeanında çox maraqlı kəşf edildi. 70 milyon il əvvəl nəsli kəsilmiş ara keçid forması kimi tanıdılan *selakant* ailəsinin *latimeria* növünə aid canlı üzvü açıq okeanda ələ keçdi! *Selakantın* "canlı" nümunəsinin tapılması, şübhəsiz, təkamülçülər üçün böyük şok idi. Təkamülçü paleontoloq J.L.B.Smit "Yolda dinozavrla qarşılaşsaydım, bundan daha az təəccüblənərdim" demişdi. (Jean-Jacques Hublin, *The Hamlyn Encyclopædia of Prehistoric Animals*, New York: The Hamlyn Publishing Group Ltd., 1984, səh. 120.) Sonrakı illərdə başqa ərazilərdə də 200-dən çox *selakant* tutuldu.



**Əllərində selekantın sadəcə fosilləri olduğu halda, təkamülçü paleontoloqlar bu canlı haqqında həddindən artıq darvinist fərziyyələr ortaya atmışdılar. Ancaq həmin balıq canlı halda tutulanda bütün fərziyyələr alt-üst oldu. Yuxarıda selekantın canlı nümunələrini görə bilərsiniz. Sağdakı şəkil 1998-ci ildə İndoneziyada tutulan ən son selekant nümunələrindəndir.**

Bu balıqların tutulmasıyla bu canlılar haqqındakı fərziyyələrin əsassızlığı da başa düşüldü. *Selakant* iddiaların əksinə, nə ibtidai ağciyərə, nə də böyük beyinə malik idi. Təkamülçü tədqiqatçıların ibtidai ağciyər olduğunu düşündükləri forma balığın orqanizmindəki yağ kisəsindən başqa bir şey deyildi. (www.ksu.edu/fishecology/relict.htm) Habelə "sudan çıxmağa hazırlaşan sürünən namizəd" kimi tanıdılan *selakantın* əslində okeanın ən dərin sularında yaşayan və 180 m dərinlikdən yuxarı qalxmayan balıq olduğu başa düşüldü.

(*Bilim ve Teknik* Dergisi, noyabr 1998, 372-ci say, səh. 21; http://www.cnn.com/TECH/ Science /9809/23/living.fossil/index.html)

Bundan əlavə, *selakant*ın təkamülçü KİV-lərdəki ad-sanı da aradan qalxdı. Piter Forey adlı təkamülçü paleontoloq "Təbiət" (Nature) jurnalında dərc edilən bir məqalədə bu barədə belə deyir:

*Selakantların tetrapodların əcdadına yaxın olduğuna dair fikir uzun müddət boyu qəbul edildiyi üçün latimerianın (canlı növünün) tapılması ilə balıqlardan suda-quruda yaşayanlara keçid haqqında birbaşa məlumatların əldə ediləcəyi ümid edilmişdi... Amma Latimerianın anatomiyası və fiziologiyası üzərində aparılan təhlillər fərz edilən bu əlaqənin sadəcə bir istəkdən ibarət olduğunu və selakantın "itmiş halqa" kimi göstərilməsinin heç bir əsasının olmadığını üzə çıxardı.* (P. L. Forey, *Nature*, vol 336, 1988. səh. 729.)

Beləliklə, balıqlar və suda-quruda yaşayanlar arasındakı yeganə ara forma iddiası da əsassız oldu.

## SUDAN QURUYA KEÇİD İDDİASININ FİZİOLOJİ ƏNGƏLLƏRİ

Balıqların quruda yaşayan canlıların əcdadı olması iddiasının fosil tapıntıları qədər anatomik və fizioloji təhlillər tərəfindən də əsassız olduğu sübut edilmişdir. Dəniz canlıları ilə quru canlıları arasındakı böyük anatomik və fizioloji fərqləri təhlil etdikdə bu fərqlərin təsadüflərə əsaslanan mərhələli təkamül prosesi tərəfindən aradan qaldırılmasının mümkün olmadığını görərik. Sözügedən fərqlərin ən çox nəzərəçarpanlarını belə sadalamaq olar:

**1. Ağırlığın daşınması:** Dənizlərdə yaşayan canlılar öz ağırlıqlarını daşımaq kimi problemlə qarşılaşmırlar. Bədən quruluşları da bu cür funksiyaya uyğun deyil. Lakin quruda yaşayanların böyük əksəriyyəti enerjilərinin 40%-ni bədənlərini daşımaq üçün istifadə edirlər. Quru həyatına keçdiyi iddia edilən bir su canlısının bu enerji ehtiyacını təmin etmək üçün yeni əzələ və skelet quruluşuna ehtiyac hiss etməsi labüddür, lakin bu kompleks formaların təsadüfi mutasiyalarla əmələ gəlməsi qeyri-mümkündür.

Təkamülçülərin selakant və buna bənzər balıqları "quruda yaşayan canlıların əcdadı" kimi təsəvvür etmələrinin əsl səbəbi isə bu balıqların üzgəclərinin sümüklü olmasıdır. Bu sümüklərin zaman ərzində ağırlıq daşıyan ayaqlara çevrildiyini güman edirlər. Ancaq bu balıqların sümükləri ilə quru canlılarının ayaqları arasında çox mühüm fərq var: balıqlardakı sümüklər canlının onurğasına bağlı deyil. Onurğaya bağlı olmadığı üçün də ağırlıq daşıma kimi funksiya yerinə yetirə bilməzlər. Quruda yaşayan

canlılarda isə sümüklər birbaşa onurğaya birləşmişdir. Ona görə bu üzgəclərin yavaş-yavaş ayaqlara çevrilməsi iddiası da əsassızdır.




**ÜZGƏC İLƏ AYAQ ARASINDAKI FƏRQ**

**Təkamülçülərin selekant və ona oxşar balıqları quruda yaşayan calıların əcdadı olaraq təqdim etmələrinin əsl səbəbi bu balıqların üzgəclərinin sümüklü olmasıdır. Bu sümüklərin uzun zaman ərzində ayaqlara çevrildiyini fərz edirdilər. Ancaq bu balıqların sümükləri ilə ixtiosteqa kimi quruda yaşayan canlıların ayaqları arasında əsas bir fərq var: Selekantda sümüklər 1-ci şəkildəki kimi onurğaya bitişik deyil. Ancaq ixtiosteqada sümüklər 2-ci şəkildəki kimi birbaşa onurğaya bitişikdir. Bir sözlə, bu üzgəclərin yavaş-yavaş ayaqlara çevrilməsi iddiası tamamilə əsassızdır.**

**Selekantın üzgəclərindəki sümüklərin quruluşu ilə ixtiosteqanın ayaqlarındakı sümüklərin quruluşu 3-cü və 4-cü şəkildə göründüyü kimi cox fərqlidir.**

**2. Temperaturun qorunması:** Quruda temperatur çox tez və böyük fərqlərlə dəyişir. Bir quru canlısının orqanizmindəki maddələr mübadiləsi bu yüksək temperatur fərqlərinə uyğunlaşır. Lakin dənizlərdə temperatur çox yavaş dəyişir və bu dəyişiklik qurudakı qədər böyük fərq əmələ gətirmir. Dənizlərdəki sabit temperatura uyğun orqanizmə malik olan bir canlı quruda yaşaya bilmək üçün qurudakı temperatur dəyişikliyinə uyğunlaşacaq tərzdə qorunma sistemi qazanmalıdır. Şübhəsiz, balıqların quruya çıxar-çıxmaz təsadüfi mutasiyalar nəticəsində bu cür sistemə malik olduqlarını irəli sürmək cəfəngiyyatdır.

**3. Sudan istifadə:** Canlılar üçün həyati əhəmiyyəti olan su quruda az tapılır. Bu səbəbdən, suyun, hətta nəmin ölçülü istifadə edilməsi vacibdir. Məsələn, dəri su itirməyin və ya buxarlanmanın qarşısını alacaq formada olmalıdır. Canlı susama hissinə malik olmalıdır. Lakin əslində suda yaşayan canlıların susama hissi yoxdur və dəriləri də susuz mühitə uyğun deyil.

**4. Böyrəklər:** Su canlıları başda ammonyak olmaq üzrə orqanizmlərində toplanan artıq maddələri olduqları mühitdə su bol olduqda dərhal süzərək atırlar. Şirin su hövzələrində yaşayan balıqda tərkibində azot olan artıq maddələrin çoxu (yüksək miqdarda ammonyak (NH3)) qəlsəmələrdən yayılma yolu ilə xaric olur. Böyrəklər ifrazat sisteminin bir hissəsi olmaqdan çox heyvanın su tarazlığını qorumağa yarayır. Dəniz balıqlarının iki növü var. Köpək balıqları, skat və pişik balıqları qanlarında çox yüksək səviyyədə sidik saxlaya bilirlər. Köpək balıqlarının qanı digər onurğalılardakı 0.01-0.03% olan nisbətə qarşılıq 2.5% sidik saxlayır. Başqa növ, məsələn, sümüklü balıqlar daha fərqlidir. Daim su itirirlər, ancaq dəniz suyunu içdikdən sonra duzdan təmizləyərək itirdikləri suyu bərpa edirlər. Orqanizmlərindəki ifrazat maddələrini xaric etmək üçün quruda yaşayan onurğalılarda olandan fərqli sistemlərə malikdirlər. Bu səbəbdən sudan quruya keçidin baş verməsi üçün böyrəyi olmayan canlılar dərhal bir anda böyrək sisteminə malik olmalıdırlar.




**Böyrək baryeri: Balıqlar bədənlərindəki zərərli maddələri birbaşa suya atırlar. Quruda yaşayan canlıların isə böyrəyə ehtiyacları var. Bir sözlə, "sudan quruya keçid" üçün böyrəklərin də təsadüfən əmələ gəlməsi lazımdır.**

**Ancaq böyrəklər son dərəcə mürəkkəb quruluşa sahibdir. Böyrəyin öz funksiyasını icra etməsi üçün qüsursuz olması lazımdır. Məsələn, böyrəyin 50 %-i və ya 70%-i , hətta 90% -nin "əmələ gəldiyini" düşünsək belə, bu halda böyrəyin heç bir funksiyasının olmayacağı aydın elmi həqiqətdir. Təkamül nəzəriyyəsi "işləməyən orqan atılmalıdır" fərziyyəsinə əsaslandığına görə, 50%-i sağlam olan böyrək elə təkamül prosesinin başlağıcında ikən orqanizmdən atılmalı idi.**

**5. Tənəffüs sistemi:** Balıqlar suda həll olmuş oksigeni qəlsəmələriylə qəbul edirlər. Sudan kənarda isə bir neçə dəqiqədən artıq yaşaya bilmirlər. Quruda yaşamaq üçün bir anda qüsursuz ağciyər sisteminə malik olmalıdırlar. Bütün bu fizioloji dəyişikliklərin eyni canlıda təsadüflər nəticəsində və eyni anda meydana gəlməsi isə, əlbəttə, qeyri-mümkündür.

# SÜRÜNƏNLƏRİN MƏNŞƏYİ

Dinozavr, kərtənkələ, tısbağa və ya timsah... Bütün bu canlılar "sürünənlər" adlanan ailəyə daxildir. Dinozavrlar kimi bəzi sürünənlərin nəsli kəsilmişdir, amma bəziləri hələ də yaşayırlar. Sürünənlərin özünəməxsus xüsusiyyətləri var. Hamısının bədəni "pulcuq" adlanan bərk qabıqlarla örtülüdür.

Soyuqqanlıdırlar, yəni öz bədən temperaturlarını özləri əmələ gətirmirlər. Buna görə də hər gün günəşə çıxıb bədənlərini isitmə ehtiyacı hiss edirlər.

Balalarını isə yumurtlayaraq dünyaya gətirirlər.



## METAMORFOZ

**Qurbağalar əvvəl suyun içində doğulurlar, bir müddət suda yaşayıb sonra "metamorfoz" adlanan dəyişmə ilə quruya çıxırlar. Bəzi insanlar isə metamorfozu təkamülün sübutu və təkamülə nümunə hesab edirlər. Ancaq həqiqətdə metamorfozun təkamüllə heç bir əlaqəsi yoxdur.**

**Təkamül nəzəriyəsinin ortaya atdığı tək inkişaf mexanizmi mutasiyalardır.**

**Metamorfoz isə mutasiya kimi təsadüfi təsirlərlə baş vermir. Əksinə, bu dəyişmə qurbağaların genlərində başlanğıcdan bəri mövcuddur. Yəni qurbağa doğulduğu anda onun sonra dəyişib quruda yaşamağa uyğun bədənə sahib olduğu məlumdur. Son illərdə aparılan tədqiqatlar metamorfoz mərhələsinin fərqli genlər tərəfindən idarə olunan murəkkəb bir əməliyyat olduğunu göstərir. Məsələn, bu dəyişmə zamanı quyruğun yoxa çıxması "Science news" jurnalındakı ifadə ilə deyilsə, bir neçə gen tərəfindən idarə olunur.**

**(Science news , 17 iyun, 1999, səh. 43)**

**Təkamülçülərin "sudan quruya keçmə" iddiası isə tamamilə suda yaşamaq üçün yaradılmış genetik məlumata sahib olan balıqların təsadüfi mutasiyalar nəticəsində təsadüfən quruda yaşayan canlılara çevrildiyi şəklindədir. Buna görə də metamorfoz həqiqətdə təkamülü müdafiə edən deyil, alt-üst edən bir sübutdur. Çünki metamorfoz mərhələsində ən kiçik xəta olsa, canlı ölər və ya şikəst qalar. Metamorfozun qüsursuz olaraq qurtarması şərtdir. Bu cür mürəkkəb və xətaya imkan verməyən bir mərhələnin təkamülün iddia etdiyi kimi, təsadüfi mutasiyalarla meydana gəlməsi mümkün deyil.**

Bu canlıların mənşəyini nəzərdən keçirdikdə təkamül nəzəriyyəsinin yenə çıxılmaz vəziyyətdə olduğunu görmək olar. Darvinistlər sürünənlərin suda-quruda yaşayanlardan təkamül yolu ilə törədiklərini iddia edirlər. Amma bu iddianı dəstəkləyən heç bir konkret dəlil yoxdur. Əksinə, suda-quruda yaşayanlar ilə sürünənlər arasında aparılan təhlil bu iki canlı qrupu arasında çox böyük fizioloji fərqlər olduğunu və "yarısürünən-yarısuda-quruda yaşayan" canlının yaşamasının qeyri-mümkün olduğunu göstərir.

Bunun bir nümunəsi iki fərqli canlı qrupunun **yumurta formalarıdır**. Amfibiyalar (suda-quruda yaşayanlar) suda yumurtlayırlar. Yumurtalar suyun içində inkişaf etmək üçün uyğun formadadırlar, olduqca keçirici və şəffaf pərdə və jeleyə bənzər qatılığa malikdirlər. Lakin sürünənlər quruda yumurtlayırlar və ona görə də yumurtaları da qurudakı quru iqlimə uyğun şəkildə yaradılmışdır. "Amniotik yumurta" adlandırılan sürünən yumurtasının bərk qabığı havanı keçirir, amma suyu keçirmir. Bunun sayəsində balanın ehtiyacı olan maye o yumurtadan çıxana qədər saxlanılır.

**YUMURTALARIN FƏRQİ**

**Suda-quruda yaşayan sürünənlərin təkamülü fərziyyəsinin ziddiyyətlərindən biri də yumurtaların quruluşudur. Suda inkişaf edən amfibiya yumurtaları şirəli quruluşa və şəffaf pərdəyə sahibdir. Ancaq sürünən yumurtaları sağdakı dinozavr yumurtasının rekonstruktiv nümunəsində görüldüyü kimi, quru şəraitinə uyğun olaraq sərt və su keçirməyən quruluşdadır. Amfibiyaların sürünənə çevrilməsi üçün yumurtalarının təsadüfi şəkildə qüsursuz sürünən yumurtasına çevrilməsi lazımdır. Ancaq belə bir çevrilmə prosesindəki ən kiçik xəta canlının nəslinin kəsilməsinə səbəb olar.**





Suda-quruda yaşayanlar əgər quruda yumurtlasalar, qısa zamanda yumurtaları quruyar və içindəki embrionlar da ölər. Bu vəziyyət sürünənlərin mərhələli şəkildə suda-quruda yaşayanlardan təkamül yolu ilə törədiklərini irəli sürən təkamül nəzəriyyəsi baxımından açıqlana bilməyən problemdir. Çünki quruda yaşamağa başlayarsa, amfibiya yumurtası bir nəsil daxilində amniotik yumurtaya çevrilməlidir. Bunun təkamül mexanizmləri kimi irəli sürülən təbii seçmə-mutasiya tərəfindən necə əmələ gətirilməsi açıqlana bilmir. Bioloq Maykl Denton bu barədə təkamülçülərin düşdükləri çıxılmaz vəziyyəti belə izah edir:



MAYKL DENTON

*Bütün təkamül dərslikləri sürünənlərin suda-quruda yaşayanlardan təkamül yolu ilə törədiklərini irəli sürürlər, ancaq heç biri sürünənlərin əsas ayırdedici adaptasiyası olan amniotik yumurtanın bir-biri ardınca meydana gələn kiçik dəyişikliklər nəticəsində necə mərhələli şəkildə əmələ gəldiyini açıqlaya bilmir.*

*Sürünənlərin amniotik yumurtası suda-quruda yaşayanlarınkından daha böyük, daha kompleks və tamamilə fərqlidir. Bütün heyvanlar aləmində bir-birindən bu qədər fərqli iki yumurta yoxdur... Amniotik yumurtanın və amfibiya-sürünən keçidinin mənşəyi təkamül sxemlərində heç vaxt göstərilə bilməyən əsas onurğalı bölmələrindən biridir. Məsələn, bir suda-quruda yaşayanın ürək və aorta damar kanallarının necə mərhələli şəkildə sürünən və məməli şərtlərinə çevrildiyini planlaşdırmaq mütləq qorxunc problemlər ortaya çıxaracaqdır...* (Michael Denton, *Evolution: A Theory In Crisis*, Adler and Adler, 1986, səh. 218-219.)

Digər tərəfdən fosil qeydəri də sürünənlərin mənşəyinin təkamül yolu ilə açıqlanmasını əsassız edir.

Robert L.Karol "ən qədim sürünənlərin bütün suda-quruda yaşayanlardan çox fərqli olduqlarını və əcdadlarının hələ də tapılmadığını" qəbul etmək məcburiyyətində qalmışdır. Klassik əsəri olan "Onurğalıların paleontologiyası və təkamül" (Vertebrate paleontology and evolution) adlı kitabında "qədim dövr amniodları Paleozoy dövrünun bütün suda-quruda yaşayan canlılarından olduqca fərqlidir və əcdadları məlum deyil" (Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 198.) yazır. 1997-ci ildə nəşr olunan "Onurğalıların təkamül modelləri və prosesləri" (Patterns and processes of vertebrate evolution) adlı sonrakı kitabında isə "müasir suda-quruda yaşayan canlı növlərinin mənşəyi və qədim dövr tetrapodları arasındakı keçid və digər bir çox əsas qrupun mənşəyi haqqında hələ də çox az məlumat var" deyə etiraf edir.

(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 296-97.)

Eyni həqiqət Stefen Cey Quld tərəfindən də qəbul edilir və Quld **"heç bir suda-quruda yaşayan fosili əsla quruda yaşayan onurğalıların (sürünən, quş və ya məməlilərin) əcdadına bənzəmir"** deyir.

(Stephen Jay Gould, Eight (or Fewer) Little Piggies, *Natural History*, no. 1., Jan 1991, vol. 100, səh. 25.)

İndiyə qədər "sürünənlərin əcdadı" kimi göstərilməyə çalışılan ən mühüm canlı isə *seymouria* adlı suda-quruda yaşayan canlı növü olmuşdur. Lakin əslində *seymouria*nın ara keçid forma olmadığı *seymouria*nın yer üzündə ilk dəfə ortaya çıxmasından 30 milyon il əvvəl də sürünənlərin yaşadığının məlum olması ilə aşkar olmuşdur. Ən qədim *seymouria* fosilləri Erkən perm təbəqəsinə, yəni bundan 280 milyon il əvvələ aiddir. Lakin məlum olan ən qədim sürünən növləri olan *hylonomus* və *paleouthyris* Erkən

pensilvan təbəqələrində tapılmışdır ki, bu təbəqələr 330-315 milyon il əvvələ aiddir. (Stephen Jay Gould, Eight (or Fewer) Little Piggies, *Natural History*, no. 1., Jan 1991, vol. 100, səh. 25.) "Sürünənlərin əcdadı"nın sürünənlərdən çox sonralar yaşaması, əlbəttə, qeyri-mümkündür.



**Seymuriya xətası:** **Təkamülçülər bir vaxtlar solda fosilinin şəkli olan seymuriya adlı canlının suda-quruda yaşayan ilə sürünənlər arasındakı keçid forma olduğunu iddia etmişdirlər. Bu ssenariyə görə seymuriya "sürünənlərin ibtidai atası" idi. Ancaq sonralar tapılan fosil tapıntıları seymuriyanın yerüzündə ilk dəfə ortaya çıxmasından 30 milyon il əvvəl də sürünənlərin yaşadığını göstərdi. Bu vəziyyət qarşısında təkamülçülər seymuriya haqqındakı şərhlərini dayandırmağa məcbur oldular.**

Qısa desək, elmi tapıntılar sürünənlərin yer üzündə təkamül nəzəriyyəsinin irəli sürdüyü kimi mərhələli inkişafla deyil, heç bir əcdadı olmadan bir anda üzə çıxdıqlarını göstərir.

## İLANLAR VƏ TISBAĞALAR

Digər tərəfdən ilan, timsah, dinozavr və ya kərtənkələ kimi çox fərqli sürünən sinifləri arasında da keçilməz sərhədlər var. Bu fərqli siniflərin hər biri fosil qeydlərində bir-birlərindən çox fərqli quruluşlarıyla birdən-birə üzə çıxırlar. Təkamülçülər bu fərqli qruplar arasında quruluşlarına baxaraq təkamül prosesinin baş verdiyini fərz edirlər. Amma bu fərziyyələr fosil qeydləri ilə **dəstəklənmir. Məsələn, çox yayılmış təkamülçü bir fərziyyəyə əsasən, ilanlar** kərtənkələlərin mərhələli şəkildə ayaqlarını itirərək təkamül yolu ilə əmələ gəlmişdir. Ancaq ayaqlarını mutasiya nəticəsində itirməyə başlayan bir kərtənkələnin daha "üstün quruluşa" necə malik olması və təbii seçmə tərəfindən "seçilməsi" sualı cavabsızdır.



**Təxminən 50 milyon illik Piton ilanı fosili. Növün İsmi; Palaeopython**

Fosil qeydlərindəki ən qədim ilanlara gəlincə, onlar da heç bir "ara keçid forma" xüsusiyyəti daşımayan və dövrümüzdəki ilanlardan fərqi olmayan canlılardır. Məlum olan ən qədim ilan fosili Cənubi Amerikada Üst təbaşir

dövrünə aid qayalıqlarda tapılmış *dinilysia*dır. Robert Karol bu canlının "həddindən artıq təkmilləşmiş təkamül səviyyəsində olduğunu", yəni ilanların xarakterik xüsusiyyətlərinə malik olduğunu qəbul edir.

(Robert Carroll, *Vertebrate Paleontology and Evolution*, səh. 235.)

Digər sürünən sinfi olan **tısbağalar** da fosil qeydlərində özünəməxsus qabıqları ilə bir anda üzə çıxır. Bir təkamülçü mənbədə tısbağaların mənşəyi haqqında bu ifadələr işlədilir:

*Təəssüf ki, tısbağaların digər onurğalılara nisbətən daha çox və yaxşı qorunmuş fosilləri qaldığına baxmayaraq, bu cinsin mənşəyi erkən dövr fosillərinin çatışmazlığına görə məlum deyil. Trias dövrünün (təqribən 200 milyon il əvvəl) ortalarına doğru tısbağalar saysız-hesabsız olmuşdur və əsas tısbağa xüsusiyyətlərinə malik idi... Tısbağalar ilə qurbağaların təkamül yolu ilə törədikləri ibtidai sürünənlər olan kotilozavrlar arasındakı keçid tamamilə boşdur.* (*Encyclopaedia Britannica Online*, "Turtle – Origin and Evolution.")

Robert Karol da tısbağaların mənşəyini "hələ çox az məlum olan mühüm keçidlər" arasına qatmağa məcbur olmuşdur.

(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 296-97.)





**Üst tərəfdə Almaniyada tapılan 45 milyon illik şirin su tısbağası fosili.**

**Solda isə elmə məlum olan ən qədim dəniz tısbağası qalığı: Braziliyada tapılan 110 milyon illik fosil bu gün yaşayan nümunələrindən fərqlənmir.**

Bütün bu sözügedən canlı sinifləri yer üzündə bir anda və ayrı-ayrı ortaya çıxmışlar. Bu vəziyyət onların yaradıldıqlarının elmi sübutudur.

# UÇAN SÜRÜNƏNLƏR

Pterodactylus khoci növünə aid uçan sürünən fosili. Bavyera bölgəsində tapılan nümunənin 240 milyon yaşındadır.

Sürünənlər sinfi daxilindəki maraqlı bir canlı qrupu uçan sürünənlərdir. Bunlar təqribən 200 milyon il əvvəl Üst trias dövründə ilk dəfə üzə çıxmış və daha sonra nəsli kəsilmiş canlı qrupudur. Bu canlılar sürünəndirlər, çünki sürünən sinfinin əsas xüsusiyyətlərini daşıyırlar: soyuqqanlı canlılardır (öz temperaturlarını özləri əmələ gətirmirlər) və bədənləri pulcuqlarla örtülüdür. Ancaq güclü qanadlara malikdirlər və bu qanadlar sayəsində uçduqları düşünülür.

Uçan sürünənlər bəzi məşhur təkamülçü KİV-lərdə darvinizmi dəstəkləyən paleontoloji tapıntı kimi göstərilir və ya insanlarda belə bir təsəvvür canlandırılır.



**Pterodactylus khoci növünə aid uçan sürünən fosili. Bavyera bölgəsində tapılan nümunə 240 milyon yaşındadır.**

Lakin əksinə, uçan sürünənlərin mənşəyi təkamül nəzəriyyəsi üçün ciddi problemdir. Bunun ən açıq göstəricisi də uçan sürünənlərin quruda yaşayan sürünənlərlə aralarında heç bir ara keçid forma olmadan bir anda və tam şəkildə ortaya çıxmalarıdır. Uçan sürünənlər qüsursuz şəkildə yaradılmış qanadlara malikdir və bu orqanlar heç bir quruda yaşayan sürünəndə yoxdur. "Yarımqanadlı" hər hansı bir canlıya isə fosil qeydlərində rast gəlinmir.

Belə ki, "yarımqanadlı" canlıların yaşaması da mümkün deyil. Çünki bu cür xəyali canlılar əgər yaşasaydılar, qabaq ayaqlarını itirdikləri, amma hələ uçacaq vəziyyətdə olmadıqları üçün digər sürünənlərə nisbətən əlverişsiz hala düşəcəkdilər. Belə olduqda isə təkamülün özünün qəbul etdiyi kimi, aradan çıxaraq nəsli kəsiləcəkdi.

Belə ki, uçan sürünənlərin qanadlarının quruluşu nəzərdən keçirildikdə onların əsla təkamüllə açıqlana bilməyəcək qədər qüsursuz yaradılışa malik olduğu görünür. Uçan sürünənlərin qanadları üzərində digər sürünənlərin qabaq ayaqları kimi beş dənə barmaqları var. Ancaq dördüncü barmaq digər barmaqlardan təxminən 20 dəfə uzundur və qanad da bu barmağın altında uzanır. Əgər uçan sürünənlər quruda yaşayan sürünənlərdən təkamül yolu ilə törəyiblərsə, onda sözügedən **dördüncü barmaq** da yavaş-yavaş, mərhələli şəkildə uzanmalıdır. Təkcə dördüncü barmaq deyil, bütün qanad quruluşu təsadüfi mutasiyalarla təkmilləşməli və bütün bu proses canlıya üstün xüsusiyyət qazandırmalıdır. Təkamül nəzəriyyəsinin paleontoloji səviyyədə qabaqcıl tənqidçilərindən biri olan Dueyn T.Ciş bu barədə belə deyir:

*Bir quruda yaşayan sürünənin mərhələli şəkildə uçan sürünənə çevrilməsi fərziyyəsi tamamilə əsassızdır. Belə bir çevrilmə əsnasında ortaya çıxacaq yarım, natamam quruluş canlıya üstünlük qazandırmaq yerinə onu tamamilə şikəst edəcəkdir. Məsələn, təkamülçülər bəzi mutasiyaların təkcə dördüncü barmağa təsir etdiyini və onu zamanla yavaş-yavaş uzatdığını fərz edirlər. Əlbəttə, digər bəzi təsadüfi mutasiyalar da nə qədər inanılmaz görünsə belə, bu istiqamətdə müştərək iş görərək qanad pərdəsinin, uçuş əzələlərinin, vətərlərin, sinirlərin, qan damarlarının və qanad üçün lazımlı digər formaların mərhələli şəkildə təkamüllə əmələ gəlməsini təmin etməlidirlər. Müəyyən bir mərhələdə təkmilləşməkdə olan bu uçan sürünən 25% qanad toxumasına malik olar. Ancaq bu qəribə məxluq heç cür yaşaya bilməz. 25% qanad toxuması ona nə üstünlük gətirə bilər? Aydındır ki, bu canlı uça bilməz və artıq əvvəlki kimi qaça da bilməz.*

(Duane T. Gish, *Evolution: The Fossils Still Say No*, ICR, San Diego, 1998, səh. 103.)

Qısası, uçan sürünənlərin mənşəyinin darvinist təkamül mexanizmləri ilə açıqlanması qeyri-mümkündür. Belə ki, fosil qeydləri də belə bir təkamül prosesinin baş vermədiyini ortaya qoyur. Fosil təbəqələrində ancaq bu gün tanıdığımız kimi, quruda yaşayan sürünənlər və qüsursuz şəkildə uçan sürünənlər var. Heç bir ara forma yoxdur. R.Karol təkamülçü olmasına baxmayaraq, bu məsələ ilə bağlı belə etiraf edir:



**Ən qədim uçan sürünən növlərindən biri olan Eudimorphodon-un fosili. Şimali İtaliyada tapılan bü nümunə təxminən 220 milyon il yaşındadır.**

*Trias dövründə üzə çıxan bütün uçan sürünənlər (pterozavrlər) uçuş üçün çox xüsusiləşmiş quruluşa malikdirlər... Əcdadlarının nə olduğu məsələsində və uçuşlarının mənşəyinin ilk mərhələləri haqqında isə heç bir tapıntı yoxdur.*

(Robert L. Carroll, *Vertebrate Paleontology and Evolution*, səh. 336.)



**Uçan sürünənlərin qanadları digər barmaqlarından təxminən 20 dəfə uzun olan "dördüncü barmaq" boyunca uzanır. Mühüm olan məsələ bu maraqlı qanad quruluşunun fosil qeydlərindəki bir anda və qüsursuz şəkildə meydana gəlməsi gerçəyidir. "Dördüncü barmağ"ın mərhələli şəkildə, yəni təkamüllə uzandığını göstərən keçid fosil nümunəsi isə yoxdur.**

Karol daha sonra "Onurğalıların təkamül modelləri və prosesləri" (Patterns and processes of vertebrate evolution) adlı əsərində pterozavrları haqqında çox məlumat olmayan mühüm ara keçid növləri arasında sayır.

(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 296-97.)

Göründüyü kimi, uçan sürünənlərin təkamülə dəlil olan heç bir yönü yoxdur. Ancaq sürünən termini çox insan üçün sadəcə quruda yaşayan canlıları ifadə etdiyi üçün məşhur təkamülçü KİV-lər "uçan sürünən" anlayışı ilə "sürünənlərin qanadlanıb uçması" təsəvvürünü verməyə çalışırlar. Lakin əslində quruda yaşayan sürünənlər ilə uçan sürünənlər aralarında heç bir təkamül xarakterli əlaqə olmadan yaranmışlar.

## DƏNİZ SÜRÜNƏNLƏRİ

Sürünənlər sinfinin digər maraqlı kateqoriyası isə dəniz sürünənləridir. Bu canlıların böyük hissəsinin nəsli kəsilmişdir, dəniz tısbağaları isə bu qrupun hələ də yaşayan cinsidir. Dəniz sürünənlərinin mənşəyi eynilə uçan sürünənlər kimi, təkamülçü yanaşma ilə açıqlana bilmir. Məlum olan ən əsas dəniz sürünəni *ichthyosaur* adlı canlıdır. Edvin H.Kolbert və Maykl Morales "Onurğalıların təkamülü" (Evolution of the vertebrates) adlı kitablarında bu canlıların mənşəyinin təkamül baxımından izah edilə bilməməsini belə qəbul edirlər:

*Dəniz məməlilərinin bir çox cəhətdən ən xüsusiləşmiş növü olan ichthyozavr* Erkən trias dövründə ortaya çıxmışdır. Sürünənlərin geologiya tarixinə daxil olması son dərəcə ani və dramatik şəkildə baş vermişdir. Trias dövründən əvvəlki dövrlərə aid fosil yataqlarında *ichthyozavr*ların əcdadlarına aid heç bir iz yoxdur... *İchthyozavr* əlaqələri haqqında ən əsas problem bu sürünənləri məlum olan başqa hər hansı bir sürünən dəstəsinə daxil etmək üçün heç bir dəlilin tapılmamasıdır.

(E. H. Colbert, M. Morales, *Evolution of the Vertebrates*, New York, John Wiley and Sons, 1991, səh. 193.)



**Stenopterygius növünə ait bir Ichthyosaur fosili; təxminən 250 milyon illik.**



Təxminən 200 milyon illik ixtozaur fosili.

Başqa bir onurğalı tarixi mütəxəssisi Alfred S.Romer isə belə yazır:

(*İchthyozavr* haqqında) heç bir ibtidai forma məlum deyil. *İchtyhozavr*ın özünəməxsus xüsusiyyətləri təkmilləşmək üçün çox uzun zaman tələb edir və ona görə də bu canlıların mənşəyi çox qədim olmalıdır. Amma bu canlıların əcdadı kimi qəbul ediləcək heç bir Perm dövrü sürünəni məlum deyil.

(A. S Romer, *Vertebrate Paleontology*, 3rd ed., Chicago, Chicago University Press, 1966, səh.120.)

Karol *ichthyozavr*lar və *nothozavr*ların (başqa dəniz sürünəni ailəsi) mənşəyinin təkamülçülər üçün "haqqında çox şey məlum olmayan" bir çox canlıdan biri olduğunu etiraf etmək məcburiyyətində qalmışdır.

(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 296-97.)

Beləliklə, sürünənlər sinfi daxilində yer alan müxtəlif canlılar aralarında təkamül xarakterli əlaqə olmadan yer üzündə ortaya çıxmışdır. Eyni vəziyyət sonrakı səhifələrdə görəcəyimiz kimi, məməlilər üçün də keçərlidir. Uçan məməlilər var (yarasa) və dəniz məməliləri vardır (delfinlər və balinalar). Bu fərqli siniflər isə təkamülə dəlil deyil, əksinə, təkamül üçün açıqlana bilməyən böyük problemdir. Çünki bütün fərqli siniflər aralarında heç bir keçid forma olmadan və tamamilə fərqli quruluşlarıyla yer üzündə ani surətdə üzə çıxmışlar.

Bu isə bütün bu canlıların yaradıldıqlarının çox açıq elmi sübutudur.

## GERÇƏK TƏBİƏT TARİXİ -II-
## (QUŞLAR VƏ MƏMƏLİLƏR)

Yer üzündə minlərlə növdə quş yaşayır. Bu quşların hər biri fərqli xüsusiyyətlərə malikdir. Şahinin iti baxışları, enli qanadları və sivri caynaqları var. Kalibr quşu uzun dimdiyi ilə bitkilərin kökünü yeyir. Bəziləri hər il minlərlə kilometr yol qət edərək dünyanın bir ucundan digər ucuna köç edirlər. Bütün bu quşları digər heyvanlardan ayıran çox mühüm xüsusiyyət var: uçmaq. Bioloji cəhətdən quş sinfinə daxil edilən heyvanların demək olar ki, hamısı uçmaq qabiliyyətinə malikdir.

Bəs quşlar necə mövcud olmuşdur?

Təkamül nəzəriyyəsi quşların mənşəyinə dair uzun ssenari ilə açıqlama verməyə çalışır: bu ssenariyə əsasən, quşların əcdadları sürünənlərdir. Quşlar dövrümüzdən təqribən 150-200 milyon il əvvəl bu sürünən əcdadlarından ayrılmışlar. İlk quşlar uçma qabiliyyəti zəif olan məxluqlar olublar. Ancaq təkamül prosesi əsnasında bu ibtidai quşların pulcuqlarla örtülü qalın dəriləri yerini uçmaq üçün istifadə etdikləri tüklərə veriblər. Ön ayaqlar da tamamilə tüklərlə örtülüb artıq ayaq kimi istifadəyə yararsız hala gəlib və qanadlara

çevriliblər. Beləliklə, bəzi sürünənlər mərhələli təkamül prosesi nəticəsində özlərini uçmağa uyğunlaşdırıblar və dövrümüzün quşlarına çevriliblər.

Bu ssenari təkamülçü mənbələrdə elmi don geydirilərək müdafiə edilir. Ancaq bir az hərtərəfli nəzərdən keçirdikdə və elmi faktlar təhlil edildikdə ssenarinin elmi faktlara deyil, təxəyyülə əsaslandığını görmək olar.

## TƏKAMÜLÇÜLƏRƏ GÖRƏ UÇUŞUN MƏNŞƏYİ

Quruda yaşayan canlı olan sürünənlərin necə uçmağa başladıqları təkamülçülər arasında müxtəlif fərziyyələrə səbəb olmuş mövzudur. Bu mövzuya dair əsas iki nəzəriyyə var: birinci nəzəriyyə quşların əcdadlarının ağaclardan yerə endiklərini müdafiə edir. Bu nəzəriyyəyə əsasən, quşların əcdadları ağaclarda yaşayan sürünənlərdir və onlar zaman ərzində "budaqdan -budağa tullanaraq qanadlanmışlar". Buna **arboreal nəzəriyyə** deyilir. Digər fikir də quşların yerdən yuxarıya doğru qanadlandığı şəklindədir və **kursorial nəzəriyyə** kimi məlumdur.



**Xəyali nəzəriyyələr, xəyali canlılar**

**Təkamülçülərin uçuşun mənşəyini açıqlamaq üçün ortaya atdıqları ilk fikir sürünənlərin "milçək ovlamağa çalışarkən qanadlandıqları" (yuxarıda), ikinci fikir isə "budaqdan budağa tulanarkən quş olduqları"dır. Ancaq nə yavaş-yavaş qanadlanan canlılara aid fosillər var, nə də belə çevrilmənin mümkün olduğuna aid hər hansı bir tapıntı.**

Hər iki nəzəriyyə də tamamilə fərziyyələrə əsaslanır. Nə arboreal nəzəriyyəni, nə də kursorial nəzəriyyəni dəstəkləyən heç bir dəlil yoxdur. Təkamülçülərin bu problemə qarşı tapdıqları həll yolu da olduqca bəsitdir, onlar belə bir dəlilin olduğunu "fərz edirlər". Kursorial nəzəriyyəni irəli

sürən Yeyl Universitetinin geologiya professoru Con Ostrom bu fikrini belə açıqlayır:

Hər hansı bir pro-avisə (uçuşdan öncəki canlıya) aid heç bir fosil dəlili yoxdur. O tamamilə fərziyyəvidir... Belə bir canlı yaşamış olmalıdır.

(John Ostrom, "Bird Flight: How Did It Begin?", *American Scientist*, yanvar-fevral 1979, 67-ci say, səh. 47.)

Ancaq arboreal nəzəriyyəyə əsasən, "yaşamış olmalı" bu ara keçid forma heç vaxt tapılmamışdır. Kursorial nəzəriyyə daha problemlidir. Bu nəzəriyyənin əsas arqumenti budur ki, bəzi sürünənlər həşərat ovlamaq üçün qabaq qollarını uzun müddət və tez-tez çırpmışlar və zaman ərzində bu qabaq qollar qanadlara çevrilmişdir. Qanad kimi olduqca kompleks bir orqanın milçək tutmaq üçün bir-birinə çırpılan qabaq qollardan necə meydana gəlməsi haqqında isə heç bir açıqlama verilmir.

Təkamül nəzəriyyəsini quşların mənşəyi məsələsində çarəsiz qoyan cəhətlərdən biri də qanadların kompleks quruluşudur. Başqa sözlə, qanadlar ancaq mükəmməl quruluşları ilə funksionaldırlar, "natamam" qanad isə heç bir funksiyanı yerinə yetirə bilmir. Bu təqdirdə təkamülün irəli sürdüyü yeganə mexanizm olan "mərhələli inkişaf" modeli heç bir şey ifadə etmir. Türk bioloq Engin Korur qanadların təkamül keçirməsinin qeyri-mümkünlüyünü belə qəbul edir:

Gözlərin və qanadların ortaq xüsusiyyəti budur ki, onlar ancaq tamamilə təkmilləşmiş olduqları təqdirdə funksional olurlar. Başqa sözlə, natamam gözlə görmək olmaz, yarımçıq qanadla uçmaq olmaz. Bu orqanların necə əmələ gəldiyi təbiətin hələ yaxşı başa düşülməyən sirlərindən biri kimi qalmışdır. (Engin Korur, "Gözlerin ve Kanatların Sırrı", Bilim ve Teknik, 203-cü say, oktyabr 1984, səh.25.)

Robert Karol isə "tüklərin uçuş orqanlarının bir ünsürü kimi, təkamülünün necə başladığını izah etmək çətindir, çünki *archaeopteryx*dəki kimi böyük ölçüyə çatanadək necə funksional olduqlarını anlamaq çox çətindir" deyərək etiraf etməyə məcbur olmuşdur. (Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 314.) Daha sonra isə tüklərin izolyasiya üçün təkamül keçirdiyini iddia etmişdir, ancaq bu açıqlama tüklərin uçmaq üçün xüsusi şəkildə formalaşmış kompleks dizaynını izah edə bilmir.

Qanadların quşun döş çıxıntısına sağlam şəkildə birləşməsi quşu havaya qaldırmaq, havada müvazinətini saxlamaq və hər istiqamətə hərəkət etmək üçün əlverişli olması vacibdir. Quşun qanad və quyruq tüklərinin yüngül, elastik və bir-birinə uyğun nisbətdə olması, qısaca desək, uçmaq üçün əlverişli şəkildə mükəmməl aerodinamik quruluşda olması şərtdir. Təkamül məhz bu yerdə çıxılmaz vəziyyətə düşür. Qanadların bu qüsursuz quruluşunun ardıcıl təsadüfi mutasiyalar nəticəsində necə meydana gəlməsi sualı tamamilə cavabsızdır. Bir sürünənin qabaq ayaqlarının genlərində meydana gələn pozulma (mutasiya) nəticəsində necə qüsursuz qanada çevrilməsi əsla açıqlana bilmir.

Yuxarıda bildirildiyi kimi, "yarım qanadla uçmaq olmaz". Ona görə, əgər hər hansı bir mutasiyanın bir sürünənin qabaq ayaqlarında qeyri-müəyyən dəyişiklik etdiyini fərz etsək belə, bunun ardınca yeni mutasiyaların baş verib

"təsadüfən" bir qanad əmələ gətirəcəyini irəli sürmək tamamilə ağıldankənardır. Çünki qabaq ayaqlarda meydana gələn bir mutasiya canlıya funksional qanad qazandırmadığı kimi, onu qabaq ayaqlarından da məhrum edər. Bu isə canlının digər həmnövlərinə görə geridə qalacağına, şikəst olacağına səbəb olar. Təkamül nəzəriyyəsinin qanunlarına görə də təbii seçmə bu şikəst canlını aradan çıxaracaq.

Biofizikii araşdırmalara gəlincə, mutasiyalar çox nadir baş verən dəyişikliklərdir. Ona görə də bu şikəst canlıların milyon illərlə yarımçıq və natamam qanadlarının kiçik mutasiyalarla tamamlanmasını gözləmələri hər cəhətdən qeyri-mümkündür. Həm də bu mutasiyalar əslində hər zaman zərərlidir...

## QUŞLAR VƏ DİNOZAVRLAR

Təkamül nəzəriyyəsi quşların kiçik formalı və ətyeyən teropod (dördayaqlı) dinozavrlardan, yəni bir sürünən növündən törədiyini iddia edir. Lakin əslində quşlarla sürünənlər arasında müqayisə aparılsa, bu canlı siniflərinin bir-birlərindən çox fərqli olduqlarını və aralarında təkamül baş vermədiyini göstərir.

Quşlar və sürünənlər arasında forma baxımından bir çox fərq var. Bunlardan ən mühümü sümüklərinin quruluşudur. Təkamülçülər tərəfindən quşların əcdadı kimi qəbul edilən dinozavrların sümükləri böyük və nəhəng formaları səbəbi ilə qalındır və içi doludur. Bunun əksinə, yaşayan və nəsli kəsilmiş bütün quşların sümüklərinin içi boşdur və bu sayədə çox yüngüldür. Bu yüngül sümük quruluşu quşların uçması üçün böyük əhəmiyyət daşıyır.

**Dinozavrların sümükləri böyük və sağlam olduqları üçün qalındır və içi doludur. Amma yaşayan və nəsli kəsilmiş bütün quşların sümüklərinin içi boşdur və bunun sayəsində yüngüldür.**



Sürünənlər və quşlar arasındakı digər fərq də metabolik quruluşdur. Sürünənlər canlılar aləmində ən yavaş metobolik quruluşa malik ikən quşlar ən yuxarı metabolik quruluşa malikdirlər (dinozavrların istiqanlı olduğu və sürətli metabolizmləri olduğu iddiası fərziyyədir). Məsələn, bir sərçənin

bədən temperaturu sürətli maddələr mübadiləsi (metabolizm) səbəbindən bəzən 48°C-yə çatır. Digər tərəfdən, sürünənlər öz bədən temperaturlarını özləri əmələ gətirmirlər, əvəzində bədənlərini günəşdən gələn istiliklə isidirlər. Sürünənlər təbiətdəki ən az enerji sərf edən canlılardır, quşlar isə ən çox enerji istifadə edirlər.

Şimali Karolina Universitetinin professoru Alan Feduçia təkamülçü olmasına baxmayaraq, elmi kəşflərə əsaslanaraq quşların dinozavrlarla qohum olması nəzəriyyəsinə qətiyyətlə qarşı çıxır. Feduçia sürünən-quş ssenarisi haqqında fikirlərini belə ümumiləşdirir:

*25 il boyu quşların kəllə sümüklərini təhlil etmişəm və dinozavrlarla aralarında heç bir bənzərlik görmürəm. Quşların dördayaqlılardan təkamül yolu ilə törəməsi nəzəriyyəsi paleontologiya sahəsində XX əsrin ən böyük rüsvayçılığı olacaqdır.*

(Pat Shipman, "Birds Do It... Did Dinosaurs?", *New Scientist*, 1 fevral 1997, səh. 28.)

Kanzas Universitetində qədim quşlar sahəsində mütəxəssis olan Lari Martin də quşların dinozavrlarla eyni soydan gəlməsi nəzəriyyəsinə qarşı çıxır. Martin təkamülün bu məsələdə içinə düşdüyü çıxılmaz vəziyyətdən bəhs edərkən “doğrusunu desəm, əgər dinozavrlarla quşların eyni mənşədən gəldiklərini müdafiə etsəydim, bunun haqqında hər dəfə utanaraq danışmaq məcburiyyətində olacaqdım” deyir.

(Pat Shipman, "Birds Do It... Did Dinosaurs?", *New Scientist*, 1 fevral 1997, səh. 28.)

Ancaq bütün elmi tapıntılara baxmayaraq, heç bir konkret dəlilə əsaslanmayan “dinozavr-quş təkamülü” ssenarisi təkidlə müdafiə edilir. Xüsusilə qeyri-akademik, populyar KİV-lər bu ssenarini təkidlə yayımlayırlar. Yeri gəlmişkən, bu ssenariyə dəlil olmayan bəzi anlayışlar da səthi üslubla xəyali “dinozavr-quş əlaqəsinin sübutu” kimi təqdim edilir.

Məsələn, bəzi təkamülçü KİV-lərdə dinozavrların bud sümüklərindəki fərqlərin quşların dinozavrlardan təkamül yolu ilə əmələ gəlməsi tezisinə sübut olduğu hesab edilir. Sözügedən bud sümüyü fərqi *saurischian* (sürünənəbənzər kələzçanaqlılar və *ornithischian* (quşçanaqlılar) qruplarına aid olan dinozavrlardadır. Elə bu “quşçanaqlı dinozavrlar” anlayışının bəzən “dinozavr-quş təkamülü” iddiasına dəlil olduğunu düşünürlər.

Lakin sözügedən çanaq fərqi quşların əcdadlarının dinozavrlar olması iddiasına heç bir dəlil təşkil etmir. Çünki *ornithischian* (quşçanaqlı) qruplarına aid dinozavrlar digər anatomik xüsusiyyətləri baxımından əsla quşlara bənzəmir. Məsələn, qısa ayaqlara, nəhəng gövdəyə, zirehə bənzər iri pulcuqlu dəriyə malik olan (hətta müharibə tanklarına bənzədilən) *ankylosaurus ornithischian* qrupuna aid quşabənzər quşçanaqlı dinozavrdır. Bunun əvəzində bəzi anatomik xüsusiyyətləri ilə quşlara bənzədilən uzun ayaqlı, qısa ön ayaqlara malik incə quruluşlu *struthiomimus* isə *saurischian* (kələzçanaqlılar) qrupuna daxildir. (Duane T. Gish, *Dinosaurs by Design*, Master Books, AR, 1996, səh. 65-66.)

Bir sözlə, çanaq quruluşu heç cür dinozavrlarla quşlar arasında təkamül xarakterli əlaqə olması iddiasına dəlil deyil. “Quşçanaqlı dinozavrlar” tərifi

sadəcə bənzərlikdən irəli gələn tərifdir və iki canlı qrupu arasındakı digər böyük anatomik fərqlər bu bənzərliyi təkamülçü nöqteyi-nəzərdən belə şərh etməyi qeyri-mümkün edir.

## QUŞUN AĞCİYƏRİNİN ÖZÜNƏMƏXSUS QURULUŞU

Sürünən-quş təkamülü ssenarisini qeyri-mümkün edən başqa bir səbəb quşun ağciyərinin təkamüllə açıqlanmayan özünəməxsus quruluşudur.

Quruda yaşayan canlıların ağciyərləri “iki-istiqamətli” quruluşa malikdir: nəfəs aldıqda hava ağciyərdəki şaxələnmiş kanallar boyu irəliləyir və kiçik hava kisəciklərinə daxil olur. Oksigen-karbondioksid mübadiləsi burada baş verir. Ancaq daha sonra çirklənmiş bu hava tamamilə əks istiqamətdə hərəkət edir və gəldiyi yolla ağciyərdən çıxır, əsas bronx yolu ilə xaric edilir.




**1-Havanın giriş-çıxışı, 2-Alveol, 3-Bronxlar, 4-Hava giriş, 5-Parabronxlar, 6-Hava çıxışı.**

**Quşların ağciyərləri quruda yaşayan canlıların tamamilə əksinə fəaliyyət göstərir. Quruda yaşayan canlılar havanı eyni borudan alıb verirlər. Quşlarda isə hava ağciyərdə birtərəfli dövr edir. Bu, ağciyərlərin ətrafında olan xüsusi hava kisəcikləri tərəfindən təmin edilir. Təfsilatı növbəti səhifədə verilən bu sistem sayəsində quşlar bizim kimi fasilələrlə deyil, davamlı olaraq nəfəs alırlar. Uçuş zamanı xeyli miqdarda oksigenə ehtiyacı olan quşlar üçün bu cür quruluş xüsusi olaraq yaradılmışdır. Bu quruluşun sürünənlərin ağciyərindən təkamül keçirərək meydana çıxması imkansızdır, çünki iki müxtəlif ağciyər quruluşu arasındakı “aralıq” bir quruluşla nəfəs almaq olmaz.**

Quşlarda isə hava ağciyər kanalı boyu “tək-tərəfli” hərəkət edir. Ağciyərlərin giriş və çıxış kanalları bir-birlərindən fərqlidir və bu kanallar boyu uzanan xüsusi hava kisəcikləri sayəsində hava daima ağciyərin içində tək istiqamətdə axır. Bu sayədə quş havadakı oksigeni fasiləsiz qəbul edir. Beləliklə, quşun yüksək enerji tələbatı təmin edilir. “Avien ağciyər” adlanan bu xüsusi tənəffüs sistemi Maykl Denton tərəfindən “Böhran içində olan nəzəriyyə” (A theory in crisis) adlı kitabında belə izah edilir:

*Quşlarda əsas bronx ağciyər toxumasını təşkil edən borulara ayrılır. “Parabronx” adlandırılan bu borular sonda yenidən birləşərək havanın ağciyərlər boyu tək istiqamətdə davamlı axınını təmin edən sistemi meydana gətirirlər... Quşlardakı ağciyərlərin quruluşu və ümumi tənəffüs sisteminin*

*fəaliyyəti tamamilə özünəməxsusdur. Quşlardakı bu "avien" sistemi başqa heç bir onurğalının ağciyərində yoxdur. Bu sistem bütün quş növlərində eynidir.* (Michael Denton, *A Theory in Crisis*, Adler & Adler, 1986, səh. 210-211.)

Mühüm olan budur ki, ikitərəfli hava axınına malik olan sürünənlərin ağciyərlərinin təktərəfli hava axınına malik olan quş ağciyərinə təkamül yolu ilə çevrilməsi qeyri-mümkündür. Çünki bu iki ağciyər formasının arasında qalan "keçid" modeli mümkün deyil. Bir canlı yaşamaq üçün daima nəfəs almaq məcburiyyətindədir və ağciyər formasını başdan-ayağa dəyişdirən dizayn dəyişikliyi mütləq ölümlə nəticələnir. Təkamülə əsasən, bu dəyişikliyin milyon illər boyu mərhələli şəkildə baş verməsinə gəlincə, ağciyəri fəaliyyət göstərməyən bir canlı bir neçə dəqiqədən artıq yaşaya bilməz.

Maykl Denton quş ağciyərinin mənşəyini təkamülçü nöqteyi-nəzərdən izah etməyin qeyri-mümkün olduğunu belə bildirir:

***Bu cür tamamilə fərqli tənəffüs sisteminin yavaş-yavaş kiçik dəyişikliklərlə standart onurğalı dizaynından təkamül yolu ilə əmələ gəlməsi iddiası düşünülmədən irəli sürülmüş tezisdir.*** *Tənəffüs fəaliyyətinin* ***bu*** *təkamül prosesi boyu heç dayanmadan qorunması canlının həyatına davam etməsi üçün labüddür. Hər hansı səhv funksiya ölümlə nəticələnir. Quş ağciyəri içində şaxələnmiş parabronxlarla və həmçinin bu parabronxlara hava almağı təmin edən hava kisəsi sistemi ilə birlikdə inkişaf edib ən ali səviyyəyə çatanadək və bununla birlikdə sistemli şəkildə funksiyasını həyata keçirənədək bir tənəffüs orqanı kimi vəzifəsini yerinə yetirə bilməz.* (Michael Denton, *A Theory in Crisis*, Adler & Adler, 1986, səh. 211-212.)










**1-Ön hava kisəciyi, 2-Ağciyər, 3-Arxa hava kisəciyi, 4-Nəfəs borusu**

**Quşların Tənəffüs Sistemi**

Bu sxemlərdə xeyli sadələşdirilmiş halda göstərilən ağciyər sisteminin cox mürəkkəb tərəfləri var. Məsələn, ciyərlərlə kisəciklərin birləşmə yerlərində, havanın doğru istiqamətdən ötürülməsini təmin edən xüsusi tıxaclar və qapaqcıqlar yerləşir. Bütün bunlar cox qüsursuz bir yaradılış olduğunu göstərir. Bu xüsusi sistemlər, həm təkamül iddiasına qarşı öldürücü zərbədir, həm də yaradılış həqiqətinin saysız-hesabsız sübutlarından biridir.

**Nəfəs Alarkən**

Quşun nəfəs borusundan içəri daxil olan təmiz hava həm ağciyərə, həm də ağciyərin arxasında yerləşən arxa hava kisəçiklərinə dolur. Ağciyərdə olan kirli hava isə ön hava kisəciklərinə ötürülür

**Nəfəs Verərkən**

Quş nəfəs verərkən arxa hava kisəciklərində toplanan təmiz hava ağciyərə daxil olur. Bu sistem sayəsində ciyərə təmiz hava axını fasiləsiz davam edir.

Qısası, quruda yaşayan canlıya məxsus ağciyərdən hava tipli ağciyərə keçid mümkün deyil, çünki ara keçid mərhələsində olan bir ağciyər qeyri-funksionaldır.

Bu məsələ ilə bağlı qeyd edilməli ikinci cəhət də sürünənlərin diafraqmalı, quşların isə diafraqmasız tənəffüs sisteminə malik olmalarıdır. Bu fərqli quruluş da yenə iki ağciyər tipi arasında baş verəcək təkamülü qeyri -mümkün edir. Tənəffüs fiziologiyası sahəsində qabaqcıl mütəxəssislərdən hesab edilən Con Ruben bununla bağlı belə şərh verir:

*Teropod dinozavrın quşlara təkamül yolu ilə çevrilməsi diafraqmasında ciddi çatışmazlığa səbəb olacaqdır, amma bu vəziyyət canlının nəfəs alma qabiliyyətini çox kritik səviyyədə məhdudlaşdıracaqdır... Buna səbəb olan mutasiyanın seçərək lazım olanı təmin etməsi qeyri-mümkün görünür.*

(Ruben, J. A., T. D. Jones, N. R. Geist and W. J. Hillenius, "Lung Structure And Ventilation in Theropod Dinosaurs and Early Birds", *Science* 278:1267.)

Quş ağciyərinin təkamülə meydan oxuyan digər xüsusiyyəti heç vaxt havasız qalmayan və havasız qaldıqda "çökmə" təhlükəsiylə qarşılaşan maraqlı quruluşudur. Maykl Denton bu mövzunu belə açıqlayır:

*Bu cür fərqli tənəffüs sisteminin standart onurğalı dizaynından təkamül yolu ilə necə əmələ gəlməsini düşünmək demək olar ki, qeyri-mümkündür. Xüsusilə tənəffüs sisteminin funksionallığının qorunmasının bir canlının həyatı üçün nə qədər labüd olduğunu nəzərə aldıqda. Habelə quş ağciyərinin özünəməxsus forma və funksiyası hələ bir çox xüsusiləşmiş adaptasiya tələb edəcəkdir... Çünki əvvəla, quş ağciyəri bədən divarlarına bərk birləşmişdir və həcm cəhətdən genişlənməsi mümkün deyil. Digər tərəfdən, ağciyərdəki hava borularının çox dar radiusları və onların içindəki hər hansı bir mayenin yuxarı səth gərginliyi səbəbi ilə quş ağciyəri digər onurğalıların əksinə, öz içinə çökdükdən sonra yenidən hava ilə doldurula bilməz... (Buna görə) quşlarda ağciyərin içindəki hava kisəcikləri digər onurğalıların əksinə, heç vaxt boşaldılmır. Əksinə, ciyərlər ilk dəfə inkişaf etməyə başladıqları andan etibarən daima ya maye ilə (rüşeym mərhələsində), ya da hava ilə dolu olurlar.* (Michael J. Denton,. *Nature's Destiny*, Free Press, New York, 1998, səh. 361.)



**Quşun ağciyərində olan və havanın bir istiqamətli hərəkətini təmin edən kiçik "parabronx" boruları. Bu boruların hər biri 0,5 mm ölçüdədir.**

Yəni quşların ağciyər kanalları o qədər dardır ki, bu ağciyərin içindəki hava kisəcikləri digər quruda yaşayan canlıların ciyərləri kimi hava ilə dolub-boşala bilməz. Əgər quş ağciyəri bir dəfə tamamilə boşalsa, quş bir daha ciyərlərinə hava çəkə bilməyəcək və ya bunu etmək üçün çox böyük çətinlik çəkəcəkdir.

Ona görə ağciyərin ətrafına yerləşdirilmiş hava kisəcikləri daimi hava axınını təmin edir və ciyərləri havasız qalıb funksiyasını itirməkdən qoruyur. Əlbəttə, sürünənlərin və digər onurğalıların ağciyərlərindən tamamilə fərqli olan və qeyri-adi dərəcədə həssas tarazlıqlara əsaslanan bu sistem təkamülün iddia etdiyi kimi, şüursuz mutasiyalarla mərhələ-mərhələ inkişaf edə bilməz. Denton quş ağciyərinin bu quruluşunun darvinizmi təkzib etdiyini belə ifadə edir:

*Quş ağciyəri Darvinin "əgər bir-birini təqib edən çox sayda kiçik dəyişikliklə kompleks orqanın əmələ gəlməsinin qeyri-mümkün olduğu sübut edilsə, nəzəriyyəm tamamilə məhv olacaqdır" şəklindəki sözlərinə cavab verir.* (Michael J. Denton, *Nature's Destiny*, Free Press, New York, 1998, səh. 361-62.)

## QUŞ TÜKLƏRİ VƏ SÜRÜNƏN PULCUQLARI

Quşlarla sürünənlər arasında keçilməz uçurum yaradan digər xüsusiyyət isə tamamilə quşlara xas forma olan tüklərdir. Sürünənlərin bədənləri pulcuqlarla, quşların bədənləri isə tüklərlə örtülüdür. Quş tüklərinin sürünən pulcuqlarından təkamüllə əmələ gəlməsi fərziyyəsi tamamilə əsassızdır və fosillərlə təkzib edilir. Təkamülçü paleontoloq Barbara Stahl belə etiraf edir:

*Tüklərin sürünən pulcuqlarından təkamül yolu ilə əmələ gəlməsi fərziyyəsi təhlillərlə təsdiqlənmir... Tüklərin kompleks quruluşu göstərir ki, bu cür formanın sürünən pulcuqlarından təkamül yolu ilə əmələ gəlməsi qeyri-adi dərəcədə uzun zaman və çox sayda ara keçid forması tələb edəcəkdir.* ***Bu vaxta qədər fosillər bu cür fərziyyəni dəstəkləməmişdir.***

(Barbara J. Stahl, *Vertebrate History: Problems in Evolution*, Dover, 1985, səh. 349-350.)

Konnektikat Universitetində fiziologiya və neyrobiologiya professoru olan A.H.Braş isə "tüklər və pulcuqlar... genetik quruluşlarından inkişaflarına, morfologiyalarından toxuma quruluşuna qədər hər şeyiylə bir-birlərindən fərqlidirlər" deyərək eyni həqiqəti qəbul edir. (A. H. Brush, "On the Origin of Feathers", *Journal of Evolutionary Biology*, vol. 9, 1996, səh. 132.) Habelə prof. Braşın fikrincə, "quş tüklərinin zülal quruluşu da digər onurğalıların heç birində rast gəlinməyən, tamamilə özünəməxsus"dur.

(A. H. Brush, "On the Origin of Feathers", *Journal of Evolutionary Biology*, vol. 9, 1996, səh. 132.)

Bununla belə, quş tüklərinin sürünən pulcuqlarından təkamül yolu ilə əmələ gəldiyini göstərən heç bir fosil dəlili də yoxdur. Əksinə, prof. Braşın ifadəsiylə "tüklər fosil qeydlərində sadəcə quşlara xas xüsusiyyətlərlə bir anda üzə çıxırlar". (A. H. Brush,"On the Origin of Feathers", *Journal of Evolutionary Biology*, vol. 9, 1996, səh.132.) Sürünənlərlə quş tüklərinin ortaq mənşəyinə dəlil olan "heç bir epidermal (üst dəriyə aid) forma yoxdur".

(A. H. Brush, "On the Origin of Feathers", *Journal of Evolutionary Biology*, vol. 9, 1996, səh.132.)

İndiyə kimi bir çox fosil üzərində "tüklü dinozavr" fərziyyəsi qurulmuş, amma ətraflı araşdırmalar bu iddiaları təkzib etmişdir. Məşhur ornitoloq

(quşları öyrənən elm adamı) Alan Feduççia "Dinozavrların tüklərdən məhrum olmasına dair" (On why dinosaurs lacked feathers) adlı məqaləsində belə yazır:

Tüklər tamamilə quşlara xas olan formadır və **sürünən pulcuqları ilə quş tükləri arasında ara keçid forma olan heç bir forma yoxdur.** *Longisquama* kimi bəzi nümunələrdə rast gəlinən uzununa pulcuqların forması haqqındakı fərziyyələrlə razı deyiləm. Bunların tükə bənzər formalar olduğuna dair heç bir konkret dəlil yoxdur. (Alan Feduccia, "On Why Dinosaurs Lacked Feathers", *The Beginning of Birds*, Eichstatt, West Germany: Jura Museum, 1985, səh.76.)



**Təkamülçü paleontoloqlar tərəfindən "tüklü dinozavr" adlandırılan, ancaq belə bir xüsusiyyəti olmadığı sonra meydana çıxan Sinosauropteryx fosili.**



**Sürünənlərin Pulcuqları**

**Sürünənlərin bədənlərini örtən pulçuqlar hər tərəfli quş tükündən fərqlidir. Pullar tüklər kimi dərinin altına girməzlər, sadəcə canlının xaricində sərt təbəqə yaradırlar. Genetik, biokimyəvi, anatomik tərəflərdən quş tükləri ilə heç bir oxşarlıqları yoxdur. Pullar ilə tüklər arasındakı böyük fərq, sürünən quş təkamülü fərziyyəsini bir daha alt-üst etmişdir.**

# TÜKLƏRİN YARADILIŞI

Quş tüklərində heç bir təkamül xarakterli proseslə açıqlanmayacaq qədər kompleks yaradılış var. Tüklərin ortasında hamımıza məlum olan uzun və sərt boru yerləşir. Bu borunun hər iki tərəfindən yüzlərlə tük çıxır. Boyları və yumşaqlıqları fərqli olan bu tüklər quşa aerodinamik xüsusiyyət qazandırır. Ancaq daha da maraqlısı budur ki, bu tüklərin hər birinin üzərində də "tükcük" adlanan və gözlə görünməyən çox kiçik tüklər var. Bu tükcüklərin üzərində isə "çəngəl" adlandırılan kiçik qarmaqlar var. Bu qarmaqlar sayəsində hər tükcük bir-birinə sanki zəncirbənd kimi bağlanmışdır.



**Quş Tüklərinin Kompleks Quruluşu**

**Quş tüklərini əsaslı şəkildə tətbiq etdikdə cox həssas dizayna sahib olduqları ortaya çıxır. Hər bir tükcüyün üzərində çoxlu kiçik tükcüklər və bu tükcükləri bir-birinə bərkidən qarmaqlar var.**

Durnanın bircə tükünün üzərində tük borusunun hər iki tərəfindən uzanan 650 dənə incə tük var. Bunların hər birində isə 600 ədəd qarşılıqlı tükcük yerləşir. Bu tükcüklərin hər biri isə 390 dənə qarmaqla bir-birinə bağlanır. Qarmaqlar bir zəncirbəndin iki tərəfi kimi bir-birinə bağlanmışdır. Qarmaqlar hər hansı şəkildə bir-birindən ayrılsa, quşun bir dəfə silkələnməsi və ya daha çətin hallarda dimdiyi ilə tüklərini düzəltməsi tüklərin normal şəklə düşməsi üçün kifayətdir.

Tüklərin bu kompleks quruluşunun təsadüfi mutasiyalar nəticəsində sürünən pulcuğundan təkamüllə əmələ gəldiyini müdafiə etmək heç bir elmi əsası olmayan ehkamçı inancdan başqa bir şey deyil. Belə ki, neodarvinizmin dualistlərindən biri olan Ernst Mayr bu mövzuda illər əvvəl bu etirafı etmişdir:

*Duyğu orqanlarının, məsələn, bir onurğalının gözünün və ya bir quşun tükləri kimi qüsursuz şəkildə tarazlanmış sistemlərin təsadüfi mutasiyalar nəticəsində təkmilləşdiyini fərz etmək bir insanın inandırıcılığı üzərində ciddi bir məhdudlaşdırmadır.*

(Ernst Mayr, *Systematics and The Origin Of Species*, Dover, New York, 1964, səh. 296.)

Tüklərdəki bu yaradılış Çarlz Darvini də çox düşündürmüş, hətta tovuzquşu tüklərindəki mükəmməl estetika öz ifadəsilə Darvini “xəstə etmişdir”. Darvin dostu Eysa Qreyə yazdığı 3 aprel, 1860-cı il tarixli məktubunda “gözü düşünmək çox vaxt məni nəzəriyyəmdən soyudur. Amma özümü zamanla bu problemə alışdırmışam” dedikdən sonra belə davam edir: “İndi isə təbiətdəki bəzi formalar məni daha çox narahat edir. **Məsələn, bir tovuzquşunun tüklərini görmək məni az qalır ki, xəstə etsin**”.

(Norman Macbeth, *Darwin Retried: An Appeal to Reason*, Boston: Gambit, 1971, səh. 101.)

Qısa desək, quş tükləri ilə sürünən pulcuqları arasındakı böyük quruluş fərqləri və quş tüklərinin həddindən artıq kompleks quruluşu tüklərin pulcuqlardan təkamül yolu ilə əmələ gəlməsi iddiasını tamamilə əsassız edir.

## ARCHAEOPTERYX XƏTASI

Sürünən-quş təkamülü ilə bağlı iddiaları dəstəkləyən fosil nümunəsini soruşduqda təkamülçü mənbələrdə həmişə dərhal bir canlıdan bəhs edilir. Bu, hələ də israrla müdafiə edilən az saydakı ara keçid forma iddialarından ən çox məlum olan *archæopteryx* adlı fosil quşdur.

Dövrümüzün quşlarının əcdadı” olduğu irəli sürülən *archæopteryx* bundan təqribən 150 milyon il əvvəl yaşamışdır. Nəzəriyyəyə əsasən, *velociraptor* və ya *dromoesaur* adlandırılan kiçik dinozavrların bir qismi təkamül keçirərək qanadlanmışlar və uçmağa başlamışlar. *Archæopteryx* dinozavr əcdadlarından ayrılan və yeni uçmağa başlayan ilk növdür.

Lakin əslində *archæopteryx*in fosilləri üzərində aparılan son təhlillər bu izahın elmi cəhətdən əsassız olduğunu göstərir. Bu quş ara keçid forması deyil, sadəcə dövrümüzün quşlarından bir az daha fərqli xüsusiyyətlərə malik olan nəsli kəsilmiş quş növüdür.

*Archæopteryx*in yaxşı uça bilməyən “yarı quş” olması tezisi yaxın dövrə



**Arxeopteriksin uçan quş olduğunun mühüm sübutlarından biri asimmetrik tük quruluşudur. Yuxarıda bu canlıya aid tük fosili var.**

qədər təkamülçü mənbələrdə çox tez-tez dilə gətirilirdi. Bu canlının "sternum"unun, yəni döş sümüyünün olmaması canlının uça bilməməsinin ən mühüm dəlili kimi göstərilirdi. (Döş sümüyü uçmaq üçün lazımlı olan əzələlərin birləşdiyi döş qəfəsinin altında yerləşən sümükdür. Dövrümüzdə uçan və ya uçmayan bütün quşlarda, hətta quşlardan tamamilə fərqli ailəyə məxsus olan uçan məməli yarasalarda belə bu döş sümüyü var).

Ancaq 1992-ci ildə tapılan yeddinci *archæopteryx* fosili bu arqumentin səhv olduğunu göstərdi. Çünki tapılan bu son *archæopteryx* fosilində təkamülçülərin uzun zaman boyu olmadığını hesab etdikləri döş sümüyü var idi. "Təbiət" (Nature) jurnalında yeni tapılan bu fosildən belə bəhs edilirdi:

*Son tapılan yeddinci archæopteryx* fosili uzun zamandan bəri varlığına şübhə edilən, amma heç vaxt sübut edilməyən düzbucaqlı döş sümüyünün varlığına işarə edir. Bu canlının uzun məsafələrə uçuş qabiliyyəti hələ də şübhəlidir, ancaq döş sümüyünün varlığı güclü uçuş əzələlərinin olduğunu göstərir. (*Nature*, cild 382, 1 avqust 1996, səh. 401.)

Bu tapıntı *archæopteryx*in tam uça bilməyən yarı-quş olması iddialarını əsassız etdi.

Digər tərəfdən *archæopteryx*in əsl mənada uça bilən quş olduğunun ən mühüm sübutlarından biri də heyvanın tüklərinin quruluşu oldu. *Archæopteryx*in dövrümüzün quşlarınınkından fərqi olmayan asimmetrik tük quruluşu canlının mükəmməl şəkildə uça bildiyini göstərirdi. Məşhur paleontoloq Karl O.Dunbarın bildirdiyi kimi, "tüklərinə görə bu məxluq tam quş xüsusiyyəti daşıyırdı".

(Carl O. Dunbar, *Historical Geology*, New York: John Wiley and Sons, 1961, səh. 310.)

Paleontoloq Robert Karol isə bu mövzunu belə izah edir:

*Archæopteryxin uçuş tüklərinin geometriyası dövrümüzün uçan quşlarınınkı ilə tamamilə eynidir, uçmayan quşların isə tükləri simmetrikdir. Tüklərin qanaddakı nizamı da dövrümüzün quşlarınınkı ilə bənzərdir... Van Tayn və Berqerin fikrincə, archæopteryx*in qanadlarının ölçüsü və forması toyuq cinsindən olan quşlar, qumrular, ağacdələnlər, cüllütlər və ağaca qonan oxuyan quşların çoxu kimi məhdud bitki örtüyünə məxsus çöllərdə hərəkət edən quşlarınkına bənzərdir... Uçuş tükləri ən az 150 milyon ildən bəri sabitdir (dəyişməmişdir).

(Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1997, səh. 280-81.)

*Archæopteryx*in tüklərinin ortaya çıxardığı başqa bir həqiqət isə bu



canlının istiqanlı olması idi. Məlum olduğu kimi, sürünənlər və dinozavrlar soyuqqanlı, yəni bədən temperaturlarını özləri verə bilməyən, ətraf mühitin bədən temperaturlarını tənzimləyən canlılardır. Quşlardakı tüklərin ən mühüm funksiyalarından biri də bədən temperaturunu qorumalarıdır. *Archæopteryx*in tüklü olması onun dinozavrların əksinə, istiqanlı olduğunu, yəni bədən temperaturunu qorumağa ehtiyacı olan əsl quş olduğunu göstərirdi.

**Berlində nümaiş etdirilən ən məhşur Archaeopteryx fosili**

## DİŞLƏR, PƏNCƏLƏR VƏ DİGƏR ORQANLAR

Təkamülçü bioloqların *archæopteryx*i ara keçid forma kimi göstərərkən əsaslandıqları ən mühüm iki cəhət isə bu canlının qanadlarının üzərindəki pəncələri və ağzındakı dişləridir.

*Archæopteryx*in qanadlarında pəncələrinin və ağzında dişlərinin olduğu doğrudur, ancaq bu xüsusiyyətləri canlının sürünənlərlə hər hansı əlaqəsi olduğunu göstərmir. Çünki dövrümüzdə yaşayan iki cür quşda – *touraco corythaix* və *opisthocomus hoazin*də də budaqlara yapışmağa kömək edən pəncələr var. Bu canlılar heç bir sürünən xüsusiyyəti daşımayan tam formalı quşdurlar. Ona görə də *archæopteryx*in qanadlarında pəncələrinin olması və bu səbəbdən də ara forma olması iddiası əsassızdır.



**Halhazırda yaşayan Opisthocomus Hoazin quşunun qanadlarında da eyni Archaeopteryxdə olduğu kimi, pəncəyə bənzər dırnaqlar mövcuddur.**

*Archæopteryx*in ağzındakı dişləri də canlını ara forma hesab etməyə əsas vermir. Təkamülçülər bu dişlərin sürünən xüsusiyyəti olduğunu irəli sürərək yanılırlar. Çünki dişlər sürünənlərin tipik xüsusiyyəti deyil. Dövrümüzdə bəzi sürünənlərin dişləri var, bəzilərininki isə yoxdur. Daha da önəmli olan cəhət budur ki, dişli quşlar təkcə *archæopteryx*lə məhdudlaşmır. Dövrümüzdə dişli quşların artıq yaşamadıqları doğrudur, ancaq fosillərə baxdıqda istər *archæopteryx* ilə eyni dövrdə, istərsə də daha sonra, hətta dövrümüzə olduqca yaxın tarixlərə qədər "dişli quşlar" adlandırılan fərqli quş qrupunun yaşadığını görərik.

Ən mühüm məsələ isə ondadır ki, *archæopteryx* və digər dişli quşların diş formaları bu quşların "təkamül əcdadları" hesab edilən dinozavrların diş formalarından çox fərqlidir. L.D.Martin, J.D.Stuart və K.N.Uetstoun kimi məşhur ornitoloqların apardıqları ölçmələrə əsasən, *archæopteryx*in və digər dişli quşların dişlərinin üstü düzdür və kökləri genişdir. Lakin bu quşların əcdadı olduğu iddia edilən teropoddinozavrlarının dişlərinin üstü mişar kimi çıxıntılıdır və kökləri də dardır. (L. D. Martin, J. D. Stewart, K. N. Whetstone, *The Auk*, cild 98, 1980, səh. 86.) Eyni tədqiqatçılar eyni zamanda *archæopteryx* ilə onun "əcdadları" hesab edilən teropod dinozavrlarının bilək sümüklərini müqayisə etmişlər və aralarında heç bir bənzərlik olmadığını üzə çıxarmışlar. (L. D. Martin, J. D. Stewart, K. N. Whetstone, *The Auk*, cild 98, 1980, səh. 86; L. D. Martin "Origins of Higher Groups of Tetrapods", *Ithaca*, New York: Comstock Publising Association, 1991, səh. 485, 540.)

*Archæopteryx*in dinozavrlardan təkamül yolu ilə törədiyini iddia edən qabaqcıl təkamülçülərdən biri olan Con Ostromun bu canlı ilə dinozavrlar arasında irəli sürdüyü bəzi "bənzərliklər"in isə əslində səhv şərh olduğu S.Tarsitano, M.K.Hext və A.D.Uolker kimi anatomistlərin tədqiqatları ilə aşkar olmuşdur. (S. Tarsitano, M. K. Hecht, *Zoological Journal of the Linnaean Society*, cild 69, 1985, səh. 178; A. D. Walker, *Geological Magazine*, cild 177, 1980, səh. 595.)

A.D.Uolker *archæopteryx*in qulaq hissəsini də tədqiq etmiş və qulaq formasının da dövrümüzün quşlarınınkı ilə eyni olduğunu bildirmişdir. (A. D. Walker, as described in Peter Dodson, "International Archaeopteryx Conference", *Journal of Vertebrate Paleontology* 5 (2):177, iyun 1985.)

Ueyls Universitetinin Biologiya Elmləri İnstitutundan C.Riçard Hinçlif isə rüşeymlər üzərində müasir izotopik texnikadan istifadə edərək quşların əllərinin II, III və IV barmaqlardan ibarət olduğunu, teropod dinozavrlarınkının isə I, II və III barmaqlardan təşkil olunduğunu müəyyən etmişdir.

Bu isə *archæopteryx*-dinozavr əlaqəsinin müdafiə edənlər üçün böyük problemdir. Hinçlifin tədqiqatları və müşahidələri məşhur elmi jurnal olan "Elm"in (Science) 1997-ci ildəki bir sayında belə dərc edilmişdir:

*Teropodlarla quş sümükləri arasındakı homologiya "dinozavr mənşəyi" hipotezi ilə əlaqədar digər bəzi problemləri də yada salır. Onlardan bəziləri bunlardır:* (I) *archæopteryx* qanadı ilə müqayisə edildikdə (bədən ölçüsünə görə) teropodun daha kiçik olan qabaq qolu. Bu cür kiçik qollar olduqca böyük dinozavrın yerdən yuxarıya doğru qanad açıb uçması üçün inandırıcı ön qanad deyil. (II) Teropodlardakı bilək sümüyü sadəcə dörd növdə var. Teropodların çoxunda bilək sümüyü çox sayda hissələrdən təşkil

olunmuşdur. Bunun *archæopteryx* ilə bənzərlik təşkil gətirməsi çox çətindir. (III) Zaman baxımından müqayisə ilə bağlı paradoks isə bir çox teropod dinozavrın və xüsusilə də quşabənzər dromazavrların fosil qeydlərində *archæopteryx*dən daha sonra tapılmalarıdır. (Richard Hinchliffe, "The Forward March of the Bird-Dinosaurs Halted?", *Science*, Volume 278, no. 5338, Issue of 24 Oct 1997, səh. 596-597.)

Hinçlifin bildirdiyi "zaman baxımından uyğunsuzluq" *archæopteryx* haqqındakı təkamülçü iddialara ən öldürücü zərbəni endirən həqiqətlərdən biridir. Amerikalı bioloq Conatan Uels də 2000-ci ildə nəşr edilən "Təkamülün ikonları" (İcons of evolution) adlı kitabında *archæopteryx*in təkamül adına sanki "ikona" (müqəddəs simvol) çevrildiyini, əslində isə dəlillərin bu canlının "quşların ibtidai əcdadı" olmadığını açıq şəkildə göstərdiyini vurğulayır. Uelsin fikrincə, bunun göstəricilərindən biri *archæopteryx*in əcdadı kimi göstərilən teropod dinozavrların əslində *archæopteryx*dən daha gənc olmalarıdır: **"Yerdə qaçan ikiayaqlı dinozavrlar *archæopteryx*in nəzəri əcdadlarından gözlənilən bəzi xüsusiyyətlərə malikdirlər, amma (fosil qeydlərində) *archæopteryx*dən daha sonra üzə çıxırlar".**

(Jonathan Wells, *Icons of Evolution*, Regnery Publishing, 2000, səh. 117.)

Bütün bunlar *archæopteryx*in ara keçid forma olmadığını, sadəcə "dişli quşlar" adlandırılan başqa bir sinifə aid olduğunu göstərir. Bu canlını teropod dinozavrlarla əlaqələndirmək isə olduqca əsassızdır. Amerikalı bioloq Riçard L.Dim də ""Quşlar dinozavrdır" nəzəriyyəsinin sonu" (Demise of the "Birds are dinosaurs" theory) adlı məqaləsində quş-dinozavr təkamülü iddiası və *archæopteryx* haqqında bunları yazır:

*Son tədqiqatların nəticələri göstərir ki, teropod dinozavrların əlləri (qabaq qol sümüklərindəki) birinci, ikinci və üçüncü xanələrdən törəmişdir, amma quşların qanadları ikinci, üçüncü və dördüncü xanələrdən törəyirlər... "Quşlar dinozavrdır" nəzəriyyəsi ilə əlaqədar başqa problemlər də vardır. Teropodların qabaq ayaqları archæopteryx*lə müqayisədə bədənlərinə görə çox kiçikdir. Bu canlıların ağır bədənlərini də düşündükdə bir cür "ön qanad" (proto-wing) inkişafı ehtimalı qeyri-mümkündür. Teropod dinozavrların çoxunda (quşlardakı) semilunatik bilək sümüyü yoxdur və *archæopteryx*də heç bir bənzəri olmayan bəzi bilək hissələri var. Bütün teropodlarda V1 sinirləri digər bəzi sinirlərlə birlikdə kəllə sümüyünün yan tərəfində qurtarır, quşlarda isə eyni sinirlər kəllə sümüyünü ön tərəfdəki xüsusi dəlikdən keçərək qurtarır. Başqa bir problem isə teropodların çox böyük qisminin *archæopteryx*dən daha sonra ortaya çıxmalarıdır.

(Richard L. Deem "Demise of the 'Birds are Dinosaurs' Theory", http://www.yfiles.com/dinobird2.html)

## ARCHAEOPTERYX VƏ DİGƏR QƏDİM QUŞ FOSİLLƏRİ

Son dövrlərdə tapılan bəzi fosillər *archæopteryx*lə bağlı təkamülçü ssenarinin əsassızlığını başqa cəhətlərdən üzə çıxarmışdır.

1995-ci ildə Çində Onurğalılar Paleontologiyası İnstitutunda tədqiqatlar aparan Lianhay Hou və Zhonqhe Zhou adlı iki paleontoloq *confuciusornis* adlandırdıqları yeni quş fosili tapdılar. *Archæopteryx* ilə eyni yaşda (təqribən 140 milyon illik) bu quşun



**Archaeopteryxlə eyni dövrdə yaşamış olan Confuciusornis, halhazırda yaşayan quşlarla çox böyük bənzərlik göstərir.**

dişləri yox idi, dimdiyi və tükləri isə dövrümüzün quşları ilə eyni xüsusiyyətləri daşıyırdı. Skelet quruluşu da dövrümüzün quşları ilə eyni olan bu quşun qanadlarında *archæopteryx*də olduğu kimi pəncələr vardı. Quyruq tüklərinə dəstək olan *pygostyle* (büzdüm sümüyü) adlı forma bu quşda da vardı. (Pat Shipman, "Birds do it... Did Dinosaurs?", *New Scientist*, 1 fevral 1997, səh. 31.) Qısaca desək, təkamülçülər tərəfindən bütün quşların ən qədim əcdadı sayılan və yarı-sürünən qəbul edilən *archæopteryx*lə eyni yaşda olan bu canlı dövrümüzün quşlarına çox bənzəyirdi. Bu həqiqət *archæopteryx*in bütün quşların ibtidai əcdadı olması ilə bağlı təkamülçü tezislərlə ziddiyyət təşkil edirdi.

Çində 1996-cı ilin noyabrında tapılan başqa bir fosil aranı bir az da qarışdırdı. 130 milyon yaşındakı *liaoningornis* adlı bu quş L.Hou, L.D.Martin və Alan Feduççia tərəfindən “Elm” (Science) jurnalında dərc edilən bir məqalədə xəbər verildi. *Liaoningornis* dövrümüzün quşlarında olan uçuş əzələlərinin birləşdiyi döş sümüyünə malik idi. Digər xüsusiyyətləri ilə də bu canlı dövrümüzün quşlarından fərqlənmirdi. Yeganə fərqi ağzında dişlərinin olması idi. Bu vəziyyət dişli quşların heç də təkamülçülərin iddia etdiyi kimi, ibtidai quruluşa malik olmadıqlarını göstərirdi. ("Old Bird", *Discover*, 21 mart 1997.) Belə ki, Alan Feduççia “Discover” jurnalında dərc edilən şərhində *liaoningornis*in quşların mənşəyinin dinozavrlardan gəldiyi iddiasını əsassız olduğunu bildirmişdi.

("Old Bird", *Discover*, 21 mart 1997.)

*Archæopteryx*lə bağlı təkamülçü iddiaları təkzib edən başqa bir fosil isə *eoalulavis* oldu. *Archæopteryx*dən 25-30 milyon il daha gənc, yəni 120 milyon yaşında olduğu söylənilən *eoalulavis*in qanad quruluşu eynilə dövrümüzdəki bəzi uçan quşlardakı kimidir. Bu da 120 milyon il əvvəl dövrümüzdəki quşlardan bir çox cəhətdən fərqi olmayan canlıların uçduqlarını sübut edirdi. (Pat Shipman, "Birds Do It... Did Dinosaurs?", səh. 28.)

Beləliklə, *archæopteryx* və digər arxaik quşların heç birinin ara keçid forması olmadığı qəti şəkildə sübut edilmiş oldu. Fosillər fərqli quş növlərinin bir-birlərindən təkamül yolu ilə törədiklərini göstərmirdi. Əksinə, dövrümüzün quşlarının və *archæopteryx*ə bənzər bəzi xüsusi quş növlərinin birlikdə yaşadıqlarını sübut edirdi. Bu quşların bəzilərinin,

məsələn, *confuciusornis* və ya *archæopteryx*in nəsli kəsilmiş, dövrümüzə ancaq az saydakı quş gəlib çatmışdır.

## ARCHAEORAPTOR: DİNO - QUŞ SAXTAKARLIĞI

Təkamül nəzəriyyəsinin tərəfdarları *archæopteryx*də axtardıqlarını tapmadıqlarına görə 1990-cı ildə digər bəzi fosillərə ümid bağladılar və bir sıra ardıcıl "dino-quş fosili" iddiası bu illərdə dünya mediasında əks-səda doğurdu. Ancaq bu iddiaların hər birinin yanlış şərh və hətta saxtakarlıq nümunəsi olduğu qısa müddətdə başa düşüldü.

"Dino-quş" iddialarının ilk nümunəsi 1996-cı ildə böyük media təbliğatı ilə gündəmə gətirilən "Çində tapılmış tüklü dinozavr fosilləri" hekayəsi idi. *Sinosauropteryx* adlandırılan bir sürünən fosili tapılmışdı, ancaq fosili təhlil edən bəzi təkamülçü paleontoloqlar onun məlum olan sürünənlərin əksinə olaraq quş tüklərinə malik olduğunu irəli sürdülər. Lakin bir il sonra aparılan tədqiqatlarda fosilin əslində quş tükünə bənzər heç bir formaya malik olmadığı məlum oldu. "Elm" (Science) jurnalında dərc olunan "Tüklü dinozavrın tüklərini yolmaq" (Plucking the feathered dinosaur) adlı məqalədə təkamülçü paleontoloqlar tərəfindən "tük" kimi qəbul edilən formaların əslində tüklərlə heç bir əlaqəsi olmadığı bildirilirdi:

*Bir il əvvəl paleontoloqlar "tüklü dinozavra" aid fotoşəkillərin ortaya çıxması ilə həyəcan yaşamışdılar. Çinin Yixian bölgəsində tapılan sinosauropteryx* adlı fosil "New York Times"ın ilk səhifəsində dərc edilmiş və quşların mənşəyinin dinozavrlardan gəldiyinə dair təsirli dəlil kimi təqdim edilmişdi. Amma keçən ay Çikaqodakı onurğalılar paleontologiyası toplantısında verilən hökm daha fərqli oldu: Fosil nümunələrini təhlil edən altı qərbli paleontoloq bunların müasir quş tükləri olmadığını söylədilər... Kanzas Universitetindən paleontoloq Lari Martin onların çürümüş kollagen lifləri olduğunu və quşlarla heç bir əlaqəsi olmadığını bildirdi. (Ann Gibbons, "Plucking the Feathered Dinosaur", *Science*, volume 278, no. 5341, Issue of 14 Nov 1997, səh. 1229 - 1230.)

Daha böyük bir dino-quş qalmaqalı isə 1998-ci ildə başladı. *"National geographic"* jurnalı 1998-ci il, iyul sayında quşların dinozavrlardan təkamül yolu ilə törədiyi iddiasının artıq tutarlı fosil dəlilinə əsaslandığını irəli sürdü. Çində tapıldığı bildirilən fosilə məqalədə geniş yer ayrılaraq fosilin quş və dinozavr xüsusiyyətlərini daşıdığı müdafiə edilirdi. Məqaləni qələmə alan *"National geographic"* jurnalisti Kristofer P.Sloun fosil haqqında verdiyi şərhə o qədər inanmışdı ki, "insanların məməli olduğunu necə əminliklə deyə biliriksə, artıq quşların da teropod (dördayaqlı dinozavr) olduğunu eyni şəkildə söyləyə bilərik" deyirdi. 125 milyon il əvvəl yaşadığı deyilən bu növə dərhal elmi ad da verildi: *archaeoraptor liaoningensis*.

(*National Geographic*, "Feathers for T. Rex?", vol. 196, no. 5, noyabr 1999.)

Lakin fosil beş fərqli fosilin bir-birinə ustalıqla birləşdirilməsiylə hazırlanmış **saxta** fosil idi! Aralarında üç paleontoloqun da olduğu bir qrup tədqiqatçı bir il sonra kompyuter tomoqrafiyasının köməyi ilə saxtakarlığı sübut etdilər. Dino-quş əslində çinli bir təkamülçünün əl işi idi... Çinli

həvəskarlar yapışqan və əhəngdən istifadə edərək 88 sümük və daşdan dino-quş düzəltmişdilər. *Archaeoraptor*un ön hissəsi bir quşa aid fosil idi, ancaq dinozavrın quyruğu ilə birlikdə bədən hissəsində dörd ayrı növə aid sümüklər var idi.

İşin maraqlı cəhəti bu idi ki, *"National geographic"* jurnalı bu cür səviyyəsiz saxtakarlığı heç şübhələnmədən dərc etmiş və hətta buna əsaslanaraq "quşların təkamülü" ssenarilərinin sübut edildiyini irəli sürmüşdü. ABŞ-dakı məşhur Smitson İnstitutu Təbiət Tarixi Muzeyindən dr. Storrs Olson bu fosilin saxta olduğuna dair daha əvvəl *"National geographic"*i xəbərdar etdiyini, ancaq jurnalın rəhbərliyinin bunu tamamilə qulaqardı etdiyini deyirdi. Olsonun fikrincə, "onsuz da *"National geographic"* uzun zamandan bəri sensasiyalı, əsassız və bayağı xəbərlər yayaraq səviyyəsini aşağı salmışdı".

(Tim Friend, "Dinosaur-bird link smashed in fossil flap", USA Today, 01/25/00.)

**"National geographic" jurnalının quşların təkamülünə sübut olaraq təqdim etdiyi Archaeoraptor adlı "dino quş" un bir ildən sonra saxta fosil olduğu bilindi.**



Olson *"National geographic"* jurnalının idarə heyətindəki Piter Reyven adlı elm adamına yazdığı aşağıdakı məktubunda jurnalın "tüklü dinozavrlar" qalmaqalının pərdə arxasını hərtərəfli şəkildə izah edirdi:

*"National geographic"*in 1998-ci il, iyul sayında dərc edilən "Dinozavrlar qanadlanır" (Dinosaurs take wing) sərlövhəli məqalənin dərc edilməsindən qısa müddət əvvəl (məqaləni hazırlayan) Kristofer P.Slounun fotoqrafı Lou Mazzatenta məni "National geographic" cəmiyyətinə çağırdı, Çində tapılan fosillərin fotoşəkillərini göstərdi və bunlar haqqında dərc ediləcək hekayə ilə əlaqədar fikirlərimi soruşdu. Onda *"National geographic"*in göstərmək istədiyi mənzərədən daha fərqli, alternativ düşüncələr olduğunu deyərək etiraz etdim, amma sonda **açıq şəkildə gördüm ki, *"National geographic"* quşların dinozavrlardan təkamül yolu ilə törəməsi doqmasından başqa heç nəyə maraq göstərmirdi.**

Slounun məqaləsi (quş-dinozavr əlaqəsi haqqında) ön mühakiməni tamamilə yeni şəklə salan və böyük ölçüdə təsdiqlənməmiş və ya sənədləşdirilməmiş məlumatlara əsaslanaraq **xəbər yaymaq əvəzinə onları "uydurur".** "İnsanların məməli olduqlarını nə qədər əminliklə deyə biliriksə,

quşların də teropod (ikiayaqlı dinozavr) olduğunu o qədər əminliklə deyə bilərik" şəkilindəki bəsit cümləsi bir və ya bir neçə elm adamının fikri kimi göstərilmir, sadəcə "KİV təbliğatı" kimi qalırdı. **Bu melodramatik iddia əslində embriologiya və müqayisəli anatomiya sahəsində aparılan yeni tədqiqatlarla təkzib edilmişdir, amma, əlbəttə, bunlar (*"National geographic"* məqaləsində) heç bildirilmir.**

Ən əsası da budur ki, Slounun məqaləsində rəsmi çəkilən və quş tükləri olduğu iddia edilən formaların heç birinin quş tükü olduğu sübut edilməmişdir. Bunların bu cür olduğunu iddia etmək bir həqiqəti dilə gətirmək deyil, sadəcə arzularının ifadəsidir. 103-cü səhifədə yer alan "içi boş, saça bənzər formalar ibtidai quş tüklərini (protofeathers) xarakterizə edir" şəkilindəki ifadə cəfəngiyyatdır, çünki "ibtidai quş tükləri" sadəcə nəzəri fərziyyədir və ona görə də bunlar sadəcə hipotezdir.

"National geographic" cəmiyyətində (National Geographic Society) hələ də göstərilən tüklü dinozavrlar sərgisi daha biabırçıdır və bir çox ətyeyən dinozavrın quş tüklərinə malik olduğu kimi, aldadıcı iddia irəli sürür. Heç şübhəsiz, bir dinozavr olan *deinonychus* üçün düzəldilən maket və bala tiranozavr rəsmlərində bu canlılar tüklərlə örtülü şəkildə göstərilir. Bunların hamısı xəyalidir və elmi-fantastikadan başqa bir şey deyil...

Hörmətlə,
Storrs L.Olson
Ornitologiya Şöbəsinin Rəhbəri
Smitson İnstitutu, Təbiət Tarixi Milli Muzeyi

("Open Letter: Smithsonian decries *National Geographic*'s 'editorial propagandizing' of dinosaur-to-bird 'evolution'", http://www.trueorigin.org/birdevoletter.asp)

Bu fosil saxtakarlığının göstərdiyi iki mühüm həqiqət var: birincisi, təkamül nəzəriyyəsinə dəlil tapma axtarışında asanlıqla saxtakarlığa əl ata bilən insanlar var. İkincisi, təkamül nəzəriyyəsini cəmiyyətə təlqinlə qəbul etdirmək kimi missiya üzərinə götürmüş bəzi "elmi jurnallar" təkamül nəzəriyyəsi lehinə istifadə etmək istədikləri tapıntıları səhv olma və ya başqa cür şərh edilmə ehtimallarını tamamilə nəzərdən qaçırıb təbliğat materialına çevirirlər. Yəni elmi deyil, doqmatik davranır, inancla bağlı olduqları təkamül nəzəriyyəsini müdafiə etmək üçün elmdən istifadə edirlər.

Mövzunun digər mühüm cəhəti isə quşların dinozavrlardan təkamüllə törədiyi tezisinə heç bir dəlil tapılmamasıdır. Dəlil tapılmadığı üçün saxtası düzəldilir və ya mövcud dəlillər təhrif edilərək şərh edilir. Əslində isə quşların başqa canlı sinfindən təkamüllə törədiyinə dair heç bir sübut yoxdur. Əksinə, dəlillər quşların yer üzündə özünəməxsus bədən quruluşları ilə ortaya çıxdığını göstərir.

## HƏŞƏRATLARIN MƏNŞƏYİ

Quşların mənşəyindən bəhs edərkən təkamülçü bioloqların bu mövzuda ortaya atdıqları "kursorial nəzəriyyə"dən danışmışdıq. Keçən dəfə də bildirdiyimiz kimi, kursorial nəzəriyyə sürünənlərin necə "qanadlandıqları" sualına "qabaq ayaqları ilə milçək ovlamağa çalışan sürünənlər hekayəsi" ilə

cavab verirlər. Bu fərziyyəvi nəzəriyyəyə əsasən, sözügedən sürünənlər milçək ovlamağa çalışarkən qabaq ayaqlarını zamanla qanadlara çevirmişlər.



**Qanadlı həşəralar, fosil qeydlərində bir anda ortaya çıxırlar və ilk peyda olduqları andan etibarən bu günkü qüsursuz quruluşlarına sahibdirlər. Yuxarıda 320 milyon illik cırcırama fosili bilinən ən qədim cırcıramadır, günümüzdəkilərdən fərqlənmir. Heç bir təkamül prosesi keçirməmişdir.**





**ABŞ-ın Kansas ştatında tapılan bu Acantherpestes major növünə aid qırxayaq təxminən 300 milyon il yaşındadır və günümüzdəki qırxayaqlardan fərqlənmir. (Solda)**

**145 milyon illik milçək, fosili. Çinin Lioaning bölgəsində tapılan bu fosil ilə eyni növə aid yaşayan milçəklər arasında heç bir fərq yoxdur. (Sağda)**

Bu nəzəriyyənin heç bir elmi tapıntıya əsaslanmadığını da qeyd etmişdik. Ancaq bu nəzəriyyə ilə əlaqədar olan və toxunmadığımız mühüm bir cəhət də var.

Bəs, milçəklər görəsən, necə qanadlanıblar? Ümumiyyətlə, milçəklər sinfinin də aid olduğu həşəratların mənşəyi nədir?

Həşəratları canlıların təsnifatında artropodlar (buğumayaqlılar) şöbəsinin *insecta* yarım-şöbəsinə aid edirlər. Ən qədim həşərat fosilləri Devon dövrünə (410-360 milyon il əvvəl) aiddir. Daha sonrakı Pensilvaniya dövründə (325-286 milyon il əvvəl) isə çox sayda müxtəlif həşərat növü bir anda üzə çıxır. Məsələn, hamam böcəkləri ani surətdə və bu günkü quruluşları ilə üzə çıxmışdır. Amerika Təbiət Tarixi Muzeyindən Betti Feyber "350 milyon il əvvələ aid hamam böcəyi fosillərinin dövrümüzdəkilərlə eyni olduğunu" bildirir. (M. Kusinitz, *Science World*, 4 fevral 1983, səh.19.)

Hörümçək, gənə və qırxayaq kimi canlılar əslində həşərat deyil, amma əsasən, həşərat kimi tərif edilir. *Elmin İnkişafı üzrə Amerika Assosiasiyası*nın *(American association for the advancement of science)* 1983-cü ildəki illik toplantısında bu canlılarla bağlı çox mühüm fosil tapıntıları təqdim edilmişdir.

Hörümçək, gənə və qırxayaqlara aid olan 380 milyon illik bu fosillərin maraqlı xüsusiyyəti isə yaşayan nümunələrindən fərqi olmamasıdır. Tapıntıları təhlil edən elm adamlarından biri fosillər haqqında "**sanki dünən ölüblər**" demişdir.

(*New York Times* Press Service, San Diego Union, 29 may 1983; W. A. Shear, *Science*, vol. 224, 1984, səh. 494.)



**320 milyon illik bu hamam böcəyi (tarakan) fosili ilə günümüzdə yaşayan nümunələri arasında heç bir fərq yoxdur.**

Uçan həşəratlar, yəni milçəklər də fosil qeydlərində bir anda və özünəməxsus quruluşları ilə üzə çıxır. Məsələn, Pensilvaniya dövrünə aid çox sayda cırcırama fosili tapılmışdır və bu cırcıramalar dövrümüzdəkilərlə tamamilə eyni quruluşa malikdirlər.

Burada maraqlı olan bir cəhət cırcıramalar kimi milçəklərin qanadsız həşərat növləri ilə eyni anda ortaya çıxmalarıdır. Bu da qanadsız həşəratların zamanla qanadlanaraq milçəklərə təkamül yolu ilə çevrilməsi fərziyyəsini əsassız edir. Robin Vutton və Çarlz P.Ellinqton "Təkamüldə biomexanika" *(Biomechanics in evolution)* adlı kitabdakı bir məqalələrində bu mövzu ilə bağlı belə yazırlar:

Həşəratlar Orta və Üst karbonifer dövrlərində ilk dəfə ortaya çıxırlar, bir-birlərindən çox fərqlənirlər və böyük hissəsi də qanadlıdır. Bir neçə qanadsız və daha

ibtidai həşərat var, amma heç bir ara keçid forma yoxdur. (R. J. Wootton, C. P. Ellington, "Biomechanics and the Origin of Insect Flight", *Biomechanics in Evolution*, ed. J. M. V. Rayner ve R. J. Wootton, Cambridge, Cambridge University Press, 1991, səh. 99.)

Həşəratlar Orta və Üst karbonifer dövrlərində ilk dəfə ortaya çıxırlar, bir-birlərindən çox fərqlənirlər və böyük hissəsi də qanadlıdır. Bir neçə qanadsız və daha ibtidai həşərat var, amma heç bir ara keçid forma yoxdur. (R. J. Wootton, C. P. Ellington, "Biomechanics and the Origin of Insect Flight", *Biomechanics in Evolution*, ed. J. M. V. Rayner ve R. J. Wootton, Cambridge, Cambridge University Press, 1991, səh. 99.)

Fosil qeydlərində bir anda ortaya çıxan milçəklərin mühüm bir xüsusiyyəti də uçuş texnikalarıdır. İnsan saniyədə 10 dəfə qolunu açıb-bağlaya bilmir, amma bir milçək saniyədə təqribən 500 dəfə qanad çalma qabiliyyətinə malikdir. Həm də hər iki qanadını eyni anda çırpır. Əgər qanadların titrəməsi arasında ən kiçik uyğunsuzluq olsa, milçək müvazinətini itirər, ancaq əsla bu cür uyğunsuzluq olmur.

R.Vutton "Milçək qanadlarının mexaniki dizaynı" adlı məqaləsində belə yazır:

*Milçək qanadlarının funksiyasını öyrəndikcə malik olduqları dizaynın nə qədər həssas və qüsursuz olduğunu daha yaxşı anlayırıq... Olduqca elastik xüsusiyyətlərə malik hissələr havadan ən yaxşı şəkildə istifadə edilməsi üçün lazımi qüvvətlər qarşısında lazımi elastikliyə malik şəkildə həssaslıqla birləşdirilmişlər. Milçək qanadlarına çatan texnoloji cihaz yoxdur.*

(J. Robin Wootton, "The Mechanical Design of Insect Wings", *Scientific American*, cild 263, noyabr 1990, səh. 120.)

Bu cür qüsursuz yaradılışa malik olan canlıların yer üzündə bir anda üzə çıxmalarının təkamüllə açıqlanması, əlbəttə, qeyri-mümkündür. Bu səbəbdən, Pol Pier Qrasse "həşəratların mənşəyi məsələsi bizə tamamilə qaranlıq qalıb" deyir. (Pierre-P Grassé, *Evolution of Living Organisms*, New York: Academic Press, 1977, səh. 30.) Həşəratların mənşəyi açıq şəkildə bütün canlıları Allahın yaratdığını təsdiqləyir.

## MƏMƏLİLƏRİN MƏNŞƏYİ

Təkamül nəzəriyyəsi daha əvvəl də bildirdiyimiz kimi, dənizdən təkamül keçirərək çıxan bir cür xəyali canlıların sürünənlərə çevrildiyini, quşların da sürünənlərin təkamül keçirməsiylə əmələ gəldiyini iddia edir. Eyni ssenariyə əsasən, sürünənlər təkcə quşların deyil, həm də məməlilərin əcdadıdır. Ancaq bu iki canlı sinfi arasında çox böyük fərqlər var. Məməlilər istiqanlı heyvanlardır (bədən temperaturlarını özləri verirlər və sabit saxlayırlar), balalarını doğurlar, əmizdirirlər və bədənləri tüklərlə örtülüdür. Sürünənlər isə soyuqqanlıdır (bədən temperaturlarını özləri verə bilmirlər və bədən temperaturları çöldəki havaya görə dəyişir), yumurtlayaraq çoxalırlar, balalarını əmizdirmirlər və bədənləri pulcuqlarla örtülüdür.

Görəsən, necə olub ki, bir sürünən bədən temperaturunu verməyə başlamış, bu temperaturu tənzimləyən tərləmə mexanizmi əmələ gətirmiş, pulcuqlarını tüklərlə dəyişdirmiş və süd ifraz etməyə başlamışdır? Təkamül nəzəriyyəsi məməlilərin mənşəyinə dair açıqlama verməsi üçün, əvvəlcə, bu suallara qənaətbəxş elmi cavablar tapmalıdırlar.

Lakin təkamülçü mənbələrə baxdıqda ya bu mövzuda səssizliyin hakim

olduğunu, ya da tamamilə fantastik və elmdənkənar ssenarilər danışıldığını görürük.

Bu ssenarilərdən biri belədir:

*Soyuq bölgələrdə yaşayan bəzi sürünənlər bədənlərini isitmək üçün üsul tapdılar... Pulcuqları getdikcə daha sivri şəklə düşdü və nəticədə təkamül yolu ilə tüklərə çevrildi. Bununla bərabər baş verən digər adaptasiya isə tərləmənin inkişafı oldu. Bu, canlıya lazım gəldikdə suyun buxarlanması sayəsində bədənini soyutma imkanı verirdi. Elə bu zaman gözlənilmədən bəzi balalar qidalanmaq üçün analarının bədənində əmələ gələn təri yalamağa başladılar. Bəzi tər vəziləri bu səbəbdən getdikcə daha çox ifrazata başladı və bu ifrazat nəticədə südə çevrildi. Bu sayədə bu ilk məməlilərin balaları həyata daha yaxşı başladılar.*

(George Gamow, Martynas Ycas, Mr. Tompkins Inside Himself, Allen & Unwin, Londra, 1966, səh. 149.)

Yuxarıdakı ssenari təxəyyül gücünün məhsulundan başqa bir şey deyiil. Çünki bu danışılanların baş verdiyinə dair nə bir dəlil var, nə də belə bir şeyin baş verməsi mümkündür. Bir canlının anasının bədənindəki təri "yalayaraq" süd kimi olduqca keyfiyyətli, qidalandırıcı, dəyəri yaxşı nizamlanmış qidanı ortaya çıxardığını irəli sürməsi olduqca ağlasığmaz iddiadır.



**Təbiət tarixi muzeylərində nümayiş etdirilən on milyonlarla illik məməli fosillləri ilə bu gün yaşa yan məməlilər arasında heç bir fərq yoxdur. Bundan başqa bu fosillər yer üzünün təbəqələrində əvvəlki növlərlə aralarında heç bir əlaqə olmadan bir anda meydana çıxmışlar.**

Bu cür ssenarilərin uydurulmasının səbəbi məməlilər və sürünənlər arasında əslində keçilməz uçurumlar olmasıdır. Bu uçurumlara başqa bir misal **sürünənlərin və məməlilərin çənə quruluşlarıdır.** Məməlilərdə alt çənədə təkcə bir sümük var və dişlər bu sümüyün üzərində yerləşir. Sürünənlərdə isə alt çənənin hər iki tərəfində üç dənə kiçik sümük var. Başqa əsas fərq bütün məməlilərin orta qulaqlarında üç dənə sümük (zindan, üzəngi və çəkic sümükləri) olmasıdır, bütün sürünənlərdə isə orta qulaqda bircə sümük var. Təkamülçülər sürünən çənəsinin və sürünən qulağının mərhələli şəkildə məməli çənəsinə və qulağına çevrildiyini iddia edirlər. Bu çevrilmənin hansı mərhələlərlə baş verdiyi sualı isə cavabsızdır. Xüsusilə tək sümükdən ibarət qulağın üç sümüklü formaya necə çevrilməsi və eşitmə hissinin bu zaman necə davam etdiyi əsla cavablana bilməyən sualdır.

Bütün bunlar sürünənlərin məməlilərə təkamüllə çevrildiyi fərziyyəsinin heç bir elmi əsası olmadığını göstərir. Belə ki, sürünənlərlə məməliləri bir-birilə əlaqələndirən bircə ara keçid forma fosili belə tapılmamışdır. Buna görə, Rocer Levin **"ilk məməliyə keçid hələ də sirdir"** demək məcburiyyətində qalmışdır.

(Roger Lewin, "Bones of Mammals, Ancestors Fleshed Out", *Science*, cild 212, 26 iyun 1981, səh. 1492.)

XX əsrin ən böyük təkamülçülərindən və neodarvinist nəzəriyyənin banilərindən biri olan Corc Qeylord Simpson isə təkamül nəzəriyyəsi baxımından çox təəccüblü olan bu həqiqəti belə ifadə edir:

*Dünyadakı həyatın ən dolaşıq məsələsi Mezozoy dövrünün, yəni sürünənlər dövrünün məməlilər dövrünə ani surətdə keçməsidir. Sanki bütün baş rolunu çox sayda və növdə sürünənlərin oynadığı dramın pərdəsi bir anda endirilmişdir. Pərdə yenidən açıldıqda isə bu dəfə baş rolu məməlilərin oynadığı və sürünənlərin bir kənarda qaldığı tamamilə yeni bir dövr başlamışdır. Üzə çıxan məməlilərin əvvəlki dövrə aid izləri isə yoxdur.*

(George Gaylord Simpson, *Life Before Man*, New York: Time-Life Books, 1972, səh. 42.)

Habelə ani surətdə üzə çıxan məməlilər bir-birlərindən çox fərqlidir. Yarasa, at, siçan və balina kimi olduqca fərqli canlıların hamısı məməlidir və eyni geoloji dövrdə üzə çıxmışdırlar. Bu canlıların aralarında təkamül əlaqəsi qurmaq ən zəngin təxəyyül gücü üçün belə qeyri-mümkündür. Təkamülçü zooloq Erik Lombard "Təkamül" (Evolution) adlı jurnalda belə yazır:

*Məməlilər sinfi daxilində təkamül xarakterli qohumluq əlaqələri (filogenetik əlaqələr) qurmaq üçün məlumat axtaranlar ümidsizliyə düşəcəklər.* (Eric Lombard, "Review of Evolutionary Principles of the Mammalian Middle Ear, Gerald Fleischer", *Evolution*, cild 33, dekabr 1979, səh. 1230.)

Qısaca desək, məməlilərin mənşəyi digər canlı qruplarında olduğu kimi, təkamül nəzəriyyəsi ilə heç cür açıqlana bilmir. Corc Qeylord Simpson bu həqiqəti uzun illər əvvəl belə etiraf etmişdir:

*Bu, məməlilərin 32 fərqli dəstəsinin hamısına aiddir... Hər dəstənin məlum olan ən qədim və ən ibtidai üzvü bu dəstəyə aid əsas xüsusiyyətlərin hamısına malikdir və heç cür bir dəstədən digərinə doğru irəliləyən davamlı inkişafa rast gəlinmir. Bir çox nümunədə fərq o qədər kəskin və boşluq o qədər böyükdür ki, bütün dəstənin mənşəyi şübhəli və həddindən artıq mübahisəlidir...*

*Ara keçid formaların bu sistemli yoxluğu sadəcə məməlilərə xas deyil və paleontoloqların uzun zamandan bəri anladığı kimi, demək olar ki, universal faktdır. Bu fakt onurğalı və ya onurğasız – bütün heyvan siniflərinə və bütün dəstələrə aiddir. Açıq desək, eyni fakt bitkilərin fərqli kateqoriyalarına da aid edilir.*

(George G., Simpson, "Tempo and Mode in Evolution", Columbia University Press, New York, 1944, səh. 105, 107.)

## ATIN TƏKAMÜLÜ ƏFSANƏSİ

Məməlilərin mənşəyi məsələsində mühüm yer tutan başlıq uzun zamandan bəri təkamülçü mənbələri baş tacına çevirdikləri "atın təkamülü" əfsanəsidir. Bu, bir əfsanədir, çünki elmi kəşflərə deyil, təxəyyül gücünə əsaslanır.



**İngiltərə Təbiət Tarixi Muzeyində olan "Atın təkamülü" sərgisi. Bu və buna oxşar "Atın təkamülü" sxemləri müxtəlif dövrlərdə, fərqli coğrafiyalarda yaşamış müstəqil canlı növlərinə məxsus qalıqların son dərəcə birtərəfli yanaşma ilə, sadəcə xüsusi məqsədlə müəyyən olunmuş ardıcıllıqla sıralanmaqla düzəldilir. Həqiqətdə "Atın təkamülü"nə aid heç bir aydın elmi sübut yoxdur.**

"Atın təkamülü"nü xarakterizə etdiyi iddia edilən sxemlər yaxın dövrə qədər təkamül nəzəriyyəsinə dəlil kimi göstərilən fosil sıralamalarının ən başında gəlirdi. Lakin bu gün bir çox təkamülçü atın təkamülü ssenarisinin əsassızlığını açıq şəkildə qəbul edir. 1980-ci ilin noyabrında Çikaqo Təbiət Tarixi Muzeyində 150 təkamülçünün iştirak etdiyi dörd gün davam edən və mərhələli təkamül nəzəriyyəsinin problemlərinin müzakirə edildiyi bir toplantıda nitq söyləyən təkamülçü Boys Rensberqer atın təkamülü ssenarisinin fosil qeydlərində heç bir əsasının olmadığını və atın mərhələli təkamül keçirməsi kimi bir prosesin heç baş vermədiyini belə izah etmişdir:

*Təqribən 50 milyon il əvvəl yaşamış dörd dırnaqlı, tülkü böyüklüyündəki canlılardan bu günün daha böyük tək dırnaqlı atına doğru ardıcıl mərhələli dəyişiklik olduğunu irəli sürən məşhur atın təkamülü misalının əsassız*

*olduğu uzun zamandan bəri məlumdur. Mərhələli dəyişiklik əvəzinə hər növün fosilləri tamamilə fərqli şəkildə üzə çıxır, dəyişmədən qalmışdır, sonra da nəsli kəsilmişdir. Ara keçid formalar məlum deyil.*

(Boyce Rensberger, *Houston Chronicle*, 5 noyabr 1980, 4-cü fəsil, səh. 15.)

Rensberqer dürüst şəkildə atın təkamülü ssenarisindəki bu mühüm müəmmanı dilə gətirərkən əslində bütün nəzəriyyənin fosil qeydlərindəki ən böyük müəmmasını – "ara keçid formaları müəmmasını" gündəmə gətirmişdir.

Dr. Nayls Eldric atın təkamülü sxemi haqqında belə deyir:

*Həyatın mənşəyi haqında hər biri bir-birindən fantastik bir sıra hekayə var. Bunun ən məşhur nümunəsi isə bəlkə 50 il əvvəl uydurulmuş və hələ də alt mərtəbədə duran atın təkamülü sərgisidir. Atın təkamülü yüzlərlə elmi mənbə tərəfindən böyük həqiqət kimi təqdim edilmişdir. Ancaq indi bu cür iddiaları ortaya atan şəxslərin təxminlərinin ancaq fərziyyə olduğunu düşünürəm.* (Colin Patterson, Harper's, fevral 1984, səh.60.)

Bəs "atın təkamülü" ssenarisi nədir? Bu ssenari Hindistan, Cənubi Amerika, Şimali Amerika və Avropada fərqli zamanlarda yaşamış, fərqli canlı növlərinə aid fosillərin təkamülçülərin təxəyyül gücü sayəsində kiçikdən böyüyə doğru düzülməsiylə əmələ gətirilən sxemlərlə ortaya atılmışdır. Ayrı-ayrı tədqiqatçıların irəli sürdükləri 20-dən çox müxtəlif atın təkamülü sxemi var. Hamısı da bir-birindən fərqlənən bu nəsil ağacları haqqında təkamülçülər arasında da fikir ayrılığı var. Bu ardıcıllıqlardakı yeganə ortaq cəhət 55 milyon il əvvəl Eosen dövründə yaşamış *eohippus* (hyracotherium) adlı itəbənzər bir canlının atın ilk əcdadı olduğuna inanılmasıdır. Əslində isə atın milyon illər əvvəl nəsli kəsilmiş əcdadı kimi təqdim edilən *eohippus* hələ də Afrikada yaşayan və atla heç bir əlaqəsi və bənzərliyi olmayan *hyrax* adlı heyvanın demək olar ki, eynisidir. (Francis Hitching, *The Neck of the Giraffe: Where Darwin Went Wrong*, New York: Ticknor and Fields, 1982, səh. 30-31.)

Atın təkamülü iddiasının əsassızlığı hər keçən gün ortaya çıxan yeni fosil tapıntılarıyla daha açıq şəkildə başa düşülür. *Eohippus* ilə eyni təbəqədə dövrümüzdə yaşayan at cinslərinin də (*equus nevadensis* və *equus occidentalis*) fosillərinin tapıldığı müəyyən edilmişdir. (Francis Hitching, *The Neck of the Giraffe*, səh. 30-31.) Bu, dövrümüzdəki at ilə onun "əcdadının" eyni zamanda yaşadığını göstərir ki, bu da atın təkamülü adlanan prosesin heç vaxt baş vermədiyinin sübutudur.

Təkamülçü yazıçı Qordon R.Teylor darvinizmin açıqlaya bilmədiyi mövzulara toxunduğu "Böyük təkamül müəmması" (The great evolution mystery) adlı kitabında atın təkamülü ardıcıllığı əfsanəsinin əsl mahiyyətini belə izah edir:

*Darvinizmin bəlkə də ən ciddi zəif cəhəti paleontoloqların böyük təkamül xarakterli dəyişikliklər göstərən qohumluq əlaqələrini və canlıların təkamül ardıcıllıqlarını üzə çıxara bilməmələridir... Atın təkamül ardıcıllığı, əsasən, bu mövzuda həllini tapmış yeganə nümunə kimi göstərilir. Ancaq həqiqət bundan ibarətdir ki, eohippusdan equus*a qədər uzanan ardıcıllıq çox

əsassızdır. Bu ardıcıllığın getdikcə böyüyən bədən ölçüsünü göstərdiyi iddia edilir, amma əslində ardıcıllığın sonrakı mərhələlərindəki canlıların bəziləri (ardıcıllığın ən başında yerləşən) *eohippus*dan daha böyük deyil, daha kiçikdirlər. Müxtəlif qaynaqlardan olan növlərin birləşdirilərək inandırıcı ardıcıllıqda ard-arda düzülməsi mümkündür, amma tarixdə həqiqətən bu ardıcıllığı dəstəkləyən heç bir sübut yoxdur.

(Gordon Rattray Taylor, *The Great Evolution Mystery*, London: Sphere Books, 1984, səh.230.)

Bütün bu həqiqətlər təkamül nəzəriyyəsinin ən tutarlı dəlillərindən biri kimi təqdim edilən atın təkamülü sxemlərinin heç bir əsası olmayan xəyali ardıcıllıqlar olduğunu ortaya qoyur. Digər növlər kimi, atlar da təkamül əcdadına malik olmadan yaradılmışdırlar.

## YARASALARIN MƏNŞƏYİ

Məməlilər sinfinə daxil olan ən maraqlı canlılardan biri, şübhəsiz, yeganə uçan məməli cinsi yarasalardır.

Yarasaların maraqlı xüsusiyyətlərindən ən əsası bu canlılardakı kompleks "sonar" sistemidir. Bu sonar sistemi sayəsində yarasalar zülmət qaranlıqda heç bir şey görmədən həddindən artıq qıvraq və qüsursuz manevrlər edərək uçurlar. Qaranlıq bir otağın döşəməsindəki kiçik bir tırtılı da görüb ovlayırlar.



**Yarasaların sahib olduğu sonar sistemi bu günə qədər düzəldilmiş bütün texnoloji sonarlardan daha həssas və səmərəlidir.**

Bu sonar heyvanın daima yüksək tezlikli səslər yayması bu səslərin əks-sədalarını təhlil etməsi və ətrafını hərtərəfli analiz etməsiylə işləyir. Həm də canlı bu işi qeyri-adi sürətlə havada uçduğu saniyələr boyu fasiləsiz və qüsursuz şəkildə yerinə yetirir.

Yarasaların sonar sistemi üzərində aparılan tədqiqatlar daha da təəccüblü nəticələr üzə çıxarmışdır. Heyvanın hiss etdiyi tezlik intervalı çox dardır, yəni ancaq müəyyən tezlikdəki səsləri hiss edə bilir. Ancaq elə burada çox mühüm problem ortaya çıxır. Doppler təsiri adlanan fiziki qanuna əsasən, hərəkət halındakı bir cisimlə toqquşan səsin tezliyi dəyişir. Buna görə, yarasa özündən uzaqlaşan bir milçəyə doğru səs dalğalarını yaydıqda qayıdan səs dalğaları yarasanın eşidə bilməyəcəyi intervala keçəcəkdir. Bu səbəbdən, yarasa hərəkətli cisimləri hiss etməkdə böyük çətinlik çəkməlidir.

Amma belə olmur. Yarasa hər cür cismi qüsursuz şəkildə hiss etməkdə davam edir. Çünki yarasa Doppler təsirini bilirmiş kimi hərəkətli cisimlərə doğru yolladığı səs dalğalarını dəyişdirir. Məsələn, özündən uzaqlaşan milçəyə ən yüksək tezlikli səs dalğasını yollayır ki, səs geri qayıtdıqda hiss etməyəcəyi qədər aşağı tezlikdə olmasın.

Bəs, bu tənzimləmə necə baş verir?

Yarasanın beynində sonar sisteminə nəzarət edən iki fərqli tipdə neyron (sinir hüceyrəsi) yerləşir, bunlardan biri geri qayıdan ultrasəsi hiss edir, digəri müəyyən əzələlərə əmr göndərib yarasanın səsini əmələ gətirir. Bu iki neyron beyində bir-birilə əlaqədar şəkildə fəaliyyət göstərir, belə ki, əks-sədanın tezliyi dəyişdikdə birinci neyron bunu hiss edir və ikinci neyrona təzyiq göstərərək və ya xəbər göndərərək səsin tezliyinin əks-sədanın tezliyinə uyğunlaşmasını təmin edir. Nəticədə yarasanın səsi mühitin vəziyyətinə görə tezliyini dəyişdirir və ən faydalı şəkildə istifadə edilir.

Bütün bu sistemin təkamül nəzəriyyəsinin "təsadüfi mutasiyalarla mərhələli təkamül" açıqlamasına vurduğu zərbəni görməmək mümkün deyil. Yarasadakı sonar sistemi olduqca kompleks quruluşdur və əsla təsadüfi mutasiyalarla açıqlana bilməz. Sistem bütün hissələri ilə birlikdə qüsursuz şəkildə mövcud olduqda funksional olur. Yarasa həm yüksək tezliklərdə səs yayan quruluşa, həm bu səsləri hiss edib təhlil edən orqanlara, həm də hərəkət dəyişikliklərinə görə səs tezliyini tənzimləyən sistemə malik olmalıdır ki, sonar işə yarasın. Əlbəttə, bütün bunlar təsadüflərlə açıqlana bilməz və yarasanın qüsursuz şəkildə yaradıldığını göstərir.

Belə ki, fosil qeydləri də yarasanın yer üzündə ani surətdə və bu günkü kompleks quruluşu ilə ortaya çıxdığını göstərir. Təkamülçü paleontoloqlar Con E.Hil və Ceyms D.Smit "Yarasalar: Təbiət tarixi" (Bats: A natural history) adlı kitablarında bu həqiqəti "etiraf" edərək belə açıqlayırlar:

*Yarasaların fosilləri erkən Eosen dövrünə qədər gedib çıxır... və beş ayrı qitədə birdən-birə üzə çıxır. Bütün yarasa fosilləri, hətta ən qədimləri belə olduqca təkmilləşmiş yarasalardır və*



**ABŞ-ın Vayominq ştatında tapılmış ən qədim yarasa fosili. 50 milyon illik bu fosili ilə bu gün yaşayan yarasalar arasında heç bir fərq yoxdur.**

*ona görə quruda yaşayan əcdadlarından nə cür ara keçidlə törədikləri məsələsi qaranlıq qalır.*

(John E. Hill, James D Smith, *Bats: A Natural History*, London: British Museum of Natural History, 1984, səh. 33.)

Təkamülçü paleontoloq L.R.Qodfrey isə eyni mövzuda belə yazır:

*Erkən Tertir dövrünə aid çox sayda yaxşı qorunmuş yarasa fosili var, məsələn, icaronycteris* kimi. Amma *icaronycteris* bizə yarasalarda uçuşun təkamül keçirməsi haqqında heç bir şey deyə bilmir, çünki bu, onsuz da qüsursuz şəkildə uçan yarasadır. (L. R. Godfrey, "Creationism and Gaps in the Fossil Record", *Scientists Confront Creationism*, W. W. Norton and Company, 1983, səh.199.)

Təkamülçü elm adamı Cef Hekt də eyni problemi 1998-ci il tarixli "New scientist" jurnalındakı məqaləsində belə etiraf edir:

*Yarasaların mənşəyi bir tapmacaya çevrilmişdir. Ən qədim yarasa fosilləri belə 50 milyon il əvvəl bu günkü yarasaların qanadlarına bənzəyən qanadlara malikdirlər.*

(Jeff Hecht, "Branching Out", *New Scientist*, 10 Oct 1998, cild 160, 2155-ci say, səh. 14.)

Qısaca desək, nə yarasaların kompleks bədən sistemlərinin təkamüllə meydana gəlməsi mümkündür, nə də fosil qeydləri belə bir təkamülün baş verdiyini göstərir. Əksinə, yer üzündə ilk dəfə ortaya çıxan yarasalarla bu gün yaşayan nümunələri eynidir. Yarasalar heç vaxt dəyişməmişlər.

## DƏNİZ MƏMƏLİLƏRİNİN MƏNŞƏYİ

Balinalar və delfinlər "dəniz məməliləri" kimi məlum olan canlı qrupunu təşkil edirlər. Bu canlılar məməlilər sinfinə daxildir, çünki eynilə qurudakı məməlilər kimi bala doğur, əmizdirir, ağciyərlə nəfəs alır və bədənlərini isidirlər. Dəniz məməlilərinin mənşəyi isə təkamülçülər tərəfindən açıqlanması ən çətin olan məsələlərdən biridir. Bir çox təkamülçü mənbədə əcdadları quruda yaşayan dəniz məməlilərinin uzun təkamül prosesi nəticəsində dəniz mühitinə keçəcək şəkildə təkamül keçirdikləri irəli sürülür. Buna əsasən, sudan quruya keçidin əksinə hərəkət edən dəniz məməliləri ikinci təkamül prosesinin nəticəsi kimi, yenidən su mühitinə geri qayıdıblar. Lakin bu nəzəriyyə heç bir paleontoloji dəlilə əsaslanmır və məntiqi cəhətdən də ziddiyyətlidir. Belə ki, təkamülçülər də uzun illər boyu bu mövzuda susublar.



Bu səbəbdən, təkamülçülər bu mövzu ilə bağlı uzun müddətdən bəri bir şey demirlər.

Ancaq 1990-cı ildə dəniz məməlilərinin mənşəyi haqqında yeni təkamülçü ssenarilər ortaya çıxdı. Bu ssenarilər 1980-ci ildə tapılan *pakicetus* və *ambulocetus* ki mi bəzi yeni fosil tapıntıları üzərində quruldu. Dördayaqlı və quruda yaşayan canlı olduqları açıq şəkildə bəlli olan bu nəsli kəsilmiş məməlilərin balinaların əcdadı

olduğu iddia edildi və beləliklə, bir çox təkamülçü mənbə onları “yeriyən balinalar” adlandırmaqda tərəddüd etmədi. (Əslində bu canlının tam adı “yeriyən və üzən balina” mənasını verən *ambulocetus natans*dır). “National geographic” jurnalı isə 2001-ci il, noyabr sayında “Balinaların təkamülü” ssenarisini gündəmə gətirdi. Ssenari elmi dəlillərin deyil, təkamülçü ön mühakimələrin üzərində qurulmuşdu.

## YERİYƏN BALİNA NAĞILI

Tam adı *pakicetus inachus* olan bu nəsli kəsilmiş məməliyə aid fosillər ilk dəfə 1983-cü ildə gündəmə gəldi. Fosili tapan P.D.Cinceriç və köməkçiləri canlının sadəcə kəllə sümüyünü tapmalarına baxmayaraq, heç çəkinmədən onun “ibtidai balina” olduğunu iddia etdilər.

Halbuki fosilin “balina” ilə heç bir əlaqəsi yox idi. Skeleti bildiyimiz canavarlara bənzəyən dördyaqlı formada idi. Fosilin tapıldığı yer paslanmış dəmir filizinin də tapıldığı və ilbiz, tısbağa və ya timsah kimi quruda yaşayan canlıların da fosillərinin olduğu bir ərazi idi, yəni dəniz yatağı deyil, quru hissəsi idi.

Bəs dördayaqlı quru canlısı olan bu fosil nə üçün “ibtidai balina” elan edilmişdi? Sadəcə dişlərindəki və qulaq sümüklərindəki bəzi xüsusiyyətlərə görə!





**Həqiqi Pakicetus**



**“National Geographic”-in Pakicetus rəsmi**

**“NATİONAL GEOGRAPHİC”-İN RƏSM TƏHRİFLƏRİ**

**Paleontoloqlar Pakicetusun dörd ayaqlı quru məməlisi olduğuna inanırdılar. “Nature” jurnalından (no 412 20.09.2011) dərc edilən soldakı skelet quruluşu, bunu açıq şəkildə göstərir. Bu skelet quruluşuna əsaslanaraq Karl Buell tərəfindən düzəldilən Pakicetusun bərpa edilmiş rəsmi də həqiqidir. (Solda skeletin aşağısında)**

**Amma “National Geographic” jurnalı canlını yeriyən balina olaraq göstərmək üçün və bu obrazı oxuculara qəbul etdirmək üçün, Pakicetusu üzən vəziyyətdə göstərən bir rəsmi seçmişdir. (Altda) Rəsmdə Pakicetusu “balinalaşdırmaq” üçün kiçik hiylə diqqət çəkir. Canlı üzən vəziyyətdə təsvir edilib, arxa ayaqları geriyə tərəf çəkilərək “üzgəc” təsürratı yaratmaq istənilib, ön və arxa pəncələri də aralayaraq üzgəcə oxşadılıb.**

Halbuki bu xüsusiyyətlər *pakicetus* ilə balinalar arasındakı əlaqəyə dəlil ola bilməz. Canlılar arasında anatomik bənzərliklərə əsaslanaraq qurulan bu cür nəzəri əlaqələrin çoxunun olduqca məntiqsiz olduğunu təkamülçülər də qəbul edirlər. Əgər Avstraliyada yaşayan dimdikli bir məməli olan ördəkburunlar və ördəklər nəsli kəsilmiş canlılar olsaydı, təkamülçülər eyni məntiqlə (dimdik **bənzərliyinə** əsasən) onları da bir-birlərinin qohumu elan edəcəkdilər. Lakin əslində ördəkburun məməlidir, ördək isə quşdur və aralarında təkamül nəzəriyyəsinə əsasən də qohumluq ola bilməz.

Təkamülçülərin "yeriyən balina" elan etdiyi *pakicetus* da fərqli anatomik xüsusiyyətləri özündə ehtiva edən xüsusi cinsdir. Belə ki, onurğalılar paleontologiyası mütəxəssislərindən Karol *pakicetus*un da daxil edilməli olduğu mesonixid (Mesonychia) ailəsinin "qəribə xüsusiyyətlərdən ibarət kombinasiyaya malik olduğunu" bildirir. (Robert L. Carroll, *Patterns and Process of Vertebrate Evolution*, Cambridge University Press, 1998, səh. 329.) Bu cür "mozaik canlıların" təkamül xarakterli ara keçid forma hesab edilmədiyini Quld kimi qabaqcıl təkamülçülər də qəbul edirlər.

Yaradılış həqiqətini müdafiə edən yazıçı Eşbi L.Kemp "balina təkamülünün mübaliğəli təbliğatı" (The overselling of whale evolution) adlı məqaləsində *pakicetus* kimi quruda yaşayan məməlilərin də daxil olduğu mesonixidlər sinfinin *archaeocetealar*ın, yəni nəsli kəsilmiş balinaların əcdadı olması iddiasının əsassızlığını belə açıqlayır:

*Təkamülçülərin mesonixidlərin archaeocetealar*a çevrildiyi ilə bağlı əminliklə davranmalarının səbəbi həqiqi nəsil əlaqəsində yer alan bir növü tərif edə bilməmələrinə baxmayaraq, məlum olan mesonixidlər və *archaeocetealar* arasında bəzi bənzərliklər olmasıdır. Ancaq bu bənzərliklər, xüsusilə də (iki qrup arasındakı) böyük fərqlər işığında bir əcdad əlaqəsi olduğunu iddia etmək üçün kifayət deyil. Bu cür müqayisələrin çox subyektivliyi indiyə qədər bir çox fərqli məməli və hətta sürünən qrupunun balinaların əcdadı kimi irəli sürülməsindən bəllidir.

(Ashby L. Camp, "The Overselling of Whale Evolution", *Creation Matters*, a newsletter published by the Creation Research Society, may/iyun 1998.)

## AMBULOCETUS NATANS: PƏNCƏLƏRİNƏ PƏRDƏ KEÇİRİLƏN SAXTA BALİNA

Xəyali balina təkamülü sxemində *pakicetus*dan sonra gələn ikinci fosil *ambulocetus natans*dır. İlk dəfə 1994-cü ildə "Elm" (Science) jurnalında dərc olunan bir məqalə ilə xəbər verilən bu fosil də təkamülçülərin zorla balinalaşdırılmaq" istədikləri quruda yaşayan canlıdır.

*Ambulocetus natans* termini latınca ambulate (yerimək), cetus (balina) və natans (üzmək) sözlərinin birləşməsindən əmələ gəlmişdir və "yeriyən və üzən balina" mənasını verir. Canlının yeridiyi aşkardır, çünki bütün digər quru məməliləri kimi, onun da dörd ayağı, hətta bu ayaqlara bağlı geniş pəncələri və arxa pəncələrinin ucunda dırnaqları vardır. Ancaq canlının bir tərəfdən də suda üzdüyü, daha doğrusu həm quruda, həm də suda (amfibiya şəklində) yaşadığı iddiasının təkamülçülərin ön mühakimələrindən başqa heç

bir əsası yoxdur.

Bu mövzuda elmlə təxəyyül gücü arasındakı sərhədi görmək üçün təkamül nəzəriyyəsinin ən qabaqcıl müdafiəçilərindən biri olan və 2001-ci il, noyabr sayını "Balinaların təkamülü" təbliğatına həsr edən "National geographic"in *ambulocetus* uydurmasına bir nəzər salaq. Jurnalda dərc edilən *ambulocetus* rəsmi belədir:

Rəsmə diqqətlə baxsanız, quruda yaşayan canlı olan *ambulocetus*u "balinalaşdırmaq" üçün qurulmuş kiçik hiyləni asanlıqla görə bilərsiniz:



- Heyvanın arxa ayaqları yeriməyə yarayan ayaqlar olaraq deyil, üzməyə yarayan üzgəclər kimi təsvir edilmişdir. Əslində isə canlının ayaq sümüklərini tədqiq edən Karol bu canlının "quruda yaxşı yerimə bacarığına malik olduğunu" bildirir.
  (Robert L. Carroll, *Patterns and Process of Vertebrate Evolution*, Cambridge University Press, 1998, səh. 333.)
- Heyvanın ön ayaqlarına "fırça" görüntüsü vermək üçün üzməyə yarayan üzgəclər kimi təsvir edilmişdir. Əslində isə əldə olan *ambulocetus* fosillərindən belə bir nəticəyə gəlmək mümkün deyil. Fosil qeydlərində bu cür yumşaq toxumalar heç vaxt görünmürlər. Ona görə canlının skeletindən başqa xüsusiyyətləri üzərində aparılan bərpa işləri şübhəlidir. Bu da təkamülçülərin əlinə geniş təbliğat materialı verir.

*Ambulocetus*un yuxarıdakı göstərilən rəsmindəki kimi təkamülçülər tərəfindən edilən düzəlişlərlə istənilən canlını başqa canlıya bənzətmək mümkündür.

İstəsəniz, meymun skeletini də ayaqlarını arxaya doğru çəkib "üzgəc" kimi göstərmək və barmaqları arasında pərdələr çəkməklə "balinaların əcdadı olan primat" kimi təqdim edə bilərsiniz.

Ambulocetus fosili üzərində edilən bu rəsm hiylələrinin əsassızlığı elə "National geographic"in eyni sayında dərc edilən aşağıdakı rəsmdən də məlum olur:



**Ambulocetus fosilinin həqiqi görüntüsü: Ayaqlar üzgəc deyil, həqiqi ayaqdır və barmaqların arasında "National Geographic" əvvəlcədən əlavə etdiyi xəyali pərdə yoxdur.**

"National geographic" canlının skeletinin rəsmini yayımlayarkən istər-istəməz bərpa edilmiş rəsmdəki "balinalaşdırıcı" düzəlişlərdən əl çəkmək məcburiyyətində qalmışdır. Canlının ayaq sümükləri, skeletin açıq şəkildə göstərdiyi kimi, onun quruda daşıya biləcək quruluşdadır. Ayaqlarında isə xəyali "pərdələrdən" əsər-əlamət yoxdur.

## YERİYƏN BALİNA NAĞILININ ƏSASSIZLIĞI

Əslində nə *pakicetus*un, nə də *ambulocetus*un balinalarla qohumluq əlaqələri olduğuna dair heç bir dəlil yoxdur. Bunlar sadəcə nəzəriyyələrinə əsasən, dəniz məməliləri üçün quruda yaşayan bir əcdad tapmaq məcburiyyətində olan təkamülçülərin bəzi məhdud bənzərliklərə əsaslanaraq müəyyən etdikləri "əcdad namizədləridir". Bu canlıların özləriylə çox yaxın geoloji dövrdə fosil qeydlərində üzə çıxan dəniz məməliləri ilə əlaqələrinin olduğunu göstərən heç bir dəlil yoxdur.

Təkamül sxemində *pakicetus* və *ambulocetus*un ardınca sözügedən dəniz məməlilərinə keçilir və *procetus*, *rodhocetus* kimi *archaeocetea* (nəsli kəsilmiş balina) növləri düzülür. Sözügedən canlılar həqiqətən də suda yaşayan nəsli kəsilmiş məməlilərdir (bir az sonra bu mövzuya da toxunacağıq). Ancaq *pakicetus* və *ambulocetus* ilə bu dəniz məməliləri arasında çox böyük anatomik fərqlər var. Canlıların fosilləri təhlil edildikdə onları bir-biriləri ilə əlaqələndirən "ara keçid formalar" olmadığı açıq şəkildə görünür:

- Quruda yaşayan dördayaqlı məməli olan *ambulocetus*da onurğa çanaq (pelvis) sümüyündə bitir və bu sümüyə bağlanan güclü ayaq sümükləri uzanır. Bu tipik quru məməlisinin anatomiyasıdır. Balinalarda isə onurğa quyruğa qədər davam edir və onlarda çanaq sümüyü yoxdur. Belə ki, *ambulocetus*dan 10 milyon il sonra yaşadığı hesab edilən *basilosaurus* eynilə bu anatomiyaya malikdir. Yəni tipik balinadır. Tipik quru canlısı olan *ambulocetus* ilə tipik balina olan *basilosaurus* arasında isə heç bir "ara keçid forma" yoxdur.
- *Basilosaurus*un və kaşalot onurğalarının alt hissəsində onurğadan ayrı kiçik sümüklər yerləşir. Təkamülçülər bunların "rudiment ayaqlar" olduğunu iddia edirlər. Lakin sözügedən sümüklər *basilosaurus*da "cütləşmə vəziyyətini almağa kömək edir", kaşalotda isə "çoxalma orqanlarına dəstək olur". (*National Geographic*, "Balinaların Evrimi", noyabr 2001, səh. 163.) Onsuz da çox mühüm funksiyanı yerinə yetirən skelet hissələrini başqa bir funksiyanın "rudiment orqanı" kimi tərif etmək təkamülçü ön mühakimədən başqa bir şey deyil.

Nəticədə dəniz məməlilərinin quru məməliləri ilə aralarında "ara keçid forma" olmadan, özünəməxsus quruluşları ilə ortaya çıxdıqları həqiqəti dəyişmir. Ortada heç bir təkamül zənciri yoxdur. Robert Karol bu həqiqəti istəmədən və təkamülçü dillə də olsa, belə qəbul edir: "Birbaşa balinalara uzanan mesonixid zənciri qurmaq mümkün deyil". (Robert L. Carroll, *Patterns and Processes of Vertebrate Evolution*, Cambridge University Press, 1998, 329.) Balinaları öyrənən məşhur

mütəxəssis olan rus elm adamı Q.A.Mkedlidze də təkamülçü olmasına baxmayaraq, pakicetus, ambulocetus natans və onlara bənzər dördayaqlı "balina əcdadı namizədləri"nin bu şəkildə tərif edilməsi ilə razı deyil və onları tamamilə ayrı bir qrup kimi tərif edir. (G. A. Mchedlidze, *General Features of the Paleo-biological Evolution of Cetacea*, Rusça'dan Tercüme (Rotterdam: A.A. Balkema), 1986, səh. 91.)

## QULAQ VƏ BURUNUN TƏKAMÜLÜ HEKAYƏLƏRİ

Quruda yaşayan məməlilər ilə dəniz məməliləri arasında irəli sürülən təkamül ssenarisi bu canlı qrupları arasındakı fərqli qulaq və burun quruluşlarını açıqlamalıdır. Əvvəlcə, qulaq quruluşunu nəzərdən keçirək. Quru məməliləri insanlar kimi xarici aləmdəki səsləri qulaq seyvanları ilə toplayır, orta qulaqdakı sümüklərlə gücləndirir və daxili qulaqda siqnallara çevirirlər. Dəniz məməlilərinin isə qulaqları yoxdur. Səsləri alt çənələrindəki xüsusi titrəyən reseptorlarla eşidirlər. Bu iki forma arasında mərhələli təkamül mümkün deyil. Mükəmməl bir eşitmə sistemindən tamamilə fərqli quruluşa malik başqa bir sistemə mərhələli təkamüllə keçmək qeyri-mümkündür. Çünki ara mərhələlər faydasız olacaqdır. Yavaş-yavaş qulaqları ilə eşitmə qabiliyyətini itirən, çənəsi ilə eşitmə qabiliyyəti isə hələ təkmilləşməmiş canlı təkmil deyil.

Sözügedən "təkmilləşmənin" necə baş verəcəyinə gəlincə, elə bu, təkamül nəzəriyyəsini çıxılmaz vəziyyətə salır. Təkamülçülərin irəli sürdükləri mexanizm mutasiyalardır və canlılara genetik məlumat əlavə etdikləri heç vaxt müşahidə edilməmiş mutasiyalar nəticəsində dəniz məməlilərinin son dərəcə kompleks duyğu sistemlərinə malik olduqlarını irəli sürmək ağlasığmazdır.

Belə ki, fosillər ortada heç bir təkamül olmadığını göstərir. *Pakicetus* və *ambulocetus*un qulaq sistemi quruda yaşayan məməlilərinki ilə eynidir. "Təkamül sxemində" bu iki quru məməlisinin ardınca gələn *basilosaurus* isə tipik balina qulağına malikdir. Yəni xarici qulaq seyvanı ilə deyil, çənəsinə gələn titrəmələrlə ətrafındakı səsləri eşidən canlıdır. *Pakicetus* və *ambulocetus*un qulaq quruluşu ilə *basilosaurus*un qulaq quruluşu arasında heç bir "ara keçid forması" yoxdur.

Buna bənzər vəziyyət "sürüşkən burun" hekayəsi üçün də keçərlidir. Təkamülçü mənbələr *pakicetus*, *rodhocetus* və dövrümüzün göy balinasına aid üç kəllə sümüyü skeletini alt-alta düzür və bunların "təkamül prosesi"ni təşkil etdiklərini irəli sürürlər. Halbuki bu üç fosilin, xüsusilə də *rodhocetus* və dövrümüzdəki balinanın burun quruluşları eyni ardıcıllığın ara keçid formaları kimi qəbul edilməyəcək qədər fərqlidir.

Habelə nəfəs dəliklərinin burundan ənsəyə qədər davam etməsi sözügedən canlıların anatomiyasında çox ciddi "yenidən dizayn" tələb edir ki, bunun təsadüfi mutasiyalar yolu ilə əmələ gəldiyinə inanmaq xəyal qurmaqdan başqa bir şey deyil.

# "NATİONAL GEOGRAPHİC"İN LAMARKÇI NAĞILLARI

Əslində təkamülçü zümrənin böyük hissəsinin canlıların mənşəyi haqqında əsas batil inancı var və problem də elə bundan qaynaqlanır. Bu batil inanc canlılara ehtiyacları olan orqanları, biokimyəvi formaları və ya anatomik xüsusiyyətləri qazandıran sanki sehirli bir "təbii güc" düşüncəsidir.

Bunu görmək üçün "National geographic"in 2001-ci il, noyabr sayında "Balinaların təkamülü" başlıqlı məqaləsindəki bəzi maraqlı abzaslara nəzər salaq:

*... Bu ərazidə tapılan balinaların bəzi əcdadlarını gözümün önündə canlandırmağa çalışdım... Hər nəsildə getdikcə qısalan və çəlimsizləşən arxa ayaqlarından istifadə edərək şappıltı ilə hərəkət etməyə çalışırdılar... Bir tərəfdən arxa ayaqları, digər tərəfdən də gövdələrini saxlayan bud sümükləri getdikcə kiçilirdi... Boynu qısaldı, beləliklə, gövdənin ön hissəsi suyu ən az müqavimətlə yarıb keçməyi təmin edən boru şəklində sualtı qayığın gövdəsinə bənzəyən formaya çevrilərkən qollar da üzgəc formasını almağa başladı. Xarici qulaqlara olan ehtiyacın azalması ilə bəzi balinalar sudakı səsləri birbaşa alt çənə sümükləri ilə qəbul edib xüsisi yağ kisələri vasitəsilə daxili qulağa ötürürdülər.*

Diqqət edilsə, bütün bu hekayələrdə təkamülçü məntiq uydurması sadəcə canlıların dəyişən mühitə görə dəyişən ehtiyaclarının olduğunu bildirir və bu ehtiyacı özbaşına "təkamül mexanizmi" kimi qavrayır: bu məntiqə əsasən, ən az ehtiyac hiss olunan orqanlar yox olur, ehtiyac olan yeni orqanlar öz-özünə meydana gəlirlər!

Lakin biologiya sahəsində ən əsas məlumatlara malik olan bir insan bilər ki, ehtiyaclarımız orqanlarımızı irsi şəkildə formalaşdıra bilməz. Bu, Lamarkın "qazanılmış xüsusiyyətlərin sonrakı nəsillərə ötürülməsi" tezisinin təkzib edilməsindən bəri, yəni təqribən 100 ildir ki, məlum olan qəti həqiqətdir. Amma təkamülçü KİV-lərə baxdıqda görürük ki, hələ də Lamarkın nəzəriyyəsinə görə düşünürlər.

Əgər onlara etiraz etsəniz, "xeyr, biz lamarkçı deyilik, ətraf mühit şərtlərinin canlılara təkamül xarakterli təzyiq göstərdiyini, bu təzyiq nəticəsində uyğun canlıların seçildiyi və beləliklə, növün təkamül keçirdiyini nəzərdə tuturuq" deyəcəklər. Amma elə məsələnin əsli də buradadır: Təkamülçülərin "təkamül xarakterli təzyiq" dedikləri şey canlılara ehtiyaclarına uyğun olaraq yeni xüsusiyyətlər qazandıra bilməz. Çünki bu təzyiqə reaksiya verəcəyini nəzərdə tutduqları iki "təkamül mexanizmi", yəni təbii seçmə və mutasiyanın canlılara yeni orqanlar qazandırma xüsusiyyəti yoxdur:

- Təbii seçmə ancaq mövcud olan xüsusiyyətləri seçə bilər, yeni bir xüsusiyyət əmələ gətirə bilməz.
- Mutasiyalar canlılara genetik məlumat əlavə edə bilməzlər, sadəcə mövcud genetik məlumatı pozarlar. Genetik məlumat əlavə edən (yeni bir orqan və ya biokimyəvi forma əmələ gətirən) bir mutasiyaya əsla rast gəlinməmişdir.

Bu həqiqətlər işığında “National geographic”in yuxarıdakı “şappıltı ilə hərəkət edən balinalar” nağılına bir daha nəzər salsaq, əslində həqiqətən də olduqca bəsit lamarkçılıq etdiklərini görərik. Diqqət edilsə, “National geographic”in jurnalisti Duqlas H.Çedvik **“hər nəsildə getdikcə qısalan və çəlimsizləşən arxa ayaqlar”**dan bəhs edir. Necə olur ki, “hər nəsildə” bir canlı növündə morfoloji dəyişiklik- həm də müəyyən bir istiqamətdə dəyişiklik olur? Bunun üçün, o növün hər nəsildəki təmsilçiləri ayaqlarının qısalmasına səbəb olan mutasiyalara uğramalı, bu mutasiyalar canlıya başqa heç bir zərər verməməli, mutasiyaya uğrayan fərdlər digərlərinə görə üstün olub seçilməli, sonrakı nəsildə (necə bir təsadüfdürsə) yenə eyni genin eyni yerində eyni mutasiya olmalı, bu nəsillər boyu heç dəyişmədən davam etməli, bütün bunlar təsadüfən qüsursuz şəkildə baş verməlidir.

Əgər “National geographic” yazıçıları buna inanırlarsa, “biz sülələ olaraq uçmağı çox sevirik, oğlum da baxın, təsadüfi mutasiya keçirdi və qoltuq altlarında quş tükünə bənzər bir neçə forma əmələ gəldi. Nəvəm də eyni mutasiyaları keçirəcək və tükləri bir az da artacaq, bu nəsillər boyu davam edəcək və nəticədə sülaləmiz qanadlanıb uçacaq” deyən bir insana da inana bilərlər. Çünki hər iki hekayənin cəfəngiyyat səviyyəsi eynidir.

Bu vəziyyət əvvəldə bildirdiyimiz həqiqəti, yəni təkamülçülərin canlıların tələbatlarının sanki təbiətdəki sehirli bir güc tərəfindən təmin edildiyinə dair batil inancını üzə çıxarır. Əslində maraqlıdır ki, animizmdəki (təbiətdəki canlı və cansız bütün varlıqların şüuru və ruhu olduğu inancı) “təbiətə şüur aid etmə” inancı XXI əsrdə “elm” adı ilə qarşımıza çıxır. Halbuki darvinizmin məşhur tənqidçilərindən biri olan Fransanın məşhur bioloqu Pol Pier Qrassenin bildirdiyi kimi, **“xəyal qurmağı qadağan edən bir qanun yoxdur, amma elm bu işin içinə daxil edilməməlidir”.**

(Pierre-P Grassé, *Evolution of Living Organisms*, New York: Academic Press, 1977, səh. 103.)

İnsanlara təlqin edilmək istənilən başqa bir ssenari də sözügedən canlıların bədən səthi ilə bağlıdır. Quruda yaşayan canlılar kimi qəbul edilən *pakicetus* və *ambulocetus*un digər məməlilər kimi tüklü bədənə malik olduğu hər kəsin ortaq fikridir. Belə ki, bərpa işlərində hər iki canlı sıx tüklərlə təsvir olunmuşdur.

Ancaq daha sonrakı canlılara (yəni həqiqi dəniz məməlilərinə) keçdikdə birdən tüklər yox olur. Bunun təkamül baxımından açıqlaması yuxarıda danışdığımıza bənzər lamarkçı hekayələrdən fərqli deyil.

Həqiqət isə sözügedən canlıların hər birinin yaşadıqları mühitə görə ən uyğun şəkildə yaradılmalarıdır. Bu qüsursuz canlıları mutasiyalarla və ya daha bəsit lamarkçı hekayələrlə açıqlamağa çalışmaq ağıldankənardır. Canlılardakı hər xüsusiyyət kimi, sözügedən canlıların mükəmməl sistemləri də bu canlıları Allahın yaratdığını sübut edir.

## DƏNİZ MƏMƏLİLƏRİNİN TƏKAMÜLÜ SSENARİSİNİN QARŞISINDAKI ÇƏTİNLİKLƏR

Buraya qədər dəniz məməlilərinin quru canlılarından təkamüllə törədiyi haqqında təkamülçü ssenarinin əsassızlığını təhlil etdik. Elmi kəşflər

təkamülçülərin bu ssenarinin başlanğıcına yerləşdirdiyi iki quruda yaşayan məməli (*pakicetus* və *ambulocetus*) ilə dəniz məməliləri arasında heç bir əlaqənin olmadığını göstərir. Bəs, ssenarinin ardı?

Bu məsələdə də təkamül nəzəriyyəsi yenə çıxılmaz vəziyyətdədir. Nəzəriyyə elmi təsnifatda *archaeocetea* (arxaik, yəni qədim balinalar) kimi məlum olan nəsli kəsilmiş özünəməxsus dəniz məməliləri ilə yaşayan balina və delfinlər arasında qohumluq əlaqəsi qurmağa çalışırlar. Lakin əslində mövzu üzrə mütəxəssislər fərqli düşünürlər. Təkamülçü paleontoloq Barbara C.Stahl belə yazır:

*Bu, archaeocetealar*ın qıvraq formada olan bədənləri və özünəməxsus mişar dişləri onların dövrümüzdəki balinaların əcdadı olmadığını açıq şəkildə ortaya qoyur. (B. J. Stahl, *Vertebrate History: Problems in Evolution*, Dover Publications, Inc., 1985, səh. 489.)



**Dəniz məməliləri sanki yerləşdirildikləri xəyali rəsmlərin hər birinə üsyan edir. Gəldiyimiz nəticə tarixdə ortaya çıxan canlı qruplarının birbirlərindən müstəqil və anidən ortaya çıxmalarıdır. Bu da bütün canlıların yaradılmış olduğu gerçəyinin elmi sübutudur.**

Dəniz məməlilərinin mənşəyi ilə bağlı təkamülçü ssenari molekulyar biologiyanın kəşfləri baxımından da çıxılmaz vəziyyətdədir. Klassik təkamülçü ssenari balinaların iki böyük qrupunun, yəni dişli balinaların (*odonotoceti*) bığlı balinalarla (*mysticeti*) bir ortaq əcdaddan təkamüllə törədiyini güman edir.

Amma Brüssel Universitetindən Mişel Milinkoviç yeni bir nəzəriyyə ilə bu fikirə qarşı çıxmış, anatomik bənzərliyə əsasən qurulan fərziyyənin molekulyar kəşflər tərəfindən təkzib edildiyini belə vurğulamışdır:

*Cetaceanların (balinaların) böyük qrupları arasındakı təkamül əlaqələri morfoloji və molekulyar analizlərin çox fərqli nəticələrə aparması səbəbindən daha da problemlidir. Morfoloji və davranış xarakterli kəşflərə baxılaraq edilən ənənəvi şərhlər ekolokasiyaya malik dişli balinaların (təqribən 67 növ) və filter sistemiylə qidalanan bığlı balinaların (10 növ) iki fərqli monofilotik (öz daxilində tək mənşədən gələn) qrup olduğunu fərz edir... Digər tərəfdən, DNT üzərində aparılan filogenetik (təkamül qohumluğu) təhlilləri... və amin turşusu müqayisələri... uzun zamandan bəri qəbul edilən bu təsnifatla ziddiyyət təşkil edir. Dişli balinaların bir qrupu, yəni kaşalotlar morfoloji cəhətdən özlərindən tamamilə fərqlənən bığlı balinalara digər odontocet*lərdən (dişli balinalardan) daha yaxın görünür.

(Michel C. Milinkovitch, "Molecular phylogeny of cetaceans prompts revision of morphological transformations", *Trends in Ecology and Evolution 10*, August 1995, 328-334.)

Qısaca desək, dəniz məməliləri xəyali təkamül sxemlərinin hər birinə üsyan edirlər.

Dəniz məməlilərinin mənşəyi məsələsindəki təkamülçü təbliğat bir daha üzə çıxdığı kimi, əslində ortada həqiqi dəlillərə əsaslanan bir təkamül prosesi deyil, təkamül nəzəriyyəsinə görə sxemə yerləşdirilməyə çalışılan, amma heç cür bu sxemə uyğun gəlməyən dəlillər var.

Sübutların ön mühakiməsiz təhlil edilməsiylə ortaya çıxan nəticə budur ki, tarixdəki fərqli canlı qrupları bir-birlərindən asılı olmadan, ani surətdə ortaya çıxmışdırlar. Bu da bütün canlıların yaradıldığının elmi dəlilidir.

Məməlilər təkamül pillələrinin ən yuxarı hissəsində yerləşən canlılar kimi qəbul edilirlər. Vəziyyət belə olduğu hlada, əvvəla, bu canlıların nə üçün dəniz mühitinə keçdiyini açıqlamaq çox çətindir? Növbəti sual isə belədir: Necə olub ki, bu canlılar dəniz mühitinə balıqlardan belə daha yaxşı uyğunlaşıblar? Çünki yırtıcı balinalar, delfinlər kimi məməli və ağciyərli canlılar suda tənəffüs edən balıqlardan belə daha mükəmməl şəkildə yaşadıqları mühitə uyğundurlar.

Dəniz məməlilərinin xəyali təkamülünün mutasiya və təbii seçmə vasitəsilə açıqlana bilmədiyi olduqca açıqdır. “GEO” jurnalında dərc olunan bir məqalə dəniz məməlilərindən mavi balinanın mənşəyindən bəhs edərkən darvinizmin bu mövzudakı çarəsizliyini belə ifadə edir:

*Mavi balinalar kimi dənizdə yaşayan digər məməli heyvanların da bədən quruluşları və orqanları balıqlarınkına bənzəyir. Onların skeletləri də balıqlarınkı ilə oxşardır. Balinalarda ayaq adlandırdığımız arxa üzvlər tərs inkişaf edib yarımçıq qalmışdır. Ancaq bu heyvanların formalarını dəyişdirdikləri haqqında əldə ən kiçik məlumat belə yoxdur. Dənizə qayıdışın darvinizmin iddia etdiyi kimi, uzunmüddətli yavaş keçidlə deyil, ani sıçrayışlar şəklində olduğunu qəbul etməliyik. Paleontoloqlar dövrümüzdə balinanın hansı məməli heyvan növündən törədiyi haqqında kifayət qədər məlumata malik deyil.*

(Uwe George, "Darwinismus der Irrtum des Jahrhunderts", *Geo*, yanvar 1984, səh. 100-102.)

Quruda yaşayan kiçik məməli heyvanın təkamül prosesi nəticəsində necə olub 30 metr və 60 ton ağırlığında bir balinaya çevrildiyini düşünmək həqiqətən də çox çətindir. Darvinistlərin bu məsələdə edə biləcəkləri yeganə şey “National geographic” jurnalında dərc edilən aşağıdakı hekayədə olduğu kimi, təxəyyül güclərindən istifadə edərək ssenari uydurmaqdır:

*Balinaların əmələ gəlməsi bundan 60 milyon il əvvəl dördayaqlı və tüklü məməlilərin qida axtarmaq üçün dənizə girmələriylə başladı. Zaman keçdikcə yavaş-yavaş dəyişikliklər əmələ gəldi. Arxa ayaqlar itdi, qabaq ayaqlar üzgəclərə çevrildi, tüklər yoxa çıxaraq qalın, yumşaq, hamar balina dərisinə çevrildi, burun dəlikləri başın təpəsinə doğru yerini dəyişdi, quyruq genişlənərək balinanın firçayabənzər quyruğuna çevrildi və bədən suyun içində getdikcə böyüyərək nəhəngləşdi.*

(Victor B. Scheffer, "Exploring the Lives of Whales", *National Geographic*, cild 50, dekabr 1976, səh. 752.)

Yuxarıda bəhs olunan mərhələli təkamül ssenariləri, bu ssenarini yazanlar da daxil olmaqla heç kimi qane etmir. Biz yenə də bu uydurmanı

hərtərəfli təhlil edək və nə cür həqiqətdənkənar olduğunu mərhələ şəklində nəzərdən keçirək.

## DƏNİZ MƏMƏLİLƏRİNİN ÖZÜNƏMƏXSUS QURULUŞU

Təkamülçülərin dəniz məməliləri ilə bağlı təkamül ssenarilərinin nə qədər qeyri-mümkün olduğunu göstərən digər bəzi dəlillər də bu canlıların olduqca özünəməxsus quruluşa malik olmalarıdır. Tənəffüs üçün ağciyərlərindən istifadə edən bir məməlinin dəniz mühitində keçirməli olduğu adaptasiyaları nəzərə aldıqda belə bir keçid haqqında "qeyri-mümkün" sözü belə qənaətbəxş deyil. Belə bir keçiddə təkamül prosesi daxilində ara mərhələlərdən hər hansı birinin əksikliyi canlını həyatdan məhrum edəcək və təkamül prosesini dayandıracaqdır.

Dəniz məməlilərinə su mühitinə keçərkən lazım olan adaptasiyalar (uyğunlaşmalar) belə sıralana bilər:

**1- Suyun qorunması.** Dəniz məməliləri su mühitində yaşamalarına baxmayaraq, su ehtiyaclarını balıqlar kimi, yəni duzlu sudan faydalanaraq təmin edə bilməzlər. Yaşamaq üçün şirin suya ehtiyacları var. Dəniz məməlilərinin su mənbələri çox yaxşı məlum olmasa da, su ehtiyaclarınn böyük hissəsini tərkibində okeandakı duz nisbətinin üçdə biri qədər su olan canlıları yeyərək təmin etdikləri düşünülür. Bu qədər qıt su mənbələrinə malik olan dəniz məməliləri üçün suyun mütləq qorunması və suya qənaət edilməsi olduqca vacibdir. Elə bu səbəbdən, dəniz məməliləri dəvələrdəki kimi suyun qorunması mexanizminə malikdirlər. Eynilə dəvələr kimi dəniz məməliləri də tərləmirlər. Böyrəklər sidiyi insanlardan daha yaxşı şəkildə toplayaraq onlara su qazandırır. Beləliklə, su itkisi ən az səviyyədə olur. Suya qənaət ən kiçik detallarda belə özünü göstərir. Məsələn, ana balina balasını pendir qatılığında olan südlə bəsləyir. Bu süd insan südündən 10 dəfə yağlıdır. Südün bu qədər yağlı olmasının bəzi kimyəvi səbəbləri var. Yağ bala tərəfindən qəbul edildikdən sonra orqanizmdəki parçalanma prosesi nəticəsində su meydana gəlir. Beləliklə, ana az su itkisiylə balasının su ehtiyacını təmin edir.



Dəniz məməliləri özlərinə məxsus xüsusiyyətlərə sahibdirlər. Bu canlılar yaşadıqları mühitə ən uyğun şəkildə yaradılmışlar.

**2- Görmə və xəbərləşmə.** Delfinlərin və balinaların gözləri fərqli yönlərdə görməyə imkan verən formadadır. Suyun altında və üzərində eyni dərəcədə mükəmməl şəkildə görə bilirlər. (halbuki insan da daxil olmaqla bir çox canlı işığın qırılmasındakı fərqlərə görə öz təbii mühiti xaricində yaxşı görə bilmir). Bir delfin suyun 6 metrə qədər üzərinə tullana bilir və havada onun üçün tutulan qidanı həssaslıqla ala bilir.




**BİR-BİRİNDƏN ƏMƏLƏ GƏLDİYİ İDDİA EDİLƏN CANLILAR ARASINDA BÖYÜK MORFOLOJİ FƏRQLƏR**

**Buraya qədər müxtəlif canlı növlərinin heç bir "aralıq keçid forması" olmadan yer üzündə anidən meydana çıxdıqlarını araşdırdıq. Canlılar fosil qeydlərində bir-birlərindən o qədər fərqli xüsusiyyətlərlə ortaya çıxırlar ki, aralarında hər hansı bir təkamül əlaqəsi qurmaq mümkün deyil.**

**Təkamülçülərin bir-birlərinin atası olaraq qəbul etdikləri canlıların skeletlərini müqayisə etdikdə bu həqiqət cox açıq şəkildə görünür. Bir-birinin atası olaraq irəli sürülən canlılar arasında son dərəcə böyük fərqlər var.**

**Burada bəzi nümunələri nəzərdən keçirəcəyik. Rəsmlərin hamısı onurğalı canlılara aid ən əsas təkamülçü mənbələrdən götürülmüşdür.**

**İki ayrı cinsə aid dəniz sürünəni və təkamülçülərə görə bu canlıların ən yaxın atası olan quru canlısı. Canlılar arasındakı böyük fərqlərə fikir verin.**




**Bilinən ən qədim quş (Archaeopteryx), uçan sürünən və təkamülçülərə görə bu canlıların ən yaxın qohumu sayılan quru sürünəni. Canlılar arasında fərq yenə də çox böyükdür.**




**Bilinən ən qədim yarasa və təkamülçülərə görə yarasaların ən yaxın atası. Yarasa ilə "atası" arasındakı böyük fərqə diqqət edin.**

Dəniz məməlilərinin gözü ilə quruda yaşayan canlıların gözü həddindən artıq fərqli xüsusiyyətlərə malikdir. Quruda gözü gözləyən təhlükələr fiziki zərbələr və tozdur. Bu səbəbdən quruda yaşayan heyvanların göz qapaqları var. Su mühitində isə ən böyük təhlükələr duzluluq nisbəti, dərinliklərə dalarkən meydana gələn təzyiq və dəniz axınlarının əmələ gətirdiyi zərərlərdir. Axınlarla birbaşa təmas olmaması üçün gözlər başın yan tərəfindədir. Bundan əlavə, dərinlərə daldıqda gözü təzyiqə qarşı qoruyan sərt təbəqə də var. 9 metr dərinlikdən sonra dənizin dibi qaranlıq olduğu üçün su məməlilərinin gözü qaranlıq mühitə uyğunlaşan bir çox xüsusiyyətlərə malikdir. Göz bülluru mükəmməl dairə formasındadır. İşığa həssas olan çöpcüklər rənglərə və detallara qarşı həssas olan kolbacıqlardan daha çoxdur. Habelə gözlərdə xüsusi fosforlu təbəqə var. Bu səbəbdən, dəniz məməlilərinin qaranlıq mühitlərdə görmə qabiliyyəti güclüdür.

**Ən qədim Plesiosaurun skeleti**





**Eosen dövrünə aid ən qədim balinalardan biri Zigorhiza**

**Ən qədim dəniz sürünəni (Plesiosaur) və onun təkamülçülərə görə ən yaxın əcdadı hesab edilən quru sürünəni. Canlılar arasında heç bir oxşarlıq yoxdur.**



**Eosen dövrünə aid ən qədim balinalardan biri Zigorhiza**

**Balinaların əcdadı mövzusu təkamülçü mənbələr arasında mübahisə mövzusudur. Ancaq bəziləri qədim bir məməli qrupu olan Creodontlarda qərarlıdır. Yan tərəfdə Greodontların bir növü olan Sinopa**

**Ən qədim balina və onun təkamülçülərə görə ən yaxın əcdadı. Canlılar arasında heç bir oxşarlığın olmamasına diqqət edin. Təkamülçülərin balinalarn əcdadı olaraq təqdim etdikləri ən uyğun namizəd belə bu qədər fərqli canlıdır.**

Amma dəniz məməlilərin ilkin duyğuları görmə deyil. Quru məməlilərinin əksinə, onlarda eşitmə daha vacibdir. Görmə üçün işıq lazımdır, amma eşitmə üçün belə bir ehtiyac yoxdur. Bir çox balina və delfin dəniz dibindəki qaranlıq ərazilərdə bir növ təbii "sonar" sayəsində qida tapır. Xüsusilə dişli balinalar səs dalğaları vasitəsilə "görürlər". Səs dalğaları eynilə görmə prosesində olduğu kimi fokuslanır və bir nöqtəyə göndərilir. Geri qayıdan dalğalar heyvanın beynində təhlil edilir və şərh olunur. Bu yolla heyvan qarşısındakı cismin formasını, ölçüsünü, sürətini və mövqeyini açıq şəkildə müəyyən edir. Bu canlılardakı radar sistemi inanılmaz dərəcədə həssasdır. Məsələn, bir delfin suya tullanan bir şəxsin "daxilini" də hiss edə bilir. Səs dalğaları istiqaməti müəyyən etməklə bərabər xəbərləşmə üçün də istifadə edilir. Bir-birindən yüz kilometrlərlə aralıqdakı iki balina səs vasitəsilə xəbərləşirlər.

***Bu heyvanların xəbərləşmək və*** istiqaməti müəyyən etmək üçün səsi necə çıxardıqları hələ də məlum deyil. Ancaq delfinin bədənindəki maraqlı bir təfərrüat diqqət çəkir: heyvanın kəllə sümüyünün quruluşu beynini dağıdacaq qədər güclü və fasiləsiz səs bombardmanından qorunmaq üçün izolyasiyalıdır.



**Miocene dövrünə aid ən qədim Suiti skeleti**



**Təkamülçülərin suitinin quruda yaşayan ən yaxın əcdadları olaraq qəbul etdiyi məməli Cynodictis gregarius**

**Suiti skeleti və təkamülçülərə görə suitinin quruda yaşayan ən yaxın əcdadı. Yenə də canlılar arasında böyük fərq var.**



**Oligocene dövrünə aid ən qədim siren Halitherium**



**Sirenlərin daxil olduğu sirenian sinfinə aid dəniz məməlilərinin ən yaxın əcdadı hesab edilən Hyrax**

**Siren və təkamülçülərə görə onun quruda yaşayan ən yaxın əcdadı.**

İndi bütün bunların üzərində düşünək. Dəniz məməlilərinin malik olduğu bütün bu heyranedici xüsusiyyətlər təkamül nəzəriyyəsinin iki yeganə mexanizmi, yəni mutasiya və təbii seçmə vasitəsilə əmələ gələ bilərmi? Hansı mutasiya bir delfinin bədəninə radar sistemini yerləşdirə bilər və sonra da heyvanın beynini radardan qorumaq üçün kəllə sümüyünü izolyasiya edər? Hansı mutasiya bu canlılara qaranlıq sularda görmələrini təmin edən göz quruluşu qazandıra bilər? Hansı mutasiya əvvəlcə quruda yaşadıqları irəli sürülən bu heyvanların "suya keçidlərini" təmin edə bilər? Hansı mutasiya bu heyvanların bədənlərinə sudan ən qənaətli şəkildə istifadə etmək üçün həssas mexanizmlər yerləşdirə bilər?

Bu cür yüzlərlə sual vermək mümkündür. Təkamülün bunların heç birinə verəcək cavabı yoxdur. Balıqların sularda "təsadüfən" əmələ gəldiklərini, sonra yenə təsadüflər nəticəsində quruya çıxıb təkamüllə sürünənlərə və məməlilərə çevrildiklərini, daha sonra bu məməlilərin yenidən suya qayıdaraq suda yaşamaq üçün lazımi xüsusiyyətləri təsadüfən qazandıqlarını irəli sürən, bütün bu fantastik hekayəni yazan təkamül nəzəriyyəsi bu mərhələlərdən hansını sübut edə bilər? Heç bir cavab qənaətbəxş deyil. Təkamül nəzəriyyəsi bu mərhələlərin baş verdiyini sübut etməyi bir yana qalsın, heç bunların baş verməsi üçün ən kiçik ehtimalın olduğunu belə sübut edə bilmir.

Buraya qədər təhlil etdiyimiz bütün tapıntılar göstərir ki, canlı növləri yer üzündə heç bir təkamül prosesi olmadan, ani surətdə və qüsursuz şəkildə üzə çıxmışlar. Bu vəziyyət- təkamülçü bioloq Duqlas Futuymanın **"Əgər canlılar dünyada tam və mükəmməl şəkildə ortaya çıxmışdırlarsa, onda üstün bir ağıl tərəfindən yaradılmalıdırlar"** deyərkən qəbul etdiyi kimi (Duglas J. Futuyma, *Science on Trial*, New York: Pantheon Books, 1983, səh. 197.) canlıların yaradıldıqlarının konkret sübutudur.

Təkamülçülər isə canlı növlərinin yer üzündə müəyyən sıra ilə ortaya çıxdıqlarını, təkamül keçirdiklərinin göstəricisi kimi izah etməyə çalışırlar. Lakin əslində canlıların yer üzündə üzə çıxma ardıcıllığı ortada heç bir təkamül olmadığına görə "yaradılış ardıcıllığıdır". Fosillər yer üzünün üstün və qüsursuz yaradılışla, əvvəlcə dənizlərdə, daha sonra quruda yaşayan canlılarla doldurulduğunu və bütün bunların ardınca insanın yaradıldığını göstərir.

## TƏKAMÜLÇÜLƏRİN TAPILAN SKELET QALIQLARI MƏLUMATLARINA AİD YALANÇI ŞƏRHLƏRİ

İnsan təkamülü əfsanəsinin təfərrüatını araşdırmadan öncə cəmiyyətin əsas hissəsinin yarımeymun-yarıinsan varlığın mövcud olması ilə razılaşdığı təbliğat metodlarına toxunmaq lazımdır. Bu təbliğat metodu arxeoloji tapıntılar əsasında düzəldilmiş "rekonstruksiyalardan" ibarətdir. Rekonstruksiya - "bərpa olunma", yəni heyvanın yalnız bir sümüyü tapıldığı halda onun rəsminin və ya maketinin düzəldilməsi deməkdir. Sizin bəlkə də qəzetlərdə, jurnallarda yaxud da filmlərdə gördüyünüz meymunabənzər insan

rekonstruksiya yolu ilə düzəldilib. Əksər hallarda daşlaşmış qalıqlar dağınıq və natamam halda tapılır və buna görə də bunlara arxalanaraq nəyisə zənn etmək xəyala qapılmaq kimi bir şeydir. Bu səbəbdən təkamülçülərin bu qalıqlar əsasında həyata keçirdiyi rekonstruksiyalar təkamül ideologiyasının tələblərinin yerinə yetirilməsinə yönəldilib. Harvard Universitetinin antropoloqu Devid Pilbim bu faktı xüsusilə vurğulayır: "Paleoantropologiya sahəsində nəzəriyyə hər zaman səhih faktlar üzərində üstünlük qazanıb".

(David Pilbeam, "Rearranging Our Family Tree", *Nature*, Haziran 1978, s. 40)



**(Soldakı şəkil)**
**Steven M. Stonley (Human Origins) tərəfindən çəkilmiş şəkil**

**(Sağdakı şəkil)**
**Mourice Vilson (From Age to Adam: the Search for the Ancestry of man) tərəfindən çəkilmiş şəkil**

Rekonstruksiyaların məqsədi təsir altına daha asanlıqla düşən insanların görmə hisslərinə nüfuz etməkdən ibarətdir və beləliklə də onları bu məxluqların keçmişdə var olmasına inandırmaqdır. Burada onu da vurğulamaq lazımdır ki, sümük qalıqlarının üzərində aparılan tədqiqatlar nəticəsində konkret obyektin yalnız ümumi cizgilərini müəyyən etmək olar. Xassələrin daha müfəssəl müəyyən olunması üçün parçalanmaya tez məruz qalan yumşaq toxumaların olması labüddür. Təkamül tərəfdarı yumşaq toxumaya öz mülahizəsi ilə istədiyi formanı asanlıqla verə bilər. Harvard Universitetindən Ernst A.Xuten bu halı belə izah edir:

*"Yumşaq toxumaların "təkrar istehsalı" çox riskli bir işdir. Dodaqların, gözlərin, qulaqların və burun kimi orqanların onların altında yerləşən sümüklə heç bir əlaqəsi yoxdur. Yəni siz neandertal insanın kəlləsini hər hansı bir meymunun və ya filosofun başına eyni uğurla oxşada bilərsiniz. Qədim insanların qalıqlarına əsaslanan bu cür rekonstruksiyalar heç bir elmi dəyər daşımır və onlardan xalq kütləsini idarə etmək üçün istifadə olunur. Buna görə də onlara etibar etməyə dəyməz".*

(Earnest A. Hooton, *Up From The Ape*, New York: McMillan, 1931, s. 332)

## EYNİ BİR KƏLLƏDƏN İSTİFADƏ OLUNMAQLA HAZIRLANAN ÜÇ MÜXTƏLİF ŞƏKİL




1) 1964-cü il, aprelin 5-də "Sunday times" qəzetində nəşr olunan şəkil Moris Uilson tərəfindən çəkilmiş şəkil

2) Steven M. Stonley (Human Origins) tərəfindən çəkilmiş şəkil

3) N. Parker tərəfindən çəkilmiş və "National Geographic" jurnalında 1960-cı ilin sentyabr ayında nəşr olunmuş rəsm




1) Junior Larousse Təməl Bilik Ensiklopediyası, cild 1 səh. 94

2) Geheimnisse Der Urzeit, Tiere und Menschen (Tarixdən əvvəlki heyvanların və insanların sirləri), səh. 200

3) Junior Larousse Təməl Bilik Ensiklopediyası, cild 1 səh. 96

National Geographic, mart 1996-cı il




**Uydurulmuş şəkillər: təkamülçülər öz nəzəriyyəsini isbat etmək üçün bilərəkdən özlərinə sərfəli olan görkəmi insanın qalıqlarda qalmayan forma və xassələrinə verirdilər, məsələn, burunun və dodaqların quruluşu, saçlar və saç düzümü, qaşların forması. Bundan əlavə, onlar tərəfindən uydurulmuş məxluqlar ailə çevrəsində, ovda və həmçinin gündəlik həyatın başqa epizodlarında təsvir olunurdular. Ancaq bu şəkillər yalnız fantaziyanın məhsuludur. Təkamülçülərin rekonstruksiyalarını təsdiq edən bir dənə də qədim insan qalıqları tapılmayıb.**

## TƏKAMÜL SAXTAKARLIQLARI

Kütləvi informasiya vasitələri və elmi qaynaqlar tərəfindən təlqin olunan "meymunabənzər insan" surəti əslində arxeoloji tapıntılarla heç cürə təsdiq olunmur. Təkamülçülər uydurulmuş məxluqların rəsmlərini çəkirlər, ancaq bu məxluqların həqiqiliyini təsdiq edən qalıqların olmaması onları bərk narahat edir. Bu problemin "həlli üçün" onlar maraqlı metoddan - tapılmamış qalıqların "istehsalı" metodundan istifadə edirlər. Həmin metodun nümunələrindən biri elm tarixində böyük qalmaqala səbəb olmuş Piltdaun adamıdır.

## PİLTDAUN ADAMI: ORANQUTANIN ÇƏNƏ SÜMÜYÜ İNSANIN KƏLLƏSİNDƏ!

1912-ci ildə məşhur həkim və eyni zamanda həvəskar paleontoloq Çarlz Douson İngiltərədə Piltdaun ətrafındakı dərədə çənə sümüyü və kəllənin bir hissəsini aşkar etmişdi. Çənə sümüyü meymunun çənəsinə bənzəsə də dişlər və kəllə insanınkına oxşayırdı. Bu eksponatın yaşı 500 min il təyin olunmuş və o, "Piltdaun adamı" adlandırılmışdı. Bundan sonra bu nümunə müxtəlif muzeylərdə insan təkamülünün təkzibolunmaz sübutu kimi nümayiş etdirilirdi. 40 ildən artıq vaxt ərzində bu eksponata elmi məqalələr, müxtəlif şərhlər və rəsmlər həsr olunmuş, dünya universitetlərinin 500-dən artıq elmi işçisi "Piltdaun adamı" mövzusunda doktorluq dissertasiyaları hazırlamışdılar. (Malcolm Muggeridge, The End of Christendom, Grand Rapids, Eerdmans, 1980, s. 59)

Məşhur amerikalı paloeantropoloq Q.F.Osborn 1935-ci ildə Britaniya Muzeyinə gəlişi zamanı belə demişdi: "Təbiət sürprizlərlə doludur və bu vacib tapıntı bəşəriyyətin tarixə qədərki dövrünə aiddir".

(Stephen Jay Gould, "Smith Woodward's Folly", New Scientist, 5 Nisan 1979, s. 44)

Britaniya Muzeyinin paleontologiya şöbəsindən Kennet Okli 1949-cu ildə bəzi qalıqlar üzərində yaşı təyin etmənin yeni metodundan istifadə etmək fikrinə düşdü. Bu metod "Piltdaun adamı" üzərində də sınaqdan keçirildi. Nəticə heyrətamiz oldu. Testin nəticələri ilə aydın oldu ki, Piltdaunun çənə sümüyünün tərkibində flüor yoxdur, bu isə öz növbəsində sümüyün yerin altında bir neçə ildən çox qalmamasından xəbər verirdi.

Özündə flüorun kiçik miqdarını daşıyan kəllə çox güman ki, bir neçə min il yer altında qalmışdı. Həmin metod əsasında həyata keçirilən sonrakı xronoloji tədqiqatlar kəllənin yaşının həqiqətən də cəmi bir neçə min il olmasını təsdiq etdi. Qalıqların yanında tapılan alətlər isə polad alətlərlə yonulmuşdu və məlum olmuşdu ki, bunlar adi saxtakarlıqdır.

(Pat Shipman, "Birds Do It... Did Dinosaurs?", *New Scientist,* 1 Şubat 1997, s. 28)

Bu saxtakarlıq Veynerin 1953-cü ildə apardığı müfəssəl analizlərdən sonra birmənalı şəkildə üzə çıxmışdır. **Kəllə 500 il əvvəl yaşamış insana, çənə sümüyü isə təzəcə ölən oranqutana məxsus idi.** Dişlər xüsusilə seçilmiş və onları sonralar insan dişlərinə bənzətmək üçün əvvəlcədən cilalanmış diş yuvalarına quraşdırıb keçirmişdilər. Detallara qədimdən qalma görkəmi vermək üçün kalium dixromatin köməyi ilə ləkələr çəkilmişdi.

Lakin sümükləri turşuya salandan sonra ləkələr yox olurdular. Saxtakarlığı aşkar etmiş qrupdan Le Qross Klark öz təəccübünü gizlətmədən deyirdi: **"Dişlərin üzərindəki süni izlər aydın görünür və maraqlıdır, onlar necə diqqətdən kənar qalıblar".** (Pat Shipman, "Birds Do It... Did Dinosaurs?", *New Scientist*, 1 Şubat 1997,) 40 ildən artıq vaxt ərzində Britaniya Muzeyində saxlanılan "Piltdaun adamı" bütün bunlardan sonra tezliklə oradan yığışdırıldı.

**Qazıntı halında tapılan qalıqlar Çarlz Douson tərəfindən aşkar edilmiş və ser Artur Vudvorda verilmişdi.**






**"Məşhur" kəllə iki müxtəlif qalığın vahid konstruksiya şəklində quraşdırılması ilə əldə olunmuşdur. İnsan kəlləsinin hissəsi > Oranqutanın çənə hissəsi**

**Kəllənin bu modelinə müvafiq olaraq sonralar rekonstruksiyalarının və rəsmlərin çoxsaylı surəti hazırlanmış, 500-dən artıq elmi məqalə yazılmışdır. Quraşdırılmış kəllənin əsli Britaniya Muzeyində sərgiyə qoyulmuşdu.**





**Bu tapıntıdan 40 il sonra Piltdaun qalıqlarının sadəcə olaraq saxta olması elan edilmişdi.**

# NEBRASKA ADAMI: DONUZ DİŞİ

1922-ci ildə Amerikanın Təbiət Tarix Muzeyinin direktoru Henri F.Osborn Qərbi Nebraskada İlan çayının yaxınlığında pliosen dövrünə aid olan azı diş qalığının tapılması haqqında məlumat vermişdi. İddiaya görə, diş özündə meymunun və insanın ümumi səciyyəvi xüsusiyyətlərini daşıyırdı. Geniş elmi diskussiyalar özünü çox gözlətmədi. Bəziləri deyirdi ki, bu diş pitekantropun dişidir, bəziləri isə bildirirdi ki, insanın. Qızğın mübahisələr bitdi, mübahisələrin səbəbkarını isə "Nebraska adamı" adlandırdılar. Bundan dərhal sonra onun elmi adı da qoyuldu - Hesperopithecus haroldcooki. Çox nüfuzlu alimlər Osbornu müdafiə etdilər. Cəmi bir dişin əsasında Nebraskanın kəllə və bədəninin rekonstruktiv rəsmləri çəkildi. Sonra isə onun ailə çevrəsində həyat yoldaşı və uşaqları ilə birlikdə şəkilləri dərc olundu.



1922-ci il, iyun ayının 24-də "İllustrated London News" jurnalında çap olunmuş bu rəsm yalnız bir dişin əsasında çəkilmişdi. Lakin bu dişin nə insana, nə də meymunabənzər məxluqa aid olmadığı, onun yalnız nəsli kəsilmiş donuz növünə məxsus olması məlum olanda təkamülçülər dərindən məyus olmuşdular.



Donuz dişi

Bütün bu ssenari yalnız bir dişin əsasında qurulmuşdu. Təkamülçülər bu xülyaya o qədər bağlanmışdılar ki, tədqiqatçı Uilyam Brayan tez-tələsik qərarların qəbul olunmasının əleyhinə çıxış edəndə təkamülçülərin çox kəskin tənqid atəşinə məruz qalmışdı.

Lakin 1927-ci ildə skeletin digər hissələri aşkar olundu. Yeni tapılmış hissələrə əsasən diş nə insana, nə də meymuna məxsus deyildi. Məlum oldu ki, diş nəsli kəsilmiş Amerika qabanı (çöl donuzu) növü olan "Prodthennops"a məxsus imiş. Uilyam Qreqorun bu səhvə aid məqaləsi "Science" jurnalında "Göründüyü kimi Hesperopithecus nə meymundur, nə də insan" başlığı ilə çap olunmuşdu. (Roger Lewin, "Bones of Mammals, Ancestors Fleshed Out", *Science*, cilt 212, 26 Haziran 1981, s. 1492) Axır nəticədə Hesperopithecus haroldcooki-nin və onun ailəsinin bütün rəsmləri ədəbiyyatdan çıxarıldı.

## OTA BENQA: QƏFƏSƏ SALINMIŞ AFRİKA ABORİGENİ

Darvinin *"İnsanın mənşəyi"* kitabında insanın meymunabənzər məxluqdan törəməsi iddiasından sonra bu ssenarinin təsdiqlənməsi üçün qalıqların axtarışına başlanmışdı. Amma bəzi təkamülçülər inanırdılar ki, təkcə meymunabənzər insanın qalıqları deyil, həmçinin canlı fərdlər də dünyanın müxtəlif qitələrində tapılacaqdır. XX əsrin əvvəllərində "canlı keçid formasının" axtarışları vəhşilik dərəcəsinə çatmışdı. Bu vəhşiliyin nümunəsi 1904-cü ildə Konqoda təkamülçü tədqiqatçı Semyuel Verner tərəfindən tutulmuş Ota Benqa adlı piqmeyin (cırtdanın) əhvalatıdır. Ota Benqa adı onun öz dilində "dost" mənasını daşıyırdı. O, evli idi və iki uşağı var idi. O, zəncirlənib heyvan kimi qəfəsə salınmış və Amerikaya Müqəddəs Luis adına dünya sərgisinə yola salınmışdı. Yerli təkamülçü alimlər onu meymunların müxtəlif növləri ilə birlikdə bir qəfəsə salıb insana ən yaxın olan "keçid forması" kimi nümayiş etdirirdilər.




İki ildən sonra onun yerini dəyişib Nyu-Yorkun Bronks zooparkında şimpanze, Dinah qorillası, Dohunq oranqutanı ilə birlikdə yerləşdirib insanın qədim əcdadı kimi təqdim etdilər. Zooparkın müdiri təkamülçü həkim Uilyam T.Honedey öz məruzələrində belə nadir keçid formasının öz zooparkında olmasının şərəfi haqqında tez-tez danışır, zooparka gələn adamlar isə Ota Benqa ilə heyvanla davranırmış kimi rəftar edirdilər. Ota Benqa sonda alçaldılmalara, təhqirlərə və rüsvayçılığa dözməyərək intihar etdi. (George Gaylord Simpson, *Life Before Man*, New York: Time-Life Books, 1972, s. 42)

Piltdaun, Nebraska və yaxud Ota Benqa... Bütün bu qalmaqallar təkamülçülərin öz məqsədlərinə çatmaq və öz nəzəriyyələrini isbat etmək naminə "məqsəd vasitəni doğruldur"

prinsipinə əsaslanaraq hər bir yanlış elmi metodlardan istifadə etməsindən xəbər verir.

Məhz bu nöqteyi-nəzərdən insan təkamülü əfsanəsinin belə demək mümkünsə, başqa "sübutlarına" baxdıqda oxşar vəziyyətlə qarşılaşmaq olar: uydurma dolu hekayələr və onların yaşaması uğrunda hər şeyə hazır olan könüllülər dəstəsinin mövcudluğu göz qabağındadır.

## İNSANIN TƏKAMÜLÜ SSENARİSİ

Biz əvvəlki mövzulardan belə nəticəyə gəlirik ki, təbiətdə canlı orqanizmlərin təkamülünə imkan yaradan mexanizm mövcud deyil; canlıların bütün növləri təkamül prosesi nəticəsində yox, biz onları tanıdığımız kimi, bir-birindən asılı olmadan yaradılmışlar. Buradan da aydındır ki, "insanın təkamülü" həyata keçməsi qətiyyən mümkün olmayan uydurmadır. Bəs müxtəlif hekayələr uyduran təkamülçülər bu zaman nəyə əsaslanırlar? Onların istinad nöqtəsi istədikləri kimi şərh edə bildikləri skelet qalıqlarının bolluğu olmuşdur. Tarix boyu 6000-dən çox meymun növü yaşamışdır. Meymunların əksəriyyətinin nəsli kəsilmiş və müasir dövrə meymunların yalnız 120 növü gəlib çatmışdır. Təkamülçülər nəsli kəsilmiş meymunların kəllələrindən və sümüklərindən özlərinə sərfəli şəkildə istifadə edib onları boy sırası ilə kiçikdən böyüyə qədər bir cərgəyə düzmüş və bu sıraya nə vaxtsa nəsli kəsilmiş insan irqinə mənsub kəllələri də əlavə etmişlər. Beləliklə də "insanın təkamülü" ssenarisi yaranmışdır. Bu ssenariyə görə, insanlar və bugünkü meymunlar ümumi əcdaddan törəmişlər. Zaman keçdikcə bu məxluqlar təkamül prosesinə məruz qalıblar, bunun nəticəsində onların bir hissəsindən meymunlar, digər hissəsindən isə insanlar əmələ gəlib. Lakin bütün paleontoloji, anatomik və bioloji məlumatlar təkamül nəzəriyyəsinin bu və ya başqa iddialarının əsassız və köhnəlmiş olmasından xəbər verir.



Saxtakarlıqlar, faktların təhrif edilməsi, aldatmalar, uydurulmuş rəsm və şərhlər istisna olmaqla meymunla insan arasında olan qohumluq əlaqəsinə aid hər hansı bir əhəmiyyətli dəlil-sübut yoxdur. Skelet qalıqları da sübut edir ki, tarix boyu insanlar insan, meymunlar isə meymun olaraq qalmışlar. Təkamül nəzəriyyəsi tərəfdarları tərəfindən insanların "əcdadı" kimi təqdim olunan bəzi qalıqları təxminən 10 min il bundan əvvəl yaşamış, lakin sonradan nəsli kəsilmiş qədim insan irqlərinə məxsusdur. Həmçinin müasir dövrdə elə xalqlar var ki, onların fiziki quruluşu və xüsusiyyətləri nəsli kəsilmiş insan irqlərinə bənzəyir. Ən əsası isə insanlar və meymunlar anatomik cəhətdən çox fərqlənirlər və onlar təkamül prosesi nəticəsində əmələ gələ bilən irqlərdən deyillər. Bu cür fərqlərdən biri "dik yerimə"dir. Dik yerimə yalnız insanlara xasdır və insanları digər canlı məxluqlardan fərqləndirən ən vacib xüsusiyyətlərdən biridir.

## İNSANIN UYDURULMUŞ NƏSİL AĞACI

Darvinizmə görə, müasir insanlar meymunabənzər məxluqlardan yaranmışlar. 4-5 milyon il bundan əvvəl başlayan prosesin gedişində meymunla insan arasında "keçid formaları"nın olması zənn edilir. Uydurulmuş ssenaridə dörd əsas "kateqoriya" sadalanır:

1. **Australorithecus - (avstralopitek)**
2. **Homo habilis - (bacarıqlı insan)**
3. **Homo erectus - (dikyeriyən insan)**
4. **Homo sapiens - (şüurlu insan)**

Təkamülçülər insanın belə demək mümkünsə, ilk meymunabənzər əcdadı zənn etdikləri canlını "cənub meymunu" mənasına gələn **"Australorithecines"** adlandırırdılar. Əslində isə bu canlı nəsli kəsilmiş meymun növündən başqa bir şey deyildi. Australorithecines-lər müxtəlif - bəziləri iri, digərləri isə daha xırda və zərif bədən quruluşlu olurlar. Təkamülçülər insanın təkamülünün növbəti mərhələlərini "***homo***", yəni "insan" adlandırdılar. İddiaya görə, homo silsiləsindən olan məxluqlar Australorithecines-lə müqayisədə daha çox inkişaf etmişdilər.

Təkamülçü nəşrlərdə və dərs vəsaitlərində tez-tez rast gəldiyimiz **"Yava insanı"**nı, **"Pekin insanı"**nı, **"Lucy"** adlanan skelet qalıqlarını yuxarıda sadalanan növlərin birinə aid etmək olar. Bu növlərin həmçinin yarımnövlərə bölünməsi güman edilir.

Təkamülçülər Australorithecus - Homo habilis - Homo erectus - Homo sapiens ardıcıllığını irəli sürməklə elə bir təsəvvür yaratmaq istəyirdilər ki, sanki hər bir növ ondan sonra gələn növün əcdadı olmuşdur. Bununla belə antropoloqların son tədqiqatları Australorithecus, Homo habilis və Homo erectus növlərinin eyni zamanda, lakin dünyanın ayrı-ayrı yerlərində yaşadığını təsdiq edir. Həmçinin Homo erectus sinfinə aid edilmiş insanlar lap müasir dövrə qədər Homo sapiens Neandertalensis və Homo sapiens sapiens-lə (müasir insanla) yanaşı eyni dövrdə, yan-yana yaşamışlar. Yəni həmin fakt bu canlıların bir-birinə əcdad olması iddiasını aydın və qəti surətdə təkzib edir.




**Təkamülçülərin Yeganə Ilham Qaynağı Çənə Sümüyü Olmuşdur**

**Ramapitekin (ramapitnekus) ilk tapılan qalıqları ikihissəli natamam çənədən ibarət idi (bax: sağdakı şəkil). Ancaq təkamülçü rəssamlar heç utanmadan yalnız bu iki qalıqlara əsaslanaraq o saat ramapiteki, onun ailəsini və yaşam mühitini təsvir etmişdilər. "Keçid forma"sı olması iddia edilən ramapitekin və başqa məxluqların adi meymunlar olması sübuta yetirildikdə onlar təkamülçülər tərəfindən heç bir izahat gətirilmədən, tələm-tələsik şəkildə insanın nəsil şəcərəsindən kənar edildilər.**

Nəticədə bu sahədə olan bütün elmi məlumatlar, tədqiqatlar və təkamülçülər tərəfindən təqdim olunan skelet qalıqları insanın heç vaxt təkamül prosesinə məruz qalmadığından xəbər verir. Bu qalıqların bir hissəsi meymun növlərinə, digər hissəsi isə müxtəlif insan irqlərinə məxsusdur. Bəs onda qalıqların hansıları insanlara, hansıları meymunlara məxsusdur? Və bunlardan hansısa birini "keçid forması" saymaq olarmı? Bu suallara cavab tapmaq üçün kateqoriyaları ardıcıllıqla nəzərdən keçirək.

## AVSTRALOPİTEK MEYMUNLARIN BİR NÖVÜDÜR

Birinci kateqoriyaya aid edilən avstralopitek "cənub meymunu" deməkdir. Hesab edilir ki, bu məxluqlar 4 milyon il bundan əvvəl Afrikada yaşamış və onların nəsli eramızdan 1 milyon il əvvəl kəsilmişdir.

*Avstralopiteklər* arasında fərqlər var. Onların ən qədim növü A.afarensis sayılır, sonra daha xırda sümüklü A.afrikanus və daha iri sümüklü A.robustus gəlir. Bəzi tədqiqatçıların fikrincə, A.boissesi ayrı növdür, digərləri isə iddia edirlər ki, bu, A.robustusun yarımnövüdür.

**Avstralopiteklərin bütün növləri müasir meymunlara bənzəyən nəsli kəsilmiş meymunlardır.** Bütün bu növlərin beyninin həcmi şimpanzenin beyninin həcmi ilə ya eynidir, ya da daha kiçikdir. Əllərdə və ayaqlarda ağaclara dırmaşmaq üçün çıxıntılar var, arxa pəncələr isə hər hansı predmeti qucaqlamaq xüsusiyyətinə malikdir, boyları qısadır (maksimum 130 sm) və avstralopiteklərin erkəkləri müasir meymunlarda olduğu kimi, dişilərdən iri olmuşdur. Kəllə quruluşunda mövcud olan çoxsaylı oxşarlıqlar, bir-birinə yaxın yerləşən gözlər, iti azı dişləri, çənənin forması, uzun əllər və qısa ayaqlar sübut edir ki, bu meymunlar müasir həmcinslərindən heç nə ilə fərqlənmir.

Bu halda təkamül nəzəriyyəsi tərəfdarlarının iddiası ondan ibarətdir ki, avstralopiteklərin anatomik cəhətdən meymunlara bənzəməsinə baxmayaraq onlar insan kimi dik yerimə qabiliyyətinə malikdir və buna digər meymunlar arasında rast gəlinmir. Meymunların "dik yeriməsi" haqqında olan fərziyyələr onilliklər boyu Riçard Liki və Donald Cohanson kimi təkamülçü paleoantropoloqlar tərəfindən müdafiə olunurdu.

*Buna baxmayaraq bir çox alimlərin avstralopitek skeleti üzərində apardığı saysız-hesabsız tədqiqatlar nəticəsində təkamülçülərin bu iddiasının doğru olmadığı məlum olmuşdur. Avstralopitekin skelet qalıqları üzərində böyük həcmdə iş aparan İngiltərənin və Amerikanın ən məşhur anatomları lord Solli Sukkerman və professor Çarlz Oksnard müəyyən etmişlər ki, bu canlılar müasir meymunlar kimi yerimişlər. İngiltərə hökumətinin köməyi ilə tərkibində 15 il ərzində bu canlıların sümükləri üzərində tədqiqat aparan lord Sukkermanın da olduğu beş nəfərdən ibarət qrup təşkil edilmişdi. Sukkermanın özü təkamül nəzəriyysi tərəfdarı olsa da o, belə nəticəyə gəlmişdi ki, avstralopitek dik yerimə xüsusiyyəti olmayan meymun növlərindən biridir.* (Solly Zuckerman, *Beyond The Ivory Tower,* New York: Toplinger Publications, 1970, ss. 75-94) *Bu sahədəki işləri ilə tanınmış təkamülçü anatom Çarlz Oksnard isə avstralopitekin və müasir oranqutanın skeletləri arasında oxşarlıqlar*

*müəyyən etmişdi.* (Charles E. Oxnard, "The Place of Australopithecines in Human Evolution: Grounds for Doubt", *Nature*, Cilt 258, s. 389)

*1944-cü ildə İngiltərənin Liverpul Universitetinin bir qrup alimi son nəticəyə gəlmək üçün avstralopitekin skeleti üzərində ətraflı tədqiqatlar aparmışdı. Yekun nəticə budur: "Avstralopiteklər dördayaqlılardır".* (Fred Spoor, Bernard Wood & Frans Zonneveld, "Implications of Early Hominid Labyrinthine Morphology for Evolution of Human Bipedal Locomotion", *Nature*, c. 369, 23 iyun 1994, s. 648.)




**Avstralopitek - Şimpanze İlə Oxşarlıq**

**1. Avstralopitek,**

**2. Şimpanze**

**Avstralopitekin və şimpanzenin çənə sümüyündəki aşkar oxşarlıqlar onu sübut edir ki, insanın əcdadı kimi təqdim edilən avstralopitek əslində meymun növlərindən biridir.**

**3. İnsanın qazıntı halında tapılan ilk skelet qalıqları Efiopiyanın Xadar adlanan yerində tapılan AL 288-1 və yaxud "Lyusi" adlandırılmış skelet olmuşdur. Alimlərin zənnincə, o, avstralopitekin aferensis növünə aid idi. Təkamülçülər Lyusinin dik yeriyən məxluq olduğunu sübut etmək üçün xeyli vaxt və əmək sərf etmişlər, lakin qalıqların müasir analizi Lyusinin dik yerimə qabiliyyətinə malik olmayan şimpanze olduğunu isbat etmişdir.**

**4. Avstralopitek afarensis AL 333-105 qalığı şimpanzenin eyni növünün cavan fərdinə məxsus olmuşdur, məhz buna görə kəllə sümüyünün üzərində olan çöküntü hələ yaxşı inkişaf etməmişdir.**

Bir sözlə, avstralopiteklər insana heç bir aidiyyatı olmayan, nəsli kəsilmiş meymun növü olmuşlar.




**Üzərində çoxlu fərziyyələrin aparıldığı Lyusi fosilinin bir ara forma olmadığı ortaya çıxdıqdan sonra Science & Vie jurnalına qoyulan manşet: "Əlvida Lyusi"**

## HOMO HABILIS: İNSAN OLUNMASI İSTƏNİLƏN MEYMUN

Bacarıqlı insan (Homo habilis): insana çevirməyə çalışdıqları meymun Şimpanze ilə avstralopitekin skelet və kəllə quruluşlarının oxşarlığı haqqında dəlillər və bu canlıların ikiayaqlı olmalarının təkzib edilməsi təkamülçü paleontoloqları çətin vəziyyətə salmışdır. Axı xəyali təkamül sxemində avstralopitekin ardınca Homo erectus gəlirdi. "Homo" sözü "insan" deməkdir, Homo erectus isə insan kateqoriyasına aiddir və dik (şaquli) skeletə malikdir. Meymun növlərindən biri olan avstralopitekdən skeletin quruluşu ilə müasir insandan heç nə ilə fərqlənməyən Homo erectus-a açıq-aydın olan keçid hətta təkamül nəzəriyyəsinə görə də mümkün deyil. Deməli, "qarşılıqlı əlaqə", yəni "keçid forması" lazımdır. Və məhz bu labüdlük "Homo habilis" məfhumununun meydana gəlməsinə səbəb oldu.

Homo habilis təsnifatı 1960-cı ildə "arxeoloji tapıntı ovçuları" - Liki ailəsi tərəfindən irəli sürülmüşdür. Liki ailəsinin fikrincə, onlar tərəfindən

Homo habilis kimi təsnif edilmiş bu yeni növ dik yeriyə bilirdi, nisbətən böyük ölçüdə olan beyinə malik idi və daş ağacdan olan əmək alətlərindən istifadə edə bilirdi. Deməli, o, insanların əcdadı ola bilərdi.



**Luis Liki (ortadakı şəkildə) və həyat yoldaşı Meri Liki müxtəlif fosillər üzərində fərziyyələr irəli sürərək insanın təkamül hekayəsini yaymağa çalışan iki məşhur təkamülçüdür.**

Ancaq 80-ci illərin ortalarında tapılmış həmin növün skelet qalıqları bu baxışları tamamilə dəyişdirdi. Bernard Vud və Lorinq Breys yeni qalıqlar üzərində işləyərək belə nəticəyə gəldilər ki, "əmək alətlərindən istifadə etməyi bacaran insan" mənasını verən "Homo habilis" əslində "əmək alətlərindən istifadə etməyi bacaran Cənubi Afrika meymunu", yəni australorithecus habilis kimi təsnif edilməlidir. Australorithecus meymunu ilə bu növün çox oxşarlıqları var idi: avstralopitekdəki kimi uzun əllər, qısa ayaqlar və meymunabənzər skelet şəklində. Çənə forması müasir meymunların çənəsi ilə tamamilə eynidir. 550 kub santimetr təşkil edən beyin ölçüsü isə ayrı-ayrılıqda bu canlıların hər birinin meymunlara aid olmasının ən bariz əlamətidir. Bəzi təkamülçülər tərəfindən ayrı növ kimi təqdim edilmiş Homo habilis bütün başqa avstralopiteklər kimi əslində bir meymun növü olmuşdur.

Sonrakı illərdə aparılmış tədqiqatlar Homo habilis-la avstralopitekin

oxşarlığını bir daha isbat etmişdi. 1984-cü ildə Tim Uayt özündə müasir meymuna xas olan beynin kiçik ölçüsünü, uzun əlləri və qısa ayaqları daşıyan OH 62 skeletini və kəllənin qalıqlarını aşkar etmişdi.





**Yuxarıdakı şəkildə: bu tip meymunların xüsusiyyətlərini, yaxşı inkişaf etmiş kəsici dişləri və xırda azı dişlərini, dördkünc çənə sümüyünün formasını ən parlaq formada nümayiş etdirən "OH 7 Homo habilis" çənə qalığı təqdim olunmuşdur. Bütün bu xassələr müasir meymunlara məxsusdur. Başqa sözlə, Homo habilis çənəsi məxluqun bu növünün adi meymun olmasını isbat etmişdir.**

### Bacarıqlı İnsan (Homo Habilis): Meymunun Daha Bir Növü

**Təkamülçülər çox uzun müddət ərzində iddia edirdilər ki, onların bacarıqlı insan (Homo habilis) adlandırdıqları məxluq dikyeriyən olmuşdur. Beləliklə, onların fikrincə, insanla meymun arasındakı aralıq keçid mərhələni təşkil edən çatışmayan həlqə nəhayət ki, tapılmışdır. Ancaq 1986-cı ildə paleontoloq Tim Uayt tərəfindən tapılmış və OH 62 adlandırılan Homo habilis-in yeni qalığı bu iddiaları tamamilə təkzib etmişdir. Qalıqların bu hissələri göstərdi ki, Homo habilis müasir meymunlar kimi uzun ön ətraflara malik canlı olmuşdur. Bu skelet qalığı Homo habilis-in ikiayaqlı və dikyeriyən məxluq olması iddialarına son qoydu. Homo habilis də meymundan başqa bir şey deyildi.**

1994-cü ildə Amerika antropoloqu Holli Smit tərəfindən aparılmış daha müfəssəl tədqiqatlar göstərdi ki, Homo habilis insan yox, meymundur. *Australorithecus*, Homo habilis, Homo erectus və Homo neandertalensis kimi növlərin dişlərini analiz etmiş Smit belə nəticəyə gəlir:

*"Bizim tərəfimizdən dişlərin quruluşu və inkişafı meyarı əsasında aparılmış analizlər* ***Australorithecus-un və Homo habilis-in Afrika meymunlarının eyni kateqoriyasına aid olmasından xəbər verir.*** *Amma Homo erectus-la Neandertalensis öz quruluşları baxımından müasir insanlara uyğun gəlirlər".* (Holly Smith, *American Journal of Physical Antropology*, Cilt 94, 1994, ss. 307-325)

*Həmin ildə anatomlar Fred Spur, Bernard Vud və Frans Zonneveld tamamilə başqa üsuldan istifadə edərək eyni nəticəyə nail olmuşdular. Bu üsul müvazinətin qorunmasına cavabdeh olan daxili qulağın yarımdairəvi kanallarının müqayisəli analizinə əsaslanırdı. Dikyeriyən insanın və yarıbükülü yeriyən meymunun qulaq kanalları arasında konkret fərqlər*

*mövcud idi. Bu tədqiqatların nəticəsində bəlli oldu ki, Australorithecus-un və Homo habilis-in daxili qulağının kanalları müasir meymunların kanalları ilə oxşardır və Homo erectus-un qulaq kanalları müasir insanın qulaq kanallarına bənzəyir.* (Fred Spoor, Bernard Wood, Frans Zonneveld, "Implication of Early Hominid Labryntine Morphology for Evolution of Human Bipedal Locomotion", *Nature*, cilt 369, 23 Haziran 1994, s. 645-648)

Bu kəşf iki çox vacib nəticə çıxarmağa imkan yaratmışdır:

**1. Homo habilis adlandırılan skelet qalıqları Homo, yəni insan təsnifatına yox, *Australorithecus*, yəni meymun təsnifatına aiddir.**

**2. Homo habilis və *Australorithecus* yarıbükülü vəziyyətdə yeriyirlər və bu fakt onların meymunabənzər skelet quruluşuna malik olmasından xəbər verirdi. Yəni onların insanla heç bir əlaqəsi yox idi.**

## RUDOLFENSİS İNSANI (HOMO RUDOLFENSIS): SİFƏTİN SƏHVƏN YENİDƏN QURULMASI

*Homo rudolfensis* istilahından 1972-ci ildə Keniyada Rudolf çayının ətraflarında tapılmış skelet qalıqları üçün istifadə olunur. Həmin ad qalıqların guya təqdim etdikləri növə də verilmişdir. Əksər paleoantropoloqlar bu faktla razılaşır ki, *Homo rudolfensis* qalıqları başqa növə yox, Homo habilis, yəni meymun növünə aiddir.

Qalıqları aşkar edən Riçard Liki "KNM-ER 1470" adlandırılan kəllənin yaşını 2,8 milyon il olduğunu müəyyən etmiş və bunu antropologiya tarixində olan ən böyük tapıntı kimi təqdim etmişdi. Təbii ki, bu hadisə böyük maraq doğurmuşdu. Tapılan canlının kəllə ölçüləri avstralopitekdə olduğu kimi idi, sifəti isə insan sifətinə bənzəyirdi. Likinin fikrincə, bu canlı avstralopiteklə insan arasında olan itirilmiş həlqə idi. Lakin bir qədər sonra aydın oldu ki, rəsmi elmi jurnalların üzərində yerləşdirilən KNM-ER 1470 kəlləsinin "insan" üzünün şəkli yenidən qurulması (rekonstruksiya) zamanı bəlkə də qəsdən buraxılmış səhvlər nəticəsində ortaya çıxmışdır. İnsan sifətinin anatomiyası sahəsində ixtisaslaşan professor Tim Bromeyc 1992-ci ildə kompüter vasitəsilə aşkar edilmiş həqiqət haqqında bunları söyləyir:

*"KNM-ER 1470-in yenidən qurulması (rekonstruksiyası) zamanı sifət müasir insanda olduğu kimi demək olar ki, kəlləyə paralel yerləşdirilmişdir. Ancaq aparılmış tədqiqatlar sifətin kəlləyə daha əyilmiş vəziyyətdə yerləşməsini tələb edir. Bu cür yerləşdirmədə biz avstralopitekdə olduğu kimi meymunabənzər sifət əldə edə bilərik."* (Tim Bromage, *New Scientist*, cilt133, 1992, s. 38-41)

Təkamülçü paleoantropoloq C.Kronin bu məsələyə dair belə deyir:

*"Kobud şəkildə formalaşmış sifət, kəllənin kiçik eni və iri azı dişləri - KNM-ER 1470 kəlləsinin ilkin xüsusiyyətləri avstralopitek kəlləsinə də xasdır. KNM-ER 1470 də Homo-nun başqa ibtidai nümunələri kimi naziksümüklü avstralopiteklərlə quruluş etibarilə çox oxşarlıqlara malikdir. Bu xüsusiyyətlər Homo-nun sonrakı nümunələrində (yəni Homo erectus-da) aşkar olunmur".* (J. E. Cronin, N. T. Boaz, C. B. Stringer, Y. Rak, "Tempo and Mode in Hominid Evolution", *Nature*, Cilt 292, 1981, s. 113-122)

Miçiqan Universitetindən (ABŞ) Ç. Lorinq Breys KNM-ER 1470-in çənə və diş quruluşu ilə əlaqədar bir sıra analizlər apararaq eyni nəticəyə gəlmişdir:




**KNM-ER 1470 kəllə fosili əsasında çəkilən Homo rudolfensis tamamilə xəyali bir canlıdır. KNM-ER 1470, digər meymun növləri kimi, Australapithecus qrupuna aiddir.**

*"İri çənə və azı dişlərinin tutduğu boşluq KNM-ER 1470-in sözün əsl mənasında avstralopitekin sifət və dişlərinə malik olmasından xəbər verir".*
(C. L. Brace, H. Nelson, N. Korn, M. L. Brace, *Atlas of Human Evolution*, 2.b. New York: Rinehart and Wilson, 1979)

*KNM-ER 1470-i Likidən heç də az tədqiq etməmiş Con Hopkins adına universitetin (ABŞ) paleoantropoloqu, professor Alan Uolker bildirir ki, bu məxluq insan növünə, yəni Homo habilis və ya Homo rudolfenisis-ə yox, əksinə, Australorithecus sinfinə aid edilməlidir.*
(Alan Walker, *Scientific American*, vol 239 (2), 1978, s. 54)

Bir sözlə, *Homo habilis və ya Homo rudolfenisis-i* Australorithecus-la Homo erectus-un arasında olan keçid forması kimi təqdim etmək istəyən bu cür təsnifatlar tamamilə uydurmadır. Bu məxluqların hər biri Australorithecus silsiləsinin adi nümayəndəsidir və bu faktla bu gün tədqiqatçılrın çoxu razılaşır. Bu məxluqların bütün anatomik xüsusiyyətləri onların meymun növünə aid olmasından xəbər verir. Onların ardınca gələn "Homo" qalıqları isə həqiqətən də insana məxsusdur.

**DAXİLİ QULAĞIN QURULUŞUNUN TƏHLİLİNİN NƏTİCƏLƏRİ: MEYMUNDAN İNSANA OLAN KEÇİD YOXDUR**




1. Semicircular Canals
2. Ampullae
3. Ampullary Nerves
4. Saccule
5. Cochlea
6. Endolymph-filled Canals
7. Posterior Semicircular Canals
8. Anterior Semicircular Canals
9. Horizontal Semicircular Canals
10. Cristae and Ampullary Nerves

**Meymunun və insanın daxili qulağının yarımdairəvi borucuqlarının quruluşunun müqayisəli təhlili göstərdi ki, insanın əcdadları adlandırılan canlılar əslində meymunlardır. Australorithecus və Homo habilis-də daxili qulağın borucuqları meymunlara, Homo erectus-da (dikyeriyən insanda) isə insana xas olan quruluşa malikdir.**

## DİK YERİYƏN İNSAN (HOMO ERECTUS) VƏ BUNDAN SONRAKI NÖVLƏR: HƏQİQİ İNSAN TİPLƏRİ

Təkamülçülərin uydurulmuş sxeminə görə, homo növünün daxilində olan təkamül belədir: əvvəlcə *Homo erectus*, sonra *Homo sapiens archaic, neandertal,* Cro-magnon və müasir insan... Lakin bu təsnifat əslində yalnız insanların xüsusi irqlərini təmsil edir. Onların arasında olan fərqlər eskimosla zənci və yaxud piqmeylə avropalı arasında olan fərqdən artıq deyil.

Əvvəlcə, təkamülçülərin zənnincə ibtidai növ sayılan Homo erectus-u gözdən keçirək.

"Erect" istilahı "dik" mənasını ifadə edir, Homo erectus isə "dik yeriyən insan" deməkdir. Təkamülçülər bu insanları öncəkilərdən "erect" kəlməsi ilə ayırmağa məcbur olmuşdular. Çünki *Homo erectus-un* bütün qalıqları *Australorithecus-dan* və ya *Homo habilis-dən* fərqli olaraq dik (şaquli) skeletə malikdir. **Homo erectus-la müasir insanın skeletləri isə**

**bir-birindən heç nə ilə fərqlənmir.**

Təkamülçülər Homo erectus-u orta insan kəllə ölçülərindən kiçik olan kəllə ölçüsünə (900-1100 sm.kub) və qalın qaşüstü çıxıntılara görə ibtidai növ sayırlar. Halbuki indi də dünyada **Homo erectus-la eyni kəllə sümüyü həcminə malik olan (məsələn, piqmeylər) və yaxud onda olduğu kimi qaşüstü çıxıntılara malik olan insanlar (məsələn, Avstraliya abo-rigenləri) yaşayır.**

*Kəllə sümüyünün həcmi qabiliyyəti və ya zehni imkanları əsla əks etdirmir. Ağıl, zəka, dərrakə səviyyəsi kəllə sümüyünün həcmindən deyil, beyindaxili olan nizamdan asılıdır.*

(Marvin Lubenow, *Bones of Contention*, Grand Rapids, Baker, 1992, s. 83)



THIS WEEK

Ancient mariners

Early humans were much smarter than we suspected

OUR ancestors made organised sea journeys more than 700 000 years earlier than previously thought—and they probably used language to coordinate their efforts.

This surprising new theory comes from palaeoanthropologist Mike Morwood and his colleagues at the University of New England in northern New South Wales. It is the result of an intriguing find during ...

ash surrounding the tools were between 800 000 and 880 000 years old. Fossil plants and animals found near the tools dated from the same period.

The researchers believe the tools were used by the ancestral ...

## 700 Min İl Bundan Əvvəlki Gəmiqayırma Mühəndisləri

**Antik dənizçilər: "İlk insanlar bizim zənn etdiyimizdən daha ağıllı olmuşlar..." 1998-ci il, martın 14-də "New Scientist" jurnalında bu başlıq altında çap olunan məqalədə təkamülçülər tərəfindən Homo erectus (dikyeriyən insan) adlandırılan insanların hələ 700 min il bundan əvvəl gəmiqayırma ilə məşğul olduqları xəbər verilirdi. Gəmiqayırma üçün lazım olan bilik və texnologiyalara malik olan insanları "ibtidai" adlandırmaq olarmı?**

Homo erectus-u dünyaya təqdim edən skelet qalıqları Asiyada tapılmış və **"Pekin insanı"** və yaxud **"Yava insanı"** adlandırılmışdır. Ancaq vaxt ötdükcə aydın olmuşdur ki, bu iki tapıntıya da etibar etmək olmaz. Pekin insanı gipsdən düzəldilmişdi və orijinalı itirilmiş modeldən ibarət idi. Yava insanı isə kəllənin özündən bir neçə metr uzaqlıqda tapılmış qırıq sümükdən və qırıq kəllə hissələrindən ibarət idi. Onların canlıya məxsus olmasının isbatı mümkün deyil. Afrikada tapılan Homo erectus bu səbəbdən daha çox əhəmiyyət kəsb etməyə başlamışdı. (Burada qeyd etmək lazımdır ki, *Homo erectus* qalıqlarının bir hissəsi təkamülçülər tərəfindən Homo ergaster adlı digər təsnifata daxil edilmiş və bu da onların arasında fikir ayrılıqlarına səbəb olmuşdu. Lakin biz bu misalları *Homo erectus* təsnifatında nəzərdən keçirəcəyik).

## DİKYERİYƏN İNSAN (HOMO ERECTUS) ƏSL İNSANDIR










**Homo erectus "ayaq üstə düz duran" insan deməkdir. Qazıntılar nəticəsində tapılan skelet qalıqlarının hamısı insanların müxtəlif irqlərinin nümayəndələrinə məxsusdur. Homo erectus qalıqlarında özünü parlaq şəkildə təzahür etdirən ümumi xarakteristikalar yoxdur və buna görə də yalnız kəllənin formasına əsaslanaraq insanın xarici görkəmini təyin etmək çox çətindir. Bu səbəbdən təkamülçü alimlərin bir çoxu bir-birindən çox fərqlənən təsnifatlar və skelet qalığı adları irəli sürürdülər.**

**Şəkildə (şəkil 2) Homo erectus-un 1975-ci ildə Afrikada Koobi Fora adlı yerin yaxınlığında tapılan ən xarakterik kəlləsi təqdim olunub. Aşağıda sağdakı şəkildə (şəkil 3) isə kəllə quruluşu xüsusiyyətlərini o qədər də dəqiq təzahür etdirməyən Homo Ergaster KNM-ER 3733 kəlləsi əks olunmuşdur. Homo erectus-un bütün qalıqlarının qafa taslarının ölçüləri 900-100 sm.kub qədərdir. Bu göstəricilər müasir insanın kəllə ölçülərinə uyğundur.**

**Daha çox "Turkana oğlanı" adı altında tanınan KNM WT 15000 skeletinin şəkli (şəkil 1) yəqin ki, bu günə qədər tapılmış ən qədim və tam qalmış skelet qalığıdır. Qalığın yaşı təqribən 1,6 milyon il təşkil edir və skeletin üzərində aparılan tədqiqatlara görə, o, boyu təxminən 1,80 sm olan 12 yaşında oğlana məxsus olmuşdur. Bu qalıq müasir insanın skeleti ilə neandertal irqinə mənsub insanın skeleti arasında olan tam oxşarlığı nümayiş etdirir. "Turkana oğlanı" insanın təkamül əfsanəsinin bütün dəlillərini təkzib edən və boşa çıxaran ən parlaq nümunədir.**

**Təkamülçü Donald Conson bu qalığı belə şərh edir: "O, uca boylu və arıq idi. Bədən quruluşu və orqanların mütənasibliyi Ekvatorial Afrikanın müasir sakinlərinin bədən quruluşlarına uyğun olmuşdur. Bədən orqanlarının ölçüləri isə Şimali Amerikanın ağ irqinə mənsub olan kişinin bədən üzvləri ilə tamamilə eynidir".**

(Donald C. Johanson & M. A. Edey, Lucy: The Beginnings of Humankind, New York: Simon & Schuster, 1981)

*Homo erectus-un ən məşhur nümunəsi "Narikotome homo erectus"* yaxud **"Turkana oğlanı"** adlandırılan və Afrikada, Keniyanın Turkana gölünün ətraflarında tapılmış skelet qalığıdır. Bu qalıqların 12 yaşlı uşağa məxsus olması müəyyən edilmişdir. Bu uşağın boyu yetkinlik dövründə 1,83 metrə çata bilərdi. Onun skeleti müasir insan skeletindən heç nə ilə fərqlənmirdi. ABŞ paleoantropoloqu Alan Uolker deyir: "Paleontologiya sahəsində hətta orta dərəcəli mütəxəssislərə belə həmin skeleti müasir insanın skeletindən ayırmaq çətindir". (Boyce Rensberger, *The Washington Post*, 19 Kasım 1984) *Kəllə haqqında isə o, belə deyir: "Neandertal kəlləsinə çox bənzəyir".* (Boyce Rensberger, *The Washington Post*, 19 Kasım 1984) *Neandertal insan müasir insan irqlərindən biridir. Deməli, Homo erectus da insan irqlərindən biridir.*

Belə ki, hətta təkamülçü Riçard Liki də etiraf edir ki, Homo erectus-la müasir insan arasında olan fərq yalnız irqi fərqlərdən ibarətdir:

*"Hər bir insan buradakı fərqləri - kəllənin forması, sifət bucağı, kobud qaşüstü yastıq və sair kimi fərqləri müşahidə edə bilər.* ***Lakin bu fərqləndirici cəhətlər bu gün də müxtəlif coğrafi mühitlərdə yaşayan insanlarda müşahidə olunur.*** *Bu müxtəliflik insanların uzun müddət ərzində bir-birindən fərqli olan şəraitlərdə yaşadıqları zaman baş verir"*

(Richard Leakey, *The Making of Mankind*, London: Sphere Books, 1981, s. 62)

Konnektikut Universitetindən (ABŞ) olan professor Uilyam Laflin uzun illər ərzində eskimoslar və Aleut adaları xalqları arasında anatomik tədqiqatlar apararaq Homo erectus-la bu insanlar arasında olan heyrətamiz oxşarlıqları aşkar etmişdir. Bu tədqiqatlar nəticəsində o, belə bir nəticəyə gəlmişdir: bunlar əslində *Homo Sapiens* (müasir insan) növünə aid olan müxtəlif irqlərdir:

*"Əgər Homo sapiens növünə mənsub olan eskimoslar və Avstraliya aborigenləri kimi uzaq qrupların arasında olan böyük fərqləri nəzərə alsaq, onda Homo erectus-un da daxilində fərqlər olan Homo sapiens* növünə aid edilməsi haqqında nəticəyə gəlmək məntiqəuyğundur".

(Marvin Lubenow, *Bones of Contention*, Grand Rapids, Baker, 1992. s. 136)




**Yuxarıdakı bütün rekonstruksiyalar uydurmadır.
Bu, təkamül yalanının tipik üsuludur.**

Bir insan irqi olan Homo erectus uydurma "insanın təkamülü" ssenarisi üzrə ondan əvvəl gələn meymunlardan (Australorithecus, Homo habilis, Homo rudolfensis) çox fərqlənir. Yəni qazıntı nəticəsində tapılan qalıqlarda aşkar olunmuş ilk insanlar hər hansı bir təkamül prosesi keçmədən birdən-birə və eyni zamanda əmələ gəlmişlər. Yaradılmanın sübutu kimi bundan tutarlı dəlil ola bilməz.

Lakin bu həqiqətlə razılaşmaq ehkamçı təkamül fəlsəfəsinə və təkamülçülərin ideologiyasına ziddir. Bu səbəbdən də onlar əslində insanın özünəməxsus irqi olan Homo erectus-u yarımeymuna bənzər məxluq kimi təqdim etməyə cəhd göstərirlər. Homo erectus-un bərpa edilmiş maketinə inadla meymunabənzər zahiri görünüş verilir. Digər tərəfdən, onlar *Australorithecus və ya Homo habilis* kimi meymunları həmin metodla "insanabənzər"ə çevirir, ayrı-ayrı qruplara mənsub olan meymunları və insanı bu cür "yaxınlaşdıraraq" onların arasında mövcud olan fərqləri azaltmaq istəyirlər.

## NEANDERTALLAR:
## İRİ BƏDƏN QURULUŞLU İNSAN İRQİ

Neandertallar 100 min il bundan əvvəl Avropada birdən-birə meydana çıxmış və 35 min il bundan əvvəl də eləcə qəfildən və səssiz-səmirsiz yoxa çıxmış yaxud başqa irqlərlə qarışmışlar. Onların insanlardan yeganə fərqi daha möhkəm skeletə və iri kəlləyə malik olmalarıdır. Neandertal insan irqidir və bu faktla bu gün hamı razılaşır. Təkamülçülər bu insanları "ibtidai növ" kimi təqdim etmək üçün çox cəhd göstərmişlər. Amma mövcud faktlar neandertal insanın küçə ilə gedən hər hansı bir "sağlam" insandan fərqlənmədiyini göstərir.



**26 Min İl Yaşı Olan İynə**
**Neandertal insanın hələ bir neçə on min illiklər bundan əvvəl geyim tikmək bacarığından xəbər verən maraqlı arxeoloji tapıntı.**
(D.Yohanson, B.Edgar, "From Lucy to Language", səh.99.)



**Yalançı maskalar: müasir insandan antropoloji cəhətdən demək olar ki, heç nə ilə fərqlənməyən neandertal insan təkamülçülər tərəfindən biləərəkdən meymunabənzər şəkildə təsvir edilirdi.**

Nyu-Meksiko Universitetinin (ABŞ) qabaqcıl paleoantropoloqlarından biri Erik Trinkaus bu barədə belə yazır:

*"Neandertal insan qalıqlarının və müasir insan sümüklərinin müqayisəli analizi nəticəsində məlum olmuşdur ki,* ***neandertal insanın anatomiyasında və ya hərəkətlərində, alətlərdən istifadə etmək bacarığında, şüur səviyyəsində və danışıq qabiliyyətində onun müasir insanlardan geri qalmasından xəbər verən heç bir primitivlik yoxdur".*** (Erik Trinkaus, "Hard Times Among the Neanderthals", *Natural History,* cilt 87, Aralık 1978, s. 10; R. L. Holloway, "The Neanderthal Brain: What Was Primitive", *American Journal of Physical Anthropology Supplement*, Cilt 12, 1991, s. 94)




**Təkamülçülər neandertallara bilərəkdən saxta rəsmlərlə meymuna bənzər görünüş verirlər. Ancaq təkamülçü fərziyyələrin əksinə olaraq, Neandertallar tamamilə bir insan irqidir.**

Buna görə müasir tədqiqatçıların çoxu neandertalı insan yarımnövünə aid edir və ona "Homo sapiens neandertalensis" adını verirlər. Tapıntılar göstərmişdir ki, neandertal insanlar ölülərini dəfn edir, musiqi alətləri düzəldir və həmin dövr ərzində mövcud olan inkişaf etmiş Homo sapiens mədəniyyəti ilə əlaqə saxlayırdılar. Bir sözlə, neandertal insanlar zaman keçdikcə nəsli kəsilmiş iribədənli insan irqidir.




**(Şəkil 1) İsraildə tapılan və Amud 1 adlandırılan Homo sapiens neandertalensis-in kəlləsi əks olunub. Neandertallar kiçik boylu və möhkəm bədən quruluşlu insanlar kimi tanınırdılar, amma bu qazıntı göstərmişdir ki, onun sahibinin boyu 1,80 sm olmuşdur. Beyinin ölçüsü 1470 sm.kub təşkil edirdi və bu günə qədər tapılmış beyinlər arasında bu, ən böyüyüdür. Bu səbəbdən həmin qalıq təkamülçülərin neandertalların primitiv insan növünə aid olması haqqında iddialarını puça çıxarmış və darmadağın etmişdir.**

**(Şəkil 2) Soldakı şəkildə bu günə kimi ən yaxşı və bütöv qalmış Kebara 2 (Moşe) adlı neandertal adamın skelet qalığıdır. Bu insanın boyu 1,70 sm olmuşdur, quruluşu isə müasir insanın skeletindən fərqlənmir. Skeletin qalıqları ilə bir yerdə tapılan məişət əşyaları həmin fərdin mənsub olduğu insan cəmiyyətinin Homo sapiens-lə bir coğrafi ərazidə yaşadığını və eyni mədəniyyəti təmsil etdiyini göstərir.**

# ŞÜURLU İNSAN (HOMO SAPIENS ARCHAIC), HEYDELBERQ ADAMI (HOMO NEILDERBERGENSIS) VƏ KROMANYON ADAMI (CRO-MAGNON)

*Homo sapiens* archaic uydurma təkamül zəncirində müasir insandan əvvəl gələn növdür. Ümumiyyətlə, təkamülçülərin bu insanlar barəsində deyə biləcək sözləri yoxdur, çünki onlar müasir insandan çox az fərqlənirlər. Bəzi tədqiqatçıların fikrincə isə bu irqin nümayəndələri indiki zamanda da mövcuddur. Misal kimi Avstraliya aborigenlərini göstərmək olar.

Bu irqin nümayəndələri kimi aborigenlərdə də iri qaşüstü yastıqlar, bir qədər kiçik beyin ölçüləri var, çənəaltı çıxıntı isə yoxdur. Bundan başqa, o da məlum olmuşdur ki, yaxın keçmişdə bu insanlar (Homo sapiens archaic) Macarıstan və İtaliyanın bəzi yaşayış məskənlərində yaşamışlar.

Homo sapiens və təkamülçü ədəbiyyatda Homo Neilderbergensis kimi müəyyən edilmiş təsnifat əslində eyni şeydir. Eyni insan irqinin müəyyən edilməsi üçün iki anlayışdan istifadə olunmasının səbəbi təkamülçülər arasındakı fikir ayrılıqlarıdır. Homo Neilderbergensis təsnifatına daxil edilən qalıqlar 500 və hətta 740 min il bundan əvvəl İngiltərədə və İspaniyada müasir insanlara anatomik cəhətdən uyğun gələn insanların yaşamasından xəbər verir.




**Təkamülçü ədəbiyyatda Homo heilderbergensis kimi təsvir edilən təsnifat əslində Homo sapiens archaic ilə eyni şeydir. Yəni, bu canlılar bir insan növüdür. Fəqət buna rəğmən bu mövzuda çəkilən rəsmlərdə həmişə xəyali primitiv humanoidlər var. Bu darvinist bir aldatmadır.**

Cro-magnon təsnifatı isə təxminən 30 min il bundan əvvəl mövcud olmuş insan irqidir. Bu insanların günbəzşəkilli kəlləsi və enli alınları var. Həcmi 1600 sm.kub təşkil edən kəllə müasir insanın orta kəllə ölçülərindən artıq olmuşdur. Qaşüstü yastıq və neandertal insanla Homo erectus-a açıq-aydın məxsus olan kəllənin peysər hissəsində sümük çıxıntısı mövcud idi. Cro-magnon Avropa irqi sayılır. Buna baxmayaraq o bu gün Afrikada və tropik iqlimli regionlarda yaşayan insan irqlərinin kəllə quruluşuna və ölçülərinə görə çox oxşardır. Bu bənzərliyi nəzərə alaraq güman edilir ki, Cro-magnon

qədim Afrika irqidir. Digər paleoantropoloji tapıntılar göstərir ki, neandertalların cütləşmsi nəticəsində bəzi müasir irqlər əmələ gəlmişdir.

Bundan əlavə, bu gün Afrikanın və Fransanın (Salute və Dordonya) müxtəlif regionlarında kromonyonlu insanlara bənzəyən etnik qruplar yaşayır. Onlara həmçinin Polşa və Macarıstanda da rast gəlinib.




**1. Homo sapiens archaic, indiki aborigenlərə bənzər bir insan irqidir.**

**2. Qəsdən fərqli bir ad verilən Homo heilderbergensis, əslində Homo sapiens archaic ilə eynidir.**

**3. Cro-Magnon, başqa bir insan irqidir. Homo erectus və Neandertallar kimi müxtəlif xarakterik xüsusiyyətlərə malikdir.**

## ÖZ ƏCDADLARI İLƏ EYNİ BİR VAXTDA YAŞAMIŞ İNSAN TİPLƏRİ

Bu vaxta qədər bütün öyrənilənlər təkamül nəzəriyyəsi ssenarisinin tamamilə uydurma və əsassız olması haqqında mənzərə yaradır. Çünki belə nəsil ağacının mövcud olması üçün meymundan insana olan təkamül prosesi və bu prosesi isbat edən müvafiq arxeoloji qalıqların olması labüddür. Halbuki meymunla insanı böyük bir uçurum ayrırır. Skelet quruluşu, kəllə ölçüləri və yerimə tərzi kimi xüsusiyyətlər insanı meymundan ayırır. (1994-cü ildə daxili qulağın vestibülyar aparatı tədqiq edilmişdir. Bu tədqiqatlar nəticəsində Australorithecus və Homo habilis meymunlar sinfinə, Homo erectus isə insanlar sinfinə aid edilmişdir). Bir-birinin əcdadları kimi təqdim edilən bu müxtəlif növlərin eyni zamanda mövcud olması və yan-yana, bir yerdə yaşaması onların arasında hər hansı bir nəsil (qohumluq) əlaqəsinin olmamasını təsdiq edir. Əgər təkamülçülərin iddia etdiyi kimi, Australorithecus vaxt ötdükcə Homo habilis-ə, o isə öz növbəsində Homo erectusa çevrilirsə, bu halda onların mövcudluq (yaşam) dövrü (mərhələsi) də ardıcıllıqla gəlməli idi. Lakin əksinə, burada heç bir xronoloji ardıcıllıq müşahidə olunmur. Təkamülçülərin hesablamalarına görə, Australorithecus 4 milyon ildən 1 milyon ilə qədər bundan əvvəl, Homo habilis kimi təsnif kəşf




**Yuxarıda göründüyü kimi xəyali sıralamalar, bir çox təkamülçü nəşrlərdə yer alır. Halbuki bu canlıların bəziləri güman edilən əcdadları ilə eyni dövrdə yaşamış tam təşəkküllü canlılardır. "Humanoid" adlanan qəribə varlıq, təkamülçü zehniyyətin məhsuludur; heç vaxt mövcud olmamışdır.**

edilmiş canlı isə 1,7-1,9 milyon il bundan əvvəl mövcud olmuşlar. Təkamülçülərin fikrincə, Homo habilis-ə nisbətən daha inkişaf etmiş sayılan Homo rudolfensis-in yaşı isə 2,5-2,8 milyon ildir. Yəni Homo rudolfensis öz "əcdadı" hesab olunan Homo habilis-dən təxminən 1 milyon il böyükdür. Digər tərəfdən, Homo erectus-un yaşı təxminən 1,6-1,8 milyon il təşkil edir. Yəni Homo erectus-ların və onların "əcdadları" Homo habilis-lərin əmələ gəlməsi eyni vaxta təsadüf edir ki, buradakı ziddiyyət də açıq görünür. Bu faktı Alan Uolkerin sözləri də təsdiq edir:

*"Australorithecus, Homo habilis və Homo erectus kimi növlərin Şərqi Afrikada bir yerdə və eyni zamanda yaşaması haqqında təkzibedilməz dəlil-sübutlar var".* (Alan Walker, *Science*, cilt 207, 1980, s. 1103) *Luis Liki Australorithecus, Homo habilis və Homo erectus skelet qalıqlarını demək olar ki, yanaşı olaraq Olduvay dərəsində Bed II qatında aşkar etmişdir".* (A. J. Kelso, P*hysical Antropology*, 1st ed., New York: J. B. Lipincott Co., 1970, s. 221; M. D. Leakey, Olduvai Gorge, Cilt 3, Cambridge: Cambridge University Press, 1971, s. 272)

Əlbəttə, bu cür nəsil ağacı (şəcərəsi) ola bilməz. Harvard Universitetinin paleoantropoloqu Stefan Cey Qould özü təkamülçü olsa da Darvin nəzəriyyəsinin çıxılmaz vəziyyətə düşməsini belə izah edir:

***"Əgər eyni zamanda mövcud olmuş üç müxtəlif hominid (insanabənzər canlılar) varsa, onda bizim nəsil şəcərəmiz nə oldu?*** *Aydındır ki, onlar bir-birindən törəyə bilməz. Həmçinin onların müqayisə edilməsində heç bir təkamül prosesi aşkar olunmur".*
(S. J. Gould, *Natural History*, Cilt 85, 1976, s. 30)

*Daha sonra Homo erectus-dan Homo sapiens*-ə keçidi nəzərdən keçirsək, biz burada da nəsil ağacının olmadığını görərik. Qalıqlar göstərir ki, Homo erectus və Homo sapiens archaic bizim zamanımızdan 27 və hətta 10 min il

əvvələ qədər yaşayırdılar. Müvafiq olaraq 13 və 27 min il yaşı olan Homo erectus-a açıq-aydın məxsus olan kəllələr Avstraliyada Kow bataqlığında və Yava adasındasazq tapılmışdır". (Time, Kasım 1996)

## ŞÜURLU İNSANIN (HOMO SAPIENS) GİZLİ TARİXİ

Yuxarıda bəhs olunan məsələlərdən başqa xəyali nəsil şəcərəsi iddiasını puç edən çox vacib və heyrətamiz həqiqət var: *Homo sapiens-in*, yəni müasir insanın tarixi çox uzaq keçmişə gedir. Paleontoloji tapıntılar sübut edir ki, təxminən 1 milyon il bundan əvvəl bizlərdən heç nə ilə fərqlənməyən Homo sapiens növünə aid insanlar yaşayırdılar.

*Bu mövzuya aid olan ilk tapıntılar məşhur təkamülçü paleoantropoloq Luis Likiyə məxsusdur. Liki 1932-ci ildə Keniyanın Kanyera ərazisində Viktoriya gölünün yaxınlığında müasir insanlara anatomik cəhətdən uyğun olan və orta pleystosen dövrünə aid olan bir neçə qalıq aşkar etmişdi. Lakin orta pleystosen 1 milyon il bundan əvvəl deməkdir.* (L. S. B. Leakey, *The Origin of Homo Sapiens*, ed. F. Borde, Paris: UNESCO, 1972, s. 25-29; L. S. B. Leakey, By the Evidence, New York: Harcourt Brace Jovanovich, 1974) *Son nəticədə təkamülçü paleoantropoloqlar bu tapıntıları inkar etdilər, çünki onlar təkamülün bütün nəsil şəcərəsini alt-üst edirdi.*

Hərçənd ki, Liki öz hesablarının düzgün olduğunu həmişə müdafiə edirdi. Bu məsələ ilə əlaqədar müzakirələr yenicə səngiməyə başladığı vaxt - 1995-ci ildə İspaniyada tapılmış skelet qalıqları əyani surətdə göstərdi ki, Homo sapiens-in tarixi əslində daha qədim köklərə malikdir. Adıçəkilən qalıqlar Madrid Universitetinin üç ispan paleoantropoloqu tərəfindən **Ataruerca** ərazisində Qran Dolina mağarasında tapılmışdı. Bu, müasir insana tamamilə uyğun gələn 11 yaşlı uşağın sifəti idi. Lakin uşaq 800 min il bundan əvvəl ölmüşdü. "Discover" jurnalı özünün 1997-ci il dekabr nömrəsində bu mövzuya böyük diqqət yetirmişdi.

Bu qalıqlar hətta Qran Dolinada tədqiqatçılar qrupuna başçılıq edən A.Ferrerasın "insan təkamülünə olan inamını" da sarsıtmışdı. Ferreras bu barədə belə demişdi:

*Biz böyük, iri, kobud, yəni sadə desək, ibtidai bir şeylə üz-üzə gəlməyə ümid edirik. Biz 800 min illik uşağın Turkana oğlanına bənzər olacağını təsəvvür edirdik. Ancaq bizim tapdığımız tamamilə müasir sifət idi... Belə hadisə insanı sarsıdan hadisələrdəndir: daşlaşmış qalıqların aşkar edilməsi gözlənilməz və xoş haldır və bu, normaldır. Amma daha maraqlısı, keçmişə aid tapılan bir şeyin indiki zamana aid olmasıdır. Bu, hansısa mənada Qran Dolinada maqnitofonun aşkar olunmasına bənzəyir. Əlbəttə, qəribədir.* ***Biz aşağı pleystosen dövründə kasset və maqnitofonların tapılmasını gözləmirik, ancaq bu, 800 min illik tarixi olan "müasir" sifəti aşkar etməklə eyni şeydir.*** *Biz onu görəndə çox təəccüblənmişdik".*

("Is This The Face of Our Past", *Discover*, Aralık 1997, s. 97-100)

Bu tapıntı Homo sapiens-in tarixini daha 800 min il əvvələ çəkirdi. Lakin ilk şoku yaşayan təkamülçülər qərara gəldilər ki, bu qalıqlar başqa bir növə məxsusdur. Çünki nəsil şəcərəsinə əsasən Homo sapiens 800 min il bundan əvvəl mövcud olmalı idi. Buna görə Ataruerca kəlləsinin yer aldığı "**Homo antecessor**" adlandırılmış yeni növ uyduruldu.




**1. Təkamülçü Discover jurnalı 1997-ci ilin dekabr sayında üz qabığına 800.000 illik insan üzünü qoyaraq "Bu, keçmişimizin üzüdürmü?" manşetini vermişdi. Bu fosil, Homo habilisin düşünüldüyündən daha çox yaşlı olduğunu ortaya qoymuşdu.**

**2. İspaniyanın Atapuerka adlanan bölgəsindəki Qran Dolina mağarasından görüntü.**

## 1,7 MİLYON İL YAŞI OLAN DAXMA VƏ 3,6 MİLYON İL YAŞI OLAN MÜASİR İNSANIN AYAQ İZLƏRİ

*Bu günə qədər aşkar edilmiş çoxsaylı tapıntılar göstərir ki, Homo sapiens-in tarixi 800 min ildən də qədimdir. Bunların biri həmin Luis Liki tərəfindən 1970-ci illərin əvvəllərində Olduvay dərəsinin yaxınlığında tapılmışdır. Luis Liki burada Bed II qatında müəyyən etmişdir ki, Australorithecus, Homo habilis və Homo erectus eyni zamanda yaşamışlar. Ancaq daha maraqlısı odur ki, Liki həmin qatda (Bed II) tikinti aşkar etmişdir. Bu tikinti 1,7 milyon yaşı olan daşdan düzəldilmiş daxmanın qalıqları idi. Bu hadisənin qəribəliyi ondan ibarətdir ki, Afrikanın bəzi rayonlarında bu gün də istifadə edilən daxmalar yalnız Homo sapiens*

*tərəfindən tikilə bilərdi. Yəni Likinin tapıntısı bizə xəbər verir ki, Australorithecus, Homo habilis, Homo erectus və müasir insan təxminən 1,7 milyon il bundan əvvəl bir yerdə və eyni bir zamanda yaşamışlar.*

(A. J. Kelso, *Physical Anthropology*, 1.b., 1970, ss. 221; M. D. Leakey, *Olduvai Gorge*, Cilt 3, Cambridge: Cambridge University Press, 1971, s. 272)



**1,7 milyon il yaşı olan evin qalıqları. Bu ev Afrikanın yerli əhalisinin içində indi də yaşadığı evlərə bənzəyir.**

Əlbəttə, bu fakt müasir insanın Australorithecus meymunlarından törəməsi ideyasını irəli sürən təkamül nəzəriyyəsini tamamilə təkzib edir. Əsas etibarilə müasir insan tarixini 1,7 milyon ildən artıq bir müddətdə əvvələ aparan tapıntılar var.

Belə tapıntılardan biri 1977-ci ildə Meri Liki tərəfindən Tanzaniyanın Laetoli rayonunda tapılan ayaq izləridir. Bu izlər yaşı 3,6 milyon il olan qatda tapılmışdır və ən əsası odur ki, onlar müasir ayaq izlərindən heç nə ilə fərqlənmir.



Meri Liki tərəfindən tapılmış ayaq izləri həmçinin Don Cohanson və Tim Uayt kimi məşhur paleoantropoloqlar tərəfindən tədqiq olunmuşdu. Nəticələr eyni idi. Uayt yazırdı:

*"Hətta şübhələnməyin də... Onlar müasir insanın ayaq izlərindən heç nə ilə fərqlənmir. Əgər bu izlər Kaliforniyanın çimərliyində aşkar olunsaydı və siz bir uşağa "Bu nədir?" sualını versəydiniz, şübhəsiz ki, o, "Buradan insan keçmişdir" cavabını verəcəkdi. O bu izləri qumda yüzlərlə başqa izlərdən ayırd edə bilməzdi. Necə ki, siz də onları ayıra bilmədiniz".*

(D. C. Johanson & M. A. Edey, *Lucy: The Beginnings of Humankind*, New York: Simon & Schuster, 1981, s. 250)

Şimali Kaliforniya Universitetindən (ABŞ) Luis Robbins bu izləri tədqiq edərək demişdir:

*"Ayaqaltı pəncəsi hündür, balaca insanın ayağının alt pəncəsi hətta mənimkindən də hündürdür, yəni barmaqlar yerə insan barmaqları kimi dəyir. Siz bunu heyvanlarda görə bilməzsiniz".* (*Science News*, Cilt 115, 1979, ss. 196-197)

Ayaq izlərinin morfoloji analizləri göstərdi ki, onlar müasir insana (Homo sapiens-ə) aiddir. Ayaq izlərini tədqiq edən Rassel Tatl yazırdı:

*"Ehtimal ki, ayaq izləri ayaqyalın Homo sapiens tərəfindən qoyulmuşdur... Aparılmış bütün morfoloji tədqiqatlar onların müasir insanla uyğunluğundan xəbər verir".* (I. Anderson, *New Scientist*, Cilt 98, 1983, s. 373)

Neytral və obyektiv tədqiqatlar ayaq izlərinin əsl sahiblərini müəyyən

etdi: 10 yaşında olan müasir insanın 20 ayaq izi və daha az yaşdakı insana məxsus olan 27 daşlaşmış ayaq izləri. Heç şübhəsiz ki, onlar da bizim kimi normal insan olmuşdur. Bu səbəbdən Laetoli ayaq izləri onilliklər ərzində qızğın mübahisələrin mövzusu olmuşdur. Təkamülçü paleoantropoloqlar müasir insanın 3,6 milyon il bundan əvvəl yerdə yeriməsi ilə razılaşa bilmir və bunu birtəhər izah etməyə cəhd göstərirdilər. 90-cı illərdə bu "izah" formalaşdı.

Təkamülçülər belə qərara gəldilər ki, bu izlər avstralopitek tərəfindən qoyulub, çünki təkamül nəzəriyyəsinə görə, 3,6 milyon il bundan əvvəl hər hansı bir Homo növünün mövcud olması mümkün deyildi. Rassell Tatl 1990-cı ildə nəşr olunan məqaləsində belə yazır:

*"Hər bir halda Laetoli G ərazisində aşkar edilən və 3,5 milyon il yaşı olan ayaq izləri müasir insanın ayaq izlərinə çox bənzəyir. Qalıqlardan da gördüyümüz kimi, bu izi qoyanlar bizdən heç də pis olmamış və öz yerişləri ilə bizdən fərqlənməmişlər. Əgər onlar bu qədər qədim olmasaydı, heç şübhəsiz ki, biz onların hər hansı bir Homo növünə aid olması ilə razılaşardıq. Ancaq yaşa görə biz bu izlərin Lucy qalıqlarının da aid olduğu Australorithecus afarensis növünə mənsub olduğunu hesab etməyə məcburuq".* (R. H. Tuttle, *Natural History*, Mart 1990, ss. 61-64)

**2,3 MİLYON İL YAŞI OLAN MÜASİR İNSAN ÇƏNƏSİ**

**Təkamülçülər tərəfindən uydurulmuş insanın nəsil şəcərəsini təkzib edən bir nümunə: yaşı 2,3 milyon il olan insan (Homo sapiens) çənəsi. Xaderdə (Efiopiya) tapılmış və A.1. 666-1 kod adlı bu sümüyü təkamülçülər öz nəşrlərində "olduqca təəccüblü tapıntı" adlandırır və bu məsələyə toxunmamağa üstünlük verirlər.**

(D. Johanson, Blake Edgar, "From Lucy to Language", səh. 169.)



Bir sözlə, ayaq izləri 3,6 milyon il yaşı olan Australorithecus-ə açıq-aydın məxsus ola bilməzdi. Bu izlərin avstralopitekə aid edilməsinin səbəbi isə bu qalıqların yaşı 3,6 milyon il müəyyən edilmiş vulkanik təbəqədə tapılmasıdır. Belə qədim zamanda insanların mövcud olmaması zənn edilərək ayaq izləri Australorithecus-ə aid edilmişdir. Laetoli izlərinə dair şərhlər bizim üçün olduqca vacib olan bir həqiqəti də açıqladı: təkamülçülər öz nəzəriyyələrini elmi faktlara istinad etməklə müdafiə etmirlər, əksinə, onlar bu faktları nəzərə almırlar. Öz xeyrinə olmayan hər yeni kəşfi müqavimət və riyakarlıqla qarşılayan, kor-koranə müdafiə olunan nəzəriyyə göz qabağındadır.

Buradan da aydındır ki, təkamül nəzəriyyəsi elmi deyil, qeyri-elmi ehkamdır.

# TƏKAMÜL NƏZƏRİYYƏSİNİN DİRƏNDİYİ DALAN - DİK YERİMƏ

Bütün arxeoloji tapıntılarla yanaşı insanla meymun arasında olan inkaredilməz anatomik fərqlər insanın təkamül nağılını təkzib edir. Bu fərqlərdən biri yerişdir.

İnsana dik yerimə xasdır. Bu, hərəkətin başqa canlılara xas olmayan xüsusi formasıdır. Bəzi heyvanlarda isə bu xüsusiyyət məhdud dərəcədədir. Ayı və meymun kimi heyvanlar nadir hallarda, özü də qısa zaman ərzində iki ayaq üstə hərəkət edə (yeriyə) bilərlər (məsələn, özlərinə qida əldə etmək lazım gələn hallarda). Onlar maili skeletə malikdir və dörd ayaq üstündə yeriyirlər.

Maraqlıdır, təkamülçülərin iddia etdikləri kimi insanın dik yeriməsi dördayaqlıların yerimə üsullarından təkamül edə bilərmi?

Xeyr... Tədqiqatlar göstərmişdir ki, dik yerimə heç vaxt təkamül prosesinə məruz qalmamışdır və bunun həyata keçməsi heç mümkün də deyil. Hər şeydən əvvəl iki ayaq üzərində yerimə təkamülün üstünlüyü deyil. Çünki dörd ayaq üstündə yeriyən meymunlar insanlara nisbətən daha tez və asan hərəkət edirlər. İnsan şimpanze kimi ağacların arasında budaqdan-budağa hərəkət edə bilməz və yaxud hepard kimi saatda 125 km sürətlə qaça bilməz.




**Aparılmış tədqiqatlar nəticəsində isbat edilmişdir ki, dörd ayaq üstündə yeriməyə uyğunlaşdırılmış meymun skeletinin dik yeriyən insan skeletinə təkamül etməsi mümkün deyil.**

Əksinə, insan ikiayaqlı kimi daha asta hərəkət edir və nəticə etibarilə təbiətdə fiziki cəhətdən ən köməksiz məxluqdur. Buna görə nəzəriyyənin öz məntiqinə əsasən meymunların dik yeriməyə istiqamətlənməsinin heç bir mənası yoxdur. Əksinə, nəzəriyyənin məntiqinə müvafiq olaraq insanlar dördayaqlı olmalıdır.

Təkamül nəzəriyyəsini başqa bir dalana salan səbəb darvinizm modelinin, yəni mərhələli inkişaf modelinin dik yeriməyə tamamilə uyğun olmamasıdır.

*Təkamülün təməlini təşkil edən bu model ikiayaqlılarla dördayaqlılar arasında olan təkamülün keçid dövründə "qarışıq" yeriş formasının olmasını tələb edir. Halbuki 1996-cı ilin tədqiqatlarında ingilis paleoantropoloqu*

*Robin Krompton kompüter vasitəsilə göstərmişdir ki, belə "qarışıq" yeriş forması yaratmaq qeyri-realdır. Krompton belə bir nəticəyə gəlmişdir: canlı məxluq ya iki, ya da dörd ayaq üstündə yeriyə bilər.* (Ruth Henke, "Aufrecht aus den Baumen", *Focus*, Cilt 39, 1996, s. 178) *Bu iki variant arasında yerimə forması enerji xərclənməsinin birdən artması səbəbi ilə mümkün olmur.*

Buna görə də "yarıikiayaqlının" mövcud olması mümkün deyil. İnsanla meymun arasında olan fərqlər təkcə dik yerimə ilə məhdudlaşmır. Beynin səviyyəsi, danışmaq qabiliyyəti və başqa bu kimi xüsusiyyətlər təkamülçülər tərəfindən izah olunmamışdır. Təkamülçü paleoantropoloq E.Morqan aşağıdakıları etiraf edir:

*"İnsan təkamülü mövzusunda 4 mühüm sirr var: 1) Niyə iki ayaq üzərində yeriyirlər? 2) Bədənin tük örtüyü niyə yox olmuşdur? 3) Beyin niyə bu qədər inkişaf etmişdir? 4) Niyə danışmağı öyrənmişlər? Bu dörd suala standart cavablar var: 1) Hələ bilmirik. 2) Hələ bilmirik. 3) Hələ bilmirik. 4) Hələ bilmirik. Sualların sayını atırmaq da olar, amma cavab dəyişməz qalar".* (Elaine Morgan, *The Scars of Evolution*, New York: Oxford University Press, 1994, s. 5)

## TƏKAMÜL NƏZƏRİYYƏSİ SAXTA ELMİ İNANCDIR

Lord Solli Sukkerman İngiltərənin ən tanınmış və hörmət edilən alimlərindəndir. O, on illərlə arxeoloji qalıqları tədqiq etmiş, çoxsaylı əsaslı tədqiqatlar aparmış və hətta elmin inkişafında misilsiz roluna görə lord rütbəsinə layiq görülmüşdür. Sukkerman təkamülçüdür, yəni onun təkamül nəzəriyysinə aid olan şərhlərində nəzəriyyəyə qarşı hər hansı bir qəsd-qərəzə yol vermək ağlasığmazdır. Lakin o, onilliklər ərzində arxeoloji tapıntıları öyrənərək belə bir nəticəyə gəlmişdir ki, nəsil şəcərəsi yoxdur.

Sukkermanın maraqlı "elmi şkala" icad edib. O, elmin elmi və qeyri-elmi sayılan sahələrinin təsnifatını tərtib etmişdi. Bu cədvəldə elmin ən "elmi", yəni konkret faktlara əsaslanan sahələri kimya və fizikadır. Sonra biologiya və ictimai elmlər gəlir. Bu siyahının ən sonunda telepatiya, altıncı hiss məfhumu və "insanın təkamülü", yəni Sukkermanın fikrincə, qeyri-elmi sahələr yerləşir. O bu nəticəni belə izah edir:

*"Əgər obyektiv reallığın hüdudlarından çıxaraq həm də təbii elm sahələri sayılan ruhi qüvvənin qavranılması və insan qalıqlarının izahı kimi elm sahələrinə nəzər salsaq görərik ki, **təkamül nəzəriyyəsinə inanan hər hansı bir insan üçün mümkün olmayan bir şey yoxdur.** Beləliklə, öz nəzəriyyəsinə israrla inanan insanlar eyni zamanda hətta bir-birinə zidd əqli nəticələr çıxara bilərlər".* (Solly Zuckerman, *Beyond The Ivory Tower*, New York: Toplinger Publications, 1970, s. 19)

Bəs niyə görə bu qədər alim bu ehkam üzərində inadla təkid edir? Nə üçün bu qədər təzadlı nəticələr qeyd-şərtsiz qəbul olunur və onların özləri tərəfindən tapılan sübutlar nəzəriyyənin yaşaması naminə gözardı edilir?

Cavab birdir: bu insanlar təkamülü tərk etdikləri vaxt həqiqətlə qarşılaşmaqdan qorxurlar. Çünki təkamülü tərk edərkən onlar yeganə həqiqətlə - insanların Allah tərəfindən yaradılması həqiqəti ilə üz-üzə gələcəklər. Bu fakt isə onların inandığı materialist fəlsəfə nöqteyi-nəzərindən

qəbuledilməzdir və onlara xas olan qabaqcadan yaranmış yanlış fikirlərə görə mümkün deyil.




**Təkamülçü Lord Solli Sukkerman, insanın təkamülü ssenarisinə yerləşdirilən fosilləri on illər boyunca araşdırdıqdan sonra, ortada gerçək bir soy ağacı olmadığı qənaətinə gəlmişdi.**

**İnsanın təkamülü hekayəsi heç bir elmi tapıntıya əsaslanmır. Yuxarıdakı kimi şəkillər, təkamülçülərin xəyal güclərini əks etdirməkdən başqa bir məna daşımamaqdadır.**



Məhz buna görə də təkamülçülər onlarla əməkdaşlıq edən kütləvi informasiya vasitələrindən istifadə edərək həm özlərini, həm də dünyanı aldadırlar. Mövcud olmayan arxeoloji qalıqlar təkamülçülər tərəfindən uydurma şəkil və maketlərlə "tamamlanıb təkmilləşdirilir", bununla da təkamül nəzəriyyəsini sübut edən faktların mövcudluğuna dair təsəvvürlərin yaradılmasına cəhd edilir. Kütləvi informasiya vasitələri isə materialist fəlsəfəyə inandığı kimi uydurma şəkil və maketlərdən cəmiyyəti aldatmaq üçün istifadə edir və insanların şüuraltısında bu obrazları həkk etməyə çalışır.

Lakin onlar nə qədər cəhd etsə də həqiqət göz qabağındadır: insan şüursuz təkamül prosesi tərəfindən yox, Uca və Qüdrətli Allah tərəfindən yaradılmışdır və Onun qarşısında məsuliyyət daşıyır. Bu məsuliyyəti öz üzərinə götürmək istəməsə də...

## HEÇ VAXT OLMAYAN ARA KEÇİD FORMALARI

Əgər dünyamızda həqiqətən də bir təkamül prosesi baş vermiş, yəni canlı növləri tək bir ortaq atadan mərhələli şəkildə törəmiş olsaydılar, bunun dəlillərini ən açıq şəkildə fosil qeydlərində görə bilərdik. Məşhur fransız zooloq Pierre Grassé bu mövzuda bunları deyir:

*Təbiətşünas alimlər unutmamalıdır ki, təkamül müddəti yalnız fosil qeydləri vasitəsilə ortaya çıxar... Yalnız paleontologiya (fosil elmi) təkamül mövzusunda dəlil meydana gətirə bilər və təkamülün inkişafını və mexanizmlərini göstərə bilər.*

(Pierre P. Grassé, Evolution of Living Organisms, Academic Press, New York, 1977, s. 82.)

Bunun səbəbini başa düşmək üçün təkamül nəzəriyyəsinin təməl iddiasını qısa şəkildə nəzərdən keçirməliyik:

Təkamül nəzəriyyəsinə görə bütün canlılar bir-birindən törəyiblər; əvvəlcədən təsadüfən yaranan bir canlı növü, vaxt keçdikcə başqa bir canlıya çevrilmiş və bütün növlər bu şəkildə meydana gəlmişdir. Bu elmə zidd iddiaya görə bitkilər, heyvanlar, göbələklər, bakteriyalar həmişə eyni nəsildən meydana gəliblər. Heyvanların 100-ə yaxın fərqli sinfi (yəni, molyuskalar, buğumayaqlılar, soxulcanlar, süngərlər kimi əsas kateqoriyaları) həmişə ortaq bir atadan törəmişdir. Bir-birinə calanmış halqalardan ibarət, böcəklər, hörümçəklər, xərçəngkimilər, çox ayaqlılar və s. hissələrə ayrılan heyvan sinifləri,) tək bir ortaq atadan törəmişdir. Nəzəriyyəyə əsasən bu kimi onurğasız canlılar vaxt keçdikcə (və təsadüfən) onurğa qazanaraq balıqlara, balıqlar amfibiyalara, onlar sürünənlərə, sürünənlərin bir qismi quşlara, bir qismi isə məməlilərə çevrilmişdir. Nəzəriyyəyə əsasən bu çevrilmə yüz milyonlarla illik uzun bir dövrü əhatə etmiş və mərhələli şəkildə baş vermişdir. Bu vəziyyətdə iddia edilən uzun çevrilmə müddəti ərzində çoxsaylı "ara növ" meydana gəlməli və yaşamalıdır.

Yeri gəlmişkən hələ də keçmişdə balıq xüsusiyyətlərini daşımalarına baxmayaraq, bir tərəfdən də bəzi amfibiya xüsusiyyətləri qazanmış olan yarı balıq-yarı amfibiya canlılar yaşamış olmalıdır. Ya da sürünən xüsusiyyətlərini daşımaqla yanaşı, bir tərəfdən də bəzi quş xüsusiyyətləri

qazanmış sürünən quşlar meydana gəlmiş olmalıdır. Bunlar bir keçid müddətində olduqları üçün şikəst, əskik, qüsurlu canlılar olmalıdır. Məsələn, bir sürünənin ön ayaqları hər nəsildə bir az daha çox quş qanadına bənzəməlidir. Yüzlərlə nəsil ərzində bu növün nə tam ön ayaqları, nə də tam qanadları olacaq, yəni bu canlı şikəst və qüsurlu olaraq yaşayacaq. Təkamülçülərin keçmişdə yaşadıqlarına inandıqları bu nəzəri canlılara "ara keçid forması" adı verilir.

Əgər həqiqətən də keçmişdə bu cür canlılar yaşamışdırsa, bunların sayları və növləri milyonlarla, hətta milyardlarla olmalı, qalıqlarına da dünyanın dörd bir tərəfində rast gəlinməliydi. Bu həqiqəti Darvin də qəbul etmiş və niyə bir çox ara keçid forması olmasının lazım olduğunu belə izah etmişdi:

*Yaşayan bütün növlər, hər cinsdə olan ata-baba növləriylə bu gün yaşayan növlərin əhliləşdirilmiş və vəhşi variasiyaları arasındakı fərqdən daha böyük olmayan fərqlərlə əlaqəli olmalıdırlar.*

(Charles Darwin, The Origin Of Species, chapter X, "On the Imperfection of the Geological Record".)

Darvinin nəzərdə tutduğu budur: İndiki vaxtda yaşayan bir canlı növünün variasiyaları (məsələn, cins bir it ilə bir küçə iti) arasında nə qədər az fərq varsa, "təkamül müddəti" ərzində bir-birinin arxasınca gəldiyi iddia edilən "ata" və "nəvə"lər arasında da o qədər az fərq olmalıdır.

Buna görə də Darvinin də ifadə etdiyi kimi, əgər həqiqətən də təkamül prosesi baş vermiş olsaydı, "çox kiçik pilləli dəyişikliklərlə" baş verəcəkdi. Mutasiyaya məruz qalan bir canlıdakı dəyişiklik çox cüzi olacaqdı. Ayaqların qanadlara, qəlsəmələrin ağciyərlərə, üzgəclərin ayaqlara çevrilməsi kimi böyük dəyişikliklərin baş verə bilməsi üçün, milyonlarla kiçik dəyişikliyin yenə də milyonlarla il ərzində baş verməsi lazım gələcəkdi. Bu müddət isə, milyonlarla ara keçid formasının meydana gəlməsinə səbəb olacaqdı. Darvin bu şərhindən sonra bu nəticəyə gəlmişdir:

*Yaşayan və ya nəsli tükənmiş bütün növlər arasındakı ara və keçid əlaqələrinin sayı inanılmaz dərəcədə böyük olmalıdır.*

(Charles Darwin, The Origin of Species, chapter X, s. 234.)

Darvin kitabının başqa hissələrində də eyni həqiqəti dilə gətirmişdir:

*Əgər nəzəriyyəm doğrudursa, növləri bir-birinə bağlayan çoxsaylı ara keçid növləri mütləq yaşamış olmalıdır... Bunların yaşadıqlarının dəlilləri də yalnız fosillər arasında tapıla bilər.* (Charles Darwin, The Origin of Species, s. 179.)

Ancaq bu sətirləri yazan Darvin bu ara keçid formaların fosillərinin qətiyyən tapıla bilmədiyini də görürdü. Bunun nəzəriyyəsini böyük bir çıxılmaz vəziyyətdə qoyduğunu da görürdü. Buna görə də *"Növlərin Mənşəyi"* kitabının *"Nəzəriyyənin Çətinlikləri" (Difficulties on Theory)* adlı hissəsində belə yazmışdı:

*Əgər həqiqətən də növlər o biri növlərdən cüzi inkişaflarla törəmişdirsə, niyə çoxsaylı ara keçid formasına rast gəlmirik? Niyə bütün təbiət bir qarışıqlıq halında deyil, əksinə tam olaraq müəyyənləşdirilmiş və yerli yerindədir? Çoxsaylı ara keçid forması olmalıdır, lakin niyə yer üzünün sayıla bilməyəcək qədər çox təbəqəsində basdırılmış vəziyyətdə tapa bilmirik... Nə üçün hər geoloji quruluş və hər təbəqə belə əlaqələrlə dolu*

*deyil? Geologiya yaxşı dərəcələndirilmiş bir müddət ortaya çıxarmır və bəlkə də bu mənim nəzəriyyəmə qarşı irəli sürüləcək ən böyük etiraz olacaq.*

(Charles Darwin, The Origin of Species, s. 172, 280.)

Darvinin bu böyük bir çıxılmaz vəziyyət qarşısında irəli sürdüyü tək şərh isə, o dövrdəki fosil qeydlərinin qeyri-kafi olduğu idi. Fosil qeydləri ətraflı şəkildə araşdırıldığında, itmiş keçid formaların mütləq tapılacağını iddia etmişdi.

Ancaq 150 ildir ki, aparılan fosil tədqiqatları Darvinin və davamçılarının boş-boşuna ümid etdiklərini göstərmiş və tək bir ara keçid formasına aid fosil belə tapıla bilməmişdir. İndiki vaxtda dünyanın hər yerində minlərlə muzeydə və kolleksiyada 100 milyondan çox fosil var. Bu fosillərin hamısı bir-birlərindən dəqiq xəttlərlə ayrılan xüsusi bədən quruluşlarına sahib növlərə aiddir. Təkamülçülərin ümidlə axtardıqları yarı balıq-yarı amfibiya, yarı dinozavr-yarı quş, yarı meymun-yarı insan və bənzəri canlıların fosillərinə əsla rast gəlinməmişdir.



Con Hopkins Universitetindən professor S. M. Stenli təkamülçü olmasına baxmayaraq, bu həqiqəti belə etiraf edir:

Məlum olan fosil qeydləri pilləli təkamüllə uyğun gəlmir və heç vaxt da uyğun gəlməmişdir... Paleontoloqların əksəriyyəti dəlillərinin, Darvinin bir növün dəyişməsiylə nəticələnən çox kiçik, yavaş və getdikcə üst-üstə yığılan dəyişikliklər haqqında etdiyi çıxışla ziddiyyət təşkil etdiyini hiss etmişdir... Onların hekayələri də ört-basdır edilmişdir.

(S. M. Stanley, The New Evolutionary Timetable: Fossils, Genes and the Origin of Species, Basic Books, Inc. Publishers, New York, 1981, s. 71.)

Amerikan Təbiət Tarixi Muzeyindən paleontoloq Niles Eldredge və antropoloq İan Tattersall isə fosil qeydlərinin təkamül nəzəriyyəsinə qarşı çıxdığını belə qeyd edirlər:

*Qeydlərdəki sıçrayışlar və bütün dəlillər qeydlərin həqiqi olduğunu göstərir: Gördüyümüz boşluqlar süni bir fosil qeydinin quruluşunu deyil, həyatın tarixindəki həqiqi hadisələri əks etdirir.*

(Niles Eldredge, Ian Tattersall, The Myths of Human Evolution, Columbia University Press, 1982, s. 59.)

Bu təkamülçü elm adamlarının da ifadə etdikləri kimi həyatın həqiqi tarixini fosil qeydlərində görmək mümkündür və bu tarixdə ara keçid formaları yoxdur.

Başqa elm adamları da ara keçid formalarının tapılmadığını qəbul edirlər. Məsələn, İndiana Molekulyar Biologiya İnstitutunun Müdiri Rudolf A. Raff və İndiana Universitetindən tədqiqatçı Tomas C. Kaufman belə deyir:

*Fosil növləri arasında ataların ya da ara keçid formalarının olmaması, erkən metazoan (çox hüceyrəli heyvan) tarixinin qəribə bir xüsusiyyəti deyil. Bu boşluqlar ümumidir və bütün fosil qeydləri boyunca hakimdir.*

(R. A. Raff, T. C. Kaufman, Embryos, Genes and Evolution: The Developmental Genetic Basis of Evolutionary Change, Indiana University Press, 1991, s. 34.)

Fosil qeydlərində milyardlarla il əvvəl yaşamış bakteriyaların qalıqları belə qorunmuşdur. Buna baxmayaraq, xəyali ara keçid formalarına aid tək bir fosilin belə tapılmaması diqqət çəkicidir. Qarışqalardan bakteriyalara, quşlardan çiçəkli bitkilərə qədər bir çox canlı növünün fosilləri mövcuddur. Nəsli tükənmiş canlıların belə fosilləri o qədər qüsursuzca qorunmuşdur ki, indiki vaxtda görmədiyimiz bu canlıların necə bir quruluşa sahib olduqlarını başa düşməyimiz mümkündür. Bu qədər zəngin fosil ehtiyatlarının arasında bir dənə belə ara keçid formasının tapılmaması isə, fosil qeydlərinin əskikliyini deyil, təkamül nəzəriyyəsinin əsassızlığını göstərir.




**1) Primrose fosili. 2) Primrose bu günkü halı. 3) 2 milyon illik kəhraba içində qarışqa fosili və üzərində halhazırda yaşayan qarışqa. 4) Bir neçə milyon illik Ağcaqayın yarpağı fosili və indiki Ağcaqayın yarpaqları. 5) Yerdə, bu günə qədər tapılan ən qədim çiçəkli bitki fosili.**

# ARA KEÇİD FORMALARI NECƏ OLMALIDIR?

Əvvəlki hissələrdə təkamülçülərin ara keçid forma olduğunu iddia etdikləri canlıları nəzərdən keçirdik və bunların həqiqətdə ara keçid formalar olmadıqlarını, bir növə aid tam xüsusiyyətlərə sahib, xüsusi, mükəmməl və qüsursuz canlılar olduqlarını gördük. Bununla yanaşı təkamül nəzəriyyəsinin iddiasına görə həqiqi ara keçid formalarının necə olmasının lazım olduğunu öyrənməkdə fayda var.

Əvvəlcə təkamülə görə bir ara keçid formanın necə meydana gələcəyini yenidən xatırlayaq. Mutasiyalar, yəni radiasiya, kimyəvi faktorlar kimi səbəblərlə bir canlının DNT-sində baş verən dəyişikliklər, o canlıda bəzi dəyişikliklərə səbəb olar. Təkamül nəzəriyyəsinin iddiasına görə bir canlı növü nəsillər ərzində bəzi mutasiyalara məruz qaldığında başqa bir növə çevrilə bilər. Nəzəriyyəyə görə təbii seleksiya mutasiyalardan "faydalı" olanları seçib yığar və beləcə uzun müddət ərzində yeni bioloji strukturlar meydana gətirər. Təkamül nəzəriyyəsinin növlərin meydana gəlməsiylə əlaqədar iddiası qısaca olaraq belədir.



**Təkamül nəzəriyyəsinin iddiasına görə, canlı növləri kiçik dəyişikliklərlə bir-birindən törəmişlər. Təkamülçülərin bu iddiaları doğru olsaydı, fosil qeydlərində şəkildəki kimi ara-keçid canlı formaları tapılmalı idi. Ancaq belə canlılardan əsər-əlamət yoxdur.**

Ancaq, mutasiyalar təsadüfən baş verir və çox vaxt canlıya zərər verirlər. Zərər vermədiklərində isə canlıya heç bir təsir göstərməzlər. Mutasiyaların bu günə qədər faydalı olduqları tək bir vəziyyət belə aşkar edilməmişdir. Buna görə də mutasiyaların canlıya fayda verməsi mümkün deyil. Xüsusilə də bir canlı növünü ən başdan götürüb, şüurlu bir şəkildə o canlının bədən formasındakı və funksiyalarındakı qüsursuzluğu korlamadan canlının həyat şərtlərini çətinləşdirmədən o canlını mərhələli şəkildə başqa xüsusiyyətlərlə yaratması qeyri-mümkündür. Məsələn, mutasiyalar təsadüfi və şüursuz olduqları üçün dənizdən quruya çıxacaq bir balığın bədənində bir dəfədə ağciyər yarada bilməzlər. Və ya bu canlının üzgəclərini bir dəfədə və ya ağlabatan mərhələlərlə quruda onun bədən ağırlığını daşıya biləcək, tarazlığını itirmədən rahat bir şəkildə yeriyə biləcəyi ayaqlara çevirə bilməzlər. Mutasiyalar nəticəsində qəlsəmələrlə ağciyər, üzgəclərlə ayaqlar, pulcuqlarla tüklər, ayaqlarla qanadlar, dörd ayaqlı duruş ilə iki ayaqlı duruş, əyri skeletlə şaquli vəziyyətdə duran skelet arasında çox pis, bir çox anormallıq və deformasiyaya sahib olan, həqiqi mənada şikəst, dövrümüzdəki növlərlə heç bir əlaqəsi olmayan "deformasiya olunmuş" qəribə formalı strukturlar ortaya çıxacaq.



**Yuxarıda soldakı şəkil:** **Milyonlarla nümunəsini gördüyümüz tam bir ayaq forması.** **Sağdakı şəkillər:** **Təkamülçülərə görə mövcud olmalı, lakin mövcud olmayan qarma-qarışıq ara formalar.**

Həmçinin unutmamaq lazımdır ki, təkamülçülərin iddia etdiyi bu xəyali dəyişiklik milyonlarla il davam edəcəyi üçün, bu cür pis, şikəst ara keçid formaların sayı tam növlərdən daha çox olmalı və fosil qeydlərində də ən çox bu cür deformasiya olunmuş canlılara rast gəlinməlidir. Çünki təkamülçülərin iddialarına görə, indiki vaxtda gördüyümüz hər növ və bu növlərin sahib olduqları hər bədən quruluşu ən incə detalına qədər, göz çuxurlarından əl biləklərinə, barmaqları meydana gətirən kiçik sümük

hissələrindən kəllənin formasına, qabırğaların qəfəs formasından onurğanın sayına qədər təsadüfü mutasiyalar nəticəsində mərhələli şəkildə meydana gəlmişdir. Deməli, onda bir canlı növü yaranana qədər o canlı növünün hər orqanı, hər bədən üzvü, hər parçası mərhələli şəkildə formalaşmışdır.




**TƏKAMÜLÇÜLƏRƏ GÖRƏ TAPILMASI LAZIM OLAN ARA-KEÇİD FORMLAR:**

**Təkamülçülər canlıların mərhələ-mərhələ bu günkü formalarını aldıqlarını iddia edirlər. Ancaq buradakı kimi qəbul edilən ara-keçid formaların tək bir nümunəsi tapılmamışdır.**

**Ən üstdə:**
**Şəkillər 1-5:** Xəyali Cırcırama ara-keçid formaları.
**Şəkil 6:** Mükəmməl dizayna malik, hal-hazırda yaşayan müasir Cırcırma.
**Şəkil 7:** Təxminən 355-295 milyon illik Cırcırama fosili, hal-hazırda yaşayan müasir Cırcırama ilə eynidir.

**Ortada:**
**Şəkillər 1-4:** Xəyali quş fosili.
**Şəkil 5:** Tam bir quş fosili.

**Ən altda:**
**Şəkil 1-5:** Xəyali Pələng forması.
**Şəkil 6:** Tam bir Pələng.

**Fosil qeydlərində tapılan canlılar həmişə qüsursuz və tamdırlar. Heç biri bu şəkillərdə göründüyü kimi ara mərhələdə deyildir. Bu gerçək, təkamülün heç bir zaman yaşanmadığının önəmli bir dəlilidir.**

Məsələn, kəlləni götürək. İndiki vaxtda gördüyümüz və keçmişdə yaşayıb fosil qeydlərində tapdığımız bütün canlıların çox qüsursuz, hamar, simmetrik, heç bir deformasiyaya məruz qalmayan kəllələri vardır. Halbuki təkamülçülərin iddialarına əsasən ilk qüsursuz kəllə yaranana qədər kəllə bir

çox təhrifli mərhələdən keçmiş olmalıdır. Məsələn, simmetrik bir görünüş alana qədər bir çox assimmetrik forma almalıdır; sağa tərəf daha çox sürüşmüş, çənəsi sağa və ya sola tərəf əyilmiş, burnu sağ yanağına yaxın, qulaqları yanağına və ya geriyə tərəf, digər tərəfdəki qulağı isə tam əks istiqamətdə, göz çuxurlarının biri üstdə, digəri sola tərəf və bunlar kimi milyonlarla təhrifli forma meydana gəlməlidir. Və ya bu kəllələrin bəzilərində faydasız, lazımsız sümüklər çıxmalı, bir neçə nəsildən sonra bu sümüklər əhəmiyyət kəsb etmədikləri üçün yox olmalıdırlar. Halbuki fosil qeydlərində heç belə canlılar yoxdur. Hamısının kəlləsi dövrümüzdəki canlıların kəllələri kimi düzgün və simmetrikdir. Göz, qulaq, burun kimi orqanlar üçün ayrılan boşluqlar da yenə simmetrik və olduqca düzgündür.



**Çərçivənin içindəkilər kimi, bütün bilinən insan kəllələri simmetrik, düzgün və tamdır. Çərçivəsiz olaraq görünən və xüsusi olaraq hazırlanmış, qarma-qarışıq asimmetrik kəllələrə isə fosil qeydlərində rast gəlinmir.**

Çərçivə daxilindəki şəkillərdə göründüyü kimi, məlum olan kəllələrin hamısı tam və düzgündür. Heç biri ara keçid forma olma xüsusiyyətini daşımır. Hansı növə aid olurlarsa olsunlar, qüsursuz bir quruluşdadırlar. Yarımçıq qalmış, tamamlanmamış bir görünüşləri yoxdur. Digər bir sözlə,

bunlar təsadüfən meydana gəlmiş, təsadüfi mutasiyalar nəticəsində deformasiya olunmuş, bir növdən başqa bir növə doğru keçid xüsusiyyəti göstərən kəllələr deyil. Eynilə dövrümüzdəki canlılar kimi qüsursuz quruluşa sahibdirlər. Halbuki, əgər təkamül nəzəriyyəsi doğru olsaydı, əvvəlki səhifədə görülən əyri və formasız, təhrifli kəllələrə aid fosillər tapılmalıydı. Ancaq bu cür fosillərdən yer üzünün təbəqələrində əsər-əlamət yoxdur. Bu açıq həqiqət, təkamül nəzəriyyəsinin iddialarının doğru olmadığının qəti bir sübutudur.

Fosil qeydlərində bu cür təhrifli quruluş və orqanlardan, qəribə ara keçid növlərdən nə qədər çox tapılmasının lazım olduğunu daha yaxşı görə bilmək üçün, təkamülçülərin təsadüf anlayışı üzərində bir az daha durmaq lazımdır. Təkamül nəzəriyyəsinə görə, formalar tamamilə şüursuz bir şəkildə, təsadüfən meydana gəlirlər. Məsələn, bir canlının yaşadığı bölgədə təsadüfi mutasiyaya səbəb olacaq bir hadisə baş verir, bu hadisə canlının genetik quruluşuna təsir edir və canlıda bəzi dəyişikliklər meydana gətirir. Ancaq, bu mutasiya canlının genetik quruluşunu tamamilə dəyişdirmir. Məsələn, əllərinə, qollarına təsir etdiyi halda, kəllə olduğu kimi qala bilir. Yəni, mutasiya hansı genlərə çatsa, o genlərin nəzarət etdiyi orqan və ya strukturlarda bir dəyişiklik baş verir. Bu reallaşması heç bir şəkildə mümkün olmayan bir xəyaldan başqa bir şey deyil.

Məlum olduğu kimi canlıların sahib olduqları bütün xüsusiyyətlər DNT-lərindəki məlumatda gizlənmişdir. DNT isə, milyardlarla hərfdən ibarət olan bir məlumat bankı kimidir. Bu hərflərə çatan təsadüfi mutasiyalar, bu məlumatı mükəmməl hala gətirə bilməz, çünki bu mutasiyalarda şüur yoxdur. Buna görə də mutasiyalar DNT-dəki qüsursuz məlumatı daim korlayacaqdır.




**1) Fosil qeydlərində tapılmayan xəyali Antilop ara forması**

**2) Antiloba aid olan düzgün bir kəllə qalığı**

**3) Tam, simmetrik və qüsursuz buynuzlu bir Antilop**

**Əgər canlılar təkamülçülərin iddia etdiyi kimi təsadüfi mutasiyalar nəticəsində meydana gəlsəydilər, məsələn, Kərgədan və ya Maralın buynuzları və kəllə sümüyü əmələ gələnə qədər, ortada saysız-hesabsız forması pozulmuş, deformasiyaya uğramış və qəribə görünüşlü kəllə və buynuzlar əmələ gələrdi. Bunlar da mütləq fosil qeydlərində görülməli idi. Halbuki fosil qeydlərində tapılan bütün kəllə və buynuzlar, tam və qüsursuzdur.**

Şüursuz şəkildə baş verən mutasiyalar ən başdan qüsursuz, mükəmməl bir quruluş meydana gətirə bilməzlər. Həmişə təhrifli, əyri, əskik, qüsurlu quruluşlar meydana gətirərlər. Məsəl üçün əllər də təkamül nəzəriyyəsinin iddiasına görə təsadüfi mutasiyaların bir əsəridir. Ancaq təsadüfən baş verən mutasiyalar həm estetik, həm ən faydalı, həm də cisimləri ən qüsursuz şəkildə tutma, idrak və hiss etmə qabiliyyətinə sahib əllər meydana gətirə bilməzlər.

Ən mükəmməl vəziyyətə gələnə qədər (belə ki, bunu bacarmaları qeyri-mümkündür) arada milyonlarla təhrifli əl, qol, ayaq, qıç yaratmalıdırlar. Məsələn, hər bir barmağın uzunluğu bugünkü formasına gələnə qədər milyonlarla mərhələdən keçəcək. Təkamülçülərin iddialarına görə kor təsadüflər barmaqları biləklərdən, qolun orta hissəsindən, əlin üstündən, ovuclardan çıxardacaq, onları yan-yana düzənə qədər hər nəsildə bir-birinin arxasınca bir çox sınaqdan keçəcək. Necə ki, əlinizdə hərflərin yazılı olduğu möhürü təsadüfən yerə atsanız bunların müəyyən bir ardıcıllıqla düzülüb mənalı bir cümlə, hətta bir söz meydana gətirmələrini gözləyə bilməzsiniz, təsadüfi baş verən mutasiyaların əl və ya ayaq barmaqlarını, qıç və qol sümüklərini də ən düzgün, ən faydalı, ən estetik ardıcıllıqda düzmələrini gözləyə bilməzsiniz.



**Əgər Təkamül Nəzəriyyəsi doğru olsaydı, şəkillərdə gördüyümüz qarma-qarışıq, formasız, qəribə əl və qol quruluşlarına fosil qeydlərində tez-tez qarşılaşmamız lazım idi. Ancaq bilinən bütün əl və qol formaları, son dərəcə funksional və düzgündür.**

Məsələn, ayaq sümükləri insanın ən ideal və ən az yorularaq yeriyə biləcəyi və bədənin ağırlığını ən az hiss edə biləcəyi şəkildə xüsusi olaraq yaradılmışdır. Ayaqdakı qövs, bədən ağırlığına qarşı sümüklərə dəstək vermə xüsusiyyətinə malikdir. Bu səbəblə də bu qövsdən məhrum olan düz dabanlılar yeriyərkən çətinlik çəkərlər. Təkamülçü iddiaları doğru qəbul etdiyimiz təqdirdə, ayaq sümükləri bu incə detallara sahib olmaq üçün çoxsaylı mərhələlərdən keçməlidir. Onda fosil qeydlərində də bu mərhələlərin heç olmasa bir neçəsinə rast gəlinməlidir. Halbuki, fosil qeydlərində yarım mərhələlər deyil, hər vaxt tam və qüsursuz ayaqlar var.




**Şəkil1 4: Fosil qeydlərində tapılmayan xəyali, qarma-qarışıq, formasız ayaq sümüyünün quruluşları.**

**Xəyali, qarma-qarışıq ayaq sümüyünün quruluşları insanların yeriməsinə və hətta nizamlı olaraq ayaq üstə durmasına əngəl olacaq şəkildədir. Ancaq bilinən bütün ayaq sümüyünün fosilləri ən ideal dizayna malikdir və bu cür anormallıqlarla qarşılaşmaz.**

**Şəkil 5: İnsana aid düzgün ayaq sümüyü.**

Təkamülçülərin iddialarına görə fosil qeydlərində mərhələlərinə rast gəlinməsi lazım olan başqa bir struktur isə əyri onurğadır. Onurğa, "fəqərə" adlanan 33 kiçik yumru sümüyün bir-birinin üstünə düzülməsiylə meydana gəlir və insan üçün həyati bir əhəmiyyət daşıyır. Onurğa, bədənin üst hissəsinin bütün ağırlığını daşıyır. Onurğanın "S" formasındakı qıvrımlı quruluşu, üstündəki yükün bərabər paylanmasını təmin edir. Yerimək üçün atılan hər addımda, bədənin ağırlığından ötrü yerdən bədənə doğru bir itələmə qüvvəsi gəlir. Bu qüvvə onurğanın sahib olduğu amorizatorlar və "qüvvə paylayıcı" qıvrımlı forması sayəsində bədənə zərər verməz. Əgər reaksiyanı azaldan amorizatorlar və qıvrımlı xüsusi quruluş olmasa atılan hər addımda əmələ gələn qüvvə birbaşa olaraq kəlləyə çatardı və onurğanın yuxarı ucu kəllə sümüklərini parçalayaraq beynin içinə daxil olardı. Belə bir vəziyyətdə isə, insan nəslinin davam etməsi qeyri-mümkün olardı.




**Şəkil 1-3: Xəyali qarma-qarışıq onurğa şəkilləri.**

**Şəkil 4: Orijinal insan onurğası son dərəcə düzgündür və bədəni çevik saxlamaq üçün ən ideal dizayna malikdir. Təkamülçülərə görə, ara-keçid forma olaraq olması lazım olan qarma-qarışıq onurğa şəkillərinə isə heç rast gəlinməməkdədir.**

Guya insanın atası olaraq göstərilən bütün onurğalıların da onurğası düzdür. Məlum olan ən qədim onurğalılar olan kembri dövrü balıqlarının, onlardan sonra ortaya çıxan balıqların və ya quruda yaşayan onurğalıların hamısı düz və özlərinə məxsus onurğa quruluşuna sahibdirlər və aralarında heç bir ara keçid forması yoxdur. Təkamül nəzəriyyəsinin iddiasına görə təsadüflər bu mükəmməl onurğaları meydana gətirənə qədər yüz minlərlə ara

keçid onurğa forması meydana gətirməlidirlər. Məsələn, onurğa, beyni parçalamayacaq bir forma alana və "S" formalı buruq quruluşa malik olana qədər, onun bir çox fərqli ara keçid forması meydana gələcək. İnsan onurğasının 33 hissəsi də bir anda meydana gəlməyəcək, minlərlə nəsil ərzində mərhələli şəkildə meydana gələcək. Əlbəttə ki, bu mərhələli şəkildə inkişaf fosil qeydlərində də iz buraxacaq, 2 fəqərəli, 5 fəqərəli, 12 fəqərəli quruluşlara sahib fosillər tapılacaq. Ancaq, fosil qeydlərindəki fəqərələr daim o canlı üçün ən mükəmməl, ən uyğun olan quruluş və xüsusiyyətlərə sahibdirlər. Forma və quruluş etibarilə qüsurlu, əskik, yarımçıq deyil, əksinə ən mükəmməl quruluşdadırlar. Yəni aşağıdakı şəkillərdə görünən ara keçid onurğa quruluşlarına fosil qeydlərində heç rast gəlinməmişdir.




**Şəkil 1-5:** **Əgər təkamülçülərin iddia etdiyi kimi mərhələli bir şəkildə inkişaf olmuş olsaydı; Yuxarıda göstərildiyi kimi, 2 və ya 5 fəqərədən ibarət fəqərələr olmalı idi. Ancaq fosil qeydlərində bu cür nümunələrə heç vaxt rast gəlinmir. Əksinə, bilinən bütün onurğa quruluşları, bu günkü mükəmməl formalarına malikdir.**

**Şəkil 6:** **Əsl onurğa.**

Fosil qeydlərində bütün canlılar həmişə ən mükəmməl hallarıyla və tam olaraq mövcuddur. Təkamülçülərin ara keçid forması olaraq irəli sürdükləri canlılar da, əvvəlki səhifələrdə ifadə edilən ara keçid forması xüsusiyyətlərinə sahib deyil. Bunların hər biri bütün xüsusiyyətləri baxımından bütövdür, ara keçid mərhələdə olan, əskik heç bir orqan və ya quruluşları yoxdur. Kəllələri, onurğaları, əl və ayaq quruluşlarında heç bir yarımçıqlıq, nöqsan qalmış xüsusiyyət yoxdur. Bütün canlılar qüsursuz hallarıyla mövcuddur.

Məsələn, delfinin, bayquşun, balıqların, dələlərdən əvvəl yer üzü təbəqələrində bir az delfini xatırladan, bir az bayquşa bənzəyən, amma bir tərəfdən də başqa canlılara aid yarım xüsusiyyətlər daşıyan qəribə canlıların fosilləri qətiyyən yoxdur. Bütün bu həqiqətlər bizə təkamül nəzəriyyəsinin "milyonlarla il ərzində mərhələli şəkildə inkişaf edən canlılar" iddiasının tamamilə bir xəyal olduğunu göstərir. Təxminən 1,5 əsrdir ki, dünyanın hər yerində təkamülçülərin fəaliyyətlərinə və dəlil axtarışlarına baxmayaraq, bu iddianı dəstəkləyəcək tək bir dəlil belə bu günə qədər tapıla bilməmişdir.



*(Allah)* **Göyləri və yeri haqq olaraq yaratmışdır,** *(Allah)* **Ona şərik qoşulan bütlərdən ucadır! İnsanı nütfədən** *(mənidən, bir qətrə sudan)* **xəlq etdi. Bununla belə, o, birdən-birə açıq-aşkar bir düşmən kəsildi. Davarı da O yaratdı. Bunlarda sizin üçün istilik, cürbəcür mənfəət vardır, həm də onlardan yeyirsiniz. Onları səhər naxıra, axşam axura gətirdikdə baxıb zövq alırsınız** *(fərəhlənirsiniz)***.** (Nəhl surəsi, 3-6)

# QALIQ QEYDLƏRİNDƏKİ SABİTLİK

Qalıq qeydlərinin ən diqqətə çarpan xüsusiyyətlərindən biri, canlıların bu qeydlərdə müşahidə edildikləri geoloji dövrlər ərzində dəyişikliyə məruz qalmamalarıdır. Başqa sözlə bir canlı növü qalıq qeydlərində ilk olaraq necə ortaya çıxıbsa, elə bu cür də yox olana qədər və ya dövrümüzə gəlib çıxana qədər on milyonlarla, hətta yüz milyonlarla il ərzində heç bir dəyişikliyə məruz qalmır, eyni quruluşunu qoruyub saxlayır. Bu, canlıların heç bir təkamülə məruz qalmadıqlarının açıq bir dəlilidir

Bu həqiqəti ilk elan edən kəslərdən biri 20-ci əsrdəki ən tanınmış, nüfuz sahibi təkamülçülərdən biri olan Amerikalı paleontoloq və elm tarixçisi Stephen Jay Goulddur. Gould 1970-ci ildə qalıq qeydlərinin ən diqqətə çarpan iki xüsusiyyəti haqqında belə yazmışdır:

Qalıqlaşmış növlərin əksəriyyətinin tarixi, mərhələli təkamüllə ziddiyyət təşkil edən iki fərqli xüsusiyyət ortaya qoyur:

**1. Sabitlik:** Bir çox növ dünyada mövcud olduğu müddət ərzində heç bir baxımdan dəyişikliyə məruz qalmaz. Qalıq qeydlərində ilk ortaya çıxdıqları vaxt hansı strukturlara sahibdirsə, qeydlərdən yox olduqları vaxt da həmin strukturlara da sahibdirlər. Morfoloji (görünüş) dəyişiklik adətən məhduddur və məlum bir istiqaməti yoxdur.

**2. Qəfildən ortaya çıxış:** Hər hansı bir lokal ərazidəki bir növÕ əcdadlarından mərhələli dəyişikliklərə məruz qalaraq mərhələli şəkildə ortaya çıxmaz; bir anda və "tamamilə formalaşmış" olaraq ortaya çıxar.

(S. J. Gould,"Evolution's Erratic Pace", Natural History, vol. 86, May 1977.)

Gould sonrakı illərdə də qalıq qeydlərində müşahidə olunan sabitliyi qəbul etdiyini ifadə etmişdir. 1993-cü ildə “Natural History” jurnalındakı bir yazısında belə deyir:

Bir çox qalıq növünün geoloji həyat müddəti ərzində sabit qalması ya da heç bir dəyişikliyə məruz qalmaması, bütün paleontoloqlar tərəfindən sözlə ifadə edilmədən təsdiqlənmişdir, ancaq əsla ətraflı bir şəkildə tədqiq edilməmişdir... Sabitliyin geniş yayılması qalıq qeydlərinin utandırıcı xüsusiyyəti halına gəldi, ancaq yoxluğun (belə ki, bu təkamülün yoxluğudur) bir elanı olaraq diqqətdən kənarda saxlanıldı.

(S. J. Gould, "Cordelia's Dilemma", Natural History, Şubat, s. 10-18.)

Hər ikisi də tanınmış paleontoloqlardan olan İan Tatterstall və Niles Eldredge isə, “the myths of evolution” (təkamül əfsanələri) adlı kitablarında qalıq qeydlərinin Darvinin fərziyyələri ilə olan ziddiyyətini və sabitlik həqiqətini belə izah edirlər:

Paleontoloqlar qalıqlarını qaya qeydləri boyunca izlədiklərində, gözlədikləri dəyişiklikləri görmürlər... Hər bir müxtəlif qalıq növünün, qalıq qeydlərində mövcud olduqları müddət ərzində tanınacaq şəkildə eyni olduğu, Darvinin Növlərin Mənşəyi adlı kitabının nəşr olunmasından xeyli əvvəldən bəri paleontoloqlar tərəfindən bilinirdi. Darvin... gələcək nəsil paleontoloqlarının bu boşluqları çalışqan axtarışlarıyla dolduracaqlarını güman etmişdir... Sonralar aparılan 120 illik paleontoloji tədqiqatlar isə, qalıq qeydlərinin Darvinin fərziyyələrinin bu qismini təsdiq etməyəcəyini ən

açıq bir şəkildə ortaya qoymuşdur. Problem qeydlərin əskik olması da deyil. Qalıq qeydləri açıq şəkildə bu fərziyyənin səhv olduğunu göstərir.

Növlərin uzun zaman ərzində təəccüblü şəkildə sadə və sabit xüsusiyyətlərə sahib olması, "çılpaq kral" hekayəsinin bütün xüsusiyyətlərini daşıyır; hər kəs bilər, ancaq görməzlikdən gələr. Paleontoloqlar Darvinin nəzərdə tutduğu cədvəli inadla rədd edərək etiraz edən və tamamilə başqa istiqamətə baxan söz eşitməz bir qeydlə üz-üzədirlər.

(Niles Eldredge, Ian Tattersall, The Myths of Human Evolution, Columbia University Press, 1982, s. 45-46.)

Sözügedən sabitliyə aid saysız-hesabsız nümunələr vardır. Məsələn, Vayominqdəki Bighorn hövzəsində məməlilərin ilk dövrlərinə aid 5 milyon illik qalıq yataqları mövcuddur. Buradakı qalıq qeydləri o qədər zəngindir ki, paleontoloqlar buradakı qalıqlarda ara keçid formalarını da tapa biləcəklərini və təkamül prosesini göstərə biləcəklərinə ümid etmişdilər. Ancaq ümidləri puç oldu. Bir-birindən təkamülləşdiyini irəli sürdükləri növlərin eyni dövrlərdə yaşadıqları məlum oldu və "qalıq qeydlərinin bir növdən digərinə keçidi göstərən tək bir inandırıcı dəlil belə təqdim etmədiyi" (Steven M. Stanley, The New Evolutionary Timetable, 1981, s. 71) müşahidə olundu. Həm də növlər qeydlərdən yox olana qədər bir milyon il ərzində heç dəyişmədən sabit qalırdılar.

Halbuki təkamül nəzəriyyəsinin iddiasına görə növlərin bir-birindən təkamülləşə bilməsi üçün, onlar, daimi bir dəyişiklik keçirməlidirlər. Məsələn, gəmirici bir canlının yarasa və ya balinaya çevrilə bilməsi üçün, o, çox uzun dövrlər ərzində mərhələli şəkildə kiçik dəyişikliklər keçirməlidir. Gəmirici bir canlının yarasa və ya balinanın xüsusiyyətlərini qazana bilməsi üçün isə, bu mərhələli çevrilmə çox uzun bir müddət davam etməlidir. Bu uzun müddət ərzində isə çox sayda ara keçid forması meydana gəlməli və bu ara keçid formalar arxalarında milyonlarla qalıq buraxmalıdırlar. Halbuki qalıq qeydlərində ara keçid forması xüsusiyyətlərinə sahib canlılara heç rast gəlinmir. Tapılan qalıqlar gəmiricilər, yarasalar və ya balinalar kimi tam və diqqətə çarpan xüsusiyyətlərə sahib xüsusi canlılardır və bu canlılar qalıq qeydlərində bu tam hallarıyla mövcuddurlar.

Niles Eldredge qalıq qeydlərində ara keçid formalarının tapılmamasının və sabitlik mövzusunun təkamülçü paleontoloqlar tərəfindən çox yaxşı bilindiyini, ancaq qəsdən görməzlikdən gəlindiyini belə etiraf edir:

Göründüyü kimi hər yeni nəsil qalıqlardakı təkamül xarakterli dəyişikliyin nümunələrini sənədləşdirmək üçün səbirsizlənən bir neçə yeni paleontoloq ortaya çıxarır. Əlbəttə ki, həmişə mərhələli şəkildə inkişafa aid dəyişikliklər axtarıldı. Bu paleontoloqların səyləri çox vaxt qarşılıqsız qalmaqla yanaşı, qalıqlar gözlənilən xüsusiyyətləri göstərmək əvəzinə, daim sabitlik göstərdilər... Bu (qalıqlardakı) fövqəladə sabitlik, təkamüllü dəyişməni tapmağa can atan paleontoloqlara heç bir təkamül yoxmuş kimi göründü. Mərhələli təkamül əvəzinə daimi sabitliyi sənədləşdirən işlər, müvəffəqiyyətsizlik kimi xarakterizə edildi və adətən nəşr olunmadı. Paleontoloqların əksəriyyəti dəyişməzliyin, sabitlik olaraq adlandırılan dəyişmə əskikliyinin fərqində idi…

(Niles Eldredge, Evolutionary Tempos and Modes: A Paleontological Perspective," in the collection What Darwin Began: Modern Darwinian and Non-Darwinian Perspectives on Evolution (Godfrey, ed, 1985))

Qalıq qeydlərinin hər cəhətdən təkamül nəzəriyyəsini açıq şəkildə yalanladığı görülür. Eldredge'in sözlərində diqqət çəkən ayrı bir mövzu isə, qalıq qeydlərində növlərin dəyişmədiyinin, əksinə sabit qaldıqlarının sənədləşdirildiyi işlərin dərc olunmaması və müvəffəqiyyətsizlik olaraq xarakterizə edilməsidir. Təkamülçülər yalnız qalıqlar mövzusunda deyil, digər əlaqədar elm sahələrində də təkamül əleyhində olan dəlilləri gözlərdən uzaqda saxlama, tərəfli şərhlərlə cəmiyyəti yanıltma mövzusunda olduqca təcrübəlidirlər. Eldredge də sözlərinin arasında təkamülçülər arasında vərdiş halına çevrilən bu üsulu ifadə edir.

“Focus” jurnalı da təkamülçü nəşr olmasına baxmayaraq, selakantın mövzu olaraq götürüldüyü aprel 2003-cü il tarixli buraxılışında bu balıq kimi milyonlarla ildir ki, dəyişməyən canlılardan belə danışmışdır:

Selakant kimi böyük bir canlının bu qədər il ərzində elm dünyasının məlumatından uzaq yaşadıqdan sonra tapılması, öz üzərinə xeyli diqqət çəkilməsinə gətirib çıxardı. Halbuki, selakant kimi bundan milyonlarla il əvvələ aid qalıqlarıyla tamamilə bənzər olan orqanizmlərin sayı olduqca çoxdur. Məsələn, qabıqlı bir heyvan növü olan neopilina 500 milyon ildən bəri, əqrəb, 430 milyon ildən bəri; zirehli və qılınc quyruqlu bir heyvan, dənizdə yaşayan bir canlı olan limulus, 225 milyon ildən bəri; yalnız Yeni Zelandiyada yaşayan bir sürünən növü olan tuatara da, təxminən 230 milyon ildən bəri dəyişmədi. Çoxayaqlıların bir çox dəstəsi, timsahlar, dəniz tısbağaları və bir çox bitki növü də uzanıb gedən siyahının bir hissəsidir.

(Focus, Nisan 2003.)

“Focus” jurnalı bu qalıqların təkamül nəzəriyyəsinə vurduğu zərbəni isə açıq şəkildə etiraf edir:

Təkamül nöqteyi-nəzərindən baxıldığında bu tip orqanizmlərin mutasiyaya məruz qalma ehtimalı digərlərinə nisbətən xeyli yüksəkdir. Çünki hər yeni nəsil DNT-nin surətinin çıxarılması deməkdir. Milyonlarla il ərzində surətçıxarma əməliyyatının neçə dəfə edildiyini düşündükdə ortaya çox maraqlı bir mənzərə çıxır. Nəzəriyyədə dəyişən mühit şərtləri, düşmən növlər, növlər arası rəqabət kimi müxtəlif təzyiq ünsürlərinin təbii seleksiyaya səbəb olmalı, mutasiyaya məruz qalmış faydalı növlər seçilməli və bu növlər bu qədər uzun müddət ərzində bir çox dəyişikliyə məruz qalmalıyıdı. Amma həqiqət belə deyil. Məsələn, hamam böcəklərini götürək. Çox sürətlə çoxalırlar, ömürləri də qısa olur, amma təxminən 250 milyon ildən bəri dəyişməmişdirlər. Daha təəccüblü bir nümunə isə arxeyalardır. Tam 3,5 milyard il bundan əvvəl, dünya hələ çox isti olduğu vaxtda ortaya çıxıblar, indiki vaxtda da Yellostoun Milli Parkındakı qaynar sularda yaşamağa davam edirlər. (Focus, Nisan 2003.)

Selakant kimi yaşayan qalıqların ortaya çıxdıqları gündən dövrümüzə qədər keçən müddət ərzində heç bir dəyişikliyə məruz qalmaması, sürəkli dəyişməni önə sürən təkamüllə deyil, canlıların ayrı-ayrı yaradıldıqlarını və heç dəyişmədən dövrümüzə qədər gəlib çatdıqlarını göstərən yaradılış həqiqətinə uyğun gəlir. Yaşayan qalıqlar bir yaradılış dəlilidirlər. Allah milyonlarla canlı növünü möcüzəvi bir şəkildə yoxdan yaratmışdır.

# TAPILAN FOSİLLƏR YARADILIŞI ELAN EDİR

## DƏNİZ CANLILARINDAN FOSİL NÜMUNƏLƏRİ





**SELEKANT**

**Dövr:** Yura

**Yaş:** 145 milyon il

**Ərazi:** Zolnhofen formasiyası, Eyxştatt, Almaniya



## SARDİNA

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Sardina balıqları sürü şəklində yaşayan balıqlardır. 54-37 milyon illik bu fosildə bir neçə sardinanın eyni anda birlikdə fosilləşdiyi görünür. Bu fosil sardina balıqlarının sahib olduqları bütün xüsusiyyətlərlə bir anda yaradıldıqlarının və on milyonlarla ildir heç bir dəyişikliyə məruz qalmadıqlarının dəlilidir.

Canlının fosili sardina balığının kəllə quruluşunu, bədəninin altındakı və üstündəki kiçik üzgəclərini, iki hissəyə ayrılmış quyruq formasını çox dəqiq şəkildə göstərir. Sardina balıqları da kainatdakı bütün canlılar kimi üstün güc və ağıl sahibi Rəbbimizin əsəridir.



## DƏNİZ ULDUZU

**Dövr:** Ordovik
**Yaş:** 500 - 440 milyon il
**Ərazi:** Mərakeş

Dəniz ulduzları əksər hallarda dənizin dibində yaşayırlar, 7000 metr dərinlikdə yaşayan növlərinə rast gəlinir. Təxminən yarım milyard ildir heç dəyişmədən nəsillərini davam etdirən bu canlılar qarşısında təkamülçülər çarəsizdirlər. Çünki həmin canlılar on milyon deyil, yüz milyon deyil, iki yüz milyon deyil, təxminən beş yüz milyon ildir ki, eynidirlər. Əgər təkamülçülərin iddiaları doğru olsa idi, dəniz ulduzları beş yüz milyon illik zaman ərzində çoxdan başqa canlılara çevrilər, bu əsnada yarı dəniz ulduzu, yarı başqa bir heyvan olan bir çox qəribə canlının qalığı dövrümüzə qədər gələrdi. Ancaq fosil qeydlərində təkamülçülərin bu iddialarının heç bir dəlili yoxdur.

Şəkildəki 500 milyon illik dəniz ulduzunun da sübut etdiyi kimi, dəniz ulduzları hər zaman dəniz ulduzu olaraq mövcud olublar, başqa bir canlıdan törəyib, başqa bir canlıya çevrilməyiblər.



## SİYƏNƏK

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Fosil qeydlərinin hər baxımdan təkamül nəzəriyyəsini açıq şəkildə təkzib etdiyi görünür. Şəkildəki siyənək fosili 54-37 milyon yaşındadır. 54-37 milyon il əvvəl yaşayan siyənək balıqlarının fizioloji xüsusiyyətləri ilə dövrümüzdə yaşayan siyənək balıqları arasında heç bir fərq yoxdur. Siyənək balığının 54-37 milyon illik fosili tədqiq edildikdə balığın kəllə quruluşunun, üzgəclərinin və quyruq formasının heç dəyişmədiyinə şahid oluruq. Siyənək fosilləri də digər nümunələr kimi bütün canlıların uca Allah tərəfindən yaradıldığını sübut edir.



**SARQAN**

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Əgər darvinistlərin iddia etdiyi kimi canlılar bir-birlərindən təkamül etsəydilər, iki fərqli canlının xüsusiyyətlərini daşıyan (məsələn, yarı sarqan, yarı siyənək; yarı akula, yarı balina; yarı alabalıq, yarı timsah və s.) bir çox fosil nümunəsinə rast gəlməli idik. Lakin belə bir fosilə heç rast gəlinməmişdir. Əslində, Darvin də hələ nəzəriyyəsini ortaya atarkən bu vəziyyətin özü üçün çıxılmaz girdab olduğunu görmüşdür. Buna görə "Növlərin mənşəyi" kitabının "Nəzəriyyənin çətinlikləri" (Difficulties on Theory) adlı bölməsində belə yazmışdır:

*"Əgər növlər digər növlərdən hiss edilməyəcək dərəcədə kiçik tədrici dəyişikliklərlə törəyibsə, nə üçün hər yerdə saysız-hesabsız keçid formalar görmürük? Nə üçün bütün təbiət qarma-qarışıqlıq içində deyil, bunun əvəzinə, gördüyümüz kimi tam nizamlanmış növlər vardır? ...Keçmişdə yer üzündə yaşamış keçid formalar olduqca nəhəng sayda olmalıdır. Bəs nə üçün hər geoloji formasiya və hər təbəqə bu cür keçid həlqələri ilə dolu deyil?"*

(Charles Darwin, "The Origin of Species", səh. 171, 280)



## FAVİA MƏRCANI

**Dövr:** Devon
**Yaş:** 350 milyon il
**Ərazi:** Mərakeş

Təkamülçülər illərlə yeni xəyali iddialar ortaya atdılar və hər dəfə də bu iddialarını geri götürmək məcburiyyətində qaldılar. Bəzən fosilləri gizlətməyə çalışdılar, bəzən xəyali rekonstruksiyalar hazırladılar. Elmi jurnallarda xəyali təsəvvürləri ilə çəkdikləri keçid fosillərini jurnalın üz qabığında dərc etdilər, lakin qısa müddət ərzində hazırladıqları yeni nömrələrdə üzr istəmək məcburiyyətində qaldılar. Çünki yerin altından çıxarılan fosil qalıqları təkamülçülərin iddialarını məhv etdi.

Şəkildə görünən 350 milyon illik mərcan yaradıldığı ilk gündən dövrümüzə qədər heç dəyişməmişdir. Bu fosil də eynilə digər milyonlarla fosil kimi darvinizmin yalnız azğın ideologiya olduğunu, elmlə heç bir əlaqəsinin olmadığını sübut edir.



## GİTARA SKATI

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

95 milyon il əvvəlki gitara skatı ilə dövrümüzdəki gitara skatı uzun-nazik quyruğu, bədənindən çıxan kiçik üzgəcləri və konusu xatırladan kəllə quruluşu baxımından tamamilə eynidir.

Bir çox heyvan özünə xas quruluşu ilə o qədər ayırd edilə bilən şəkildə fosilləşmişdir ki, fosil qalıqlarını müşahidə edən alimlər təkamül nəzəriyyəsinin tarixə çevrildiyini qəbul etmək məcburiyyətində qalıblar. Allahın üstün yaratmasının izləri olan fosillər təkamülçülərin yalanlarını günbəgün ortaya çıxarır.

Gitara skatı on milyonlarla ildir dəyişmədən qalan canlılara sadəcə bir nümunədir. Bütün təfərrüatları ilə qorunmuş milyonlarla fosil təkamülün yalan, yaradılışın isə həqiqət olduğunu bizə göstərir və insanlara kainatdakı mükəmməlliyin təsadüfən yaranmadığını izah edir.

21-ci əsr, Allahın izni ilə, darvinist saxtakarlığın məğlub edildiyi müqəddəs dövr olacaq.



## ANGVİL

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Fərqli növlərə aid fosillərin fosil qeydlərində mövcud olduqları müddət ərzində heç bir dəyişiklik göstərməməsi Darvinin "Növlərin mənşəyi"ni yayımlamasından əvvəl belə paleontoloqların bildiyi həqiqətdir. Darvin gələcək nəsillərin bu boşluqları dolduran yeni fosil tapıntıları əldə edəcəklərinə dair fikir irəli sürüb. Lakin aradan keçən 150 il boyu aparılan bütün paleontoloji araşdırmalar nəticəsində fosil qalıqlarının Darvinin bu proqnozunu təsdiq etmədiyi açıq-aydın görünür.

Şəkildə görünən angvil də 95 milyon il keçməsinə baxmayaraq, zərrə qədər dəyişiklik keçirməmiş, təkmilləşməmiş və başqa canlıya çevrilməmişdir.



## DƏNİZ ATI

**Dövr:** Pliosen
**Yaş:** 3 milyon il
**Ərazi:** İtaliya

Dəniz atları xarici görünüşləri və olduqca xüsusi nizama malik olan ümumi quruluşları ilə diqqət çəkən canlılardır. Boyları 4-30 sm arasında dəyişən dəniz atları, əksərən, sahil zonalarında yosunların və digər bitkilərin arasında yaşayırlar. Sahib olduqları qoruyucu sümükvari zireh bu heyvanları təhlükələrdən qoruyur. Zireh o qədər möhkəmdir ki, qurumuş ölü dəniz atını əlinizlə qırmağınız, demək olar ki, mümkün deyil. Şəkildəki 3 milyon illik dəniz atı canlıların təkamül keçirmədiyini, hamısını Allahın yaratdığını söyləyir.



## SKUMBRİYA

**Dövr:** Miosen
**Yaş:** 5 milyon il
**Ərazi:** İtaliya

Bu günə qədər əldə edilən 100 milyon fosilə baxdıqda bir həqiqət görünür: o da canlıların təkamül keçirməməsidir. Əgər canlılar təkamül keçirsə idi, məsələn, skumbriyalar başqa canlı növündən dəyişərək bugünkü hallarına çevrilsə idilər, bu halda, dövrümüzdəki skumbriyalarla bundan milyonlarla il əvvəl yaşayanlar arasında çoxlu fərqlər olmalı idi. Lakin belə bir fərq yoxdur. Bugünkü skumbriyalar necədirsə, 5 milyon il bundan əvvəl yaşayanlar da elədir və bunun mənası aydındır: elmi tapıntılar təkamülün yalan olduğunu deyir.



## QULAQLI XANI BALIĞI, SİYƏNƏK BALIĞI

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Canlıların milyonlarla ildir heç dəyişmədiklərini göstərən yaşayan fosillər təkamül nəzəriyyəsinə ağır zərbə vurur. Məlum olduğu kimi, təkamül nəzəriyyəsi ancaq dəyişən mühit şərtlərinə uyğunlaşa bilən canlıların həyatda qaldığını, bəzi xəyali təsadüfi dəyişikliklərin təsiri ilə canlıların təkamül vasitəsilə başqa canlılara çevrildiyini iddia edir. Yaşayan fosillər isə nəzəriyyənin növlərin vaxt keçdikcə dəyişən mühitə görə dəyişiklik keçirdiyi iddiasının əsassız nağıldan ibarət olduğunu ortaya qoyur.



## ZİREHLİ DURNA BALIĞI

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Bu günə qədər əldə edilən yüzlərlə zirehli durnabalığı fosili bu canlıların milyon illərdir cüzi dəyişikliyə belə məruz qalmadıqlarını göstərir. Şəkildə görünən 54-37 milyon illik zirehli durnabalığı ilə dövrümüzdə dənizlərdə yaşayanlar arasında heç bir fərq yoxdur. Bu eynilik darvinistlərin açıqlaya bilmədikləri vəziyyətdir və yenə yaradılış həqiqətini sübut edir.



**YENGƏC**

**Dövr:** Oliqosen
**Yaş:** 37 - 23 milyon il
**Ərazi:** Danimarka

Fosil qalıqları, darvinistlərin təxminən 150 ildir önə sürdükləri "ara-keçid forma fosilləri tapılmayıb, lakin sonrakı dövrdə tapıla bilər" arqumentinin artıq qüvvədə olmadığını göstərir. Fosil tapıntıları canlılar aləminin mənşəyini anlamaq üçün kifayət qədər zəngindir və qarşımıza aydın cədvəl çıxarır: fərqli canlı növləri aralarında təkamül xarakterli keçid formaları olmadan, yer üzündə bir anda və müxtəlif quruluşları ilə ayrı-ayrılıqda ortaya çıxıb. Bunun mənası isə aydındır: canlıları Allah yaradıb.

Bu həqiqəti göstərən tapıntılardan biri də şəkildə görünən 37-23 milyon il yaşındakı yengəc fosilidir.



## SKAT

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Skatlar qığırdaqlı dəniz canlılarındandır. Hər hansı bir təhlükə ilə qarşı-qarşıya qaldıqda quyruqlarındakı zəhərli iynəni batıraraq özlərini müdafiə edirlər. Gözləri bədənlərinin üzərində, ağızları isə bədənlərinin altında yerləşir. Yemlərini akulalar kimi iybilmə bacarıqlarından və elektrik reseptorlarından istifadə etməklə tapırlar. Çox vaxt yalnız gözləri və quyruqları görünən tərzdə dənizin dibində gizlənmiş formada yaşayırlar.

Şəkildəki fosil skatların təkamül keçirmədiyini göstərən dəlildir. 50 milyon il əvvəlki skatlar dövrümüzdəkilərdən fərqlənmirlər. Milyonlarla il keçməsinə baxmayaraq, skatların quruluşunda dəyişiklik olmamışdır. Təkamülçülərin iddiaları doğru olsa idi, bu zaman ərzində skatlar müxtəlif mərhələlərdən keçməli və bu mərhələləri göstərən kifayət qədər fosil olmalı idi. Lakin tapılan hər fosil dövrümüzdəki skatlarla keçmişdə yaşayanların eyni olduğunu göstərir, yəni təkamülçülərin iddiasını təkzib edir.



**KALMAR**

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Kalmarların tarix boyu hər zaman kalmar kimi mövcud olduqlarının sübutu olan şəkildəki 95 milyon illik fosil təkamülçülərin iddialarına meydan oxuyur. Kalmarların təkamül keçirdiyinə dair ən kiçik bir dəlil belə önə sürə bilməyən təkamülçülər fosil qeydləri qarşısında pərişan haldadırlar.





## PİŞİK AKULA

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Darvinizmin elmdən kənar iddialarına görə, bitkilər, heyvanlar, göbələklər, bakteriyalar həmişə eyni kökdən gəliblər. Heyvanların 100-ə yaxın fərqli tipi (yəni molyusklar, buğumayaqlılar, qurdlar, süngərlər kimi başlıca kateqoriyalar) bir xəyali ortaq əcdaddan törəmişdir. Nəzəriyyəyə görə, onurğasız canlılar zaman ərzində (və təsadüfən) onurğa qazanaraq balıqlara, balıqlar amfibiyalara, onlar sürünənlərə, sürünənlərin bir qismi quşlara, bir qismi isə məməlilərə çevrilmişdir. Nəzəriyyəyə görə, bu çevrilmə yüz milyonlarla illik uzun zamanı əhatə etmiş və mərhələ-mərhələ davam etmişdir. Bu vəziyyətdə iddia edilən uzun zamanı əhatə edən çevrilmə prosesi əsnasında saysız-hesabsız ara-keçid növ yaranmalı və yaşamalı idi. Lakin belə bir ara-keçid növün dəlilinə fosil izlərində heç rast gəlinməmişdir. Fosillər hər zaman şəkildəki 95 milyon illik pişik-akula kimi bütün xüsusiyyətləri ilə nöqsansız var olmuş və milyon illərdir heç dəyişməmiş canlıların varlığını göstərir. Bu da təkamülün fosillər qarşısındakı məğlubiyyətinin xəbərçisidir.



## QIZILBALIQ - XANI

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Şəkildəki qızılbalıq-xanı *(percopsidae)* fosili bu canlıların milyon illərdir dəyişikliyə məruz qalmadığını, yəni təkamül keçirmədiyini göstərir. Əgər bir canlı milyon illər əvvəlki bütün xüsusiyyətləri ilə hal-hazırda qüsursuz şəkildə həyatını davam etdirirsə və heç bir dəyişiklik keçirmirsə, bu vəziyyət Darvinin iddia etdiyi mərhələli təkamül modelini tamamilə aradan qaldıran güclü dəlildir. Yer üzündə bunu sübut edən bir yox, milyonlarla nümunə mövcuddur. Sözügedən qızılbalıq-xanı fosili də bu sübutlardan sadəcə biridir.



## DƏNİZ KİRPİSİ

**Dövr:** Daş kömür
**Yaş:** 295 milyon il
**Ərazi:** ABŞ

Dəniz kirpiləri dünyanın dörd tərəfində, dənizlərdə rast gəlinən *echinoidea* sinfinə daxil olan tikanlı dəniz canlılarındandır. Təxminən 300 milyon illik dəniz kirpisi fosilləri bu canlıların mürəkkəb quruluşları ilə birlikdə yüz milyon illərdir mövcud olduqlarını göstərir. Bu zaman ərzində quruluşlarında dəyişiklik olmamış, hər hansı keçid mərhələsindən keçməmişlər. Darvinistlər bu fosillər qarşısında çarəsizdirlər. Çünki bu fosillər darvinistlərin iddia etdiyi təkamül prosesinin heç vaxt baş vermədiyinin sübutudur.



## BALIQ ƏSGƏRLƏR

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Fosil qeydləri canlıların on, hətta çox vaxt yüz milyon illərdir heç dəyişmədiklərini, yəni təkamül keçirmədiklərini göstərir. Bu aşkar həqiqət darvinizm üçün ciddi problemdir və kifayət qədər təkamülçü də bu vəziyyətin fərqindədir. Məsələn, təkamülçü paleontoloq Stiven M. Stenli darvinist izahların fosillərlə uyğun gəlmədiyini bu sözlərlə ifadə edir:

*"Uzun müddətdir ki, qapalı bir qutu kimi qalan fosil qalıqları artıq bizi təkamülün bu ənənəvi anlayışına yenidən nəzər salmağa vadar edir. Artıq ortaya çıxmışdır ki, saysız-hesabsız canlı növü milyon illərdir heç bir nəzərəçarpan təkamül dəyişikliyi keçirmədən yer üzündə mövcudluğunu davam etdirir".*

(Steven M. Stanley, "The New Evolutionary Timetable", 1981, New York, səh. 3)



**KATOSTOM**

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** ABŞ

Şəkildə görünən katostomlar *(catostomidae)* fəsiləsinə aid olan bu balıq 50 milyon ildir heç bir dəyişikliyə məruz qalmamışdır. Hal-hazırda dənizlərdə yaşayan növləri ilə eyni olan bu fosil təkamül nəzəriyyəsinin etibarsızlığının dəlilidir.



## QULAQLI XANI BALIĞI

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Hal-hazırda dənizlərdə qulaqlı xanı balıqlarının bir çox növü yayılmışdır. Şəkildə görünən qulaqlı xanı fosili qulaqlı xanıların hər hansı bir təkamül prosesindən keçmədiyini göstərir. Aradan keçən milyonlarla il boyu qulaqlı xanının fizioloji quruluşunda hər hansı bir dəyişiklik olmamışdır. Bundan 55 milyon il əvvəlki qulaqlı xanı balıqlarının görüntüsü və quruluşu necədirsə, dövrümüzdəkilər də elədir.



## KİLQARIN

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Fosillər təkamülün iddialarını yerlə bir etdiyi üçün təkamülçülər tərəfindən qulaqardına vurulur. Yaxud təkamülçülər həmin fosillərdə dəyişiklik edərək onları təkamül təbliğatına vasitəçi etməyə çalışırlar. Lakin son dövrlərdə yaradılışın dəlili olan yüzlərlə fosilin sərgilər, kitablar və internet saytları ilə ortaya çıxarılması təkamülçülərin düşdükləri girdabı çılpaq şəkildə göz önünə qoyur. Fosilləri və yaşayan nümunələrini yanbayan görən insanlar əlavə açıqlamaya belə ehtiyac olmadan təkamülün yalan olduğunu dərhal başa düşürlər. Təkamülçüləri təşvişə salan səbəb də budur. Təkamülçülər bu dəfə bərpası mümkün olmayan şəkildə nəzəriyyələrinin dünya miqyasında çökdüyünü görür və buna əzabla tamaşa edirlər. Təkamül nəzəriyyəsinin dəlillərindən biri də şəkildəki 95 milyon illik kilqarın fosilidir.



## CƏRRAH BALIĞI

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Vendell R. Börd "The Origin of Species Revisited" adlı kitabında təkamül nəzəriyyəsinin ara-keçid forma iddiasının xəyali hekayədən ibarət olduğunu belə ifadə edir:

*"... Geoloji qeyd ən başdan söylənilən şeyi bir daha vurğulayır: fərqli geoloji dövrlərə aid növlər arasında yaşadığı zənn edilən ara-keçid formalar xəyali şeylərdir, yalnız nəzəriyyəni dəstəkləmək üçün ortaya atılmışdır".* (Wendell R. Bird, "The Origin of Species Revisited", Thomas Nelson Inc, dekabr 1991, səh. 44)

Bu günə qədər aparılan fosil araşdırmaları təkamülçülərin iddialarına dəstək olan hər hansı bir ara-keçid forma nümunəsi ortaya qoymamışdır. Məsələn, tapılan heç bir cərrah balığı fosili yarımçıq, az inkişaf etmiş, bəzi orqanları formalaşmış, bəziləri tam inkişaf etməmiş deyildir. Nə qədər geriyə getsək də, əldə edilən hər cərrah balığı fosili bu gün yaşayan cərrah balıqları ilə tamamilə eyni xüsusiyyətləri daşıyır. Şəkildəki 95 milyon illik cərrah balığı fosili də bu həqiqətin dəlillərindəndir.



## TİKANLI ÇÜTRƏ

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Təkamülçülər balıqların onurğasız dəniz canlılarından; amfibiyaların və müasir balıqların guya əcdad bir balıqdan; sürünənlərin suda-quruda yaşayanlardan; quşların və məməlilərin ayrı-ayrı sürünənlərdən və nəhayət, insanların və müasir meymunların ortaq bir əcdaddan təkamül keçirdiyini iddia edirlər. Lakin fosil qeydlərində bu iddiaları təsdiq edən bircə keçid forması belə tapılmamışdır.

Bu səhifədə gördüyünüz 95 milyon illik tikanlı çütrə balığının fosili ilə hal-hazırda yaşayan nümayəndəsi tamamilə bir-biri ilə eynidir. Belə ki, bu canlı da digər növlər kimi yaşadığı milyonlarla il boyu ən kiçik bir dəyişikliyə məruz qalmamış, təkamül keçirməmişdir. Tapılan hər fosil təkamül prosesinin heç vaxt gerçəkləşmədiyini və bütün canlıların Allah tərəfindən mükəmməl vəziyyətdə yaradıldığını sübut edir.



**NAXA**

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** ABŞ

Şəkildə gördüyünüz 50 milyon illik naxa balığı dövrümüzə qədər heç bir dəyişikliyə məruz qalmamışdır. Bu balıq eynilə yaradılan digər milyonlarla balıq kimi təkamül keçirməmişdir. Təkamülçülərin iddia etdiyi sudan quruya keçid də heç vaxt baş verməmişdir. Digər canlılar kimi naxa balığı da 50 milyon il əvvəlki görünüşü və forması ilə yaşayır.



## BALTA BALIĞI

**Dövr:** Oliqosen
**Yaş:** 37 - 23 milyon il
**Ərazi:** Çex Respublikası

Gümüş rəngli, baltanı xatırladan bu parlaq və kiçik balıqların digər bir çox dənizin dərinliklərində yaşayan balıqlar kimi qarınlarının altında işıq istehsal edən orqanları var. Bu balıqlar bədənlərinin altında mavi rəngə çalan işıq yaya bilən 100-ə qədər işıq orqanına malikdirlər. Bu mükəmməl yaradılışla milyonlarla ildir dənizlərdə yaşayan balta balığı başqa bir canlıya çevrilməmişdir. Şəkildə gördüyünüz 37-23 milyon illik Oliqosen dövrünə aid balta balığı fosili Çex Respublikasından tapılmışdır və dövrümüzdə yaşayan nümunəsi ilə tamamilə eynidir.



## MEDUZA

**Dövr:** Kembri
**Yaş:** 500 milyon il
**Ərazi:** ABŞ

Şəkildəki 500 milyon illik meduza fosilinin dövrümüzə qədər gəlməsi möcüzəvidir. Çünki dənizin altında yaşayan bu canlının balıqlarda olduğu kimi bir skeleti yoxdur, tamamilə jeleyəbənzər quruluşa malikdir. Normal şəraitdə bu heyvanın fosili dövrümüzə qədər gəlib çatmamalıdır. Lakin Allah təkamülçülərin iddialarını əsassız etmək üçün bu canlını da fosilləşdirmiş və 500 milyon il əvvəldən indiyə sübut kimi təqdim etmişdir.

Meduzaların ürəkləri, beyinləri, sümükləri, pulcuqları və gözləri yoxdur. Sinir sistemləri bütün bədəninə yayılmışdır. Meduzaların bəzi növləri zəhərlidir. Zəhərsiz olanlarda da müdafiə məqsədi ilə istifadə edilən, biolüminessensiya adlanan, kimyəvi reaksiya nəticəsində yaranan işığı yayma xüsusiyyəti var. Meduzalar da eynilə digər canlılar kimi Allahın möhtəşəm yaratma sənətinin bir təzahürüdür.



## YARIMDİMDİK

**Dövr:** Yura
**Yaş:** 152 milyon il
**Ərazi:** Almaniya

Yarımdimdik balığı uzun, nazik konusşəkilli, güclü dişlərlə təchiz edilmiş uzun və dimdiyə bənzər bir çənəyə malikdir. Bu canlının Almaniyada tapılan 150 milyon illik fosili ilə dövrümüzdə yaşayan nümunəsi müqayisə edildikdə xüsusi görünüşlü çənəsindən sümük və quyruq quruluşuna qədər heç bir dəyişikliyə məruz qalmadığı çox dəqiq şəkildə görünür. Yarımdimdiklər təkamülün əsassızlığını sübut edən saysız-hesabsız canlılardan biridir. Məlum olan ən qədim nümayəndələri Yura dövründə (206-144 milyon il) yaşamış yarımdimdiklər milyonlarla ildir eyni qalmışlar.



## MƏRCAN

**Dövr:** Yura
**Yaş:** 150 milyon il
**Ərazi:** Almaniya

Mərcanlar dənizin dərinliklərində yaşayan onurğasız canlılardır. Yumşaq mərcanlar, buynuzvari mərcanlar, tikanlı mərcanlar kimi qrupları var. Mərcan quruyub qatılaşdıqda daş kimi olur, dənizin dibində isə sanki bitki kimidir. Mərcanlar dənizin diblərində rəngarəng gül-çiçək bağçalarını xatırladır.

Şəkildə görünən 150 milyon illik mərcan fosili bütün detalları ilə qorunacaq şəkildə fosilləşmişdir. Hər iki şəkildə açıq göründüyü kimi, fosillərdəki mərcanlar dövrümüzdə yaşayan nümunələri ilə tamamilə eynidir. Bu, o deməkdir ki, mərcanlar aradan keçən 150 milyon ilə baxmayaraq, heç dəyişməyiblər, yəni təkamül keçirməyiblər.



## BUYNUZLU AKULA

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Buynuzlu akulanın dövrümüzdə yaşayan canlı nümunəsini araşdırdıqda balığın uzun bədənində enli çıxıntılar olduğu görünür. Balığın 95 milyon illik fosilinə baxdıqda da uzun bədənindəki çıxıntıların, baş və quyruq quruluşunun ən kiçik bir dəyişikliyə məruz qalmadığı açıq görünür. Buynuzlu akula dənizin dərinliklərində yaşayır, bəzən qarın üzgəclərini qayalara sürtür. Mağara və ya qayalarda ovlarına tələ qururlar. Təqribən 1 metr boyları var. Şəkildəki 95 milyon illik buynuzlu akula fosili də darvinistlərin məğlubiyyətini bir daha vurğulayır, bütün canlıları Rəbbimizin yaratdığı həqiqətini sübut edir.



**BARRAKUDA**

**Dövr:** Miosen
**Yaş:** 5 milyon il
**Ərazi:** İtaliya

Barrakuda balığı bütün isti və ılıq dənizlərin dayaz yerlərindən 100 metr dərinliyə qədər olan hissədə yaşayır. Sürü şəklində hərəkət edirlər və yırtıcıdırlar, belə ki, akulalara belə hücum edirlər. Balığın 5 milyon il əvvəl İtaliyada tapılan Miosen dövrünə aid fosili canlının başının düz altında və quyruqlarında olan kiçik üzgəclərini, incə və uzun baş quruluşunu, uzun nazik bədənini çox dəqiq göstərir. Bütün bu təfərrüatlar barrakudaların aradan keçən 5 milyon ilə baxmayaraq, heç dəyişmədiyini, yəni təkamül keçirmədiyini sübut edir.



## AĞIZAYAQLI XƏRÇƏNG

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Daş kömür dövründən (354-290 milyon il) bəri heç dəyişmədən mövcud olan ağızayaqlı xərçənglər təkamül nəzəriyyəsini əsassız edən canlılardan biridir. Bir canlının təxminən 300 milyon il ərzində dəyişməməsi təkamülçülərin məntiqsiz izahları ilə açıqlanan vəziyyət deyil. Şəkildəki ağızayaqlı xərçəng fosili isə 95 milyon yaşındadır və həm 300 milyon il əvvəl yaşamış, həm də dövrümüzdə yaşayan ağızayaqlı xərçənglərlə tamamilə eynidir.

Ağızayaqlı xərçəngin ölçüsü 30 santimetrə çatır və üzərində müxtəlif rəngləri olan qabığa malikdir. Təhlükəli qısqaclarına görə dalğıclar tərəfindən barmaq yaran adlandırılan ağızayaqlı xərçənglər heyvanlar aləmindəki ən mürəkkəb göz sisteminə sahib olan canlılardandır. Ağızayaqlı xərçəng insanlardan dörd dəfə çox olmaqla, 12 başlıca rəngi görür və eyni zamanda fərqli polyarlaşmış işıq tiplərini, yəni işıq dalğalarındakı titrəyişlərin yönünü hiss edə bilir.





## OSMİNOQ

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Osminoq kimi qabıqsız və onurğasız heyvanların bütün təfərrüatları ilə fosil qeydlərində tapılması Allahın möcüzələrindən biridir. Bu molyuskların baş quruluşu, qolları və göz çuxurları belə tapılan fosillərdə çox dəqiq şəkildə görünür. Beləcə, insanlar Allahın yaratdığı bütün növlərin fosil qeydlərini görərək bütün canlıların heç bir dəyişikliyə məruz qalmadığına şahid olurlar. Osminoq *başıayaqlılar* sinfinə aid bir molyuskdur. Bədənləri qısa və yumru formadadır. Bir cüt inkişaf etmiş gözləri vardır. Başının kənarlarından 8 ədəd qol uzanır. Bu qolların uzunluqları eynidir və onlar dibindəki qısa bir membranla bir -birlərinə bağlıdır. Hər qolda iki sıra sormac vardır. 2-3 santimetrdən 10 metrə qədər çatan müxtəlif ölçülərdə növləri vardır. Osminoq da eynilə digər heyvanlar kimi Allahın möhtəşəm yaratmasının əsəridir.



## MENE BALIĞI

**Dövr:** Eosen dövrü
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** İtaliya

*Menidae* fəsiləsinə aid olan mene balığına xüsusilə Sakit okeanda tez-tez rast gəlinir. Canlının Kaynozoy erasına (65 milyon il – dövrümüz) aid bir çox fosil nümunəsi əldə edilmişdir. Şəkildə görünən 54-37 milyon illik Eosen dövrünə aid fosil bu canlının heç cür dəyişmədiyini göstərən mühüm sübutdur. Fosil dövrümüzdə yaşayan canlı nümunəsi ilə tamamilə eyni olub balığın geniş bədənini, kiçik quyruğunu, skelet quruluşunu və bədəninin altından çıxan iki uzun üzgəcini çox aydın formada göstərir. Fosil qeydləri canlıların milyonlarla il əvvəlki hallarının, sanki şəklini əks etdirir. Əgər bir canlı on milyonlarla il boyu ən kiçik dəyişiklik belə keçirməyibsə, onda canlıların təkamülü ssenarisindən bəhs etmək mümkün deyil.



## QILINCQUYRUQ

**Dövr:** Yura
**Yaş:** 150 milyon il
**Ərazi:** Almaniya

Şəkildəki 150 milyon illik qılıncquyruq xərçəngi fosili, həmin canlıların yüz milyon ildən artıq zamandır ki, dəyişmədiklərinin sübutudur. Bu dəlilin göstərdiyi həqiqət çox açıq və anlaşıqlıdır. Tarix boyu təkamül baş verməmiş, bütün canlıları uca Allah yaratmışdır.



## POLYODONTİDAE

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
Bölgə: ABŞ

*Polyodontidae* şpatelə bənzəyən ağız və burun quruluşu ilə kiçik üzgəcləri 50 milyon illik fosildə də çox aydın görünür. Canlı aradan 50 milyon il keçməsinə baxmayaraq, zərrə qədər dəyişikliyə belə məruz qalmamış, təkamül keçirməmişdir. Çarlz Darvin təkamül nəzəriyyəsini ortaya atarkən, canlıların bir-birlərindən törədiklərini, onun varisləri isə bunun mutasiyalarla baş verdiyini iddia etmişdir. Lakin tapılan milyonlarla fosil canlıların bir-birlərindən törəmədiyini, dövrümüzə qədər ilk yaradıldıqları kimi qaldıqlarını göstərir. Tanınmış alim Stiven Cey Quld mutasiyalarla növlər arasında keçidin mümkün olmadığını belə ifadə edir:

*“Bir mutasiya böyük və yeni xammal (DNT) meydana gətirmir. Növləri mutasiyaya məruz qoyaraq yeni növ əldə edə bilməzsiniz”.*

(Stephen Jay Gould, “Is a New and General Theory of Evolution Emerging?”, Lecture at Hobart&Wm Smith College, 4 fevral 1980)



**TRESKA**

**Dövr:** Oliqosen
**Yaş:** 37-23 milyon il
**Ərazi:** Polşa

Darvinistlər bütün canlıların təkamül keçirdiyini və bir-birilərindən törədiklərini iddia edirlər. Milyonlarla il əvvələ aid fosil nümunələri də məhz bu baxımdan çox önəmlidir. Canlılar milyonlarla il keçməsinə baxmayaraq, heç bir dəyişiklik keçirməyiblər. Təkcə bir fosil belə bu həqiqəti isbat etmək üçün kifayət etsə də, yerin qatları saysız-hesabsız fosil nümunələri ilə doludur.

Təkamül nəzəriyyəsini təkzib edən nümunələrdən biri də təxminən 37-23 milyon illik treska balığıdır. Canlının hazırkı skelet, kəllə, quyruq və üzgəc quruluşları tədqiq edildikdə anatomik xüsusiyyətlərinin bu gün yaşayan nümunəsi ilə tamamilə eyni olduğu müşahidə edilir. Treska balıqları mülayim və olduqca soyuq sularda 30-300 metr dərinliklərdə yaşayan səyyah balıqlardır. Zərif, uzun bədənə malik olan treska balığının ölçüsü 20-50 sm arasında dəyişir. Kütləsi 1-2 kq olan nümayəndələri var. Treskalar sürü halında yaşayırlar. Dənizdəki kiçik balıqlar və digər qabıqlı dəniz canlıları ilə qidalanırlar. Dişi treska təxminən 200 000 yumurta qoyur. Treska balığının fosili də digər növlərin fosillərində olduğu kimi, təkamül prosesinin heç zaman baş vermədiyini sübut edir.



## KREVET

**Dövr:** Yura
**Yaş:** 150 milyon il
**Ərazi:** Almaniya

150 milyon il əvvəl yaşayan bir canlının fosil qeydlərində bu qədər aydın müəyyənləşdirilməsi, canlının bədəninin bütün təfərrüatları ilə müşahidə edilməsi təkamül nəzəriyyəsinə böyük zərbə vurmuşdur. Şəkildə göstərilən 150 milyon il əvvəl yaşamış krevetin bədən quruluşu bədəninin altından çıxan ayaqları və kəllə quruluşu ilə birlikdə çox açıq şəkildə görülür. Düz 150 milyon il boyunca heç dəyişmədən mövcud olan krevetlər, canlıların daima dəyişərək guya ibtidaidən aliyə doğru təkmilləşdiklərini iddia edən darvinistlərin yalan söylədiklərini açıq-aydın göstərir.

Avropa dənizlərində və Şimali Amerika sahillərində yaşayan krevet xərçəngkimilər yarımtipindəndir. Silindrik bədənləri və uzun bığcıqları var. Bədəni kalsium-karbonatdan ibarət zirehlə örtülüdür. Bədəni buğumludur.



## XİMER BALIĞI

**Dövr:** Daş kömür
**Yaş:** 320 milyon il
**Ərazi:** ABŞ

Şəkildə üzgəcləri, kəllə və quyruq quruluşu ilə mükəmməl qorunmuş düz 320 milyon illik ximer balığının fosili göstərilib. Müntəzəm diş quruluşuna, hər iki tərəfində üzgəclərə, insan gözünə bənzər göz quruluşuna və ip şəklindəki 30 sm uzunluğunda quyruğa malik olan bu balıqlar, düz 320 milyon ildir ki, heç bir dəyişikliyə məruz qalmayıblar. Canlının bütün təfərrüatları və heç bir dəyişikliyə məruz qalmaması fosilin göstərildiyi şəkildə açıq-aydın görünür. Təkamülün əsassızlığı fosil qeydlərinin təqdim etdiyi dəlillərlə hər ötən gün daha açıq şəkildə ortaya çıxır. Allah bütün canlıları sonsuz elm və sənətlə yaratmışdır.



## DENTEKS

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** İtaliya

Fosillərin təfsilatlı şəkildə daşların üzərində qalması təkamülçülərin bütün ssenarilərini alt-üst etmişdir. Allah milyonlarla il əvvəl yaşamış canlıların fosillərini sanki bir şəkil kimi daşların üzərində yerləşdirmişdir. Beləcə, canlıların zərrə qədər belə dəyişikliyə uğramadıqları, təkamül keçirmədikləri elm dünyası tərəfindən müşahidə olunmuşdur. Belə ki, Darvin də bunun nəzəriyyəsini çıxılmaz vəziyyətə saldığını "Növlərin mənşəyi" kitabının "Nəzəriyyənin çətinlikləri" başlıqlı bölməsində belə etiraf etmişdir:

*"Əgər növlər digər növlərdən hiss edilməyəcək dərəcədə kiçik tədrici dəyişikliklərlə törəyibsə, nə üçün hər yerdə saysız-hesabsız ara-keçid formalar görmürük? Nə üçün bütün təbiət qarma-qarışıqlıq içində deyil, bunun əvəzinə, gördüyümüz kimi, tam nizamlanmış növlər vardır? ...Keçmişdə yer üzündə yaşamış ara-keçid formalar olduqca nəhəng sayda olmalıdır. Bəs nə üçün hər geoloji formasiya və hər təbəqə bu cür ara-keçid həlqələri ilə dolu deyil? Geologiya, düzü, heç belə bir dəqiqliklə dərəcələndirilmiş üzvi zəncir ortaya qoymur və bu, bəlkə də, mənim nəzəriyyəmə qarşı irəli sürülə biləcək ən bariz və ən ciddi etiraz olacaqdır".* (Charles Darwin, "The Origin of Species", səh. 171, 280)



## MİŞARBURUN SKAT

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Şəkildə gördüyünüz 95 milyon illik mişarburun skat ilə bugünkü nümunələri arasında heç bir fərq yoxdur. Təkcə bu belə təkamül nəzəriyyəsini çıxılmaz vəziyyətə salır. Uca Rəbbimiz bütün canlıları müxtəlif növlər kimi yaratmışdır və bu canlılar yaradıldıqları andan etibarən heç bir dəyişikliyə məruz qalmadan bu günə qədər gəlib çıxmışlar.





## NƏRƏ BALIĞI

**Dövr:** Yura
**Yaş:** 144 - 65 milyon il
**Ərazi:** Çin

Hal-hazırda ancaq iki fəsiləsi nəslini davam etdirən nərə balıqları həmişə nərə balığı olaraq mövcud olmuşdur. Başqa bir canlıdan törəməmiş, başqa bir canlıya da çevrilməmişlər. Bu həqiqəti təsdiq edən fosil tapıntıları digər bütün canlılar kimi nərə balıqlarının da təkamül keçirmədiklərini göstərir.



## UÇAN BALIQ

**Dövr:** Tabaşir
**Yaş:** 100 - 95 milyon il
**Ərazi:** Livan

Uçan balıqlar quyruq üzgəcinin çox sürətli hərəkəti sayəsində sudan bayıra tullanır və havada müəyyən qədər süzdükdən sonra yenidən yavaş-yavaş suya düşürlər. Uçuş zamanı sürətləri saatda 50 km-ə çatır. 100 milyon ildir ki, ən kiçik dəyişikliyə belə uğramayan bu balıqlar təkamülçülərin canlıların mənşəyi və tarixi haqqındakı bütün iddialarını yerlə bir edir. Elmi kəşflər canlıların mərhələli təkamül keçirmədiklərini, uca Allah tərəfindən yaradıldıqlarını ortaya qoyur.

# BİTKİ FOSİLLƏRİNDƏN NÜMUNƏLƏR



## QARAĞAC YARPAĞI, BUDAQLARI İLƏ BİRLİKDƏ

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** Kanada

Fosil qeydlərində istənilən bitki növünün kiçik dəyişikliklər nəticəsində təkamül keçirərək başqa bir bitkidən əmələ gəldiyini göstərən bir nümunə belə yoxdur. Əldə edilən saysız-hesabsız fosil nümunələri hər bir bitkinin özünəməxsus xüsusiyyətlərlə yaradıldığını və mövcud olduğu müddət ərzində heç bir dəyişikliyə məruz qalmadığını göstərir. Bu həqiqəti göstərən dəlillərdən biri də şəkildə gördüyünüz 54-37 milyon illik qarağac yarpağının budaqları ilə birlikdə əmələ gəlmiş fosilidir.



## FISTIQ YARPAĞI

**Dövr:** Eosen dövrü
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** Kanada

Fıstıq ağacı, əsasən, Avropa, Asiya və Şimali Amerikada mövcud olan ağac növüdür. Fıstıqkimilər fəsiləsinə daxil olan bu ağacların heç vaxt təkamül keçirmədiklərini göstərən mühüm dəlillərdən biri fosil qeydləridir. Fosil qeydlərindən məlum olduğu kimi, hər zaman eyni görünüşdə və xüsusiyyətlərdə olan fıstıq ağacı on milyonlarla il boyunca ən kiçik dəyişiklik belə keçirməmişdir. Bu da bəhs olunan ağacın başqa bitkidən mərhələli şəkildə törəmədiyini və başqa bitkiyə çevrilmədiyini göstərir. Bütün digər canlılar kimi Rəbbimiz fıstıq ağacını da üstün ağılla, nümunə götürmədən və qüsursuz olaraq yaratmışdır.



## QOZA

**Dövr:** Paleogen
**Yaş:** 65 - 23 milyon il
**Ərazi:** Almaniya

Aid olduqları ağacın çoxalması üçün lazım olan toxumları daşıyan qozaların quruluşu digər bütün canlılar kimi milyonlarla il ərzində heç bir dəyişikliyə məruz qalmamışdır. Bugünkü qozalarla eyni olan 65-23 milyon il yaşındakı qozalar tarix boyu təkamülün heç vaxt baş vermədiyinin önəmli nümunələrindəndir.



## MAQNOLİYA YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** Kanada

Fransız bioloq Pyer Manyolun *(Pierre Magnol)* şərəfinə adlandırılan maqnoliya ağacının təqribən 210 növü məlumdur. Təxminən 95 milyon illik fosilləri tapılan maqnoliyalar yaradıldıqları andan etibarən hər zaman maqnoliya kimi mövcud olmuşlar, başqa hər hansı bir bitkidən törəməmiş, başqa bir bitkiyə çevrilməmişlər. Fosil qeydləri bu həqiqətin ən önəmli dəlilləridir. Şəkildə gördüyünüz fosil isə təxminən 50 milyon il yaşındadır.



## QƏRB ÇİNARI, TOXUMLARI İLƏ BİRGƏ

**Dövr:** Oliqosen
**Yaş:** 37 - 23 milyon il
**Ərazi:** ABŞ

Bitkilərin ortaq əcdaddan törədiklərini iddia edən təkamülçülər bu iddialarını sübut edən bir elmi dəlil belə ortaya qoya bilməyiblər. Digər tərəfdən, bitkilərin özünəməxsus xüsusiyyətlərlə ayrı-ayrı yaradıldıqları və təkamül keçirmədiklərini göstərən saysız-hesabsız tapıntı var. Bunlardan biri də şəkildə gördüyünüz 37-23 milyon il yaşındakı toxumları ilə birlikdə fosilləşmiş qərb çinarı budağıdır. Bugünkü qərb çinarlarının toxumlarından heç bir fərqi olmayan bu fosil təkamülün əsassızlığının dəlillərindəndir.



## ƏRKƏVAN YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** Kanada

Həm ümumi quruluş, həm də mikrobioloji cəhətdən tədqiq edildikdə yarpaqların hər cəhətdən maksimum enerji istehsalını təmin etmək üçün planlanmış, olduqca təfsilatlı və mürəkkəb sistemlərə malik olduğunu görürük. Yarpaq enerji hasil etmək üçün istilik və karbonu xarici mühitdən almalıdır. Yarpaqlardakı bütün strukturlar da onları asanlıqla qəbul edə bilən formada nizamlanmışdır. Məsələn, yarpaqların xarici səthi genişdir, bu da fotosintez üçün lazım olan qaz mübadiləsinin (karbonun udulması və oksigenin xaric edilməsi kimi əməliyyatların) asan baş verməsini təmin edir.

Mövcud olduqları ilk andan etibarən bütün bitkilərin yarpaqları bu xüsusiyyətlərə malikdir. Heç biri bunları təsadüflər nəticəsində özbaşına qazanmamışdır.



## GİNKQO YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** Kanada

Canlıların mənşəyini izah etməkdə aciz qalan təkamül nəzəriyyəsi ginkqoların on milyonlarla il ərzində dəyişmədən qaldıqlarını göstərən fosil nümunələri qarşısında da çarəsizdir. Canlıların nəsli davam etdikcə dəyişmədən qaldıqlarının isbatı olan fosillər təkamül nəzəriyyəsinə böyük zərbə vurmuşdur. Digər bir çox elm sahəsi kimi paleontologiya da yaradılışın aydın həqiqət olduğunu təsdiqləyir.

Təxminən 150 ildir ki, dünyanın dörd tərəfində fosil araşdırmaları aparılır. Bu araşdırmalar nəticəsində milyonlarla fosil əldə edilmişdir. Ancaq bu fosillərin içində bir dənə də olsun yarımçıq inkişaf etmiş, iki fərqli canlının xüsusiyyətlərini daşıyan, keçid forma təyinatlı, yəni təkamülçülərin iddialarını dəstəkləyən fosil tapılmamışdır. Tapılan hər fosil canlıların anidən ortaya çıxdıqlarını və nəsilləri davam etdikcə heç dəyişmədiklərini ortaya qoyur. Bunun mənası isə məlumdur: canlıları Allah yaratmışdır.



## AYIDÖŞƏYİ

**Dövr:** Daş kömür
**Yaş:** 320 milyon il
**Ərazi:** İngiltərə

Bütün canlılar kimi bitkilər də yaradılmışdır. İlk ortaya çıxdıqları andan etibarən bütün mexanizmləri əskiksizdir. Təkamülçü ədəbiyyatda istifadə olunan zaman ərzində inkişaf, təsadüflər nəticəsində dəyişikliklər, zərurətdən meydana gələn adaptasiyalar və s. kimi terminlər heç bir həqiqətlə uzlaşmır və elmi məna ifadə etmir. Fosil tapıntıları bu həqiqətin ən önəmli dəlilləridir.



## SEKVOYA YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** Kanada

Sekvoya ağacının bu günə qədər gəlib çatan saysız-hesabsız qalıqları bu bitkinin on milyonlarla il boyunca dünyanın müxtəlif yerlərində nəslini davam etdirdiyini və heç bir dəyişikliyə uğramadığını sübut edir. Darvinistlərin bitkilərin xəyali təkamülünə dair fərziyyələri bu önəmli dəlillər sayəsində aradan qalxmış vəziyyətdədir. 50 milyon illik sekvoya yarpağı da təkamülü aradan qaldıran dəlillərdən biridir.



## İRQA YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 54-37 milyon il
**Ərazi:** Kanada

Bütün canlılar kimi bitkilər də fosil qeydlərində bir anda və özünəməxsus quruluşları ilə ortaya çıxır. Bu gün malik olduqları görünüş və xüsusiyyətləri necədirsə, milyonlarla il əvvəl də sahib olduqları görünüş və xüsusiyyət də elədir. Bu məlumat bizə canlıların üstün ağıl sahibi Yaradıcı tərəfindən yaradıldığını göstərir.



## AT ŞABALIDI YARPAĞI

**Dövr:** Paleosen
**Yaş:** 58 milyon il
**Ərazi:** ABŞ

Fosil qeydləri təkamül nəzəriyyəsini yerlə bir edən vacib dəlillərdən biridir. Alimlərin böyük əksəriyyəti, əslində, bu həqiqətin fərqindədir. Məsələn, N. Eldric və Y. Tattersoll bu barədə belə deyirlər:

*"Ayrı növlərə aid fosillərin fosil qeydlərində üzə çıxdıqları cizgi boyunca fərqinə varılacaq dərəcədə eyni qalması Darvin öz "Mənşəyi"ni ("Növlərin mənşəyi" kitabını) nəşr etdirməzdən çox əvvəllər də paleontoloqlara məlum idi. Darvin özü isə... gələcək paleontoloq nəsillərinin bu boşluqları şövqlü araşdırmalarla dolduracaqlarını proqnozlaşdırmışdı... Sonrakı yüz iyirmi illik paleontoloji tədqiqat ərzində geniş miqyasda aydın olmuşdur ki, fosil qeydləri Darvinin proqnozlarının bu hissəsini təsdiq etməyəcək. Problem heç də ümidsiz dərəcədə kasad qeydlərdə (fosil qeydlərində) deyil. Fosil qeydləri, sadəcə olaraq, həmin proqnozun səhv olduğunu göstərir".*

(N.Eldredge, I.Tattersall, "The Myths of Human Evolution", Columbia University Press, 1982, səh. 45-46)

Darvinin fərziyyələrinin yanlış olduğunu göstərən bu fosillərdən biri də şəkildəki 58 milyon illik at şabalıdı yarpağı fosilidir.



## SEKVOYA QOZASI

**Dövr:** Tabaşir
**Yaş:** 146 - 65 milyon il
**Ərazi:** ABŞ

100 metrdən də çox boy ata bilən və adətən, Şimali Amerikada rast gəlinən sekvoyaların on milyonlarla ildir ki, eyni olduqlarını göstərən saysız-hesabsız fosil nümunələri var. Şəkildəki fosil isə təxminən 140 milyon il yaşındadır. Bu nümunələr bitkilərin ilk dəfə necə ortaya çıxdığını və hansı yolla bu qədər çox növə malik olduğunu elmi olaraq açıqlaya bilməyən təkamülçüləri təkrarən səssizliyə məhkum etmişdir. Hər biri özünəməxsus xüsusiyyətləri ilə fosil qeydlərində birdən-birə təzahür edən və milyonlarla il boyunca heç dəyişmədən nəsillərini davam etdirən bitkilər, məlumdur ki, uca Allah tərəfindən yaradılıblar.



## ALLOPHYLLUM YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

*Polemoniaceae* fəsiləsinə daxil olan bu bitkilər milyonlarla ildən bəri dəyişməyən quruluşları ilə təkamül nəzəriyyəsinə meydan oxuyan canlılardandır. Saysız-hesabsız fosil nümunəsi təkamülün heç vaxt baş vermədiyini göstərdiyi halda, darvinistlərin nəzəriyyələrini israrla müdafiə etməsi tapıntıların daşıdığı mənanı düşünməmələrindən irəli gəlir. Bu günə qədər tapılan milyonlarla fosillərin içində bir dənə də ara-keçid forması tapılmadığını heç düşünməyən təkamülçülər eyni nağılları danışmağa davam edirlər. Əvvəllər bu nağıllarla təsəlli tapan və özlərini ovunduran təkamülçülər artıq bu gün çox təfərrüatlı məlumatlara malik insan kütlələri qarşısında yalan danışa bilmirlər.



## QOVAQ YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 54 - 37 milyon il
**Ərazi:** ABŞ

Qovaqların başqa bir bitkidən törəmədiklərini, hər hansı bir əcdadlarının olmadığını və həmişə qovaq kimi mövcud olduqlarını göstərən bu fosil yaradılış dəlilidir.

Qovaqların hər cəhətdən eynisi olan və təxminən 50 milyon il əvvəl yaşamış qovaq ağacları təkamülün təxəyyül məhsulu ssenari olduğunu göz qabağında qoyur.



## YALANÇI SƏRV YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** Kanada

Şəkildəki iynəyarpaqlı bitkilərdən olan yalançı sərv ağacının 50 milyon ildən bəri dəyişmədiyini göstərən fosil təkamülçülərin iddialarının doğru olmadığını sübut edir. Çarlz Darvinin iddialarına görə, keçmişdə yer üzündə xəyali ortaq əcdaddan digər canlı növlərini mərhələli törədən təkamül prosesi baş verməlidir. Ancaq fosil qeydləri istisnasız olaraq bunun tamamilə əksini göstərir. Nəsli kəsilmiş və ya davam edən müxtəlif canlılara aid saysız-hesabsız qalıqlar var, amma bu qalıqların aid olduğu bitkilər Darvinin nəzəriyyəsinin ehtiyac duyduğu kimi, bir-birləri ilə qohumluq əlaqələri göstərmir. Məlum olan hər fosil məlum olan hər canlı kimi özünəməxsus xüsusiyyətlərə sahibdir. Təbiət tarixi bir-birinə çox bənzəyən və yaxın növlərə deyil, bir-birlərindən çox fərqli və aralarında quruluş cəhətdən böyük fərqlər olan qruplara ayrılmışdır.



## DOQQUZDON YARPAĞI

**Dövr:** Paleosen
**Yaş:** 58 milyon il
**Ərazi:** ABŞ

Bir çox alimlər də təkamül nəzəriyyəsinin elmi dəlillərlə dəstəklənmədiyini və xəyali hekayədən başqa bir şey olmadığını ifadə edirlər. Təkamülçü bioloqlar Gilbert, Opits və Raff 1996-cı ildə "İnkişaf biologiyası" jurnalında yayımlanan məqalələrində Darvinin təkamül nəzəriyyəsinin həllini tapmadığını belə ifadə edirlər:

*"Qudvinin 1995-ci ildə bildirdiyi kimi, növlərin mənşəyi, yəni Darvinin problemi hələ də həllini tapmayıb".*

(Scott Gilbert, John Opitz, and Rudolf Raff, "Resynthesizing Evolutionary and Developmental Biology", Developmental Biology, cild 173, məqalə no. 0032, 1996, səh. 361)

Bu sözlər təkamülün konkret elmi dəlillər qarşısındakı məğlubiyyətinin etirafıdır. Şəkildəki 58 milyon illik doqquzdon yarpağı fosili də bu məğlubiyyəti bir daha gözlər önünə sərir.



## SABUNAĞACI YARPAĞI

**Dövr:** Tabaşir
**Yaş:** 95 milyon il
**Ərazi:** Livan

Bu günə qədər əldə edilən heç bir fosil sabunağaclarının təkamül prosesini əks etdirməmişdir. Çünki bütün sabunağacı fosilləri bu gün mövcud olan sabunağacları ilə eyni xüsusiyyətlərə malikdir. Təkamülçülər yalnız sabunağaclarının deyil, heç bir canlının təkamül prosesini və ortaq əcdadını göstərə bilməzlər. Çünki fosil tapıntıları bütün canlı növlərinin yer üzündə birdən-birə ortaya çıxdığını göstərir. Bu günə qədər 250 min müxtəlif canlı növünə aid 100 milyonlarla fosil nümunəsi çıxarılmışdır, amma heç biri təkamül nağılını dəstəkləmir.



## ASTRONİUM ÇİÇƏYİ

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** ABŞ

Bu bitki fosilindən də məlum olduğu kimi, əgər canlı 50 milyon il ərzində heç bir dəyişiklik keçirmədən varlığını davam etdirirsə, bu halda, o canlının təkamül keçirdiyindən bəhs etmək heç cür mümkün deyil. Fosil qeydlərinə baxdığımız zaman bütün canlıların mövcud olduqları andan etibarən milyonlarla il ərzində heç dəyişmədiklərini görürük. Təkamülçülər bu vəziyyəti təkidlə görməzlikdən gəlməyə çalışır və sanki heç bu haqda məlumatları yox imiş kimi birtərəfli, yanlış məlumatlar verməyə davam edirlər. Halbuki özlərinin də 150 ildən çoxdur apardıqları qazıntı işləri və əldə etdikləri yüz milyonlarla fosil təkamülün heç zaman baş vermədiyini sübut edir.



## QARAĞAT YARPAĞI

**Dövr:** Miosen
**Yaş:** 23 - 5 milyon il
**Ərazi:** ABŞ

Aparılan qazıntı işləri nəticəsində yer üzünün heç bir yerində yarımçıq inkişaf etmiş, iki fərqli növün xüsusiyyətlərini daşıyan hər hansı bir fosil nümunəsinə rast gəlinməmişdir. Bu vəziyyət təkamül fərziyyəsinin ən böyük müəmmasıdır. Belə ki, fərziyyənin banisi Çarlz Darvin də bu həqiqətin fərqində idi və fərziyyəsinin nə qədər çürük təməl üzərində qurulduğunu bilirdi. Darvinin bu mövzu ilə bağlı bir etirafı belədir:

*"Əgər növlər digər növlərdən hiss edilməyəcək dərəcədə kiçik tədrici dəyişikliklərlə törəyibsə, nə üçün hər yerdə saysız-hesabsız keçid formalar görmürük? Nə üçün bütün təbiət qarma-qarışıqlıq içində deyil, bunun əvəzinə, gördüyümüz kimi tam nizamlanmış növlər vardır? ...Keçmişdə yer üzündə yaşamış ara-keçid formalar olduqca nəhəng sayda olmalıdır. Bəs nə üçün hər geoloji formasiya və hər təbəqə bu cür ara-keçid halqələri ilə dolu deyil? Geologiya, düzü, heç belə bir dəqiqliklə dərəcələndirilmiş üzvi zəncir ortaya qoymur və bu, bəlkə də, mənim nəzəriyyəmə qarşı irəli sürülə biləcək ən bariz və ən ciddi etiraz olacaqdır".*

(Çarlz Darvin, "Növlərin mənşəyi", səh. 171, 280)



## ƏRİK YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** Kanada

50 milyon il əvvəl də ərik ağacları eynilə bugünkü kimi çiçək açır, meyvə verirdi. 50 milyon il keçməsinə baxmayaraq, ərik ağaclarının heç dəyişmədiyini göstərən bu fosillər təkamülün olmadığının ən açıq dəlillərindən biridir.



## SUMAQ YARPAĞI

**Dövr:** Oliqosen
**Yaş:** 30 milyon il
**Ərazi:** Fransa

Bu gün Darvinin təqribən 150 il əvvəl söylədiyi sözlər gerçək oldu və Darvinin 19-cu əsrdə etiraf etdiyi kimi, həqiqətən də, ara-keçid forma fosili deyə bir şey olmadığı üzə çıxdı.

Yer üzünün sayıla bilinməyən qədər çox təbəqəsində 600 milyondan çox fosil tapılıb. Amma bunlardan bircə fosil belə ara-keçid fosili deyil. Tapılan 600 milyondan çox fosil təbiətin Darvinin zənn etdiyi kimi, qarışıqlıq içində olmadığını, əksinə, bütöv, mükəmməl, qüsursuz və bütün hissələri yerli-yerində olan canlılardan ibarət olduğunu ortaya çıxardı. Heç bir geoloji quruluşda və heç bir təbəqədə canlıları bir-biri ilə əlaqələndirən ara-keçid fosili olmadığı anlaşıldı. Məhz bu həqiqətlər 21-ci əsrdə darvinizmə ağır zərbə vurdu.



## PALMA YARPAĞI

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Ərazi:** ABŞ

Təqribən 150 ildən bəri aparılan fosil tədqiqatları Darvinin və onu dəstəkləyən təkamülçülərin boş yerə ümidləndiklərini göstərmiş və bircə keçid formasına aid fosil belə tapılmamışdır. Hal-hazırda dünyanın hər yerində, minlərlə muzeydə və kolleksiyada təxminən 600 milyon fosil tapılıb. Bu fosillərin hər biri bir-birilərindən dəqiq göstəricilərlə fərqli, məxsusi quruluşlara malik növlərə aiddir. Təkamülçülərin ümidlə axtardıqları yarı balıq, yarı amfibiya; yarı dinozavr, yarı quş; yarı meymun, yarı insan və bunlara bənzər canlıların fosillərinə qətiyyən rast gəlinməmişdir. Əldə edilən fosillərin hər biri şəkildə gördüyünüz palma yarpağı kimi təkamülü təkzib edən dəlillərdir.



## QOZ

**Dövr:** Pliosen
**Yaş:** 2,5 milyon il
**Ərazi:** Hollandiya

Təbiətdə, demək olar ki, hər yerdə yetişən fərqli növlərdə qoz ağacları var. Burada fosillərini gördüyümüz qozlar milyonlarla il ərzində heç bir dəyişikliyə uğramamış, yaradıldıqları ilk gündən etibarən eyni şəkildə varlıqlarını davam etdirmişdir.

# BUĞUMAYAQLI FOSİLLƏRİNDƏN NÜMUNƏLƏR



## QANADLI QARIŞQA

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Qanadlı qarışqaların 5-8 mm uzunluğunda iki uzun qanadı var. Yuvalarını su və qida qaynaqlarına yaxın yerdə qururlar. Bu qarışqalar milyonlarla ildir ki, heç bir dəyişikliyə uğramamışdır.

25 milyon illik kəhrəba içindəki qanadlı qarışqa fosili sözügedən canlıların milyonlarla il ərzində eyni qaldıqlarını, yəni təkamül keçirmədiklərini göstərir.







## SSELİONİD MİNİCİ

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Sselionid minicilər çox vaxt yerə tökülmüş yarpaqlar altında yaşayırlar. Bu minicilərin bir çox həşərat növünə, xüsusilə onların yumurtalarına zərər verdikləri məlumdur. Şəkildəki sselionid minicisi uçan vəziyyətdə fosilləşmişdir. Dövrümüzdəki nümunələrindən heç bir fərqi yoxdur.

25 milyon illik sselionid minicisi kəhrəbası digər canlılar kimi minicilərin də təkamül keçirmədiyini göstərir.



**HÖRÜMÇƏK**

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Dövrümüzdəki hörümçəklərə aid bütün xüsusiyyətlərə milyonlarla il əvvəl yaşayan hörümçəklər də malikdir. 25 milyon illik kəhrəba içindəki hörümçək fosili bu həqiqətin sübutudur.



## MEYVƏ AĞCAQANADI

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Kəhrəbanın içindəki fosilləşmiş meyvə ağcaqanadıdır (detritçi). 25 milyon ildir ki, dəyişməyən bu canlılar təkamülçülərin iddialarını darmadağın edir.



## MİLÇƏK

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Milçəklər həmişə milçək olublar, hər hansı bir canlıdan törəməyiblər və hər hansı bir keçid mərhələdən keçməyiblər. Bu həqiqətin dəlillərindən biri də şəkildəki 25 milyon yaşındakı kəhrəba içindəki milçək fosilidir.



## AYAQQUYRUQLU

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

25 milyon il əvvəl yaşamış ayaqquyruqluların günümüzdəki nümunələrindən heç bir fərqi yoxdur.





## QANADLI TERMİT

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Termitlər qarışqalara bənzər canlılar olsalar da, əslində, onlardan çox fərqli xüsusiyyətlərə və bacarıqlara sahibdirlər. Termitlər milyonlarla il ərzində koloniya həyatı yaşayan, quruluşlarında heç bir dəyişiklik olmadan günümüzə qədər gəlib çatan canlılardır. 25 milyon illik termit fosilləri bunun dəlillərindən biridir. Milyonlarla il əvvəl yaşamış bütün termitlər indiki termitlərlə eyni xüsusiyyətlərə malikdir. 25 milyon il əvvəlki işçi termitlər də hazırda yaşayan termitlər kimi fədakarlıq edir, sürfələri, əsgərləri, kraliçaları qida ilə təmin edir, gözləri görmədiyi halda, metrlərlə uzunluqda yuvalar inşa edirlər. Bugünkü termitlərin xüsusiyyətləri milyonlarla il əvvəl yaşayan hər termit üçün eynidir. Şəkildəki kəhrəba içindəki termit fosili isə 25 milyon yaşındadır.



## QISQAC

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Milyonlarla fosil darvinizmi tamamilə susdurmuşdur. Darvinistləri aciz vəziyyətə salan bu fosillərdən biri şəkildəki 25 milyon illik kəhrəba içindəki qısqac (qulağagirən) fosilidir. Bütün digər fosil tapıntıları kimi bu fosil də təkamülün əsassız olduğunu göstərir.



### YUMŞAQBƏDƏNLİ BÖCƏK

**Dövr:** Tabaşir
**Yaş:** 100 milyon il
**Bölgə:** Myanma

Yumşaqbədənli böcəklər kimyəvi müdafiə mexanizminə malikdir. *Cantharidae* fəsiləsinə daxil olan şəkildəki böcək canlıların 100 milyon il əvvəl də kimyəvi müdafiə mexanizmlərindən istifadə etdiyini göstərən mühüm dəlildir. Oreqon Universitetindən kəhrəba mütəxəssisi Corc Poynarın yayımladığı elmi məqalələrə görə, fosil izlərində daha əvvəl də kimyəvi müdafiə mexanizmindən istifadə edən canlı nümunələri tapılmışdır. Məsələn, Yura dövrünə aid bəzi mürəkkəbbalığı fosillərinin zəhər kisələri, Dominikan kəhrəbaları içində əsgər termitlərin müdafiə ifrazatları, həmçinin Dominikan kəhrəbaları içində bu mexanizmdən istifadə edən bəzi soxulcan növləri tapılmışdır. Ancaq bu qədər qədim tarixə aid yumşaqbədənli böcək növünün sahib olduğu bu mexanizmdən istifadə edərkən fosilləşmiş halına bundan qabaq heç rast gəlinməmişdir.



## UZUNBURUN

**Dövr:** Eosen
**Yaş:** 54-37 milyon il
**Bölgə:** ABŞ

*Curculionoidea* üst fəsiləsinə daxil olan uzunburunların fərqli fəsilələr altında toplanmış 60 mindən çox növü var. Fosillərdən uzunburunların hər zaman uzunburun olduqlarını, başqa bir canlıdan törəmədiklərini, on milyonlarla il ərzində heç dəyişmədiklərini və başqa bir canlıya da çevrilmədiklərini görmək olur. Bu həqiqəti sübut edən dəlillərdən biri də şəkildə olan dövrümüzdə yaşayan uzunburunlardan heç bir fərqi olmayan 54-37 milyon yaşındakı uzunburun fosilidir.



## YOĞUNAYAQLI AĞCAQANAD

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Bölgə:** Kanada

Yoğunayaqlı ağcaqanad milyonlarla il ərzində dəyişməyən quruluşu və görünüşü ilə təkamülçülərin iddialarını yerlə-yeksan edir. Təxminən 3-12 mm ölçüdə olan bu ağcaqanadlar yazda üzə çıxırlar. Torpaq səthinə yaxın yerdə yaşayan növləri bitkilərə zərər verir. Bu fəsiləyə daxil olan canlılar məlum olan ən qədim ağcaqanad növlərindəndir.



## PARILDAYAN BÖCƏK (NİTİDULİDAE)

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

*Nitidulidae* (parıldayan böcəklər) fəsiləsinə daxil olan böcəklərin yalnız çiçəklər üzərində yaşayan növləri zərərli qəbul edilir. Növlərin böyük əksəriyyəti tozcuqlar və bitki şirələri ilə qidalanır. Dövrümüzdə yaşayan parlaq böcəklərin sahib olduğu bütün xüsusiyyətlərə bundan milyonlarla il əvvəl yaşamış olanlar da sahib idilər. Fosil tapıntıları ilə sübut edilmiş bu həqiqət həmin böcəklərin mərhələlərlə yaranmadığını, yəni təkamül keçirmədiyini göstərir.



## HÖRÜMÇƏK

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

Təkamül nəzəriyyəsi hər cür elmi dəlillərdən məhrum, heç bir etibarlı sübuta əsaslanmayan, tamamilə mücərrəd bir iddiadır. Bütün iddiası hər canlının saysız təsadüflərlə yarandığı kimi ağıldan və elmdən kənar təməl üzərində qurulmuşdur. Elmi tədqiqatlar da vəziyyətin belə olduğunu göstərir. Məsələn, fosillər araşdırıldıqda təkamülçülərin iddia etdiyi kimi bir prosesin heç vaxt yaşanmadığı aşkar olur. Canlıların ard-arda gələn dəyişikliklərlə inkişaf etmədikləri, sahib olduqları bütün xüsusiyyətlərlə bir anda ortaya çıxdıqları aydın olur. Bu da canlıların təkamül keçirmədikləri, yəni yaradıldıqları deməkdir.



## SİNƏSİXORTUMLU

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

Yer üzündə məlum olan 1 milyon həşərat növü, 15 min isə fosil növü məlumdur. Hər il bir neçə min yeni həşərat növü də kəşf edilir. Bu həşərat növlərinin hər biri fərqli sistemə, maddələr mübadiləsinə və həyat tərzinə malikdir. Təkamülçülər bütün bu növlərin kiçik dəyişikliklərlə tədricən bir-birlərindən meydana gəldiyini iddia edirlər. Ancaq həşəratların ilk primitiv əcdadının nə olduğunu da, növlər arasındakı xəyali qohumluq əlaqəsini də göstərə bilmirlər. Bunu göstərə biləcəkləri fosilləri ümidsiz şəkildə axtarırlar. Ancaq əldə edilən hər fosil bütün həşərat növlərinin özünəməxsus xüsusiyyətlərlə yoxdan var olduqlarını, yəni yaradıldıqlarını; on milyonlarla, hətta yüz milyonlarla il boyunca da dəyişmədiklərini, yəni təkamül keçirmədiklərini gözlər önünə sərir. Bunun dəlillərindən biri də şəkildəki 125 milyon yaşındakı sinəsixortumlu həşərat fosilidir. Günümüzdəki nümayəndələrinin tamamilə eynisi olan bu fosil təkamülü təkzib edir.



## İYNƏCƏ

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

İynəcənin qanad quruluşu və uçuş mexanizminin üstünlüyü dövrümüzdəki texnologiya ilə belə tam olaraq təqlid edilə bilmir. İynəcələr 125 milyon il əvvəl də, bu gün də sahib olduğu sistemlərin eynisindən istifadə edərək eyni mükəmməllikdə uçur və manevrlər edirdi. Bu həqiqətin sübutu olan şəkildəki fosil darvinistləri təkzib edir, bütün canlıların Allahın əsəri olduğu həqiqətini bir daha ortaya qoyur.



## CIRCIR BÖCƏYİ

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

Əgər sisəklər təkamülçülərin iddia etdiyi kimi, başqa həşəratlardan əmələ gəlmişdirlərsə, o zaman sisəyə yeni çevrilməyə başlamış yarı sisəklərin bir çox fosil izləri tapılmalı idi. Halbuki indiyə qədərki bütün sisək fosilləri tam və əskiksiz quruluşları ilə hazırkı nümunələrinin eynisidir. Canlıların ortaq bir əcdaddan törədiyi iddiası isə xəyal olaraq qalmışdır. Paleontologiya professoru Stiven Stenli bunu belə dilə gətirir:

*"Bir zamanlar digər canlılara çevrildiyi güman edilən növlərin sonradan xəyali əcdadları ilə üst-üstə düşdüyü aydın oldu. Əslində isə canlıların bir-birlərinə çevrildiklərini göstərən tək bir inandırıcı nümunə göstərə bilməyiblər".*

(Stanley, S.M., The New Evolutionary Timetable: Fossils, Genes, and the Origin of Species, 1981, səh. 95)



## DƏVƏDƏLLƏYİ

**Dövr:** Tabaşir
**Yaş:** 100 milyon il
**Bölgə:** Myanma

*Mantodea* yarımdəstəsində olan bu həşəratların 2340 növü məlumdur. Çoxu tropik və subtropik bölgələrdə yaşayan bu canlılar növlərinə görə kamuflyaj olaraq yaşıl və ya qurumuş yarpağa, parlaq rəngli çiçəyə, qarışqaya, incə budağa və ya şibyəyə bənzər görünüşə bürünə bilər. Dəvədəlləyilər həşəratlar arasında boyunlarını iki istiqamətə hərəkət etdirə bilən tək həşərat qrupudur. Yuxarıdakı şəkildə kəhrəba içindəki 100 milyon illik dəvədəlləyi fosili dəvədəlləyilərin bütün xüsusiyyətləri ilə birlikdə yaradıldıqlarını göstərən dəlildir.



## EŞŞƏKARISI

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

"Ümumi paleontologiya" kitabının müəllifi A. Brauer darvinizmin fosillər qarşısındakı məğlubiyyətini belə bildirir:

*"Ötən əsrin ən mənfi paleontoloji nəticələrindən biri ara-keçid formaların, demək olar ki, heç görünməməsidir. Darvinin dövründə bunun paleontoloji tapıntıların qeyri-kafiliyi və məlumat əskikliyindən qaynaqlandığı düşünülə bilərdi. Amma həmin vaxtdan dövrümüzə qədər saysız-hesabsız fosillər əldə edilmişdir. Ara-keçid formaların olmaması üçün bu gün artıq başqa bir bəhanə olmalıdır".* (Brouwer, A., "General Paleontology", [1959], Transl. Kaye R.H., Oliver & Boyd: Edinburgh & London, 1967, səh. 162-163)

Təkamülçülər Brauerin bildirdiyi kimi bəhanə tapmamalı, gerçəkləri görməlidirlər. Şəkildəki 125 milyon illik eşşəkarısı fosili kimi saysız-hesabsız fosil təkamülün baş vermədiyini, canlıların yaradıldığını göstərir.



## BƏRABƏRAYAQLI (İSOPOD)

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

Toxunduqda qıvrılaraq top şəklini aldığı üçün bəzən muncuq böcəyi kimi adlandırılan bu canlılara dünyanın bir çox yerində tez-tez rast gəlinir. Yan səhifədəki şəkildə görünən 25 milyon illik kəhrəba içində fosilləşmiş bərabərayaqlı hazırda yaşayan bərabərayaqlılar ilə tamamilə eyni xüsusiyyətləri daşıyır. Canlılar heç bir dəyişiklik keçirməyiblər, onları hər şeyi bilən uca Allah yaratmışdır.



**SUÖLÇƏN**

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

Təkamülçülərin iddia etdiyi dəyişikliklər tarix boyunca əsla baş verməmişdir və canlıların hər biri əskiksiz olaraq bir anda yaradılmışlar. Suda qaçmaq kimi bir qabiliyyətə sahib bu həşərat da bundan 125 milyon il əvvəl eynilə indiki sistemlərə sahib olaraq mövcud olmuşdur.





## UZUNAYAQLI AĞCAQANAD

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

Tez-tez rast gələnən ağcaqanad qrupu olan uzunayaqlı ağcaqanadların bu günə qədər gəlib çatan bir çox fosil nümunələri vardır. Fosillər bizə bu canlıların 125 milyon il əvvəl də eynilə indiki anatomik quruluşa sahib olduqlarını göstərir. Canlılar təkamül keçirməmiş, hər birini uca Allah yaratmışdır.



## HÖRÜMÇƏK GƏNƏSİ

**Dövr:** Tabaşir
**Yaş:** 100 milyon il
**Bölgə:** Myanma

Şəkildə 100 milyon illik fosili görülən hörümçək gənələri adi gözlə görülməsi çətin olan kiçik canlılardır. Ölçüləri sancağın başından balacadır. Bu canlıların fosil izlərində birdən ortaya çıxmaları, heç bir dırnaqarası təkamül keçirən əcdada sahib olmamaları, olduqca kompleks orqanlara sahib olmaları və ən əhəmiyyətlisi də bu qədər çox müxtəliflik göstərmələri təkamül nəzəriyyəsi üçün cavablandırılması mümkün olmayan sualların ortaya çıxmasına səbəb olmuşdur. Təkamülçülər mikrobiologiya və entomologiyanın inkişafı ilə ortaya çıxan bu detallar qarşısında çarəsizliklərini gizlədə bilmirlər. Bütün canlılar heç bir dəyişikliyə uğramadan bir anda fosil izlərində ortaya çıxırlar. Bu isə canlıları Allahın yaratdığının bir dəlilidir.



## YALANÇI ƏQRƏB

**Dövr:** Tabaşir
**Yaş:** 100 milyon il
**Bölgə:** Myanma

Bu canlı qısqaclarının əqrəblərə olan oxşarlığına görə yalançı əqrəb adlandırılır. Kiçik ölçülərinə baxmayaraq, bəzən adi gözlə də görmək olur.

Allah bu kiçik canlını bir çox xüsusiyyətlə yaratmışdır. Yer üzündəki heç bir canlıda əskiklik, patologiya və ya anormal quruluş olmadığı kimi, bu 100 milyon illik yalançı əqrəbdə də heç bir əskiklik, anormal quruluş və ya patologiyaya rast gəlinmir. Canlının hər orqanı mütənasib və simmetrikdir. Təsadüflər nəticəsində belə bir simmetriya və mükəmməllik meydana gələ bilməz. Bütün canlılarda görünən möhtəşəm simmetriya və nisbət uca Allahın yaratdıqlarıdır.



## YIRTICI TAXTABİTİ

**Dövr:** Tabaşir
**Yaş:** 100 milyon il
**Bölgə:** Myanma

Əldə edilən 350 milyondan çox fosil canlıların mərhələlərlə bir-birlərindən törəmədiklərini, heç bir şəkildə təkamül keçirmədiklərini göstərmişdir. Yuxarıda gördüyünüz 100 milyon illik yırtıcı taxtabiti fosili heç bir dəyişikliyə uğramadan bu günə qədər gəlib çıxmışdır. Darvinistlərin heç dəyişməmiş milyonlarla fosili görmələrinə baxmayaraq, hələ də təkamülün baş verdiyini iddia etmələri onların bir doqmaya ovsunlanmış şəkildə inandıqlarını göstərir. Təkamülçülərin səyləri heç bir fayda verməmiş, 21-ci əsrdə fosil elmi ilə təkamül nəzəriyyəsi tamamilə çökmüşdür.







## PEYİN AĞCAQANADI (SCATOPSİDAE)

**Dövr:** Oliqosen
**Yaş:** 25 milyon il
**Bölgə:** Dominikan Respublikası

25 milyon illik peyin ağcaqanadının möhtəşəm fasetli (pətək) göz quruluşunun kəhrəba içində heç dəyişmədən qalması möcüzədir. Bu canlının gözlərində minlərlə büllurun olması, bundan başqa gördüklərinə məna verəcək beyin sisteminə sahib olması ağcaqanaddakı mükəmməl yaradılışı göstərir. Mükəmməl gözlərə sahib olan bu canlılar təxminən 390 milyon ildir ki, mövcuddurlar.

Kompleks göz quruluşuna 530 milyon il əvvəl Kembri dövründə yaşamış trilobitlərdə də rast gəlinir. Olduqca kompleks orqan olan göz təkamülçülərin haqqında danışmaqdan ən çox qaçdıqları, nəzəriyyələrini yerlə-yeksan edən mövzulardan biridir.

Bütün bu büllurların görüntünü birləşdirib tək görüntüyə çevirməsi Allahın yaratma sənətinin üstünlüyünü göstərir. Milyonlarla il əvvəl yaşayan peyin ağcaqanadının belə kompleks orqana sahib olması təkamül keçirmədiyini, Allahın onu möhtəşəm bir sənətlə yaratdığını göstərir.



## ƏQRƏB

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

1300 növü olan bu canlı 400 milyon ildir ki, eyni anatomik xüsusiyyətlərə sahib olaraq dünyada mövcuddur. 2 gün su altında yaşaya bilən bu canlılar gecə ov edirlər. Şəkildəki 125 milyon illik əqrəb fosili indiki əqrəblərlə eyni xüsusiyyətlərə malikdir. Əqrəblər heç bir zaman təkamül keçirməmiş, onları da Allah yaratmışdır.



## QIZILGÖZLÜ

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Braziliya

Zərif görünüşlü bu canlı torqanadlılar dəstəsinin qızılgözlülər (chrysopidae) fəsiləsinə mənsubdur. Ən çoxu Şimali Amerika və Avropada yaşayan bu canlıların yarasaların ultrasəs dalğalarını duymaq qabiliyyəti var. Yarasanın uçarkən onları təsbit edə biləcəyini anlamalarını təmin edən ultrasəs dalğası ilə qarşılaşdıqda qanadlarını bağlayıb yerə düşürlər və yarasadan xilas olurlar. Bu qeyri-adi xüsusiyyətə sahib canlılar milyonlarla il əvvəl eynilə bu gün sahib olduqları xüsusiyyətlərlə yaradılmışlar.



## MİMARİD MİNİCİ (MYMARİDAE)

**Dövr:** Tabaşir
**Yaş:** 100 milyon il
**Bölgə:** Myanma

100 milyon illik bu mimarid minicisinin o vaxtkı anatomik quruluşu necə olubsa, hazırda yaşayan mimaridlərin də anatomik quruluşları eynidir. Allah bu canlıları qüsursuz şəkildə yaratmışdır. Heç bir canlı təkamül mərhələlərindən keçməmiş və heç bir dəyişikliyə uğramamışdır.

# QUŞ FOSİLLƏRİNDƏN NÜMUNƏLƏR



## KONFUTSİUSORNİS

**Dövr:** Tabaşir
**Yaş:** 125 milyon il
**Bölgə:** Çin

Təkamül nəzəriyyəsi quşların kiçik quruluşlu və ətyeyən teropod dinozavrlardan, yəni sürünənlərdən törədiyini iddia edir. Halbuki həm quşlarla sürünənlər arasında aparılan anatomik müqayisələr, həm də fosil izləri bu iddianı təkzib edir. Şəkillərdəki fosil ilk nümunəsi 1995-ci ildə Çində tapılan konfutsiusornis *(confuciusornis sanctus)* adlanan nəsli kəsilmiş bir quş növünə aiddir.

Konfutsiusornisin 125 milyon illik fosili bizə bu canlı haqqında çox mühüm məlumatlar verir. Dişləri olmayan bu quşun dimdiyi, lələkləri və skelet quruluşu dövrümüzün quşları ilə eynidir. Konfutsiusornisdə uçuş zamanı quyruq lələklərinə dəstək verən struktur da var.

Qısa şəkildə desək, arxeopterikslə təxminən eyni dövrdə yaşayan konfutsiusornis dövrümüzdəki quşlara çox bənzəyir. Konfutsiusornis quşların təkamülü ssenarisini qəti şəkildə təkzib edir.

Darvinistlərin ictimaiyyətə ən qədim uçan dinozavr kimi təqdim etdikləri bu fosil faktiki olaraq tez-tez rast gəlinən dimdikli quşlara aid növdür.

125 milyon il əvvəldən günümüzə qədər gəlib çatan konfutsiusornisin bütün xüsusiyyətləri canlının təkamül keçirmədiyini, ilk meydana çıxdığı andan etibarən uçan quş olduğunu bizə göstərir.

Milyonlarla il əvvəldən günümüzə qədər gəlib çatan konfutsiusornisə bənzər fosillər dinozavr-quş təkamülü iddialarını qəti şəkildə qüvvədən salır.

Təkamülçülərin gerçəyi qəbul etməyərək ona qarşı çıxmaları nəzəriyyənin kor-koranə müdafiə olunduğunu göstərir.



## LİAXİORNİS

**Dövr:** Tabaşir
**Yaş:** 120 milyon il
**Bölgə:** Çin

Əldə edilən bütün fosillər quşların hər zaman quş olaraq yaşadıqlarını, hər hansı bir canlıdan törəmədiklərini göstərir. Quşların quruda yaşayan canlılardan törədiyi iddiasında olan darvinistlər də, əslində, bu həqiqətin fərqindədirlər. Onlar qanadların və uçma mexanizminin təkamül mərhələləri ilə və mutasiya kimi təsadüfi mexanizmlərlə necə yarandığını açıqlaya bilmirlər.

Türk bioloq Engin Korur qanadların təkamül keçirməsinin qeyri-mümkünlüyünü belə qəbul edir:

*"Gözlərin və qanadların ortaq xüsusiyyəti budur ki, onlar ancaq tamamilə təkmilləşmiş olduqları təqdirdə funksional olur. Başqa sözlə, natamam gözlə görmək olmaz, yarımçıq qanadla uçmaq olmaz. Bu orqanların necə əmələ gəldiyi təbiətin hələ yaxşı anlaşılmayan sirlərindən biri kimi qalmışdır".*

(Engin Korur, "Gözlerin ve Kanatların Sırrı", Bilim ve Teknik, no. 203, oktyabr 1984, səh. 25)



## MESSEL QUŞU

**Dövr:** Eosen
**Yaş:** 50 milyon il
**Bölgə:** Almaniya

Şəkildəki quş fosili məşhur Messel formasiyasında tapıldığı üçün bu adla xatırlanır. Quruda yaşayan canlılardan tamamilə fərqli quruluşda olan bu quşların heç bir bədən mexanizmi mərhələli təkamül modeli ilə açıqlana bilməz. Hər şeydən əvvəl quşu quş edən ən mühüm xüsusiyyət olan qanadlar təkamül nəzəriyyəsi üçün çox böyük problemdir. Təkamülçülər bir sürünənin uça bilməsinin qeyri-mümkünlüyünü və bu iddianın fosil izləri ilə ziddiyyət təşkil etdiyini özləri dilə gətirirlər. Məsələn, ornitoloq Alan Feduççia belə deyir:

*"Bu qədər böyük iki ayağı, qısaldılmış ön ayaqları və ağır quyruğu olan bir canlının təkamül keçirərək uçması biofiziki cəhətdən qeyri-mümkündür".*
("Jurassic Bird Challenges Origin Theories", Geotimes, vol. 41, Yanvar, 1996, səh.7)

Quşların fosilləşməsi sümük strukturlarına görə (quş sümüklərinin içi boşdur), ümumiyyətlə, çətin mərhələdir. Almaniyadakı Messel formasiyasında isə bütün üzvləri ilə birlikdə yaxşı qorunmuş quş fosillərinə tez-tez rast gəlinir. Şəkildə görünən messelornis cristata ən çox rast gəlinən quşlardan biridir. Təxminən su fərəsi ölçüsündə olan bu quş, adətən, durnakimilər dəstəsinə daxil edilir. Qısa lələkləri, uzun ayaqları və qısa caynaqları var. Quyruq lələkləri isə olduqca uzundur. Baş qismində dəbilqə tüklərini xatırladan pipiyi olur. Ümumi skelet uzunluğu 25-30 sm-dir.

# KƏLLƏ QUTUSU FOSİLLƏRİNDƏN NÜMUNƏLƏR



## ÇÖL DONUZU KƏLLƏSİ

**Dövr:** Paleosen
**Yaş:** 58 milyon il
**Ərazi:** Çin

Darvinistlər əvvəllər primitiv fikirlər irəli sürərək özlərinə tərəfdar toplaya bilirdilər. Elmi cəhalətin yayıldığı mühitdə zülalların palçıqlı sudan zaman ərzində öz-özünə yarandığına və nəhayət hüceyrənin meydana gəldiyinə, suda ov edən ayıların bir müddət sonra üzgəclər əldə edərək balinaya çevrildiyinə, meymunların ağacdan-ağaca tullanmağı dayandırıb, dik yeriməyə qərar verərək insan olduqlarına cəmiyyəti inandırmaq asan idi. Genetika və paleontologiya bilinmədiyi üçün bütün bu xəyali çevrilmələr, sanki qəti həqiqət kimi təqdim edilirdi. Lakin hal-hazırda darvinistlər üçün vəziyyət heç də asan deyil. Genetika elmi hüceyrənin kompleks quruluşunu, paleontologiya isə canlıların dəyişmədiyini ortaya çıxarmışdır... 58 milyon illik çöl donuzunun kəllə sümüyü fosili kimi saysız-hesabsız nümunələr milyonlarla illik canlıların bugünkü canlılardan fərqsiz komplekslilik sərgilədiyini göstərir. Artıq darvinizmlə insanların aldadılması qeyri-mümkündür.





## MEYMUN KƏLLƏSİ

**Dövr:** Oliqosen, **Yaş:** 32 milyon il, **Ərazi:** Çin

Bu günə qədər yarı meymun, yarı insan xüsusiyyəti daşıyan bircə fosil belə tapılmamışdır. Bir vaxtlar guya insanın təkamülünə dəlil kimi irəli sürülən fosil nümunələrinin saxtakarlıq məhsulu olduğu ortaya çıxmış və bunların hamısı təkamülçülər tərəfindən geri götürülmüşdür. Geriyə darvinistlərin xəyali ssenarilərindən başqa bir şey qalmamışdır.

Konkret dəlillər meymunların hər zaman meymun, insanların hər zaman insan olaraq mövcud olduqlarını, təkamülün yalan olduğunu sübut etmişdir. Bu dəlillərdən biri də şəkildəki 32 milyon illik meymun kəlləsi fosilidir.



## ZEBRA KƏLLƏSİ

**Dövr:** Eosen
**Yaş:** 45 milyon il
**Ərazi:** Çin

Allah hər canlını fərqli görünüşdə və fərqli formada yaratmışdır. Həyat tərzləri və ehtiyacları bir-birindən fərqli olduğu kimi, bədən quruluşlarında da böyük fərqlər mövcuddur. Məhz bu səbəbdən, əldə edilən fosilləri aydınlaşdırmaq çətin deyil. Fosili tapılan canlının bütün anatomik xüsusiyyətlərini qalıqlardan müəyyən etmək mümkündür. Şəkildə görünən 45 milyon illik zebr fosili də bu fərqi açıq-aydın göstərir. Canlının bugünkü zebrlərdən heç bir fərqinin olmadığını fosil xüsusiyyətlərinə əsasən aydın görmək mümkündür.

Şübhəsiz, bu, Allahın böyük möcüzəsidir. Əldəki elmi dəlil təkamülçü də olsalar, alimlər üçün rədd edilməyəcək qədər dəqiqdir. Canlıların dəyişmədikləri, yəni hansısa təkamül prosesi keçirmədikləri konkret elmi dəlildir.





## KAFTAR KƏLLƏSİ

**Dövr:** Tabaşir
**Yaş:** 73 milyon il
**Ərazi:** Çin

Təkamül tarixi saysız-hesabsız saxtakarlıqlara səhnə olmuşdur. Müxtəlif nəsli kəsilmiş fosillər və ya bir neçə sümük parçası xəyali keçid formaya dəlil kimi göstərilməyə çalışılmış, hal-hazırda yaşayan canlıların fosilləri illər boyu təkamül keçirmiş canlılar kimi cəmiyyətə təqdim olunmuşdur. Amma fosillər üzərində aparılan bu yalan spekulyasiyaların yerini uzun zamandır ki, səssizlik tutmuşdur. Çünki şəkildə gördüyünüz 73 milyon illik kaftar kəlləsində göründüyü kimi, bugünkü canlıların əksəriyyətinin milyonlarla il əvvəl də indiki kimi yaşadığı və beləcə, təkamül keçirmədikləri məlum olmuşdur. İndi artıq təkamülçülərin insanın təkamülü nağılı ilə bağlı etdikləri saxtakarlıqların və spekulyasiyaların də sona çatmaq vaxtı gəlmişdir.





## DƏVƏ KƏLLƏSİ

**Dövr:** Pliosen
**Yaş:** 3,9 milyon il
**Ərazi:** Çin

Təkamülçülərin iddialarına görə, dəvə kimi iri bir məməlinin kəllə qutusunun, uzun boynunun, hürgüclərinin bugünkü görünüşünə çatması üçün ardıcıl olaraq bir çox mutasiyalar baş verməli, bunların nəticəsində yarı inkişaf etmiş boynu, qəribə formada başı, tam əmələ gəlməmiş hürgücləri olan saysız-hesabsız keçid formalar yaşamalı idi. Bu xəyali keçid formalara fosil qeydlərində tez-tez rast gəlinməli, şəkildəki kimi tam inkişaf etmiş dəvə nümunələrinin isə milyonlarla il əvvələ aid heç bir izi tapılmamalı idi. Amma fosil qeydlərindən əldə etdiyimiz məlumatlar xəyali keçid formalarının heç vaxt yaşamadığını, dəvələrin hansısa keçid mərhələdən keçmədiklərini, hər zaman dəvə olaraq mövcud olduqlarını göstərir.



## VİVERRA KƏLLƏSİ

**Dövr:** Eosen
**Yaş:** 40 milyon il
**Ərazi:** Çin

Stiven Cey Quld 1993-cü ildə "Natural History" jurnalındakı məqaləsində canlıların fosil qeydlərində hər zaman dəyişməz quruluşları ilə müşahidə edildiklərini belə ifadə edir:

*"Bir çox fosil növlərinin geoloji həyat prosesi boyunca sabitliyi və ya heç bir dəyişikliyə məruz qalmaması bütün paleontoloqlar tərəfindən dilə gətirilmədən təsdiq olunmuşdur. Amma əsla üzərində geniş tədqiqat aparılmamışdır... Sabitliyin çox geniş yayılması fosil qeydlərinin utandırıcı xüsusiyyətinə çevrilmiş, amma yoxluğun (hansı ki, bu, təkamülün yoxluğudur) elanı kimi görməzlikdən gəlinmişdir".*

(S.J.Gould, "Cordelia's Dilemma", Natural History, Fevral, səh. 10-18)

Fosil qeydlərindəki sabitliyin təkamülçülər tərəfindən utandırıcı olaraq xarakterizə edilməsinin isə bir səbəbi var: canlıların heç bir dəyişikliyə məruz qalmaması təkamül nəzəriyyəsinin sonu deməkdir. Təkamülün heç yaşanmadığını göstərən bu məlumat yaradılış həqiqətini təsdiq edir...



## PİNQİVİN KƏLLƏSİ

**Dövr:** Miosen
**Yaş:** 10 milyon il
**Ərazi:** Çili

Bir növ dəniz quşu olan pinqvinlər qütblərdə buz üstündə yaşayan ən izdihamlı qrupdur. Bu Canlılar Təxminən –40$^{O}$C şəraitində yaşamalıdırlar. Amma malik olduqları xüsusiyyətlərlə bu çətin şəraitdə çox rahatlıqla yaşaya bilirlər. Pinqvinlərin bədənlərinin əksər hissəsi su keçirməyən lələkləri sayəsində soyuqdan qorunur. Dərilərinin altındakı qalın yağ təbəqəsi və lələkləri olduqca mükəmməl istilik izolyasiyası təmin edir. Pinqvinlərə aid fosillər bizə bu canlıların milyonlarla il boyu eyni bədən quruluşuna malik olduqlarını göstərir. 10 milyon yaşındakı pinqvin fosili də bunun dəlillərindəndir.





## MANUL PİŞİYİ KƏLLƏSİ

**Dövr:** Tabaşir
**Yaş:** 73 milyon il
**Ərazi:** Çin

Manul pişikkimilər fəsiləsinə aid bir növdür. Ev pişiyi böyüklüyündədir. 73 milyon illik manul kəlləsi fosili üzərində müəyyən edilən xüsusiyyətlər bu gün yaşayan nümayəndələrinin də on milyonlarla il boyunca dəyişmədiklərini göstərmişdir. Kəllə sümüyü üzərində canlının təkamül keçirdiyini göstərən bir dəlil belə tapmaq mümkün deyil. Manullar təkamülü təkzib edən saysız-hesabsız növlərdən biridir.





## YAQUAR KƏLLƏSİ

**Dövr:** Tabaşir, **Yaş:** 87 milyon il, **Ərazi:** Çin

Darvinin insanlarla meymunların ortaq əcdaddan gəldikləri ilə bağlı tezisi ortaya atıldığı dövrdə də, sonrakı dövrlərdə də elmi dəlillərlə dəstəklənə bilmədi. O vaxtdan etibarən təxminən 150 ildir ki, insanın təkamülü nağılını dəstəkləmək üçün göstərilən bütün səylər nəticəsiz qalmışdır. Əldə edilən fosillər meymunların hər zaman meymun, insanların da hər zaman insan olaraq var olduqlarını, meymunların insanlara çevrilmədiyini və meymunla insanın ortaq əcdada sahib olmadığını sübut etmişdir. Fosil qeydlərinin gətirdiyi məyusluq və düşdükləri sübutsuz vəziyyət qarşısında təkamülçülər heç bir həqiqəti əks etdirməyən kəllə qutularını təkrarən sıralayaraq saxtalığı uzun müddət əvvəl təsdiqlənmiş fosillər üzərində spekulyasiyalar etməkdən başqa heç nə edə bilmədilər. Lakin şəkildəki 87 milyon illik yaquar kəlləsi kimi fosillər bu spekulyasiyaları tamamilə əsassız edir. İstənilən canlının kəlləsində on milyonlarla il boyunca zərrə qədər dəyişiklik olmadığı kimi, meymunlarda və insanlarda da təkamül dəyişkənliyi olmamışdır.



## TASMANİYA ŞEYTANI KƏLLƏSİ

**Dövr:** Oliqosen
**Yaş:** 31 milyon il
**Ərazi:** Çin

"Dinozavrların səssiz gecəsi" kitabının müəllifi, təkamülçü Hoymar fon Ditfurt belə deyir:

*"Geriyə dönüb baxdığımız zaman, demək olar ki, iztirabla axtarılan o ara-keçid formalarını heç bir halda tapa bilməməyimizə təəccüblənməməli olduğumuzu anlayırıq. Çünki böyük ehtimalla, belə bir ara-keçid mərhələ heç vaxt mövcud olmayıb".*

("Im Anfang war der Wasserstoff", "Secret Night of the Dinosaurs", vol. 2, pp. 22-23 in Turkish edition)

Fon Ditfurt təkamülçüləri düşdükləri vəziyyətdən çıxarmağa çalışaraq nə qədər "böyük ehtimalla" ifadəsini işlətsə də, keçid mərhələnin olmadığı aşkardır. Təbiət tarixi mərhələ-mərhələ meydana gələn varlıqların deyil, tarixin hər dövründə bütün quruluş və hissələri ilə əskiksiz, bir anda ortaya çıxan və varlığını davam etdirən mükəmməl canlıların izləri ilə doludur. Belə izlərdən biri də şəkildəki 31 milyon illik Tasmaniya şeytanı kəlləsidir.



## QIRMIZI PANDA KƏLLƏSİ

**Dövr:** Tabaşir
**Yaş:** 67 milyon il
**Ərazi:** Çin

Allahın sənəti misilsizdir. Bu sənət yeri, göyü və bütün aləmi əhatə etmişdir. Allahın üstün və möhtəşəm yaratması yoxdan var etdiyi hər varlıqda təzahür edir.

Allahın misilsiz yaratmasını qavraya bilməyən təkamülçülər canlıların mənşəyi haqqında bəzi ssenarilər qururlar. Amma bu ssenarilər elmin heç bir sahəsi tərəfindən təsdiq edilməmişdir. Darvinizmə ən ciddi zərbə vuran elm sahələrindən biri isə paleontologiya olmuşdur. Tapılan milyonlarla fosil təkamülün baş verdiyinə dair ən kiçik iz belə daşımır. Bu gün təbiətdə gördüyümüz kiçik pandalardan heç bir fərqi olmayan şəkildəki 67 milyon illik qırmızı panda kəlləsi fosili də bu həqiqəti təsdiq edir.



## QUTAN KƏLLƏSİ

**Dövr:** Tabaşir, **Yaş:** 75 milyon il, **Ərazi:** Çin

Qutanlar mülayim iqlimi olan ərazilərdə, əsasən, qrup halında və koloniyalar şəklində yaşayırlar. Heç güc sərf etmədən qanadları açıq formada su səthinin düz üstündə uzun müddət süzərək uça bilən qutanların olduqca xüsusi və böyük qanadları var. Lələk quruluşlarından içi boş, yüngül sümüklərinə qədər qutanlardakı hər təfərrüat qüsursuzdur. Bu mükəmməl quruluş onların su üzərindəki nazik hava təbəqəsi üstündə belə rahatlıqla uça bilmələrini təmin edir.

Şəkildə gördüyünüz qutan fosili bu quruluşların 75 milyon il ərzində eyni cür mövcud olduğunu bizə göstərir.



**PANDA KƏLLƏSİ**

**Dövr:** Pliosen
**Yaş:** 4,6 milyon il
**Ərazi:** Çin

Pandaların həmişə panda kimi var olduqlarını göstərən bu fosil, canlıların təkamülü iddiasını təkzib edir. Bu günə qədər pandaların ortaq əcdadını göstərən və ya bugünkü formalarına çevrilənə qədər fərqli ara-keçid mərhələlərdən keçdiklərini sübut edən bircə fosil belə tapılmamışdır. Tapılan hər fosil yaşının neçə olmasından asılı olmayaraq, bugünkü pandalarla eyni xüsusiyyətləri daşıyır. Bu həqiqət qarşısında darvinistlər heç bir açıqlama verə bilmirlər.



## KÜRƏN CANAVAR KƏLLƏSİ

**Dövr:** Eosen
**Yaş:** 51 milyon il
**Ərazi:** Tayvan

Şəkildə göstərilən 51 milyon il əvvələ aid kürən canavar kəlləsi, malik olduğu mükəmməl təfərrüatlarla bu canlılara aid xüsusiyyətləri olduğu kimi əks etdirir.

Əgər belə bir fosil nümunəsi ortaya çıxmasa idi, darvinistlər, heç şübhəsiz, kürən canavarların xəyali təkamülü üzərində də çoxlu ssenarilər qurmağa davam edərdilər. Çoxlu saxta keçid formalar irəli sürər, saysız-hesabsız nağıllar danışardılar. Amma bu fosil nümunəsi darvinist nağıllara şərait yaratmır. Bu vəziyyət digər bütün canlılara və insanlara da aiddir. Darvinistlər tərəfindən qurulan hər ssenari tamamilə yalan üzərində qurulmuşdur və bu, artıq hər kəsin qəbul etdiyi bir həqiqətə çevrilib.



## QÜTB TÜLKÜSÜ KƏLLƏSİ

**Dövr:** Paleosen, **Yaş:** 59 milyon il, **Ərazi:** Çin

Fosil qeydləri darvinistlərin elmi və ağlabatan cavab vermələrinin qeyri-mümkün olduğu kifayət qədər məlumat ortaya çıxarmışdır:

– Bütün canlı nümunələri kimi qütb tülküsünün də guya mərhələ-mərhələ inkişaf edərək bugünkü formaya gəldiklərini göstərən bircə ara-keçid forma fosili belə yoxdur.

– On milyonlarla il əvvəl yaşamış qütb tülküləri eynilə bugünkülər kimi bütöv və qüsursuz quruluşa malikdirlər. Hansısa ibtidai görünüşləri, yaxud quruluşları yoxdur.

– Bu gün yaşayan qütb tülkülərinin 59 milyon il əvvəl yaşamış qütb tülkülərindən zərrə qədər belə fərqi yoxdur. Bu da bəhs edilən canlıların milyonlarla ildən bəri dəyişmədiyini göstərir.

Bütün bu məlumatlar darvinistləri böyük bir müəmmaya salır və canlıların mənşəyinin yaradılış olduğunu bizə göstərir.



## ŞİR KƏLLƏSİ

**Dövr:** Tabaşir, **Yaş:** 82 milyon il, **Ərazi:** Çin

82 milyon il əvvələ aid bu fosil darvinistlərin iddiasına görə, əskiklik və yarımçıq inkişaf etmiş orqanlarla dolu olmalı idi. Fosilin göz çuxurlarında, çənə quruluşunda, qulaqlarında bir çox patologiyalar olmalı idi. Amma vəziyyət heç də belə deyil. Şəkildəki milyonlarla illik şir kəlləsi mükəmməl formada qorunmuşdur və malik olduğu təfərrüatlar canlının qüsursuz görünüşdə və eynilə indiki şirlər kimi olduğunu göstərir.

Darvinistlərin insanın xəyali təkamülünə dair iddialarının səbəblərindən biri fərziyyələr qura bildikləri meymun fosillərinin çoxlu sayda olmasıdır. Halbuki fosil qeydlərindən əldə olunan nəticə spekulyasiya deyil, heç kimin inkar edə bilməyəcəyi konkret elmi nəticələrdir. Buna əsasən, canlılar heç vaxt dəyişikliyə məruz qalmamış, ara-keçid mərhələlərdən keçməmişdir. Elm təkamül nəzəriyyəsini inkar edir.

# TARİX BOYU HEÇ BİR CANLI NÖVÜNÜN KƏLLƏ QUTUSUNDA DƏYİŞİKLİK OLMAMIŞDIR

Canlıların bütün bədən üzvləri və xüsusiyyətləri kimi kəllə sümükləri və baş quruluşları da milyonlarla ildən bəri dəyişməmişdir. Heç bir canlının kəllə qutusunda təkamül prosesi baş verməmişdir. Bu qədər çoxlu sayda canlı milyonlarla il təkamül keçirmədən qaldığı kimi, insan da təkamül prosesindən keçməmiş, bütün anatomik xüsusiyyətləri də daxil olmaqla, insan olaraq mövcud olmuşdur. Təkamülçülərin insanın xəyali təkamülünə sübut kimi ortaya qoyduğu kəllə sümükləri nəsli kəsilmiş meymunlara, yaxud da hal-hazırda yaşamayan müxtəlif insan irqlərinə məxsusdur. Bunların heç biri təkamülə dəlil deyildir.

Bütün bu canlılara aid olan dəyişməzlik insan üçün də qüvvədədir. Digər canlıların kəllə quruluşlarında on milyonlarla il ərzində heç bir dəyişiklik olmadığı kimi, insanların da kəllə sümüyündə heç bir təkmilləşmə baş verməmişdir. Balıqlar hər zaman balıq, quşlar hər zaman quş, sürünənlər hər zaman sürünən olduğu kimi, insanlar da həmişə insan olaraq mövcud olmuşdur. İstənilən canlının hər hansı bir orqanı və strukturunda təkamülçülərin iddia etdiyi kimi, ibtidaidən aliyə doğru təkamül deyə bir şeyin olduğu haqqında danışmaq əbəsdir.



**_Homo erectus_ kəllələrindəki qalın qaş çıxıntıları, arxaya maili olan alın quruluşu kimi xüsusiyyətlər bu gün yaşayan bəzi irqlərdə də müşahidə edilir. Yuxarıdakı Malayziya yerlisində olduğu kimi.**

Təkamülçülər insanın xəyali təkamülü nağılından bəhs edərkən tapdıqları kəllə qutularının həcmini, qaş çıxıntılarını və ya alın quruluşlarını göstərərək xəyali təkamül ardıcıllığı və nəsil ağacı qururlar. Halbuki təkamülçülərin ortaya qoyduqları kəllə sümüklərinin quruluşundakı fərqlər təkamülə dəlil deyil. Çünki bu kəllə sümüklərinin bir qismi nəsli kəsilmiş meymunlara, bir qismi də keçmişdə yaşamış fərqli insan irqlərinə aiddir. Müxtəlif insan irqlərinin fərqli kəllə quruluşuna malik olması isə çox təbii haldır. Piqmeylərlə ingilislərin, ruslarla çinlilərin, aborigenlərlə eskimosların,

zəncilərlə yaponların alın quruluşlarında, göz çuxurlarında, qaş çıxıntılarnda, kəllə qutusu həcmlərində, təbii olaraq, fərqliliklər olmalıdır. Amma bu müxtəlifliklər bir irqin digərindən təkamül keçirdiyini, ya da digərindən ibtidai və yaxud ali olduğunu göstərmir. Aborigenlərin nəsli başqa bir nəsil ilə qarışmadığı halda, hər zaman eyni xüsusiyyətlərə sahib olaraq qalacaq. Nə qədər zaman keçsə də, bu insanlar daha fərqli xüsusiyyətlər qazanaraq təkamül keçirməyəcək, kəllə qutularının həcmi hal-hazırkından daha çox böyüməyəcək, fərqli anatomik xüsusiyyətlərə sahib olmayacaqlar.

## İNSAN İRQLƏRİNDƏKİ KƏLLƏ QUTUSU FƏRQLƏRİ

Bir yaponun zəncidən, eskimosun almandan fərqli kəllə quruluşuna sahib olması olduqca normaldır. Bu fərqliliklər bir irqin digərindən daha təkmilləşmiş, ya da daha geridə olduğunu göstərmir və qətiyyən təkamülə dəlil deyil. Allahın yaratmasındakı fərqlilik və üstünlükdür.




**a)** **Benqallı orta yaşlı kişi,** **b)** **15-ci əsrdə yaşamış Peru yerlisi,**
**c)** **25-30 yaşında alman kişi,** **d)** **35-40 yaşında zairli kişi,**
**e)** **35-40 yaşında eskimos kişi,**
**f)** **Cənub şərqi Asiyadakı Solomon adalarında 1893-cü ildə vəfat edən kişi.**

Məsələn, təkamülçülərin xəyali olaraq ibtidai insan qəbul etdikləri homo erectus kəllə qutularında mövcud olan iri qaş çıxıntılarına və arxaya əyilmiş formada alın quruluşuna bu gün yaşayan bəzi Malayziya yerliləri də sahibdirlər. Əgər təkamülçülərin iddiaları doğru olsa idi, bəhs edilən

Malayziya yerliləri də meymunluqdan yeni çıxmış, tam formalaşmamış insan quruluşu və görünüşündə olmalı idilər. Halbuki belə bir şeydən söhbət gedə bilməz. Homo erectus kəllə qutusunun anatomik xüsusiyyətlərinə hal-hazırda da rast gəlinməsi həm homo erectusun ibtidai insan olmadığını, həm də təkamülçülərin insanın nəsil ağacı ssenarisinin yalan olduğunu göstərir.

## TƏKAMÜLÇÜLƏRİN UYDURMA TARİX ANLAYIŞLARI

İnsanların 700 min il bundan əvvəl çox mahir inşa edilmiş gəmilərlə okean səyahətinə çıxdıqlarını bilirdinizmi? Və yaxud bizə ibtidai mağara adamları kimi təqdim edilən insanların, əslində, heç də günümüzün rəssamlarından geri qalmayan istedada və estetik zövqə malik olduqlarını eşitmisinizmi? 80 min il əvvəl yaşamış və bizə təkamülçülərin "meymun adam" adı ilə göstərmək istədikləri Neandertal irqinə aid olan insanların musiqi alətləri düzəltdiyini, geyim zövqünə sahib olduğunu, qızmar qumlarda müəyyən ölçü ilə biçilmiş səndəllərdə gəzdiyini bilirdinizmi?

Böyük ehtimalla bunların heç birini daha əvvəl eşitməmisiniz. Əksinə, bu insanların yarı meymun yarı insan, danışmaq qabiliyyəti məhdud olan, dik dayana bilməyən, sadəcə xırıltılı səslər çıxaran vəhşi mağara adamları olduğu barədə yanlış təsəvvürə malik ola bilərsiniz. Çünki bu böyük yalan, təqribən 150 ildir ki, dünyanın dörd tərəfində insanlara təlqin edilir.

Bu cür təlqinin məqsədi isə materialist fəlsəfəni yaşatmaqdır.

Materialist fəlsəfə, yəni maddəni əsas götürən fəlsəfə Yaradıcının varlığını inkar edir. Bizi həqiqətlərdən yayındıran bu görüşə əsasən, kainat və maddə əzəlidir, yəni bir başlanğıcı, bilavasitə Yaradıcısı yoxdur. Bu uydurma inancın uydurma elmi əsası isə təkamül nəzəriyyəsidir. Belə ki, materialistlər kainatın bir yaradıcısının olmadığını iddia etdikləri üçün kainatdakı canlı aləmin və nizamın necə yarandığını özlərinə uyğun tərzdə izah etməlidirlər. Təkamül nəzəriyyəsi bu məqsədlə istifadə edilən bir ssenaridir. Bu ssenariyə görə, kainatdakı bütün nizam və canlı aləm təsadüflər nəticəsində öz-özünə əmələ gəlmişdir. İbtidai şərtlərdə dünya atmosferində mövcud olan bəzi cansız maddələr təsadüfən birləşərək ilk canlı orqanizmi əmələ gətirmişdir. Milyonlarla il sürən təsadüflər nəticəsində isə həmin canlı orqanizmlər təkamülə məruz qalaraq təkamül zəncirinin ən son bəndi olan insanı meydana gəlmişdir. Hər biri imkansız olan milyonlarla mərhələnin nəhayətində meydana gəlməsi iddia edilən insanlığın tarixi də yenə bu ssenariyə uyğun olaraq uydurulmuşdur.

Heç bir elmi dəlili olmayan bu izaha görə bəşər tarixi belədir: necə ki, canlı aləm ibtidai bir orqanizmdən ən mürəkkəb orqanizm olan insana qədər inkişaf etmişsə, bəşər tarixi də ibtidai insan icmalarından ən inkişaf etmiş insan cəmiyyətinə doğru inkişaf etmiş olmalı idi. Bu, elmi əsası olmayan bir fərziyyədir. Və bu fərziyyə materialist fəlsəfənin və təkamül nəzəriyyəsinin iddialarına əsasən hazırlanmış bəşər tarixinin özülünü təşkil edir.

Təkamülçü alimlər bir hüceyrəlidən çox hüceyrəliyə və ondan sonra meymundan insana doğru davam edən guya təkamül prosesini izah edə bilmək üçün tarixin gedişini də uydurmuşdular. Bunun üçün ibtidai insanın

həyat tərzini açıqlayan "mağara dövrü", "daş dövrü" kimi saxta dövrlər uydurmuşlar. "İnsanlar meymunlarla eyni kökdən törəmişlər" yalanını müdafiə edən təkamülçülər bu iddialarını özlərinə uyğun tərzdə sübut etmək üçün araşdırmalar aparmağa başlamış və arxeoloji qazıntılar zamanı tapdıqları hər daşı və ya ox parçasını və ya bir gil qabı bu istiqamətdə şərh etmişlər. Halbuki, qaranlıq bir mağarada dərilərə bürünərək oturan, danışıq qabiliyyəti olmayan yarı insan yarı meymun canlılar sadəcə bir təxəyyül məhsuludur. İbtidai insan heç vaxt olmamış, daş dövrü heç vaxt yaşanmamışdır. Bunlar təkamülçülərin bəzi kütləvi informasiya vasitələrinin də köməkliyi ilə formalaşdırdıqları gözbağlayıcıdan başqa bir şey deyil.

Bunlar gözbağlayıcıdır, belə ki, biologiya, paleontologiya, mikrobiologiya, genetika kimi elm sahələri başda olmaqla, ümumi elm aləmində baş verən nailiyyətlər bu gün təkamül iddiasını tamamilə darmadağın etmişdir. Canlı növlərin bir-birilərinə çevrilərək təkamülə uğraması iddiasının əsassız olduğu aydın olmuşdur. Eyni qaydada insan da meymunabənzər canlılardan təkamül nəticəsində meydana gəlməmişdir. İnsan var olduğu gündən bu yana insandır. Var olduğu gündən bu yana yüksək mədəniyyətə malikdir. Bu, o deməkdir ki, tarixin təkamülü də heç vaxt baş verməmişdir.

İnsan bu dünyaya təkamüllə deyil, sonsuz güc və ağıl sahibi olan Allahın qüsursuz yaratması ilə gəlmişdir.

Təkamülçü tarix anlayışına görə, bəşər tarixi insanın guya təkamülünə paralel olaraq müxtəlif dövrlərə ayrılaraq tədqiq edilir. Bir çoxlarımızın məktəb illərində və ya müxtəlif qəzet və televizor xəbərlərində eşitməyə öyrəşdiyimiz paleolit, mezolit, neolit, tunc dövrü, dəmir dövrü kimi xəyali anlayışlar bəhs etdiyimiz təkamülçü xronologiyanın mühüm hissəsidir. Bir çox insan bu uydurma təsviri heç düşünmədən qəbul edir və bəşəriyyətin bir zaman sadəcə kobud daş alətlərdən istifadə edilən, mədəniyyət və texnologiyanın olmadığı bir dövr içərisində yaşamış olduğunu qəbul edir.

Halbuki, arxeoloji qazıntılar və elmi məlumatlar dərindən tədqiq edildikdə, çox fərqli bir mənzərə ortaya çıxır. Keçmişdən qalan izlər insanların tarixin hər dövründə mədəniyyətin və sosial həyatın mövcud olduğu, mədəni həyat tərzi keçirdiklərini göstərir. Arxeoloji qazıntılar nəticəsində aşkarlanan alətlər, tikiş iynələri, fleyta qalıqları, bəzək əşyaları, dekorativ əşyalar, qədim insanların mədəni baxımdan inkişaf etmiş bir həyat tərzi sürdüklərini göstərir.

Bundan yüz minlərlə il əvvəl də eyni günümüzdəki kimi, insanlar evlərində yaşayır, kənd təsərrüfatı və ticarətlə məşğul olur, tikiş məmulatları istehsal edir, yemək yeyir, qohumlara baş çəkir, musiqi ilə maraqlanır, şəkillər çəkir, xəstəlikləri müalicə edir, ibadətlərini yerinə yetirir, qısaca olaraq normal gündəlik həyatlarını yaşayırdılar. Allahın göndərdiyi peyğəmbərlərə iman edən insanlar bir olan Allaha iman edir, bəziləri isə yollarını azaraq bütlərə sitayiş edirdi. Peyğəmbərlərə iman edən möminlər Allahın əmr etdiyi əxlaqı yaşayarkən, bir qisim insanlar da batil işlər görür,

azğın ayinlər həyata keçirirdilər. Hazırkı dövrdə olduğu kimi, tarixin hər dövründə həm Allahın varlığına iman edən insanlar, həm də bütpərəst və müşrik insanlar olmuşdur.

Əlbəttə tarix boyu bir yanda mədəni bir həyat sürən insanlar var ikən, digər yanda isə daha sadə və ibtidai şəraitdə yaşayan icmalar mövcud olmuşdur. Lakin bu, bəşər tarixinin guya təkamülünə dəlil kimi təqdim ediləcək bir hal deyil. Çünki hazırkı dövrdə də dünyanın bir yerində kosmosa raket göndərildiyi bir vaxtda digər yerində insanlar hələ elektrikin varlığını belə bilmirlər. Lakin bu vəziyyət nə kosmosa raket göndərən insanların zehni və fiziki cəhətdən -guya təkamül prosesi nəticəsində- daha inkişaf etmiş olduqlarını, nə də ki, digərlərinin daha geridə -guya meymun insanlara yaxın- olduğunu göstərir. Bunlar sadəcə mədəniyyət və sivilizasiya fərqini göstərir, mədəniyyətin təkamülünün həyata keçməsini deyil.

## DAŞ DÖVRÜ HEÇ VAXT MÖVCUD OLMAYIB

Təkamülçülərin "daş dövrü" adlandırdıqları dövrdə insanlar ibadətlərini yerinə yetirir, göndərilmiş elçilərin təbliğlərini dinləyir, binalar tikir, mətbəxlərində yemək bişirir, ailələri ilə söhbət edir, qonşuları ilə görüşür, dərzilərə paltar tikdirir, həkimlərə müalicə olunur, musiqi ilə maraqlanır, rəsim çəkir, heykəl düzəldir, qısası, normal həyat tərzi keçirirdilər. Arxeoloji tapıntıların da göstərdiyi kimi, texnologiyada və elmdə tarix boyu dəyişikliklər olmuş, lakin insan həmişə insan kimi yaşamışdır.



**Eradan əvvəl 7-11-ci minilliklərə aid olan qablar, stollar və qaşıq həmin dövrdəki insanların həyat tərzləri haqqında mühüm məlumatlar verir. Təkamülçülərin iddiasına görə bu dövrdə insanlar yenicə oturaq həyat tərzinə keçiblər və yeni mədəniləşməyə başlayıblar. Halbuki bu qalıqlar qədim dövrün insanlarının mədəniyyətlərinin mövcud olduğunu, tam mənası ilə mədəni bir həyat yaşadıqlarını göstərir. Bu insanlar eynilə dövrümüzdəki insanlar kimi stollarda oturur, qablarda çəngəl, bıçaq, qaşıq istifadə edərək yeməklərini yeyir, qonaqlarına qulluq edir, qısası nizamlı həyat tərzi keçirirdilər. Arxeoloji tapıntılar tədqiq olunanda sənət anlayışları, tibb bilgiləri, texniki imkanları və gündəlik həyat tərzi ilə neolitik əsrdəki insanların özlərindən əvvəlkilər və sonrakılar kimi insani bir həyat tərzi keçirdikləri görünür.**



**Solda Neolit dövrünə aid daşlardan və qabıqlardan hazırlanmış bu boyunbağı o dövrdəki insanların sənət və estetika zövqləri ilə yanaşı, belə bir bəzək əşyasını meydana gətirə biləcək texnologiyaya da sahib olduqlarını göstərir.**

### 12 MİN İLLİK DÜYMƏ

**Sağda- e.ə. 10-cu minillikdə istifadə edilmiş sümükdən hazırlanmış bu düymələr dövrün insanlarının paltar mədəniyyətlərinin olduğunu göstərir. Düyməni istifadə edən bir cəmiyyət tikişi və toxuculuğu da bilməlidir.**





### 12 MİN İLLİK MUNCUQLR

**Solda təxminən e.ə. 10-cu minilliyə aid olan bu daşlar tədqiqatçılara görə muncuq kimi istifadə edilirdi. Daşlardakı müntəzəm dəliklər diqqətçəkicidir. Bu dəliklər daşa daşlar vurularaq açılmaz. Belə sərt daşlarda bu dərəcə düzgün dəliklər aça bilmək üçün polad və ya dəmirdən hazırlanmış alətlər istifadə etmək lazımdır.**

### 9-10 MİN İLLİK İYNƏLƏR

**Sağda- e.ə. 7-8-ci minilliklərə aid olan bu iynələr dövrün insanlarının mədəni həyatlarının çox mühüm bir dəlilidir. İynəni istifadə edən insanların təkamülçülərin iddia etdiyi kimi heyvani deyil, tam mənası ilə insani həyat təriz keçirdikləri açıqdır.**





**12 MİN İLLİK MİS İYNƏ**

**Solda - e.ə. 10 min il əvvələ aid olan mis iynə həmin dövrdə mədənlərin və metalların istifadə edildiyinin bir dəlilidir. Kristal və ya toz minerallar şəklində olan mis cövhərləri qədim sərt qayalarda damar şəklində tapılır. Misdən iynə düzəldən bir cəmiyyət mis cövhərini tanımalı, qayanın içindən çıxarmağı bacarmalı və işləyə biləcək texniki imkanlara sahib olmalıdır. Bunu da təkamülçülərin iddia etdiyi kimi, "ibtidailikdən yeni qurtulmuş varlıqların" edə bilməyəcəyi aydındır.**

**Sağda - şəkildəki fleyta təxminən 95 min illikdir. Bundan on minlərlə il əvvəl yaşayan insanların da inkişaf etmiş musiqi mədəniyyəti vardır.**



## TƏKAMÜLÇÜLƏR BU ARXEOLOJİ QAZINTILARI HEÇ CÜR İZAH EDƏ BİLMİR

Bəşər tarixini təsvir edən təkamülçülərin hər hansı əsərini tədqiq etdiyimiz zaman ilk diqqəti cəlb edən məqamlardan biri, insanın uydurma əcdadlarının gündəlik həyatına dair təfsilatlı təsvirlərdir. İstifadə edilən təlqin etmə metodundakı əminliyin təsiri ilə mövzu barədə məlumatı olmayan insan bütün bu izah edilənlərin elmi dəlillərə əsaslandırıldığını fikirləşə bilər. Təkamülçü alimlər sanki həmin dövrdə yaşamış, müşahidə aparmaq imkanına malik olmuş kimi təfsilatlı hekayələr danışırlar: iki ayaq üzərində durmağa başlayan uydurma əcdadlarımızın əlləri boş qalanda alətlər düzəltməyə başladıqlarını, uzun dövrlər ərzində sadəcə daşdan istifadə etdiklərini, taxta və daşdan başqa heç bir alətlərinin olmadığını, dəmir, mis və tuncdan istifadə etməyi daha sonrakı dövrlərdə öyrəndiklərini qeyd edirlər. Lakin bu izah edilənlər elmi dəlillərlə deyil, təkamülçülərin ön mühakimələrinə uyğun olaraq tapıntıların yanlış şərhinə əsaslanan hekayələrdir.

Arxeoloq Pol Bahn (Paul Bahn) bəşər tarixinin təkamülü ssenarisinin bir nağıldan ibarət olduğunu belə ifadə edir:

***“Elmin necə də böyük hissəsi hekayələrə əsaslanır!*** *Hekayə sözünü yaxşı mənada işlədirəm, lakin yenə də hekayədir ki, hekayə. Bəşər övladının təkamülünə dair ənənəvi ssenarini düşünün: ov etmək üçün od, məskən salmaq üçün od, qaranlıq mağaralar, ayinlər, alətlərin düzəldilməsi, yaşlanma, mübarizə və ölümlə bağlı hekayələri.* ***Nə qədəri sümük və qalıqlara, nə qədəri isə ədəbi meyarlara əsaslanır”.*** (Paul Bahn, Arxeologiyanın ABC-si, səh.16; Burak Eldem, 2012: “Mardukla görüş”, “İnkılap” Nəşriyyat, İstanbul, 2003, səh. 23)

Pol Bahnın dəqiq olaraq ifadə etməkdən çəkindiyi sualın cavabı açıq aşkar görünür, bəşər tarixinin uydurma təkamülü elmi deyil, tamamilə ədəbi meyarlara əsaslanır.



**Tünd rəngli şüşəyə bənzər bir qaya olan obsidiandan hazırlanmış bu alət təxminən e.ə. 10-cu minilliyə aiddir. Sadəcə daş zərbələri ilə obsidianın belə incəldilib formalaşdırılması mümkün deyil.**

Həqiqətən də, bu hekayələrdə çox cavabsız məqam, məntiqi ziddiyyət və pozuntular var. Ancaq təkamülçü doqmalarla düşünən bir insan bu ziddiyyətləri görə bilməz. Məsələn, təkamülçülər daşın yonulması dövründən bəhs edir, lakin həmin dövrə aid alət və ya qalıqların necə yonulub forma aldıqlarını izah etmirlər. Təkamülçülərin dinozavrların milçəkləri qovarkən qanadlarını inkişaf etdirərək uçmağa başladığını irəli sürdüyü halda, milçəyin isə necə uçduğunu heç vaxt izah edə bilmədikləri kimi, on minlərlə əvvələ aid qalıqların necə düzəldilib formaya salındığını izah edə bilmirlər. Mövzunun bu tərəfini tamamilə unutmağa və unutdurmağa çalışırlar.



**Qaşıqlar dövrün insanlarının mətbəx mədəniyyətlərinin mövcud olduğunu göstərir. Bu təkamülçülərin iddia etdiyi kimi, “ibtidai həyatın” mövcud olmadığının dəlilidir.**

Halbuki, daşı yonub ona forma vermək çox çətin bir işdir. Daşı daşa sürtərək, tarixdən əvvəlki dövrə aid qalıqlarda olduğu kimi, mükəmməl dəqiqlikdə və sivrilikdə kəsilmiş alətlər əldə etmək mümkün deyil. Qranit, bazalt və ya doleritə bənzəyən sərt daşların parçalanıb dağılmadan, ağac kütləsi kimi nazik kəsilməsi yalnız, polad əyələrin, tokar dəzgahlarının, rəndələrin, daş kəsimi və cilalanması üçün istifadə edilən digər alətlərin mövcudluğu ilə mümkün ola bilərdi. Yenə on minlərlə il əvvələ aid qolbağıların,

sırğaların, boyunbağıların, kürələrin daşdan istifadə etməklə düzəldilmədiyi gün kimi aydındır. Həmin əşyalardakı kiçik dəliklər daşla vurularaq açıla bilməzdi. Üzərilərindəki bəzəklər daş sürtülərək əmələ gələ bilməzdi. Bəhs edilən tarixi əsərlərin düzgün olması onların düzəldilməsi üçün dəmir, polad və digər metallardan düzəldilmiş alətlərdən istifadə edilmiş olmasının labüdlüyünü göstərir.

Bir çox arxeoloq və alimlər sözü gedən tarixi əsərlərin və ya qalıqların təkamülçülərin iddia etdiyi şəraitdə düzəldilə bilməyəcəyini sübut etmək üçün sınaq keçirmişdi. Məsələn, 11 min il bundan əvvəl inşa edilmiş olması təxmin edilən Göbəkli Təpədə tapılan blok daşlar üzərindəki işləmələrin hansı üsulla işlənmiş olmalarını araşdıran prof. Klaus Şmidt (Klaus Schmidt) belə bir sınaq keçirmişdir: təkamülçülərin həmin dövrdə istifadə etməsi iddia edilən daşları işçilərin əllərinə verərək, qayaların üzərinə bənzər qabartmaların çəkilməsi tələb edilmişdir. Qayaları daşla formaya salmağa çalışan işçilər 2 saat ərzində fasiləsiz işləmələrinə baxmayaraq, qaya üzərində sadəcə nəzərə çarpmayan cizgilər çəkə bilmişlər.



**Bu daş relyefin 11 min il yaşı var.**



**Tarixdə heç vaxt ibtidai zehnə malik olan varlıqların yaşamadığının dəlillərindən biri də 40 min illik fleytadır. Elmi çalışmalar dövrümüzün Qərb musiqisində istifadə edilən 7 notla köklənmiş fleytaların on minlərlə il əvvəl istifadə edilidiyini göstərir.**

Buna oxşar sınağı hər bir kəs öz evində də keçirə bilər. Əlinizə qranit kimi sərt bir daş alın, bundan 100 min il əvvəl yaşamış insanların düzəltdikləri mizraq uclarını düzəltməyə çalışın. Lakin bunun üçün əlinizdə yalnız həmin qranit parçası və bir daşdan başqa heç nə olmasın. Belə bir vəziyyətdə bunu necə bacara bilərsiniz? Tarixi tapıntılardakı kimi mükəmməl itilikdə, simmetrik və dəqiqliklə düzəlmiş alət meydana gələcəkmi? Daha da dərinə getsək, 1$m^2$ sahə böyüklüyündə bir qaya alıb üzərinə heyvan şəkli oymağa çalışın. Qayaya əlinizdəki daşla vuraraq necə nəticə əldə edə bilərsiniz? Aydın görünür ki, polad və dəmirdən düzəldilmiş vasitəçi material olmadan nə sadə mizraq ucunu düzəldə bilərik, nə də bir daş işləməsini işləyə bilərik.

Bu halda, unutmamalıyıq ki, istifadə edilən daşı kəsən və forma verən alətlərin düzəldilməsi də ayrıca bir peşə sahəsidir. Əyənin, tokar dəzgahı, rəndə və digər alətlərin istehsal edilməsi üçün lazımi əsas materiallar olmalıdır. Bu isə həmin əsərlərin meydana gəldiyi dövrün şərtlərinin olduqca qənaətbəxş və mütərəqqi olduğunu göstərir. Yəni təkamülçülərin sadə daş alətlərindən istifadə edildiyi, texnikanın və texnologiyanın olmadığı iddia edilən "qədim daş dövrü" sadəcə bir cəfəngiyatdan ibarətdir, həqiqətdə isə belə bir dövr olmamışdır.

Digər tərəfdən daşların kəsilməsində, düzəldilib formaya salınmasında istifadə edilən dəmir və polad materiallarının günümüzə qədər qalmaması da son dərəcə təbiidir. Təbii şəraitdə xüsusən də rütubətli və turş mühitdə, bütün metal materiallar

oksidləşərək çürüyüb dağılır və məhv olur. Qalan isə məhv olması daha uzun sürən daş parçaları qalır. Bu daş parçalarına əsaslanaraq həmin dövrün insanlarının sadəcə daşdan istifadə etdiklərini irəli sürmək isə elmi yanaşma deyil.

Həqiqətən də, artıq bir çox təkamülçülər də arxeoloji qazıntıların darvinizmi müdafiə etmədiyini qəbul edir. Təkamülçü arxeoloq Riçard Liki (Richard Leakey), arxeoloji tapıntıların xüsusilə də daş alətlərin təkamül nəzəriyyəsi ilə izah edilməsinin mümkün olmadığını belə etiraf etmişdir:

*“Əslində, darvinist nəzəriyyəsinin əsassızlığı arxeoloji qeydlərdə qəti şəkildə öz təsdiqini tapmışdır. Əgər darvinist yönlü təqdimat doğru olsaydı, bu halda, həm arxeoloji qeydlərdə, həm də fosil qeydlərində iki ayaqlı olmağın, texnologiyanın və inkişaf edən beyin ölçülərinin dəlillərini müşahidə etməli idik. Tarixdən əvvəlki qeydlərin tək bir istiqaməti belə bu nəzəriyyənin əsassız olduğunu göstərmək üçün kifayət edir: daş alətlər”.*

(Richard Leakey, The Origin of Humankind, Basic Books, New York, 1994, səh. 12)

## CİLALANMIŞ DAŞ SAXTAKARLIĞI

Qədim mədəniyyətlərdən dövrümüzə qədər gəlib çıxan qalıqlarda daşişləmə diqqət çəkmişdir. Daşa bu qədər dəqiq və düzgün forma verilə bilməsi üçün güclü polad alətlər istifadə edilməlidir. Daşı daşla yontaraq, daşı daşa sürtərək incə naxışların vurulması və müxtəlif formalarda əşyalar düzəltmək mümkün deyil. Qranit kimi möhkəm daşların bu dərəcə düzgün kəsilməsi, üzərlərinə naxış vurulması bunu edə biləcək texniki strukturu tələb edir.



**Yuxarıdakı şəkillərdə görünən soldakı bilərzik mərmərdən, sağdakı isə bazaltdan hazırlanmışdır. E.ə. 8500-9000-cu minilliklərə aiddir. Təkamülçülər bu dövrdə sadəcə daşdan hazırlanmış alətlərin istifadə edildiyini iddia edirlər. Bazalt və mərmər çox sərt daşlardır. Bu daşların belə düzgün yumru halqalar formasına gətirilməsi üçün poladdan düzəldilmiş vəsaitlər istifadə olunmalıdır. Bilərziklərin polad alətlər istifadə edilmədən kəsilib formaya salınması mümkün deyil. Bir şəxsə bir parça daş verib, əlindəki bazalt kütləsini şəkildəki kimi bir bilərziyə çevirməsini istəsək, bunu bacara bilərmi? Əlbəttə daşı daşa sürtərək, daşa daşla vuraraq bilərziyi düzəldə bilməyəcək. Həmçinin bu tapıntılar o dövrdə burada yaşayan insanların estetik anlayışa və sənət zövqünə sahib olan, mədəniyyətləri inkişaf etmiş fərdlər olduğunu göstərir.**





**Yuxarıda - şəkillərdə əllə hazırlanmış obsidianlar, sümük alətlər, yabalar və daşdan hazırlanmış müxtəlif vəsaitlər görünür. Sümüyə daşla vuraraq belə düzgün şəkillərin əldə edilə bilməyəcəyi aydındır. Sərt daş zərbələri, sümüyü davamlı dağıdıb parçalayaraq, istənildiyi kimi formalaşdırılmasına mane olacaq. Qranit və bazalt kimi ən sərt daşlardan hazırlanan bu vəsaitlərin də daş zərbələri ilə bu dərəcə düzgün kəsilməsi, formalaşdırılması mümkün deyil. Bu daşlar meyvə kəsən kimi düzgün kəsilmişdir. Daşların parlaqlığı da təkamülçülərin iddia etdiyi kimi cilalanmış olmalarından deyil, kəsməkdən qaynaqlanır. Bu əşyaları hazırlayan insanlar əllərindəki vəsaitləri istədikləri formaya sala biləcəkləri dəmir və ya poladdan hazırlanmış texniki cihazlara sahib olmalıdırlar. Sərt daş parçaları ancaq poladla bu dərəcə düzgün kəsilə bilər.**

Bir çox daş qalıqdakı parlaqlıq da daşları düzgün kəsməkdən qaynaqlanır. Təkamülçü alimlərin bu parlaqlığı “cila” adlandırmaları bu dövrü də “cilalanmış daş dövrü” olaraq qəbul etmələri elmə zidddir. Cilanın minlərlə il boyu mühafizə edilməsi mümkün deyil. Həmin daşlar iddia edildiyi kimi cilalandığı üçün deyil, düzgün kəsildikləri üşün parlayır. Bu daşın öz formasından qaynaqlanan bir parlamadır.

# TƏKAMÜLÇÜLƏRİN UYDURMA XRONOLOGİYASI

Təkamülçülər tarixi dövrlərə ayıran zaman, tapdıqları tarixi əsərləri nəzəriyyələrinə uyğun gələn formada, doqmalarına uyğun şəkildə şərh edərək dəyərləndirirdilər. Tunc əşyalar tapdıqları zaman həmin dövrü tunc dövrü adlandırır, dəmirin isə bizə daha yaxın dövrdə istifadə edilməyə başladığını qeyd edirlər. Metalların ən qədim mədəniyyətlərə məlum olmadığını iddia edirlər.

Halbuki, yuxarıda da qeyd etdiyimiz kimi, dəmir, polad və bir çox metal daha tez oksidləşir və aşınır. Daşla müqayisədə çox qısa bir müddət içərisində çürüyüb yox olurlar. Oksidləşməsi çətin olan tunc kimi metallar isə digər metallarla müqayisədə daha uzun müddət qoruna bilir. Belə olan halda, tuncdan düzəldilmiş əsərlərin daha qədim tarixli olması, dəmirdən düzəldilmiş əsərlərin isə daha cavan olması son dərəcə təbiidir.

Bundan əlavə, tuncu əldə etməyi bilən bir cəmiyyətin dəmiri tanımadığını irəli sürmək, tuncu əldə edəcək biliyə və texniki materiallara malik olan bir cəmiyyətin digər metallardan istifadə etmədiyini iddia etmək məntiqli bir şərh deyil.

Tunc misə qalayın, arsenin və antimonun qatılması və bir az da sinkin əlavə edilməsi ilə əldə edilir. Tuncu əldə edən insan, əvvəlcə, mis, qalay, arsen, sink və antimon kimi elementlərin kimyəvi xassələrinə bələd olmalıdır, bunların hansı dərəcədə əridilməli olmasını bilməlidir, lazımi əritməni həyata keçirə biləcək və qarışıq əldə edə biləcək sobaya və ləvazimatlara sahib olmalıdır. Sadalanan bu məlumatlardan xəbərsiz olan bir insanın uğurlu bir qarışıq əldə etməsi olduqca çətindir.

Məsələn, mis mədənləri yaşlı və sərt qayalarda kristal və toz şəklində mineral kimi rast gəlinir. Misdən istifadə edən cəmiyyətin, əvvəlcə, qayalarda toz şəklində rast gəlinən mədəni tanıya biləcək savada sahib olması gərəkir. Daha sonra əldə etdiyi misi yerin altından çıxarmaq üçün mədən inşa etməli, xam mədəni qayadan söküb çıxarda bilməli və yerin üstünə daşıya bilməlidir. Bütün bunların daş və taxta alətlərlə icra edilə bilməyəcəyi açıqdır.

Mis mədəninin metala çevrilməsi üçün mədən alovlanan odla təmas etməlidir. Misin əridilərək ayrılması üçün lazım olan temperatur 1084.50 C dərəcə təşkil edir. Bu zaman alova hava axınını təmin edən cihaz və ya körükdən istifadə edilməlidir. Misin emalı ilə məşğul olan bir cəmiyyətin bu temperaturu ala bilməsi üçün soba düzəltməsi, bundan əlavə, bu sobada lazım olan puta, maşa kimi alətlərin də düzəldilməsi şərtdir. Burada sadəcə misin emal edilməsi üçün lazımı əsas təchizatlar qısaca verilmişdir. Daha sərt tuncun əldə edilməsi üçün misin qalay, sink və digər elementlərlə qarışdırılması isə bundan da mürəkkəb bir işdir. Çünki hər metal üçün fərqli emal üsulu tətbiq edilməlidir. Bütün bunlar metalı emal edən, qarışıqlar əldə edən, mədən çıxarma ilə məşğul olan cəmiyyətin dərin biliyə sahib olduğunu göstərir. Bu dərəcədə dərin biliyə sahib olan insanların dəmiri tapmadıqlarını iddia etmək isə məntiqli və tutarlı bir izah deyil.




***1) E.ə 10-cu minilliyə aid olan daş mozaikalar.***

***2) E.ə 11-ci minilliyə aid həvəngdəstə.***

***3) E.ə 10-cu miniliyyə aid obsidian alət.***

***4) E.ə 11-ci minilliyə aid daş əşyalar.***

***5) Mis daşı plomp vəsaitləri istifadə edilərək hazırlanmış e.ə 9-10-cu minilliyə aid olan daş əşya.***

***6) E.ə 10-cu minilliyə aid olan mismar görünüşündə plomp daş.***

***7) E.ə 10-cu minilliyə aid çəkic ucu.***

**Bu şəkildə görünən daş alətlər təxminən e.ə 10-11-ci minilliyə aiddir. Buradakı daşlardan hərhansı birini təkamülçülərin iddia etdikləri kimi daşı başqa bir daşa vuraraq düzəltməyə çalışaq. Məsələn, 4-cü şəkildə görünən daşlardakı düzgün oyuqların eyinisi düzəltəməyə çalışaq. Əlimizdəki qaya parçasına istədiyimiz qədər daşla vuraq, belə düzgün bir dəlik açа bilmərik. Bunu edə bilmək üçün polad kimi möhkəm metallardan hazırlanmış alətlər istifadə etməliyik.**

**Sağda e.ə. 8-10-cu minilliyə aid olan, muncuq kimi istifadə edildiyi güman edilən mis parçalar. Dövrün insanları mis cövhərlərini tapıb işləyə biləcək texniki struktura sahib idilər.**



Digər tərəfdən, arxeoloji tapıntılar da həmçinin təkamülçülərin qədim dövrlərdə metalın bilinmədiyi və istifadə edilmədiyi iddialarının doğru olmadığını göstərir. 100 min illik metal qab qalıqları, 2.8 milyard illik metal kürələr, 300 milyon illik olması təxmin edilən dəmir küpə, 27 min illik gil parçaları üzərində olan parça qalıntıları, maqnezium, platinium kimi Avropada bir neçə əsr əvvəl əridilməsi müvəffəq olunan metalların min illik qalıqlarındakı izləri kimi saysız tapıntı təkamülçülərin iddia etdiyi paleolit, mezolit, neolit, tunc dövrü, dəmir dövrü kimi sıralamanı alt-üst etmişdir. Bir çox elmi mediada yer alan bu tapıntıların əhəmiyyətli bir hissəsini təkamülçü alimlər ya görməzlikdən gəliblər, ya da muzeylərin zirzəmilərində

gizləmişlər. Həqiqi bəşər tarixi yerinə təkamülçülərin təxəyyülünün məhsulu olan hekayələri bəşər tarixi kimi ictimaiyyətə izah etmişlər.

## TƏKAMÜLÇÜLƏRİN AÇIQLAYA BİLMƏDİYİ MİLYONLARLA İLLİK PARÇALAR

Təkamül nəzəriyyəsinə görə canlılar müəyyən mərhələlər içində təkamülləşmiş, bakteriyadan insana qədər uzanan xəyali inkişaf ssenarisində hər şey milyonlarla il ərzində xəyali bir təkamül müddəti daxilində ortaya çıxmışdı. Bu ssenaridə insan ən son təkamülləşən canlı olmalı və son 20000 il içində inkişafını tamamlamalı idi. Lakin elmi tapıntılar və fosillər belə bir inkişafı göstərən tək sübut belə verməmiş, hətta bunun qeyri-mümkünlüyünü göstərmişdir.



**Solda - şəkildə görünən metal kürə Cənubi Afrikada milyonlarla il əvvələ aid olduğu fərz edilən bir neçə yüz kürədən biridir. Kürələrdə təbii hərhansı bir hadisə ilə meydana gəlməsi mümkün olmayan, çox incə işlənərək şəkil verilmiş novlar vardır. Bu tapıntı metalın ən qədim tarixlərdən bəri istifadə edildiyini, milyonlarla il əvvəl də insanların metal üzərində incə novlar düzəldə biləcək alətlərə sahib olduqlarını göstərir.**



**Sağda - 1912-ci ildə Oklahamadakı Thomas Böyükşəhər Elektrik fabrikində iki işçi fabrik qazanına kürəklə kömür atarkən təəccübləndirici bir tapıntı ilə qarşılaşdılar. Kömür parçalarından biri qaldırmaq üçün olduqca böyük idi, bu səbəbdən işçilərdən biri kömürü qırdı. Kömür parçasını qıranda içində dəmir bir saxsı olduğunu gördü. Saxsı kömürdən çıxarılanda, onun qəlibi iki parça içində də görünə bilirdi. Bir çox mütəxəssis saxsının ətrafındakı kömürü tədqiq etdi və saxsının təxminən 300-325 milyon il əvvəl hazırlandığını müəyyən etdilər. Bu dəmirin e.ə 1200-ci illərdə istifadə edilməyə başladığını iddia edən təkamülçülər üçün açıqlanması mümkün olmayan bir tapıntıdır.**

Bu mühüm həqiqəti göstərən digər tapıntılar isə milyonlarla il əvvəldən qalan insanlara aid istifadə vəsaitləri, alətlər və bəzək əşyalarıdır. Darvinistlər dövrümüzdən 100 milyon il əvvəl, hətta 500 milyon il əvvəl – bu tarix təkamülçülərin yer üzündə bakteriyadan başqa heç bir canlının yaşamadığını iddia etdikləri bir zamandır - yaşamış insanları xəyali təkamül sxemlərinin heç bir yerinə yerləşdirmirlər. Əlbəttə bunu etmələri qeyri-mümkündür, çünki Allah hər canlını olduğu kimi insanı da yoxdan yaratmış, "Ol" əmri ilə var etmişdir. Belə ki, bundan 100 min il əvvəl yaşamış insanlara aid tapıntıları kəşf etmək nə qədər mümkündürsə, dövrümüzdən 500 milyon il əvvələ aid insanların əsərlərini tapıb müşahidə etmək də o

qədər mümkündür. Yoxdan yaradan Allah tarixin hər dövründə istədiyi canlını var edə bilir. Əlbəttə bu üstün güc və qüdrət sahibi Allah üçün çox asandır. Darvinistlərin anlaya bilmədiyi həqiqət budur və bu səbəbdən yaradılış həqiqətini sübut edən tapıntılar qarşısında heç bir açıqlamaları yoxdur. Elmi həqiqətlərin məhv etdiyi ssnenarilərini yeniləməkdən başqa bir həll yolu tapa bilmirlər. Amma aparılan qazıntı işləri hər keçən gün getdikcə artan dəlillərlə təkamül doqmasını yox edir.


**A Relic of a By-Gone Age.**

A few days ago a powerful blast was made in the rock at Meeting House Hill, in Dorchester, a few rods south of Rev. Mr. Hall's meeting house. The blast threw out an immense mass of rock, some of the pieces weighing several tons and scattered small fragments in all directions. Among them was picked up a metallic vessel in two parts, rent assunder by the explosion. On putting the two parts together it formed a bell-shaped vessel, 4½ inches high, 6½ inches at the base 2½ inches at the top, and about an eighth of an inch in thickness. The body of this vessel resembles zinc in color, or a composition metal, in which there is a considerable portion of silver. On the sides there are six figures of a flower, or bouquet, beautifully inlaid with pure silver, and around the lower part of the vessel a vine, or wreath, inlaid also with silver. The chasing, carving, and inlaying are exquisitely done by the art of some cunning workman. This curious and unknown vessel was blown out of the solid pudding stone, fifteen feet below the surface. It is now in the possession of Mr. John Kettell. Dr. J. V. C. Smith, who has recently travelled in the East, and examined hundreds of curious domestic utensils, and has drawings of them, has never seen anything resembling this. He has taken a drawing and accurate dimensions of it, to be submitted to the scientific. There is no doubt but that this curiosity was blown out of the rock, as above stated; but will Professor Agassiz, or some other scientific man please to tell us how it came there? The matter is worthy of investigation, as there is no deception in the case.

***Scientific American*** **jurnalının 1852-ci ildə nəşr olunan 5 iyun tarixli sayında 100 min illik bir metal qab qalıqlarının olduğu xəbəri yerləşdirilmişdir. Tədqiqatlar göstərir ki, çanaq şəklindəki bu qab metal, sink və gümüşün qarışığından istifadə edilərək hazırlanmışdır. Vazın üzərində zərif çiçək buketləri, üzüm salxımı və tac naxışları işlənmişdir. Ən qədim dövrlərdə insanların metalı istifadə etmədiyi iddiasında olan təkamülçülərin bu tapıntını açıqlaya bilmələri mümkün deyil. Aydındır ki, bu əsəri meydana gətirən şəxslər metal xəlitələrini düzəldən, metalişləməni bilən, inkişaf etmiş bir mədəniyyət təcrübəsinə sahib olan insanlardır.**




**1)** Şəkildəki minomyot və çəkic 1877-ci ildə Table Mountain kömür mədənində tapılmışdır. 33 milyon illik kömür yatağında tapılan bu minomyot və çəkic insanın hər dövrdə insani bir həyat tərzi keçirdiyinin dəlillərindəndir.

**2)** Bu ayaqqabı dabanı fosili 213 milyon illik daş yatağında tapılmışdır. Bundan milyonlarla il əvvəl yaşayan insanlar ayaqqabıları ilə, paltarları ilə, yemək mədəniyyətləri ilə, social münasibətləri ilə mədəni bir həyat tərzi keçiriblər. Fosilin tək şəkli 1922-ci il tarixli bir New York qəzetində nəşr olunmuşdur. Başər tarixinin təkamülü iddiasını yalanlayan bu tapıntılar təkamülçülər tərəfindən ya gizlənir, ya da göz ardı edilir.

**3)** 3 milyon illik çınqıl daşı üzərində insan üzünə bənzər bir fiqur düzəldilmişdir. Çınqıl daşında belə düzgün deliklər aça bilmək olduqca çətin işdir. Bunun üçün sərt metaldan hazırlanmış dəlik açma alətləri istifadə edilməlidir. Təkamülçülərin iddia etdiyi kimi, son dərəcə ibtidai şərtlərdə bunun hazırlanması mümkün deyil.

## MÖMİNLƏR TARİX BOYU MƏDƏNİ HƏYAT TƏRZİ KEÇİRİBLƏR

Allah tarix boyu insanları haqq dinə dəvət edəcək elçilər göndərmişdir. İnsanların bir qismi elçilərə itaət edib Allahın varlığına və birliyinə iman etmişlər. İnsanlığın ilk var olduğu gündən etibarən insanlar bir olan Allaha imanı və haqq din əxlaqını Rəbbimizin vəhyi ilə bilib öyrənmişdir. Bilavasitə, təkamülçülərin irəli sürdüyü bir olan Allaha imanın ilk icmalara məlum olmadığı iddiası doğru deyil.

Allahın tarixin hər dövründə insanları iman etməyə və din əxlaqını yaşamağa dəvət edən elçilər göndərdiyi Quranda belə xəbər verilmişdir:

**İnsanlar tək bir ümmət idi. Allah** *(onlara)* **müjdə verən və qorxudan peyğəmbərlər göndərdi, onlarla birlikdə haqq olan kitab nazil etdi ki, insanlar arasında onların ixtilafa düşdükləri şeylərə dair hökm versin. Halbuki,** *(kitab)* **verilmiş şəxslər özlərinə açıq-aydın dəlillər gəldikdən sonra aralarındakı paxıllıq üzündən ixtilafa düşdülər. Allah isə Öz icazəsi ilə iman gətirənləri ixtilafda olduqları** *(məsələlərdə)* **haqqa yönəltdi. Allah istədiyini düz yola yönəldər.** (Bəqərə surəsi, 213)

Başqa bir ayədə də hər qövmə onlara xəbərdarlıq etmək, Allahın varlığını və birliyini xatırlatmaq, din əxlaqını yaşamağa dəvət etmək üçün bir



Tarixin hər dövründə müasir dövrdə olduğu kimi, haqq dinlər və batil inanclar mövcud olmuşdur. Tarixin hər dövründə iman edənlər Allahın əmri olan ibadətləri yerinə yetirirdilər.

elçi göndərildiyi bu cür bildirilmişdir:

**... Elə bir ümmət yoxdur ki, ona xəbərdar edən** *(bir peyğəmbər)* **gəlmiş olmasın.** (Fatir surəsi, 24)

Rəbbimizin insanlara elçilər və haqq kitablar göndərmiş olmasına baxmayaraq, bəzi insanlar bir müddət sonra öz aralarında ixtilafa düşdülər, haqq din əxlaqından uzaqlaşdılar və bəzi azğın və batil inanclara uydular. Bəziləri bütpərəst inanclar yetişdirdi, torpağa, daşa, taxtaya, Aya, Günəşə, sözdə pis ruhlara sitayiş etmək kimi azğınlığa düşdülər. Beləliklə, günümüzdə də haqq dinə inananlar olduğu kimi, hal-hazırda yollarını azaraq oda, Aya, Günəşə, taxtadan bütlərə sitayiş edənlər var. Bəziləri Allahın varlığını və tək olduğunu bilməsinə baxmayaraq, Rəbbimizə bəzi ortaqlar qoşdular. Rəbbimiz yenə onlara elçilər göndərmiş, aralarında ixtilaf düşən mövzularda haqq olan hökmü onlara bildirmiş, batil inanclarından ayrılıb haqq din əxlaqını yaşamağa onları dəvət etmişdir. Və tarixin hər mərhələsində iman edənlərlə etməyənlər, əməlisaleh möminlərlə azğın yollara uyanlar da mövcud olmuşdur.





Keçmişdə olduğu kimi dövrümüzdə də batil inanclı, bütlərə sitayiş edən insanlar yaşayır.

Tarix boyu yaşamış peyğəmbərlərlə birlikdə iman edənlər, son dərəcə mədəni şəraitdə, müasir və səviyyəli həyat tərzi keçirmişlər. Hz. Nuhun vaxtında da, Hz. İbrahimin, Hz. Yusifin, Hz. Musanın və Hz. Süleymanın dövründə də indiki kimi ictimai intizam çərçivəsində müasir həyat tərzi

yaşanmışdır. Hər mərhələdə möminlər namazlarını qılmış, oruclarını tutmuş, Allahın bildirdiyi sərhədləri qorumuş, halal və təmiz bir həyat sürmüşlər. Arxeoloji qazıntılarda əldə edilən məlumatların göstərdiyi inkişaf etmiş həyat standartlarının ən gözəlinə, ən nəcib və ən təmizinə Allaha iman edən əməlisaleh möminlər sahib olmuşlar. Yaşadıqları dövrün təmin etdiyi hər cür imkanların ən yaxşısını peyğəmbərlər və səmimi möminlər Allah rizasına uyğun olaraq istifadə etmişlər.

Nəmrud zamanında mövcud olan hər cür texnoloji inkişaf hz. İbrahim və onunla birlikdə iman edən möminlər tərəfindən ən gözəl şəkildə istifadə edilmişdir. Fironlar dövründə mövcud olan texniki biliklər hz. Yusif, hz. Musa, hz. Harun və həmin dövrdə yaşayan əməlisaleh möminlərin də xidmətində olmuşdur. Hz. Süleyman dövründə memarlıqda, incəsənətdə, rabitə sahəsində əldə edilən yüksək texnologiyadan müdrikliklə istifadə edilmişdir. Rəbbimizin Hz. Süleymana lütfü olan zənginlik və ehtişam, nəsillər boyunca heyranlıq oyatmışdır.

Unutmaq olmaz ki, bundan yüz minlərlə il bundan əvvəl yaşamış insanların da müasir xalqların da sahib olduğu hər cür bilik və imkan Allahın insanlara bir lütfüdür. Yüz minlərlə il əvvəl mədəniyyətlərini quranlar, on minlərlə il əvvəl mağara divarlarına estetik baxımdan gözəl rəsmlər çəkənlər, ehramları, zikkuratları inşa edənlər, iri daş abidələrini inşa edənlər, Amazon meşələrinin ən yüksək yerlərində iri abidələr tikənlər Allahın ilhamı və öyrətməsi ilə bu sənət əsərlərini meydana gətirmişlər. Hal-hazırda, atomun tərkib hissələrini tədqiq edənlər, kosmosa kosmik gəmilər göndərən, kompyuterdən ən effektiv şəkildə istifadə edənlər bunları Allah istədiyi üçün edə bilirlər. İnsanların var olduqları gündən bu yana sahib olduqları hər cür bilik Allahın insanlara rəhmi, qurduqları hər bir mədəniyyət Rəbbimizin əsəridir.

Allah insanı yoxdan yaratmış və ona dünya həyatı boyunca müxtəlif imkanlar və nemətlər vermişdir. Verilən hər bir nemət insan üçün bir sınaqdır. Sahib olduğu mədəniyyətin, texnologiyanın və imkanların Allahın bir lütfü olduğunu bilən, bütün bunlar üçün Rəbbimizə şükür edən qullarına Allah nemətlərini artırır:

**O zaman Rəbbiniz bildirmişdi: "Əgər şükür etsəniz, sizə** *(olan nemətimi)* **artıraram, yox əgər nankorluq etsəniz,** *(bilin ki,)* **Mənim əzabım şiddətlidir".** (İbrahim surəsi, 7)

Və Allah saleh qullarını həm dünyada, həm axirətdə gözəl şəkildə yaşadır. Quranda bu həqiqət belə xəbər verilir:

**Mömin olaraq yaxşı iş görən kişi və qadınlara, əlbəttə, gözəl həyat bəxş edəcək və etdikləri ən yaxşı əməllərə görə onları mütləq mükafatlandıracağıq.** (Nəhl surəsi, 97)

Bu ayənin bir təzahürü olaraq tarix boyu yaşayan bütün müsəlmanlar yaşadıqları dövrün ən yaxşı imkanlarına sahib olmuşlar, mədəni və gözəl həyat sürmüşlər. Əlbəttə, sınaq mühitinin zərurəti olaraq müəyyən vaxtlarda çətinliklər və sıxıntılarla da imtahan edilmişlər. Lakin bu sıxıntılar onların

mədəni və insan kimi həyat sürməməsi mənasını ifadə etmir. Allahı inkar edən, inkarında təkid edən, gözəl əxlaqla yaşamayan və yer üzündə pozğunluq törədənlərin sonu isə nə qədər varlı, rifah içində və inkişaf etmiş mədəni həyat sürsələr də, zərər olmuşdur. Bundan əlavə, bunların bir çoxu, bəlkə də, bizim cəmiyyətdən də inkişaf etmiş imkanlara sahib olan cəmiyyətlər olmuşdur. Bu həqiqət Quranda belə xəbər verilir:

**Məgər onlar yer üzündə gəzib dolaşaraq özlərindən öncəkilərin aqibətini görmədilərmi? Onlar bunlardan da güclü idilər. Onlar torpağı şumlayır, yer üzünü bunlardan daha çox abadlaşdırırdılar. Elçiləri onlara açıq-aydın möcüzələr gətirirdilər. Onlara Allah zülm etmirdi. Onlar özləri özlərinə zülm etmişdilər.** (Rum surəsi, 9)

## MƏDƏNİ TƏRƏQQİ TƏKAMÜL PROSESİNİN HƏYATA KEÇDİYİNİ GÖSTƏRMƏZ

Təkamülçülərin iddiası ilk insanların guya yarı meymun varlıqlar olduğu, müəyyən zaman içərisində fiziki qabiliyyətləri ilə birlikdə zehni qabiliyyətlərinin də inkişaf etdiyi, müəyyən bacarıqlar qazandığı, mədəniyyətin bu minvalla təkamülə uğrayaraq inkişaf etməsidir. Elmi sübutlara əsaslanmayan bu iddiaya görə, uydurma əcdadlarımız (ibtidai insanlar) heyvanabənzər həyat tərzi keçiriblər, insanlaşdıqca mədəniləşmiş və zehinləri inkişaf etdikcə mədəni irəliləyiş əldə etmişdir. Bədəni tamamilə tüklərlə örtülü, üzərində heyvan dərisi geyinmiş, ocaq qalamağa çalışan, bellərində ovladıqları heyvanlarla birlikdə çay kənarı boyu yeriyən, mağaraların içində xırıltılı səslər çıxararaq bir-biriləri ilə ünsiyyət qurmağa çalışan insan səhnə mizanı da elmilikdən uzaq iddianın ortaya atdığı hekayələrdən ibarətdir.

Fosil qeydləri bu hekayəni dəstəkləmir. Elmi məlumatların göstərdiyi nəticə insanın insan olaraq yoxdan var olduğu gündən etibarən də insana xas olan həyat tərzi keçirmiş olmasıdır. Arxeoloji tapıntılar da təkamülçülərin tərtib etdiyi xronologiyanı heç bir halda dəstəkləmir. Təkamülçülərin insanların təzə-təzə danışmağı öyrəndiklərini dedikləri dövrə aid olan arxeoloji qazıntılar həqiqətdə insanların mətbəxlərinin olduğunu, ailə həyatı sürdüklərini göstərir. Təkamülçülərin daş dövrü olaraq iddia etdikləri dövrlərdə beyin əməliyyatlarının həyata keçirildiyi meydana çıxmışdır. Yenə təkamülçülərin insanların



**Səba məlikəsinin Hz. Süleymanı ziyarət etməsini təsvir edən şəkil**

incəsənətdən bixəbər olduqlarını dedikləri dövrlərə aid qazıntılarda isə bəzək əşyaları və boya üçün xam maddələr tapılmışdı. Kitabın növbəti fəsillərində bunun kimi bir çox misal təfsilatı ilə tədqiq ediləcəkdir.



Hz. Məryəm və Əzizlər rəsmi, Giovanni Bellini, 1505 Venedik

Bütün bu misalların nümayiş etdirdiyi həqiqət tarixin heç bir dövründə ibtidai və heyvanabənzər həyat tərzinin mövcud olmamasıdır. Təkamülçülərin irəli sürdüyü kimi, daşı daşla yonaraq, daşdan taxtadan başqa heç bir alətdən istifadə etmədən mədəniyyətdən kənar bir həyat olmamışdır. Hər dövrdə iman edənlər insan kimi yaşamışdır. Hər dövrdə insana yaraşan geyimlər olmuş, insan üçün münasib boşqablar, qablar, qaşıqlar, çəngəllərdən istifadə edilmiş, insana xas mühitdə oturmuşlar, yeyib-içib söhbət etmişlər. İnsan üçün münasib olan tikililər inşa etmiş, sənət əsərlərini meydana gətirmişlər. Həkimlər, müəllimlər, dərzilər, mühəndislər, memarlar, incəsənət xadimləri olmuş, cəmiyyətdə intizam təmin edilmişdir. Ağıl və vicdan sahibi olanlar Allahın ilhamı ilə yer üzərindəki nemətlərdən ən gözəl şəkildə faydalanmışlar.

Əlbəttə ki, tarix boyunca texnoloji irəliləyiş də olmuş, insanların bilik səviyyələri artdıqca texnoloji dəyişikliklər olmuş, yaşanan mühitin şərtlərinə uyğun olaraq yeni cihazlar düzəldilmiş, elmi ixtiralar olmuş, mədəni dəyişikliklər yaşanmışdır. Lakin bəşər tarixində yaşanan bilik səviyyəsi və texnoloji tərəqqi təkamülün prosesinin yaşanmış olduğunu ifadə etmir.

Biliyin daima artması adət edilmiş haldır. Bir insanın sahib olduğu bilik səviyyəsi məktəb dövründə fərqli, universitet illərində isə tamamilə fərqlidir. Bir insanın həyatı boyu bilik səviyyəsini artırması onun təkamül prosesinin içində olması və özü-özünə yaranan təsadüflərin təsiri ilə inkişaf etmiş olması demək deyil. Buna bənzər hal insanların həyatına da tətbiq edilir. İctimai həyatda da ehtiyaclar səbəbindən yeni kəşflər, ixtiralar edilir, yeni mexanizmlər icad edilir, başqa bir insan isə həmin mexanizmləri daha da mükəmməlləşdirir. Daima mədəni tərəqqi yaşanmaqdadır. Lakin bu, təkamül prosesi demək deyil.

# SİVİLİZASİYALAR İNKİŞAF ETDİYİ KİMİ, GERİLƏYƏ DƏ BİLƏR ...

Darvinizmin iddiası insanın və bilavasitə sahib olduğu mədəniyyətin ibtidai formadan aliyə doğru inkişaf etməsidir. Lakin arxeoloji qazıntılar bəşər tarixinin ilk günlərindən etibarən cəmiyyətlərin çox qabaqcıl mədəniyyətə sahib olduğu dövrlərin olduğu kimi, çox geridə qalmış mədəniyyətlərin mövcud olduğu dövrlərin də mövcud olduğunu göstərir. Hətta əksər hallarda çox zəngin sivilizasiyalarla eyni dövrdə geridə qalmış mədəniyyətlər də olmuşdur. Tarix boyu eyni dövrdə yaşayan cəmiyyətlərin əksəriyyətinin texnoloji və sivilizasiya səviyyəsi, sosial və mədəni strukturu eynilə bugünkü gündə olduğu kimi, bir-birindən fərqlənmişdir. Məsələn, hal-hazırda Şimali Amerika qitəsi tibdə, elmdə, memarlıqda və texnologiya sahəsində olduqca inkişaf etməsinə baxmayaraq, Cənubi Amerikanın müxtəlif bölgələrində texnologiya baxımından olduqca geridə qalmış, müasir dünya ilə heç bir əlaqəsi olmayan xalqlar yaşayır. Dünyanın bir çox yerlərində xəstəliklərə ən müasir təsvirli texnika və analizlərə əsasən diaqnoz qoyularaq son dərəcə müasir şərtlərdə müalicə edildiyi halda, digər yerlərdə də xəstəliklərin guya şər qüvvələrin təsiri ilə meydana gəldiyinə inanaraq yalançı şər qüvvələri qovmaq üçün ayinlər keçirməklə müalicə edənlər var.



**21-Cİ ƏSR - KOLUMBİYA**
**(Üstdə Şəkildə:) Avstraliyalı Papou yerlisi**
**21-ci əsrdə belə batil inanclara sahib olan bir çox cəmiyyət yaşayır. Bu insanlar özlərinə heç bir fayda və ya zərər verməyə gücü çatmayan saxta ilahlara sitayiş etmək qəflətinə düşürlər. Rəsimdə Arhuaco qəbiləsinin rəhbərinin özlərinə edilən hücumların ardınca guya kömək almaq üçün keçirdiyi ayin görünür. Bu ayini təşkil etmə məqsədlərini rəhbərləri belə açıqlayır: “Dağı sakitləşdirmək üçün təbiətdəki yaşlı ruhları köməyə çağırırıq.”**
(Natinoal Geographic Türkiye, Ekim 2004)




**21-Cİ ƏSR - ABŞ, MAYAMİ**
**Dünyanın bir tərəfində insanlar “ölü ruhların dağları sakitləşdirə biləcəyinə” inanıb ibtidai şərtlərdə yaşayarkən, başqa bir tərəfdə insanlar göydələnlərdə yaşayıb, təyyarələrlə və ya lüks gəmilərlə səyahət edir, çox rahat yaşayırlar. Təkamülçülərin iddialarının əksinə, həm inkişaf etmiş, həm də inkişaf etməmiş mədəniyyətlər eyni anda mövcud ola bilir.**

E.ə. 3000 il əvvəl yaşayan şumerlər, qədim misirlilər, hindlilər kimi xalqlar hər baxımdan hal-hazırda yaşayan bu qəbilələrlə -hətta bu qəbilələrdən irəlidə olan bir çox xalqlarla- müqayisə edilməyəcək dərəcədə yüksək mədəniyyətə sahib idilər. Minlərlə il əvvəl yaşayan cəmiyyət 20-ci əsrdəki bir cəmiyyətdən daha da irəliyə gedə bilmişdir. Bu da bizə tarixin axınının təkamül prosesi içərisində meydana gəlmədiyini, yəni tarix boyu ibtidai cəmiyyətdən mədəni cəmiyyətə doğru bir irəliləyişin olmadığını göstərir.

Əlbəttə ki, tarixi proses içərisində hər sahədə böyük irəliləyişlər qeyd edilmiş, elm və texnologiyada böyük nailiyyətlər əldə olunmuşdur. Lakin bu dəyişiklikləri təkamülçülər və materialistlərin iddia etdiyi kimi, təkamül prosesi olaraq xarakterizə etmək ağıllı və elmi bir yanaşma deyil. Mədəniyyətin zənginləşməsi və təcrübə toplamaq sayəsində texnologiya və elm kimi sahələrdə daima bir irəliləyişin olması əsas məsələdir. Lakin burada vacib məqam budur ki, müasir insanla minlərlə il əvvəl yaşayan insan arasında zəka və bacarıq baxımından heç bir fərq yoxdur. 20-ci əsrdəki insanların beyin həcmi və zəkası daha çox inkişaf etdiyi üçün daha çağdaş sivilizasiyaya malik olduğumuz fikri təkamül nəzəriyyəsinin təlqin edilməsi nəticəsində əmələ gələn səhv nəzər nöqtəsidir. Halbuki, bugünkü gündə belə, müxtəlif bölgələrdə yaşayan xalqların fərqli dərrakələri və mədəniyyətləri ola bilər. Məsələn, bu gün Avstraliyadakı bir aborigenin ABŞ-dakı bir alimin sahib olduğu biliyə malik olmaması onun zəkasının və ya beyninin kifayət qədər inkişaf etmədiyini göstərmir. Çox ağıllı olmasına baxmayaraq, bu cür qəbilə içində doğulub həyatını sürdürən, hətta elektrikin varlığından belə xəbərsiz olan bir çox insan vardır. Bundan əlavə, müxtəlif əsrlərdə müxtəlif ehtiyaclar yarana bilərdi. Məsələn, hal-hazırkı dövrdə moda anlayışı ilə misirlilərin moda anlayışının eyni olmaması bizim mədəniyyətimizin onlarınkından daha mütərəqqi olduğunu göstərməz. 20-ci əsrdə mədəniyyətin əlaməti göydələnlər ikən, qədim Misir dövründə sivilizasiyanın göstəricisi ehramlar və sfinkslər idi.

**İnsanların yaşadıqları şərtlər onların ibtidai bir zehnə və inkişaf etməmiş xüsusiyyətlərə sahib olduğunu göstərmir. Hər dövrdə fərqli ehtiyaclar yaranmış, insanlar fərqli şərtlərdə yaşamışlar. Məsələn, dövrümüzün memarlıq anlayışı ilə misirlilərin memarlıq anlayışının eyni olmaması bizim mədəniyyətimizin onlarınkından daha üstün olduğunu göstərmir. 20-ci əsrdə mədəniyyətin işarəsi göydələnlərdirsə, Misir dövründə də sivilizasiyanın sübutu piramidalar və sfinkslər idi.**



Əldə edilən tapıntıları təkamülçü dünyagörüşlə qiymətləndirən bir alim o dövr haqqında bir çox açıqlama verə bilər. Lakin bu izahların elm kimi qəbul edilməsi üçün konkret tapıntılarla və məlumatlarla dəstəklənməlidir. Bugünə qədər təkamülçülərin nağıllarını dəstəkləyə biləcək tək bir elmi tapıntı belə əldə edilməmişdir. Xırıltılar çıxararaq başqa insanlarla əlaqə yaradan, mağaralarda yaşayan, heyvan dərisinə bürünərək ocaq kənarında oturan, kobud alətlərlə ov edən yarı insan, yarı meymun varlıqlar sadəcə təkamülçülərin xəyallarını əks etdirir. Elm isə insanın hər zaman insan olaraq mövcud olduğunu göstərir.

Müasir dövrdə tapdıqları fosil qalıqlarına, yonulmuş daşlara, mağara divarlarına çəkilmiş şəkillərə baxaraq həmin dövr haqqında xırdalıqları ilə şərhlər verən bəzi arxeoloqların vəziyyəti də bu misaldan çox da fərqli deyil. Buna baxmayaraq, əllərində olan dəlilləri ön mühakiməyə əsasən bir yanaşma ilə qiymətləndirərək guya ibtidai insanın demək olar ki, həyatının hər anına dair hekayələr yazan təkamülçülərin qondarma təsvir və nağılları bir çox jurnal və qəzet səhifələrini bəzəyir. Müasir dövrün məşhur təkamülçülərindən olan Luis Likin (Louis Leakey) guya ibtidai insanın məişətinə dair yazdığı ssenarilərdən biri:

*“Bir anlıq 20-30 min il qədər geriyə gedərək bir qaya sığınağında yer alan hadisələri bir-bir izləyə biləcəyimizi fərz edək: daş dövründə yaşayan bir ovçu vadidə ogünkü ovunun arxasınca düşərkən, birdən təpədəki sıldırım yarğanın yanında bir qayada sığınacaq görür. Buranın şir və ya mağara ayısının yuvası olduğunu düşünərək və ya başqa bir ailənin məskəni olma ehtimalına görə çox diqqətlə buraya qalxır. Xeyli yaxınlaşandan sonra oranın boş olduğunu görür, sonra içəri daxil olur və yaxşıca ətrafı yoxlayır. Buranın ailəsi ilə birlikdə yaşadığı kiçik sığınacaqdan qat-qat əlverişli olduğu qənaətinə gələn ovçu ailəsinin digər üzvlərini buraya gətirməyə gedir. Bundan sonra isə ailənin yeni evlərinə gələrək yerləşdiklərini görərik. Bu təzə evin ocağı, ya çox böyük ehtimalla əvvəlki evdən gətirilən bir neçə köz parçasından və yaxud da iki taxta parçasının bir-birinə sürtülməsi ilə əldə edilir. (Daş dövründə insanın*



**Əldə edilən tapıntıları təkamülçü ön mühakimə ilə dəyərləndirən bir alim həmin dövr haqqında bir çox şərhləri verə bilər. Lakin bu şərhlərin elmi qəbul edilməsi üçün onlar dəqiq tapıntı və sübutlarla əsaslandırılmalıdır. Bu günə qədər təkamülçülərin nağıllarını dəstəkləyə biləcək tək bir elmi tapıntı belə əldə edilməmişdir. Xırıltı çıxararaq ünsiyyət quran, mağaralarda yaşayan, dəri geyinib ocaq ətrafında oturan, kobud alətlərlə ov etdiyi təsvir edilən yarı insan, yarı meymun varlıqlar sadəcə təkamülçülərin xəyallarını əks etdirir. Elm isə insanın hər zaman insan olaraq yaşadığını göstərir.**

*odu necə əldə etdiyi tamlığı ilə bilinməsə də, ən qədim dövrlərdən bəri oddan istifadə etdikləri və ondan yararlandıqları faktdır. Belə ki, mağara və qaya sığınacaqlarındakı, demək olar ki, bütün məskən laylarında ocaqlara məişətin bir hissəsi olaraq rast gəlinir). Bəlkə bundan sonra ailənin bəzi fərdləri yataq hazırlamaq üçün ot yığmağa gedəcəkdir. Ailənin digər fərdləri isə ətrafdakı tikanlı kol və kolluqdan budaq qıraraq məskən saldıqları bu yeni evin önünə böyük bir çəpər hörərlər. Bu müddət ərzində evin əşyaları yerləşdirilir və müxtəlif heyvan dəriləri gətirib yerə sərilir. Bunda sonra ailə təzə evlərinə yerləşmiş olurlar. Qida ehtiyacı üçün kişilər vəhşi heyvanları ovlayırlar. Qadınlar ov zamanı kişilərə kömək etdikləri kimi, yeməli meyvələri, qabıqlı meyvələri və kök yığmaqla məşğul olurlar".*

(L.S.B.Leakey, İnsanın Ataları, Türk Tarih Kurumu Yayınları: Ankara, 1988, sf.8)

Ən kiçik xırdalıqlara qədər təsvir edilən bu ssenari hər hansı bir elmi tapıntıya deyil, tamamilə müəllifin təxəyyülünə əsaslanır. Bu və buna bənzər hekayələri bir sıra elmi sözlərlə bəzəyib təqdim edən təkamülçülər bir neçə sümük parçasına əsasən, bütün bu xırdalıqları formalaşdırmışlar. (Bundan əlavə, tapılmış bu fosillər, təkamülçülərin iddialarının tamamilə əksini göstərir, təkamül prosesinin əsla yaşanmadığını sübut edir.) Halbuki, sümük parçalarının qədim dövrlərdə yaşamış insanların hansı hisslərlə hərəkət etdiklərinə, gündəlik məişətlərində nələr etdiklərinə, aralarındakı iş bölümünün hansı formada olmasına dair dəqiq məlumat verməyəcəyi açıq görünür. Lakin buna bənzər uydurma ssenarilər və şəkillərlə zənginləşən insanın təkamülü nağılı, təkamülçülər tərəfindən çox tez-tez istifadə edilir. Təkamül nəzəriyyəsinin təqdim edildiyi ilk gündən etibarən bu doqmadan yaxa qurtara bilməyən saysız hesabsız təkamülçü yuxarıdakı ssenarinin müxtəlif versiyalarını irəli sürmüşdür. Məqsəd isə həqiqətləri izah etmək deyil, insanlara təlqin və təbliğ yolu ilə ibtidai insanın yaşadığına inandırmaqdır.

Təkamülçü alimlər əllərində heç bir dəlil olmadan bu cür ssenarilər uyduraraq öz iddialarını sübut etməyə çalışsalar belə, rast gəldikləri hər tapıntı tərəfsiz olaraq qiymətləndirilmədiyi zaman onlara bəzi həqiqətləri çox açıq şəkildə göstərir. Bunlardan biri odur ki, insan mövcud olduğu ilk gündən insandır. İnsanın zəkası, sənətkarlıq və estetik bacarığı kimi xüsusiyyətləri tarixin hər bir dövründə eyni olmuşdur. Keçmişdə də təkamülçülərin iddia etdikləri kimi ibtidai, yarı heyvan yarı insan olan məxluqlar deyil, bizim kimi düşünən, danışan, sənət əsərləri meydana gətirən, mədəni və əxlaqa sahib olan insanlar yaşamışdır. Kitabda bundan sonra da bəhs edəcəyimiz kimi, arxeoloji və paleontoloji tapıntılar dəqiq və açıq bir şəkildə bu həqiqəti sübut edir.

# GİZLƏNƏN ƏSL TARİX

Tarix haqqında öyrəndiklərimiz yalnız kitablardan oxuduqlarımızdır. İnsanların çox böyük əksəriyyəti bu kitablarda yazılanlardan heç vaxt şübhələnmir və demək olar ki, hərkəs bu məlumatları dərhal qəbul edir. Lakin xüsusilə insanın tarixindən söhbət gedəndə, bizə təqdim olunan tarix anlayışını bir daha nəzərdən keçirmək lazımdır. Çünki bu anlayış dövrümüzdə biologiya, molekulyar biologiya, paleontologiya, genetika, biogenetika, antropologiya kimi bir çox elm sahəsinə görə heç bir etibarlılığı olmayan bir nəzəriyyəyə, təkamül nəzəriyyəsinə görə formalaşır. Təkamül nəzəriyyəsinin elmi olaraq çökməsi ilə birlikdə bu nəzəriyyəyə görə təşkil olunmuş tarix anlayışı da çökmüşdür.

Tarixçi Edward A. Freeman tarix məlumatlarımızın həqiqətləri nə qədər əks etdirdiyi mövzusunda bunları ifadə edir:

*Bütün tarixi tədqiqatlarda üz-üzə gəldiyimiz həqiqətlər insana aid istəklərin yönləndirməsi istiqamətində ortaya çıxmışdır və sübutlar məlumatı ötürənlərin etibarlı olmalarına bağlıdır. Bu şəxslər şüurlu olaraq aldada bilər, ya da pis niyyət olmadan yanlış yönləndirə bilərlər. Bir insan yalan söyləyə bilər, səhv edə bilər.*

Bu vəziyyətdə bizə ötürülən tarixin doğruluğundan necə əmin ola bilərik?

Bunun üçün tarixçilərin və arxeoloqların bizə təqdim etdikləri tarixi məlumatların obyektivliyindən və dəqiqliyindən əmin olmalıyıq. Çünki tarix hər düşüncədən insan üçün fərqli bir məna daşıyır. Bir hadisə məlumat verən şəxsə və onun dünyagörüşünə görə fərqlilik göstərə bilər. Hadisələr xüsusilə şahid olmamış şəxslər tərəfindən izah olunanda tamam fərqli bir görüntü ala bilər.

Tarix "keçmiş hadisələrin xoronoloji şəkildə qeyd edilməsi ilə təqdim olunur. Bu hadisələrə verilən məna və əhəmiyyət " tarixçinin" təqdim etmə tərzinə bağlıdır. Belə ki, bir müharibənin tarixini yazan şəxsən, müharibəni qazanan tərəfin haqlı və ya haqsız olduğunu düşünməsi verdiyi məlumata təsir edə bilər. Həmin tarixçinin simpatiya duyduğu cəmiyyət digər tərəfin



**II Dünya Müharibəsindən yazan bir tarixçi əgər nasional sosialist bir dünyagörüşə sahibdirsə, sadəcə soldakı şəkli müşahidə edərək Hitleri bir qəhrəman olaraq tanıda bilər. Halbuki soldakı şəkildə Buchenwald toplama düşərgəsində Hitlerin səbəb olduğu qırğınlardan sadəcə bir örnək görünür.**

bölgəsini işğal etmiş və saysız qəddarlıq etmiş olsa belə, bu tarixçi onu “qəhrəman” olaraq təqdim edə bilər. Məsələn, bir-birinə düşmən olan iki ölkənin tarix kitablarına baxsaq, bu kitablarda eyni tarixi hadisələrin tamamilə fərqli baxımdan izah olunduğunu görərik.

Dövrümüzdə təkamül tərəfdarı olan tarixçilərin və alimlərin etdikləri də tam olaraq budur: Bioloji və tarixi baxımdan konkret bir dəlilə əsaslanmamasına baxmayaraq, insanın “təkamül tarixi, cəmiyyətə adətən qəti həqiqət olaraq təqdim olunur. Nəzəriyyəni sarsıdan güclü dəlillər göz ardı edilir, əldə edilən tapıntılar tamamilə bu alimlərin önmühakimələri istiqamətində izah olunur, bəzi alimlərin ideologiya olaraq sahib çıxdıqları nəzəriyyə adətən bir qanun kimi tanıdılmağa çalışılır.

## MƏDƏNİYYƏTİMİZDƏN GERİ NƏ QALACAQ?

Bugünkü gündə sahib olduğumuz nəhəng sivilizasiyadan bundan yüz minlərlə il sonra geriyə nə qalacağını düşünün. Minlərlə ilin mədəni irsi, rəsm əsərləri, heykəltəraşlıq nümunələri, saraylar yox olacaq, texnologiyaya aid demək olar ki heç bir iz qalmayacaq. Xüsusi olaraq eroziyaya davamlı istehsal edilən bir çox material belə müəyyən bir müddət ərzində -təbii şəraitdə- aşınmaya başlayacaqdır. Bütün materialların müəyyən müddətdən sonra bərpaya ehtiyacı olur, belə ki, polad paslanır, beton aşınır, torpaq altında qurğular çürüyür. Həm də bunların üstündən minlərlə il keçdiyini, minlərlə ton yağışa, şiddətli küləyə, selə, zəlzələyə məruz qaldıqlarını düşünün. Bəlkə də geriyə qalan eyni keçmişdən bizə qalan sadəcə işlənmiş iri daş parçaları, binaların tikildiyi blok daşlar və bəzi heykəl qalıntıları olacaqdır. Və yaxud müasir dövrün inkişaf etmiş sivilizasiyasından geriyə gündəlik həyatımızı tam anlaya biləcəkləri bir iz qalmadığı halda, Afrikada, Avstraliyada yaşayan qəbilələrdən bəzi izlər qalacaq. Yəni sahib olduğumuz texnologiyanın (televizor, kompyuter, mikrodalğalı sobalar və s.) izləri qalmayacaq, lakin bəlkə də daş bir binanın ana xətləri, böyük bir heykəlin parçaları qalacaqdır. Həmin dövrdə alimlər bu izlərə baxaraq bizim yaşadığımız dövrdəki bütün cəmiyyətləri mədəni cəhətdən geridə qalmış kimi təqdim edərlərsə, bu, həqiqətən də, nə qədər həqiqətdən uzaqlaşmış olduqlarını göstərməzmi?

Və yaxud da bundan minlərlə il sonra üzərində Çin dilində yazıları olan bir əsəri tapan bir şəxs sadəcə bu məlumata əsaslanaraq, çinlilərin qəribə işarələrlə ünsiyyət quran, geridə qalmış bir növ olduğunu irəli sürərsə, bunun həqiqəti əks etdirməyən şərh olduğu açıq deyilmi? Və yaxud da belə bir misal verək: Rodenin “Mütəfəkkir” adlı heykəli bütün dünyada məşhurdur. Bu heykəlin on minlərlə il sonra gələcəyin arxeoloqları tərəfindən tapıldığını fərz edək. Əgər tədqiqatçıların nəzərdə tutulan cəmiyyətin inancı və yaşayışı barədə ön mühakiməli fikirləri varsa və əllərində kifayət qədər tarixi sübut yoxdursa, bu heykələ müxtəlif formalarda şərh verə bilərlər. Həmin cəmiyyətdə yaşamış insanların düşünən bir şəxsə sitayiş etdiklərini hesab edə bilərlər və ya bu heykəlin mifologiyada olan guya bir tanrıya aid olduğunu iddia edə bilərlər. Lakin bu gün biz bilirik ki, “Mütəfəkkir” heykəli sadəcə

olaraq incəsənət naminə ərsəyə gələn bir sənət əsəridir. Yəni günümüzdən on minlərlə il sonra yaşayan bir tədqiqatçının əlindəki məlumatlar kifayət qədər deyilsə və bundan əlavə, həmin dövrə aid ön mühakiməli fikirləri varsa, həqiqətləri görə bilməsi imkansız olacaq. Bu səbəbdən də bu heykəli sahib olduğu ön mühakiməyə görə qiymətləndirəcək və zehnində buna uyğun olan bir ssenari uyduracaq. Buna görə də əldə edilən sübutların ön mühakiməsiz və tərəfsiz mövqedən qiymətləndirilməsi, hər tərəfli düşünərək hərəkət edilməsi olduqca vacibdir. Unutmamalıyıq ki, bu gün əlimizdə cəmiyyətlərin təkamülünə, ya da keçmiş cəmiyyətlərin ibtidai olmasına dair heç bir dəlil mövcud deyil. Onların irəli sürdükləri sadəcə fərziyyələrdən ibarətdir və təkamül ideyasını müdafiə edən tarixçilərin və yaxud da arxeoloqların qərəzli şərhlərinə əsaslanır. Məsələn, bir mağara divarına çəkilmiş heyvan fiqurları həmin ibtidai insanın çəkdiyi ibtidai şəkillər kimi təqdim edilmişdir. Halbuki, bu şəkillər həmin dövrün incəsənət xadimlərinin incəsənət haqqında anlayışını ifadə edə bilərdi. Yaşadığı dövrün şərtlərinə görə olduqca müasir geyimdə olan bir sənətçi yalnız incəsənət naminə bu rəsmləri çəkmiş ola bilər. Bundan başqa, bir çox alim sözügedən mağara rəsmlərini ibtidai bir zehnin məhsulu olmasının imkansız olduğunu vurğulayır.




**İL 2000**
**Təkamülçü dünyagörüşlə hərəkət edən bəzi arxeoloqlar dövrümüzün sənət əsərlərindən, məsələn Rodinin heykəlindən heç də geri qalmayan, sənət dəyəri olan Cənubi Fransada Pirenelerin şimal ətəklərindəki Tuc d'Audoubert mağarasındakı bizon heykəllərini ibtidai insanların düzəltdiklərini önə sürürlər. Lakin istifadə edilən texnika və əsərin estetik görünüşü bu əsəri yaradanın zehni və fiziki olaraq dövrümüzün insanından fərqlənmədiyini göstərir.**

**İL 8000**
**Bundan 6000 il sonra yaşayan insanlar Rodinin "Düşünən İnsan" heykəlini tapsalar və dövrümüzdəki bəzi alimlər kimi ön mühakimə ilə hərəkət edərək, 20-ci yüzillikdə yaşayan insanlar haqqında bu insanların "düşünən bir insana sitayiş etdiklərini", hələ sosiallaşmadıqlarını və s. iddia etsələr, bu iddiaların həqiqəti nə qədər təkzib edəcəyini göstərməz?**

Başqa bir misal, iti uclu daşların guya meymun-insan tərəfindən düzəldilmiş ilk alətlər olduğu irəli sürülmüşdür. Həmin dövrün insanları bu daşları formaya salaraq dekorativ məqsədlə də istifadə edə bilərdi. Mövcud olan parçaların, həmin dövrün insanları tərəfindən mütləq alət kimi istifadə etdiklərini göstərən bir dəlil yoxdur. Bu, bir fərziyyədir. Təkamülçü alimlər

qazıntılar zamanı tapdıqları dəlilləri qərəzli mövqedən çıxış edərək araşdırmış, öz mülahizələrinə uyğun olaraq nəzəriyyəni sübut etmək üçün fosillərin üzərində dəyişikliklər aparmış və ya sadəcə uyğun hesab edilənləri götürərək digərlərini bir kənara atmışlar. Eyni oyun tarixin təkamülə məruz qaldığını göstərmək üçün də oynanılmışdı. (Abram Kardiner, Posthumous Essays by Branislau Malinowski isimli yazının özeti, Scientific American, June 1918, sf.58) Amerikalı antropoloq Melvill Herskovits "tarixin təkamülü" görüşünün meydana gəlmə formasını və təkamülçülərin sübutları dəyərləndirmə qaydasını belə açıqlamışdır:

*Mədəni təkamülü müdafiə edən hər bir tədqiqatçı beynində canlandırdığı insan irqinin inkişafı ilə bağlı fərziyyə səhnə mizanı yaratmışdır. Bu səbəbdən, eyni təkamül nəzəriyyəsində şüurlu seçilən kəllə sümüklərində olduğu kimi, burada da bir-birinin ardından gələn hadisələr misal olaraq götürülməyib. Qeyd edilən nailiyyətlərin çoxu bir mədəniyyətin sadəcə bir istiqamətini göstərir.* (Melville Herskovits, Man and His Works, Knopf: NY, 1950, sf. 467)

Herskovitsin bu fikirlərini təsdiq edən ən vacib misallardan biri təkamülçü etnoqraf Luis Henri Morqanın apardığı işlərdən biridir. Morqan sadədən mürəkkəbə doğru təkamül prosesinin baş verdiyini iddia etdiyi bir cəmiyyətin patriarxat və monoqam quruluşa çatmaq üçün keçirdiyi mərhələləri tədqiq etmişdir. Lakin bu araşdırmanı apararkən dünyanın dörd tərəfindən olan, bir-biriləri ilə heç bir əlaqəsi olmayan müxtəlif cəmiyyətləri misal olaraq götürmüş, almaq istədiyi nəticəyə görə bu cəmiyyətləri sıralamışdır. Yüz minlərlə mədəniyyət içində niyə məhz sadəcə nəzəriyyəsinə uyğun olan cəmiyyətləri seçdiyi açıq aydın görünür. Herskovits, Morqanın mülahizəsinə görə tarixi necə yenidən şərh etdiyini belə izah edir:

*Morqan tarixdə soyu müəyyən edən patriarxat və monoqam sistemə hansı yollarla keçildiyini izah edərkən, ilk olaraq, Avstraliyadakı ibtidai qəbilələrdəki matriarxat sistemi götürmüş, daha sonra Amerikadakı qırmızıdərililərə keçərək burada nəsli müəyyən edən amilin kişinin olduğunu misal göstərmiş, daha sonra isə tarixdən əvvəlki dövrün ilk mərhələlərində ata xaqan, daha çox monoqam yunan qəbilələrini sosial təkamül zəncirinə əlavə etmiş, son olaraq da monoqam, ata xaqan cəmiyyət olaraq günümüzün mədəniyyətini göstərib təkamül zəncirini düzəltmişdi.*

(Melville Herskovits, Man and His Works, Knopf: NY, 1950, sf.476)

Herskovits, Morqanın bu xəyali zəncirini: "Bu sıralama tarixi yanaşma baxımından uydurmadır", -deyə təqdim etmişdir.

## ON MİNLƏRLƏ İL SONRA GERİYƏ QALACAQLAR...

İnşaatda, sənayedə, texnoloji məhsullarda, dekorasiyada, gündəlik həyatın bir çox sahəsində sıx-sıx istifadə edilə bilən maddələrin ömrü bəşər tarixi ilə müqayisə olunanda olduqda məhduddur. Bundan on minlərlə il əvvəlki insanlar estetik taxta mənzillərdə yaşayırdılarsa, geriyə bunu göstərəcək çoxlu dəlil qalmaması çox normaldır. Bizim mədəniyyətimizin də hərhansı böyük bir fəlakətlə yox olduğunu fərz edək, bundan yüz minlərlə il sonra görəsən nələr qalacaq? Gələcəkdə insanlar əldə edəcəkləri bir neçə

sümük və daş parçasına əsaslanaraq bizləri ibtidai varlıqlar kimi qələmə versələr, bu izah həqiqəti əks etdirərmi?



**Şəkillərdə görünən dövrümüzün daş evlərinin bundan on minlərlə il sonrakı görüntülərin Çatalhöyükdəki qazıntılarda ortaya çıxarılan xarabalardan fərqsiz olacağı aydındır. Təbii şərtlər altında əvvəl taxta, sonra metallar çürüyərək və ehtimalla geriyə sadəcə daş divarlar, blok daşlar, kasa və saxsılardan parçalar qalacaq. Bu vəziyyətdə dövrün arxeoloqlarının 2000-ci illərdə insanların ibtidai həyat tərzi keçirdiklərini iddia etmələrinin həqiqəti əks etdirməyəcəyi aydındır. Dövrümüzdə təkamülçülərin yaşadıqları vəziyyət bundan fərqli deyil.**

Dövrümüzdəki hərhansı bir binadan on minlərlə il sonra geriyə sadəcə bir neçə blok daş parçası qalacaq. Taxta vəsaitlər, metallar, dəmirdən hazırlanmış əşyalar çürüyəcək. Çırağan sarayından geriyə nə sarayın divarlarındakı bəzəkli şəkillər, nə estetik mobil əşyalar, nə dəbdəbəli pərdələr, nə pərdələrin asıldığı karnizlər, nə xalılar, nə çilçıraqlar, nə də ki digər vəsaitlər qalar. Bu vəsaitlər çürüyüb yox olar. Bundan on minlərlə il sonra Çırağan Sarayının qalıqlarını tapan şəxslər sadəcə bir neçə parça işlənmiş sütun, böyük parça daş və bəlkə də sarayın bəzi təməllərini görəcəklər. Bunlara baxaraq, dövrümüzdə yaşayan insanların hələ yeni oturaq həyata keçdiklərini, o səbəbdən iri daşları üst-üstə qoyaraq ibtidai evə bənzər yerlərdə yaşadıqlarını, yeni sosiallaşdıqlarını önə sürsələr, bunun son dərəcə yanlış bir açıqlama olacağı aydındır.

Keçmişdən dövrümüzə qalan qalıqlar da eynilə Çırağan sarayı kimi son dərəcə estetik binaların izləri ola bilər. Bu qalıqların üzərinə mebellər yerləşdirilsə, pərdələr, xalılar və çilçıraqlarla bəzədilsə, ortaya çox möhtəşəm binalar çıxar.

Quranda da keçmişdə yaşamış qövmlərin sənət, memarlıq, mədəniyyət və elmi inkişaf etmiş cəmiyyətlər olduqları xəbər verilmişdir. Bir ayədə keçmiş cəmiyyətlərin qüvvət və əsər baxımından üstün olduqları belə bildirilir:

**Məgər onlar yer üzündə gəzib-dolaşıb özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmədilərmi? Onlar bunlardan daha qüvvətli idilər və yer üzündə daha çox iz qoymuşdular...** (Ğafir surəsi, 21)



**Çırağan Sarayının yanmış, içəridəki dizayn və dekorasiyasının məhv olmuş halıdır. Sarayı bu halı ilə qiymətləndirən bir şəxs nə zamansa bunun çox ehtişamlı olduğunu tam olaraq gözündə canlandırmaya bilər.**

**Çırağan sarayının bərpa edilib, dekorasiyasının tamamlanmış halı.**

# 1.5 MİLYON İL ƏVVƏL YAŞAYAN İNSANLAR DA YAŞLILARI QORUYUB MÜDAFİƏ EDİRDİLƏR

2005-ci ildə Gürcüstanın Dmanisi şəhərində tapılan fosil, bəşər tarixinin təkamül ssenarisinin, reallığı əks etdirmədiyini bir daha ortaya qoydu. Təkamülçülərin elmdən kənar iddialarına görə, ilk insanlar eqoist və heyvani bir həyat sürmüşlər. Onların nə ailə həyatı, nə də sosial nizamı var idi. Arxeoloq David Lordkipanidzenin tapdığı yaşlı bir insana aid kəllə fosili bu iddiaların doğru olmadığını göstərdi.



***Discover*** **jurnalı ilin mühüm elmi nailiyyətlərini qiymətləndirdiyi xüsusi sayında təkamülçülərin ssenarisini darmadağın edən əhəmiyyətli bir tapıntıya yer verdi. Milyonlarla il əvvəl də insanların xəstələrə baxdıqlarını, onlara maraq göstərdiklərini ortaya qoyan bu tapıntı "Homo Erectus" ailə böyüklərinə maraqmı göstərirdi?" başlığı ilə nəşr olundu. Bu fosilin ortaya qoyduğu həqiqət odur ki, tarixin heç bir dövründə insanların heyvani həyat yaşamayıblar, insanlar həmişə insan kimi yaşayıblar.**

Tapılan fosil, yaşlı bir insana aid idi və tək dişdən başqa heç bir dişi yox idi. Alimlər, bu insanın tək xəstəliyinin dişlərinin əskikliyi olmadığını, həm də başqa xəstəliklərinin olduğunu da düşünməkdədirlər. Bu insanın dişlərini itirməsinə və xəstəliklərinə rəğmən, qocalığa qədər yaşaması, yaşadığı cəmiyyətdə ona qayğı və ona maraq göstərildiyini sübut edən əhəmiyyətli bir məlumatdır. Fosili tapan arxeoloq Lordkipanidze də mövzu ilə bağlı bunları söyləməkdədir:

"Bu şəxsin xəstə biri olduğu aydındır. Bunun, xəstə şəxslərin cəmiyyətin digər üzvləri tərəfindən baxıldığını göstərən önəmli bir örnək olduğunu düşünürük." (Claire Imber, "Ape-Man: Origin of Sophistication," BBC News, 22 February 2000, online at http://news.bbc.co.uk/1/hi/sci/tech/650095.stm)

Təkamülçülər, fosilin yaşadığı tarixdən ən az 1,5 milyon il sonra insanların sosial olaraq inkişaf etdiyini və mədəni davranışlar göstərdiyini iddia edirlər. Sözügedən fosil təkamülçülərin bu iddialarını təkzib edir. Onu göstərir ki, milyonlarla il əvvəl insanlar xəstələrə şəfqət, mərhəmət və diqqət göstərmiş, onlara qayğı göstərmiş, onları qorumuşlar. Bu tapıntı bir daha göstərir ki, insanlar tarixin heç bir dövründə heyvan həyatı yaşamamış, həmişə insancasına yaşamışlar.

## MAĞARALARDA İNKİŞAF ETMİŞ İNCƏSƏNƏT



**Lascauxdaki mağaralarda tapılan rəsimlərdən bir nümunə. Bu rəsmin "meymunluqdan xilas olmamış ibtidai bir insan məhsulu olmadığı aydındır.**

Təkamülçülər guya meymunabənzər insanların Avropada bundan təqribən 30-40 min il əvvəl, Afrikada bir az daha qədim dövrdə ani keçid dövrü yaşadıqlarını, beləliklə də, birdən-birə müasir insanlar kimi düşünmək və istehsal etmək qabiliyyəti qazandıqlarını irəli sürürlər. Çünki həmin dövrə aid arxeoloji tapıntılar təkamül nəzəriyyəsi ilə açıqlanması mümkün olmayan dəlillərdir. Darvinist bir iddiaya görə, təxminən 200 min il ərzində dəyişməmiş qalan daş alət texnologiyasının yerini birdən birə daha inkişaf etmiş və sürətlə inkişaf edən əl sənəti texnologiyası tutmuşdur. Guya bir müddət əvvəl ağacdan yerə düşən və müasirləşməyə başlayan xəyali ibtidai insan birdən-birə mahir qabiliyyətlər əldə etmiş, mağara divarlarını oyaraq və ya rəngləyərək heyranedici rəsmlər çəkməyə başlamış, boyunbağı, gərdənlik kimi olduqca estetik bəzək əşyaları düzəltmişlər. Bəs nə oldu ki, belə bir inkişaf yarandı? "Yarı meymun ibtidai varlıqlar" hansı səbəbdən və necə birdən birə incəsənətə meyil göstərdi? Təkamülçü alimlər bunun necə

həyata keçdiyini heç bir yolla izah edə bilməzlər, lakin bir neçə fərziyyə irəli sürürlər. Təkamülçü Rocer Levin (Roger Lewin) darvinistlərin bu mövzuda keçirdiyi sıxıntını "Müasir insanın mənşəyi" kitabında bu sözlərlə ifadə edir: *"Hələ də natamam olan arxeoloji qeydlərin hər baxımdan qeyri-müəyyən olmasına baxmayaraq, alimlər bu sualı fərqli şəkildə cavablandırırlar".*

(Roger Lewin, The Origin of Modern Humans, W.H. Freeman and Company, New York, 1993, sf. 148)

Arxeoloji tapıntıların göstərdiyi həqiqət isə insanın var olduğu gündən etibarən mədəni anlayışa sahib olmasıdır. Bu anlayış çərçivəsində bəzən inkişaf, bəzən kəskin dəyişikliklərin baş verməsi mümkündür. Lakin bu təkamül prosesinin baş verməsi deyil, mədəni bir inkişafın və dəyişikliyin baş verdiyi mənasını ifadə edir. Təkamülçülərin "ani dəyişiklik" kimi adlandırdıqları incəsənət əsərlərin ortaya çıxması da bioloji (xüsusən də zehni qabiliyyət) kimi insanın inkişafını göstərən bir vəziyyət deyil. Həmin dövrdə yaşayan insanlar bəzi ictimai dəyişikliklərə məruz qalmış ola bilər, incəsənət və istehsal anlayışları dəyişmiş ola bilər, lakin bu məlumatlar insanın ibtidaidən müasirliyə keçid yolu keçdiyini göstərən dəlillər deyil.

Qədim insanların özlərindən sonra qoyduqları arxeoloji izlərlə təkamülçülərə görə mövcud olmalı anatomik və bioloji izlərin bir-biriləri ilə uyğunsuzluğu da darvinizmin bu mövzudakı iddialarını bir daha əsassız edir. Təkamülçü iddiaya görə, insanın mədəni inkişafı bioloji inkişafı ilə düz mütənasib olmalıdır. Məsələn, insanlar əvvəlcə sadə cizgilər vasitəsi ilə sənətkarlıq qabiliyyətlərini nümayiş etdirməli, daha sonra isə həmin cizgilər daha da inkişaf etməli, bu cizgilər yavaş-yavaş inkişaf edərək sənətkarlığın zirvəsinə ucalmalıdır. Halbuki, bəşər tarixinə aid tapılmış ilk sənət izləri bu fərziyyəni bünövrəsindən zədələyir. Sənətkarlıq tarixinin ilk nümunələri kimi qəbul edilən mağara rəsmləri, oymaları və qayaüstü relyeflər həmin dövrdə yaşayan insanın çox yüksək səviyyəli sənətkarlıq qabiliyyətinə sahib olduğunu göstərir. Mağaralarda tədqiqatlar aparan alimlər həmin rəsmləri incəsənət tarixinin ən əhəmiyyətli və dəyərli işlərindən biri olaraq dəyərləndirir. Rəsmlərdəki kölgə effektləri, perspektiv təsvirdən istifadə və zərif cizgilər, relyeflərdə ustalıqla əks etdirilən dərinlik hissi, oymalarda günəş işığının düşməsi ilə meydana gələn oynamalar, təkamülçülərin izah edə bilməyəcəyi xüsusiyyətlərdir. Çünki bunlar darvinist iddiaya görə, çox sonrakı dövrdə meydana gəlməli bir tərəqqidir.

Fransa, İspaniya, İtaliya, Çin, Hindistan və Afrikanın müxtəlif bölgələrində, bir sözlə, dünyanın müxtəlif yerlərində tapılan bir çox mağara rəsmi qədim insanın mədəni səviyyəsi haqqında çox vacib məlumatları təqdim edir. Bu rəsmlərdə istifadə edilən üslub və boya texnikası tədqiqatçıları çaşdıracaq keyfiyyət və üstünlüyə malikdir. Darvinist alimlər bu rəsmləri ön mühakimə ilə qiymətləndirir, çaşqınlıq içərisində olmalarına baxmayaraq, sözü gedən əsərləri təkamül hekayələrini bəzəmək üçün qərəzli bir şəkildə şərh edirlər. Müasir insanın bədən quruluşuna sahib olmayan varlıqların olduqca ibtidai şərtlər daxilində yaşadıqları mağaralarda qorxduqları və ya ovladıqları heyvanların şəkillərini çəkdiklərini bildirirlər. Halbuki, bu əsərlərdə istifadə edilən texnikalar sözü gedən şəkli çəkən

sənətkarların çox dərin bir qavrayışa, qavradıqlarını təsiredici bir şəkildə əks etdirmək qabiliyyətinə sahib olduqlarını göstərir. İstifadə edilən rəngləmə texnikası isə heç də təxmin edildiyi kimi ibtidai bir şəraitdə yaşamadıqlarının başqa bir göstəricisidir. Bundan əlavə, mağara divarlarına çəkilmiş bu şəkillər dövrün insanlarının mağaralarda yaşadığını göstərən bir dəlil deyil. Bu əsərləri meydana gətirən sənətkarlar yaxınlıqda bir evdə yaşaya, lakin əsərlərini sözü gedən mağara divarlarında çəkməyi üstün tutmuş ola bilərdi. Nəyi çəkəcəyini hansı hiss və düşüncə ilə seçəcəyi isə sənətkara məlumdur. Belə rəsmlər üzrə bir çox şərh verilə bilər, lakin veriləcək şərhlərdən həqiqətə ən çox zidd olanı isə onların ibtidailikdən təzəcə çıxmış varlıqlar tərəfindən çəkilmiş olmalarıdır. Bundan əlavə, BBC-nin internet vasitəsi ilə yayımlanan elmi səhifəsində yer alan 22 fevral, 2000-ci il tarixli xəbərdə mağara rəsmləri ilə əlaqədar olaraq aşağıdakı sətirlər dərc edilmişdir:

*Bunların ibtidai insanlar tərəfindən çəkildiyi güman edilirdi... Lakin iki alimin apardığı araşdırmalara görə, antik rəssamlarla bağlı bu qənaət tamamilə yanlışdır. Onlar bu şəkillərin mürəkkəb olduğunu və müasir cəmiyyətin dəlilləri olduğunu düşünürlər.* <u>(BBC News, 22 Fevral 2000)</u>



**Ortada:** **Pipolu insan, Pablo Picasso**
**Solda:** **Qəzəbli At, Salvador Dali**
**Sağda:** **Saat Patlaması, Salvador Dali**
**Altda:** **Gitara, Pablo Picasso**

**Dövrümüzün sənət anlayışı gələcək nəsillər tərəfindən ön mühakimə ilə qiymətləndirilsə, cəmiyyətimizlə bağlı çox fərqli qənaətlər yarana bilər. Gələcəyin təkamülçüləri Pablo Picassonun, Salvador Dalinin və ya başqa rəssamların əsərlərinə baxaraq, dövrümüzün insanlarının da ibtidai olduqlarını önə sürə bilərlər. Amma bu heç bir şəkildə həqiqəti əks etdirməyən bir izah olar.**

Müasir incəsənət anlayışının bir sıra əsəri də minlərlə il sonra eyni məntiqlə dəyərləndirilə bilsəydi, 21-ci əsr cəmiyyətinin ibtidai qəbilə və yaxud inkişaf etmiş mədəniyyət olması bir sıra mübahisələrə səbəb ola bilərdi. Bundan 5000 il sonra müasir rəssamların tabloları heç bir zərər görmədən tapılsa və müasir dövrümüzə aid heç bir tarixi dəlil qalmamış olsa, həmin dövrün insanları dövrümüz haqqında nə düşünərdi? Van Qoqun (Van Gogh) və ya Pablo Pikassonun (Pablo Picasso) əsərlərini tapan gələcəyin insanları təkamülçü məntiqə görə hərəkət etsələr, müasir cəmiyyətimiz üçün neçə şərhlər verərdilər? Mənzərə şəkli çəkən Klod Mone (Claude Monet) üçün "sənaye hələ inkişaf etməmiş, insanlar əkinçiliklə məşğul olurdular" və ya Kandinskinin abstrakt rəsmlərinə "hələ yazıb oxuya bilməyən, inkişaf etməmiş insanlar müxtəlif qaralamalarla bir-birini anlayırdılar" şərhini vermək hazırkı dövrümüz haqqında onları doğru nəticələrə aparacaqmı?





**(Soldakı Şəkil:) Əlcəzairdə tapılan təxminən 9000 il əvvələ aid divar rəsimləri.**
**(Sağdakı Şəkil:) Tuc d'Audoubert Mağarasındakı bizon qabartmaları.**

**Rəsimlər rəsmi çəkən şəxslərin sənət anlayışını əks etdirir. Ancaq bu rəsimlərə baxaraq o dövrün insanlarının nə yedikləri, hansı şərtlərdə yaşadıqları, sosial münasibətlərinin necə olduğuna dair izahlar qurmaq və bu izahların qəti həqiqət olduğunu iddia etmək elmi yanaşma deyil. Təkamülçülərin israrla qədim dövrün insanlarını "ibtidai" olaraq qiymətləndirmələri isə ön mühakiməli mövqelərinin bir nəticəsidir. Hazırlanmış insan fiqurlarının üzərində qalın parça olduğu görünür. Bu da təkamülçülərin iddia etdiyi kimi, nə zamansa insanların yarıçılpaq gəzən, ibtidai varlıqlar olmadıqlarını göstərir.**

Bütün bu əsərlər və arxeoloji tapıntılar təkamül nəzəriyyəsi tərəfindən açıqlanması mümkün olmayan bir çox sualı gündəmə gətirir. İnsanların meymunlarla ortaq bir atadan gəldikləri fikrini müdafiə edən darvinizm bu sualların heç birini açıqlamır. Məsələn, on minlərlə il əvvəl guya xırıltılar çıxarıb, heyvani bir həyat tərzi keçirdiklərini iddia etdikləri meymunəbənzər varlıqların niyə və necə sosiallaşmağa başladıqları sualı təkamülçülər üçün çox böyük problemdir. Bu meymunəbənzər insanların niyə ağaclardan yerə düşdükləri, necə iki ayaqları üzərində durmağa başladıqları, ağıllarının və bacarıqlarının necə inkişaf etdiyi kimi suallar qarşısında təkamül nəzəriyyəsi elmi və ağıllı cavablar verə bilmir. Bu mövzuda irəli sürülən açıqlamalar yalnız bir neçə ön mühakimədən və xəyal məhsulu hekayələrdən ibarətdir.

Təkamülçülərə “budaqlardan budaqlara tullanaraq gəzən meymunlar necə olub ki, yerə düşməyə qərar veriblər?” deyə sual versəniz, bunu iqlim şərtlərinin tələbi adlandıracaqlar. “Digər meymunlar da onları təqlid edərək yerə düşə biləcək ikən, niyə budaqlarda gəzməyi seçiblər? Ya da bu iqlim şərtləri niyə sadəcə bəzi meymunlara təsir etmişdir? Eyni iqlim şərtlərində yaşayan digər meymunları yerə düşməkdən saxlayan şey nədir?” kimi ilk planda ağlınıza gələn bir çox sual isə təkamül nəzəriyyəsi tərəfindən ağıllı və məntiqli bir şəkildə cavablana bilməz. “Yerə düşən meymunlar necə olub ki, iki ayağı üzərində gəzməyə başlamışdır?” deyə bir sual versəniz təkamülçülər bu suala da fərqli açıqlamalar gətirməyə çalışırlar. Məsələn, bəzi təkamülçülər digər güclü heyvanlardan qorunma ehtiyacına görə bu meymunabənzər insanların iki ayaqları üzərində dik durmağa qərar verdiklərini söyləyirlər. Amma bu açıqlamaların heç biri elmi deyil.

İki ayaqlılığın təkamülü deyə bir mövzu yoxdur. İnsan iki ayağı üzərində dik gəzir. Bu başqa heç bir canlıda rast gəlinməyən, çox xüsusi bir hərəkət şəklidir. Burada bir məqama da toxunmaq lazımdır ki, iki ayaqlılıq üstünlük deyil. Belə ki, meymunların hərəkət şəkli insanın iki ayaqlı yerişindən daha asan, sürətli və məhsuldardır. İnsan nə bir şimpanze kimi ağaclar arasında budaqdan budağa tullanaraq irəliləyə bilər, nə də bir gepard kimi saatda 125 km sürətlə qaça bilər. Əksinə insan iki ayağı üzərində gəzdiyi üçün, yerdə daha yavaş şəkildə hərəkət edə bilər və bu səbəbdən təbiətdəki canlıların ən müdafiəsizlərindən biridir. Belə ki, təkamül nəzəriyyəsinin öz məntiqinə görə, meymunların iki ayaqlı gəzməyə yönəlmələrinin heç bir mənası yoxdur. Əksinə təkamülün hekayələrinə görə insanlar dörd ayaqlı olmalıdırlar.

Təkamülçü iddianın başqa problemi isə iki ayaqlılığın darvinizmin “mərhələ-mərhələ inkişaf etmə” modelinə qətiyyən uyğun gəlməməsidir. Təkamülün əsasını təşkil edən bu model təkamülün bir mərhələsində iki ayaqlılıqla dörd ayaqlılıq arasında “qarışıq” bir yeriş olmasını tələb edir. Halbuki ingilis paleoantropoloq Robin Crompton 1996-cı ildə komputerin köməyi ilə apardığı araşdırmalarda bu çeşid bir “qarışıq” yerişin mümkün olmadığını göstərmişdir. Cromptonun gəldiyi nəticə belədir: Bir canlı ya tam dik, ya da tam dörd ayağı üzərində yeriyə bilər. (Ruth Henke, "Aufrecht aus den Baumen", Focus, Cilt 39, 1996, s. 178) Bu ikisini arasında bir yeriş şəkli enerji istifadəsinin aşırı

dərəcədə artması səbəbindən mümkün deyil. Buna görə yarı iki ayaqlı bir canlının mövcud olması mümkün deyil.

Bu ibtidai varlıqların necə ağıllı və sosial davranışlar meydana gətirdikləri sualının cavabı da təkamülçülərin fərziyyələrinə görə kütləvi şəkildə yaşadıqları, beləcə də ağıllı və sosial davranışlar inkişaf etdirdikləridir. Halbuki sürü şəklində yaşayan yalnız bu ibtidai varlıqlar deyil, qorillalar, şimpanzelər, meymunlar və başqa bir çox heyvan növü sürülər şəklində yaşayır. Amma bunların heç biri insanlar kimi ağıllı və sosial davranışlara malik ola bilməmişlər. Heç biri sənət əsərləri inşa etməmiş, astronomiya ilə maraqlanmamış, nəhəng abidələr düzəltməmiş, qısası ağıl və bacarıq nümayiş etməmişlər. Çünki ağıllı və şüurlu davranış yalnız insanlara xas xüsusiyyətlərdir. Keçmişdən dövrümüzə izi qalan bütün əsərlər də bizlər kimi ağıl və şüura sahib, hesablama, planlama, istehsal etmə bacarığı olan insanlar tərəfindən meydana gətirilmişdir. Bu insanların ibtidai şərtlərdə yaşsdıqları iddiası isə bilavasitə arxeoloji tapıntılar tərəfindən yalanlanır.

## MAĞARA RƏSMLƏRİNDƏKİ ÜSTÜN BOYA TEXNİKASI

Pireney yarımadasının Fransaya aid hissəsində yerləşən Nio (Niaux) mağarası qədim dövrdə yaşayan insanların çəkdikləri biri digərindən effektli rəsmlərlə doludur. Rəsmlər üzərində aparılan karbon testləri bu əsərlərin təxminən 14 min il əvvəl çəkildiyini göstərir. Nio mağarasındakı rəsmlər 1906-cı ildə aşkar edilmiş və o zamandan bu yana da təfsilatlı olaraq tədqiq edilir. Mağaranın ən bəzəkli hissəsi "Qara salon" olaraq adlandırılan qaranlıq bir yerdə yerləşən yüksək bir oyuqdan ibarət küncdür. Bizon, at, maral və dağ keçisi rəsmlərinin olduğu bu bölümlə əlaqəli olaraq "Müasir insanın mənşəyi" kitabında Rocer Levin belə şərh vermişdir: *"... kompozisiyaların yaradılması zamanı yaradıcılıq və şüurun təsiri müşahidə edilir".*

(Roger Lewin, The Origin of Modern Humans, W.H. Freeman and Company, New York, 1993, sf. 193)

Bu rəsmlərlə əlaqədar alimlərin diqqətini cəlb edən ən vacib ünsürlərdən biri də istifadə edilən boya texnikasıdır. Aparılan araşdırmalar bu rəsmlərdə təbii və yerli qaynaqların bir yerə toplayaraq xüsusi qarışıqların əldə edildiyini göstərir. Şübhəsiz ki, bu ibtidailikdən təzəcə çıxmış varlıqların edə bilməyəcəyi düşünmə, planlaşdırma və istehsal bacarığının göstəricisidir. Rocer Levin bu boyama texnikasını belə izah edir:

*Boyanın düzəldilməsində istifadə edilən maddələr (piqmentlər) və mineral aşqarlar, Üst Paleolit dövrünün insanları tərəfindən seçilərək xüsusi bir qarışıq əldə etmək üçün 5-10 mikronadək xırdalanırdı. Qara rəngli boya təxmin edildiyi kimi, odun kömürü və manqan 4-oksid idi. Lakin diqqət ən çox aşqarlar üzərinə yönəlmişdi. Aşqarlar, yəni doldurma materialları daha çox rənglərə canlılıq verdiyi kimi, adından da göründüyü kimi, boyanın qatılaşmasını da təmin edir. Dörd müxtəlif növü olduğu müəyyən edilən bu maddələri tədqiqatçılar birdən dördə qədər sıralamışlar: talk, barit, kalium çöl şpatı və biotit (mika) tərkibli çöl şpatı kalium.* Klotte və dostları bu

*aşqarları özləri də sınaqdan keçirmiş və çox effektiv olduğunu görmüşlər.*

(Roger Lewin, The Origin of Modern Humans, W.H. Freeman and Company, New York, 1993, sf. 193)

Göründüyü kimi, istifadə edilən texnika olduqca inkişaf etmişdir. Bu da açıq şəkildə həqiqəti bir daha əks etdirir: keçmişdə ibtidai adlandırılan hər hansı varlıq yaşamamışdır. İnsan ilk olaraq var olduğu gündən bəri düşünmə, danışma, anlama, qavrama, qiymətləndirmə, plan qurma və istehsal qabiliyyəti olan üstün bir varlıqdır. Şəkilləri rəngləmək üçün aşqardan istifadə edən, bu aşqarları hazırlamaq üçün tarik, barit, kalium çöl şpatı və biotit kimi kimyəvi maddələri birləşdirən insanların guya meymunluqdan yeni çıxmış, hələ mədəniləşməmiş varlıqlar olduqlarını iddia etmək ağıla və məntiqə ziddir.









**Mağara rəsimlərində istifadə olunan boyalar, kimya təhsili almış bir universitet tələbəsinin belə əldə etməsinin olduqca çətin olduğu bir qarışıq maddə ilə hazırlanmışdır. Çox mürəkkəb tərkibli bu boya qarışıqlarını kimya mühəndisləri ancaq laboratoriyalarda əldə edə bilərlər. Talk, barıt, potasium feldispat və biotit kimi maddələrin istifadəsi ilə əldə edilən boyaların ətraflı bir kimya bilgisi tələb etdiyi aydındır. Bu bilgiyə sahib olan insanları isə "yeni inkişaf etmiş" adlandırmaq mümkün deyil.**





**Yuxarıdakı at rəsmi Niaux mağarasındakı rəsimlərdən biridir. Aparılan tədqiqatlar bu rəsmin təxminən 11 min il əvvələ aid olduğunu göstərmişdir. Rəsmin bölgədə yaşayan atlarla olan bənzərliyi rəsmi çəkən şəxsin bacarığını göstərməsi baxımından diqqət çəkir.**
**Bu rəsimləri çəkənlərin inkişaf etmiş bir sənət anlayışına sahib olan şəxslər olduğu aydındır. Həmin rəsimlərin mağara divarlarına çəkilməsi bu şəxslərin ibtidai şərtlərdə yaşadığını göstərən bir dəlil deyil. Sadəcə şəxsi seçimlərinə görə kətan olaraq bu divarları istifadə etmələri olduqca yüksək bir ehtimaldır.**

**Bu rəsimdə sənətkar üçölçülü bir görüntü yaradıb. Üçölçülü görüntü yaratmaq ancaq çox yaxşı sənət və rəsim təhsili almış şəxslərin edə biləcəyi bir texnikadır. Bir çox şəxs bu təfsilatlı sənəti tətbiq edə bilməz.**



**Tarixləri e.ə 35 min illərə qədər uzanan mağara rəsimlərindəki boyalarda o dövrün insanları manqan oksid, dəmir oksid, dəmir hidroksid, dentin kili (onurğalı heyvanların dişlərindəki kolagen və kalsium duzundan meydana gələn daxili qisim) kimi elementlər və maddələr istifadə edirdilər. Kimya təhsili olmayan bir insandan bu rəsimlərdən hərhansı birindəki boyanı əldə etməsi istənilsə, bu şəxs hansı elementi istifadə edəcəyini, bu elementi haradan necə tapa biləcəyini, hansı elementi hansı ilə necə qarışıdırmaq lazım olduğunu bilməz. Həmçinin qədim dövrün insanlarının sadəcə kimya mövzusunda deyil, heyvan anatomiyası mövzusunda da məlumatlı olduqları anlaşılır. Onurğalı heyvanların dişlərindəki kolagen və kalsium tozlarından ibarət maddələrdən faydalanmaları bunun bir göstəricisidir.**

# BLOMBOS MAĞARASINDA TAPILAN ƏSƏRLƏR İNSANIN TƏKAMÜLÜ SSENARİSİNİ BİR DAHA ALT-ÜST EDİR!

Cənubi Afrika sahillərindəki Blombos mağaralarında aparılan qazıntılar nəticəsində əldə edilən sübutlar insanın təkamülü ssenarisini bir daha alt üst etdi. *"Daily Telegraph"* qəzeti mövzu ilə əlaqəli xəbəri *"Daş dövrü adamı o qədər də sadəlövh deyildi (Stone Age Man Wasn't So Dumb)"* başlığı altında verilmişdi. Məsələn, "BBC News" məsələni belə şərh etmişdi: *"Alimlər düşünür ki, bu tapıntı həmin dövr üçün müasir olan düşüncə metodlarının təxmin ediləndən daha çox əvvəl meydana gəlmiş olduğunu göstərir".* (BBC News, 10 January 2002)

Blombos mağaralarında bundan 80-100 min il əvvəlinə aid torpaq boya qəlibləri tapılmışdı. Bu qəliblərin həm bədən, həm də sənət əsərlərinin rənglənməsində istifadə edildiyi təxmin edilirdi. Bu tapıntıdan əvvəl alimlər insanın düşünmə, qavrama və istehsal bacarığının inkişaf etdiyini göstərən dəlilərin ən tez 35 min il əvvəl meydana çıxdığını irəli sürürdülər. Tapılan bu qəliblər isə sözü gedən iddianı tamamilə sarsıtdı. Təkamülçü alimlərin guya ibtidai, hətta yarı meymun olaraq adlandırdıqları bu dövrün insanları sanki dövrümüzün insanları kimi qavrama və istehsal etmək qabiliyyətinə malikdir.





**Blombos mağarasında tapılan üstdə görünən muncuqlar və tapılan müxtəlif bəzək əşyaları dövrün insanlarının estetikadan anlayan, sənəti bilən, gözəllikdən xoşlanan şəxslər olduğunu göstərir. Bunlar ibtidai varlıqlar tərəfindən meydana gətirilə bilməz.**

# ŞOVE (CHAUVET) MAĞARASINDAKI QEYRİ-ADİ RƏSMLƏR

Şove mağarası 1994-cü ildə kəşf edildi və tapılan rəsmlər elm aləmində böyük əks-səda doğurdu. Bundan əvvəl, Ardeşdəki (Ardeche) sənət əsərləri, Laskodakı (Lascaux) 20 min illik rəsmlər və yaxud da İspaniyada Altamiradakı 17 min illik əsərlər də marağa səbəb olmuşdu, lakin Şovedəki əsərlər çox-çox əvvələ aid idi. Karbon-14 üsulu ilə aparılan yaşın müəyyən edilməsi nəticəsində, bu rəsmlərin təqribən 35 min illik olduğu məlum oldu. "National Geographic" jurnalında Şovedəki əsərlərlə əlaqədar aşağıdakı şərh verilmişdi:

*Mağaranın ilk fotoşəkilləri mütəxəssislər qədər ictimaiyyəti də heyrətləndirdi. On illər ərzində akademiklər incəsənətin ibtidai cızma qaralardan canlı naturalist rəsmlərə doğru mərhələli şəkildə inkişaf etdiyini irəli sürürdülər... Daha məşhur mağaralarda olan rəsmlərin yaşının təxminən iki qatına bərabər yaşlı Şovedəki rəsmlər, sadəcə, tarixdən əvvələ aid incəsənətin mövcud olduğu ən yüksək nöqtəni deyil, eyni zamanda, incəsənətin bizə məlum olan ən qədim başlanğıcını təmsil edirdi.*

(National Geographic, Ağustos 2001, sf. 156)



**Chauvet mağarasındakı "Atlar Paneli" təxminən 6 metr uzunluğunda olan divar tablosudur. Hücum edən kərkədanlar, atlar, bizonlar, şirlər və uzun buynuzlu bir növ mal sürüsünün çəkildiyi bu şəkil heyranlıq oyandıran bir estetikaya malikdir. Təkamülçülərin ibtidai cızmaqaralar gözlədikləri bir dövrdə sənətin bu dərəcə inkişaf etməsi darvinist iddialara görə açıqlanması mümkün olmayan bir vəziyyətdir.**





**(Soldakı şəkil:) Chauvet mağarasında qırmızı boya maddəsi istifadə edilərək çəkilmiş leopard rəsmi.**

**(Sağdakı şəkil:) Təxminən 6 metr uzunluğundakı paneldən bir hissə görünür.**




**Mağara rəsimlərindəki nkişaf etmiş sənət anlayışı qarşısında təkamülçü *National Geographic* jurnalı bu rəsimləri *"Bizim Kimi İnsanlar"* başlığı ilə təqdim etdi.**

## LASKO (LASCAUX) MAĞARALARINDA 16.500 İLLİK ASTRONOMİYA XƏRİTƏLƏRİ

Münhen Universitetindən tədqiqatçı Dr. Mixael Rappenqlük (Micheal Rappenglueck) Lasko mağaralarında apardığı tədqiqatlar nəticəsində bu mağaraların divarlarında olan rəsmlərin astronomik məna daşıya biləcəklərini müəyyən etmişdir. Mağaranın divarlarında olan fiqurlar fotoqrammetriyadan istifadə edilib kompyuter vasitəsilə bir daha təkmilləşdirilmiş və əmələ gələn həndəsi çertyoj dairələrin, bucaqların və düz xətlərin hər birinin bir məna kəsb etdiyini göstərmişdir. Kompyuter vasitəsilə həyata keçirilən hesablamalara ekliptik əyrilik, gecə-gündüz bərabərliyi ilə öz oxu ətrafında dönməsi, ulduzların nizamlı hərəkətləri, Ayın və Günəşin diametrinin və radiusunun ölçüləri, kainatdakı bütün sınma və sıxılmalarla əlaqədar bütün mənalar əlavə edilmişdir. Aparılan tədqiqatlar nəticəsində bu çertyojların bəzi ulduz topalarına və Ayın müəyyən hərəkətlərinə işarə etdiyi aydın olmuşdur. BBC kanalı elm və texnika bölümünə aid mövzu ilə əlaqədar aşağıdakı məlumatları vermişdir:

*Mərkəzi Fransada tapılan Lasko mağaralarındakı məşhur divar rəsmlərində tarixdən əvvəlki dövrə aid (gecə vaxtı) göyün xəritəsi kəşf edildi. 16.500 illik tarixə sahib olduğu təxmin edilən xəritə bugünkü günümüzdə yay üçbucağı (summer triangle) olaraq tanınan üç parlaq ulduzu göstərir. Laskodakı cizgilər arasında, ayrıca olaraq, Pleyada ulduz kəhkəşanının da xəritəsi tapıldı... 1940-cı illərdə kəşf edilən divarlar atalarımızın sənət qabiliyyətlərini göstərirdi. Lakin bu gün artıq sözü gedən rəsmlərin*

*atalarımızın elmi biliklərinin səviyyəsini də göstərdiyi aydın olmuşdur.*

(BBC News, 9 Ağustos 2000)



**(Soldakı şəkil:) Alimlərin araşdırmalarına görə at rəsminin alt qismindəki nöqtələr ayın 29 günlük dövrünü göstərir.**

**(Sağdakı şəkil:) Maral rəsminin altında çəkilmiş 13 nöqtəli silsilə isə Ayın bir ay ərzindəki dövriyyəsinin yarısını təmsil edir.**

Darvinistlərin iddialarına görə, bu rəsmləri çəkənlər guya ağacdan təzəlikcə enən, zehinləri təkmilləşməkdə olan varlıqlardır. Lakin həm bu rəsmlərin sənətkarlıq baxımından dəyəri, həm də son tədqiqatların göstərdiyi nəticələr təkamülçülərin bu iddialarını əsassız edir. Sözü gedən rəsmləri çəkənlər həm üstün estetika anlayışına, həm mütərəqqi sənətkarlıq texnikasına, həm də tədqiqatların göstərdiyinə görə elmi məlumata sahib olan insanlardır.



**Lascaux mağaralarındakı inək fiqurları**



**Lascaux mağaralarındakı bizon fiqurları**



**Solda - Lascaux mağarasından Rotundanın şimal divarı**
**Üstdə - Lascaux Mağarasından 17.000 illik heyvan fiqurları**
**Altda - At fiquru**

**Rəsimlərdə hərəkətlilik və canlılıq mükəmməl bir şəkildə əks etdirilmişdir. Bu rəsimlər akademik təhsil alan şəxslərin çəkə biləcəyi keyfiyyətdə, olduqca estetik sənət əsərləridir. Belə mükəmməl sənət əsərlərini ortaya çıxaran şəxslərin zehni olaraq geri olduqlarını söyləmək mümkün deyil.**


BBC NEWS

You are in: Sci/Tech

Front Page
World
UK
UK Politics
Business
Sci/Tech
Health
Education
Entertainment
Talking Point
In Depth
AudioVideo

Monday, 16 October, 2000, 22:27 GMT 23:27 UK

Oldest lunar calendar identified

A dappled, brown horse and a lunar calendar

By BBC News Online science editor Dr David Whitehouse in France

What could be the oldest lunar calendar ever created has been identified on the walls of the famous, prehistoric caves at Lascaux in France.

The interpretation that symbolic paintings, dating back 15,000 years, show the Moon going through its different phases comes from Dr Michael Rappenglueck, of the University of Munich.

"They were aware of all the rhythms of nature. Their survival depended on them"

Dr Michael Rappenglueck

***"Ən qədim ay təqvimi təyin edildi"* başlığı ilə BBC-in internet saytında yerləşdirilən xəbərdə darvinistlərin cəmiyyətlərin təkamülü iddiasını bir daha darmadağın edən məlumatlar vardır.**

## ŞİMALİ AFRİKADA QAYADA QABARTMALAR (RELYEF TƏSVİRLƏR) VƏ QAYA ÜSTÜ RƏSMLƏR TƏKAMÜLÇÜLƏRİ HEYRƏTƏ GƏTİRİR



Təxminən 7 min illik olan bu zürafə formalı qabartmalar görənlərə sürünün hərəkətdə olduğu hissini verən mükəmməllikdə canlandırılmışdır. Bu əsərin düşünmə qabiliyyətinə malik, mühakimə etməyi bacaran, öz fikirlərini ifadə edə bilən, istehsal qabiliyyətli, incəsənət haqqında anlayışlı insanlar tərəfindən ərsəyə gətirildiyi çox açıq görünür.

Daha bir misal, təxminən 7 min illik bu rəsmdə, musiqi alətində ifa edən bir insan görünür. Yandakı digər şəkildə isə, Botsvanada yaşayan Dzu adlı yerli əhalidən bir nəfərin buna bənzər musiqi alətində ifadə etdiyini görürük. 7 min il əvvəl istifadə edilən bir musiqi alətinə çox oxşayan alətin bugünkü gündə də istifadə edilməsi diqqət çəkir. Bu darvinistlərin iddiasını məhv edən misallardan biridir. Darvinizmin iddia etdiyi kimi mədəniyyət həmişə inkişaf etmir, bəzən də minlərlə il eyni qalır. Bu adam 7 min il ərzində var olan bir musiqi alətini istifadə etməyə davam edərkən, dünyanın o biri ucunda ən son musiqi alətləri ilə simfoniyalar bəstələnir və hər iki mədəniyyət eyni dövrə aiddir.



**Yuxarıdakı 7 min illik divar rəsmində görünən fleyta çalan insan fiquru dövrün insanlarının musiqi elminə və mədəniyyətinə, beləliklə də inkişaf etmiş zehniyyətə və mədəniyyətə sahib olduqlarını göstərir.**

## TARİXİN İLK ŞƏHƏRİ KİMİ QƏBUL EDİLƏN ÇATALHÖYÜK TƏKAMÜLÜ RƏDD EDİR

Eramızdan 9000 il əvvələ aid olduğu qəbul edilən Çatalhöyük tarixin ilk şəhərlərindən biri olaraq müəyyən edilir. İlk tapıntılarla birlikdə, arxeologiya dünyasında böyük mübahisələr başlamış, təkamülçü iddiaların əsassızlığı bir daha üzə çıxmışdı. Arxeoloq Ceyms Mellaart (James Melaart) -özünü də heyrətə salan- bölgədəki tərəqqini aşağıdakı kimi izah edir:



*Neolit dövrünün ən qabaqcıl cəmiyyətlərindən olan Çatalhöyükdəki mədəni cəmiyyətin sahib olduğu texnoloji xüsusiyyətlər heyranedicidir... Məsələn, obsidiandan (sərt bir vulkanik şüşə növü) olan bir şüşəni necə olur ki, heç cızmadan parıldatmışlar və yaxud da daşdan muncuqlarda polad iynələr vasitəsi ilə belə dəlik açmaq hədsiz çətin olduğu halda, onlar bunu necə bacarmışlar? Nə vaxt və necə misi, qurğuşunu və digər metalları əritməyə başlamışlar?* (http://www.goldenageproject.org.uk/108catalhuyuk.html)



**Çatalhöyük divar rəsmlərindən biri olan üstdəki rəsm, maral ovunu əks etdirir.**

Çatalhöyükdə əldə edilən bütün tapıntılar tarixin və mədəniyyətin təkamülü iddiasını təkzib edir. Bu divar rəsmləri də, ibtidailikdən yeni çıxmış insanların deyil, estetik anlayışa sahib və sənət qabiliyyəti olan insanların əsəridir.

Tapıntılar Çatalhöyükdə yaşayan insanların inkişaf etmiş şəhərsalma anlayışına, planlama, layihələndirmə, hesablama qabiliyyətinə sahib olduqlarını, incəsənət anlayışlarının isə təxmin ediləndən daha çox inkişaf etmiş olduğunu göstərmişdi. Qazıntılar aparan arxeoloji qrupun müasir dövrümüzdəki lideri Prof. Yan Hodder (Ian Hodder) burada əldə edilən tapıntıların təkamülçü iddiaları əsassız etdiyini aşağıdakı kimi ifadə edir:

*Gəldiyi yeri bilinməyən bir mədəniyyətləri var. Çatalhöyükün coğrafi yerləşməsini də izah etmək olduqca çətindir. Həmin dövrə aid kənar ərazilərlə birbaşa bir əlaqəsi yoxdur… Aşkar edilən mala üzərindəki rəsmlər dövrünə görə çox mütərəqqidir. Bu insanlar bu cür mədəni səviyyəyə haradan və necə gəlib çıxdılar?... Verilməli əsas sual budur: bir qrup insan necə olur ki, bu qədər nəhəng mədəni tərəqqi əldə edə bilmişdir? Bir anda və yoxdan olduqca əhəmiyyətli sənət əsərləri meydana gəlmişdir. Bildiyimizə görə, Çatalhöyükdə əldə edilən mədəni tərəqqidə heç bir təkamül baş verməmişdir.* (Fenomen, 15 Eylül 1997, sf. 45)

## TƏKAMÜLÇÜLƏRİ ÇAŞDIRAN 400 MİN İLLİK MİZRAQLAR

Almaniyanın Şöninqen (Schöningen) şəhərində 1995-ci ildə alman arxeoloqu Hartmut Time (Hartmut Thieme) tərəfindən bir sıra taxta qalıntılar tapıldı. Bunlar diqqətlə və məxsusi olaraq düzəldilmiş mizraqlar idi, yəni tapıntı ən qədim ov vasitələri idi. Həmin tapıntılar təkamülçülər arasında böyük çaxnaşmaya səbəb oldu. Belə ki, təkamülçü nöqteyi-nəzərindən sistematik ovçuluq müasir insanın meydana gəldiyi fərz edilən təxminən 40 min il əvvəl başlamış olmalı idi. Hətta bu hekayəyə uyğun olması üçün daha əvvəl tapılan Klakton (Clacton) və Leyrinqen (Lehringen) mizraqları diqqətdən kənar buraxılmış, bunların sadəcə yeri qazmaq üçün istifadə edilən dəyənək və ya qarı qazmaq üçün alət olduğu iddia edilərək yaşları azaldılmış və təkamül yalanını davam etdirməyə cəhd etmişdilər.

(Robbin Dennell, "The World's Oldest Spears", Nature 385, Feb. 27, 1997, sf. 767)



Mizraqların tarixi isə daha qədim dövrü göstərirdi: təxminən 400 min il əvvəl... Bundan əlavə, Şöninqen mizraqlarının yaşı o qədər dəqiq idi ki, mövzu ilə əlaqəli “Nature” jurnalında məqaləsi dərc edilən Şefild Universitetinin arxeoloqlarından Robin Dennel bu mizraqların yaşını dəyişdirməyin və yaxud bunlarla əlaqədar saxta şərhlər verməyin qeyri-mümkün olduğunu aşağıdakı kimi ifadə edirdi:

*Lakin, Şöninqen tapıntıları heç bir şübhəyə yer qoymayacaq şəkildə olan mizraqlardır, bunları qar qazan və ya qazma dəyənəkləri kimi qiymətləndirməyin, elektrik burğuların kağız ağırlığında olduğunu iddia etməkdən fərqi yoxdur.* (Robbin Dennell, "The World's Oldest Spears", Nature 385, Feb. 27, 1997, sf. 767)

Bu mizraqların təkamülçü elm adamlarını heyrətə gətirməsinin bir səbəbi də mizraqların düzəldilməsi üçün lazım olan layihələndirmə, hesablama, istehsal texnikasının həmin dövrdə yaşayan guya ibtidai insanlarda olmadığı yanlışıdır. Halbuki, bu mizraqlar layihələndirə bilən və hesablaya bilən və mütərəqqi düşünə bilən bir zehnin məhsuludur. Hər bir mizraq üçün təxminən 30 yaşlı ladin ağacının gövdəsindən istifadə edilmişdir və hər bir mizrağın uc hissəsi ağacın ən sərt olan yerindən, yəni kökün gövdə ilə bitişdiyi yerdən -özəyindən- hazırlanmışdır. Hər bir mizraq sanki müasir mizraqlarda olduğu kimi, bərabər nisbətdə tərtib edilmişdir; ağırlıq mərkəzi, uc hissənin 1/3-i qədər məsafədədir. Bütün bu xırdalıqlar qarşısında Robin Dennell aşağıdakı şərhi vermişdi:

*Bu mizraqlar əhəmiyyətli zaman və qabiliyyət sərfidir. Yəni uyğun ağacın seçilməsi, formasının müəyyən edilməsi və ən son mərhələdə isə lazımı qaydada tərtib edilməsidir. Başqa sözlə, bu insanlar təsadüfi "beş dəqiqəlik" bir mədəniyyətlə yaşamırdılar. Bu insanlarda daha çox üstün bir planlama, inkişaf etmiş layihələndirmə və taxtaya forma vermək üçün səbir görürük və bütün bunlar sadəcə müasir insanlarda görə biləcəyiniz xüsusiyyətlər.*

(Robbin Dennell, "The World's Oldest Spears", Nature 385, Feb. 27, 1997, sf. 767)

Mizraqları tapan arxeoloq Time isə aşağıdakıları qeyd etmişdir:

*Orta Pleystosen kimi erkən bir dövrdə belə inkişaf etmiş mizraqların istifadə edilmiş olması qədim insanların davranış və mədəniyyətləri haqqında bir çox nəzəriyyənin yenidən baxılması zərurətini yaradır.*

(Robbin Dennell, "The World's Oldest Spears", Nature 385, Feb. 27, 1997, sf. 767)

Hartmut Time və Robin Donnellin də ifadə etdiyi kimi, darvinistlərin insanlıq tarixi ilə əlaqədar irəli sürdükləri iddialar həqiqəti ifadə etmir. Həqiqət budur: bəşəriyyət heç vaxt təkamül keçirməmişdir. Keçmişdə tərəqqi etməmiş durğun mədəniyyətlərin olduğu kimi olduqca inkişaf etmiş və mütərəqqi mədəniyyətlər də olmuşdur.

## URFADA GÖBƏKLİ TƏPƏDƏKİ SİVİLİZASİYA İZLƏRİ

Urfa yaxınlığındakı Göbəkli Təpədəki qazıntılarda alimlər tərəfindən misilsiz və bənzərsiz kimi qiymətləndirilən tapıntılar əldə edilmiş, üzərində heyvan təsvirli relyeflərin olduğu, diametri 20 metrdən və hündürlüyü insan boyundan artıq olan nəhəng "T" şəklində sütunlar aşkarlanmışdır. Bu sütunlar dairəvi şəkildə düzülmüşdü. Əslində, elm dünyasını çalxalayan xüsusiyyət isə bu ərazinin yaşıdır: 11 min il əvvəl inşa edilmişdir. Təkamülçü iddiaya görə, dövrün insanları ibtidai daş alətlərlə bu görkəmli abidəni inşa etmişdilər. Bu cür yanlışlığa görə, sözü gedən mühəndislik möcüzəsi bundan 11 min il əvvəl ən ibtidai vasitələrlə işləyən yığıcılıq və ovçuluqla məşğul olan insanların əl işidir. Əlbəttə, bu, inanılması mümkün olmayan bir



**Rəsimlərdə Göbəkli təpədə tapılan T formalı daşlar görünür. Bəzilərinin üzərində şir fiqurları vardır.**

hekayədir. Həqiqətən də Göbəkli Təpədə arxeoloji qazıntı işlərini aparan qrupa rəhbərlik edən Prof. Klaus Şmidt (Klaus Schmidt) də bu həqiqəti aşağıdakı kimi ifadə etmişdir:

Həmin dövrdə yaşayan insanların sanki bugünkü insanlardakı kimi düşünmə qabiliyyəti müşahidə edilir. Onlar bizim həmişə fikirləşdiyimiz kimi ibtidai insanlar deyil. Onların ağacdan enərək mədəniyyət qurmağa çalışan meymunabənzər varlıqlar olduqları düşünülməməlidir. Zəka nöqteyi-nəzərindən baxsaq, bizə oxşar olduqları görünür.

(Taş Devrinde Yaşam, Terra X Belgeseli, TRT)

Arxeoloq Klaus Şmidt bu nəhəng ölçüdəki daşların həmin dövrün şərtlərində necə daşındığını, necə formaya salındığını aydınlaşdırmaq üçün qazıntı aparan qrupla birgə bir sınaq keçirmişlər. Bu sınaqda maşınların köməyi olmadan, sadəcə guya tarixdən əvvəlki dövrdə yaşayan insanların istifadə etdiyi ibtidai alətlərlə böyük bir qaya bloku üzərində işləməyə başladılar və onu çox qısa məsafəyə daşımağa cəhd etdilər. Onlar əsl abidədəki daşlara nisbətən daha kiçik ölçülü bir qaya bloku üzərində işləməyi üstün tutmuşdular. Qrupun bir qismi kötük, ip və qol gücü ilə təbii və sadə vasitələr düzəldərək daş üzərində işləməyə başlamış, digərləri isə əllərində daşlarla e.ə. 9000 il əvvəl yaşayan daş ustaları kimi sərt bir yerdə oyuq ovmağa başlamışlar. (Təkamülçü tarix anlayışına görə, həmin günlərdə metal alətlər olmadığına görə, daş dövrünün insanlarının sərt və ucu şiş çaxmaq daşından istifadə edildiyinə inanırlar.) Daşı oymağa çalışan işçilərin 2 saat boyunca dayanmadan davam edəm səyləri nəticəsində, ortaya sadəcə bilinməyən xətt çıxmışdır. Daşı daşımağa çalışan qrupun 4 saatlıq intensiv



**Bölgədə tapılan bəzi sütunlar üzərində işlənmiş şir motivləri.**

**Göbəkli təpədə tapılan insan heykəli.**

**Göbəkli təpədə aparılan qazıntı işlərində ortaya çıxarılan çöl donuzu heykəli.**

**Bu əsərlərin tapıldığı dövr təkamülçülərin "daş dövrü" olaraq adlandırdıqları, sadəcə daş alətlərin istifadə edildiyini iddia etdikləri dövrdür. Tapılan əsərlər isə bu iddianın doğru olmadığını göstərir. Sadəcə daş istifadə edərək bu qayalar üzərində həmin naxışların işlənməyəcəyi, bu heykəlin düzəldilə bilməyəcəyi aydındır. Daşa daşla vuraraq qayanın üzərində bu dərəcə düzgün bir heyvan fiquru çəkmək olmaz. Daşa daşla vurularaq heykəlin gözləri, burnu, ağzı düzəldilə bilməz.**

fəaliyyəti nəticəsində 12 nəfər ağır qaya blokunu sadəcə 7 metr hərəkət etdirə bilmişdilər. Aparılan bu sınaq nəticəsində tək bir daş çevrənin qurulması üçün yüzlərlə işçinin aylarla işləməsi zərurətini göstərir. Bu sadə sınaq belə açıq şəkildə irəli sürür ki, həmin dövrün insanları təkamülçü alimlərin irəli sürdükləri kimi ibtidai şərtlər altında deyil, çox böyük ehtimalla olduqca mütərəqqi imkanlara sahib idilər.

Təkamülçü ideyanın digər bir ziddiyyəti də bu əsərlərin meydana gəldiyi dövrü "Erkən (akeramik) neolit dövrü" olaraq adlandırmalarıdır. Bu həqiqətə zidd şərhə görə dövrün insanları hələ dulusçuluq məmulatlarını hazırlayacaq texnologiyaya sahib deyildilər. Bu, o demək olur ki, heykəllər düzəldə bilir, nəhəng daşları daşıya bilir, bunları estetik nöqteyi-nəzərdən baxımlı edə bilir, bunların üzərində heyvan təsvirli relyef işləmələr həkk edə bilir, divarları rəsmlərlə bəzəyə bilir, mühəndislik və memarlıq elmindən istifadə edə bilir



**Keçmiş dövrlərdə yaşayan insanlardan geriyə qalan və sıx-sıx rast gəlinən izlərdən biri də dulusçuluq izləridir. Bugün də hələ bir çox insan saxsı qablar düzəltməklə dolanışığını təmin edir. Dövrümüzdən geriyə yalnız saxsı parçaları qalsa və bunları tapan gələcəyin alimləri bizlərin hələ metalişləməni bilməyən geridə qalmış bir mədəniyyət olduğumuzu önə sürsələr, bu iddialarında nə qədər doğruluq olardı?**

amma, hələ dulusçuluq məmulatları düzəldə bilmir? Bu, o deməkdir ki, deyilənlər sadəcə təkamülçü ön mühakiməsini müdafiə edə bilmək üçün təkidlə söylənən yalandır. Şübhəsiz ki, sözü gedən əsərlər bu insanların təxmin ediləndən çox daha mütərəqqi bir elmə, texnologiyaya və mədəniyyətə sahib olduqlarını göstərir. Bu "T" şəklindəki böyük sütunların necə istifadə edildiyinin, həmin yerə necə gətirildiyinin bir izahı olmalıdır. Bu da sözü gedən insanların iddia edildiyi kimi, ibtidai olmadıqlarını nümayiş etdirir. Həqiqətən də, "Bilim Teknik" jurnalında dərc olunan bir xəbərdə Göbəkli Təpədə əldə edilən tapıntıların bəşər tarixinə dair geniş yayılmış yanlışlığı aşkara çıxardığı qeyd edilir: *"Bu yeni məlumatlar bəşər tarixinə dair mühüm bir yanlışlığı ortaya qoyur"*. (Bilim ve Teknik, Eylül 2000) Bu yanlışlıq bəşər tarixinin təkamül yalanının doğruluğunu şərh etmək üçündür.

**Daşa forma vermək üçün dəmir və ya poladdan hazırlanmış müxtəlif alətlər istifadə edilməlidir. Keçmişdə yaşayan cəmiyyətlər də eynilə dövrümüzdəki kimi daşları kəsib şəkilləndirərkən belə alətlər istifadə ediblər.**



# 8 MİN İL ƏVVƏL PEŞƏKAR VASİTƏLƏRLƏ DİŞLƏRİN MÜALİCƏSİ APARILIRDI

Pakistanda aparılan qazıntılar bundan 8 min ildən də əvvəl diş həkimlərinin diş çürümələrini plombla müalicə etdiklərini göstərmişdir. Kolumbiya Universiteti arxeoloqlarından Andre Kukina Pakistanda apardığı qazıntıları zamanı bundan 8-9 min il əvvələ aid kəsici dişlərdə kiçik dəliklər görmüşdü. Təxminən 2.5 mm ölçüsündə olan bu kiçik dəliklərin bərabər ölçüdə olmasından heyrətlənən Kukina məsələ ilə araşdırmanı daha da dərinləşdirmişdi.

***Daha sonra elektron mikroskoplarından istifadə edərək aparılan tədqiqatlar sözü gedən balaca dəliklərin bakteriyalar tərəfindən meydana gətirilməyəcəyi qədər biçimli olduqlarını müəyyən etdi. Yəni bunlar bakteriyalar tərəfindən meydana gətirilən dəliklər deyil, şüurlu müdaxilə ilə açılan dəliklərdir və müalicə məqsədi ilə açılmışdılar. Balaca dəliklərin olduğu dişlərin heç birində çürük izinə rast gəlinməmişdir. Bu isə "New Scientist" jurnalındakı ifadə ilə desək, tarixdən əvvəlki dövrdə diş həkimlərinin öz işlərində müvəffəqiyyətli olduqlarının göstəricisidir.***

(New Scientist, 11 Nisan 2001)

Təkamülçülərin baxışlarına görə, həmin dövr guya insanların meymunlardan hələ təzəlikcə ayrıldıqları, olduqca ibtidai şəraitdə yaşadıqları, hətta dulusçuluq məmulatlarını müəyyən yerlərdə düzəltməyi yenicə öyrəndikləri bir dövrdür. Təkamülçülərə görə, bu cür ibtidai şərtlər altında yaşayan insanların əllərində heç bir texnologiya olmadan bir sıra daş alətlərlə dişlərdə bərabər ölçülü dəliklər açaraq plomb qoyduqları müəmmadır. Açıq-aydın görünür ki, diş müalicəsini həyata keçirən insanlar nə ibtidaidir, nə də ki, ibtidai şəraitdə yaşamışlar. Bunun tam əksi olaraq, xəstəliyə diaqnoz qoya biləcək, müalicə üsullarını təqdim edə biləcək düşüncəyə və bu üsulları tətbiq edə biləcək texniki imkanlara sahibdirlər. Bu da -bir daha- darvinistlərin cəmiyyətlərin ibtidaidən aliyə doğru sürətlə təkmilləşdiyi tezisini əsassız edir.

# QƏDİM İNSANLARIN MUSİQİ SEVGİSİ

İncəsənətin hər bir sahəsi kimi, musiqi də sadəcə insana xasdır. Təqribən bundan 100 min il əvvəl yaşamış insanların musiqiyə marağı sözü gedən insanların günümüzün insanı ilə demək olar ki, bərabər zövqə malik olduğunun başqa bir göstəricisidir. Məlum olan ən qədim musiqi aləti Liviyanın Haua Fteah adlı bölgəsində tapılan və 70.000 ilə 80.000 illik olduğu təxmin edilən quş sümüyündən düzəldilmiş bir fleytadır. (Glynn Isaac, Barbara Isaac, The Archaeology of Human Origins, Cambridge University Press: Cambridge, 1989, sf.71; C.B.M Mc Burney, Haua Fteah, Cambridge University Press: Cambridge, 1967, sf.90) Bundan əlavə, Şərqi Krımda tədqiqatların aparıldığı "Prolom II" adlı mağarada 41 ədəd tütək tapılmışdır. (Vadim N.Stpanchuk, "Prolom II, A Middle Palaeolithic Cave Site in the Eastern Crimea with Non-Utilitarian Bone Artefacts", Proceedings of the Prehistoric Society 59, 1993, sf. 17-37, sf. 33- 34.) "Prolom II" mağarasının isə 90.000 ilə 100.00 il əvvələ aid olduğu kəşf edilmişdir. (Paul Mellars, The Neandertal Legacy, Princeton: University Press, 1996, sf. 17 ve Vadim N. Stpanchuk, "Prolom II, A. Middle Palaeolithic Cave Site in the Eastern Crimea with Non - Utilitarian Bone Artefacts", Proceedings of the Prehistoric Society 59, 1993, sf. 17-37, sf. 17)

Lakin bu dövrün insanlarının musiqi məlumatı bununla da bitmir. Bir musiqişünas Bob Fink Şimali Yuqoslaviyadakı bir mağarada arxeoloq İvan Turk tərəfindən 1995-ci ilin iyul ayında tapılan bir ayının bud sümüyündən düzəldilmiş qədim bir sümük fleytadakı dəlikləri analiz etdi. Karbon testinə görə yaşının 43.000 ilə 67.000 il arasında olduğu hesab edilən bu alətin 4 not ifa etdiyini və fleytada yarım tonlar və tam tonların da olduğunu müəyyən etdi. Bu kəşf sözü gedən insanların şərq musiqisinin əsası olan yeddi not ölçüsündən istifadə etdiklərini göstərir. Fleytanı tədqiq edən Fink qədim fleytanın üzərindəki ikinci və üçüncü dəliklər arasındakı məsafənin üçüncü və dördüncü dəliklər arasında olan məsafədən iki qat artıq olduğunu müəyyən etmişdir. Bunun mənası odur ki, birinci məsafə tam notu, onun yanındakı məsafə yarım notu təmsil edir. "Bu üç not inkar edilməz şəkildə diatonik və müasir və yaxud antik standart diatonik bir şkaladakı kimi səs çıxarır (Neandertals Lived Harmoniously, The AAAS Science News Service, 3 April 1997) deyən Fink bunlardan istifadə edənlərin musiqi duyumu və məlumatı olan insanlar olduğunu bir daha göstərir.




**Neandertal irqindən bir insan tərəfindən hazırlanmış bu fleyta o dövrdə Qərb musiqisinin əsas növü olan yeddi not ölçüsünün istifadə edildiyini göstərir. Fleytanın istehsalı və istifadə edilməsi məlumat təcrübəsi, mədəniyyət və bacarıq tələb edir.**

Bütün bu əsərlər və arxeoloji tapıntılar təkamül nəzəriyyəsi tərəfindən açıqlanması mümkün olmayan bir çox sualı gündəmə gətirir. İnsanların meymunlarla ortaq bir atadan gəldikləri yalanını müdafiə edən darvinizm bu sualların heç birini izah edə bilməz. Məsələn, on minlərlə il əvvəl guya xırıltılar çıxararaq heyvani həyat tərzi keçirdiklərini iddia etdikləri meymunabənzər varlıqların haradan və necə sosiallaşmağa başladıqları sualı təkamülçülər üçün çox çıxılmaz vəziyyətdir. Bu meymunabənzər varlıqların niyə ağacdan endikləri, necə iki ayaq üzərində durmağa başladıqları, ağıllarının və bacarıqlarının hansı formada inkişaf etdiyi kimi suallar qarşısında təkamül nəzəriyyəsi elmi və ağıllı cavablar verə bilməz. Bu mövzuda irəli sürülən izahlar yalnız bir sıra ön mühakimələrdən və təxəyyül məhsulu olan hekayələrdən ibarətdir.

Təkamülçülərdən soruşsaq ki, budaqdan budağa dırmanaraq ağacda gəzən meymunlara nə oldu ki, onlar yerə enməyə qərar verdilər? Bunu iqlim şərtlərinə görə zəruri olduğu səbəbdən olduğu cavabını verirlər. "Digər meymunlar da onları təqlid edərək yerə enə bildikləri halda, niyə budaqlarda gəzməyi üstün tutdular?", "Bu iqlim şərtləri niyə sadəcə bir sıra meymuna təsir etmişdi?", "Eyni iqlim şərtlərində yaşayan digər meymunları yerə

enməyə mane olan nədir?" kimi ilk ağıla gələn bir çox sual isə təkamül nəzəriyyəsi tərəfindən ağıllı və məntiqli şəkildə cavablandırıla bilməz. "Yerə enən meymunlar necə oldu ki, iki ayağı üzərində gəzməyə başladı?" -deyə bir sual versəniz, təkamülçülər bu suala da özlərinə görə məxsusi tərzdə cavab verməyə çalışacaqlar. Məsələn, bəzi təkamülçü alimlər digər vəhşi heyvanlardan qorunmaq məqsədi ilə bu meymunların arxa ayaqları üstdə dik durmağa qərar verdiklərini deyirlər. Amma bu izahların heç birinin elmi əsası yoxdur.

## TƏKAMÜLÇÜLƏRİN NƏZƏRİYYƏLƏRİNİ MÜDAFİƏ EDƏCƏK HEÇ BİR ELMİ DƏLİL YOXDUR

Təkamülçülər insanın meymunlarla ortaq bir atadan təkamülləşdiyi iddiasını dəlilsiz olaraq qəbul edirlər, lakin bu təkamülün necə olduğu sualına "bilmirik, bəlkə gələcəkdə bir gün başa düşərik" şəklində heç bir elmi dəyəri olmayan bir cavab verirlər. Məsələn, təkamülçü paleoantropoloq Elaine Morgan bu etirafları etmişdir:




İnsanlarla (insanın təkamülü ilə) bağlı ən mühüm dörd sirr bunlardır:

**1) Niyə iki ayaq üzərində gəzirlər?**
**2) Niyə bədənlərindəki sıx tüklər yoxa çıxıb?**
**3) Niyə belə böyük beyin inkişaf etdirdilər?**
**4) Niyə danışmağı öyrəndilər?**

Bu suallara veriləcək standart cavablar belədir:

**1) Hələ bilmirik.**
**2) Hələ bilmirik.**
**3) Hələ bilmirik.**
**4) Hələ bilmirik.**

Suallar daha da artırıla bilər, amma cavabların sabitliyi heç dəyişməyəcək. (Elaine Morgan, The Scars of Evolution, New York: Oxford University Press, 1994, s. 5)

## TƏKAMÜLÇÜLƏRİN İRƏLİ SÜRDÜYÜ BƏŞƏR TARİXİ TABLOSUNUN YALAN OLDUĞUNU GÖSTƏRƏN TAPINTILAR

Arxeoloq Maykl A. Kremo (Michael A. Cremo) və Riçard Tomson (Richard L. Thompson) tərəfindən hazırlanan Qadağan olunmuş arxeologiya kitabında təqdim edilən dəlillər təkamülçülərin irəli sürdükləri insanın tarixi mövhumunu alt-üst etdi. Bu tapıntılar təkamülçü anlayışına görə, heç gözlənilməyən dövrlərdə gözlənilməz tapıntıları aşkara çıxardı. Məsələn, 1950-ci illərdə Kanada Beynəlxalq Muzeyində tədqiqatçı Tomas E. Li Huron gölünün şimalında, Şegiandadakı buzlaqlardan qalan çöküntülərin içərisində təkmilləşmiş daş alətlər tapmışdır. Bunların yaşlarının 65 min ilə 125 min il arasında olduğu aşkar olunduğu zaman nəticələrin elan edilməsi təxirə

salınmışdır. Çünki elm dünyasına hakim olan yanlışlığa görə, Şimali Amerikaya ilk insanların köçü 120 min il əvvəl Sibirdən olmuş və bunun daha əvvəl olduğunu iddia etmək mümkün deyildi.

Kitabda verilən başqa bir misal isə belədir: Karlos Ameqino (Carlos Ameghino) Argentinanın Miramar ərazisində arxeoloq Pliosen dövrünə aid korlanmamış 3 milyon illik süxur törəmələrində bola daşları tapmışdır. Eyni qatda artıq Cənubi Amerikada nəsli kəsilmiş bir Şimali Amerika məməlisinin sümüyü tapılmışdır. Bu sümüyün içinə sancılmış şəkildə bir çaxmaq daşından ox ucu da tapılmışdı. Daha sonra bir başqa tədqiqatçı eyni təbəqədə insan çənəsinin parçasını tapdı. Halbuki, darvinistlərə görə, bola daşları və ox ucları düzəldə bilən insanlar ancaq 100-150 min il əvvəl meydana gəlmişdilər. Dolayısilə, 3 milyon il əvvələ aid bola daşları bu daşların içində tapılan sümüklər və ox ucu təkamülçülər üçün izah olunması mümkün olmayan qazıntılardır. Bu vəziyyət təkamül nəzəriyyəsinin elmi tapıntılarla uyğunsuzluğunu bir daha göstərir. (Chi, Nisan 2005, sf. 46)

İngilis tədqiqatçı-yazıçısı Maykl Beycent (Michael Baigent) isə "Qədim izlər" (Ancient Traces) adlı kitabında 1891-ci ildə 260-320 milyon illik bir qızıl zəncirin tapıldığını izah edir. Bu zəncirin 8 karat qızıl və 16 karat başqa bir metalın əridilərək qarışığından hazırlanmış olduğu məlum olmuşdur. Bir kömür parçasının içindən çıxan bu qızıl zəncirinin orta hissəsi xeyli köhnələrək aşınmış, lakin uc hissələri yaxşı vəziyyətdə idi və iki ucu bir-birinə sıx bağlı idi. Aşınmış hissənin, kömür içində nəzərəçarpacaq dərəcədə basılmış izi qalmışdır. Bütün bunlar tapılan zəncirin kömür parçası qədər qədim olduğunu göstərir. Kömürün çıxarıldığı mədəndəki yataqların tarixi isə 260-320 milyon il arasındadır. (Cremo and Thompson, Forbidden Archaeology, s. 392) Təkamülçülərin insanın belə olmadığı iddia etdikləri bir dövrdə mədəniyyətin əhəmiyyətli göstəricilərindən biri olan qızıl bəzək əşyasının tapılması təkamülçülərin çəkdiyi bəşəriyyət tablosunu yerlə-yeksan edir.

Bir cəmiyyətdə qızıl istifadə edilirsə, bəzək əşyaları meydana gəlirsə, bu, həmin cəmiyyətin mədəni həyat tərzi sürməsinin əhəmiyyətli dəlilidir. Bundan əlavə, qızıl zəncirin düzəldilə bilməsi həm peşəkarlıq, həm də texniki təchizat tələb edən bir işdir. Daş alətlərdən istifadə edilib xam qızıldan biçimli zəncirin düzəldilməsi qeyri-mümkündür. Açıq-aydın görünür ki, günümüzdən milyonlarla il əvvəl yaşayan insanların da bəzək əşyaları və cavahirat haqqında anlayışları var idi, estetikadan zövq alır, insan kimi həyat sürürdülər.

Bəşər tarixinin təkamülü nəzəriyyəsini darmadağın edən tapıntılardan biri də 378 milyon illik olduğu təxmin edilən dəmir mismar parçasıdır. Ser Devid Brüster (David Brewster) tərəfindən Britaniya Elmi Assosiasiyasına (əvvəlki adı- British Association for the Advancement of Science) təqdim etdiyi hesabatda qeyd etdiyi məlumata görə, mismar qum daşının içində tapılmışdır. Qumdaşının çıxarıldığı daş yatağı erkən Devon dövrünə aiddir, bu da təxminən 378 milyon il yaşındadır.

*(Brewster, Queries and Statements Concerning a Nail Found Embedded in a Block of Sandstone, II, s. 51)*

Burada sadəcə bir neçə misalı verilən qazıntılar insanın təkamülçülərin iddia etdiyi kimi heç vaxt yarı-heyvan, yarı-insan bir varlıq olmadığını, qəti şəkildə heyvani həyat tərzi keçirmədiyini göstərir. Maykl Beycent bənzər misalları saydıqdan sonra mövzu ilə əlaqədar belə bir şərh vermişdir:

*... Bəllidir ki, bu verilənlərin heç biri dünya tarixi ilə əlaqədar klassik mühafizəkar elmi anlayış tərəfindən izah edilə bilməz... Əslində, bu dəlillər - yalnız tanış olduğumuz misalların biri belə- göstərir ki, yer üzərində müasir insan çox uzun müddətdən bəri yaşayır.*

Beycentin klassik mühafizəkar olaraq müəyyən etdiyi təkamülçü düşüncə tərzi, həqiqətən də, bu tapıntılar qarşısında çarəsizdir. Arxeologiya tarixi bunun kimi minlərlə misallarla doludur. Lakin təkamülçü zehniyyət bu əhəmiyyətli misalları səylə xalqdan gizləyir, özü isə görməzlikdən gəlir. Darvinistlər ideologiyalarını nə qədər mühafizə etməyə çalışsalar da, təkamülün bir yalan olduğu, yaradılışın isə rədd edilməsi mümkün olmayan elmi bir həqiqət olduğu bütün dəlilləri ilə ortadadır. Allah insanı yoxdan yaratmış, ona ruhundan üfləmiş və bilmədiklərini öyrətmişdir. Allahın ilhamı ilə insan var olduğu ilk gündən bu yana insan kimi həyat tərzi keçirir.

## QAZINTILARIN APARILDIĞI "AYN GEV 1" ADLI SAHƏDƏ ƏLDƏ EDİLƏN TAPINTILAR TARİXİN TƏKAMÜLÜ TEZİSİNİN YALAN OLDUĞUNU GÖSTƏRİR

Aparılan araşdırmalar minlərlə il əvvəl yaşayan insanların hazırkı dövrdə kəndlərdə istifadə edilən alətlərə oxşar alətlərdən istifadə etdiyini göstərir. Hazırkı Fələstin torpaqlarında e.ə. 15.000 il əvvələ aid olan "Ayn Gev 1" adlı qazıntıların aparıldığı yerdə yaşayış məskəni kimi istifadə edilən kürə şəkilli bir daxmanın özülündə taxıl üyütmə daşları, daş həvəngdəstə və oraqlar tapılmışdır. Bu alətlərin ən qədim olanları e.ə. 50.000 ildən daha əvvəlki dövrlərə aiddir.

(John Baines ve Jaromir Malek, Eski Mısır Medeniyeti, İletişim Yayınları, İstanbul, 1986, Giriş Bölümü)

Qazıntılar zamanı tapılan bütün bu əşyalar insan oğlunun ehtiyaclarının hər dövrdə eyni olduğunu və -sahib olduqları texnologiya ilə düz mütənasib olmaqla birlikdə -tapdıqları çıxış yollarının də bir-birinə bənzədiyini göstərir. Taxıl üyütmə daşları, həvəngdəstə, oraq kimi hazırkı dövrümüzdə kəndlərdə ən çox istifadə edilən və ehtiyac duyulan alətlərdən həmin dövrdə də istifadə edilmişdi.

**Bu, sənə söylədiyimiz məmləkətlər haqqında hekayətlərin bəzisidir. Onlardan** *(izi)* **qalanı da vardır, yerlə-yeksan olanı da. Biz onlara zülm etmədik, lakin onlar özləri özlərinə zülm etdilər. Rəbbinin əmri gəldikdə Allahdan başqa çağırdıqları bütlər onları heç nədən qurtara bilmədilər.** *(Bütlər)* **onların ancaq tələfatını artırdı.**
(Hud surəsi, 100-101)

# KEÇMİŞDƏKİ XALQLAR

**Məgər onlara özlərindən əvvəlkilərin – Nuh, Ad və Səmud camaatının, İbrahim qövmünün, Mədyən əhalisinin və alt-üst edilmiş kəndin** *(Lut tayfasının)* **xəbərləri gəlib çatmayıbdırmı? Elçiləri onlara açıq-aydın dəlillər gətirmişdilər. Allah onlara zülm etmədi, lakin onlar özləri özlərinə zülm edirdilər.** (Tövbə surəsi, 70)

Allahın peyğəmbərlər vasitəsilə göndərdiyi müqəddəs çağırış bəşəriyyətin yaradıldığı ilk gündən insanların nəzərinə çatdırılır. Bəziləri buna qulaq asdılar, bəziləri isə onu rədd etdilər. Bəzən də elə oldu ki, bütöv bir kafirlər tayfasından yalnız cüzi bir insan toplusu Peyğəmbərin ardınca getdi.

Ancaq müqəddəs çağırışın göndərildiyi xalqların böyük əksəriyyəti onu qəbul etmədi. Bundan əlavə, bu xalqlar Uca Allaha itaətsizliklə kifayətlənmir, həmçinin onlara göndərilən peyğəmbərləri və onlara inanan ardıcıllarını kobudcasına alçaldır, onları məsxərəyə qoyurdular. Hər dəfə peyğəmbərləri "yalanda, kafirlikdə və sehrbazlıqda, divanəlikdə, acgözlükdə və azğınlıqda" təqsirləndirirdilər. Üstəlik, xalqın içindən çıxan əyanlar peyğəmbərlərin həyatına da qəsd edirlər, halbuki peyğəmbərlərin hər biri öz xalqına ona nəsihət vermək və ona Allaha səcdə etməyin vacibliyini xəbər vermək üçün göndərilmişdi. Onlar nə pul, nə vəzifə, nə də digər dünyəvi nemət istəmirdilər. Onların bütün fəaliyyəti yalnız xalqı haqq dinə qayıtmağa və başqa həyata başlamağa dəvət etməkdən ibarət idi.

Keçmişdəki tarixi hadisələrin parlaq nümunəsi kimi Şuayb peyğəmbərlə onun göndərildiyi Mədyən çarlığının xalqı arasında baş verən hadisəni göstərmək olar. Mədyənliləri onların törətdiyi ədalətsizliklərdən çəkinməyə və Allaha inanmağa səsləyən Şuayb peyğəmbərin gəlişinə reaksiyası diqqəti xüsusilə cəlb edir:

**Mədyən qövmünə də qardaşları Şueybi** *(göndərdik)*. **O dedi: "Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa ilahınız yoxdur. Ölçünü və çəkini əskiltməyin. Mən sizi bolluq içində görürəm və qorxuram ki, başınıza** *(hər şeyi)* **bürüyən günün əzabı gələ.**

**Ey qövmüm! Ölçüyə və çəkiyə ədalətlə tam riayət edin, insanların mallarını əksik verməyin və yer üzündə fəsad yaymaqla pis işlər görməyin!**

**Əgər möminsinizsə,** *(bilin ki,)* **Allahın saxladığı** *(nemətlər)* **sizin üçün daha xeyirlidir. Mən sizin üstünüzdə gözətçi deyiləm".**

**Onlar dedilər: "Ey Şueyb! Atalarımızın ibadət etdikləri** *(tanrılardan)*, **yaxud mallarımızı istədiyimiz kimi istifadə etməkdən vaz keçməyimizi sənə namazınmı əmr edir? Doğrudan da, sən yumşaq xasiyyətlisən, ağıllısan".**

**O dedi: "Ey qövmüm! Bir deyin görək, əgər mən Rəbbimdən açıq-aydın bir dəlilə istinad edirəmsə, O da Öz tərəfindən mənə gözəl bir ruzi**

**veribsə, onda necə olsun?" Sizə qadağan etdiyim şeyləri etməklə sizin əleyhinizə çıxmaq istəmirəm. Mən ancaq bacardığım qədər islah etmək istəyirəm. Mən ancaq Allahın sayəsində uğur qazanıram. Mən yalnız Ona təvəkkül edir və yalnız Ona üz tuturam.**

**Ey qövmüm! Qoy mənimlə olan ixtilafınız, Nuh qövmünün, yaxud Hud qövmünün, yaxud Saleh qövmünün başına gələnlərin eynisini sizin də başınıza gətirməsin. Lut qövmü də sizdən uzaq deyildir".**

**Rəbbinizdən bağışlanma diləyin, sonra Ona tövbə edin. Həqiqətən, Rəbbim Rəhmlidir, Sevəndir** *(həm də Seviləndir)***.**

**Onlar dedilər: "Ey Şueyb! Dediklərinin çoxunu anlamırıq. Biz səni aramızda zəif görürük. Əgər qəbilən olmasaydı, səni daşqalaq edərdik. Sən bizim üçün heç də böyük bir adam deyilsən".**

**O dedi: "Ey qövmüm! Məgər mənim qəbiləm sizin üçün Allahdan da əzizdir? Siz Onu saymayıb unutdunuz. Şübhəsiz ki, Rəbbim sizin nə etdiklərinizi əhatə edir.**

**Ey qövmüm! Əlinizdən gələni edin, mən də edəcəyəm. Rüsvayedici əzabın kimə gələcəyini və kimin yalançı olduğunu tezliklə biləcəksiniz. Gözləyin! Şübhəsiz ki, mən də sizinlə birlikdə gözləyirəm".**

**Əmrimiz gəldikdə Şueybi və onunla birlikdə iman gətirənləri Öz mərhəmətimizlə xilas etdik. Zülm edənləri isə qorxunc səs yaxaladı və onlar öz evlərində üzüqoylu düşüb qaldılar.**

**Sanki orada heç yaşamamışdılar. Səmud qövmü məhv olduğu kimi Mədyən qövmü də məhv olsun!** (Hud surəsi, 84-95)

Allah onları xeyirxahlığa və ədalətə səsləyən Şuayb peyğəmbəri "daşlarla döyərək" öldürməyi düşünən Mədyən xalqını bu cür cəzalandıraraq məhv etdi. Mədyənlilər Quranda adı çəkilən yeganə misal deyillər. Şuayb və onun xalqı arasında olan dialoqlardan da aydın olduğu kimi, Mədyən sakinlərindən əvvəl və sonra da bir çox icma və tayfalar yer üzündən Allahın qəzəbi nəticəsində silinmişdir.

Daha sonra biz keçmişin məhv olmuş sivilizasiyaları haqda arxeoloji məlumatlardan bəhs edəcəyik. Quranda bu xalqların həyat tarixi bütün təfsilatı ilə təsvir edilir. Uca Allah insanları bu çarlıqların başına gələn pis aqibət haqda düşünməyə və bundan özləri üçün dərs götürməyə çağırır.

Maraqlısı budur ki, Allahın qəzəbinə uğramış xalqlar əksər hallarda yüksək səviyyədə inkişaf etmiş sivilizasiyaya malik idilər. Bu xüsusiyyət Quranda xüsusi qeyd edilir:

**Biz onlardan əvvəl özlərindən daha qüvvətli neçə-neçə nəsilləri məhv etdik. Onlar diyarbədiyar gəzib dolaşırdılar. Məgər** *(əzabdan)* **qaçıb qurtara bildilərmi?"** (Qaf surəsi, 36)

Ayədə həmin cəmiyyətlərin "güclü" olmasından bəhs edilir, görünür, adıçəkilən cəmiyyətlər güclü hərbi-dövlət sisteminə malik idilər, yeni torpaqları və xalqları işğal edir, başqalarından fərqlənən özünəməxsus arxitekturaya malik şəhərlər salırdılar.

Məhv olmuş səltənətlərin bu xüsusiyyətləri sizə texnologiya və elmin

köməyi ilə yaradılmış yüksək inkişaflı dünya, mərkəzləşdirilmiş dövlətlər və böyük şəhərlər yaradan, ancaq bütün bunların Allahın bəxş etdiyi gücün sayəsində mümkün olduğunu unudan əksər müasir cəmiyyətləri xatırlatmırmı?! Bu cəmiyyətlər Allahın rəhminə etinasızlıq göstərərək Onun əmrlərinə tabe olmurdular. Ancaq ayədə deyildiyi kimi, məhv edilmiş xalqları nə yüksək inkişaflı sivilizasiya, nə də güc həlak olmaqdan xilas edə bilmədi, çünki onların irəli sürdükləri hər şey Allahın qanunlarını inkar etməyə, nifaq toxumu səpməyə və yer üzündə hərc-mərclik yaratmağa əsaslanırdı. Ətrafımızda ədalətsizlik və əzab toxumu səpdiyimiz müddətdə bizi də bu cür tale gözləmirmi?

Arxeoloji tədqiqatların nəticələri hadisələrin doğruluğunu faktiki olaraq təsdiqlədi və Quranın ibrətamiz xarakterini aydın və inandırıcı şəkildə göstərdi. Uca Allah bizi əvvəlki nəsillərin başına gələnləri unutmamağa və yer üzündə Onun rəhminə layiq yaşamağa çağırır:

**Biz səndən əvvəl də məmləkət əhlindən yalnız özlərinə vəhy etdiyimiz kişilərdən elçi göndərdik. Məgər** *(müşriklər)* **yer üzündə gəzib dolaşıb özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmürlər? Əlbəttə, Axirət yurdu** *(Allahdan)* **qorxanlar üçün daha xeyirlidir. Məgər anlamırsınız?**

**Elçilər** *(hər dəfə)* **ümidlərini itirdikdə və özlərinin yalançı hesab edildiklərini güman etdikdə köməyimiz onlara gəlir və dilədiyimiz kəs də nicat tapırdı. Günahkar tayfadan əzabımız əsla dəf olunmaz.**

**Onların rəvayətlərində ağıl sahibləri üçün bir ibrət vardır.** *(Bu Quran)* **uydurulmuş bir kəlam deyildir. Ancaq özündən əvvəlkiləri təsdiqləyən və hər şeyi müfəssəl izah edəndir; iman gətirən bir camaat üçün hidayət və mərhəmətdir.** (Yusuf surəsi, 109-111)

Qurani-Kərimdə bəhs edilən keçmişdəki hadisələrin hekayələri şüurlu insan üçün bir ibrət dərsidir. Allah-Təalaya qarşı çıxan, Onun əmrlərini rədd edən və Onun peyğəmbərlərini ələ salan xalqlar bizim üçün ibrətdir. İnsanın uydurma gücü Allah qarşısında necə də miskin və cılızdır. Biz keçmişin ibrətamiz hadisələrini sizə xronoloji ardıcıllıqla çatdıracağıq. Şüurlular isə bunların üzərində düşünəcəklər...

# NUH TUFANI

**Biz Nuhu öz qövmünə** *(peyğəmbər)* **göndərdik. O, min ildən əlli il az bir müddət ərzində onların arasında qaldı. Tufan onları zülm etdikləri zaman yaxaladı.** (Ənkəbut surəsi, 14)

Nuh peyğəmbərin xalqının başına gəlmiş tufanın hekayəti praktiki olaraq bütün dünya millətlərinin mədəni irslərində əsas yer tutur.

Bu süjet Qurani-Kərim ayələrində də xüsusi qeyd edilir. Bir çox ayələrdə Nuh peyğəmbərin onun öyüdlərinə və xəbərdarlıqlarına baxmayan xalqından, bu xalqın peyğəmbərin gəlişinə reaksiyasından, həmçinin sonralar bu xalqın başına gəlmiş hadisələrin gedişatından ətraflı bəhs edilir.

Uca Allah Yeganə Yaradana inanmayan, özünə yeni tanrılar seçən xalqı qorumaq, onun səhvlərini dərk edib tək Allaha səcdə etməsi üçün Nuh peyğəmbəri göndərdi. Nuhun onları gözləyən cəza haqda dəfələrlə xəbərdarlıq etməsinə və həqiqi dinin ardınca getmək çağırışlarına baxmayaraq insanlar öz günahlarında israrlı idilər. Bu haqda Qurani-Kərimdə belə şərh edilir:

**Həqiqətən, Biz Nuhu öz qövmünə elçi göndərdik. O dedi: "Ey qövmüm! Allaha ibadət edin! Sizin Ondan başqa heç bir ilahınız yoxdur. Məgər qorxmursunuz?"**

**Qövmünün kafir zadəganları dedilər: "O da sizin kimi sadəcə bir insandır. Sizə böyüklük etmək istəyir. Əgər Allah** *(elçi göndərmək)* **istəsəydi, mələklər göndərərdi. Biz bunu ulu babalarımızdan eşitməmişik.**

**Bu ancaq cinli bir adamdır. Odur ki, ona münasibətdə bir müddət gözləyin!"**

**O dedi: "Ey Rəbbim! Onların məni yalançı saymasına qarşı mənə kömək et!"** (Muminun surəsi, 23-26)

Bu ayədə adı çəkilən dəstələr, yəni aristokratiya Nuhu tamahkarlıqda, cəmiyyətdə tanınmaq və zənginləşmək arzusunda günahlandırıb onu "ağılsız" damğası ilə ləkələyərək xalqın arasından qovmağa çalışırdı.

Bunun ardınca Allah belə buyurmuşdur: **Biz ona vəhy etdik: "Gözlərimiz önündə və vəhyimizlə gəmini düzəlt. Əmrimiz gəldiyi və təndir qaynadığı zaman hər canlıdan bir cüt** *(erkək və dişi)*, **barəsində söz keçmiş** *(əleyhinə hökm verilmiş)* **kəslər istisna olmaqla, öz ailəni gəmiyə mindir. Zalımlar barəsində Mənə müraciət etmə. Çünki onlar** *(suya)* **qərq olunacaqlar."** (Muminun surəsi, 27) Nuh peyğəmbərə bildirdi ki, onun xalqının bədəməl, cinayətkar və zülmkarları su altında qalaraq cəzalandırılacaq, ona inananlarsa xilas olacaqlar.

Son xəbərdarlıqdan və xalq tövbə etməkdən imtina edəndən sonra tezliklə hesab saatı yetişdi, yer su püskürdü, onlar şiddətli yağışlarla birlikdə irimiqyaslı selə səbəb oldular. Allah Nuh peyğəmbərə buyurdu: **..."***(Heyvanların)* **hər növündən bir cüt, barələrində söz keçmiş kəslər istisna olmaqla, öz ailəni və bir də iman gətirənləri gəmiyə mindir"...** (Hud surəsi, 40)

Nuhun gəmisinə qalxanlardan savayı hamı, o cümlədən atasını atıb dağda gizlənərək xilas olmağı güman edən Nuhun oğlu da sel sularında boğuldular. Qurana görə, “sular çəkildikdə” tufandan sonra “əmr icra olundu”, gəmi əl-Cudi dağına endi.

Aparılmış geoloji, tarixi və arxeoloji tədqiqatlar bu hadisələrin bu cür - məhz Quranda xəbər verildiyi kimi baş verdiyini sübut edir. Yerlərin coğrafi və insanların adlarındakı müəyyən fərqlərə baxmayaraq qədim mədəniyyətin tarixi sənədləri tufandan heyrətamiz uyğunluqla bəhs edir, “yolunu azmış xalqın başına gələnlər” isə onların müasirlərinə nəsihət kimi göstərilir.

Bu tufan haqqında İncil və Tövratla yanaşı Şumer, Assuriya, Babil yazılarında, qədim yunan əfsanələrində, Satapath Brahmanın, Mahabharatanın qədim hind eposlarında, Qalle vilayətinin (Böyük Britaniyada) bəzi əfsanələrində, skandinav xalqlarının Eddesində, Litvanın xalq dastanlarında və hətta Çin mənşəli mənbələrdə də bəhs edilir.

Bir-birindən və tufanın güman edildiyi coğrafi rayondan bu qədər uzaq olan şifahi və yazılı mədəni abidələrdə tufan haqda bu cür qəribə oxşar və təfsilatlar necə əmələ gələ bilər?

Bu sualın cavabı aydındır: eyni hadisənin heç bir əlaqəsi olmayan müxtəlif mədəni abidələrdə qeyd edilməsi onu sübut edir ki, insanlar bu bilgiləri ilahi mənbələrdən alırdılar. Uca Allahın əksər xalqlara göndərdiyi peyğəmbərlər Nuh peyğəmbərin xalqının tarixini və onun qorxulu taleyini ibrətamiz nümunə kimi söyləyirdilər, tufan haqda xəbər bu mədəniyyətlərə məhz bu yolla çatdı.

Nuh peyğəmbər və tufan haqda rəvayətlərə bir çox kulturoloji və dini mənbələrdə rast gəlinir, ancaq zaman keçdikcə süjet ya səhv rəvayət edildiyindən, ya da kafir və mürtəd xalqın ölüm şəraitinin bilərəkdən təhrif edilməsi ucbatından öz orijinallığını itirdi. Arxeoloji tədqiqatlar göstərir ki, əslində eyni hadisədən bəhs edən bütün rəvayətlərdən yeganə elmi inandırıcı və müasir faktlara uyğun olan hekayə yalnız Qurani-Kərimin bəhs etdiyidir.

## QURAN HZ. NUH PEYĞƏMBƏR VƏ TUFAN HAQQINDA

Ümumdünya daşqınından Quranın bir çox ayələrində bəhs edilir. Hadisəni təsvir edən ayələr aşağıda xronoloji ardıcıllıqla verilir.

### Nuh Öz Xalqını Dinə Çağırır

**Biz Nuhu öz xalqına** *(elçi)* **göndərdik. O dedi: “Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa ilahınız yoxdur. Mən sizə üz verəcək Böyük günün əzabından qorxuram”.** (Əraf surəsi, 59)

**Həqiqətən, mən sizin üçün etibar edilməli bir elçiyəm. Allahdan qorxun və mənə itaət edin. Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir. Allahdan qorxun və mənə itaət edin!”** (Şuəra surəsi, 107-110)

**Həqiqətən, Biz Nuhu öz qövmünə elçi göndərdik. O dedi: “Ey qövmüm! Allaha ibadət edin! Sizin Ondan başqa heç bir ilahınız yoxdur. Məgər qorxmursunuz?”** (Muminun surəsi, 23)

## Nuh Peyğəmbər Öz Xalqını Allahın Yaxınlaşmaqda Olan Cəzası Haqda Xəbərdar Edir

**Həqiqətən, Biz Nuhu öz qövmünə göndərdik** *(və dedik)*: **"Sən öz qövmünü, onlara ağrılı-acılı bir əzab gəlməmişdən əvvəl xəbərdar et!"** (Nuh surəsi, 1)

**"Siz rüsvayedici əzabın kimə gələcəyini və daimi əzabın kimə üz verəcəyini mütləq biləcəksiniz."** (Hud surəsi, 39)

**"Allahdan başqasına ibadət etməyin! Mən sizi yaxalayacaq məşəqqət gününün əzabından qorxuram."** (Hud surəsi, 26)

## Xalqın Nuh Peyğəmbərin Öyüdünü Rədd Etməsi

**Xalqının zadəganları dedilər: "Həqiqətən də, biz, səni açıq-aydın azğınlıq içində görürük!"** (Əraf surəsi, 60)

**Onlar dedilər: "Ey Nuh! Sən bizimlə mübahisə etdin və mübahisəmizi də çox uzatdın. Əgər doğru danışanlardansansa, bizə vəd etdiyin** *(əzabı)* **gətir."** (Hud surəsi, 32)

*(Nuh)* **gəmini düzəldir, qövmünün zadəganları isə hər dəfə yanından keçdikcə onu ələ salırdılar. O isə deyirdi: "Əgər siz bizi ələ salırsınızsa, biz də sizi, siz bizi ələ saldığınız kimi ələ salacağıq."** (Hud surəsi, 38)

**Qövmünün kafir zadəganları dedilər: "O da sizin kimi sadəcə bir insandır. Sizə böyüklük etmək istəyir. Əgər Allah** *(elçi göndərmək)* **istəsəydi, mələklər göndərərdi. Biz bunu ulu babalarımızdan eşitməmişik. Bu ancaq cinli bir adamdır. Odur ki, ona münasibətdə bir müddət gözləyin!"** (Muminun surəsi, 24-25)

**Onlardan əvvəl Nuh qövmü** *(elçiləri)* **yalançı hesab etmişdi. Onlar qulumuzu yalançı sayıb: "O, dəlidir!"– dedilər və ona hədə-qorxu gəldilər.** (Qəmər surəsi, 9)

## Hz. Nuha Tabe Olanların Təhqir Edilməsi

**Onun qövmünün kafir zadəganları dedilər: "Biz sənin özümüz kimi sadəcə bir insan hesab edir və içimizdən ancaq düşüncəsiz olan ən rəzil adamların sənə qoşulduğunu görürük. Həmçinin sizin bizdən üstün olduğunuzu da görmürük. Əksinə, biz sizi yalançı hesab edirik."** (Hud surəsi, 27)

**Onlar dedilər: "Sənə ən rəzil adamlar tabe olduğu halda biz sənə inanarıqmı?"** *(Nuh)* **dedi: "Mən onların nə etdiklərini bilmirəm! Onların haqq-hesabı yalnız Rəbbimə aiddir. Kaş başa düşəydiniz! Mən iman gətirənləri qovan deyiləm. Mən yalnız açıq-aşkar bir qorxudanam."** (Şuəra surəsi, 111-115)

## Allah Nuh Peyğəmbəri Ümidsizlik və Müsibətdən Qoruyur

**Nuha belə vəhy olundu: "Qövmündən, daha əvvəl iman gətirənlər istisna olmaqla artıq heç kəs iman gətirməyəcək. Elə isə onların etdikləri əməllərə görə kədərlənmə.** (Hud surəsi, 36)

## Hz.Nuhun Duaları

**Mənimlə onlar arasında qəti hökm ver, məni və mənimlə birlikdə olan möminləri** *(əzabdan)* **qurtar!”** (Şuəra surəsi, 118)

**O, Rəbbinə yalvarıb: “Məni üstələdilər!** *(Mənə)* **kömək et!”– dedi.** (Qəmər surəsi, 10)

**O dedi: “Ey Rəbbim, mən xalqımı gecə də, gündüz də dəvət etdim. Amma dəvətim onların** *(haqdan)* **qaçmalarını daha da artırdı.** (Nuh surəsi, 5-6)

**O dedi: “Ey Rəbbim! Onların məni yalançı saymasına qarşı mənə kömək et!”** (Muminun surəsi, 26)

**Nuh Bizə yalvarıb yaxardı. Biz** *(çağırışa)* **necə də gözəl cavab verənik!** (Saffat surəsi, 75)

## Nuhun Gəmisinin Tikilməsi

**Gözlərimizin önündə və vəhyimiz üzrə gəmini düzəlt. Zalım olanlardan ötrü Mənə müraciət etmə. Şübhəsiz ki, onlar** *(suda)* **batırılacaqlar.”** (Hud surəsi, 37)

## Nuh Peyğəmbərin Xalqının Cəzası

*(Kafirlər)* **onu yalançı hesab etdilər. Biz onu və onunla birlikdə gəmidə olanları xilas etdik. Ayələrimizi yalan hesab edənləri isə** *(suya)* **qərq etdik. Doğrudan da, onlar kor adamlar idilər.** (Əraf surəsi, 64)

**Yerdə qalanları isə suya qərq etdik.** (Şuəra surəsi, 120)

**Biz Nuhu öz qövmünə** *(peyğəmbər)* **göndərdik. O, min ildən əlli il az bir müddət ərzində onların arasında qaldı. Tufan onları zülm etdikləri zaman yaxaladı.** (Ənkəbut surəsi, 14)

## Hz.Nuhun Oğlunun Cəzası

*(Gəmi)* **onları dağlar kimi dalğalar içərisində apardığı zaman Nuh kənarda duran oğlunu səsləyib dedi: “Oğlum! Bizimlə birlikdə** *(gəmiyə)* **min, kafirlərdən olma!” O dedi: “Məni sudan qoruyacaq bir dağa sığınacağam!”** *(Nuh)* **dedi: “Bu gün, Allahın rəhm etdiklərindən başqa heç kəs Onun əmrindən qoruna bilməz!” Sonda dalğa onları bir-birindən ayırdı və o, suda boğulanlardan oldu.** (Hud surəsi, 42-43)

## Möminlərin Xilas Edilməsi

**Biz onu və onunla birlikdə olanları yüklü gəmidə xilas etdik.** (Şuəra surəsi, 119)

**Biz onu və gəmidə olanları xilas edib bu möcüzə ilə aləmlərə ibrət dərsi verdik.** (Ənkəbut surəsi, 15)

## Tufanın Fiziki Xüsusiyyətləri Haqda

**Biz göyün qapılarını leysan yağışı ilə açdıq. Yeri yarıb bulaqlar qaynatdıq.** *(Göydən tökülən və yerdən çıxan)* **sular əzəldən yazılmış bir iş üçün bir-birinə qovuşdu. Biz onu taxtalardan pərçimlənib mismarlanmış gəmidə daşıdıq.** (Qəmər surəsi, 11-13)

**Nəhayət, əmrimiz gəldiyi və təndir qaynadığı zaman Biz** *(Nuha)* **dedik:**

**“***(Heyvanların)* **hər növündən bir cüt, barələrində söz keçmiş kəslər istisna olmaqla, öz ailəni və bir də iman gətirənləri gəmiyə mindir”.** *(Əslində)*, **onunla birlikdə az adam iman gətirmişdi.** (Hud surəsi, 40)

*(Gəmi)* **onları dağlar kimi dalğalar içərisində apardığı zaman Nuh kənarda duran oğlunu səsləyib dedi: “Oğlum! Bizimlə birlikdə** *(gəmiyə)* **min, kafirlərdən olma!”** (Hud surəsi, 42)

**Biz ona vəhy etdik: “Gözlərimiz önündə və vəhyimizlə gəmini düzəlt. Əmrimiz gəldiyi və təndir qaynadığı zaman hər canlıdan bir cüt** *(erkək və dişi)*, **barəsində söz keçmiş** *(əleyhinə hökm verilmiş)* **kəslər istisna olmaqla, öz ailəni gəmiyə mindir. Zalımlar barəsində Mənə müraciət etmə. Çünki onlar** *(suya)* **qərq olunacaqlar.** (Muminun surəsi, 27)

### Tufanın Başa Çatması Və Dağa Enmiş Nuhun Gəmisi Haqda

*(Sonra)* **deyildi: “Ey yer, suyunu ud! Ey göy,** *(yağışını)* **saxla!” Su çəkildi, iş bitdi və gəmi Cudi** *(dağı)* **üzərində qərar tutdu.** *(Sonra)* **deyildi: “Məhv olsun zalım adamlar!”** (Hud surəsi, 44)

### Tufanın Ibrətamizliyi

**Su aşıb-daşdıqda Biz sizi üzən gəmidə daşıdıq. Sizə bir xatırlatma olsun və yadda saxlayan qulaqlar onu yadda saxlasın deyə** *(belə)* **etdik.** (Haqqə surəsi, 11-12)

### Allahın Nuhu Tərifləməsi

**Aləmlər içərisində Nuha salam olsun! Həqiqətən, Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. Həqiqətən, o Bizim mömin qullarımızdandır.** (Saffat surəsi, 79-81)

## NUHUN TUFANI MƏHƏLLİ FƏLAKƏT İDİMİ?

Tarixçilər tufan faktını inkar edərək öz iddialarını sübut etmək üçün Yer miqyasında qlobal selin real olmaması haqda dəlillər gətirirlər. Bundan əlavə, bu iddia Quran ayələrinin və Allahın göndərdiyi bütün Müqəddəs Kitabların həqiqiliyini tənqid etmək məqsədilə irəli sürülür. Bir sıra alimlərin iddialarına görə, ümumdünya tufanının reallığından bəhs edən və onu təsdiqləyən Müqəddəs Kitablar, o cümlədən Quran insanları aldadırlar.

Bu iddialar insanların təhrifinə məruz qalmamış yeganə müqəddəs mənbə və birbaşa Allahın vəhyi olan Qurani-Kərim ayələrinə münasibətdə tam əsassız və tutarsızdır. Quranın tufan haqda bəhs etdiyi hekayət Tövratda və digər mədəniyyətlərdə olan versiyalardan köklü surətdə fərqlənir.

Əhdi-ətiqin ilk beş kitabı olan Tövrat iddia edir ki, bütün dünyanı bürüyən tufan qlobal xarakterli idi. Quranda isə bu cür məlumat yoxdur. Əksinə, tufan haqda bəhs edən ayələrdən aydın olur ki, tufan məhəlli (lokal) xarakter daşıyırdı və o, bütün dünya üçün deyil, yalnız Nuh peyğəmbərin xəbərdar etdiyi xalqa cəza olaraq göndərilmişdi.

İzahlardakı bu fərqi Tövrat və Quran rəvayətlərinin müqayisəli təhlilində asanlıqla izləmək olar. Tarix boyu bir çox ixtisar və əlavələrlə təhrif edilmiş Tövrat tufandan belə bəhs edir:

***“Və Rəbb gördü ki, yer üzündə insan pisliyi çoxalır, hər gün insan düşüncəsi daha da pozulur. Və Rəbb dedi: “Mən insanı yaratdığıma təəssüfləndim”. Və Rəbb dedi: “Yaratdığım adamı, heyvanları, sürünənləri və göylərin quşlarını torpağın üzərindən siləcəyəm. Çünki yaratdığıma təəssüfləndim”. Fəqət Nuh hidayətə çatdı”*** (Təkvin, 6/5-8)

Quran isə Uca Allahın bu cəzanı bütün dünyaya deyil, yalnız Nuh xalqının üzərinə düşdüyünü xəbər verir. Eyni Ad qövmünə göndərilmiş Hud peyğəmbər kimi (Hud surəsi, 50) və ya Səmud xalqına göndərilən Saleh (Hud surəsi, 61) və yaxud başqa peyğəmbərlər kimi Nuh da yalnız öz xalqına göndərilmişdi. Və tufan da yalnız Nuhun xalqını məhv etdi.

**Biz Nuhu öz xalqına elçi göndərdik.** *(O dedi)*: **“Həqiqətən, mən sizin üçün açıq-aydın xəbərdar edən** *(bir elçiyəm)*. **Allahdan başqasına ibadət etməyin! Mən sizi yaxalayacaq məşəqqət gününün əzabından qorxuram.”** (Hud surəsi, 25-26)

Nuh peyğəmbərin çağırışına etinasız yanaşan və Allaha qarşı üsyan edən xalq məhv edildi. Bu haqda bəhs edən Quran ayələri bu iddianın həqiqiliyinə heç bir şübhə yeri qoymur.

*(Kafirlər)* **onu yalançı hesab etdilər. Biz onu və onunla birlikdə gəmidə olanları xilas etdik. Ayələrimizi yalan hesab edənləri isə** *(suya)* **qərq etdik. Doğrudan da, onlar kor adamlar idilər.** (Əraf surəsi, 64)

**Biz onu və onunla birlikdə olanları Öz mərhəmətimizlə xilas etdik. Ayələrimizi yalan hesab edənlərin isə kökünü kəsdik. Onlar iman gətirən deyildilər.** (Əraf surəsi, 72)

Bundan əlavə, Allah Quranda bizi xəbərdar edir ki, O, dəfələrlə insanlara peyğəmbərlər göndərərək onları törətdikləri pozğunluqlar barədə xəbərdar edəcək və onlara nəsihətlər verəcək, ancaq küfr və peyğəmbərləri təhqir etmək, günahları yumaq nəsihətlərindən və haqq yola gəlməkdən imtina etmək Allahın qəzəbini dayandırmaq gücündə olmayan həddə gətirib çıxara bilər. “Qəsəs” surəsinin ayələrindən biri:

**Sənin Rəbbin** *(şəhərlərdən)* **ən mühüm olanına, özlərinə ayələrimizi oxuyan bir elçi göndərməmiş o şəhərləri məhv etmədi. Biz yalnız əhalisi zalım olan şəhərləri məhv etdik.** (Qəsəs surəsi, 59)

Allah dəfələrlə öz peyğəmbərlərini göndərərək xalqları xəbərdar edir, indi heç də bütün dünya deyil, yalnız Nuh peyğəmbərin xalqı məhv edildi, çünki onlara Rəbbin elçiləri göndərilməmişdi.

Qurani-Kərim ayələrindən aydın olur ki, daşqın qlobal fəlakət xarakteri daşımırdı, o, yalnız məhəlli təbii fəlakət idi. Təxmin edilən fəlakət zonasında aparılmış arxeoloji qazıntılar Quranın dediklərini təsdiq edir: tufan dünyəvi deyil, yalnız Mesopotamiyanın bir hissəsinin başına gələn irimiqyaslı fəlakət idi.

# NUHUN GƏMİSİNƏ BÜTÜN HEYVANLARMI GÖTÜRÜLMÜŞDÜ?

Əhdi-cədidin şərhçiləri güman edirlər ki, Nuh tikdiyi gəmisinə hər növ heyvanları götürdü və beləliklə, heyvanat aləmi məhv olmaqdan xilas oldu. Bu fərziyyəyə görə, gəmiyə Yer üzündə məskunlaşmış bütün növ heyvanlar toplanmışdı. Ancaq bu iddianın tərəfdarları çox çətin vəziyyətə düşür və bununla bağlı yaranan bir çox suallara cavab verə bilmirlər: gəmiyə götürülən heyvanlar nə ilə qidalanırdı? Qısa müddət ərzində onlar gəmiyə necə toplandılar? Onlara necə qulluq edilirdi? Onlar bir-birindən necə təcrid edilmişdilər? Əlbəttə, bu suallara cavab vermək mümkün deyil. Bundan əlavə müxtəlif qitələrdən olan heyvanların bir yerə necə toplanması tam aydın deyil. Məsələn, qütb zonasının məməliləri, Avstraliya kenqurusu və ya Amerika qitəsi üçün xarakterik bizonlar. Sonra suallar bir-birinin ardınca düzülür: vəhşi, yırtıcı və insan həyatı üçün təhlükəli zəhərli heyvanlar (ilanlar, əqrəblər və s.) necə tutulmuşdular? Bu heyvanlar daşqın qurtarana qədər öz təbii yuva şəraitlərindən kənarda necə qaldılar?

Ancaq bunlar Tövratın şərhçilərinin qarşılaşdığı çətinliklərdir. Quranda bütün növ heyvanların gəmiyə götürülməsi haqda məlumat yoxdur. Əvvəl qeyd etdiyimiz kimi, Quranda daşqının müəyyən coğrafi məkanda lokallaşdığı haqda xəbər verilir, buna görə də gəmiyə götürülən heyvanlar məhz Nuhun yaşadığı coğrafi arealın sakinləri olmalı idilər.

Amma hətta bu rayonda məskunlaşmış heyvanları belə bir gəmiyə toplamağın mümkün olmasını da güman etmək olmaz. Nuh peyğəmbərin və onun dünyanın dörd bir yanına səpələnib yüzlərlə heyvanların cütlərini toplayan bəzi davamçılarını (Hud surəsi, 40) təsvir etmək çətindir. Bu coğrafi arealın faunası o qədər zəngin və çoxsaylıdır ki, dişi və erkək zatının seçiminin vacibliyini də nəzərə alsaq, yalnız bu rayonun həşəratlarını yığmaq belə mümkün deyil.

Buna görə də yalnız asanlıqla tutulub saxlanıla bilən, xüsusən insanların əhlilləşdirdiyi heyvanların, yəni ev heyvanlarının - dəvələrin, atların, davarın və mal-qaranın, bir sözlə, tufan ucbatından bütün canlılarını itirmiş rayonda yeni həyat qurmaq üçün insana vacib olan heyvanların gəmiyə toplandıqlarını güman etmək məntiqli olardı.

Burada qeyd etmək lazımdır ki, Uca Allahın Nuh peyğəmbərə heyvanları toplamaq halda əmrinin müdrikliyi və mənası heyvan nəsillərinin qorunmasında deyil, tufandan sonra insanların həyatını davam etdirmək və ehtiyaclarını təmin etməkdədir, çünki lokal tufan nəticəsində bütün heyvan nəslinin yox olması həqiqətəuyğun deyil. Axı sular çəkildikdən sonra qonşu arealların heyvanları bura köçəcək və bu məskənə yenə əvvəlki rəngarənglik və canlılıq verəcək.

Allahın buyurduqlarında tufandan sonrakı həyat üçün şərtlərin qorunması əsas məsələ idi və heyvanlar bu məqsədlə toplanmalı idilər.

## SULAR NƏ QƏDƏR QALXMIŞDI?

Nuh tufanının şərhinin daha bir mübahisəli məqamı var: sular hansı hündürlüyə qalxmışdı? Sular dağları örtəcək qədər qalxmışdımı? Məlum olduğu kimi, Qurani-Kərimdə deyilir ki, tufan bitəndə Nuhun gəmisi ən hündür nöqtə olan əl-Cudi dağına endi. Ərəb dilindən tərcümədə "əl-Cudi" "ucaldılmış yer, yüksəliş" deməkdir. "Əl-Cudi" sözü Quranda dağın coğrafi adı deyil, yalnız Nuh gəmisinin endiyi yüksək yeri ifadə etmək üçün işlədilir. Bundan əlavə, Quranda istifadə edilmiş "əl-Cudi" sözünün mənasından belə nəticə çıxarmaq olar ki, su müəyyən yüksək səviyyəyə qədər qalxıb, ancaq yenə də dağların təpəsinə çatmayıb. Yəni daşqın suları Tövratda da deyildiyi kimi, bütün dağları deyil, yalnız müəyyən yeri basmışdı.

## TUFANIN ƏRAZİSİ

Daha çox ehtimal olunan daşqın rayonu Mesopotamiya ovalığı hesab edilir, çünki burada qədim dünyanın iri sivilizasiyaları var idi. Ovalığın Dəclə və Fərat çayları arasındakı coğrafi vəziyyətini nəzərə alsaq, belə məntiqi nəticə çıxarmaq olar ki, sel məhz göstərilən yerdə baş verib. Mesopotamiyanın iki iri çayının daşaraq sahillərindən çıxması çox güman ki, daşqının miqyasını artıran amillərdən biri olub.



**Nuh Tufanını tasvir eden bir illüstrasyon**

Üstəlik, daşqının məhz bu coğrafi rayonda olmasına işarə edən tarixi sübutlar da var. Qədim sivilizasiyanın bizim günümüzə qədər qorunmuş salnamələri arasında o dövrdə baş vermiş daşqını sübut edən sənədlər tapılıb. Nuh xalqının həlak olmasının şahidləri olmuş sivilizasiyalar hadisələrin gedişatını və bu təbii kataklizmin kədərli nəticəsini təsvir ediblər. Həmçinin məlumdur ki, daşqın haqda rəvayətlərin əksəriyyəti Mesopotamiya mənşəlidir. Ancaq ən parlaq sübutlar arxeoloji qazıntılar nəticəsində əldə edilən faktlardır. Onlar bu regionda yaşayan xalqları və mədəniyyətləri məhv edən böyük selin baş verdiyini göstərirlər.

Mesopotamiyada aparılan qazıntılardan aydın olur ki, bu regionda Dəclə və Fəratın öz məcrasından çıxması nəticəsində yaranan gur sellər və fəlakətlər dəfələrlə baş verib. Məsələn, eramızdan 2000 il əvvəl Mesopotamiyanın cənubunda yerləşən Ur şəhərində çar İbbisin hakimiyyətinin bir ili "yerlə göy arasındakı sərhədi götürmüş daşqından sonrakı zaman" kimi xarakterizə edilir. (Max Mallowan, Nuh's Flood Reconsidered, Iraq:XXVI-2, 1964, p.66) Babil hökmdarı Hammurapinin hakimiyyət dövrünün (bizim eradan əvvəl 1700-ci illər) bir ili isə "Eşnunna şəhərinin bir sellə dağılması" kimi tanınır.

Eramızdan əvvəl X əsrdə - Nabumukinapalın hakimiyyət dövründə Babilistanda böyük sel baş verdi. (Ibid.) Bu rayonda güclü sellər həmçinin eramızdan əvvəl VII, VIII, X, XI və XII əsrlərdə baş vermişdi. Belə daşqınlar XX yüzillikdə də - 1925, 1930 və 1954-cü illərdə də baş vermişdi. (Muazzez Ilmiye Cig, Kuran, Incil ve Tevrat'in Sümer'deki Kökleri (The Roots of Qur'an, Old Testament and New Testament in Sumer), 2.b., Istanbul: Kaynak, 1996) Görünür, bu ərazilər daşqınlara coğrafi cəhətdən daim meylli idi və Quranda bildirildiyi kimi Nuh peyğəmbərin daşqınının olması gümanı tam məntiqidir.

## TUFANIN ARXEOLOJİ SÜBUTLARI

Məhv olması haqda Qurani-Kərimdə bəhs edilən xalqların mövcudluğu izlərinin bizim dövrümüzdə aşkar edilməsi təsadüfi deyil. Arxeoloji tədqiqatların təcrübəsindən çıxış etsək, hər hansı bir xalqın kökünün kəsilməsi və ya məhvi ani olaraq, qəfildən baş veribsə, bu xalqın izlərini aşkar etmək ehtimalı çoxdur.

Təbii fəlakətin, müharibənin və ya sürətli köçürülmənin nəticəsi ola bilən hər hansı bir sivilizasiyanın qəfildən yox olması onun izlərini daha yaxşı qoruyub saxlayır. Bu halda evlər və əşyalar qum və gil qatı ilə örtülmüş olur, beləliklə, uzun zaman ərzində heç bir ciddi dəyişikliklərə məruz qalmır və arxeoloqlara uzaq keçmişin məhv olmuş sivilizasiyaları haqda həddən artıq vacib informasiyaları çatdırırlar.

Müasir arxeoloqlar daşqınla bağlı bir çox faktları məhz bunun sayəsində aşkar edə biliblər. Mesopotamiyanın təxminən eramızdan əvvəl 3000-ci ildə məruz qaldığı Nuhun tufanı bütün sivilizasiyanı bir göz qırpımında məhv etdi və yer üzündən silinmiş xalqların yerində yalnız sonralar yaranan yeni mədəniyyətlərin təbəqələri aşkar edilir. Beləliklə, yer özü daşqının aşkar sübutlarını bütün bəşəriyyətə ibrət olsun deyə minilliklər ərzində saxladı.

Daşqın hadisəsini öyrənmək məqsədilə xeyli qazıntılar və arxeoloji ekspedisiyalar aparılmış, onların gedişatında Mesopotamiya düzənliklərindəki dörd iri şəhərin - Ur, Uruk, Kiş və Şuruppakın məruz qaldığı irimiqyaslı daşqının izləri aşkar edilmişdir. Aparılmış qazıntılar göstərir ki, bu şəhərləri b.e.ə. təxminən 3000-ci ildə sel bürümüşdü.

Ur şəhərində aparılmış qazıntılardan başlayaq. Ur şəhərində (indiki Tell-əl-Mükəyyər) aşkar edilmiş qədim sivilizasiya qatları e.ə. 7000-ci illərə aiddir. Ur şəhəri Mesopotamiya mədəniyyətinin yaranmasının və inkişafının mərkəzlərindən biridir. Bu rayonu bir-birini tarixən əvəz edən müxtəlif sivilizasiyalar məskunlaşdırmışdı.

Aparılan arxeoloji qazıntıların nəticələri göstərir ki, bu rayonun mədəniyyəti qəfildən böyük daşqın nəticəsində yox olub və xalqlar burada yalnız müəyyən müddətdən sonra yenidən məskunlaşıblar. Bu regionu öyrənməyə başlayan ilk arxeoloq Britaniya Muzeyindən Riçard X.Xoll oldu. Xollu əvəz edən ser Leonard Vulley Britaniya muzeyinin himayəsi altında Pensilvaniya Universiteti ilə birgə aparılmış arxeoloji ekspedisiyanı davam etdirməyə başladı.




**1. Bağdad, 2. Babil, 3. Dəclə, 4. Mesopotamiya düzənliyi, 5. Fərat, 6. Ur, 7. Fars körfəzi.**

**Son arxeoloji tədqiqatlar Nuh tufanının Mesopotamiya düzənliyində baş verdiyini təsdiqlədi. Daşqın zamanı Dəclə və Fərat çayları hələ indiki qədər körfəzi doldurmamışdı. Kəsik xətlərlə göstərilən sahə allüviumla (alluvion) doldurulmuş hazırkı sərhədləri göstərir.**

Vulley tərəfindən aparılan və dünya miqyasında sensasiyaya səbəb olan qazıntılar 1922-ci ildən 1934-cü ilə qədər davam etdi. Ekspedisiya Bağdad və Fars körfəzi arasındakı səhranın arasında işləyirdi. Sonralar Ur şəhərinin yarandığı bu yerin ilk sakinləri Mesopotamiyanın şimalından gələn və özlərini ubaydulu adlandıran insanlar idi. Bu xalq haqda məlumat axtarmaq üçün son dərəcə dəqiq qazıntılar başlandı. “Readers Digest” jurnalı bu haqda belə danışır:

*“Qazıntılar rayonunda dərinə getdikcə çox böyük tapıntı - Ur çarlarının qəbristanlığı aşkar edildi. Tədqiqatçılar Şumer çarlarının və onlara yaxın aristokratiyanın uyuduğu bu qəbristanlıqda çoxsaylı nadir incəsənət əsərləri ilə qarşılaşdılar. Bahalı daşlardan və qızıldan düzəldilmiş dəmir qapaqlar, qılınclar, musiqi alətləri. Bundan əlavə, preslənmiş saxsı lövhəciklər üzərində heyrətamiz məharət və ustalıqla düzəldilmiş qiymətli tarixi yazılar, mixi yazılar tapılmışdır. Tədqiqatçılar Ur çarlarının mətnlərinin xatırlatdığı həmin adları tapdılar: onların arasında Ur sülaləsinin banisinin də adı var idi. Vulley belə nəticəyə gəldi ki, qəbristanlıqdakı cəsədləri ilk sülalədən*

*əvvəl basdırmağa başlayıblar: yüksək inkişaflı bu sivilizasiya ilk sülalədən əvvəl olmalı idi.*

*Vulley bu faktı diqqətlə öyrəndikdən sonra qəbirlərin dərinliyinə gedərək qazıntıları davam etdirmək qərarına gəldi. İşçilər yarısı saxlanılmış kərpiclərin daha bir metrinə irəlilədilər və saxsı qabı və əşya qalıqlarını çıxarmağa başladılar. Vulley belə yazırdı:*

*"Qəfildən hər şey dayandı. Biz artıq nə saxsı qab, nə də kül tapırdıq, yalnız açıq-aşkar suyun gətirdiyi lil və palçıq çıxarırdıq".*

*Vulley qazıntıları davam etdirdi. İşçilər ikimetrlik "təmiz palçıq" qatından keçdilər və birdən son daş əsrinin adamlarının hazırladığı saxsı qab parçalarına və çaxmaq daşından hazırlanmış alətlərə rast gəldilər. Palçıq qatı təmizlənəndən sonra bir zamanlar yüksək inkişaf etmiş sivilizasiyanın izləri göründü. Bu isə bilavasitə Mesopotamiya rayonunda daşqının baş verməsi haqqındakı tezisi təsdiqləyir. Lil nümunələrinin mikroskopik analizi təmiz palçığın qalın qatının bura bütün qədim Şumer sivilizasiyasını məhv etməyə qadir olan güclü daşqın tərəfindən gətirildiyini göstərdi. Mesopotamiya düzənliyində qazılmış quyuda Gilqameş dastanı və Nuh peyğəmbər haqda rəvayətlər birləşirdi".* (Werner Keller, Und die Bibel hat doch recht (The Bible as History; a Confirmation of the Book of Books), New York: William Morrow, 1964, pp. 25- 29)

Vulley ekspedisiyanın iştirakçısı, Yel Universiteti tarix fakültəsinin dosenti A.Maks Mallouen Leonard Vulleyin fikirlərini belə dilə gətirir:

"Vulley qeyd etdi ki, müəyyən bir zaman kəsiyində əmələ gəlmiş bu qədər böyük palçıq və gil kütləsi yalnız güclü daşqının nəticəsi ola bilər. O, tapılmış şirəli saxsı qablardan istifadə edərək əl-Übeydə xalqının tikdiyi şəhəri və Şumer Urunu ayıran bu palçıq və lil qatını əfsanəvi daşqının izləri kimi xarakterizə etdi". (Max Mallowan, Nuh's Flood Reconsidered, Iraq:XXVI-2, 1964, p. 70)

Bu əsaslar Ur şəhərinin daşqının yayıldığı ərazidə yerləşdiyini göstərdi. Alman arxeoloqu Verner Keller aparılmış qazıntıların əhəmiyyətini belə xarakterizə edirdi:

"Mesopotamiyada aparılmış qazıntılar zamanı lil qatı altında şəhər tapıntılarının aşkar edilməsi burada həqiqətən selin baş verdiyini sübut etdi". (Werner Keller, Und die Bibel hat doch recht (The Bible as History; a Confirmation of the Book of Books), New York: William Morrow, 1964, pp. 23- 32)

Tufanın sel izləri aşkar edilmiş daha bir şəhər qədim Şumer şəhəri Kiş (hazırkı Tell-Əl Ühaymer və ya Oheymir) idi. Qədim Şumer mixi yazılarında Kiş şəhəri "böyük daşqından sonra hakimiyyətə gəlmiş sülalənin paytaxtı" kimi qeyd edilirdi. (Kish, Britannica Micropaedia, Volume 6, p. 893)

Cənubi Mesopotamiyada (hazırkı Tell-Əl-Fara) yerləşən Şuruppak şəhəri də özündə daşqının aşkar izlərini saxlayıb. 1920-ci ildən 1930-cu ilə qədərki müddətdə burada Pensilvaniya Universitetindən Erik Şmidtin rəhbərlik etdiyi arxeoloji ekspedisiya işləyib. Yerin müxtəlif qatlarında aparılmış qazıntılar zamanı e.ə. 3000 və 2000-ci illərdə olan sivilizasiyanın inkişafı və əmələ gəlməsi asanlıqla görünürdü. Şumerlilərin mixi xəttlərinin üzərindəki yazılarından aydın oldu ki, Şuruppak rayonunda yüksək inkişaflı xalq yaşamışdır. (Shuruppak, Britannica Micropaedia, Volume 10. p. 772)




**1. Mesopotamiya düzənliyi, 2. Tufandan sonrakı sivilizasiyalar, 3. Palçıq qatı, 4. Tufandan öncəki sivilizasiyalar.**

**Ser Leonard Vulleyin Mesopotamiya düzənliyində apardığı qazıntılar bu bölgədə torpağın dərinliyində 2,5 metr qalınlığında palçıq qatının olduğunu ortaya çıxardı. Bu palçıq-gil təbəqəsi Tufan zamanı suların daşıdığı gil kütlələri idi və dünyada yalnız Mesopotamiya düzənliyinin altında mövcud idi. Bu tapıntı Tufanın yalnız Mesopotamiya düzənliyinin bir hissəsində baş verdiyinə dair mühüm sübutlar ortaya qoydu.**

Ancaq ən əsası aydın oldu ki, e.ə. 2900 və 3000-ci illərdə burada böyük daşqın baş vermişdir. Şmidtin işləri haqda danışan Maks Malloun xəbər verir:

"Şmidt 4-5 metr dərinliyində gil və lil qarışığı olan sarı yer qatına çatdı (bu qat sellə bərabər əmələ gəlib). Təpənin kəsiyinə nisbətən bu qat düzənliyə yaxın bir səviyyədə yerləşir və bütün təpənin kəsiyində görünürdü. Şmidt Cəmdət Nəsrə dövrünü qədim çarlıq dövründən ayıran gil və lil qatını "sırf çay mənşəli qum" kimi təsvir etdi və onu daşqınla əlaqələndirdi".

(Max Mallowan, Early Dynastic Period in Mesapotamia, Cambridge Ancient History 1-2, Cambridge: 1971, p. 238)

Beləliklə, e.ə. 2900 və 3000-ci illərə təsadüf edən selin izləri Şuruppak şəhərindəki qazıntılar zamanı da aşkar edilmişdir. Görünür, Şuruppak da daşqına məruz qalmışdır. (Joseph Campbell, Eastern Mythology, p. 129)

Mixi yazılarının sübutlarından alınmış əsaslara görə, daşqının əhatə dairəsində olmuş son məntəqə Şuruppakın cənubunda yerləşən Uruk şəhəri (müasir Tell-Əl-Vərəqə) idi. Urukun yaxınlığında aparılmış qazıntılardan da aşkar olundu ki, lil qatını sel gətirib. Başqaları kimi bu qat da e.ə. 3000-2900-cü illərə uyğun gəlir. (Bilim ve Utopya, July 1996, 176. Footnote p. 19)

Məlum olduğu kimi, Dəclə və Fərat çayları bütün Mesopotamiya ərazisi

boyunca axırlar. O da bəllidir ki, sel zamanı bu çaylar bütün kiçik və iri mənbələrlə birləşərək məcrasından çıxdı və şiddətli yağışlarla birlikdə irimiqyaslı daşqına səbəb oldular. Quranda bizə belə xəbər verilir:

**Biz göyün qapılarını leysan yağışı ilə açdıq. Yeri yarıb bulaqlar qaynatdıq.** *(Göydən tökülən və yerdən çıxan)* **sular əzəldən yazılmış bir iş üçün bir-birinə qovuşdu.** (Qəmər surəsi, 11-12)

**Su aşıb-daşdıqda Biz sizi üzən gəmidə daşıdıq.** (Haqqə surəsi, 11)

Əslində, tufanın yaranmasına səbəb olan tərkib hissələr əsl təbii kataklizm xarakteri daşıyır, ancaq Nuh peyğəmbərin gözlənilən tufan haqqında son xəbərdarlığından sonra bütün səbəblərin bir yerə yığılması ilahi qüvvə haqda gümanı təşkil edir.

Arxeoloji tədqiqatlar nəticəsində əldə edilmiş bütün faktları analiz edərkən aydın olur ki, tufan ölçüləri qərbdən şərqə təxminən 160 km və şimaldan cənuba 600 km təşkil edən bir ərazidə baş vermişdir. Bu o deməkdir ki, tufanın suları bütün Mesopotamiyanı basmışdı. Daşqının izlərini saxlayan Ur, Uruk, Şuruppak və Kiş şəhərlərinin yerləşdiyi ərazini öyrəndikdə bu şəhərlərin dördünün də eyni ox üzərində yerləşdikləri aydın oldu. Beləliklə, tufan bu dörd şəhəri və onların ətraflarını əhatə etməli idi. Bir faktı qeyd etmək lazımdır ki, Mesopotamiya düzənliklərinin e.ə. 3000-ci illərdəki relyefi ilə müasir relyefi fərqli idi. O vaxtlar Fərat çayının yatağı indikindən şərqdə idi və Uruk, Ur, Şuruppak və Kiş şəhərlərini birləşdirən ox boyunca keçirdi. Quranda açılmış "yer və göy mənbələrinin" birləşməsi haqda danışılır. Görünür, elə bundan idi ki, Fərat çayı öz sahillərindən çıxaraq adıçəkilən şəhərləri yerlə-yeksan edib dağıtdı.

## TUFAN HAQQINDA BƏHS EDƏN DİN VƏ MƏDƏNİYYƏTLƏR

Peyğəmbərlər Nuhun xalqının tufanda həlak olması haqda rəvayətləri inama və Allaha səcdə etməyə çağırdıqları bütün xalqlara danışırdılar. Ancaq bu rəvayətlər zaman keçdikcə xeyli uydurma və əlavələrlə təhrif edilmiş və hər hansı bir reallıqdan məhrum olaraq əfsanəyə çevrilmişdir.

Allah-Təala yolunu azmışlara nəsihət olsun deyə müxtəlif xalqlara göndərilmiş peyğəmbərlər və vəhylər vasitəsilə insanları Nuh peyğəmbər dövrünün tufanı haqda xəbərdar edirdi. Ancaq onların məzmunu rəvayət söyləyənlər tərəfindən hər dəfə təhrif olunur və tufan barədəki hekayətlərə mistika və mifologiya elementləri əlavə edilirdi. Müasir arxeologiyanın kəşfləri ilə təsdiq edilmiş Allahın tufan haqda vəhylərinin yeganə düzgün mənbəyi Qurani-Kərimdir. Axı Allah-Təala bizə Quranda insanlara nazil etdiyi bu son Kitabı dəyişilməz halda saxlayacağını və Onun sözlərinin təhrif olunmasına yol verilməyəcəyini xəbər verib: **Şübhəsiz ki, Zikri Biz nazil etdik, əlbəttə, Biz də onu qoruyacağıq.** (Hicr surəsi, 9)

Nuh peyğəmbərin xalqının başına gəlmiş tufandan bəhs edən bu bölümün sonunda müqayisə üçün Tövratda və başqa xalqların mənbələrində 3000 il əvvəlki hadisələr haqda təhrif edilmiş bir neçə məlumatlar gətirək.

# TÖVRATDA NUH TUFANI HAQDA DEYİLƏNLƏR

Məlum olduğu kimi, Tövrat Musa peyğəmbərə göndərilmiş həqiqət kitabı olaraq zaman keçdikcə öz həqiqiliyini itirdi. Onun bəzi hissələri yəhudi cəmiyyətinin din xadimləri və üzünü köçürənlər tərəfindən öz mənfəətləri naminə dəyişdirilmişdir. Allahın İsrail oğullarına Musa peyğəmbərdən sonra da göndərdiyi bütün nəsihət və xəbərdarlıqların taleyi də eyni oldu, Allahın sözləri təhrif edildi. Beləliklə, "dəyişdirilmiş Tövrat" İlahi Həqiqətdən çox tarixi kitab kimi nəzərdən keçirilməlidir. Təhrif edilmiş Tövratın bu xüsusiyyəti və ondakı ziddiyyətlər öz əksini Nuh peyğəmbərin xalqı haqda deyilənlərdə də tapır. Eyni zamanda bəzi məqamlar Quranda deyilənlərlə uyğunlaşır. Məsələn, Tövratda deyilir ki, bütün bəşəriyyət "yer üzündə nə varsa, hamısı həyatdan məhrum olacaq" əmri ilə bu, ona ibrət olsun deyə cəzalandırılmışdır.

Tövrata görə, Allah Nuh peyğəmbəri xəbərdar edir ki, yer pis əməllərlə doludur və buna görə O, möminləri çıxmaq şərti ilə bütün bəşəriyyəti məhv edəcək. O, Nuha gəmi tikməyi əmr edir və onu necə düzəltmək lazım olduğunu müfəssəl şəkildə təsvir edir. Həmçinin Allah ona üç oğlunu xanımları ilə birlikdə, eləcə də bütün heyvanlardan bir cüt və bir az azuqə götürməyi tapşırır.

Yeddi gündən sonra, müəyyən edilmiş hesab saatı yetişdikdə yerin bütün su qaynaqları aralandı, göy qapıları açıldı və qırx gün, qırx gecə davam edən böyük tufan başladı. Gəmi bütün yüksəklikləri və dağları örtmüş su ilə üzürdü. Nuhun yanında olanlar bu cür xilas oldular. Qalanlarını isə tufan tərəfindən yaxalanaraq intəhasız sularda batdı. Qırx gün, qırx gecə keçdikdən sonra sular sakitləşdi, yüz əlli gün keçdikdən sonra isə suyun səviyyəsi endi. Yeddinci ayın on yeddinci günündə gəmi Ağrı dağına endi. Suyun səviyyəsinin enib-enmədiyini öyrənmək üçün Nuh gəmidən göyərçin buraxır. Göyərçin dönmür, aydın olur ki, sular xeyli çəkilib. Allah Nuha hər kəsin gəmidən yerə enməsini əmr edir.

Tövratın bu hekayədəki ziddiyyətlərindən biri odur ki, Yəhvistə (Tövratın variantlarından biri) görə, Tanrı gəmiyə yeddi cüt "təmiz" və yalnız bir cüt "natəmiz" heyvanlardan götürməyi əmr edir. Bu isə yuxarıda göstərilən mətnə ziddir.

Bundan əlavə, Tövratda həmçinin tufanın müddəti müxtəlifdir. Yəhvist variantına görə, suyun səviyyəsi qırx gün ərzində artdı, başqa varianta görə isə yüz əlli gün ərzində. Tövratın tufandan bəhs edən bölümlərindən bəziləri:

**"Və Allah Nuha dedi: "Qarşıma bütün bəşərin sonu gəldi. Çünki onlara görə yer üzündə özbaşınalıq oldu. Mən onları yer üzü ilə birlikdə yox edəcəyəm. Özünə qofer ağacından bir gəmi düzəlt. Mən, bəli Mən, göylərin altında həyat nəfəsi olan bütün kainatı yox etmək üçün yer üzünə tufan göndərirəm. Yer üzündə onların hamısı öləcəkdir. Ancaq səninlə əhdimi sabit saxlayacağam. Sən, səninlə birlikdə oğlanların, sənin xanımın və oğlanlarının xanımları gəmiyə minəcəksiniz. Və səninlə birgə sağ qalmaq üçün hər yaşayan, bütün bədən sahibi olanlardan hər**

**növündən iki-iki gəmiyə gətirəcəksən. Erkək və dişi olacaqlar. Və Nuh Allahın ona əmr etdiyi kimi etdi""** (Təkvin, 6/13-22)

**"Və gəmi yeddinci ayda, ayın on yeddinci günündə, Ararat dağları üzərinə oturdu"** (Təkvin, 8/1-19)

**"Bütün yer üzündə üzərində zürriyyətlərinin sağ qalması üçün, özünə hər təmiz heyvandan, erkək və dişili olaraq yeddi cüt və təmiz olmayan heyvanlardan erkək və dişili olaraq iki cüt..."** (Təkvin, 7/1-24)

**"Və sizinlə əhdimə sadiq qalacam və bəşəriyyət tufanın suları ilə məhv edilməyəcək və məhv üçün yer üzündə bir tufan olmayacaqdır"** (Təkvin, 9/11)

Təhrif olunmuş Tövrata görə, Allah-Təalanın "yer üzündə hər şey həyatdan məhrum olacaq" əmri ilə göylərin cəzası bütün bəşəriyyəti bürüdü, tufandan sonra isə yalnız Nuh peyğəmbərlə gəmiyə minənlər sağ qaldı.

## İNCİLDƏ NUH TUFANI HAQDA DEYİLƏNLƏR

Bizə çatan İncil də müqəddəs vəhyin əsl variantı deyil. Əhdi-cədid İsa peyğəmbərin davamçılarının tərtib etdiyi İncilin dörd mətni ilə başlayır və bizim İsa peyğəmbərin nitqlərindən və əmrlərindən bəhs edir. Matfey, Mark, Luka və İohanna görə olan İncil İsa peyğəmbərin çarmıxa çəkilməsindən təxminən 30-50 il sonra onun davamçıları və tələbələri tərəfindən tərtib edilmişdir. Qeyd etmək lazımdır ki, müxtəlif İncillərin mətnlərindəki ziddiyyətlər tam aydındır. Məsələn, İohanın İncili yuxarıda adı çəkilənlərdən öz məzmununa görə kəskin surətdə fərqlənir, lakin eyni zamanda Nuh tufanı haqda deyilənlər həmin kitablarda bir-birinə süjet şərhinə görə yaxındır. Əhdi-cədidin başqa kitabları isə İsa peyğəmbər çarmıxa çəkildikdən və yüksəldiləndən sonra həvarilərin əməllərindən bəhs edir və həvarilərin məktublarından və ya həvari Pavelin (Pavel Tarsuskiy) məktublarından ibarətdir.

Beləliklə, İncil ilahi əhdi-ətiq deyil, həvarilərin və İsa peyğəmbəri görənlərin xatirələrindən tərtib edilmiş tarixi əsərdir.

İncildə Nuh peyğəmbərin xalqının tufanda həlak olması belə təsvir edilir: Nuh peyğəmbər azğın və dinsiz xalqa göndərilmişdi, ancaq xalqı onun ardınca getmədi və günah etməyə davam etdi. Buna görə Tanrı onları tufanla cəzalandırdı, Nuh peyğəmbəri və onun ardınca gedənləri isə gəmidə xilas etdi. Hadisə ilə bağlı İncildən bəzi parçalar:

**"Nuhun günləri necə idisə, İnsan Oğlunun gəlişi də elə olacaqdır. Çünki Nuhun gəmiyə girdiyi günə qədər tufandan əvvəlki günlərdə insanlar yeyir, içir, evlənir, ərə gedirdilər. Və tufan gəlib hamısını aparıncaya qədər necə bixəbər idilərsə, İnsan Oğlunun gəlişi də bu cür olacaqdır"** (Matta, 24/37-39)

**"O, qədim dünyaya da rəhm etmədi. Lakin allahsızlar dünyası üzərinə tufanı gətirərkən salehlik təbliğçisi olan Nuh da daxil olmaqla səkkiz nəfərin canını saxladı."** (Peterin 2-ci məktubu, 2/5)

**"Nuhun günlərində necə oldusa, İnsan Oğlunun günlərində də elə**

**olacaqdır. Nuhun gəmiyə girdiyi günə qədər insanlar yeyir, içir, evlənir, ərə gedirdilər. Sonra tufan gəlib hamısını məhv etdi.”** (Luka, 17/26-27)

**“Bunlar bir zaman Allah Nuhun günlərində səbrlə gözlədiyi vaxt, gəmi tikilərkən itaətsiz idilər. O gəmidə isə az adam, başqa sözlə, səkkiz nəfər sudan sağ-salamat çıxdı.”** (Peterin 2-ci məktubu 3/20)

**“Belə düşünənlər bilmirlər ki, göylər qədim zamanlarda Allahın kəlamı ilə yarandı, yer də sudan və su vasitəsilə təşkil edildi. O zamankı dünya da həmin sularda boğulub məhv oldu.”** (Peterin 2-ci məktubu, 3/5-6)

## DİGƏR MƏDƏNİYYƏTLƏRDƏ NUH TUFANI HAQDA MƏLUMATLAR

**Şumerlərdə tufan haqda rəvayət:** Enlil adlı Tanrı insanlara qalan tanrıların bəşəriyyəti məhv etmək qərarı haqda və özünün insanları xilas etmək istəyindən xəbər verir. Rəvayətin əsas personajı Sippar şəhərinin Ziusudra adlı hökmdarıdır. Tanrı Enlil Ziusudraya onun tufan zamanı xilas olması üçün nə etməli olduğundan danışır. Mətnin qayığın tikintisindən bəhs edilən hissəsi itib, ancaq bu hissənin olması Ziusudranın xilası və tufandan danışılan bölümlərdən aydın olur. Rəvayətin Babil variantına arxalanaraq belə qənaətə gəlmək olar ki, hadisənin tam Şumer versiyasında tufanın səbəbi və gəminin tikilməsi haqda daha inandırıcı təfsilatlar var.

**Babillilərdə Nuhun tufanı haqda rəvayət:** Ziusudranın Babil analoqu Utnapiştim idi. Digər əsas qəhrəman isə Gilqameşdir. Əfsanəyə görə, Gilqameş ölməzliyin sirrini əldə etmək üçün atasını tapmaq qərarına gəlir. Onu bu yolun çətinlikləri və təhlükələri haqda xəbərdar edirlər: indiyə qədər yalnız tanrı Şamaşın (Günəş Allahı) keçməyə nail olduğu “Maşu dağlarını və Ölüm suyunu” keçmək lazımdır. Necə olsa da Gilqameş bu tikanlı yolu fəth edir və sonunda uğurla Utnapiştimə çatır.

Mətn Gilqameş və Utnapiştimin görüşündən danışılan yerdə qırılır. Sonra mətnin daha aydın oxunan hissəsində Utnapiştim Gilqameşə söylədi ki, “ölüm və həyat sirrini tanrılar özləri üçün seçiblər” (yəni insana verməyiblər). Sonra Gilqameş və Utnapiştimdən soruşun ki, o, ölməzliyin sirrini öyrənməyə necə nail olub: cavab olaraq Utnapiştim ona tufan haqda əfsanəni danışır. Tufan haqqındakı rəvayət Gilqameş dastanının məşhur “on iki lövhəciklərinin” əsas süjetidir.

Utnapiştim öz nitqini onun danışmağı “tanrıların sirridir” təshihi ilə başlayır. Sonra bildirir ki, o, Akkad ölkəsinin ən qədim şəhəri olan Şurumakdandır. Onun danışığına görə, tanrı Ea ona komanın qamış divarından müraciət edərək tanrıların tufanla bütün “həyat toxumlarını” məhv etmək qərarını bildirdi. Ancaq tanrıların bu qərarının səbəbi Şumer variantında olduğu kimi Babil təfsirində də məlum deyil. Utnapiştimin rəvayətinə görə, Ea ona gəminin tikintisi haqda deyir, Utnapiştim hər canlının toxumunu gətirməlidi. O, həmçinin Utnapiştimə gəminin formasını və ölçülərini göstərir, onlara görə gəminin hündürlüyü və uzunu bir-birinə bərabərdir.

Fırtına altı gün altı gecə davam etdi. Təbii hadisə yeddinci gün sakitləşir və Utnapiştim ətrafda hər şeyin "palçıq olduğunu" görür. Gəmi Nissir dağına enir.

**Şumer-Babil mənbələri:** Şumer və Babil yazılarına görə, Ksisutros və ya Hasisatr, onun ailəsi, dostları quşlarla və heyvanlarla birlikdə 925 metrlik gəmidə tufandan xilas oldular. "Sular göyə yönəlirdilər, okeanlar sahilləri örtdü və çaylar yataqlarından çıxdılar". Sonra gəmi Hordinov dağına endi.

**Assur-Babil mənbələri:** Yazılı Assur və Babil mənbələrindən məlumdur ki, Ubar-Tutu (və ya Hasisatr) adlı mömin, öz ailəsi, xidmətçisi və öz sürüləri və vəhşi heyvanlarla birlikdə 600 qulac uzunluğunda, 60 qulac enində və hündürlüyündə gəmidə xilas oldular. Tufan altı gün altı gecə davam etdi. Gəmi Nizar dağına yanaşıb bağlandıqda göyərçin və qarğa buraxıldı. Yalnız göyərçin döndü.

Bəzi Şumer, Assuriya və Babil yazılarına görə, Utnapiştim ailəsi ilə bu tufanı yaxşı keçirdilər. "Yeddinci gün Utnapiştim çölə baxırdı, ətrafda sakitlik hökm sürürdü. İnsan oğlu yenə gölə döndü" deyə sonra bildirilir. Gəmi Nizar dağına endikdən sonra, Utnapiştim göyərçin, qarğa və qaranquş göndərir. Qarğa leş yemək üçün qalır, digər iki quş isə dönmürlər.

**Hind əfsanələri:** Hind Satapathı Brahman və Mahabharata əfsanələrində Manu adlı personaj Rişizlə birgə tufandan xilas olur. Əfsanəyə görə, Manunun tutduğu, sonra isə azadlığa buraxdığı balıq qəfildən böyüyür və Manuya deyir ki, o, gəmi tiksin və onun buynuzlarına bağlasın. Bu balıq həmçinin tanrı Vişinunun mücəssəməsi sayılır. Balıq gəmini nəhəng dağlardan aşıraraq onu şimala aparır və Himavat dağında qoyur.

**İngilis əfsanələri:** Böyük Britaniyanın Uels qraflığında saxlanılmış əfsanələrə görə, Dvifan və Dvifah böyük fəlakətdən gəmidə xilas olurlar. "Dalğalar gölü" adlanan Linlayon gölünün partlamasından yaranmış qorxunc sellər sakitləşdikdən sonra Dvifan və Dvifah Britaniya xalqını dirçəldirlər.

**Skandinav əfsanələri:** Skandinavların Edda eposu Berqalmer adlı qəhrəmanın öz arvadı ilə tufandan böyük gəmidə xilas olduğunu bildirir.

**Litva əfsanələri:** Litva əfsanələrində bir neçə cüt insanlar və heyvanlar uca dağın üstündə qoz qabığının içində xilas olurlar. On iki gün on iki gecə sürən külək və sellər artıq dağın başına çatanda və orada olanları aparmalı olduqda Rəbb ona nəhəng qoz qabığı atır. Dağda gizlənənlər qoz qabığında səyahət edərək fəlakətdən xilas olurlar.

**Çin əfsanələri:** Çin mənbəli əfsanələrdə Yao adlı biri və yeddi nəfər (başqa versiyaya görə isə Fa Li, onun arvadı və uşaqları) sel və zəlzələlərdən yelkən gəmisində xilas olurlar. "Yer darmadağın edildi... Sular yerdən qalxdı və bütün ətrafı bürüdü..." - bu əfsanələrdə belə deyilir.

**Yunan mifologiyası tufan haqda:** Tanrı Zevs günahkar insanları tufanla məhv etmək qərarına gəlir. Bu seldən yalnız Devkalion və xanımı Pirra xilas olurlar, çünki Devkalionun atası - Prometey oğluna gəmi tikməyi buyurur. Tufanın doqquncu günü ər və arvad Parnas dağına qədəm basırlar.

Bütün bu mənbələr konkret bir faktı təsdiqləyir. Nuh peyğəmbərin xalqının tufanı haqda bilgilər tarixin gedişatı boyunca Allahın yerdə yaratdığı bütün xalqlara çatıb. Ancaq insanların müqəddəs vəhyin həqiqətindən yayınması ciddi dəyişikliklərə səbəb oldu və tufan haqda məlumat əfsanə və miflərə çevrildi.

Nuh peyğəmbərin və onun murdar xalqının əsl tarixi həqiqi mənbə Quranda - ilahi vəhyin yeganə təhrif edilməmiş mənbəsində keçir. Məhz buna görə də Quran tək tufan haqda deyil, başqa tarixi hadisələr və xalqlar haqda da həqiqi məlumatların mənbəyidir. Sonrakı bölümlərdə biz bəşəriyyətə nazil edilmiş Qurani-Kərimdə tarixin həqiqi hadisələri haqda bəhs etməkdə davam edəcəyik.

## HƏZRƏTİ İBRAHİMİN HƏYATI

**İbrahim nə yəhudi, nə də nəsrani idi. O, ancaq hənif bir müsəlman idi və müşriklərdən deyildi. Həqiqətən, insanlardan İbrahimə ən yaxın olanı, onun ardınca gedənlər, bu Peyğəmbər və iman gətirənlərdir. Allah möminlərin Himayədarıdır.** (Ali-İmran surəsi, 67-68)

Qurani-Kərim insanlara İbrahim peyğəmbərin həyatı və əməlləri haqda dəfələrlə xatırladır və Onu insanlara nümunə göstərir. O, bütlərə səcdə edən xalqına Allah-Təalanın vəhyini gətirdi. Ancaq insanlar peyğəmbərin çağırışına baxmadılar və ona qarşı çıxdılar. İbrahim öz xalqının artan təzyiqləri altında həyat yoldaşı ilə, Lut peyğəmbərlə və bəzi möminlərlə birlikdə doğma diyarları tərk etməyə məcbur qaldı.

Quranda ən əvvəl İbrahimin əsil-nəcabətindən bəhs edilir. O, Nuh peyğəmbərin nəslindən idi:

**Aləmlər içərisində Nuha salam olsun! Həqiqətən, Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. Həqiqətən, o Bizim mömin qullarımızdandır. Sonra o birilərini suya qərq etdik. Həqiqətən, İbrahim onun ardıcıllarından idi.**

(Saffat surəsi, 79-83)

O dövrdə Mesopotamiyada, Orta və Şərqi Anadoluda yaşayan xalqlar göyə və ulduzlara sitayiş edirdilər. Onların əsas tanrısı Ay tanrısı Sin idi. O, paltarlarda aypara ilə uzunsaqqalı qoca obrazında təsvir edilirdi. Bundan əlavə, insanlar bu tanrıların obrazlarını hazırlayır, kiçik fiqurlar düzəldir və onlara səcdə edirdilər. Bu inamlar qeyd edilmiş coğrafi regionda geniş yayılmışdı. Həmin etiqadlar Yaxın Şərqdə də davamçıları olduqlarına görə uzun müddət fəaliyyət göstərdilər.

Bu rayonda yaşayan xalqlar eramızın 600-cü illərinə qədər bu tanrıcıqlara itaət etməkdə davam edirdilər. Mesopotamiya və Orta Anadoluda məbəd və rəsədxana kimi istifadə edilən və "zikkurt" adı ilə tanınan xüsusi tikililər qalmışdır; burada xeyli tanrılara, əsasən də Ay tanrısına - Sinə sitayiş ayinləri icra edilirdi...

(Everett C. Blake, Anna G. Edmonds, Biblical Sites in Turkey, Istanbul: Redhouse Press, 1977, p. 13)

İndi yalnız arxeoloji tədqiqatlar yolu ilə aşkar etmək mümkün olan xurafatın izləri Quranda xatırladılır. İbrahim peyğəmbər bu bütlərə itaət etməkdən boyun qaçırır və yeganə həqiqi Tanrının - Allah-Təalanın





**Hz. İbrahimin dövründə Mesopotamiya bölgəsində çoxallahlı dinlər üstünlük təşkil edirdi.
Ay tanrısı Sin ən böyük tanrılardan biri idi. İnsanlar bu sözdə tanrıları təmsil edən heykəlciklər düzəldir və bunlara sitayiş edirdilər. Yuxarıda Sin təmsilçi heykəlciyi görünür. Heykəlin sinəsindəki hilal şəkli açıq şəkildə görünməkdədir. Yuxarıda digər tərəfdə rahiblərin Sinə nəzir gətirdikləri görünür.**

mövcudluğunu etiraf edir. İbrahimin bu hərəkəti haqda Quranda belə deyilir:

**Bir zaman İbrahim atası Azərə demişdi: "Sən bütləri tanrılarmı qəbul edirsən? Mən səni və sənin camaatını açıq-aydın azğınlıq içində görürəm."**

**Beləcə, Biz, İbrahimə göylərin və yerin səltənətini göstərdik ki, yəqinliklə inananlardan olsun.**

**Gecənin qaranlığı onu bürüdükdə o, ulduz görüb: "Bu mənim Rəbbimdir!"– dedi. O batdıqda isə: "Mən batanları sevmirəm!"– dedi.**

**Doğan ayı gördükdə: "Bu mənim Rəbbimdir!"– dedi. O batdıqda isə: "Əgər Rəbbim məni doğru yola yönəltməsəydi, mən azmış adamlardan olardım"– dedi.**

**Doğan günəşi gördükdə: "Bu mənim Rəbbimdir, bu daha böyükdür!"– dedi. O batdıqda isə dedi: "Ey qövmüm! Həqiqətən, mən sizin** *(Allaha)* **şərik qoşduqlarınızdan uzağam!**

**Doğrudan da mən, hənif olaraq üzümü göyləri və yeri yaradana çevirdim. Mən müşriklərdən deyiləm."** (Ənam surəsi, 74-79)

Quranda İbrahim peyğəmbərin doğum və yaşayış yeri haqda məlumat yoxdur. Ancaq aydındır ki, İbrahim və Lut eyni bir dövrdə və bir-birinə coğrafi yaxın ərazidə yaşayırdılar, çünki Luta göndərilmiş mələklər onu görməzdən əvvəl İbrahim peyğəmbərin yanına gəldilər və onun arvadına uzun zaman gözlənilən uşağın yaxın müddətdə boyuna düşəcəyi haqda xeyir xəbər gətirdilər.

İbrahim peyğəmbərdən bəhs edən və Əhdi-ətiqdə olmayan Quranın digər süjeti Kəbənin tikintisidir. Qurandan bizə bildirildiyi kimi, İbrahim Kəbəni

öz oğlu Ismayılla birlikdə tikirdi.

**O zaman İbrahim və İsmail evin** *(Kəbənin)* **bünövrəsini qaldırarkən** *(belə) (dua etdilər)*: **"Ey Rəbbimiz!** *(bunu)* **bizdən qəbul et! Həqiqətən, Sən Eşidənsən, Bilənsən!** (Bəqərə surəsi, 127)

İndi yalnız o məlumdur ki, uzun zamanlardan bəri o yer müqəddəs hesab edilir. Buna görə də Kəbədə cahiliyyə dövründə (sonuncu peyğəmbər Muhəmmədin (s) gəlişinə təsadüf edən İslamdan öncəki dövr) bizə belə nəticə çıxarmağa imkan verir ki, bu, İbrahim peyğəmbərin gətirdiyi əsl dinin tənəzzülünə və degenerasiyasına səbəb oldu.



**O dövrdə həm ibadət, həm də astronomik rəsədxana kimi istifadə edilən ziqquratlar dövrün ən qabaqcıl tikililəri idi. Ulduzlara, Aya və Günəşə sitayiş olunurdu və buna görə də səmaya böyük əhəmiyyət verilirdi. Yuxarıda, Mesopotamiyanın önəmli ziqquratları görülür.**

## ƏHDİ-ƏTİQDƏ İBRAHİM PEYĞƏMBƏRİN DOĞUM YERİ HAQDA

İbrahim peyğəmbərin doğum yeri həmişə mübahisə mövzusu olub. Həm xristianlar, həm də yəhudilər İbrahim peyğəmbərin Cənubi Mesopotamiyada anadan olduğunu iddia edərkən İslam aləmində yayılmış fikrə görə, İbrahim indiki Suriya sərhədlərinin yaxınlığında, Anadolunun cənub-şərqində yerləşən Urfa - Harrana şəhərinin ətrafında anadan olub. Son tarixi məlumatlar xristian və yəhudi iddialarının həqiqəti tam əks etdirmədiyini göstərir.

Xristian və yəhudilər Tövratda İbrahim peyğəmbərin doğulduğu yerin Cənubi Mesopotamiyanın Ur şəhəri olduğu haqda məlumatlara arxalanaraq bu qənaətə gəlirlər. O bu şəhərdə doğulub və böyüdükdən sonra Harrana vilayətindən (indiki Türkiyə ərazisindən kənarda yerləşən) keçərək Misirə yola düşüb. İbrahim uzun səyahətin sonunda nəhayət, Misirə çatır.

Əhdi-ətiqin bu yaxınlarda tapılmış nüsxəsi bu məlumatın mötəbərliyi ilə bağlı ciddi şübhələrə səbəb oldu. Çünki qədim yunan dilində tərtib edilən, e.ə. III əsrə təsadüf edən və bu gün Əhdi-ətiqin ən köhnə nüsxəsi sayılan bu nüsxədə Ur şəhərinin hətta adı da çəkilmir. Bu gün Əhdi-ətiqin əksər tədqiqatçıları belə düşünürlər ki, "Ur" sözü düzgün yazılmadığından əmələ gəlib və ya mətnə sonradan əlavə edilib. Bu məlumatlara əsasən mühakimə

yürüdülsə, İbrahim peyğəmbər Ur şəhərində anadan olmayıb, o bu diyarda bəlkə də heç olmayıb.

Bir şeyi nəzərdən qaçırmaq olmaz ki, bəzi coğrafi yerlərin adı və bu rayonların sərhədləri o dövrdən bəri xeyli dəyişikliklərə məruz qalıb. İndi Mesopotamiyadan söhbət gedəndə o, Fərat və Dəclə çaylarının arasındakı Iraqın cənub əraziləri ilə assosiasiya edilir. 2000 il əvvəl Mesopotamiya adlanan bu yer demək olar ki, indiki Türkiyə torpaqlarına qədər uzanan bütün Harranı daxil edirdi. Çünki Əhdi-ətiqin "Mesopotamiya düzənliyi" ifadəsini nəzərə aldıqda əminliklə demək olmaz ki, indiki və e.ə. 2000-ci illərdəki dövrün Mesopotamiyası eyni ərazilərdir. İbrahim peyğəmbərin doğulduğu yerin Ur şəhəri olması barədə ciddi şübhələrə və fikir ayrılıqlarının olmasına baxmayaraq müqəddəs vəhylərin bütün tədqiqatçıları belə bir yekun qərara gəliblər: İbrahim peyğəmbərin yaşayış yeri Harran və onun ətrafı idi. Həmçinin Əhdi-ətiqin qısa öyrənilməsi İbrahim peyğəmbərin yaşayış yerinin məhz Harran rayonunda olduğuna işarə edən bəzi ifadələr irəli sürməyə icazə verir (Təkvin, 11/31 və 28/10)

Eynilə İslam mənbələri də İbrahim peyğəmbərin doğum yerinin Harran və ya Urfa olması fikri ilə razılaşır. "Peyğəmbərlər şəhəri" adlandırılmış Urfa şəhərində İbrahim peyğəmbərlə bağlı xeyli hadisə və əfsanələr eşitmək, hətta onun dünyaya gəldiyi mağaranı da görmək olar.

## ƏHDİ-ƏTİQ NİYƏ DƏYİŞDİRİLİB?

Əhdi-ətiq və Quran iki ayrı-ayrı İbrahim peyğəmbərdən bəhs edirlər. Quranda İbrahim bütpərəstlər cəmiyyətinə peyğəmbər kimi göndərilir. Onun xalqı göyə, ulduzlara, Aya və başqa bütlərə itaət edir. O isə xalqı ilə mübarizə aparır, onları düzgün yola gətirmək istəyir və buna görə də öz doğma atası da daxil olmaqla xalqının ədavəti ilə qarşılaşır.

Əhdi-ətiqdə isə bu deyilənlər haqda hətta xatırlatma da yoxdur. Orada Quranda deyildiyi kimi, nə xalqının İbrahimi atdığı tonqal, nə də İbrahimin onun xalqının itaət etdiyi bütləri qırması haqda heç nə deyilmir.

Əhdi-ətiqdə İbrahimin obrazı yəhudi əcdadı kimi təqdim edilir. Tam aydındır ki, irqi təmizliyi ön plana çıxarmaq istəyən yəhudi din xadimləri Əhdi-ətiqi bu cür dəyişmişdilər. Əsrlər boyunca özlərini öyən, təriflərini göylərə qaldıran və allah seçimlərinə əmin olan yəhudilər onlara göndərilmiş Müqəddəs Kitabları şüurlu şəkildə və qəsdən təhrif ediblər. Onlar öz təsəvvürlərinin xeyrinə olmaqla İlahi Həqiqətlərə bir sıra əlavə və ixtisarlar etdilər. Məhz buna görə İbrahim peyğəmbər Əhdi-ətiqin dəyişdirilmiş versiyasına görə, yalnız yəhudilərin əcdadıdır.

Əhdi-ətiqə inanan xristianlar da yalnız bir fərqlə İbrahimin yəhudi olduğunu güman edirlər: onların fikrincə, İbrahim yəhudi yox, xristian idi. İrqə yəhudilər kimi bir belə prinsipial əhəmiyyət verməyən xristianların İbrahim peyğəmbərin rolunu bu şəkildə görməsi iki dinin davamçıları arasında mübahisə və konfliktlərə səbəb oldu.

Allah-Təala növbəti ayələrdə bu mübahisələrə aydınlıq gətirir:

**Ey Kitab əhli! Nə üçün İbrahim barəsində höcətləşirsiniz? Tövrat və**

**İncil ancaq ondan sonra nazil edilmişdir, məgər anlamırsınız? Bax, siz o kəslərsiniz ki, bildiyiniz şeylər barəsində də höcətləşirsiniz. Bəs nə üçün bilmədiyiniz şeylər barəsində höcətləşirsiniz? Allah bilir, siz bilmirsiniz! İbrahim nə yəhudi, nə də nəsrani idi. O, ancaq hənif bir müsəlman idi və müşriklərdən deyildi. Həqiqətən, insanlardan İbrahimə ən yaxın olanı, onun ardınca gedənlər, bu Peyğəmbər və iman gətirənlərdir. Allah möminlərin Himayədarıdır.** (Ali-İmran surəsi, 65-68)

Quranda İbrahim peyğəmbər Əhdi-ətiqdəkindən tam fərqli tərzdədir. O, bütlərə itaət edən xalqını hələ gənc ikən xəbərdar edir və onları bu həyat tərzindən imtina etməyə çağırırdı:

**İbrahimi də** *(xatırla!)* **Bir zaman o öz qövmünə demişdi: "Allaha ibadət edin və Ondan qorxun! Heç bilirsinizmi bu sizin üçün nə qədər xeyirlidir?** (Ənkəbut surəsi, 16)

**Əgər** *(onu)* **yalançı hesab etsəniz,** *(bilin)(ki,)* **sizdən əvvəlki xalqlar da öz** *(peyğəmbərlərini)* **yalançı saymışdılar. Peyğəmbərin vəzifəsi isə sadəcə olaraq** *(dini)* **anlaşıqlı tərzdə təbliğ etməkdir.** (Ənkəbut surəsi, 18)

Buna cavab olaraq xalq peyğəmbəri öldürməyə cəhd göstərdi:

**Qövmünün cavabı isə ancaq: "Ya onu öldürün, ya da yandırın!"– demələri oldu. Lakin Allah onu oddan qorudu. Doğrudan da, bunda mömin adamlar üçün** *(mənimsəməli bir)* **ibrət vardır.** (Ənkəbut surəsi, 24)

Öz xalqının əlində ölməkdən qaçan İbrahim peyğəmbər hicrət etməyə üstünlük verib doğma diyarları tərk edir. Allah ayələrdə bunu belə xəbər verir:

**Onlar İbrahimə qəsd etmək fikrinə düşdülər, lakin Biz onları daha şiddətli cəzaya məruz qoyduq.** (Ənbiya surəsi, 70)

**Mən sizi və Allahdan başqa sitayiş etdiyiniz** *(bütləri)* **tərk edir və öz Rəbbimə dua edirəm. Ola bilsin ki, mən Rəbbimə dua etməklə heç vaxt bədbəxt olmayım"** (Məryəm surəsi, 48)

## LUT PEYĞƏMBƏRİN XALQI VƏ ALT-ÜST EDİLMİŞ ŞƏHƏR

**Lut qövmü də xəbərdarlıqları yalan saydı. Biz onların üstünə** *(qasırğa ilə birgə)* **daşlar göndərdik. Yalnız Lutun ailəsini sübh çağı xilas etdik – Özümüzdən bir mərhəmət olaraq! Biz şükür edənləri belə mükafatlandırırıq.** *(Lut)* **onları Bizim əzabımızla hədələdi, onlar isə bu xəbərdarlıqlara şübhə ilə yanaşdılar.** (Qəmər surəsi, 33-36)

Lut peyğəmbər İbrahim peyğəmbərlə bir dövrdə yaşayıb. Tövrata görə, Lut İbrahimin qardaşı oğlu idi və hətta onu uzun səyahətlərdən birində müşayiət edirdi.

Lut İbrahimə qonşu xalqlardan birinə peyğəmbər olaraq göndərilmişdi. Quran bu xalqın etdiyi iyrəncliklərdən və pozğunluqlardan bəhs edir, kişilər arasında indiyə qədər görünməmiş pozğunluq - homoseksualizm çiçəkləyirdi. Lut onları Allahın xoşuna gəlməyən bu eyibdən əl çəkməyə çağırdı və Allah-Təalanın müqəddəs çağırışı ilə onlara müraciət etdi, sakinlər isə köhnə həyat tərzini üstün tutdu və Lutun peyğəmbərliyinə fikir verməyib ondan imtina

etdilər. Ancaq Allahın qəzəbi özünü çox gözlətmədi və şəhər sakinləri qorxunc təbii fəlakətlə məhv edildilər.

Əhdi-ətiqə görə, Lut peyğəmbər Sodom şəhərində yaşayırdı. Arxeoloji tədqiqatlar bu şəhərin indiki İordaniya-İsrail sərhəddi ilə uzanan Duzlu gölün (Ölü dənizin) yaxınlığında yerləşdiyini göstərdi. Həmçinin aydın oldu ki, Qırmızı dənizdən şimal tərəfdə yaşayan xalqın qırılmasının səbəbi məhz Quranda göstərilənlərdir.

Lut xalqının başına gəlmiş cəzadan danışmazdan əvvəl Allah-Təalanın bu cür sərt qərarının səbəbini izah edən Quran ayələrini gətirək. Lut peyğəmbərin yolunu azmış xalqa yönəlmiş nəsihətləri:

**Lut tayfası da elçiləri yalançı saydı. Qardaşları Lut o zaman onlara dedikdə ki: "Məgər qorxmursunuz? Həqiqətən, mən sizin üçün etibar edilməli bir elçiyəm. Allahdan qorxun və mənə itaət edin! Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir. Doğrudanmı siz insanlar içində ancaq kişilərlə yaxınlıq edir və Rəbbinizin sizin üçün yaratdığı qadınlarınızı tərk edirsiniz? Siz, həqiqətən də, həddi aşan adamlarsınız". Onlar dedilər: "Ey Lut! Əgər** *(təbliğatına)* **son qoymasan, mütləq qovulanlardan olacaqsan!" O dedi: "Mən sizin əməllərinizə nifrət edənlərdənəm."**

(Şuəra surəsi, 160-168)

Xalq Lutun tövbə etməyə və düzgün yola çağırışına hədə ilə cavab verdi. İnsanlar Luta haqq yolunu göstərdiyinə görə nifrət edirdilər və onu möminlərlə bərabər qovmaq qərarına gəldilər. Bu haqda Quran ayələrində belə deyilir:

**Lutu da** *(elçi göndərdik)*. **Bir zaman o, öz qövmünə demişdi: "Sizdən əvvəl aləmlərdən heç kəsin etmədiyi iyrənc əməli sizmi edəcəksiniz? Siz, qadınları qoyub şəhvətlə kişilərin yanına gedirsiniz. Həqiqətən, siz, həddi aşmış adamlarsınız". Onun qövmünün cavabı: "Onları yurdunuzdan çıxarın. Axı onlar təmizliyə can atan adamlardır"– deməkdən başqa bir şey olmamışdı.** (Əraf surəsi, 80-82)

Lut peyğəmbər xalqını tam aşkar həqiqətə səsləyirdi və onları aydın rəmzlərlə xəbərdar edirdi, ancaq xalq heç bir tədbir görməyərək buna əhəmiyyət vermirdi. Luta və onlar üçün hazırlanmış cəzalara gülərək şərəfsizlikdə və namussuzluqda israr edirdi:

**Lutu da** *(xatırla!)* **Bir zaman o öz qövmünə belə demişdi: "Doğrudan da, siz özünüzdən əvvəlki aləmlərdə heç kəsin etmədiyi iyrənc bir iş tutursunuz. Həqiqətən, siz kişilərin yanına** *(şəhvətlə)* **gedir, yol kəsir və məclislərinizdə** *(bir-birinizlə)* **murdar işlər görürsünüz?" Qövmünün cavabı isə ancaq: "Əgər doğru danışanlardansansa, bizə Allahın əzabını gətir!"– demələri oldu.** (Ənkəbut surəsi, 28-29)

Xalqından bu cür cavab eşidən Lut peyğəmbər Allahdan kömək diləyirdi:

*(Lut)* **dedi: "Ey Rəbbim! Fitnə-fəsad törədən qövmün əleyhinə mənə kömək et!"** (Ənkəbut surəsi, 30)

**"Ey Rəbbim! Məni və ailəmi onların tutduqları işdən xilas et!"**

(Şuəra surəsi, 169)

Allah Lutun dualarına kişi şəkilli iki mələk göndərir. Onlar Lutun yanına gəlməzdən əvvəl İbrahimə baş çəkirlər. Elçilər İbrahimə onun sonsuz və yaşlı arvadının doğacağı uşaq, həmçinin öz əsas missiyaları - bütün sərhədləri aşan Lut xalqının ölümə məhkum edilməsi haqda xəbər verirlər.

*(İbrahim)* **dedi: "Sizin işiniz nədir, ey elçilər?" Onlar dedilər: "Biz günahkar bir qövmə göndərilmişik ki, onların üstünə gildən daşlar yağdıraq – həddi aşanlar üçün sənin Rəbbinin yanında nişan qoyulmuş** *(daşlar!)***"** (Zariyat surəsi, 31-34)

**Yalnız Lutun ailəsi istisnadır. Biz onların hamısını xilas edəcəyik.** *(Lutun)* **arvadından başqa. Biz onun geridə qalanlardan olmasına qərar verdik".** (Hicr surəsi, 59-60)

Elçi-mələklər İbrahimi tərk edərək Lut peyğəmbərin yanına gəldilər. O, əvvəlcə onları tanımadı və çox həyəcanlandı, onlarla danışdıqdan sonra isə sakitləşdi:

**Elçilərimiz Lutun yanına gəldikdə, onlara görə kədərləndi, ürəyi sıxıldı və: "Bu, çox çətin bir gündür"– dedi.** (Hud surəsi, 77)

**O dedi: "Siz yad adamlarsınız!" Onlar dedilər: "Xeyr, biz sənin yanına onların şübhə etdiyi** *(əzab)* **ilə gəlmişik. Biz sənin yanına doğru xəbərlə gəlmişik. Həqiqətən də, biz doğru danışanlarıq. Gecənin bir vaxtı ailəni yola çıxart və özün də onların arxasınca get. Sizdən heç kəs çevrilib arxaya baxmasın. Sizə əmr olunan yerə yollanın." Biz ona vəhy etdik ki, sübh çağı onların kökü kəsiləcək.** (Hicr surəsi, 62-66)

Bu zaman Lutun qonaqları haqqında xəbər bir anda şəhərə yayıldı. Əxlaqsız xalq bu qonaqlara dəyişməz fikirləri ilə yaxınlaşmaqdan çəkinmədi və Lutun evini əhatəyə aldı. Xalqın niyyətindən narahat olan və öz qonaqları qarşısında eyibdən qorxan peyğəmbər xalqına səsləndi:

*(Lut)* **dedi: "Bunlar mənim qonaqlarımdır. Məni biabır etməyin! Allahdan qorxun və məni hörmətdən salmayın!"** (Hicr surəsi, 68-69)

**Onlar dedilər: "Məgər biz sənə** *(bura gələn)* **adamları** *(qonaq saxlamağı)* **qadağan etməmişik?"** (Hicr surəsi, 70)

Lut qonaqlarına dəyəcək xətərdən narahat olaraq və xalqını sakitləşdirmək üçün əlindən gələn hər şeyi edərək belə dedi:

**O dedi: "Kaş ki, sizə çatan bir qüvvəm olaydı, yaxud möhkəm bir dayağa söykənəydim!"** (Hud surəsi, 80)

Qonaqlar isə Allah elçiləri olduqlarını bildirərək ona dedilər:

*(Mələklər)* **dedilər: "Ey Lut! Biz sənin Rəbbinin elçiləriyik. Onlar əsla sənə zərər yetirə bilməzlər. Gecənin bir vaxtında ailənlə birlikdə yola düş. Qoy içinizdən, arvadından başqa heç kəs dönüb arxaya baxmasın. Çünki onların başına gələcək müsibət onun da başına gələcəkdir. Onların** *(həlak olmaq)* **vaxtı səhərdir. Məgər səhər yaxın deyilmi?"**

(Hud surəsi, 81)

Şəhər sakinlərinin iyrəncliyinin və alçaqlığının həddini aşdığını görən Allah Luta səhər ikən ona şəhəri tərk etməyi və heç bir halda şəhərə tərəf dönməməyi əmr edən mələklər göndərməklə Lutu xilas etdi. Səhər isə Lut peyğəmbərin xalqını xəbərdar etdiyi cəza baş verdi:

**Onlar** *(Lutdan)* **qonaqlarını israrla tələb etdilər. Biz də onları kor etdik** *(və) (dedik)*: **"Əzabımı və təhdidlərimi dadın!" Sübh tezdən onlara yaxalarından əl çəkməyəcək bir əzab gəldi.** (Qəmər surəsi, 37-38)

Allahın yolunu azmış xalqa yönələn qəzəbi Quranda belə təsvir edilir:

**Günəş doğanda qorxunc səs onları yaxaladı. Oranın altını üstünə çevirdik və onların üzərinə odda bişmiş gil daşlar yağdırdıq. Şübhəsiz ki, bunda, başa düşənlər üçün dəlillər vardır. Həqiqətən, onlar yolun üstündə yaşayırdılar.** (Hicr surəsi, 73-76)

**Əmrimiz gəldikdə oranın altını üstünə çevirdik və odda bişmiş gil daşları ardıcıl olaraq onların üstünə yağdırdıq.** *(O daşlara)* **Rəbbinin yanında işarə qoyulmuşdur. Onlar zalımlardan da uzaq deyildir.**
(Hud surəsi, 82-83)

**Sonra da o birilərini yerli-dibli yox etdik. Biz onların üstünə** *(daşlardan)* **yağış yağdırdıq. Qorxudulanların yağışı nə yaman imiş! Şübhəsiz ki, bunda bir ibrət vardır. Lakin onların əksəriyyəti yenə iman gətirmədi. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.** (Şuəra surəsi, 172-175)

Xalq məhv edildi, Lut və bəzi möminlərsə xilas oldular. Lutun xanımı da öldü, çünki o da Rəbbdən imtina edənlərin sırasında idi:

**Biz onu və ailəsini xilas etdik. Yalnız arvadından başqa. O, geridə qalanlardan oldu. Biz onların üstünə** *(daşlardan)* **yağış yağdırdıq. Bir gör günahkarların aqibəti necə oldu.** (Əraf surəsi, 83-84)

Lut peyğəmbər, xanımını çıxmaq şərti ilə onun ailəsi və möminlər bu cür xilas oldular. Əhdi-ətiq xəbər verir ki, Lut İbrahim peyğəmbərin yanına getdi, yolunu azmış xalq isə yer üzündən silindi.

## LUT GÖLÜNÜN "AYDIN ƏLAMƏTLƏRİ"

Allah Lut xalqının başına gəlmiş cəza haqda Quranda belə bəhs edir: **Əmrimiz gəldikdə oranın altını üstünə çevirdik və odda bişmiş gil daşları ardıcıl olaraq onların üstünə yağdırdıq.** (Hud surəsi, 82) Ayənin əvvəlində işlədilmiş **"altını üstünə çevirmək"** ifadəsi bəlkə şəhərin yer üzündən güclü zəlzələ ilə silinməsi deməkdir. Hadisələr özündə burada baş verənlərin "aydın əlamətlər"ini dəqiq şəkildə saxlayan Lut gölü rayonunda baş verirdi.

Alman arxeoloqu Verner Keller bu haqda belə deyir:

"Bir vaxt bu rayonda özünü büruzə verən böyük çöküntü zamanı burada şimşəklərlə, təbii qaz partlayışları və yanğınlarla müşayiət edilən dəhşətli zəlzələ baş verdi və Siddim dərəsi Lut xalqının şəhərləri ilə birlikdə yerin altına çökdü." (Werner Keller Und die Bibel hat doch recht (The Bible as History; a Confirmation of the Book of Books), New York: William Morrow, 1964 p. 75- 76)

Lut gölü və ya Ölü dəniz fəal seysmik zonanın episentrində yerləşir:

"Ölü dənizin dibi Rift dərəsi adlanan tektonik mənşəli çökəkdə yerləşir. Bu dərə Bəhr-Təbariyə (Tiveriad gölü) gölünün şimalından cənubda Arabah dərəsinin ortasına qədər uzanan üç yüz kilometrlik zonada əsas yer tutur."
(Le Monde de la Bible, Archeologie et Histoire, July-August 1993.)

Ayədə təsvir edilən "üzərinə bişmiş bərk daşlar yağdırdıq" hadisə Lut gölü sahilində baş vermiş vulkan partlayışından və bunun nəticəsində qaya və daş parçalarının göyə qalxmasından başqa bir şey deyil.




**1) Aralıq dənizi, 2) Təl-Əviv, 3) Qüds, 4) Lut qövmü, 5) Ölü dəniz.**

Quranda bu hadisə belə təsvir edilir:

**Biz onların üstünə** *(daşlardan)* **yağış yağdırdıq. Qorxudulanların yağışı nə yaman imiş!** (Şuəra surəsi, 173)

Verner Kellerin daha bir müşahidəsi:

"Yer qabığının çökməsi bu zəlzələ zamanı yer qabığı altında yatan vulkanları azad etdi. İordan çayının yuxarı dərəsində bu gün də sönmüş kraterləri görmək olar; burada əhəngdaşı laylarının üstündə donmuş lavaların və bazalt təbəqələrinin böyük kütlələri yerləşir." (Werner Keller Und die Bibel hat doch recht (The Bible as History; a Confirmation of the Book of Books), New York: William Morrow, 1964, p. 76)





**Lut gölünün peykdən çəkilmiş şəkilləri.**

Yerdə məhz massiv lava və bazalt qatlarının olması burada vulkanik partlayış və zəlzələnin olmasının ən aşkar sübutudur. Quranda təsvir edilən "üzərinə odda bişmiş bərk daşlar yağdırdıq" hadisəsi çox güman ki, bu vulkanik partlayışın təsviridir. Elə həmin ayədə sonrakı hadisə haqda deyilən **"əmrimiz gəldikdə oranın altını üstünə çevirdik"** ifadəsi Rift dərəsində vulkan püskürməsinin ardınca gələn tektonik mənşəli zəlzələ və bunun ardınca gələn yer qabığı hissəsinin çatları olmalıdır.

Lut gölünün özündə daşıdığı "aşkar əlamətlər" həqiqətən çox informativdir. Quranda adı çəkilən hadisələr Yaxın Şərq, Ərəbistan yarımadası və Misir regionunda baş verirdi. Lut gölü bu ərazinin düz mərkəzində yerləşir. Lut gölü həmçinin həm tarixi, həm də geoloji nöqteyi-nəzərdən xüsusi diqqət cəlb edir. Göl Aralıq dənizi səviyyəsindən

400 metr aşağıda yerləşir, gölün ən dərin nöqtəsinin 400 metr dərinliyində yerləşdiyini nəzərə alsaq, bu gölün dibi Aralıq dənizi səviyyəsindən 800 metr aşağıda yerləşir. Bu isə Yer kürəsinin ən aşağı nöqtəsidir.

Yerin digər regionlarında bu ölçü yüz metri keçmir. Lut gölü suyunda 30 faizə çatan duzun yüksək qatılıq dərəcəsi ilə də fərqlənir. Buna görə də göldə heç bir canlı orqanizm yaşamır, bu isə bir sıra Qərb dillərində “Dead Sea” (Ölü dəniz) kimi adlanan Lut gölünün adlarından birini izah edir.



**Lut gölü və ya digər bir adı ilə Ölü dəniz**

Lut xalqının başına gələn təbii fəlakət arxeoloqların gümanına görə, e.ə. 1800-cü illərdə baş verib. Alman alimi Verner Keller arxeoloji və geoloji tədqiqatların nəticələrinə arxalanaraq izah edir ki, Sodom və Gomorra şəhərləri Lut gölünün ən cənub nöqtəsində - Siddim dərəsi adlanan yerdə yerləşirdilər və bir vaxtlar burada iri məskunlaşma rayonları var idi.

Ən maraqlısı odur ki, Lut gölünün quruluşu bu hadisənin necə baş verməsini təsdiqləyir.



**Lut qövmünün məhv olmasına səbəb olan vulkanik zəlzələ və ardından meydana gələn çöküşü göstərən illüstrasiya**



“Lut gölünün şərq hissəsində yarımada əmələ gətirən və dili xatırladan quru hissə gölün ortasına gedir. Ərəblər bu hissəni “əl-Lisan”, yəni “dil” adlandırıblar. Burada gölün

dibində gölü sanki iki yerə bölən, ancaq kənardan gözə görünməyən kəskin çat (yarıq) keçir. Gölün yarımadanın sağ tərəfindəki dərinliyi 400 metr təşkil edərkən sol tərəfi qəribə şəkildə kiçikdir. Son zamanlar aparılan ölçmələr göstərir ki, bu yerdə dərinlik ancaq 15-20 metrə çatır. Müəyyən edildiyi kimi, dərin olmayan bu hissə adıçəkilən zəlzələnin və onun yaratdığı massiv çöküntünün nəticəsində gölün özündən sonra əmələ gəlib. Keçmişdə Sodom və Gomorra şəhərlərinin yerləşdiyi ərazi elə budur, yəni Lut peyğəmbər xalqının yaşadığı yer.

Bir vaxtlar buradan qarşı sahilə piyada getmək olardı. Keçmişdə Siddim dərəsində yerləşən Sodom və Gomorra şəhərləri indi Ölü dəniz sularının altında gizləniblər.

Bu yerdə e.ə. təxminən 2000-ci ildə baş vermiş dağıdıcı zəlzələ nəticəsində dənizin dibinin çökməsi şimaldan gələrək sonralar əmələ gəlmiş boşluqları dolduran duzlu suların axınına səbəb olub." (Ibid, pp. 73-74)

Lut xalqının sivilizasiyasının izləri bu gün də görünür. Lut gölünün bu aşağı hissəsində qayıqla gəzinti zamanı aydın gündə, günəş şüaları su səthindən müvafiq bucaq altında əks ediləndə insan qəribə panorama ilə qarşılaşır.

Sahildən bir az aralıda gölün duzları ilə son dərəcə bol-bol "konservləşdirilmiş" ağaclar görünür. Su altında yaşıl görünən ağac budaqları və gövdələri əslində çox nazik və kövrəkdir. Bir zamanlar bu ağacların çiçəklədiyi və ərazini qalın yarpaqlar arxasında görünməz edən bu yer məhz Siddim dərəsi - bu diyarın təbiətinin gözəl guşəsidir.

Lut xalqının yaşadığı yerdə zəlzələyə səbəb olan fiziki proseslər geoloqların apardığı tədqiqatlardan aydın olur. Onlar belə nəticəyə gəlir ki, Lut xalqını məhv edən bu fəlakət Iordan çayının yatağını təşkil edən və 190 km uzunluğu olan, ümumiyyətlə, 180 metr səviyyədən aşağı enən ərazidə yer qabığının yarılması nəticəsində baş verib.

Bu fakt və Lut gölünün dəniz səviyyəsindən 400 metr aşağıda yerləşməsi burada bir zamanlar bir geoloji-tektonik kataklizmin baş verməsinin ən vacib sübutlarından biridir.

Lut gölünün və Iordan çayının bu qəribə quruluşu Yer kürəsinin bu rayonundan keçən çatın və ya sınığın yalnız kiçik hissəsindən ibarətdir. Geoloqlar bu çatın vəziyyətini və uzunluğunu bu yaxınlarda müəyyən ediblər.

Tavra dağının ətəklərindən başlayan bu çat Lut gölünün cənub sahilindən və Ərəbistan səhrasından keçir, oradan Əkəb körfəzinə çatır və Qırmızı dənizdən keçərək Afrikada yolunu bitirir. Bu çatın uzunluğu boyunca güclü vulkanik hərəkətlərin olması məlumdur. İsrailin Qaliley dağlarında, İordaniyanın uca dağlı yaylarında, Əkəb körfəzində və yaxınlıqda yerləşən başqa rayonlarda donmuş lavaya və ya qara bazaltın daşlaşmış qalıqlarına rast gəlmək olar.

Yer quruluşunun bütün bu qalıqları və geoloji xüsusiyyətləri Lut gölündə iri geoloji-tektonik hadisənin baş verməsinin reallığını sübut edir.









**Gölə sürüşən şəhərin bəzi qalıqları Lut gölünün cənub sahilində tapılmışdır. Bu qalıntılar, Lut qövmünün həyat səviyyəsinin çox yüksək olduğunu göstərirdi.**

Alman arxeoloqu və tarixçisi Verner Keller bu haqda belə yazır:

*"Bir zamanlar bu rayonda özünü büruzə verən iri çöküntü zamanı burada şimşəklə, təbii qazların partlayışı və yanğınlarla müşayiət edilən qorxulu zəlzələ baş verib və Siddim dərəsi Lut xalqının şəhərləri ilə birlikdə yerin dibinə çöküb. Bu zəlzələ zamanı Yer qabığının çökməsi Yer qabığı altda yatan vulkanları azad etdi. İordan çayının üst dərəsində bu gün də sönmüş kraterləri görmək olar: burada əhəngdaşı laylarının üstündə çoxlu iri donmuş lava və bazalt təbəqələri yerləşir."* (Ibid, pp. 75-76)

"National Geographic" jurnalının 1957-ci il dekabr nömrəsində bu Bibliya süjetinə həsr edilmiş məqalələr silsiləsində xəbər verilirdi:

*"Sodom yüksəkliyi Ölü dəniz istiqamətində qalxır. İndiyə qədər heç kəs itmiş Sodom və Gomorra şəhərlərini tapa bilməyib, ancaq alimlərin fikrincə, bu şəhərlər hələ də qayalıq sahili ilə üzbəüz yerləşən Siddim dərəsində dururlar. Çox güman ki, onlar zəlzələdən sonra Ölü dənizin gur suları altında qalıblar."*

(G. Ernest Wright, Bringing Old Testament Times to Life, National Geographic, Vol. 112, December 1957, p. 833)



**Lut qövmünün məhvi bir çox rəssamın mövzusu olmuşdur. Yuxarıdakı bir nümunə.**

# POMPEYİN AQİBƏTİ

Quran bizə bildirir ki, Allah-Təalanın göndərdiyi əmrlər dəyişməzdir:

**Onlar Allaha çox möhkəm and içdilər ki, özlərinə qorxudan** *(bir peyğəmbər)* **gəlsə, hər hansı ümmətdən daha çox doğru yolda olacaqlar. Onlara qorxudan** *(peyğəmbər)* **gəldikdə isə bu, onların ancaq nifrətini artırdı.** *(Bütün bunlar)* **onların yer üzündə təkəbbür göstərmələrinə və yaramaz hiyləgərliklər törətdiklərinə görə idi. Yaramaz hiylələr isə ancaq öz sahiblərini qaplayar. Onlar əvvəlkilərin başlarına gələn aqibətdən başqasınımı gözləyirlər? Sən Allahın qayda-qanununa heç bir əvəz tapa bilməzsən, Allahın qayda-qanununda heç bir dəyişiklik də tapa bilməzsən.** (Fatir surəsi, 42-43)

Allahın qanunlarında özünü görməməzliyə vurma, üzgörənlik etmə yoxdur, Onun əmrlərinə etinasızlıq edən hər bir kəs cəzalandırılacaq. Pompey şəhəri seksual pozğunluqlar və iyrəncliklər içində batan Roma imperiyasının mənəvi-əxlaqi süqutunun ümumi rəmzidir. Pompeyin məhv olmasının tarixi Lut xalqının aqibəti ilə xeyli ümumi xüsusiyyətlərə malikdir.



**Yandakı şəkil açıq şəkildə göstərir ki, Pompey əhalisi fəlakətdən əvvəl böyük dəbdəbə və əzəmət içində yaşayırdı.**

## POMPEYİN HƏLAKI, VEZUVİ VULKANININ PÜSKÜRMƏSİ İLƏ GERÇƏKLƏŞMİŞDİR

Vezuvi vulkanının püskürməsi Pompey fəlakətinə səbəb oldu. Neapolun yaxınlığında yerləşən bu vulkan İtaliyanın rəmzidir. Artıq 2000 il ərzində yatan Vezuvi boş yerə “İbrət dağı” adlandırılmır.

Öz kədərli aqibəti ilə məşhur olan Sodom və Gomorranın başına gələn bu fəlakətin Pompey hadisəsi ilə çox oxşarlığı var.

Vezuvinin qərb yamacında Neapol, şərq yamacında isə Pompey şəhəri yerləşir. Təxminən 2000 il əvvəl baş vermiş vulkan püskürməsi şəhəri bir anda məhv etdi. Pompeyə yönələn lava və kül selləri şəhər sakinlərini bir anda yaxaladı. Şəhərin fəlakətli şəkildə məhv olması o qədər ani şəkildə baş

verdi ki, bütün sakinlər vulkan süxuru qalıqları altında təbii pozalarda saxlanırlar və hər şey olduğu kimi elə qalıb ki, sanki iki min il əvvəl zaman qəfildən dayanıbmış.



**Pompey qalıntılarından çıxarılan daşlaşmış insan cəsədlərindən bir neçə nümunə.**

Pompeyi bu şəkildə məhv edən Allahın qəzəbinin ciddi səbəbləri var idi. Tarixi sənədlər dəlalət edir ki, şəhər fəlakətdən əvvəl əxlaqsızlığın və pozğunluğun əsl mərkəzi idi. Şəhərin fərqləndirici xüsusiyyəti fahişəliyin son dərəcə yüksək səviyyəsi idi. Şəhərdə fahişəxanaların sayı o qədər çox idi ki, hətta Pompeyin sakinləri belə onların minlərlə hesablanan sayı haqda dəqiq məlumat verə bilmirdilər. Bordellərin qapılarında kişi cinsi orqanının tam həcmdə rəmzləşdirən heykəlcikləri asılırdı. Mitraizm ayininə istinad edən Pompey sakinləri arasında yayılmış adətə görə, cinsi orqanlar və cinsi akt kimi bu cür xüsusiyyətlər mütləq açıq nümayiş etdirilməli idi.

Vezuvidən axan qızmar lava şəhəri bir anda yer üzündən sildi. Bir fakt maraqlıdır ki, qorxulu gurultu və vulkan partlamasına baxmayaraq heç kəs

baş verənin mahiyyətini anlaya və qaça bilmədi, sanki hər kəs tilsimlənmişdi. Arxeoloqlar faciə vaxtı süfrə arxasında oturmuş və heç bir dəyişikliyə məruz qalmadan daşlaşmış ailənin qalıqlarını aşkar ediblər. Cinsi əlaqə zamanı bir anda donmuş xeyli cütlərin qalıqlarına da rast gəlinirdi. Ən möcüzəli odur ki, bu cütlər arasında təkcə homoseksuallar deyil, uşaqlar da vardı. Qazıntılar zamanı çıxarılmış bəzin insanların sifətlərinin ifadəsi belə dəyişməmişdir. Onların üzündə bir qayda olaraq çaxnaşma və çaşqınlıq ifadə olunurdu.



**Pompey qalıntıları arasından çıxarılan daşlaşmış cəsədlər.**

Fəlakətin ən izah edilməyən vəziyyəti məhz burada gizlənib. Necə olub ki, minlərlə insan heç nə görməyərək və eşitməyərək, xilas olmaq üçün heç bir tədbir görməyərək sakitcə ölümün gəlişini gözləyirdi?

Bu amil Pompeyin yoxa çıxmasından əvvəlki real hadisələrlə bizim diqqətimizi bütöv bir şəhərin bir anda itməsinə yönəldən Quran təsvirləri arasındakı oxşarlığı göstərir. Məsələn, "Yasin" surəsində bir anda həlak olmuş "kəndin yiyələri" haqda bəhs edilir. Bu surənin 29-cu ayəsində hadisə haqda belə deyilir:

*(Onları məhv edən)* **ancaq dəhşətli bir səs oldu. Onlar birdən sönüb getdilər.** (Yasin surəsi, 29)

"Qəmər" surəsinin 31-ci ayəsində Səmud xalqının həlakından bəhs

edilərkən də, yenə "anında məhv olma" hadisəsinə diqqət çəkilir:

**Həqiqətən, Biz onlara bircə tükürpədici səs göndərdik və onlar mal-qara ağılında istifadə edilən quru saman kimi oldular.** (Qəmər surəsi, 31)

Arxeoloji qazıntılar zamanı əldə olunan faktlar sübut edir ki, Pompey sakinləri eynilə Qurani-Kərimdə deyildiyi kimi, bir anda qırılıblar.

Ancaq onlar Allahın bütün xəbərdarlıqlarına baxmadılar və Allah-Təalanın qəzəbi əxlaqsız Pompey sakinlərini məhv etdi ki, bu, gələcək nəsillərə ibrət olsun. Keçmiş Pompeyin yerində yaşayan insanların həyat tərzi Allahın qəzəbinə səbəb olan bu şəraitdən çox az fərqlənir. Pompey xarabalığının yaxınlığında yerləşən Kapri adası bu gün homoseksualların, lesbiyanların və nudistlərin bir növ istirahət paytaxtıdır, turist reklamı hamını bu "homoseksuallar cənnətini" ziyarət etməyə səsləyir. İnsanların həyat tərzində heç nə dəyişməyib, onları yenə də öz iyrəncliklərinə və əxlaqsızlıqlarına israrla davam edirlər. Bunlar təkcə İtaliyada və ya Kapri adasında baş vermir. Mənəvi degenerasiya müasir aləmdə hər yerdə müşahidə edilir, insanlar keçmiş xalqların başına gələn faciəni təəssüf ki, xatırlamaq istəmirlər.





**Pompeydə aşkar edilmiş daşlaşmış insan cəsədlərinin bəzi digər nümunələri.**

**Şəkildəki görüntülər fəlakətin nə qədər ani olduğunun çox gözəl nümunəsidir.**

# AD QÖVMÜ VƏ QUMLUQLARIN ATLANTİDASI - UBAR

**Ad** *(tayfası)* **isə hədsiz soyuq və şiddətli küləklə yox edildi.** *(Allah)* **onu yeddi gecə, səkkiz gün fasilə vermədən onların üstündə əsdirdi.** *(Sən orada olsaydın,)* **o tayfanı xurma ağacının yıxılmış çürük gövdələri kimi yerə sərilmiş görərdin. Sən onlardan qalan bir kimsəyə heç rast gəlmisənmi?**

(Haqqə surəsi, 6-8)

Quranın bir çox surələrində nəsihət üçün daha bir xalqın - Ad xalqının düşkünlüyü, deqradasiyası və məhv olması tarixi verilir. Xalqın kədərli tarixi Nuh peyğəmbərin xalqı barədəki hekayətlə eyni xatırladılır. Ad xalqına göndərilmiş Hud peyğəmbər öz xalqını tək olan Allaha inanmağa, Ona yeni tanrıları şərik qoşmamağa və Onun əmrlərinə tabe olmağa çağırırdı, ancaq xalq Hudu ağılsızlıqda, yalanda və əcdadlarının qoyduğu "düzgün" sistemi dəyişmək cəhdində günahlandıraraq ona düşmənçiliklə cavab verdi.

Qurani-Kərimdə Hud və Ad xalqı arasında baş verən hadisələr haqda ətraflı bəhs edilir:

**Ad qövmünə də qardaşları Hudu** *(göndərdik)*. **O dedi: "Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa ilahınız yoxdur. Siz ancaq iftira yaxırsınız. Ey qövmüm! Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım ancaq məni yaradana aiddir. Məgər anlamırsınız? Ey qövmüm! Rəbbinizdən bağışlanma diləyin, sonra da Ona tövbə edin ki, göydən sizə bolluca yağış yağdırsın və gücünüzü daha da artırsın. Günahkarcasına üz çevirməyin". Onlar dedilər: "Ey Hud! Sən bizə açıq-aydın bir dəlil gətirmədin, biz də sənin sözünlə tanrılarımızı tərk edən deyilik. Biz sənə inanmırıq. Biz ancaq onu deyə bilərik ki, bəzi tanrılarımız səni bəlaya düçar edib". O dedi: "Həqiqətən, mən Allahı şahid çağırıram, siz də şahid olun ki, mən sizin şərik qoşduqlarınızdan uzağam. Ondan başqa** *(tapındıqlarınızın hamısından uzağam)*. **Hamılıqla mənə qarşı hiylə qurun və mənə heç möhlət də verməyin. Mən, Rəbbim və Rəbbiniz olan Allaha təvəkkül etdim. Elə bir canlı yoxdur ki,** *(Allah)* **onun kəkilindən tutmuş olmasın. Həqiqətən, Rəbbim ədalətlidir. Əgər üz çevirsəniz,** *(bilin ki,)* **mənə əmr olunanı sizə çatdırdım. Rəbbim yerinizə başqa bir camaat gətirər və siz də Ona heç bir zərər yetirə bilməzsiniz. Şübhəsiz ki, Rəbbim hər şeyi hifz edir". Əmrimiz gəldikdə Hudu və onunla birlikdə iman gətirənləri Öz mərhəmətimizlə xilas etdik və onları ağır bir əzabdan qurtardıq. Bu Ad qövmü idi! Onlar Rəbbinin ayələrini inkar etdilər, Onun elçilərinə asi oldular və hər bir inadcıl təkəbbür sahibinin əmrinə uydular. Onları həm bu dünyada, həm də Qiyamət günündə lənət təqib edəcəkdir. Həqiqətən, Ad qövmü öz Rəbbini inkar etdi. Məhv olsun Hudun qövmü Ad!**

(Hud surəsi, 50-60)

Ad xalqından bəhs edən daha bir surə "Şuəra" surəsidir. Burada "hər yüksəklikdə əcaib şeylər quran" və "əbədi olmaq" ümidilə "çənlər düzəldən" Ad xalqının bəzi xüsusiyyətlərinə diqqət artır. Bundan əlavə, Ad xalqı başqa

xalqları zorakılıqla əsarət altına almaları ilə, öz qəddarlıqları ilə seçilir, fitnə-fəsad, nifaq və hərc-mərclik toxumu səpirdilər. Hud peyğəmbər xalqını qoruduqda onlar peyğəmbərin sözlərini "ilklərin yaradılışı" kimi izah edirdi və cəzasız qalacaqlarına son dərəcə əmin idilər:

**Ad tayfası da elçiləri yalançı saydı. Qardaşları Hud o vaxt onlara deyəndə ki: “Məgər qorxmursunuz? Həqiqətən, mən sizin üçün etibar etməli olduğunuz bir elçiyəm. Allahdan qorxun və mənə itaət edin! Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir. Əcəba, siz hər təpədə əbəs yerə bir əlamətmi qurursunuz** *(hündür binalarmı tikirsiniz)***? Sanki əbədi qalacaqsınız deyə qalalarmı tikirsiniz?** *(Bir kəsi)* **yaxaladığınız zaman qəddar hökmdar kimi yaxalayırsınızmı? Allahdan qorxun və mənə itaət edin! Bildiyiniz nemətləri sizə verəndən qorxun. O sizə heyvanat və oğul-uşaq verdi,** *(üstəlik)* **bağlar və çeşmələr də əta etdi. Mən sizə üz verəcək böyük günün əzabından qorxuram”. Onlar dedilər: “Bizə öyüd-nəsihət versən də, verməsən də, bizim üçün birdir. Bu, yalnız və yalnız əvvəlkilərin adətidir. Biz əzaba düçar olan da deyilik”. Onlar onu yalançı saydılar. Biz də onları məhv etdik. Şübhəsiz ki, bunda bir ibrət vardır. Lakin onların əksəriyyəti iman gətirmədi. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.** (Şuəra surəsi, 123-140)

Hud peyğəmbərə düşmənçilik göstərən və bununla Uca Allahın əmrlərinə qarşı qiyam edən xalq həqiqətən qırıldı. Qorxulu qum fırtınası Ad xalqını məhv etdi, "sanki onlar heç zaman olmamışdılar".

## İRƏM ŞƏHƏRİNDƏKİ ARXEOLOJİ TAPINTILAR

1990-cı illərin əvvəllərində dünyanın iri qəzet nəşrlərinin ilk səhifələri "Gözəl ərəb şəhəri tapıldı", "Mifik ərəb şəhəri tapıldı", "Qumluqların Atlantidası - Ubar" sərlövhələri ilə bəzənmişdi və onlar ən vacib arxeoloji kəşf barədə xəbər verirdilər. Bu kəşf xüsusi əhəmiyyətə malik idi, çünki bu şəhərin adı Qurani-Kərim ayələrində də keçir. Əksər alimlər Quranda adı çəkilən Ad xalqının bir vaxtlar dünyada yaşayan mifik xalqlardan biri olduğunu və ya Ad xalqının sivilizasiyasının qalıqlarını tapmağın mümkün olmayacağını güman edirdilər. Buna görə də arxeoloqların aşkar etdiyi şəhər elm aləmində sensasiya doğurdu. Yalnız bədəvi əfsanələrinin və nağıllarının zəngin fantaziyasının bəhrəsi kimi təsəvvür edilən şəhər real oldu.




**1) İraq, 2) İran, 3) Səudiyyə Ərəbistanı, 4) Oman, 5) Ad Qövmü, 6) Yəmən.**

**Ad Qövmünün yaşadığı Ubar şəhərinin qalıntıları, Omanın sahilə yaxın bir yerində tapıldı.**

Quranda adıçəkilən bu mifik şəhəri aşkarlayan ilk adam Nikolas Klepp adlı həvəskar arxeoloq idi. (Thomas H. Maugh II, Ubar, Fabled Lost City, Found by LA Team, The Los Angeles Times, 5 February 1992.) Ərəbşünas və sənədli filmlər prodüsseri olan Nikolas Klepp ərəb tarixi ilə bağlı materialları öyrənmək prosesində tam təsadüfən çox maraqlı bir kitaba - ingilis tədqiqatçısı Bertram Tomasın 1932-ci ildə yazdığı son dərəcə maraqlı Arabia Felix kitabına rast gəldi. Qədim romalılar Ərəbistan yarımadasında yerləşən və hazırda Yəmən və Omanı özünə daxil edən rayonu Arabia Felix adlandırırdılar. Qədim yunanlar bu rayonu Eudaimon Arabia, orta əsrlərin ərəb alimləri isə "Əl-Yəmən Əs-Səidə" adlandırırdılar. (Kamal Salibi, A History of Arabia, Caravan Books, 1980) Bütün bu adlar "Xoşbəxt Ərəbistan" deməkdir. Çünki Ad Qövmü öz dövrünün ən inkişaf etmiş, xoşbəxt və firavan xalqı kimi tanınırdılar.

Bu tərəqqinin səbəbi nə idi? İndi səhralıq olan bu ərazilər nə üçün belə ad almışdı?

Bunun səbəbi buranın Hindistanla Şimali Ərəbistan arasında bərqərar olmuş ədviyyat ticarətinin mərkəzinə çevrilməsi və onun strateji mövqeyi idi. Bundan əlavə, yerli əhali nadir frankincense (büxur) adlı bitkinin becərilməsi və ticarəti ilə məşğul idi. Qədim xalqların böyük tələbat hiss etdiyi bu bitkidən qədim xalqların dini ayinlərində tüstülətmə üçün istifadə edilirdi. Büxur o zamanlar elə yüksək dəyərləndirilirdi ki, dəyəri qızıla bərabər idi.

İngilis tədqiqatçısı Bertram Tomas kitabının bir bölümünü "uğur qazanmış" xalqların təsvirinə həsr etdi. O, bəyan etdi ki, bu xalqlardan birinin əsasını qoyduğu şəhərin izinə düşüb. Bu, bədəvilərin Ubar adlandırdığı şəhər idi. B. Tomasın bu yerə tədqiqat ekspedisiyalarından birində səhrada yaşayan bədəvilər ona köhnə cığırı göstərdilər və onun Ubar adlı qədim şəhərə məxsus olduğunu bildirdilər. Ancaq B. Tomas tezliklə, tədqiqatlarını bitirmədən vəfat etdi.

(Bertram Thomas, Arabia Felix: Across the Empty Quarter of Arabia, New York: Schrieber’s Sons 1932, p. 161)

Ondan qalma əlyazmaları öyrənən və Tomasın işlərinin davamçısı olan arxeoloq Klepp kitabda adıçəkilən bu itmiş şəhərin mövcudluğuna əmin oldu və vaxt itirmədən axtarışlara başladı.

Klepp Ubarın mövcudluğunu sübut etmək üçün iki tədqiqat üsulundan istifadə etdi: o, bədəvilərin söylədiyi cığırın izlərini tapdı, həmçinin NASA (ABŞ Milli Kosmik Tədqiqatlar Agentliyi) mütəxəssislərindən bu yerin peykdən şəklini çəkməsini xahiş etdi. Uzun-uzadı xahiş-minnətdən və dilətutmalardan sonra NASA bu işlərin aparılmasını bəyəndi və bu rayonun şəklini çəkmək kimi qeyri-adi xahişi yerinə yetirməyə razılıq verdi.

(Charlene Crabb, Frankincense, Discover,January 1993)

Bunun ardınca Klepp Kaliforniya ştatının Hantinqon kitabxanasında olan coğrafi xəritələrin və qədim əlyazmaların öyrənilməsinə başladı. O bu rayonun coğrafi xəritəsini tapmağa çalışırdı və qısamüddətli tədqiqatlardan sonra buna nail oldu. Onun tapdığı xəritəni Misir və Yunanıstan vilayətlərində eramızın 200-ci ilində qədim yunan alimi Ptolemey tərtib etmişdi. Xəritədə qədim şəhərin yeri və ona aparan yolun sxemi aydın göstərilirdi.

Bu vaxt NASA-dan çəkilmiş şəkillər haqda məlumat gəldi. Şəkillərdə adi gözlə görünməyən, yüksəklikdən bir bütöv kimi görünən bəzi yolların izləri aşkar edildi. Klepp əlindəki xəritəni bu fotoşəkillərlə tutuşduraraq nəhayət, arzuedilən nəticəyə gəldi. Qədim xəritədə və şəkillərdə işarə edilən yollar tam eyni idi. Onların qırıldığı, kəsildiyi yerlərdə isə böyük bir ərazi var idi. Görünür, firavan şəhər özü keçmişdə elə orada yerləşirmiş.




**Kosmik gəmidən çəkilmiş fotoşəkillərlə əldə edilən görüntülərdə Ad qövmünün yeri təsbit edildi. Fotoda ticarət yollarının kəsişdiyi yer, yəni Ubar işarələnmişdir.**

**1) Ubar, qazıntı edilmədən öncə ancaq kosmosdan görünə bilir.**

**2) Aparılan qazıntılar zamanı 12 metr qumun altından bir şəhər çıxdı.**

Nəticədə bədəvilərin şifahi danışıqlarının süjeti olan əfsanəvi şəhərin yeri aşkar olundu. Bir müddət sonra qazıntılar başladı və "qumluqların Atlantidası" adlanan Ubarın qalıntıları qumların altından tezliklə üzə çıxarıldı.



**Ubarda aparılan qazıntılar zamanı Quranda bildirildiyi kimi çoxlu sənət əsərləri və yüksək mədəniyyət əsərləri tapıldı.**



Ubarda aparılan qazıntı işləri

Hər halda məhz bu qədim şəhərin Quranda bəhs edilən Ad xalqının şəhəri - Ubar olduğuna əminlik necə yarandı?

Hələ qazıntıların lap əvvəlində qumlardan bu xarabalıqların adı Quranda çəkilən Ad xalqının şəhərinə və İrəm sütunlarına məxsus olmasını təsdiqləyən sübutlar çıxırdı. Çünki qazıntılar zamanı tapılan tikililər arasında Quranda xüsusi qeyd edilən hündür sütunlar var idi. Qazıntılarda iştirak etmiş doktor Zarins həmçinin bəyan edirdi ki, şəhər başqa arxeoloji tapıntılardan yüksək sütunların olması ilə fərqlənir və beləliklə, Quranda adıçəkilən Ad şəhəri İrəmdir. İrəm Quran ayələrində belə təsvir edilir:

**Məgər görmədinmi ki, Rəbbin nələr etdi Ad** *(qövmünə)*, **sütunlar sahibi İrəm** *(qəbiləsinə)* **– halbuki, yer üzündə onlar kimisi xəlq edilməmişdi.**

(Fəcr surəsi, 6-8)

## AD XALQI

Beləliklə, biz müasir arxeoloqların Ubar şəhərinin elə Quranda adı çəkilən İrəm şəhəri olduğunu sübut edən tədqiqatlarını nəzərdən keçirdik. Quran deyir ki, şəhərin əxlaqsız sakinləri onlara vəhy gətirən və Allahın gözlənilən cəzasından qorumaq istəyən peyğəmbərə qulaq asmadılar və məhv edildidər.

İrəmi tikmiş Ad xalqının adı ətrafında da xeyli mübahisələr var idi. Tarixi sənədlərdə bu xalqın qurduğu bu dərəcədə yüksək inkişaf etmiş mədəniyyət və həyat səviyyəsi haqda heç bir məlumat qalmayıb. Tarixi sənədlərdə bu cür

məlumatın olmaması çox qəribədir.

Ancaq unutmayaq ki, Ad xalqı Cənubi Ərəbistanda - Orta Şərq və Mesopotamiyanın yaşayış məskənlərindən çox uzaq yerdə yaşayırdılar və onların başqa xalqlarla əlaqələri ya çox məhdud idi, ya da heç yox idi. Çox az tanınan dövlət haqda məlumatın olmaması çox normaldır. Bununla yanaşı, Orta Şərq əfsanələrində Ad xalqı haqda da eşitmək olar.

Yazılı mənbələrdə Ad xalqı haqda məlumatın olmamasının əsas səbəbi yəqin ki, bu regionda yazının hələ yayılmaması idi. Yəqin Ad xalqı dövlət qurublar, ancaq bu, tarixi salnamələrdə qeyd edilməyib. Əgər bu dövlət yazının əmələ gəlməsinə qədər bir müddət fəaliyyət göstəribsə, çox güman ki, indi o haqda daha çox şey məlumdur.

Ad xalqı haqda heç bir tarixi qeydlər yoxdur, ancaq sirli xalqın mövcudluğunu işıqlandıran "əcdadları" haqda məlumatlara rast gəlinir.

## AD XALQININ TÖRƏMƏLƏRİ - HƏDRAMİLƏR

Ad xalqının və ya onların əcdadlarının tikdiyi güman edilən sivilizasiya izlərinin axtarışını ilk növbədə qumluqların Atlantidası - Ubar yerləşən Cənubi Yəməndən başlamaq lazımdır. Yunanların "uğur qazanmış ərəblər" adlandırdıqları dörd xalq - hədramilər, səbalılar, minalar və qatabanlılar məhz burada yaşayırdı. Bu xalqlar bir-birinə yaxın ərazilərdə yetərincə uzun müddət ərzində hökmranlıq etdilər.

İndi əksər tarixçilər iddia edirlər ki, Ad xalqı müəyyən dəyişikliklər dövrünü keçdilər və yenidən tarix səhnəsinə çıxdılar. Bu alimlərdən biri Ohayo Universitetindən olan tədqiqatçı doktor Mikail H. Rəhman hesab edir ki, Ad xalqı Cənubi Yəməndə yaşamış dörd xalqdan birinin - hədramilərin əcdadları idilər. Meydana çıxması e.ə. 500-cü illərə uyğun gələn hədramilər "uğur qazanmış ərəblər" adlananların arasında ən az tanınanlarıdır. Bu xalq uzun müddət ərzində bütün Cənubi Yəmən rayonuna nəzarət edirdi, ancaq o, e.ə. 240-cı ildə dövlətçiliyin uzunmüddətli süqutu dövründən sonra öz mövcudluğuna son qoydu.

Hədrəmilərin Ad xalqının əcdadları olmasının sübutu çox güman ki, elə bu xalqın adındadır. E.ə. üçüncü əsrdə yaşamış qədim yunan yazıçısı Plini bu xalqı "Adramitai", yəni hədramilər adlandırırdı. (Nigel Groom, Frankincense and Myrrh, Longman, 1981, p. 81) "Adramitai"nin ismi isə "hədrəm" sözüdür. Çox güman ki, "hədrəm" sözü Quranda "Ad-ı-Irəm", yəni "İrəm Ad xalqı" kimi keçir və o dövrdən bəzi fonetik dəyişikliklərə məruz qalıb.

Qədim yunan coğrafiyaçısı Ptolemey (b.e. 150-160) Ərəbistan yarımadasının cənubunu "hədramiai" xalqının yaşayış rayonu kimi göstərir. Bu rayon yaxın zamanlara qədər "Hadramaut" kimi tanınırdı. Hədrəmilər dövlətinin paytaxtı Sabvah Hadramaut dərəsinin qərbində yerləşirdi. Həmçinin qeyd etmək lazımdır ki, deyilənlərə görə, Ad xalqına göndərilmiş Hud peyğəmbərin qəbri məhz Hadramautda yerləşir.

Hədrəmilərlə Ad xalqının qohumluğuna işarə edən digər amil onların saysız-hesabsız var-dövlətidir. Yunanlar hədramiləri "yer üzündə ən varlı xalq" kimi xarakterizə edirdilər. Qədim yunan salnamələri hədramilərin bu

cür var-dövlətə qiymətli ətir bitkisinin - büxurun sayəsində nail olduqlarına dələlət edir. Hədrəmilər bu bitkinin yeni tətbiq sahəsini tapdılar və bu regionun əksər ölkələri ilə bu strateji məhsulun geniş ticarətini apardılar. Qədim yunan tarixçilərinin salnamə mənbələrinə görə, kənd təsərrüfatı dövriyyəsinin həcmi və bu ətrin istehsalı indikindən xeyli artıq idi.

Hədrəmilərin paytaxtı kimi tanınan Sabvah şəhərində aparılmış qazıntılar olduqca maraqlı memarlıq tikintilərini üzə çıxardı. 1975-ci ildə başlanmış bu işlər zamanı arxeoloqlar iri qum kütləsi ucbatından şəhərin qalıqlarını çox çətinliklə tapa bildilər, ancaq onların qalın qum qatını uzun-uzadı təmizlədikdən sonra qarşılaşdığı mənzərə hər kəsi öz mükəmməlliyi və əzəməti ilə heyran etdi. Tapılmış antik şəhər arxeoloqların bu günə qədər aşkar etdiyi qədim dünyanın ən böyük memarlıq incisindən biri idi. Şəhəri əhatə edən qalanın divarları Yəməndə tapılmış şəhər divarları arasında ən qalını və ən möhkəmi idi. Çar sarayı isə yarıuçmuş vəziyyətinə baxmayaraq hələ də özündə olan əzəmətin və monumentallığın izlərini daşıyırdı.

Hədrəmilərin bu memarlıq mirasını öz əcdadları Ad xalqından götürdüklərini düşünmək tam məntiqli olardı. Çünki Quran Hud peyğəmbərin Ad xalqına yönələn xəbərdarlığı haqda deyir:

**Əcəba, siz hər təpədə əbəs yerə bir əlamətmi qurursunuz** *(hündür binalarmı tikirsiniz)***? Sanki əbədi qalacaqsınız deyə qalalarmı tikirsiniz?**

(Şuəra surəsi, 128-129)

Aşkar edilmiş Səbvah memarlığının başqa cəlbedici xüsusiyyəti təmtəraqlı və möhtəşəm sütunlar idi. Bu sütunlar monolit və kvadrat şəklində yonulmuş Yəmən şəhərləri sütunlarından fərqlənirdi. Səbvah sütunları isə yumru formada yonulmuşdu və dairəvi şəkilli idilər. Səbvah xalqı öz əcdadlarının - Ad xalqının arxitektura üslubuna yiyələnmişdilər. Eramızın 9-cu əsrində yaşamış Bizans Konstantinopolunun baş yepiskopu Fotiy indi itmiş qədim yunan əlyazmalarından, o cümlədən tarixçi Aqatarasidin (e.ə. 132-ci il) "Qırmızı dəniz haqda" kitabından istifadə edərək cənub ərəbləri və onların ticarət fəaliyyəti haqda xeyli tədqiqatlar apardı. Əsərlərinin birində Fotiy yazırdı: "Deyirlər ki, onlar (cənub ərəbləri) gümüş və qızıla bürünmüş xeyli sütunlar tikirdilər. Bu sütunların dairəvi yerləşməsi diqqətəlayiq idi".

(Ibid., p. 72)

Fotiyin bu ifadəsi birbaşa hədramilərə işarə etməsə də, bu ifadə regionun xalqlarının memarlıq məharətini və var-dövlətini əks etdirdiyinə görə vacibdir. Qədim yunan tarixçi və yazıçıları Plini və Strabon Cənubi Yəmən haqda "valehedici gözəl məbəd və saraylarla bəzədilmiş" diyar kimi danışırlar.

Bu şəhərlərin sakinlərinin Ad xalqının əcdadları olduğunu güman etdikdə Quranda Ad xalqı diyarının **“sütunlar sahibi İrəm** *(qəbiləsinə)* **–”** (Fəcr surəsi, 6-7) kimi anıldığı aydın olur.

## AD XALQININ ÇEŞMƏLƏRİ VƏ BAĞLARI

Müasir Cənubi Ərəbistan səyyahın gözü qarşısında geniş səhra kimi dayanır. Şəhərləri və süni yaşıllaşmış rayonları çıxmaqla ərazilərin böyük hissəsi qumla örtülüb.

Ancaq Ad xalqından bəhs edən Quran ayələrinin birində olduqca maraqlı məlumat var. Ad xalqını xəbərdar edən Hud peyğəmbər onlara nümunə olaraq Allahın bəxş etdiyi çeşmələri və bağları misal gətirir:

**Allahdan qorxun və mənə itaət edin! Bildiyiniz nemətləri sizə verəndən qorxun. O sizə heyvanat və oğul-uşaq verdi,** *(üstəlik)* **bağlar və çeşmələr də əta etdi. Mən sizə üz verəcək böyük günün əzabından qorxuram.** (Şuəra surəsi, 131-135)

Ancaq artıq deyildiyi kimi, bir vaxtlar Ubarın yerləşdiyi torpaqlar İrəm şəhəri ilə oxşadılaraq eyniləşdirilib və ya praktiki olaraq bütün Cənubi Yəmən bu gün qum səhraları ilə örtülüb. Bəs onda Hud peyğəmbər xalqına müraciət etmək üçün o zaman niyə bu ifadədən istifadə edib?

Cavab sadədir - zaman keçdikcə iqlimin dəyişməsi bir vaxtlar çiçəkləyən diyarı səhraya çevirdi. Tarixi faktlar ona dəlalət edir ki, qədimdə, bir neçə min il bundan əvvəl Cənubi Yəmənin əraziləri Quranda da deyildiyi kimi, yaşıllıq içində üzürdülər və kiçik çaylarla bol idilər. Yerli sakinlər bu nemətlərdən faydalanır, meşələr bölgənin sərt iqlimini yumşaldır və onu həyat üçün yararlı edirdi. Səhralıq da var idi, ancaq o, hazırkı qədər yer tutmurdu.

Cənubi Ərəbistanda Ad xalqı yaşayan yerlərdə qazıntılar zamanı bu sualın cavabı tapıldı. Kəşflər göstərdi ki, yerli xalqlar inkişaf etmiş suvarma sistemindən istifadə edirmiş. Bu isə yalnız bir şeyi təsdiqləyir: indi insan həyatı üçün yararsız olan bu rayonlarda bir vaxtlar suvarma əkinçiliyi çiçəkləmişdi.

Ramlat at-Sabatayan yaşayış məskəninin ətrafının peykdən çəkilmiş şəkillərində bənd qalıqları və suvarma arxlarının qalıqları aşkar edilmişdir. Bu tikintilərin forma və ölçüləri onların 200 min nəfərlik əhalinin ehtiyacını ödəyə biləcəyini göstərir. (Joachim Chwaszcza, Yemen, 4PA Press, 1992) Ərəbistan yarımadasının tədqiqatlarında iştirak edən arxeoloq Doe yazırdı: "Məribin ətrafındakı ərazi o qədər məhsuldar idi ki, əminliklə demək olar: burada Mərib və Hadramaut arasında bir vaxtlar bol məhsuldar əkinçilik çiçəkləyib". (Ibid)

Qədim yunan tarixçisi Plini də öz əsərlərində buranın məhsuldar torpağı, zəif bitki örtüyünə malik ucsuz-bucaqsız meşəli dağları haqda danışırdı. Hədrəmilərin paytaxtı Sabvahın yaxınlığında yerləşən erkən dövr məbədlərinin divar yazılarında deyilir ki, burada heyvanları ovlayır və onları qurban kəsirdilər. Bütün bunlar bu diyarlarda bir zamanlar səhralarla yanaşı məhsuldar və çiçəkləyən torpaqların olmasına şahidlik edir.

Bu yerin səhraya dönməsi üçün nə qədər zamanın keçməsi məsələsi əksər tədqiqatların mövzusu oldu. Onlardan biri Pakistanda Smitsonian İnstitutunda aparılmışdı. Geoloqlar müəyyən ediblər ki, orta əsrlərdə məhsuldar sahə kimi tanınan bu rayon indi 6 metrlik qum qatı altında qalıb. Bu qat qum fırtınaları nəticəsində gündə 15 santimetr arta, yəni səhra hətta ən yüksək tikintiləri qısa zaman müddətində "udub" onu qum altında qoya bilər. Məsələn, 50-ci illərdə Yəmənin Timna rayonunda qazıntılar zamanı aşkar edilən tikintilər indi yenə qumla örtülüb. Bu qumlar yalnız

uzunmüddətli qazıntılar zamanı yerin üstünə çıxarılmış Misir piramidalarını da bir vaxtlar tamamilə örtürdülər. Bir sözlə, bunu ehtimal etmək tam məntiqidir ki, qumla örtülmüş səhra regionun keçmişdə tam başqa cür görünüşü var idi.

## AD XALQI NECƏ MƏHV EDİLDİ?



Ad qövmünün yaşadığı ərazi qum təpələri ilə dolu idi.

Quranda deyilir ki, Allah-Təalanın xəbərdarlığına tabe olmayan Ad xalqı səkkiz gün və yeddi gecə davam edən "gurultulu küləklə" məhv edildilər:

**Ad** *(qövmü)* **də** *(elçiləri)* **yalançı saydı.** *(Görəydin)* **Mənim əzabım və qorxutmağım necə oldu! Biz uzun sürən uğursuz bir gündə onların üstünə çox soyuq külək göndərdik. O, insanları kökündən çıxardılmış xurma kötükləri kimi qopardıb atırdı.** (Qəmər surəsi, 18-20)

**Ad** *(tayfası)* **isə hədsiz soyuq və şiddətli küləklə yox edildi.** *(Allah)* **onu yeddi gecə, səkkiz gün fasilə vermədən onların üstündə əsdirdi.** *(Sən orada olsaydın,)* **o tayfanı xurma ağacının yıxılmış çürük gövdələri kimi yerə sərilmiş görərdin.**

(Haqqə surəsi, 6-7)

Dəfələrlə xəbərdarlıqlara baxmayaraq xalq öz lovğalığı və qüruru ilə kor olmuşdu və Hud peyğəmbərdən inadla imtina etməkdə davam edərək heç bir nəsihəti eşitmirdi. Bununla belə camaat elə səhlənkar idi ki, hətta fəlakətin yaxınlaşdığını görərək baş verənlərin mahiyyətini dərk etmədi və Allahı inkar etməkdə davam etdilər:

**Nəhayət o** *(əzabı)* **vadilərinə doğru gələn bir bulud şəklində gördükdə: "Bu bizə yağış yağdıracaq buluddur!"– dedilər.** *(Hud dedi:)* **"Xeyr! Bu sizin tez gəlməsini istədiyiniz – özü ilə ağrılı-acılı əzab gətirən bir küləkdir!**

(Əhqaf surəsi, 24)

Ayədə deyilir ki, insanlar onlara cəza gətirən bulud gördülər, ancaq əslində nə baş verdiyini yenə də dərk etmədilər. Onlar bunu yağış sandılar. Bu vəziyyət bizə hadisələrin gedişatını təsəvvürə gətirməyə imkan verir. Qum fırtınası həqiqətən uzaqdan yağış buluduna bənzəyir. Bəlkə Ad xalqı da buludun bu görünüşünə aldanıb və hadisələrin başqa axarını gözləməyiblər. Cənubi Ərəbistanı tədqiq edən arxeoloq Doe qum fırtınasını belə təsvir edir: "(Qum fırtınasının) ilk əlaməti güclü küləklə qalxan və hava axını ilə bərabər yüz metr yüksəkliyə qalxan qum bulududur".

(Brian Doe, Southern Arabia, Thames and Hudson, 1971, p. 21)

Ad qövmünün qalıntısı olduğu hesab edilən "Qumluqlar Atlantidası - Ubar" da, bir neçə metrlik qum qatının altından çıxarılmışdı. Quranda

deyilənlərdən aydın oldu ki, fırtına şəhərə tonlarla qum gətirərək və altında bütöv xalqı dəfn edərək "yeddi gecə və səkkiz gün" davam etdi. Ubarda aparılan qazıntılar bu faktı təsdiqləyir. Fransız jurnalı "Ça m'Interesse" qeyd edir ki: "Ubar güclü fırtına nəticəsində 12 metrlik qum qatı altında basdırıldı". (Ça M'Interesse, January 1993)

Ad xalqının həqiqətən də qum fırtınası nəticəsində batmasının əsl sübutu Quranda Ad xalqının yerini aydınlatmaq üçün istifadə edilmiş "əhqaf" sözüdür. "Əhqaf" surəsinin 21-ci ayəsində bizə belə xəbər verilir:

**Ad** *(tayfasının)* **qardaşını xatırla! Bir zaman o özündən əvvəl də, sonra da qorxudan** *(peyğəmbərlər)* **gəlib-getmiş qumsal təpələrdə** *(yaşayan) (Əhqafdakı)* **tayfasını: “Allahdan başqasına ibadət etməyin. Mən sizə üz verəcək əzəmətli günün əzabından qorxuram!”** *(deyə)* **xəbərdar etmişdi.** (Əhqaf surəsi, 21)

Ərəb dilindən tərcümədə "əhqaf" sözü "qum barxanları" (qum, qum təpələri) deməkdir və "qum barxanı"nı ifadə edən "hiqf" sözünün cəmidir. Ad xalqının şəhərinin qum fırtınası nəticəsində batmasının bundan məntiqli izahı sadəcə olaraq yoxdur. Başqa versiyaya görə, "əhqaf" sözü "qum barxanı" mənasını itirərək sonralar Cənubi Yəmənin Ad xalqı yaşayan hissəsinin adı oldu. Ancaq bu da sözün özünün mənşəyinə heç bir dəyişiklik gətirmir, belə ki, yalnız onu göstərir ki, bu söz haqqında danışılan ərazi üçün çoxsaylı qum barxanlarının olmasına görə ümumi ad oldu.

Qum fırtınası özlərinə bəndlər və arxlar tikən, məhsuldar yerləri becərərək yaşayan Ad xalqını məhv etdi, onları "sanki yıxılmış palma budaqları" kimi heçliyə məhkum etdi. Yəqin ki, qum fırtınası qısa bir müddət ərzində bütün xalqı məhv etdi. Məhsuldar yerlər, suvarma arxları, bəndlər - hər şey qumlar altında qaldı, şəhər özü və onun sakinləri isə diri-diri basdırıldılar. O zamandan genişlənən səhrada isə Ad xalqının əvvəlki sivilizasiyasının əzəmətindən iz belə qalmadı.

Sonda demək olar ki, tarixi və arxeoloji faktlar Ad xalqının və İrəm şəhərinin olmasını sübut edir və yalnız Qurani-Kərimin bildirdiklərini təsdiqləyir.

Qumların altında qalan və bir vaxtlar qüdrətli olmuş xalqın bu cür kədərli aqibəti düşünən insanlar üçün ibrət ola bilər:

**Ad** *(xalqına)* **gəlincə, onlar yer üzündə haqsızcasına təkəbbür göstərib: “Bizdən daha qüvvətli kim ola bilər?”– dedilər. Məgər onları yaradan Allahın onlardan daha qüvvətli olduğunu görmürdülərmi? Onlar ayələrimizi, sadəcə, inkar edirdilər.** (Fussilət surəsi, 15)

Bu sarsılmaz həqiqəti unutmaq olmaz: yalnız tək Uca Allah bizim üzərimizdə Qüdrətli və hər şeyə Qadirdir və insanın payına yalnız Yaradanın əmrləri ilə xilas olmaq və həqiqəti axtarmaq düşür.

# SƏMUD XALQI

**Səmud** *(qövmü)* **də xəbərdarlıqları yalan saydı. Onlar dedilər: "Özümüzdən olan bir adamamı tabe olacağıq? Onda biz azğınlığa düşər və ağılsız iş görmüş olarıq! Zikr aramızdan təkcə onamı verildi? Xeyr, o, yalançıdır, lovğadır!" Sabah onlar kimin yalançı və lovğa olduğunu mütləq biləcəklər.** (Qəmər surəsi, 23-26)

Quranda deyilənlərə görə, Səmud xalqı da Ad xalqı kimi Allahın xəbərdarlıqlarına baxmayaraq özlərini ölümə məhkum etdilər. Müasir elmi tədqiqatlar əvvəllər məlum olmayan Səmud qövmünün olduqları yer, tikdikləri evlər, həyat tərzi haqda bir çox məlumatların üzərinə işıq saldı. Quranda adıçəkilən Səmud xalqının mövcudluğu indi əksər arxeoloji tapıntılarla təsdiqlənən sübut edilmiş tarixi faktdır.

Səmud qövmü ilə bağlı arxeoloji tapıntılardan danışmazdan əvvəl Quran ayələrindəki peyğəmbərin yolunu azmış xalqı ilə mübarizəsini xatırlamaq lazımdır, çünki Quran bütün dövrlərin insanlarına nazil edilib və buna görə də Səmud xalqının onlara gələn çağırışı inkar etməsi faktı və Allah-Təalanın onları cəzalandırması bütün sonrakı nəsillər üçün ibrət olmalıdır.

## SALEH PEYĞƏMBƏRİN TƏBLİĞİ

Quranda deyilir ki, Allah-Təala Saleh peyğəmbəri göndərdi ki, Səmud xalqını gördükləri pis əməllərdən çəkindirsin. Saleh peyğəmbər Səmud xalqı arasında olduqca böyük nüfuza malik şəxsiyyət idi. Xalq bir gün Salehin dilindən həqiqi dinə çağırış eşitdikdə və onları etdiyi pis əməllərdən çəkindirdiyinə görə güclü təəccüblənmişdi. Onların ilk reaksiyası soyuqluq və töhmət idi:

**Səmud qövmünə də qardaşları Salehi** *(göndərdik)*. **O dedi: "Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa ilahınız yoxdur. O sizi torpaqdan yaratdı və sizi orada sakin etdi. Elə isə ondan bağışlanma diləyin, sonra da Ona tövbə edin. Şübhəsiz ki, Rəbbim Yaxındır,** *(çağırışa)* **cavab verəndir". Onlar dedilər: "Ey Saleh! Sən bundan əvvəl içərimizdə ümid edilən bir kimsə idin. Doğrudanmı atalarımızın ibadət etdiyinə ibadət etməyi bizə qadağan edirsən? Doğrusu, biz sənin bizləri dəvət etdiyin** *(əqidə)* **barəsində şübhə doğuran şəkk içindəyik".** (Hud surəsi, 61-62)

Xalqın az hissəsi Saleh peyğəmbərin çağırışına cavab verdi, sakinlərin əksəriyyəti isə peyğəmbərin sözlərinə güldü, Salehə çox düşməncəsinə yanaşan əyanlar ona xüsusi ədavətlə yanaşdılar. Onlar təzyiq göstərərək Salehin tərəfdarlarını da zəiflətməyə cəhd göstərirdilər. Onlar Saleh peyğəmbərin yalnız tək Allaha səcdə etmək çağırışından qəzəbləndilər. Əslində, Səmud xalqı yalnız öz sələflərinin - Nuh peyğəmbər xalqının və Ad xalqının taleyini təkrar etdilər. Quranın üç xalqdan bu cür bəhs edən ayələrindən biri:

**Sizdən əvvəlkilərin – Nuh, Ad və Səmud tayfalarının, onlardan sonrakıların xəbərləri sizə gəlib çatmadımı? Bu haqda Allahdan başqa heç kəs** *(heç nə)* **bilmir. Elçiləri onlara açıq-aydın dəlillər gətirdilər. Onlar**

**isə əllərini ağızlarının üstünə qoyub dedilər: "Biz sizinlə göndərilənlərə inanmırıq və bizləri dəvət etdiyiniz** *(tövhid)* **barəsində şübhə doğuran şəkk içindəyik!"** (İbrahim surəsi, 9)

Səmud xalqı Saleh peyğəmbərin bütün xəbərdarlıqlarına baxmayaraq kafirliklərində və Yaradanın rəhmini inkar etməkdə inadla davam edirdilər. Yalnız bəziləri Salehin peyğəmbərliyinə inandı və ədəbsizliklərinə görə peşman oldular. Sonra Səmud xalqının cəza vaxtı yetişdikdə Allah yalnız onlara və Saleh peyğəmbərə toxunmadı:

**Onun qövmünün təkəbbürlü zadəganları öz aralarından iman gətirən zəiflərə dedilər: "Siz Salehin öz Rəbbi tərəfindən göndərildiyini bilirsinizmi?" Onlar dedilər: "Həqiqətən, biz onunla göndərilən- hər şeyə inanırıq". Təkəbbür göstərən** *(başçılar)* **dedilər: "Həqiqətən, biz sizin inandığınızı inkar edirik".** (Əraf surəsi, 75-76)




**1) Şam**
**2) Hicr**
**3) Hicaz**
**4) Ubar**
**5) Hadramut**

**Quranda verilən məlumatlardan belə anlaşılır ki, Səmud tayfası Ad qəbiləsinin nəslindəndir. Əslində, arxeoloji tapıntılar, Səmudluların kökünün Ərəbistan yarımadasının şimalında yaşadığını, Ad qəbiləsinin də Cənubi Ərəbistanda yaşadığını göstərir.**

Səmud xalqı Salehin peyğəmbərliyini inkar etməkdə davam edir və Allah -Təalaya səcdə etməkdən imtina edirdilər. Bundan əlavə, səmudun əyanları hətta Salehi - guya Allahın adına - öldürməyi planlaşdırırdı:

**Onlar dedilər: "Biz sənin və səninlə birlikdə olanların ucbatından uğursuzluğa uğradıq".** *(Saleh)* **dedi: "Sizin uğursuzluğunuz Allah yanındadır. Siz sınağa çəkilən bir camaatsınız". Şəhərdə doqquz adam var idi ki, bunlar yer üzündə fitnə-fəsad törədir, yaxşı işlər görmürdülər. Onlar dedilər: "Bir-birinizin yanında Allaha and için ki, gecə ona və ailəsinə basqın edib öldürəcək, sonra da onun yaxın qohumuna deyəcəyik ki, biz onun ailəsinin öldürüldüyünü görməmişik**

**və biz, həqiqətən, düzünü deyirik". Onlar hiylə qurdular, Biz də hiylə qurduq. Lakin onlar** *(bunu)* **hiss etmədilər.** (Nəml surəsi, 47-50)

Saleh Səmud xalqını son dəfə yoxlamaq və onlara Allahın əmrlərinə tabe olmağa imkan vermək üçün onlara dişi dəvəni göstərdi və dedi ki, onlar olan sularını dəvə ilə bölüşsünlər və ona ziyan yetirməsinlər. Bu, xalq üçün son sınaq idi. Salehin xalqı Allahın bu əmrinə dəvəni öldürməklə cavab verdi. Bu ayədə hadisələrin gedişatı belə təsvir edilib:

**Səmud tayfası da elçiləri yalançı saydı. Qardaşları Saleh o zaman onlara dedikdə ki: "Məgər qorxmursunuz? Şübhəsiz ki, mən sizin üçün etibar etməli olduğunuz bir elçiyəm. Allahdan qorxun və mənə itaət edin. Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir. Məgər siz burada olanların içində sərbəst buraxılacaqsınız? Bağlar və bulaqlar içində, əkinlər və yumşaq meyvəli xurmalıqlar içində** *(arxayınlıqla qalacaqsınız)***? Dağlardan məharətlə evlər yonub düzəldəcəksiniz? Allahdan qorxun və mənə itaət edin! Həddi aşanların əmrinə tabe olmayın. Onlar yer üzündə fəsad törədir və** *(özlərini günahdan)* **təmizləmirlər". Onlar dedilər: "Sən yalnız və yalnız sehrlənmişlərdənsən. Sən də bizim kimi ancaq bir insansan. Əgər doğru danışanlardansansa, bizə bir möcüzə göstər".** *(Saleh)* **dedi: "***(Möcüzə)* **bu dişi dəvədir! Onun da, sizin də müəyyən edilmiş vaxtlarda su içmək haqqınız vardır.** *(Bir gün o, su içməli, bir gün də siz içməlisiniz)***. Ona heç bir pislik etməyin, yoxsa böyük günün əzabı sizi yaxalayar". Onlar dəvənin diz vətərini kəsdilər, sonra da peşman oldular.** (Şuəra surəsi, 141-157)

Saleh peyğəmbər və xalqı arasındakı mübarizə haqda bu surədə də xəbər verilir:

**Səmud** *(qövmü)* **də xəbərdarlıqları yalan saydı. Onlar dedilər: "Özümüzdən olan bir adamamı tabe olacağıq? Onda biz azğınlığa düşər və ağılsız iş görmüş olarıq! Zikr aramızdan təkcə onamı verildi? Xeyr, o, yalançıdır, lovğadır!" Sabah onlar kimin yalançı və lovğa olduğunu mütləq biləcəklər. Biz onları sınağa çəkmək üçün bir dişi dəvə göndərəcəyik. Sən isə gözlə və səbr et! Onlara xəbər ver ki,** *(bu)* **su, dəvə ilə onlar arasında bölüşdürülmüşdür. Hər biri su içməyə öz növbəsində gəlsin!" Onlar öz yoldaşlarını çağırdılar. O da dəvəni tutub diz vətərini kəsdi.** (Qəmər surəsi, 23-29)

Ancaq cəzalanmadıqlarını və Salehin xalqına öldürdükləri dəvəyə görə xəbər verdiyi qisasın olmadığını görən xalq daha da azğınlaşdı: Salehin ünvanına təhqirlər və həqarətlər yağdırdı, onu yalançı elan etdi:

**Onlar dişi dəvənin diz vətərini kəsdilər və** *(beləliklə) (də)* **Rəbbinin əmrindən çıxıb: "Ey Saleh! Əgər sən** *(göndərilən)* **elçilərdənsənsə, bizə vəd etdiyin əzabı gətir"– dedilər.** (Əraf surəsi, 77)

Ancaq Allah kafirlərin bütün əxlaqsızlıqlarını üzə çıxardı və Salehi bu pis niyyətlərdən qorudu. Saleh xalqının bu hərəkətindən sonra bütün nəsihətlərin onlar üçün faydasızlığını anlayaraq xalqına xəbər verdi ki, üç gün müddətində Allahın qəzəbi onları məhv edəcək: **... Dedi: "Yurdunuzda üç gün də kef eləyin. Bu, yalan olmayan bir vəddir".** (Hud surəsi, 65)

Həqiqətən də Salehin xəbərdar etdiyi vəd düz üç gündən sonra yerinə yetdi. Səmud xalqı məhv edildi:

**Zülm edənləri isə qorxunc bir səs yaxaladı və onlar öz evlərində üzüqoylu düşüb qaldılar. Sanki orada heç yaşamamışdılar. Həqiqətən, Səmud qövmü öz Rəbbini inkar etdi. Məhv olsun Səmud qövmü!**

(Hud surəsi, 67-68)

## SƏMUD XALQI HAQQINDA ARXEOLOJİ TAPINTILAR

Quranda bütün adıçəkilən xalqlardan ən çox Səmud xalqı haqda məlumat qalıb. Tarixi mənbələrdən Səmud xalqının olması dəqiq məlumdur. Güman edilir ki, Quranda adıçəkilən Hicr və Səmud xalqları eyni xalqlardır, çünki səmudluların başqa etnonimi "Əshabı-Hicr"dir. Bu halda "səmud" sözü xalqın özəl etnonimi, Hicr isə onların tikdiyi böyük şəhərlərdən birinin adıdır, bu isə qədim yunan coğrafiyaçısı Plininin təsvirlərinə uyğundur. O, yazırdı ki, "Səmud xalqının yaşayış yerləri Domath və Heqra şəhərləri, yəni indiki Hicr şəhərinin torpaqlarıdır". (Hicr, Islam Ansiklopedisi: Islam Alemi, Tarihi,Cografya, Etnografya ve Bibliyografya Lugati,(Encyclopedia of Islam: Islamic World, History, Geography, Ethnography, and Bibliography Dictionary) Vol. 5/1, p. 475)

Səmud xalqından bəhs edən tanınmış mənbələrdən ən qədimi Babilin (e.ə. 8-ci əsr) hərbi salnamələridir. Orada Səmud xalqı üzərində qələbə çalmış Babil hökmdarı II Sarqon haqda danışılır. Sarqon onları Şimali Ərəbistana yürüş zamanı darmadağın etmişdi. Qədim yunanlar da bu xalq haqqında məlumat verirlər: Aristotelin, Ptolemeyin və Plininin əsərlərində bu xalq "Thamudaei", yəni "Səmudlar" kimi tanınır. (Philip Hitti, A History of the Arabs, London: Macmillan, 1979, p. 37) Peyğəmbərimizin (s) gəlişinə qədər, yəni təxminən 400-cü ildən 600-cü illərə qədər onların izi-tozu da qalmadı.



PETRA

Səmud və Ad xalqlarının adı Quranda həmişə bir yerdə çəkilir. Bundan əlavə, ayələr Səmud xalqı Ad xalqının ölümündən dərs götürməyə çağırırdı, deməli, Səmud xalqı Ad tayfasının taleyi haqda xəbərdar idilər:

**Səmud qövmünə də qardaşları Salehi** *(göndərdik)*. **O dedi: "Ey qövmüm! Allaha ibadət edin! Sizin Ondan başqa ilahınız yoxdur. Rəbbinizdən sizə açıq-aydın dəlillər gəldi. Allahın** *(qayadan çıxartdığı)* **bu dişi dəvəsi sizin üçün bir möcüzədir. Onu buraxın Allahın torpağında otlasın. Ona bir pislik etməyin, yoxsa sizi üzücü bir əzab yaxalayar. Xatırlayın ki, O, sizi Ad qövmündən sonra xələflər etdi və yer üzündə yerləşdirdi. Siz də onun düzənliklərində qəsrlər tikir, dağlarda evlər yonursunuz. Allahın nemətlərini yada salın, yer üzündə fəsad yayaraq pis işlər görməyin".** (Əraf surəsi, 73-74)







**Ərəb tayfası olan Nəbatilər indiki İordaniyanın Rum vadisində bir krallıq qurmuşdular. Bu gün Petra adı ilə də tanınan bu yerdə Nəbatilərin daş işinin ən gözəl nümunələrini görmək mümkündür. Qurani-kərimdə Səmud qəbiləsinin daş işlərindəki ustalıqlarından bəhs edilir. Ancaq bu gün hər iki qövmdən də geriyə o dövrün sənətini tanıdan qalıntılar qalmışdır. Şəkillərdə Petra vadisindəki daş işləri görülməkdədir.**

Ad və Səmud xalqı arasındakı əlaqə Quran ayələrindən aydın olur. Həmçinin çox güman ki, Ad xalqı Səmud xalqının mədəniyyətinin əsasını qoymuşdu və onların əcdadlarıdır. Saleh peyğəmbər Səmud xalqını Ad xalqının pis taleyini xatırlamağa və ondan dərs almağa çağırırdı.

Öz növbəsində Ad xalqına sələfləri Nuh xalqı haqda da danışılırdı, deməli, Nuh xalqı Ad xalqı üçün olduğu kimi Ad xalqı da Səmud xalqı üçün vacib tarixi əhəmiyyət kəsb edirdi. Bu xalqlar bir-biri haqda məlumatlı və bəlkə də eyni kökdən idilər.

Biz Quranda Ad xalqının Səmud xalqı arasında deyilən əlaqəyə dair məsələyə artıq toxunmuşduq. Quran Səmud xalqına Ad xalqını xatırlamağa və onların ölümündən ibrət götürməyə çağırırdı, ancaq Ərəbistan haqda tarixi kitablarda iddia edildiyi kimi, Səmud xalqı və Ad xalqı coğrafi cəhətdən bir-birindən uzaq torpaqlarda yaşayırdılar. İlk baxışda bu iki xalq arasında heç



**Petra, nəbatilərin daş işində nə qədər usta olduqlarını göstərən ən gözəl örnəklərdəndir. O dövrün möhtəşəm tikililərindən geriyə hal-hazırda sadəcə qalıntılar qalmışdı. (Yuxarıda) Arxeoloqların işi nəticəsində ortaya çıxan qalıqlar, Allahın qövmlərin həlakı ilə bağlı ayələrini ortaya qoymaqdadır.**

bir əlaqə yoxdur. Bəs o zaman ayədə Ad xalqına tarixi Səmud xalqı niyə xatırladılır? Cüzi coğrafi araşdırma aparandan sonra məsələ aydın olur: məlum olur ki, Ad xalqının Səmud xalqına coğrafi uzaqlığı əslində aldadıcıdır. Tarix Ad xalqı ilə Səmud xalqının arasındakı sıx əlaqəyə şahidlik edir. Səmud xalqı Ad xalqını gözəl tanıyırdılar, həmçinin bu iki xalq hər şeydən əvvəl bir kökdən əmələ gəliblər. "Britannika" Ensiklopediyası "Səmudlar" başlıqlı məqalədə belə yazır:

"Qədim Ərəbistanda b.e.ə. IV əsrdən b.e.VII əsrinə qədər üstünlük təşkil edən tayfa və ya tayfa ittifaqı. Səmud xalqı Cənubi Ərəbistandan çıxmasına baxmayaraq onların böyük hissəsi yəqin ki, çoxdan şimala köçüb, ənənəvi

olaraq Cəbəl Əsləb dağının yamacında məskunlaşıb. Hicazla Dəməşq arasında yaşayan səmud xalqı "Əshab-i-Hicr" kimi tanınır. Həm Cabəl Əsləbdə, həm də bütün Mərkəzi Ərəbistanda aparılmış arxeoloji tədqiqatlar zamanı səmud xalqına məxsus olan çoxsaylı qayaüstü rəsmlər və yazılar tapılmışdır". (Thamuds, Britannica Micropaedia, Vol. 11, p.672)

Həm Hicazda, həm də Cənubi Ərəbistanda səmud xalqının yazısını (bunu səmud əlifbası adlandırırlar) xatırladan əlifba tapılmışdır. (Brian Doe, Southern Arabia, Thames and Hudson, 1971, pp. 21-22) O, ilk dəfə Orta Yəməndəki səmud yerinin yaxınlığında tapılmışdır. Bu rayonun şimalında Rubal-Xali, cənubunda Hadramaut və qərbində Sabvah şəhərləri yerləşir.



Əvvəl biz Ad xalqının Cənubi Ərəbistanda yaşadıqlarını qeyd etmişdik. Ancaq ən maraqlısı odur ki, Ad xalqının, xüsusən onların əcdadlarının - hədramilərin məskunlaşdığı rayonda və Ad xalqının paytaxtının ətrafında Səmud xalqına məxsus olan ev əşyaları aşkar edilmişdir. Bu isə Quranda qeyd edilən Səmud xalqı ilə Ad xalqı arasındakı əlaqəni işıqlandırır. Saleh peyğəmbər Səmud xalqına müraciət edərkən onlara Ad xalqının yerinə gəldiklərini xatırladır və bu əlaqə belə aydın olur:

**Səmud qövmünə də qardaşları Salehi** *(göndərdik)*. **O dedi: "Ey qövmüm! Allaha ibadət edin! Sizin Ondan başqa ilahınız yoxdur... Xatırlayın ki, O, sizi Ad qövmündən sonra xələflər etdi və yer üzündə yerləşdirdi. Siz də onun düzənliklərində qəsrlər tikir, dağlarda evlər yonursunuz..."** (Əraf surəsi, 73-74)

Bir sözlə, Səmud xalqı Allaha və onun peyğəmbərlərinə tabe olmadığı üçün cəzalandırıldı. Onların ucaltdığı bütün tikililər, yaratdığı incəsənət əsərləri və sivilizasiyanın digər nailiyyətləri onları Yaradanın qəzəbindən xilas etmədi. Səmud xalqı da çoxsaylı əvvəlki və sonrakı dönük xalqlar kimi təbii fəlakətlə yer üzündən silindilər.





**Xatırlayın ki, O, sizi Ad qövmündən sonra xələflər etdi və yer üzündə yerləşdirdi. Siz də onun düzənliklərində qəsrlər tikir, dağlarda evlər yonursunuz. Allahın nemətlərini yada salın, yer üzündə fəsad yayaraq pis işlər görməyin.** (Əraf surəsi, 74)

## SULARDA QƏRQ OLMUŞ FİRON

*(Bunların əməli)* **Firon nəslinin və onlardan əvvəlkilərin əməlinə bənzəyir. Onlar Rəbbinin ayələrini yalan hesab etdilər, Biz də onları günahlarına görə məhv etdik. Firon nəslini dənizdə qərq etdik. Onların hamısı zalım idi.** (Ənfal surəsi, 54)

Qədim Misir mədəniyyəti öz dövrünün qədim sivilizasiyalarından və ən qabaqcıl sosial quruluşu olan güclü dövlətlərindən biri hesab edilir. E.ə. 3000 -ci ilə yaxın yazının əmələ gəlməsi və işlənilməsi, Nilin suyundan istifadə edilməsi, xarici hücumlardan qoruyan təbii-coğrafi şərait - bütün bunlar Misir mədəniyyətinin inkişafına təkan verirdi.

Ancaq bu "sivil" mədəniyyət politeist kult və fironlara itaət üzərində

bərqərar olmuşdu. Misir Qurani-Kərimin ayələrində dinsizliyin mərkəzi kimi qeyd edilir. Misir fironları öz uğurları ilə lovğalanır və özlərini tanrı hesab edərək Allahın həqiqətindən üz döndərirdilər. Ancaq nə qabaqcıl mədəniyyəti, nə ictimai-siyasi quruluşu, nə də hərbi nailiyyətləri onları ilahi qəzəbdən və ölümdən qurtarmadı.

## FİRONLARIN NÜFUZU

Misir sivilizasiyasının inkişafı əsasən münasib iqlim şəraiti və Nil çayının bərəkəti sayəsində mümkün oldu. Misirlilər Nil vadisində məskunlaşmışdılar və onlar bu çayın bol suyu sayəsində yağış mövsümündən asılı olmayaraq əkinçiliklə məşğul ola bilirdilər. Bu barədə alman tarixçisi Ernst Qombrih deyir:

"Afrika isti qitədir. Burada aylarla yağış olmur. Buna görə də bu böyük qitənin əksər rayonları quraqlığa meylli idi. Bu yerlər qum səhraları ilə əhatə olunmuşdur. Misir də istisna deyil. Elə Misirin özündə də az yağış yağır. Ancaq orada buna ehtiyac yoxdur, çünki Nil çayı bütün bu ölkə boyunca axıb keçir. Bu dərəcədə böyük strateji əhəmiyyət kəsb edən Nilə nəzarət etmək ən vacib ticarət və əkinçilik mənbəyinə nəzarət etmək demək idi. Fironlar Misir üzərində öz təsirlərini məhz bu yolla bərqərar etdilər". (Ernst H. Gombrich, Gençler için Kisa Bir Dünya Tarihi, (Translated into Turkish by Ahmet Mumcu from the German original script, Eine Kurze Weltgeschichte Für Junge Leser, Dumont Buchverlag, Köln, 1985), Istanbul: Inkilap Publishing House, 1997, p.25)

Nil vadisinin uzunsov və ensiz olması misirlilərə öz ərazilərini genişləndirməyə və yaşayış məskənlərini böyütməyə imkan vermirdi və buna görə də iri şəhərlərdən ibarət olan ölkənin əvəzinə daha kiçik yaşayış məskənlərindən və kəndlərdən ibarət sivilizasiya formalaşmışdı. Bu amil də fironun xalq üzərində hakimiyyətinin möhkəmlənməsinə yardım edirdi.

Məlumdur ki, e.ə. təxminən 3000-ci ildə hökmdar Menes Yuxarı və Aşağı Misiri ilk dəfə iri unitar dövlət halında birləşdirdi və ilk Misir fironu oldu. "Firon" (və ya "firaun") epiteti bir vaxtlar Misir hökmdarlarının sarayına münasibətdə işlədilirdi. Ancaq zaman keçdikcə bu ləqəbin də mənası dəyişdi və ondan Misir hökmdarlarının titulu kimi istifadə edildi. Misir hökmdarları bu yolla "firon" adlandırıldılar.

Ölkənin bütün torpaqlarını özlərinə tabe edərək sonsuz hakimiyyət sahibi olan fironlar, Qədim Misirin çoxallahlı yanlış dinində onlar yer üzündəki ən böyük tanrının əksi hesab olunurdular. İdarəçilik, Misir torpaqlarının gəlirlərinin bölüşdürülməsi, yəni bütün istehsal və satış sistemi yalnız fironlara işləyirdi.

İdarəçiliyin və hakimiyyətin mərkəzləşdirilməsi fironları böyük hakimiyyətə və var-dövlətə yiyələndirərək hökmdara çevirdi. Hələ ilk sülalənin yaranması dövründən Yuxarı və Aşağı Misiri birləşdirən hökmdar Menes bütün ölkə boyu suvarma arxlarının tikintisinə başladı ki, Misir torpaqlarını və ölkənin məhsuldar torpaqlarının sahəsini genişləndirmək imkanını təmin etsin. Bundan əlavə, məhsulların və xidmətlərin istehsalı mərkəzləşdirilmiş və fironun əlində cəmlənmişdi. Hökmdar öz növbəsində bu məhsul və xidmətləri xalqının ehtiyacından asılı olaraq bölüşdürürdü.

Misir hökmdarları ölkədə belə hakimiyyət sistemi quraraq ölkənin bütün əhalisini özlərinə tabe etdilər. Misir hökmdarı və ya firon xalqının bütün ehtiyacını təmin edən sonsuz hakimiyyətin müqəddəs sahibi sayıldı və beləliklə, ilahiləşdi. Zaman keçdikcə fironlar özləri də öz ilahiliklərinə möhkəm inanırdılar.

Budur, Qurani-Kərim ayələrinin birində fironla Musa peyğəmbər arasındakı dialoq və Musanın ünvanına olan hədələr haqda bəhs edilir: (Firon) dedi: **"Əgər məndən başqasını özünə tanrı qəbul etsən, səni məhbusların yanına ataram!"** (Şuəra surəsi, 29) və ya xalqa bu sözlərlə müraciəti **"...Mən sizin üçün özümdən başqa bir məbud tanımıram..."** (Qəsəs surəsi, 38)

## MİSİRLİLƏRİN DİNİ ETİQADI

Tarixçi Herodotun sözlərinə görə, Qədim Misirin sakinləri bütün dünyada ən "dindar" insanlar idilər, ancaq onların inamı həqiqət dini deyil, əxlaqsız çoxtanrılıq dini idi.

Qədim Misir sakinlərinin rifahı ölkənin təbii-coğrafi şərtlərindən birbaşa asılı idi. Misirin mövqeyi ölkəni xarici təcavüzdən etibarlı şəkildə qoruyurdu. Misir səhralar, dağlar və dənizlərlə əhatə olunmuşdu. Ölkəyə aparan iki yol var idi və bu yerlərin mühafizəsi Misir ordusu üçün heç bir çətinlik törətmirdi. Beləliklə, misirlilər başqa ölkələrdən təbii şərtlər sayəsində təcrid olunmuşdular. Ancaq zaman bu təcridolmanı kor mübtəlalığa çevirdi. Yeniliklər misirlilərə yad idi, din məsələlərində isə tam mühafizəkarlıq hökm sürürdü. Quranda tez-tez adıçəkilən "əcdadların dini" onların sarsılmaz dəyərləri oldu.

**Onlar dedilər: "Gəlmisiniz ki, bizi atalarımızın tutduğu yoldan döndərəsiniz və yer üzündə böyüklük etmək ikinizə qalsın? Biz sizə iman gətirən deyilik."** (Yunus surəsi, 78)

Qədim Misirin dini bir neçə qanada ayrılırdı. Bu, əsasən, ölkənin rəsmi dini, həmçinin axirətlə, yəni ölümdən sonrakı həyatla bağlı xalq etiqadları və xurafatları idi.

Ölkənin rəsmi dininə görə, firon müqəddəs hesab edilirdi. O, Yer üzündə Qədim Misir tanrılarının "inikası" idi, onun borcu insanlar arasında ədaləti yaymaq və onları bu dünyada qorumaq idi.

Xalq arasında yayılmış xurafat son dərəcə dolaşıq və ziddiyyətli idi. Dövlətin rəsmi dini ilə bir arada gedən bu əminlərin təzahürlərinin qarşısını firon hakimiyyəti alırdı. Xalqın xurafatanın əsasında bir qayda olaraq mifik məxluqlar kimi təqdim edilən heyvan başlı və insan bədənli tanrılara itaət dayanırdı. Lakin burada yalnız Qədim Misirin ayrı-ayrı rayonlarına xas olan adətlərlə qarşılaşmaq olar.

Qədim Misir xurafatları arasında əsas yeri ölümdən sonrakı həyat tuturdu. Qədim misirlilər bədən öldükdən sonra ruhun yaşadığına inanırdılar. Hesab edilirdi ki, mələklər mərhumun ruhunu tanrı-hakim və qırx iki şahid-hakim qarşısında duracağı yerə aparırlar. Məhkəmədə ruhun ürəyini çəkən tərəzi quraşdırılırdı. Yaxşı əməlləri üstünlük təşkil edənləri onların xoşbəxtlik və bolluq içində yaşayacağı rifahlı iqamətgaha köçürürdülər.

Günahları yaxşı əməllərini üstələyənlərin ruhu isə sonsuz əzab çəkilən yerə köçürülürdü. Burada onlar "ölü yeyənin" törətdiyi əbədi iztirablara məruz qalırdılar.





**Misirlilərin dini inancları tanrılarına xidmət etmək fikrinə əsaslanırdı. Bu tanrılarla insanlar arasında "vasitəçilər" qəbilə başçılarından olan kahinlər idi. Cadugərliklə də məşğul olan keşişlər, fironların insanlara təsir etmək üçün istifadə etdikləri çox əhəmiyyətli bir təbəqə idi.**

Misirlilərin xurafatı ilə axirətin təkallahlıq dini əsasında yozulması arasındakı paraleli görməmək mümkün deyil. Hətta ölümdən sonrakı həyata inam da sübut edir ki, əsl dinin əks-sədası Qədim Misir sivilizasiyasına gedib çatmışdı. Ancaq zaman keçdikcə bu da təhrif edildi və nəticədə çoxallahlıq dininə çevrildi. Məlumdur ki, insanları Allahın təkliyinə və Ona səcdə etməyə çağıran peyğəmbər və elçilər Misirə müntəzəm olaraq göndərilirdi. Onlardan biri həyatı Quranda ətraflı təsvir edilən Yusif peyğəmbərdir. Yusif peyğəmbərin həyatı ona görə vacibdir ki, onun həyatı İsrail oğullarının Misirə köçürülməsi və onların burada yerləşdirilmə tarixini izləməyə icazə verir.

Digər tərəfdən, tarixi mənbələrdə həmçinin Musa peyğəmbərin gəlişindən əvvəl öz xalqını monoteist dininə çağıran misirlilər haqda danışılır. Bütün Misir tarixində özünə daha çox diqqət cəlb edən insan - firon IV Amenxotep deyilənlərə əyani misaldır.

## MONOTEİST - FİRON - IV AMENXOTEP (AMENOFİS)



IV. AMENXOTEP (AMENOFİS)

Misir fironları öz xalqlarına münasibətdə amansız və zülmkar siyasət yürüdürdülər. Onların ümumi xüsusiyyəti özlərini ilahiləşdirməyə icazə verən Misirin politeist dininin ardınca getmələri idi.

Ancaq Misir tarixində başqalarından seçilən bir firon da var idi, o, Vahid Tanrıya inanmağın vacibliyini bildirir, buna görə onların əsgərlərini himayə edən Amon kahinləri tərəfindən təqib edilirdi. Nəhayət, o, öldürüldü. Söhbət e.ə. 14-cü əsrdə taxta çıxmış firon IV Amenxotepdən gedir.

E.ə. 1375-ci ildə IV Amenxotep hakimiyyətə gələndə çoxəsrlik özüllərlə - mühafizəkarlıq və ənənəçiliklə üz-üzə qaldı. O vaxta qədər ictimai quruluş və xalqın hakim sarayla qarşılıqlı münasibətləri heç bir dəyişikliyə məruz qalmamışdı. Cəmiyyət hər cür dini yenilikdən və ölkədən kənar hadisələrdən təcrid edilmişdi. Qədim yunan səyyahlarının da gördüyü bu şüursuz konservatizm Misirin təbii-coğrafi şəraitindən doğurdu.

Fironların xalqa caladığı rəsmi din insanları köhnə və ənənəvi quruluşa mütləq sadiq olmağa məcbur edirdi. Amma IV Amenxotep bu dövlət dinini qəbul etmirdi. Tarixçi Ernst Qombrix belə yazır:

*"Qədim ənənələrlə müqəddəs sayılmış əksər özülləri rədd edib xalqının bu cür qeyri-adi şəkildə təsvir edilən mənasız tanrı çoxluğuna hörmət etmək istəmədi. Onun üçün yeganə böyük tanrı - Aton mövcud idi. O, Atona səcdə*

*edir və onu günəşlə eyniləşdirirdi. Başqa tanrılara hörmət bəsləyənlərin mənfi təsirindən qorunmaq üçün o, öz iqamətgahını indiki Əl-Amarna köçürdü".* (Ernst H. Gombrich, The Story of Art, London MCML, The Phaidon Press Ltd., p. 42)

Gənc IV Amenxotep atasının ölümündən sonra cəmiyyətin güclü təzyiqi altına düşdü. Belə ki, o, Qədim Misirin ənənəvi politeist dininin dəyişdi, tək tanrıya səcdəyə əsaslanan ayin tətbiq etdi və həyatın bütün sahəsində əsl dəyişikliklər etdi.

Ancaq Tebesin əyanları ona yeni dini yaymağa icazə vermədi. IV Amenxotep və onun tərəfdarları Tebes şəhərini tərk edib Tell-Əl-Amarnada məskunlaşdılar. Burada Ax-et-Aton adlanan yeni şəhər salındı. Amenxotep özünün "Amonun razılığı" anlamına gələn adını (Amon Qədim Misir bütpərəst dinində ali ilahiliyin əsas totemi idi) yeni Ax-en-Aton (Exnaton), yəni "Atona səcdə edən" adına dəyişdirdi. Amenxotep israr edirdi ki, yalnız tanrı Aton yeganə "göylərin və yerin yaradıcısı" idi. Çox güman ki, o, bu titulla Allahı nəzərdə tutmuşdur.

Bununla razılaşmayan Amon kahinləri həm də ölkəni bürümüş iqtisadi böhrandan istifadə edərək hakimiyyəti Exnatonun əlindən almaq qərarına gəldilər. Onların təşkil etdiyi sui-qəsd nəticəsində Exnatonu zəhərlədilər, sonrakı fironlar isə yalnız kahinlərin əmrlərini yerinə yetirməkdə davam edirlər.

Exnatondan sonra hakimiyyətə gələn fironlar hərbi mənsubiyyətə malik idi. Onlar keçmişin bütpərəst qanunlarını geri qaytarmaq üçün xeyli əmək sərf etdilər və ənənəvi politeist dinini yenidən yaydılar.

Yüz ildən sonra hakimiyyətə Misirin tarixi boyunca ölkəyə ən uzun müddət hökmranlıq edən II Ramzes gəldi. Əksər tarixçilərin fikrincə, bir vaxtlar İsrail oğullarını əsarət altına salan və Musa peyğəmbərə qarşı mübarizə aparan firon məhz II Ramzesdir. (Eli Barnavi, Historical Atlas of The Jewish People, London: Hutchinson, 1992, p. 4; "Egypt", Encyclopedia Judaica, Vol. 6, p. 481 and "The Exodus and Wanderings in Sinai", Vol. 8, p. 575; Le Monde de la Bible, No:83, July-August 1983, p. 50; Le Monde de la Bible, No:102, January-February 1997, pp. 29-32; Edward F. Wente, The Oriental Institute News and Notes, No:144, Winter 1995; Jacques Legrand, Chronicle of The World, Paris: Longman Chronicle, SA International Publishing, 1989, p. 68; David Ben Gurion, A Historical Atlas Of the Jewish People, New York: Windfall Book, 1974, p. 32)

## HZ. MUSANIN GƏLİŞİ

Qədim misirlilər öz kor-koranə sədaqətinə və cahilliklərinə görə bütpərəst xurafatını əldən buraxmırdılar. Yalnız Tək və Uca Allaha səcdə etməyə çağıran insanlar gəlirdilər, ancaq firon və xalqı yenə də adət etdikləri ədəbsiz dinə dönürdülər. Zaman gəldi, Allah Musa peyğəmbəri İsrail oğullarını əsarət altına salan və əsl dinin yerinə bütpərəstliyi seçən misirlilərə nəsihətçi göndərdi. Musa peyğəmbərin missiyası misirliləri Həqiqət dininə çağırmaqdan, həmçinin İsrail oğullarına həqiqi yol göstərərək onları əsarətdən xilas etməkdən ibarət idi. Qurani-Kərim Musa peyğəmbərin nəsihətnaməsi haqda bizə belə xəbər verir:

**Biz sənə, iman gətirən insanlar üçün, Musa ilə Fironun əhvalatını olduğu kimi oxuyacağıq. Həqiqətən, Firon yer üzündə təkəbbürlük göstərib onun əhalisini zümrələrə bölmüşdü.** *(Firon)* **onlardan bir zümrəni zəiflədir, onların oğlan uşaqlarını öldürür, qadınlarını isə sağ buraxırdı.**

**Həqiqətən, o, fitnə-fəsad törədənlərdən idi. Biz istədik ki, həmin yerdə aciz qalanlara mərhəmət göstərək, onları öndə gedənlər və varislər edək, yer üzündə onlara hökmranlıq bəxş edək, Firona, Hamana və onların əsgərlərinə qorxub çəkindikləri şeyi göstərək.** (Qəsəs surəsi, 3-6)

Firon İsrail oğullarının sayının artmasına mane olmaq üçün bütün təzə doğulan oğlan uşaqlarını öldürməyi əmr etdi. Musa peyğəmbərin anası Allahın buyurduğu kimi, balaca Musanı səbətə qoyub çaya buraxdı. Bu yol Musanı fironlar sarayına gətirəcək yol idi. Bu haqda Quranda belə deyilir:

**Biz Musanın anasına: "Onu əmizdir. Ondan ötrü qorxduqda isə onu çaya at. Qorxma və kədərlənmə. Çünki Biz onu sənə qaytaracaq və onu elçilərimizdən biri edəcəyik"** *(– deyə)* **təlqin etdik. Fironun ailəsi onu tapıb götürdülər ki, axırda onlara düşmən və başlarına bəla olsun. Həqiqətən, Firon, Haman və onların əsgərləri günahkar idilər. Fironun zövcəsi dedi: "***(Bu)(uşaq)* **həm mənim, həm də sənin üçün gözaydınlığıdır. Onu öldürməyin. Ola bilsin ki, o bizə bir fayda verər, yaxud da onu oğulluğa götürərik". Onlar** *(bu işin sonunu)* **bilmirdilər.** (Qəsəs surəsi, 7-9)

Fironun həyat yoldaşı balaca Musanın öldürülməsinə mane oldu və onu oğulluğa götürdü. Musa peyğəmbər uşaqlığını fironlar sarayında keçirdi. Allahın iradəsi ilə peyğəmbərin doğma anası da saraya dayə kimi işə götürüldü.

İllər keçdi və bir gün böyümüş Musa peyğəmbər misirlilərin İsrail oğullarından birini sıxışdırmasının şahidi oldu və dərhal onun mühafizəsinə qalxaraq misirlini bir zərbə ilə öldürdü. Musa peyğəmbərin sarayda yaşamasına və hökmdarın xanımının onu oğulluğa götürməsinə baxmayaraq, şəhər əyanları Musanı ölüm cəzasına məhkum etdilər. Musa peyğəmbər Misiri gizlicə tərk etməyə məcbur oldu və Mədyənə köçdü. Günlərin bir günü Allah ona müraciət edəcək və ona peyğəmbərlik missiyasını tapşıracaqdı: o, fironun yanına dönməli və onu Allahın dininə çağırmalı idi.

## FİRONUN SARAYINDAKI HADİSƏLƏR

Allahın buyurduğu kimi, Musa və Harun peyğəmbərlər fironun yanına gəldilər və onları düzgün yola dəvət etdilər. Onlar həmçinin hökmdardan İsrail oğullarını azad etməyi və onlarla birgə buraxmağı istədilər. Firon öz sarayında böyütdüyü və taxt-tacını vermək istədiyi Musa peyğəmbərin birdən-birə ona belə sözlər deməsi ilə heç cür barışa bilmədi. Qəzəblənmiş firon onu nankorluqda günahlandırdı:

*(Firon)* **dedi: "Biz səni körpə ikən** *(götürüb saxlayıb)* **boya-başa çatdırmadıqmı? Sən ömrünün bəzi illərini bizimlə yaşamadınmı? Elədiyin** *(pis)* **əməli də elədin.** *(Doğrudan da,)* **sən bir nankorsan!"**

(Şuəra surəsi, 18-19)

Firon Musa peyğəmbərin hissləri ilə oynayaraq ona yaxınlaşmağa çalışırdı. Düşünürdü ki, Musa tabe olacaq, axı onu firon tərbiyələndirib. Üstəlik, o, artıq bir misirlini öldürüb. Onların iddiasına görə, bu cür hərəkətlər ağır cəzaya layiq idi. Fironun fikrincə, təqsirkar oğlunun geri qayıtma və tövbə etmə səhnəsi eyni zamanda nüfuzlu əyanları sakitləşdirməli

idi. Əyanlar isə öz növbəsində fironun etirazlarını və narazılığını ədalətli hesab edərək onu haqlı sayırdılar.

Digər tərəfdən, Musanın insanları dəvət etdiyi Həqiqət dini fironu hakimiyyətdən məhrum edib onu başqa insanlarla bir sıraya qoyacaq, tanrının yerdəki müqəddəs varisi statusundan məhrum edəcəkdi. Bundan əlavə, o, Musa peyğəmbərə tabe olmalı idi. Əsarət altına salınmış İsrail oğullarını azad etdikdə isə o, xeyli işçi qüvvəsindən məhrum olacaq, bu da böyük iqtisadi çətinliklər yaradacaqdı.





**Fironun zülm etdiyi qul qövmlər. Xüsusilə Yeni Krallıq dövründə ölkədə yaşayan azsaylı xalqlar tikinti işlərində işlədilməyə başlandı. İsraillilər də bu az saylı xalqlar arasında idilər. Yuxarıdakı şəkildə, bir məbədin tikintisində işləyən və böyük bir ehtimalla israil oğullarından olduqları təxmin edilən qullar göstərilir. Aşağıdakı böyük şəkil də, yenə israil oğulları olaraq təxmin edilən qulların tikinti işləri üçün texniki hazırlıqlarını göstərir. Qullar odda palçıq bişirir, kərpic düzəldir və məhlul hazırlayır.**

Firon Musanın sözlərindən qəzəbləndi, hətta peyğəmbəri eşitmək belə istəmədi. O, peyğəmbəri gülünc vəziyyəti salmaq və çaşdırmaq üçün ona mənasız suallar verməyə başladı. Həmçinin firon Allahın elçilərini dövlət quruluşuna qəsd etməkdə günahlandıraraq onları siyasi cani və xəyanətkar adlandırdı. Nəticədə nə firon, nə də onun ətrafındakılar Musa və Harun peyğəmbərlərə tabe olmadılar, Allahın çağırışına qulaq asmadılar və özlərini və ölkələrini elə öz lovğalıqları ucbatından saysız əzablara məhkum etdilər.



**Bir çox tarixçilərə görə Quranda adı keçən firon olan II. Ramses, ələ keçirdiyi əsirlərindən bir neçəsini öldürmək üzrədir. Bu divar rəsmlərindən də göründüyü kimi fironlar, özlərini ideallaşdıraraq güclü döyüşçülər olaraq təsvir etdirirdilər. Onlar öz sənətkarları tərəfindən geniş çiyinli, hündürboylu, eyni zamanda bir neçə adamın öhdəsindən gələ bilən qəhrəmanlar kimi göstərilirdilər. Özlərini guya ilahi varlıqlar kimi görərək, bütün insanlardan üstün görünməyə çalışırdılar.**



**Misirlilər tərəfindən əsir götürülən hərbi əsirlər ölüm hökmlərinin icrasını gözləyirlər.**



**Fironların digər insanlardan üstün olduqlarını simvolizə edən bir şəkil.**

# FİRONUN VƏ ONUN ÖLKƏSİNİN BAŞINA GƏLƏN FƏLAKƏTLƏR

**"Bütün ölkə yoxsulluq və ehtiyac içindədir...**
**Hər yer qana bürünüb..."** (İpuveranın papirusu, 2/5-6)

Firon və onun ətrafındakılar özlərini "əcdadların dini" olan bütpərəstlik ayininə o qədər fanatikcəsinə bağlamışdılar ki, ondan əl çəkməyə heç cür razılaşa bilmirdilər. Hətta Musa peyğəmbərin əlinin birdən-birə ağarması və Allahın onun əlindəki əsanı ilana döndərməsi kimi möcüzəli əlamətlər də əxlaqsız xalqa sübut üçün yetmədi və onları düzgün yola çıxarmadı. Onlar dedilər:

*(Kafirlər)* **dedilər: "Sən bizi sehrləmək üçün nə qədər möcüzə gətirsən də, biz sənə inanan deyilik!"** (Əraf surəsi, 132)

Buna cavab olaraq Allah onlara **"müxtəlif möcüzələr"** (Əraf surəsi, 133) kimi bir-birinin ardınca fəlakətlər yağdırdı ki, onları bu dünyada cəzalandırsın. Əvvəlcə quraqlıq baş verdi ki, bu da məhsulun azalmasına səbəb oldu. Bu haqda Quranda belə deyilir:

**Biz Firon xalqını quraqlıq illərinə və məhsul qıtlığına məruz qoyduq ki, bəlkə düşünüb ibrət alsınlar.** (Əraf surəsi, 130)

Misirlilərin əkinçiliyi Nil suları sayəsində mümkün olur və iqlim dəyişiklikləri ona mühüm təsir etmirdi. Ancaq firon və onun saray əyanları Allah qarşısında lovğalanaraq Onun elçisindən üz döndərdilər və özlərini gözlənilməz fəlakətlərə düçar etdilər. Çox güman ki, Nil sularının səviyyəsi kəskin şəkildə aşağı düşdü və çaydan gələn suvarma arxları sahələri lazımi miqdarda su ilə təmin edə bilmədi. Qızmar bürkü isə məhsulun qalan hissəsini də məhv etdi. Beləliklə, firon və əyanları tamamilə gözlənilməz şəkildə böyük çətinliklərə düşdülər. Axı ölkənin bütün var-dövləti və qüvvəsi Nil boyunca uzanan məhsuldar torpaqların sayəsində təmin olunurdu. Allah xalqa bu sözlərlə müraciət edən fironu bu quraqlıqla qəti rədd etdi: **Firon qövmünü çağırıb dedi: "Ey xalqım! Məgər Misir səltənəti və altımdan axan bu çaylar mənim deyilmi? Məgər görmürsünüzmü?"** (Zuxruf surəsi, 51) Ancaq bu fəlakətlər də misirlilərin ağlını başına gətirmədi, ayədə deyildiyi kimi, onlar baş verənləri Musa peyğəmbərin və İsrail oğullarının özləri ilə gətirdiyi bədbəxtlik kimi qəbul etdilər. Onlar düşdükləri fəlakətlərə görə mövhumat və xurafat ucbatından peyğəmbərləri günahlandırdılar və buna görə çox şeydən məhrum oldular. Ancaq onların əzabları bununla bitmədi. Bu, yalnız başlanğıc idi. Bunun ardınca Quranda deyilən kataklizmlər və dərd axını başladı:

**Biz də onların üstünə müxtəlif möcüzələr olaraq tufan, çəyirtkələr, bitlər, qurbağalar və qan göndərdik. Onlar isə təkəbbürlük göstərdilər və günahkar bir tayfa oldular.** (Əraf surəsi, 133)

Fironun və onun ətrafındakı kafirlərin başına gələn fəlakətlər Tövratda da Qurandakı kimi ətraflı təsvir edilir:

***"Əgər sən buraxmaq istəməsən, mən sənin bütün sərhədələrini qurbağalarla vuracağam. Və çay qurbağalarla dolub-daşacaq. Sənin evinə, yataq otağına, yatağına çıxacaqlar və qullarının evlərinə və xalqına və sobalarına və xamır qablarına girəcəklər"*** (Çıxış, 8/2-3)

***"Və Rəbb Musaya dedi: "Haruna de: "Dəyənəyini uzat və yerin tozuna vur. Ta bütün Misir diyarında qum fırtınası olsun""""*** (Çıxış, 8/16)

***"Və bütün Misir diyarına çəyirtkə çıxdı. Misirin hər tərəfində oldu. Həddindən artıq çox idilər. Bundan əvvəl bu qədər çəyirtkə və bunlar kimisi olmamışdı. Ondan sonra da beləsi olmayacaqdır"*** (Çıxış, 10/14)

***"...fəqət Rəbbin söylədiyi kimi fironun ürəyi qatılaşdı və onlara qulaq asmadı"*** (Çıxış, 8/19)

Bu qorxulu fəlakətlərin fərqləndirici cəhəti o idi ki, onlar məhz insanların tanrılar kimi səcdə etdiyi bütlərə əsaslanırdı. Məsələn, Nil və ya oradakı quru qurbağaları onlar üçün müqəddəs idi, misirlilər onları ilahiləşdirmişdilər. Onlar öz "tanrılarından" kömək və rəhm gözlədikləri zaman Allah onları elə həmin "tanrıların" vasitəsilə də cəzalandırdı ki, onlar günahkar olmalarına inanıb bu günahlarını dərk etsinlər.

Təfsirçilər Tövratdakı "qan" sözünü Nil sularının qana çevrilməsi kimi izah edirlər, yəni bu söz hərfən başa düşülür. Məcazi mənada isə suyun çayda

al rəng (qan rəngi) almasını ifadə edə bilər. Başqa təfsirə görə, çayın bu rəngi onda olan xüsusi bakteriyaların növü ilə izah edilir.

Nil misirlilərin yaşaması üçün əsas vasitə idi. Bu mənbəyə vurulan hər ziyan bütün Misir üçün ölüm demək idi. Görünür, Nilin suyunun rənginin qəfil dəyişməsi onda olan bakteriyaların miqdarının kəskin artması demək idi, yəni istənilən canlının onun suyundan istifadə etməsi təhlükəli idi.

Bu gün aparılan tədqiqatlar göstərir ki, suyun qırmızı rəngi onda olan protozoa (sadə birhüceyrəli canlılar), zooplankton, dəniz və çay planktonu (fitoplanton), həmçinin dinoflagellates-dən asılıdır. (http: / / www2.plaguescape.com / a / plaguescape /) Bütün bu orqanizmlər (sadə bitkilər, göbələklər və protozoa) suda olan bütün oksigeni udur və başqa canlı orqanizmlər üçün zəhərli olan maddə buraxırlar.



**II. Ramses döyüş arabasını böyük bir düşmən dəstəsinə qarşı "qəhrəmancasına" sürür. Bir çoxları kimi bu da Fironun öz rəssamlarına çəkmələrini əmr etdiyi xəyali ssenarilərdən biridir.**

ABŞ Milli Balıqyetişdirənlər Cəmiyyətindən Patrisiya A. Tester Nyu-York Elmlər Akademiyasının məcmuəsi üçün hazırladığı məqaləsində izah edir ki, ən azı əlli növ fitoplankton dəniz sakinləri üçün zəhərli və ziyanlıdır. Kanadanın Səhiyyə Nazirliyindən Evan Todd tarixi dəlillərə əsaslanaraq elə bu nəşrdə qeyd edir ki, planetin müxtəlif nöqtələrində təxminən iyirmi beş növ fitoplankton müxtəlif epidemiyalara səbəb olur. Öz növbəsində V. Karmaykl və I. Falkoner özlərilə göy-yaşıl yosunların törətdiyi xəstəliklərin siyahısını təqdim edirlər. Şimali Karolina Dövlət Universitetindən olan dəniz ekoloqu Coanna M. Berhholder Pfiesteria riscimorte adlı dinoflagellates haqda danışır. Adından da göründüyü kimi, bu, balıqları öldürən növdür.

Bəlkə fironun zamanında da silsilə faciələr zənciri yer alırdı. Nilin bu yoluxma ssenarisinə görə, yəqin bütün balıqlar ölüb və misirlilər daha bir əsas qidalanma mənbəyindən məhrum olublar. Kürüsü balıqlar tərəfindən yeyilməyən quru qurbağaları bu zaman sürətlə artıb törədilər və ətrafı bürüdülər. Ancaq tezliklə onlar da zəhərləndilər. Nil sularındakı balıqların və quru qurbağalarının cəsədi, onlarla bərabər isə zəhər məhsuldar torpaqları

zəhərlədi. Quru qurbağalarının ölməsinin ardınca isə çəyirtkə və buğda güvəsi kimi həşəratların nəzarətsiz və kütləvi şəkildə çoxalması baş verdi.

Bir sözlə, faciələr necə baş versə də, nə cür təsir göstərsə də nə firon, nə də onun xalqı baş verənlərdən heç bir dərs almadı və Allah qarşısında tövbə etmədilər. Onlar Allahın qarşısında əvvəlki tək lovğalanmaqda davam edirdilər.



**Kadeş savaşı. II. Ramses ilə Xetlər arasında keçən bu mücadilə, Firon tərəfindən böyük bir qalibiyyət olaraq tarixə keçirildi. Halbuki Firon ölümdən son anda qurtulmuş və sülh imzalamaq çətinliyinə düşmüşdü.**

Firon və onun ətrafı o qədər ikiüzlü və riyakar idi ki, ürəklərində Allah-Təalanı və Musa peyğəmbəri aldatdıqlarını düşünürdülər. Yalnız başlarına bu qorxulu cəza gəldikdə Musa peyğəmbəri çağırdılar və onları bu bəladan qurtarmağı dilədilər:

**Biz də onların üstünə müxtəlif möcüzələr olaraq tufan, çəyirtkələr, bitlər, qurbağalar və qan göndərdik. Onlar isə təkəbbürlük göstərdilər və günahkar bir tayfa oldular. Əzab onları bürüdükdə dedilər: "Ey Musa! Bizim üçün Rəbbinə sənə verdiyi əhd ilə dua et! Əgər əzabı bizdən sovuşdursan, biz hökmən sənə iman gətirəcək və İsrail oğullarını mütləq səninlə birlikdə göndərəcəyik".** (Əraf surəsi, 134-135)

## MİSİRDƏN ÇIXMA

Allah fironu və onun əyanlarını cəzadan qorunmaqla bağlı Musa peyğəmbərin vasitəsilə xəbərdar etdi. Onlar isə Allaha qarşı qiyamla cavab verdilər və Musanı yalançılıqda və ağılsızlıqda günahlandırdılar. Ancaq Allahın qəzəbi böyük idi. Allah onları təhqiramiz və alçaldıcı bir ölümə məhkum etdi və peyğəmbərə bu haqda xəbər verdi:

**Biz Musaya: "Qullarımla birlikdə gecə yola çıx. Çünki siz təqib olunacaqsınız"** *(–deyə)* **vəhy etdik. Firon şəhərlərə** *(əsgər)* **toplayanlar göndərdi.** *(O dedi:)* **"Bunlar kiçik bir dəstədir. Onlar bizi qəzəbləndirmişlər. Biz hamımız ayıq-sayıq olmalıyıq". Biz onları** *(o zalım tayfanı)* **bağlardan və çeşmələrdən çıxartdıq; xəzinələrdən və gözəl**

**yerlərdən də** *(qovduq)*. **Beləcə, Biz İsrail oğullarını o yerlərə varis etdik. Günəş üfüqdən qalxarkən** *(Firon öz əsgərləri ilə)* **onları izləməyə başladılar. İki dəstə bir-birini görüncə Musanın səhabələri: "Biz yaxalanacağıq!"– dedilər.** (Şuəra surəsi, 52-61)

İsrail oğulları xilas olmağa bütün ümidlərini itirdiyi, fironun adamları isə öz məqsədlərinə çatdığını hesab etdiyi bir şəraitdə Musa peyğəmbər Allahın köməyinə ümidini itirməyərək öz xalqına belə dedi: **"Xeyr, Rəbbim mənimlədir. O, mənə doğru yol göstərəcəkdir!"** (Şuara surəsi, 62)

Elə bu zaman Allah dəniz sularını yardı və Musanı İsrail oğulları ilə birlikdə xilas etdi, onlara dənizin dibinədək keçməyə imkan yaratdı. Firon və adamları isə sıxlaşdırılmış qəzəbli dalğalar altında həlak oldular:

**Biz Musaya: "Əsanla dənizə vur!"** *(– deyə)* **vəhy etdik** *(Dəniz)* **dərhal yarıldı,** *(on iki yol açıldı)* **və hər biri nəhəng bir dağ kimi oldu. O birilərini də ora yaxınlaşdırdıq. Musa və onunla birlikdə olanların hamısını xilas etdik. O birilərini isə suya qərq etdik. Şübhəsiz ki, bu** *(hekayətdə)* **bir ibrət vardır. Lakin onların çoxu iman gətirmədi. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.** (Şuəra surəsi, 63-68)

Musa peyğəmbərin əsası möcüzəvi xüsusiyyətlərə malik idi. Allah Musaya ilk vəhyini nazil etdikdə bu əsanı ilana döndərdi, sonra isə elə həmin əsa fironun cadugərlərinin sehrini uddu. İndi Musa həmin o əsa ilə dənizi yarırdı. Bu, Allahın Öz elçisinə bəxş etdiyi möcüzələrdən biri idi.

## BU HADİSƏ HARADA BAŞ VERİB: MİSİRİN ARALIQ DƏNİZİ SAHİLLƏRİNDƏ, YOXSA QIRMIZI DƏNİZDƏ?

Musa peyğəmbərin dənizi keçdiyi yerə dair məsələdə yeganə fikir yoxdur. Quranda da bu hadisənin təfsilatları verilmədiyinə görə hansısa gümanın mübahisəsizliyinə əmin ola bilmərik. Bəzi mənbələrə görə, bu hadisə Misirin Aralıq dənizi sahillərində baş verib. İudaika ensiklopediyasında bu haqda belə deyilir:

"Hazırda geniş yayılmış fikrə görə, bu hadisə Aralıq dənizi sahillərində dənizdən ayrılmış kiçik göllərin birində baş verib".

("Red Sea", Encyclopedia Judaica, Volume 14, pp.14-15)

Hadisə II Ramzesin hakimiyyəti dövründə, ehtimal ki, Kadeş məğlubiyyətindən sonra baş verə bilərdi. Əhdi-ətiqin "Çıxış" kitabında deyilir ki, bu hadisənin baş verdiyi yer Miqdol və Vaal-sefondur, bu isə Nilin deltasının şimal hissəsindədir.

(David Ben-Gurion, The Jews in Their Land, New York: A Windfall Book, 1974, pp.32-33)

Bu nöqteyi-nəzər Əhdi-ətiqə arxalanır. Əhdi-ətiqin "Çıxış" kitabının tərcüməsində deyilir ki, firon və onun adamları Qırmızı dənizin sahillərində qərq olublar. Lakin bu versiyanın tərəfdarlarına görə, "Qırmızı dəniz" kimi tərcümə edilən söz əslində "Sea of Reeds" deməkdir. Əksər mənbələrdə bu söz "Red Sea" sözləri ilə eyniləşdirilmiş və o yerə (Qırmızı dənizə) də aid edilmişdir. Hərçənd "Sea of Reeds" "Qamış dənizi" deməkdir və bu sözdən Misir sahillərinə münasibətdə istifadə edilir. Bundan əlavə, Tövratda Musa

peyğəmbər və onun adamlarının getdiyi yol haqda danışıldıqda Miqdol və Vaal-Sefon kimi adlar keçir, bu isə Misirin Aralıq dənizi sahillərində Nil deltasının düz şimalında yerləşir. Qamış dənizi öz mənasını sayəsində hadisənin Misir sahillərində baş verməsi ehtimalını artırır, çünki bu ərazidə onun adına uyğun olaraq və deltanın su ilə gətirdiyi torpaqlar sayəsində qamış bitir.




**Yandakı xəritədə Hz. Musanın dənizdən keçə biləcəyi nöqtələr nömrələndirilmişdir. Göründüyü kimi, 1 və 2 nömrələr Qırmızı dənizdə yer alarkən, 3-cü mümkün nöqtə isə Misirin Aralıq dənizi sahilində yerləşir.**

## FİRONUN VƏ ONUN ORDUSUNUN MƏHV OLMASI

Quran bizə İsrail xalqının dənizdən keçməsinin təfsilatlarını bildirir. Belə ki, Musa peyğəmbər adamları ilə Misiri tərk etmək üçün yola düşür. Ancaq firon onun xoşuna gəlməyən nəticə ilə barışmaq istəmir. Buna görə də firon və onun qoşunu möminlərin ardınca **"zülm və düşmənçilik məqsədilə"** (Yunus surəsi, 90) atılır. Onlar düz dənizin yanında onlara çatırlar. Bunu görə bəzi İsrail oğulları Musanı qınamağa başlayırlar. Onların bu zəiflikləri haqda Quranda belə bəhs eddilir:

**İki dəstə bir-birini görüncə Musanın səhabələri: "Biz yaxalanacağıq!"– dedilər.** (Şuəra surəsi, 61)

Əslində, Allaha inamlarında möhkəm olmayan, Ondan köməyə ümidlərini itirmiş İsrail oğullarının bu cür hərəkəti özünü ilk və sonuncu dəfə büruzə vermirdi. Onlar əvvəl də Musa peyğəmbəri təqsirləndirmişdilər:

**"Sən bizə** *(peyğəmbər)* **gəlməzdən əvvəl də, sənin gəlişindən sonra da bizə əziyyət verildi."** (Əraf surəsi, 129)

Halbuki Musa heç də şübhə etmədi, çünki o, hər şeydə Allah-Təalanın rəhminə arxalanırdı. Axı hələ mübarizənin lap əvvəlində Allah peyğəmbəri əmin etmişdi ki, ondan Öz köməyini bir anlıq da olsa əsirgəməyəcək:

*(Allah)* **buyurdu: "Qorxmayın, çünki Mən sizinləyəm, eşidirəm və görürəm!** (Ta Ha surəsi, 46)

İlk dəfə fironun sehrbazları ilə qarşılaşdıqda **"Musanın ürəyi xoflandı."** (Taha surəsi, 67) Bunun ardınca Allah ona dedi: **"Qorxma, qalib gələn mütləq sən olacaqsan!"** (Taha surəsi, 68)

İndi isə onun xalqından olan adamlar fironun qoşunu qarşısında qorxu keçirdikdə Musa onlara dedi:

*(Musa)* **dedi: "Xeyr, Rəbbim mənimlədir. O, mənə doğru yol**

**göstərəcəkdir!"** (Şuəra surəsi, 62)

**Biz Musaya: "Əsanla dənizə vur!"** *(– deyə)* **vəhy etdik** *(Dəniz)* **dərhal yarıldı,** *(on iki yol açıldı)* **və hər biri nəhəng bir dağ kimi oldu.** (Şuəra surəsi, 63)

Elə gəlirdi ki, firon bu cür möcüzəni görüb baş verənlərin fövqəladəliyini və bunda birbaşa Allahın müdaxiləsinin olduğunu dərk etməli idi. Dəniz Onun öldürmək istədiklərinin qarşısında aralandı. Ancaq heç nəyə baxmayaraq onları izləyənlər aralanmış suların arası ilə İsrail oğullarının ardınca getdilər. Qəzəblənmiş firon və qoşunu ağıllarını itirdilər və olanların gözlənilməz olduğunu dərk edə bilmədilər.

Fironun həyatının son anları Quranda belə təsvir edilir:

**Biz İsrail oğullarını dənizdən keçirtdik. Firon və onun qoşunu zülm və düşmənçilik məqsədilə onları təqib etdilər. Nəhayət** *(Firon) (dənizdə)* **batdığı vaxt dedi: "İsrail oğullarının iman gətirdiklərindən başqa ilah olmadığına inandım. Mən də müsəlmanlardanam!"** (Yunus surəsi, 90)

Burada Allahın Musaya nazil etdiyi daha bir möcüzə haqda deyilir. Bu ayəni xatırlayaq:

**Musa dedi: "Ey Rəbbimiz! Sən Firona və onun əyanlarına dünya həyatında zinət və mal-dövlət bəxş etdin. Ey Rəbbimiz! Onlar** *(insanları)* **Sənin yolundan sapdırırlar. Ey Rəbbimiz! Onların mal-dövlətini məhv et və qəlbini sərtləşdir ki, üzücü əzabı görməyincə iman gətirməsinlər".** (Yunus surəsi, 88)

Buradan aydın olur ki, Musa peyğəmbər Allahın istəyi ilə əvvəlcədən xəbər verdi ki, firon onu şiddətli cəza yaxalayanda iman gətirəcək. Belə ki, dəniz qovuşanda firon birdən dedi ki, o, həqiqətən inandı. Ancaq bu cür hərəkətin qeyri-səmimiliyi və riyakarlığı aydın idi.

Allah fironun riyakar tövbəsini qəbul etmədi, o və qoşunu cəzadan yaxa qurtara bilmədilər və sularda qərq oldular:

*(Firona deyildi:)* **"İndimi? Sən ki əvvəllər asilik etmiş və fəsad törədənlərdən olmuşdun. Bu gün sənin bədənini xilas edəcəyik** *(sahilə çıxaracağıq)* **ki, səndən sonra gələnlərə ibrət olasan". Həqiqətən də, insanların çoxu ayələrimizdən xəbərsizdir.** (Yunus surəsi, 91-92)

Firon və əsgərləri öz cəzalarını aldılar, axı onlar da başçıları kimi ***"günahkar"*** (Qəsəs surəsi, 8), ***"zalım və düşmən"*** (Yunus surəsi, 90) idilər, çünki onlar **"...yer üzündə haqsız yerə təkəbbür göstərdilər və elə güman etdilər ki, hüzurumuza qaytarılmayacaqlar."** (Qəsəs surəsi, 39) Buna görə də Allahın hazırladığı cəzanı şübhəsiz ki, onlar qazanmışdılar və Allah **"onu və onun əsgərlərini tutub dənizə atdı..."** (Qəsəs surəsi, 40)

Allah: **"Ayələrimizi inkar edib onlardan qafil olduqlarına görə Biz** *(o tayfadan)* **intiqam alaraq onları dənizdə qərq etdik."** (Əraf surəsi, 136)

Fironun ölümündən sonra baş verən hadisələr haqda Quranda belə deyilir:

*(Musa ilə olan)* **zəif camaatı isə yer üzünün xeyir-bərəkət verdiyimiz məşriqlərinə və məğriblərinə varislər təyin etdik. Səbr etdiklərinə görə Rəbbinin İsrail oğulları barəsindəki gözəl Sözü yerinə yetdi...**

(Əraf surəsi, 137)

**Bu gün sənin bədənini xilas edəcəyik** *(sahilə çıxaracağıq)* **ki, səndən sonra gələnlərə ibrət olasan". Həqiqətən də, insanların çoxu ayələrimizdən xəbərsizdir.** (Yunus surəsi, 92)



**Şəkillərdə gördüyünüz Firon II Ramzesin məzarından çıxarılan mumiyasıdır. Tarixi mənbələrin əksəriyyəti bu fironun, Quranda bəhs edilən Firon olduğunu göstərməkdədir. Bəs Qurana görə boğularaq ölən Fironun mumiyası necə olur ki, bir qəbirdə tapılmışdır? Çox güman ki, sular üstünə qapanıb boğulduqdan sonra fironun cəsədi sahilə çıxmış və Misirlilər tərəfindən tapılaraq öncədən tikilmiş olan məzarına aparılmışdır.**



# SƏBA XALQI VƏ ARİM SELİ

**Səba** *(qəbiləsinin)* **yaşadığı yerdə nişanə –** *(biri)* **sağda,** *(digəri də)* **solda olan iki bağça var idi.** *(Onlara:)* **"Rəbbinizin ruzisindən yeyin və Ona şükür edin. Gözəl diyar və Bağışlayan Rəbb!"** *(– deyilmişdi.)* **Amma onlar üz döndərdilər, Biz də üstlərinə güclü sel göndərdik. Onların iki bağçasını acı meyvəli, yulğunlu və** *(içində)* **bir az sidr ağacı olan iki bağla əvəz etdik.**
(Səba surəsi, 15-16)

Səba xalqı nə vaxtsa Cənubi Ərəbistanda məskunlaşmış dörd iri sivilizasiyanın nümayəndələrindən biridir. Biz artıq Ad xalqının adını çəkmişdik. Tarixçilər güman edirlər ki, səba xalqı ilk olaraq dövlətçiliyin əsasını e.ə. 1000-750-cü illərdə qoyub, imperiya e.ə. 550-ci illərdə farsların və ərəblərin dağıdıcı hücumları nəticəsində çöküb.

Səba dövlətinin yaranmasının tarixinə dair yekdil fikir yoxdur, çünki səbailərin ilk rəsmi yazıları e.ə. 600-cü illərə aiddir. Səba dövləti haqda qədim xatırlamalar isə tarixçilərdə hələ yoxdur.

Səba xalqı haqda ilk məlumatlara Assuriya hökmdarı II Sarqonun (hakimiyyət illəri e.ə. 722-705-ci illər) hərbi salnamələrində rast gəlinir. Sarqon ona həvalə edilmiş dövləti təsvir edərək Səba hökmdarı Yis-i Əmar haqda qeyd edir. Bu tarixi qeyd qədim Səba dövlətindən bəhs edən ən qədim yazılı mənbədir. Ancaq Səba mədəniyyətinin dirçəlməsini məhz e.ə. 700-cü ilə aid olduğunu güman etmək səhv olardı, çünki istisna deyil ki, Səba dövləti hələ qədim əlyazmalarda qeyd edildiyindən əvvəl fəaliyyətə başlamışdır. Çox güman ki, xalqın tarixi daha erkən zamanlara gedir. Məsələn, Ur çarlığının sonuncu hökmdarlarından biri olan Arad - Nannarın qeydlərində "Sabum" sözünə rast gəlinir ki, alimlərin fikrincə, bu da "səbalılar ölkəsi" deməkdir. Tarixçilər bu gümanlarında səhv etmirsə, Səba tarixi e.ə. 2500-cü illərə aiddir. ("Seba" Islam Ansiklopedisi: Islam Alemi, Tarihi, Cografya, Etnografya ve Bibliyografya Lugati, (Encyclopedia of Islam: Islamic World, History, Geography, Ethnography, and Bibliography Dictionary) Vol.10, p. 268)



Səba tayfasının dilində yazılmış yazılar.

Səba xalqından bəhs edən tarixi sənədlər, onları inkişaf və rifah səviyyəsinə görə dövlətləri yüksək inkişaf etmiş, ticarəti ilə səciyyəvi

olan finikiyalılarla bir sırada tuturlar. Şimali Ərəbistanın bir sıra iri ticarət yolları finikiyalıların nəzarətində idi. Səbanın tacirləri isə mallarını Şimali Ərəbistandan Aralıq dənizi hövzəsinə və Qazuya daşımaq üçün bu yerlərin yeni hökmdarı olan Assuriya çarı II Sarqondan ya icazə almalı, ya da ona rüsum ödəməli idilər. Səbalılar assuriyalıların salnaməsinə, onların hökmdarına müntəzəm şəkildə bac-xərac ödəməyə başladıqdan sonra daxil oldular.

Səba xalqının sivilizasiyası tarixdə yüksək inkişafı ilə tanınır. Səba hökmdarlarının yazılarında "tikinti", "ticarət", "ianə" kimi sözlər yer alır. Öz dövrünün vacib texnoloji nailiyyətlərindən biri olan Mərib bəndi Səba xalqının inkişaf inkişaf səviyyəsinin bəlkə də ən parlaq nümunəsi ola bilər. Ancaq tikinti və ianə sözlərinin bu qədər qeyd edilməsi güclü hərbi quruluşun olmaması demək deyil. Səba ordusu ərazi bütövlüyünün qorunmasını və bu dövlətin çiçəklənməsini, uzun müddət ərzində xarici hədələrdən qorunmasını təmin edən əsas amillərdən biri idi.

Səba çarlığı güclü ordulardan birinə sahib idi. Bunun sayəsində Səba hökmdarları qonşu torpaqların və xalqların fəal işğalı siyasətini aparırdılar. Belə ki, Səba qədim Kataban dövlətinin torpaqlarını işğal etdi, həmçinin Afrika qitəsində torpaqların bir hissəsinə sahib oldu. E.ə. 24-cü ildə Səba ordusu o dövrün ən yüksək inkişaf etmiş və güclü dövləti olan Roma imperiyasının Misir canişini Mark Eliy Qallanın başçılıq etdiyi ordusunu məğlub etdi. Səba mötədil siyasət yürüdən güclü dövlət təəssüratı yaradır, ancaq lazım olduqda zor tətbiqindən də istifadə edirdi. Səba çarlığı özünün çiçəklənmə dövründə inkişaf etmiş mədəniyyəti və hərbi gücü ilə sözün əsl mənasında o dövrün ən güclü dövlətlərindən biri hesab edilirdi.

Quranda Allah-Təala Səba ordusunun gücü və xüsusiyyətləri haqda məlumat verir. Səba sərkərdələrinin sözləri lovğalıq və özlərinin sonsuz gücünə əminlik elementləri ilə doludur. Onlar öz çariçalarına belə deyirdilər:

**Onlar dedilər: "Biz böyük bir qüvvət və qüdrət sahibiyik. Buyuruq isə sənindir. Nə buyuracağını özün fikirləş!"** (Nəml surəsi, 33)

Səba çarlığının paytaxtı əlverişli coğrafi vəziyyətinə görə çiçəkləyən Mərib şəhəri idi. O, Adhan çayının yaxınlığında yerləşirdi. Bu çayın Cəbəl-Bələkəyə töküldüyü yer bənd tikintisi üçün olduqca əlverişli idi. Səbalılar bundan istifadə edərək hələ öz sivilizasiyalarının ilk çağında burada bənd ucaltdılar və ölkənin və onun sakinlərinin yüksək səviyyəli rifahını təmin edəcək suvarma əkinçiliyini inkişaf etdirdilər. Mərib bir zamanlar qədim dünyanın iri şəhərlərindən biri kimi tanınırdı. Bu yerlərə səyahət edən Qədim Roma tarixçisi və yazıçısı Pliniy bu diyarı özünün "Təbii tarix" kitabında tez-tez tərifləyərək onun bol yaşıllığına heyranlığını bildirirdi.

(Hommel, Explorations in Bible Lands, Philadelphia: 1903, p.739)

Qədim tarixçilərin təsvirlərinə görə, Mərib bəndinin hündürlüyü 16 metr, eni 60 metr, uzunluğu 620 metr idi. Bəndin suvardığı torpaqların ümumi sahəsi 9600 hektar idi ki, onun da 5300 hektarı cənub, qalan hissəsi isə şimal vadisinin payına düşürdü. Səba çarlığının daş yazılarında bu torpaqlar "Mərib

və iki vadi" kimi qeyd edilir. ("Marib", İslam Ansiklopedisi: İslam Alemi, Tarihi, Coğrafya, Etnoğrafya ve Bibliyografya Lugatı, Volume 7, p. 323-339.) Belə ki, Quranda **"sağdan və soldan iki bağ"** (Səba surəsi, 15-16) sözünün keçməsi bu dərələrdə bitən təmtəraqlı bağlara və üzümlüklərə işarə edir. Bu rayon bənd və suvarma qurğuları sayəsində Cənubi Yəmənin ən məhsuldar hissəsi sayılırdı. Himer ləhcəsində tərtib edilmiş qədim əlyazmaları və sənədləri öyrənən fransız tarixçisi və arxeoloqu C. Holevi və avstriyalı Qlaser sübut etdilər ki, Mərib bəndi ta qədimlərdən mövcud idi. Bu ölkənin torpaqlarının məhsuldarlığı tarixi sənədlərdə məhz bəndin olması ilə izah edilirdi.




Eramızın V-VI əsrlərində bu bənd irimiqyaslı dəyişikliklərə məruz qaldı və yenidən quruldu, ancaq bu dəyişikliklər də bəndin 542-ci ildə uçmasının qarşısını ala bilmədi ki, bu da **"bəndin daşmasına"** (Səba surəsi, 16) gətirib çıxardı və torpaqların məhsuldarlığına xeyli zərər vurdu. Bağlar, üzümlüklər, tarlalar, bir sözlə, səbalıların əsrlər ərzində ucaltdığı hər şey su altda qaldı. Bəndin dağılması Səba çarlığının iqtisadi gücünün kəskin zəifləməsinə səbəb oldu və qədim dövrün ən zəngin və güclü dövlətlərindən birinin sonunun başlanğıcına çevrildi.

## SƏBA DÖVLƏTİNƏ GÖNDƏRİLƏN ARİM SELİ

Biz adıçəkilən tarixi faktlarla birgə Quran ayələrinin öyrənilməsində aşkar bir həqiqətlə qarşılaşırıq: arxeoloji dəlillər və tarixi faktlar Quran sətirlərinin həqiqiliyini təsdiq edir. Ayədə bildirildiyi kimi, Allahın göndərdiyi peyğəmbərin xəbərdarlıqlarına qulaq asmayan və Rəbbin onlara bəxş etdiyi nemətlərə naşükürlük edən xalq sonda selə məruz qaldı. Bu hadisə Quranda belə təsvir edilir:

**Səba** *(qəbiləsinin)* **yaşadığı yerdə nişanə –** *(biri)* **sağda,** *(digəri də)* **solda olan iki bağça var idi.** *(Onlara:)* **"Rəbbinizin ruzisindən yeyin və Ona şükür**

**edin. Gözəl diyar və Bağışlayan Rəbb!”** *(–deyilmişdi.)* **Amma onlar üz döndərdilər, Biz də üstlərinə güclü sel göndərdik. Onların iki bağçasını acı meyvəli, yulğunlu və** *(içində)* **bir az sidr ağacı olan iki bağla əvəz etdik. Nankorluqlarına görə onları belə cəzalandırdıq. Məgər biz nankordan başqasını cəzalandırarıqmı?** (Səba surəsi, 15-17)

Quranda deyilir ki, Səba xalqı yaşıl bağlar içində və heyranedici gözəlliyi olan səxavətli və bərəkətli diyarda yaşayırdı. Həmçinin ölkədən keçən çoxlu ticarət yolları ilə şərtlənən yüksək səviyyəli rifaha malik Səba çarlığı öz dövründə qədim dünyanın ən tanınmış şəhərlərindən idi.

Bu dərəcə gözəl şəraitdə yaşayan Səba xalqı gərək ayədə deyildiyi kimi, **“...Rəbbinizin ruzisindən yeyin və Ona şükür edin...”** (Səba surəsi, 15) deyiminə uyğun hərəkət edəydi. Ancaq təəssüf, səbalılar məhz özlərini bu rifahın yaradıcısı və həyatlarının tam hakimi hesab etdilər. Şükr etmək əvəzinə lovğalandılar qürurlandılar və ayədə də deyildiyi kimi, Allahdan “üz çevirdilər." Ancaq onların qanunsuzluqları çox sürmədi, çünki yalnız özlərinin yaratdıqlarını hesab etdikləri nemət və bolluq Qurani-Kərimdə də deyildiyi kimi, tezliklə yox oldu, "bəndin daşması" ölkəni yerlə-yeksan etdi.





**Dağıntıları görünən Marib bəndi Səbalıların ən mühüm əsərlərindən biri idi. Quranda bəhs edilən Arim Seli ilə bərabər bənd çökdü və bütün əkin sahələri sular altında qaldı. Bəndin uçması ilə torpaqları xarab olan Səba Dövləti qısa müddətdə iqtisadi cəhətdən zəiflədi və bir müddət sonra isə süqut etdi.**

Səba xalqına göndərilən cəza Quranda "Səylül-Arim" kimi qiymətləndirilir ki, bu da ərəb dilindən tərcümədə "bəndin daşması" deməkdir. Quranın bu ifadəsi eyni zamanda selin necə baş verməsinə işarə edir. Çünki "ərim", yəni "bənd" sözü artıq özü haqda bildirir, "Səylül-Arim" söz birləşməsi isə "daşma" və ya sadəcə bəndin yarılmasının əmələ gətirdiyi sel deməkdir. İslam ilahiyyatçıları Quranda "bəndin daşmasına" dair istifadə edilən mənaları nəzərə alaraq hadisənin yerini və zamanını olduqca dəqiq müəyyən ediblər. Məvdudi öz təfsirində yazır:

**Onların iki bağçasını acı meyvəli, yulğunlu və** *(içində)* **bir az sidr ağacı olan iki bağla əvəz etdik.** (Səba surəsi, 16)

*Deməli, ölkə bəndin daşmasının doğurduğu axının gətirdiyi sel nəticəsində dağıldı. Həmçinin bütün suvarma kanalları sistemi xəsarət aldı. Nəticədə əvvəllər "sanki bağ olan" ölkə cır ağacların kiçik toxumlarından başqa yeməli heç nə qalmayan vəhşi otlar bataqlığına çevrildi.*

(Mawdudi, Tefhimul Kuran, Cilt 4, Istanbul: Insan Yayinlari, p.517.)

"Müqəddəs Kitab doğru söylədi" ("Und die Bidel hat doch recht") kitabının müəllifi, dini inancına görə xristian olan arxeoloq Verner Keller qeyd edir ki, sel Quranda təsvir edilənlərlə uyğun baş verib: "Nə vaxtsa bəndin olması, onun uçması və bütün dövlətin dağılmasına səbəb olması şübhəsiz onu təsdiq edir ki, Quranda "bağların sahibləri ilə" baş verən hadisələr həqiqətən olub". (Werner Keller, Und die Bibel hat doch recht (Tbe Bible as History; a Confirmation of the Book of Books), New York: William Morrow, 1956, p.207.)



Sütunların səthində səba dilində yazılmış yazılar vardır.

Seldən sonra bu yerin məhsuldar torpaqları tədricən səhraya döndü, məhsuldarlığın itməsi ilə də səbalılar əsas gəlir mənbəyindən məhrum oldular. Allah öz Rəbbinin tövbə çağırışlarına lovğalıq, təkəbbür, özünə hədsiz inam içində cavab verməyən, Yaradana şükr etməyən bu xalqı belə cəzalandırdı. Selin vurduğu ciddi zərbə ölkəni tam xarabalıq vəziyyətinə gətirdi. İnsanlar öz yuvalarını tərk etməyə başladılar və Ərəbistanın şimalına - Məkkəyə və ya Suriyaya köçdülər. (New Traveller's Guide to Yemen, p.43.)

Bu hadisə Uca Yaradan İncili və Tövratı nazil etdikdən sonra baş verdiyi üçün onun haqqında yalnız Qurani-Kərimdə bəhs edilir.

Bir vaxtlar Səba xalqının məskunlaşdığı Mərib indi səhra arasında insansız xarabalıqlara bənzəyir. Qoy bu, səbalıların etdiyi günahları təkrar edən hər kəsə dərs olsun. Səba buna dair yeganə misal deyil. Qurani-Kərimin "Kəhf" surəsində bağların iki sahibi haqda ibrətamiz hekayə gətirilir. Onlardan birinin bağı eynilə səbalıların bağları kimi cah-cəlallı və məhsuldardır. Onun sahibinin etdiyi günahlar da eynidir - Allahın buyurduqlarına tabe olmamaq. İnsan Allahın rəhmindən ona bəxş ediləni mənimsəmək istəyir:

**Onun** *(başqa)* **sərvəti də var idi. O öz** *(mömin)* **yoldaşı ilə söhbət edərkən ona: "Mən sərvətcə səndən daha zəngin və adamlarıma görə səndən daha qüvvətliyəm!"– dedi. O özünə zülm edərək bağına daxil olub dedi: "Bunun nə vaxtsa yox ola biləcəyini düşünmürəm. O Saatın gələcəyini də zənn etmirəm. Rəbbimin dərgahına qaytarılmalı olsam, sözsüz ki, bundan daha firavan bir həyat qismətim olacaq!"** (Kəhf surəsi, 34-36)

**Beləcə, onun** *(bağının)* **məhsulu bir anda məhv edildi. O,** *(bağını belə görüb)* **ora qoyduğu xərcə görə** *(peşmançılıq çəkməyə)* **və əllərini bir-birinə vurmağa başladı. Bağın talvarları belə darmadağın olub yerə yıxılmışdı. O dedi: "Kaş Rəbbimə heç kəsi şərik qoşmayaydım!" Allahdan başqa ona yardım edə biləcək dostlar yox idi və o da öz-özünə kömək edə bilməzdi.**

(Kəhf surəsi, 42-43)

Quran ayələrindən də aydın olduğu kimi, bağ sahibinin günahı Allahın mövcudluğunu inkar etmək deyil, əksinə, bəyan edilir ki, əgər o, "Rəbbinə doğru qaytarılsa", daha yaxşısı veriləcək. Hazırkı vəziyyətini isə o, yalnız şəxsi uğuru hesab edir və heç kəsə təşəkkür etməyə məcbur olmadığını düşünür.

Axı bu, elə Allaha şərik qoşmaqdır! Bütövlükdə Allaha aid olanları və sənə rəhmi gəldiyindən verdiyinə görə Allah-Təalaya şükr etmək əvəzinə onları mənimsəmək özünü hansısa seçilmişlərdən saymaq, Allahın onsuz da qoruyacağını hesab etmək və beləliklə, Yaradanın qarşısında qorxmağı və hörməti unutmaqdır.

Səba xalqı ilə bağlı da belə oldu, başlarına gələn cəza onlara dərs və gələcək çarlıqlar üçün ibrət oldu: bütün ölkə bünövrəsinə qədər müflisləşmişdi ki, insan dərk etsin ki, o, öz var-dövlətinin və əmlakının sahibi deyil, onun yalnız müvəqqəti istifadəçisidir.



**Rəbbimiz, Quranda Səba məlikəsi və xalqının Hz. Süleymana tabe olmamışdan öncə "Allahı qoyub, Günəşə səcdə etdiklərini" bildirməkdədir. Yazılarda tapılan məlumatlar, bunu təsdiq etməkdə və Səba əhlinin yuxarıdakı və ona bənzər məbədlərdə Aya və Günəşə sitayiş etdiklərini ortaya qoymaqdadır.**

# HZ. SÜLEYMAN VƏ SƏBA HÖKMDARI

**Qadına: "Saraya daxil ol!"– deyildi. O, sarayı gördükdə onu dərin bir gölməçə hesab etdi və baldırlarını açdı.** *(Süleyman)* **dedi: "Bu, büllurdan hamarlanıb düzəldilmiş bir saraydır!"** *(Qadın)* **dedi: "Ey Rəbbim! Mən özümə zülm etmişdim. İndi isə Süleymana tabe olub aləmlərin Rəbbi olan Allaha təslim oldum!"** (Nəml surəsi, 44)

Cənubi Yəməndəki qədim Səba çarlığının ərazisində aparılan arxeoloji qazıntılar zamanı Süleyman peyğəmbərin və Səba hökmdarının görüşü haqda tarixi qeydlər aşkar edilmişdir. Tapılmış saray xarabalıqlarının öyrənilməsi göstərdi ki, eramızdan əvvəl təxminən 1000-950-ci illərdə məhz burada şimala (Əl-Qüdsə, yəni Yerusəlimə) səfər edən qadın hökmdar yaşayırdı.

İki hökmdarın görüşü, onların idarə etdiyi ölkələrin iqtisadi və siyasi gücü, həmçinin digər tarixi təfsilatlar haqda Qurani-Kərimin "Nəml" surəsində xəbər verilir. Surənin xeyli hissəsini tutan hekayə ondan başlayır ki, Süleymanın ordusundakı Hüd-hüd quşu peyğəmbərə Səba qadın hökmdarı haqda xəbər gətirir:

**Çox keçmədən** *(hüdhüd)* **gəlib dedi: "Mən sənin bilmədiyin bir şeyi öyrəndim. Sənə Səbadan doğru bir xəbər gətirmişəm. Mən onlara padşahlıq edən, özünə hər şey verilmiş və çox böyük bir taxtı olan bir qadın gördüm. Mən onun və tayfasının Allahı qoyub günəşə səcdə etdiklərinin şahidi oldum. Şeytan onların əməllərini özlərinə gözəl göstərmiş və onları** *(haqq)* **yoldan çıxartdığına görə haqqın yolunu tapa bilmirlər.** *(Şeytan ona görə belə etmişdir)* **ki, göylərdə və yerdə gizli olanı aşkara çıxardan, sizin gizlətdiklərinizi də, üzə çıxartdıqlarınızı da Bilən Allaha səcdə etməsinlər. Böyük Ərşin Rəbbi olan Allahdan başqa ilah yoxdur".** *(Süleyman)* **dedi: "Baxaq görək, sən doğru deyirsən, yoxsa yalançılardansan.** (Nəml surəsi, 22-27)




**a.** Gediş Yolu
**b.** Dönüş Yolu

**1.** Süleyman Krallığı
**2.** Ərəbistan yarımadası
**3.** Səba Krallığı

**4.** Yerusəlim
**5.** Dəclə
**6.** Fərat
**7.** Nil

Bundan sonra Süleyman peyğəmbər ona buyurur:

**Mənim bu məktubumu apar onların yanına at. Sonra bir qədər uzaqda dur və bax gör nə cavab verəcəklər!"** (Nəml surəsi, 28)

Sonra Quranda çariçanın naməni aldıqdan sonra baş verən hadisələr təsvir edilir:

*(Qadın)* **dedi: "Ey əyanlar! Mənə çox əhəmiyyətli bir məktub atıldı. O** *(məktub)* **Süleymandandır və** *(onda deyilir:)* **"Mərhəmətli və Rəhmli Allahın adı ilə! Mənə qarşı təkəbbür göstərməyin və yanıma müti olaraq gəlin!""**

*(Qadın)* **dedi: "Ey əyanlar! Bu iş barəsində mənə məsləhət verin. Mən heç vaxt siz yanımda olmayınca qəti qərar verməmişəm".**



SÜLEYMAN MƏBƏDİ

**Onlar dedilər: "Biz böyük bir qüvvət və qüdrət sahibiyik. Buyuruq isə sənindir. Nə buyuracağını özün fikirləş!"** *(Qadın)* **dedi: Hökmdarlar hər hansı bir məmləkətə soxulduqları zaman onu viran qoyar, xalqının hörmətli adamlarını da zəlil edərlər. Onlar bax belə edərlər. Mən onlara bir hədiyyə göndərəcəyəm və baxacağam görüm elçilər nə ilə qayıdacaqlar.**

*(Elçilər)* **Süleymanın yanına gəldikdə o dedi: "Siz mənə mal-dövlətləmi yardım edirsiniz? Allahın mənə bəxş etdiyi sizin verdiyinizdən daha yaxşıdır. Siz isə ancaq öz bəxşişlərinizlə fərəhlənirsiniz. Onların yanına qayıt! Biz onların üstünə qarşısında dura bilməyəcəkləri bir ordu ilə gəlib onları oradan zəlil və alçalmış vəziyyətdə çıxardarıq!"**

*(Süleyman)* **dedi: "Ey əyanlar! Onlar müti olaraq yanıma gəlməmiş hansınız onun taxtını mənə gətirə bilər?" Cinlərdən çox qüvvətli birisi dedi: "Sən məclisdən qalxmamış mən onu sənə gətirərəm. Mən bu işi görməyə çox qüvvətliyəm, etibarlıyam!"**

**Kitabdan xəbəri olan** *(bir başqa)* **kimsə isə belə dedi: "Mən onu sənə bir göz qırpımında gətirərəm!"** *(Süleyman)* **taxtı yanında hazır durmuş görən kimi dedi: "Bu, Rəbbimin lütfündəndir ki, məni sınağa çəksin, görək şükür edəcəyəm, yoxsa nankor olacağam! Kim şükür etsə, ancaq öz xeyrinə şükür etmiş olar, kim də nankor olsa,** *(bilsin ki)*, **həqiqətən, Rəbbim** *(onun şükrünə)* **möhtac deyildir, Səxavətlidir!"**

*(Süleyman)* **dedi: "Onun taxtını tanınmaz hala salın, görək onu tanıyacaq və ya tanımayanlardan olacaq?"**

**Qadın gəldikdə ona: "Taxtın bu cürdürmü?" – deyildi. O dedi:**

**“Deyəsən odur!”** *(Süleyman dedi:)* **“Bizə ondan əvvəl elm verilmiş və biz müsəlman olmuşuq!” Allahdan başqa tapındığı şeylər o qadını** *(tövhiddən)* **yayındırmışdır. Çünki o, kafir bir tayfadan idi. Qadına: “Saraya daxil ol!”– deyildi. O, sarayı gördükdə onu dərin bir gölməçə hesab etdi və baldırlarını açdı.** *(Süleyman)* **dedi: “Bu, büllurdan hamarlanıb düzəldilmiş bir saraydır!”** *(Qadın)* **dedi: “Ey Rəbbim! Mən özümə zülm etmişdim. İndi isə Süleymana tabe olub aləmlərin Rəbbi olan Allaha təslim oldum!”** (Nəml surəsi, 29-44)





**Bəzi mənbələrə görə, Süleyman məbədi dağıdılandan sonra məbədin salamat qalan tək divarı yəhudilər tərəfindən “Ağlama divarı”na çevrilmişdir. 7-ci əsrdə Qüdsü fəth edən müsəlmanlar isə, məbədin köhnə yerində Həzrəti Ömər Məscidini və Qübbətüs-Səhranı inşa etdilər. Qüds hələ də bu vəziyyətdədir. Yuxarıdakı şəkildə Qübbətüs-Səhra və onun yaxınlığındakı Ağlama Divarı görünür.**

## SÜLEYMAN PEYĞƏMBƏRİN SARAYI

Səba çariçasından bəhs edən Quran ayələrində Süleyman peyğəmbər, onun gücü və gözəl sarayı haqda da danışılır.

Biz öyrənirik ki, Süleyman peyğəmbərin sarayı o dövrün ən qabaqcıl texnologiyaları əsasında tikilib, nadir incəsənət əsərləri ilə bəzədilib, sarayın döşəməsi isə təmiz büllurdan işlənib.

Bu tikintinin cah-cəlalı və onun Səba çariçasında yaratdığı təəssürat Quranda bu cür təsvir edilib:

**Qadına: “Saraya daxil ol!”– deyildi. O, sarayı gördükdə onu dərin bir gölməçə hesab etdi və baldırlarını açdı.** *(Süleyman)* **dedi: “Bu, büllurdan hamarlanıb düzəldilmiş bir saraydır!”** *(Qadın)* **dedi: “Ey Rəbbim! Mən özümə zülm etmişdim. İndi isə Süleymana tabe olub aləmlərin Rəbbi olan Allaha təslim oldum!”** (Nəml surəsi, 44)

Süleymanın sarayı yəhudi mənbələrində "Solomonun məbədi" kimi tanınır. Sarayın və ya məbədin yeganə bütöv hissəsi yəhudilərin "Fəryad divarı" adlandırdığı qərb divarıdır. Süleymanın sarayının və Əl-Qüdsdə bir çox yerlərin dağılmasının səbəbi yəhudilərin hər yerdə yaydığı fitnə-fəsad və onların təkəbbürüdür. Quran bizə bu haqda belə xəbər verir:

**Biz, Kitabda İsrail oğullarına: "Siz yer üzündə iki dəfə fəsad törədəcəksiniz və olduqca təkəbbür göstərəcəksiniz"** *(– deyə)* **xəbər verdik. İki fəsaddan birincisinin vaxtı gəldiyi zaman üstünüzə qüvvətli qullarımızı göndərdik. Onlar yurdunuzda gəzib dolaşıb** *(sizi)* **axtarırdılar. Bu, yerinə yetirilmiş bir vəd idi. Sonra sizə onların üzərində yenidən qələbə qazandırdıq, var-dövlət və oğullarla sizə yardım etdik və sizin sayınızı çoxaltdıq. Yaxşılıq etsəniz, özünüzə yaxşılıq etmiş, pislik etsəniz öz əleyhinizə etmiş olursunuz. Sonuncu vədin vaxtı gələndə, üzünüzü qara etsinlər, birinci dəfə** *(Yerusəlimdəki)* **məscidə girdikləri kimi** *(yenə də)* **ora girsinlər və ələ keçirdikləri hər şeyi darmadağın etsinlər deyə** *(düşmənlərinizi üstünüzə göndərdik)***.** (İsra surəsi, 4-7)

Haqqında əvvəlki bölümlərdə bəhs edilən bütün xalqlar Allah-Təalanı təhqir etdiklərinə, Ona nifrin etdiklərinə, Onun bəxş etdiyi nemətlərin əvəzinə naşükürlük etdiklərinə görə ədalətli şəkildə cəzalandılar. Allah onları dəfələrlə xəbərdar etdi, peyğəmbərlər göndərdi, ancaq onların ürəklərində tövbənin və peşmançılığın əlaməti belə yox idi və bunun ardınca onlar gözlənilən mütləq cəzadan qaça bilmədilər. Vətənsiz və dövlətsiz halda bütün dünyanı dolaşan və Süleyman peyğəmbərin dövründə müqəddəs torpaqda məskunlaşan yəhudilər həddi aşdıqlarına, Uca Yaradanın əmr və buyruqlarını inkar etdiklərinə, fitnə və ədavət yaymağa başladıqlarına görə müflisləşdilər. Yaxın keçmişdə həmin torpaqda rahatlıq tapan yəhudilər bu gün təkəbbürlə o vaxt Rəbbin ilk vədinin gəldiyi vaxtda olduğu kimi "böyük təkəbbürlə lovğalanırlar". Eynilə o vaxtkı kimi, vəd yerinə yetməmişdən əvvəl…




**Hz. Süleymanın sarayı, öz dövrünün ən qabaqcıl texniki xüsusiyyətlərinə və üstün bir estetik anlayışına sahib idi. Üstdəki planda Hz. Süleyman dövründə Qüdsün mərkəzi göstərilmişdir.**

**1) Cənub-qərb qapısı**
**2) Kraliçanın sarayı**
**3) Hz. Süleymanın sarayı**
**4) 32 sütunlu giriş**
**5) Ədliyyə**
**6) Livan meşəsi**
**7) Baş kahinlər evi**
**8) Məbədin giriş qapısı**
**9) Məbədin həyəti**
**10) Məbəd**

# ƏSHABİ - KƏHF

**Bir zaman gənclər mağaraya sığınıb:**
**"Ey Rəbbimiz! Bizə Öz tərəfindən mərhəmət bəxş et və işimizdə bizə düz yol göstər!"– demişdilər.** (Kəhf surəsi, 10)

Qurani-Kərimin on səkkizinci "Kəhf" surəsində Allah-Təala bizə Allahı inkar edən, möminlərə zülm edən zalım və allahsız hakimiyyətdən qaçaraq mağarada gizlənmiş gənclər haqqında bəhs edir. Aşağıda onların tarixini əks etdirən ayələr gətirilir:

**Yoxsa sən mağara və Rəqim əhlinin möcüzələrimizdən ən qəribəsi olduğunumu güman edirsən?**

**Bir zaman gənclər mağaraya sığınıb: "Ey Rəbbimiz! Bizə Öz tərəfindən mərhəmət bəxş et və işimizdə bizə düz yol göstər!"– demişdilər.**

**Biz mağarada onların qulaqlarını illərlə qapalı saxladıq** *(onları yuxuya verdik)***.**

**Sonra iki dəstədən hansının onların** *(mağarada)* **qaldıqları müddəti daha düzgün hesabladıqlarını bilmək üçün onları oyatdıq.**

**Biz onların əhvalatını sənə olmuş bir həqiqət kimi söyləyirik. Onlar Rəbbinə iman gətirmiş gənclər idi. Biz də onların hidayətini artırdıq.**

**Onlar** *(kafir hökmdarın qarşısında)* **durub: "Rəbbimiz göylərin və yerin Rəbbidir. Biz heç vaxt Ondan başqa tanrıya ibadət etməyəcəyik. Əks halda olduqca böyük bir** *(küfr)* **danışmış olarıq!"– deyərkən onların qəlbinə qüvvət verdik.**

*(Cavanlardan biri o birilərinə) (dedi:)* **"Bizim bu xalqımız Allahdan başqa tanrılar qəbul etdi. Bəs nə üçün onlar buna aid** *(bütlərə dair)* **bir dəlil gətirmədilər?**

**Allaha qarşı yalan uydurandan daha zalım kim ola bilər?!**

**Madam ki, siz onları və Allahdan savayı ibadət etdiklərini tərk etdiniz, onda mağaraya sığının ki, Rəbbiniz sizə Öz mərhəmətini geniş etsin və işinizdə sizin üçün fayda hazırlasın.**

*(Orada olsaydın)* **günəşin doğduğu zaman onların mağarasının sağ tərəfinə yönəldiyini, batdığı zaman isə onlardan uzaqlaşıb sol tərəfə addadığını, onların da mağaranın içində geniş bir yerdə yerləşdiklərini görərdin. Bu, Allahın dəlillərindəndir. Allah kimi doğru yola yönəldərsə, o, doğru yoldadır. Kimi də azdırarsa, ona doğru yolu göstərən bir yaxın adam tapa bilməzsən.**

**Onlar yatmış ikən sən onları oyaq hesab edərdin. Biz onları sağa-sola çevirirdik. Onların iti isə girəcəkdə qabaq pəncələrini uzadıb** *(yatmışdı)***. Əgər sən onları görsəydin, dönüb onlardan qaçardın və dəhşət səni bürüyərdi.**

**Beləcə onları oyatdıq ki,** *(nə baş verdiyini)* **bir-birindən soruşub öyrənsinlər. Onlardan biri: "***(Burada)* **nə qədər qaldınız?"– dedi.** *(Bəziləri:)* **"Bir gün yaxud günün bir hissəsi qədər qaldıq"– dedilər.** *(Digərləri də)* **dedilər: "Qaldığınız müddəti Rəbbiniz daha yaxşı bilir. Birinizi bu**

**gümüş pulunuzla şəhərə göndərin. Qoy baxsın ən təmiz yemək hansıdır-sa, ondan sizə azuqə gətirsin. Amma ehtiyatlı olsun və sizin barənizdə heç kəsi duyuq salmasın!**

**Çünki onlar sizi tapsalar ya sizi daşqalaq edər, ya da öz dinlərinə döndərərlər.** *(Onda)* **siz heç vaxt nicat tapa bilməzsiniz!"**



Efesdə Əshabi-Kəhfə aid olduğuna inanılan mağara.

**Beləcə,** *(insanları)* **onların halından xəbərdar etdik ki, Allahın vədinin həqiqət olduğunu və o Saatın gələcəyinə şübhə olmadığını bilsinlər. O zaman** *(möminlər və kafirlər)* **öz aralarında onların işi barəsində mübahisə edirdilər.** *(Bəziləri:)* **"Onların üstündə bir bina tikin. Rəbbi onların halını daha yaxşı bilir!"– dedilər.** *(Mübahisədə)* **üstün gələnlər isə: "Onların** *(məzarı)* **üstündə mütləq bir məscid tikəcəyik!"– dedilər.**

*(Bəziləri:)* **"***(Onlar)* **üçdür, dördüncüsü köpəkləridir!"– deyəcəklər.** *(Digərləri isə)* **"***(Onlar)* **beşdir, altıncısı köpəkləridir!"– deyəcəklər.** *(Bununla da)* **qeyb haqqında təxmini fikir yürüdəcəklər.** *(Bəziləri də:)* **"Onlar yeddidir, səkkizincisi köpəkləridir!"– deyəcəklər.**

**De: "Onların sayını Rəbbim daha yaxşı bilir.** *(İnsanlardan)* **bunu bilən çox azdır!" Mağara əhli barədə açıq mübahisə et** *(ayələrə əsaslan)* **və** *(kitab əhlinin)* **heç birindən onlar barədə bir şey soruşma!**

**Heç bir şey barəsində: "Mən onu sabah edəcəyəm!"– demə! Ancaq: "Əgər Allah istəsə!"** *("İnşaAllah"- de!)* **Unutduğun zaman Rəbbini yada salıb: "Ola bilsin ki, Rəbbim məni haqqa bundan daha yaxın olan bir yola yönəltsin"– de.**

**Onlar mağarada üç yüz il, üstəlik doqquz** *(il də)* **qaldılar.**

**De: "Onların nə qədər qaldıqlarını Allah daha yaxşı bilir. Göylərin və yerin qeybi ancaq Ona məxsusdur. O, necə gözəl görür, necə də yaxşı eşidir! Onların Ondan başqa heç bir himayədarı yoxdur. O, Öz mülkünə heç kəsi şərik etməz!"** (Kəhf surəsi, 9-26)

Tarixçilərin yekdil fikrinə görə, möminləri izləyən və onları mağarada gizlənməyə vadar edən qəddar hökmdar Roma imperatoru Desiy idi. Desiyin izlədiyi gənclər öz xalqını dəfələrlə xəbərdar etmişdilər ki, dinlərini satmasın və Allahın əmrlərindən yayınmasınlar. İnsanların bu haqq çağırışa biganəliyi, dözülməz zülm, imperatorun təqibləri və ölüm qorxusu gəncləri bu yerləri tərk etməyə vadar etdi. Mağara sakinlərinin dəyanəti, cəsarəti, mərdliyi və qeyrəti həm İslam, həm də xristian mənbələrində dəfələrlə təriflənib.

Tarixi sənədlərin də təsdiq etdiyi kimi, Allahın İsa peyğəmbərlə göndərdiyi və hələ insanların təhrif etmədiyi vəhyə inanan möminləri qırmağa yönəlmiş təzyiq və zorakılıq siyasəti əksər Roma imperatorları tərəfindən həyata keçirilirdi.

Belə ki, Şimal-Qərbi Anadolunun (hazırkı Türkiyənin ərazisi) romalı canişini Pliniyin (69-113-cü illər) imperator Trayana məktubunda "imperatorun heykəlinə səcdə etməkdən imtina etdiklərinə görə cəzalandırılan messianlar" (Isa peyğəmbərin davamçıları) haqqında qeyd var. Bu məktub bizim günlərimizə çatan və İsa peyğəmbərin davamçılarına təzyiq göstərilməsini təsdiqləyən vacib orijinal sənədlərdən biridir. Məhz Allahdan üz döndərməyin və "qüdrətli imperatora" itaət etməyin tələb olunduğu bir şəraitdə gənclər bu əmri yerinə yetirməkdən imtina etdilər və belə dedilər:

**... "Rəbbimiz göylərin və yerin Rəbbidir. Biz heç vaxt Ondan başqa tanrıya ibadət etməyəcəyik. Əks halda olduqca böyük bir** *(küfr)* **danışmış olarıq!"– deyərkən onların qəlbinə qüvvət verdik.** *(Cavanlardan biri o birilərinə) (dedi:)* **"Bizim bu xalqımız Allahdan başqa tanrılar qəbul etdi. Bəs nə üçün onlar buna aid** *(bütlərə dair)* **bir dəlil gətirmədilər? Allaha qarşı yalan uydurandan daha zalım kim ola bilər?!** (Kəhf surəsi, 14-15)

İlk xristianların gizləndiyi mağaranın yerinə dair bir neçə versiya mövcuddur. Ən çox iki şəhər ehtimal olunur - Efes və Tarsus (ikisi də hazırkı Türkiyənin ərazisində yerləşir). Praktiki olaraq bütün xristian mənbələri Efesi qeyd edir. Bir sıra müsəlman ilahiyyatçıları və Quran təfsirçiləri də xristianların fikri ilə razıdır. Digərləri isə bu yerin Efes deyil, Tarsus olduğunu sübut etməyə çalışır. Biz bu kitabda hər iki variantı nəzərdən keçirəcəyik. Müqəddəs vəhylərin bütün tədqiqatçıları və təfsirçiləri, o cümlədən xristian təfsirçiləri hadisənin 250-ci ildə Roma imperatoru Desiyin (və ya Desiananın) hakimiyyəti dövründə baş verməsi fikri ilə razılaşır.

Eynilə Neron kimi Desiy də xristianlara qarşı öz müdhiş qəddarlığı ilə "məşhurlaşdı". O, özünün qısamüddətli hakimiyyəti dövründə imperiyanın bütün sakinlərini Roma tanrılarına qurban kəsməyə məcbur edən qərar verdi, bundan əlavə, insanlar qurban kəsmələri faktını təsdiqləyən yazılı sənəd götürməli və onu səlahiyyətli şəxslərə təqdim etməli idilər. Bu qanunun yerinə yetirilməməsi ölümlə cəzalandırılırdı. Xristan mənbələrinin dəlillərinə görə, erkən xristianların böyük hissəsi daim "şəhərdən şəhərə" köçür və ya mağaralarda yaxud gizli yerlərdə gizlənirdilər ki, bütpərəst ayinindən xilas olsunlar. Çox güman ki, mağaranın sakinləri İsa peyğəmbərin məhz bu davamçılarının mömin nümayəndələri idilər.

Yeri gəlmişkən, burada bəzi xristian və müsəlman tarixçilərinin və

təfsirçilərinin rəvayət şəklində söylədiyi əhəmiyyətli bir faktı qeyd etmək gərəkdir. Bu epizod zaman keçdikcə hədis söyləyənlər tərəfindən təhrif edilərək mifik elementlərlə və hər cür uydurmalarla zənginləşdirilmiş və əfsanəyə çevrilmişdir. Amma bu, yenə də tarixi fakt olaraq qalır.

## ƏSHABİ - KƏHF EFESDƏ YERLƏŞİR?

Mağara sakinlərinin olduqları yerə dair müxtəlif mənbələr bir çox adlar gətirirlər. Olsun ki, bunun əsas səbəbi insanların cəsarətli və qorxmaz insanların olduqları tarixi yerə yaxınlıq hiss etmək arzusunda, həmçinin güman ki, bu yerlərdəki mağaraların böyük oxşarlığındadır. Bu yerlərin hər birində mağara ibadətgahlarının (səcdə yerlərinin) olması buna aşkar sübutdur.

Məlum olduğu kimi, Efes xristianların xüsusi rəğbət bəslədiyi şəhərdir. Çünki rəvayətlərə görə, burada İsa peyğəmbərin anası Məryəmin yaşadığı ev yerləşir. Onun yaşayış evi güman edilən yer hazırda kilsəyə çevrilib. Xristianların hesab etdikləri kimi, mağara sakinləri olan ilk xristianlar məhz onlar üçün müqəddəs olan bu yerlərdə yaşayıblar. Bir sıra xristian mənbələri bu faktı olduqca qətiyyətlə iddia edir.



**Efesdə Əshabi-Kəhfə aid olduğuna inanılan mağaranın içi.**

Bu problemi nəzərdən keçirən ən qədim mənbə Suriya rahibi Yames Saruc-un (452-ci ildə anadan olub) əsərləridir. Tanınmış ingilis tarixçisi Eduard Gibbon "Roma imperiyasının süqutu və dağılması tarixi" ("The Decline and Fall of the Roman Emrire") kitabında onun məlumatlarından istifadə edib. Rahibin qeydlərinə görə, yeddi gənc xristianı izləyən və onları

mağarada gizlənməyə vadar edən hökmdar Roma imperiyasına 249-cu ildən 251-ci ilə qədər hakimlik etmiş imperator Desiy idi. Bu dövr İsa peyğəmbərin davamçılarına yönəlmiş amansız və irihəcmli təqiblərlə tanınır. Müsəlman alimlərinin fikrincə, hadisələrin baş verdiyi yer "Afesus" və ya "Afesos"dur. E. Gibbonun versiyasına görə, bütün hadisələr "Efesos"da, yəni Roma imperiyasının Anadolunun qərb sahillərində yerləşən iri liman şəhərlərindən birində cərəyan edirdi. Bu şəhərin xarabalıqları bu gün "antik Efes şəhəri" kimi tanınır.

Hakimiyyəti dövrü "gənclərin uzun yuxudan ayılması" dövrü ilə üst-üstə düşən imperatorun adı Tezusiy idi.

E. Gibbon isə iddia edir ki, bu, II Feodosi olub, ancaq bu imperator 408-450-ci illərdə hakimiyyətdə idi, bu zaman isə Roma imperiyası xristianlığı artıq qəbul etmişdi.

Bir sıra Quran təfsirlərində aşağıdakı ayəyə aydınlıq gətirilərkən deyilir ki, mağaraya giriş şimaldan idi və buna görə də içəri işıq düşmürdü. Hətta mağaranın yanından keçənlər də onun içində baş verənləri görmürdü. Quran bizə xəbər verir:

**Günəşin doğduğu zaman onların mağarasının sağ tərəfinə yönəldiyini, batdığı zaman isə onlardan uzaqlaşıb sol tərəfə addadığını, onların da mağaranın içində geniş bir yerdə yerləşdiklərini görərdin. Bu, Allahın dəlillərindəndir...** (Kəhf surəsi, 17)

Türk arxeoloqu Musa Baran da "Efes" əsərində bu şəhərin məhz ətrafını gənclərin gizləndiyi yer kimi qeyd edir və əlavə edir:

"250-ci ildə Efesdə yaşayan yeddi gənc bütpərəstlikdən imtina edir və xristianlığı qəbul edir. Gənclər qorunmaq üçün sığınacaq yeri axtararkən Selion (Pion) dağının şərq yamacında mağara aşkar edirlər. Bunu görən Roma əsgərləri mağaraya girişi hörürlər". (Musa Baran, Efes, pp.23-24.)

Bu gün Efesin bu xarabalıqlarının üstündə xeyli dini tikinti ucaldığı məlumdur. 1926-cı ildə bu rayonda Avstriya arxeologiya institutunun əməkdaşlarının apardığı qazıntılardan sonra məlum oldu ki, Selion (Pion) dağının şərq yamacında aşkar edilmiş xarabalıqlar V əsrin ortalarında (II Feodosinin hakimiyyəti dövründə) mağara sakinlərinin əzablı həyatının xatirəsinə tikilmiş tikintilərə aiddir. (L.Massignon, Opera Minora, v.III, pp.104 -108.)



Efesdəki mağaranın xarici görünüşü

# TARSUS: MAĞARA BURADA YERLƏŞİRDİMİ?

İlk xristianların gizləndiyi güman edilən daha bir yer Tarsus şəhərinin ətrafıdır. Həqiqətən, Tarsusdan şimal-qərbdə yerləşən Encilus (və ya Bencilus) dağında Qurani-Kərimdə təsvir edilənləri xatırladan mağara var.

Əksər müsəlman ilahiyyatçıları Tarsus versiyasını qızğın müdafiə edirlər. Quranın tanınmış təfsirçilərindən biri olan Ət-Təbəri "Tarixül-Ümam" əsərində işarə edir ki, gənclərin gizləndiyi mağara Tarsusun yaxınlığındakı Bencilus dağında yerləşirdi. (At-Tabari, Tarikh-al Umam.)

Quranın tanınmış təfsirçisi Muhəmməd Əmin öz növbəsində bu dağı "Pencilus" adlandıraraq ondan bəhs edir. Onun fikrincə, "Pencilus" kimi səslənən söz bəzən "Encilus" kimi deyilir, o, coğrafi yerin tələffüzündəki fərqi isə "b" hərfinin sadəcə sözdən düşməsinə səbəb olan "tarixi eroziya" ilə izah edir. (Muhammed Emin.)

Daha bir tanınmış ilahiyyatçı və Quran tədqiqatçısı Fəhruddin Ər-Razi əsərlərinin birində yazır: "Bu yeri Efsus adlandırsalar da burada Tarsus nəzərdə tutulur, çünki Efsus Tarsusun başqa adıdır". (Fakhruddin ar-Razi.)

Bundan əlavə, Qazi əl-Beyzəvi, Ən-Nəsam, Əl-Cəlaleyn, Ət-Tibyan, Elmalılı, Ömər Nəsuhi Bilmən kimi alimlərin təfsirlərində hadisənin məhz Tarsusda baş verdiyi bildirilir. Həmçinin bütün adıçəkilən müfəssirlər (Quran təfsirçiləri) belə nəticəyə gəliblər ki, mağaraya giriş şimaldan olub. Belə qənaətin əsası isə "Kəhf" surəsinin 17-ci ayəsindəki sözlərə arxalanır:

**Günəşin doğduğu zaman onların mağarasının sağ tərəfinə yönəldiyini, batdığı zaman isə onlardan uzaqlaşıb sol tərəfə addadığını, onların da mağaranın içində geniş bir yerdə yerləşdiklərini görərdin...** (Kəhf surəsi, 17)

(From the commentaries of Qadi al-Baidawi, an-Nasafi, al-Jalalayn and at-Tibyan, also Elmalili, Nasuhi Bilmen.)





Tarsusda Əshabi Kəhfə aid olduğuna inanılan mağara

Məşhur mağaranın yerləşməsi məsələsi Osmanlı imperiyası dövründə də diqqəti cəlb edirdi və hələ keçən əsrdə bir sıra tədqiqatlar aparılmışdı.

Türkiyə Dövlət Arxivinin Osmanlı dövrü sənədləri bölümündə indiyə qədər bu mağaranın axtarışı ilə bağlı sənədlər saxlanılır. Məsələn, Tarsus şəhər administrasiyasının Bencalus dağındakı mağaranın təmizliyinə və

qorunmasına cavabdeh olan insanlara ləvazimat verilməsi xahişi ilə Osmanlı dövləti xəzinə idarəsinin rəisinə ünvanlanmış məktubuna və bəyanatına cavabda bildirilir ki, dövlət xəzinəsinin tələb olunan ləvazimatı ödəməsi üçün bunu müəyyən etmək gərəkdir ki, xristin gənclərin gizləndiyi mağaranın yeri həqiqətənmi budur.

Osmanlı Məclisinin (Osmanlı imperiyasının bir növ parlament hakimiyyətinin orqanı) göstərişi ilə aparılmış tarixi tədqiqatların birinin yazılı yekununda belə deyilir: "Adana əyalətində Tarsus şəhərindən iki saatlıq şimal yolundakı dağda mağara yerləşir. Mağaraya giriş Quranda deyildiyi kimi, şimal tərəfdəndir". (Ahmet Akgündüz, Tarsus ve Tarihi ve Ashab-i Kehf. (Ahmet Akgündüz, Tarsus and History and the Companions of the Cave.))

Əshabi-Kəhfin şəxsiyyəti, həmçinin onların yaşayış yeri və zamanı tarixçiləri və bir çox düşünən insanları həqiqəti aydınlaşdırmağa həmişə sövq edib. Bu gün buna dair xeyli şərhlər deyilmişdir, ancaq buna baxmayaraq, onların heç biri bu epizodla bağlı suala tam cavab vermir. Mömin gənclərin yaşadığı dövr və mağaranın yeri ilə bağlı Quranda qeyd edilmiş əksər suallar hələ cavabsız qalır.

* * *

Allah-Talanın qanunlarını inkar etmək, Ona şərik qoşmaq, təkəbbür və lovğalıq göstərmək, qanunsuz olaraq özgə əmlakının mənimsəmək, sələmçilik və pozğunluq - bunlar bizim Quran ayələrindən öyrəndiyimiz və bu kitabda təqdim etdiyimiz xalqların günahlarının yalnız bəziləri idi. Onlar möminləri təqib edir və onlara qəddarcasına zülm edirdilər, Allah-Təalanın qanunlarına tabe olan insanları qırmaq üçün hər şeyi edirdilər.

Sözsüz, Quran keçmiş xalqlardan bizə tarix dərsi vermək üçün bəhs edir. Quran bildirir ki, peyğəmbərlər və onların xalqları haqda hekayələr bizə yalnız ibrət üçün misal gətirilir. Sələflərin ölümü əcdadların nəsillərini haqq yoluna çıxarmalıdır:

**Onlardan əvvəl öz məskənlərində gəzib dolaşan neçə-neçə nəsilləri məhv etməyimiz, onlara dərs olmadımı? Həqiqətən, bunda ağıl sahibləri üçün ibrətlər vardır.** (Taha surəsi, 128)

Bunu dərs kimi qəbul edib bizi həyatda əhatə edən hər şeyin baş verdiyinə diqqətlə nəzər yetirdikdə qəti əmin olursan ki, bizim cəmiyyətin böyük hissəsi məhv olan keçmiş xalqlardan heç də az olmayan dərin mənəvi tənəzzül və əxlaqsızlıq vəziyyətindədir.

Cəmiyyətimizin İslamın və imanın əsas prinsiplərini bilən hər hansı bir nümayəndəsinin sizə kimi xatırlatdığı haqda düşünün, ancaq bu, onları pozğunluqdan və əxlaqsızlıqdan iyrəndirmir, bundan əlavə, onlar inananlara və müsəlmanlara açıq-aşkar lağ edirlər.

Lut xalqı haqda hekayəni xatırlayırsınızmı, onların xeyli "qohumları" indi də bizim ətrafımızdadır. Öz iyrənc orgiyalarını açıq-aşkar və qorxu-hürküsüz həyata keçirən homoseksuallar pozğunluqlarında elə dərinə gedirlər ki, onlara hətta sodomlu və Gomorralı "qardaşları" belə qibtə edərdilər. Onlar dünyanın çoxmilyonlu meqapolislərində yaşayaraq hətta Pompeyin əxlaqsızlıqlarını da ötüb keçiblər...

Haqqında Qurani-Kərimdə bəhs edilən bütün xalqlar layiqli cəzalarını aldılar. Allahın cəzası onları hər yerdə tutdu, tufanlar süpürdü, qəfildən hər bir tərəfdən gələn sular batırdı, vulkanlardan axan daşlarla və lava külləri ilə əzab içində yandılar. Müasir sivilizasiyanı da eyni şey gözləmirmi? Biz həddimizi aşmamışıqmı? İnsanlar Allah-Təalanın dərslərini nəhayət ki, dərk edib öz alçaq əməllərinə nə vaxt son qoyacaqlar?

Bəşəriyyət bir dəqiqə də belə unutmamalıdır ki, Allah hər insanı və ya bütöv cəmiyyəti cəzalandırmaqda sərbəstdir, bizim günahlarımızın çəkisini yalnız O, bilir. Biz onları insanlardan gizlədə bilərik. Allahdan isə heç nəyi gizli saxlamaq olmaz, hər an həyatımızın hər yaxşı və ya pis addımı bizim salnaməmizə qeyd edilir. Allah-Təala bu dünyada rahatlıq içində yaşamağı təmin edər, ancaq günahlarımıza görə bizə o biri dünyada qəzəblənə bilər. Çünki Quran deyir:

**"Biz hər birini öz günahına görə yaxaladıq. Onlardan kimisinin üstünə qasırğa ilə birgə daşlar göndərdik, kimisini qorxunc səs yaxaladı, kimisini yerə batırdıq, kimisini də suya qərq etdik. Allah onlara zülm etmirdi, onlar ancaq əməlləri ilə özləri özlərinə zülm edirdilər.”**

(Ənkəbut surəsi, 40)

Qurani-Kərim bizə Musa peyğəmbərin dövründə yaşayan, Allaha inanan, ancaq firon ailəsindən olduğu üçün bu inamını gizlətməyə məcbur olan daha bir möminin tarixindən bəhs edir. O, öz xalqına bu sözlərlə müraciət etdi:

**"Mömin kişi dedi: "Ey xalqım! Mən sizə, əlbir dəstələrin başına gəlmiş dəhşətli günün bənzərinin sizin də başınıza gəlməsindən qorxuram. Nuhun qövmünə, Ad və Səmud tayfalarına və onlardan sonra gələnlərə bənzər bəlanın gəlməsindən qorxuram. Allah bəndələrə zülm olunmasını istəməz. Ey xalqım! Mən başınıza gələcək fəryad qoparacağınız gündən qorxuram. Geriyə dönüb qaçacağınız gün sizi Allahdan qoruyan tapılmaz. Allahın azğınlığa saldığı kimsəyə isə yol göstərən olmaz.”** (Mumin surəsi, 30-33)

Allahın bütün elçiləri eynilə bu mömin kimi insanları Qiyamət Günü və etdiklərinə görə cəzalandırılacaqları haqda xəbərdar edirdilər. Hər bir peyğəmbərin həyatı yolunu azmış insanların ruhunun nicatına, Allahın göndərdiyi həqiqətlərin onların daşa dönmüş ürəklərinə çatdırılmasına həsr olunmuşdu. Ancaq hər dəfə xalqlar peyğəmbərləri rədd edir, onları yalançılıqda, acgözlükdə və tamahkarlıqda günahlandırırdılar: onlardan heç kəs verilən xəbərlər üzərində düşünməyin əziyyətini çəkmədi, heç kəs səhvini etiraf etmədi, cəmiyyətlər cəhalətlə dolu qəddar və təkəbbürlü həyat tərzlərini davam etdirdilər. Bundan əlavə, bəzi xalqlar möminləri və tövbə etmiş tayfadaşlarını qırmağa və sürgün etməyə çalışırdılar. Nə qədər kədərli olsa da onlara göndərilən peyğəmbərlərin və onların ardınca gedənlərin sözlərini və əməllərini düşünməyi qəbul edən möminlərin sayı həmişə az olub, ancaq yalnız onlar və peyğəmbərlər Allah-Təalanın qəzəbindən və əsl cəzadan yaxa qurtarmışlar.

Bu kitabda təsvir edilən hadisələr neçə min illər bundan əvvəl baş versə və bəşəriyyət xeyli dəyişikliklərə, siyasi, sosial, texnoloji və mədəni həyat

tərzinin yeniləşməsinə məruz qalsa da hər bir insanın şüurunda və bütövlükdə dinsizliklə, təkəbbürlə və Uca Yaradana naşükürlüklə öyünməyə davam edən cəmiyyətdə çox az şey dəyişib. Məgər bizi əhatə edən insanların arasında özlərini məhv edilmiş xalqların nümayəndələri kimi aparanlar yoxdurmu? Çoxsaylı yalançılar və kələkbazlar sürüsü "tərəzilərində qaydaya nəzarət etməyən" səmudlulara bənzəyir. Və ya Lut xalqından heç də geri qalmayan, öz iyrənc və alçaq ehtiraslarını qorxu-hürküsüz və utanmadan geniş yayaraq bunu comərdlik dərəcəsinə ucaldan və "azad seçim hüququ" olan "homoseksuallar cəmiyyəti". Və yaxud Allahın bəxş etdiyi nemətlərə səbalılar kimi naşükür və laqeyd yanaşan insan kütləsi. Onlar da sanki İrəm sakinləri kimi rifahlarını özləri "yaratdıqlarına" görə Uca Yaradanın onlara bəxş etdiyi var-dövlət üçün şükr etməyi və həmd oxumağı vacib bilmirlər. Və ya Allahın əmrlərinə tabe olmağı və ona ehtiramı cəhalət və mədəniyyətsizlik sayan və əsl inananların hisslərini təhqir edən Nuh xalqı kimi. Nəhayət, sosial ədalətə laqeyd yanaşan, zəiflərə və köməksizlərə zülm edən ədrəmilər kimi. Obrazlarını indi təsvir etdiyimiz insan növləri bu gün məgər azdırmı... Onlar toplumların böyük hissəsini təşkil edirlər.

Bu əlamətlər çox şeydən danışır...

Bir şeyi unutmaq olmaz: bəşəriyyət nə cür dəyişikliklərə məruz qalsa da, öz inkişafında nə cür yüksəkliklərə nail olsa da nə texnologiyanın, nə də iqtisadi rifahın heç bir mənası yoxdur. Onlar pozğun və allahsız xalqları Allah-Təalanın cəzasından qorumaqda gücsüzdür. Bu həqiqət Quranda belə xatırladılır:

**"Məgər onlar yer üzündə gəzib dolaşaraq özlərindən öncəkilərin aqibətini görmədilərmi? Onlar bunlardan da güclü idilər. Onlar torpağı şumlayır, yer üzünü bunlardan daha çox abadlaşdırırdılar. Elçiləri onlara açıq-aydın möcüzələr gətirirdilər. Onlara Allah zülm etmirdi. Onlar özləri özlərinə zülm etmişdilər"** (Rum surəsi, 9)

# QƏDİM SİVİLİZASİYALARIN HEYRANEDİCİ İZLƏRİ

Avqust Komte (August Comte), Herbet Spenser (Herbert Spencer), Levis Henri Morqan (Lewis Henry Morgan) kimi ideoloqlar tərəfindən müxtəlif dövrlərdə irəli sürülən və daha sonra Çarlz Darvinin nəzəriyyəsi ilə birləşdirilən sosial mədəni təkamül anlayışındakı yanlışlıqlara uyğun olaraq bütün cəmiyyətlər ibtidaidən aliyə doğru bir təkamül keçirir. 19-cu əsrin sonlarında inkişaf edən və Birinci Dünya Müharibəsi dövründə təsirini getdikcə artıran bu yanlışlıq sonrakı illərdə irqçilik, müstəmləkəçilik, yevgenika kimi bir çox qəddar cərəyan və təcrübələrin guya elmi əsasını təşkil edirdi. Dünyanın müxtəlif bölgələrində yaşayan fərqli mədəniyyətlərə, rənglərə, fiziki xüsusiyyətlərə sahib olan müxtəlif xalqlar bu cür elmdən kənar anlayışı irəli sürərək insanlıqdan kənar davranışlara səbəb oldular.



**Dövrümüzdə çox üstün mədəniyyətlərlə yanaşı, olduqca geridə qalmış mədəniyyətlər də varlığını davam etdirir. Lakin cəmiyyətlərin sahib olduqları texnoloji imkanların geniş və ya məhdud olması bir cəmiyyətin digərindən zehni və fiziki olaraq daha inkişaf etmiş və ya geridə qalmış bir növ olduğunu göstərmir.**

Adam Ferqüson (Adam Ferguson), Con Millar (John Millar), Adam Smit (Adam Smith) kimi yazıçı və mütəfəkkirlər bütün cəmiyyətlərin dörd əsas mərhələdən keçərək guya təkamülə uğradıqlarını irəli sürürdülər. Bu dörd mərhələ bunlardır: ovçuluq və yığıcılıq, heyvandarlıq, əkinçilik və son olaraq ticarət. Təkamülçü iddialara görə, guya meymunabənzərlikdən yeni çıxmış ibtidai insan düzəltdiyi sadə alətlərlə sadəcə ov edir və ətrafındakı bitkiləri, meyvələri və s. yığırdı. Zehni və bacarığı daha da inkişaf etdikcə heyvanları əhliləşdirməyə başladı, daha sonra isə əkinçiliklə məşğul ola biləcək qədər inkişaf etdi və ən son olaraq da ticarətlə məşğul ola biləcək zəka və bacarığa sahib oldu. Lakin arxeologiya və antropologiya kimi elm sahələrində baş verən irəliləyişlər və əldə edilən tapıntılar "mədəni və ictimai təkamül hekayəsinin" əsas iddiasının əsassız olduğunu göstərdi. Bütün bunlar materialistlərin insanı ağılsız heyvanlardan təkmilləşmiş bir canlı kimi

göstərmə və fəlsəfi olaraq inandıqları bu nağılı elmdə yerləşdirmə cəhdindən başqa bir şey deyil.

Aydındır ki, insanların ovçuluq və ya əkinçiliklə güzəranlarını təmin etməsi onların zehni bacarıq baxımından daha inkişaf etmiş və yaxud geridə qalmış olmalarını göstərmir. Yəni ovçuluqla öz yaşayışlarını təmin edən bir cəmiyyət daha geridə qaldığı üçün və zehni cəhətdən guya meymunlara daha yaxın olduğu üçün ovçuluqla məşğul olmur. Yaxud da bir cəmiyyətin əkinçiliklə məşğul olması onun meymunabənzərlikdən uzaqlaşdığı demək deyil. Cəmiyyətlərin məşğuliyyətləri insanların bir başqa canlıdan törədiyini göstərən ünsürlər də deyil. Bu məşğuliyyətlər guya təkamül müddəti ərzində zehni və bacarıq baxımından daha inkişaf etmiş fərdləri meydana gətirmir, yəni bir canlı növünü meydana gətirmir. Hazırkı dövrdə də texnologiya baxımından geridə qalmış bir çox qəbilə yalnız ovçuluq və yığıcılıqla məşğul olur. Lakin bu vəziyyət onların daha az insana bənzədiklərini göstərmir. Eyni vəziyyət bundan yüz minlərlə il əvvəl yaşayan insanlar üçün olduğu kimi, bundan on minlərlə il sonra yaşayacaq insanlar üçün də qüvvədədir. Nə keçmişdə yaşayanlar ibtidai insanlardır, nə də gələcəkdə yaşayanlar daha inkişaf etmiş fərqli bir növ olacaq.



**İnsanların ovçuluqla və ya əkinçiliklə dolanışıqlarını təmin etmələri onların zehni bacarıqları baxımından daha inkişaf etmiş və ya geridə qalmış olduqlarını göstərmir. Yəni ovçuluqla dolanan bir cəmiyyət daha geri və zehni olaraq meymunlara daha yaxın olduğu üçün ovçuluqla məşğul olmur. Ya da bir cəmiyyətin əkinçiliklə məşğul olması onun meymun xüsusiyyətlərindən uzaqlaşdığı demək deyil.**



**Bu şəkildəki ibtidai varlıqlar heç vaxt yaşamayıblar. Bu və bunabənzər rəsimlər darvinist alimlərin xəyal məhsulu təsvirləridir. Heç bir elmi dəyərləri yoxdur.**

Yaşayış formasından asılı olaraq, cəmiyyətlərə bir təkamüli mədəniyyət tarixi yazmaq qeyri-elmi bir nəzər nöqtəsidir. Bu nəzər nöqtəsi arxeoloji qazıntılarda əldə edilən bəzi tapıntıların darvinist elm adamlarının fikrinə görə materialist ideologiyasının ön mühakiməsinə uyğun olaraq şərh edilməsinə əsaslanır. Bu batil inanca görə, daş alətlərdən istifadə edən

insanlar xırıltılı səslər çıxaran, dizləri və beli bükülmüş şəkildə yeriyən heyvanabənzər davranışlı meymun adamlar olduqları fərz edilirdi. Halbuki, tapılan heç bir tapıntı onlardan istifadə edənin zehni bacarığının həcminə dair dəqiq dəlil ola bilməz. Daha əvvəl də qeyd etdiyimiz kimi, bu, bir təxəyyül məhsuludur; məsələn, günümüzdən yüz min il sonra bu dövrə aid müxtəlif şəkillərdəki müasir sənət əsərləri tapılmış olsa və gələcəkdəki insanların günümüzə aid başqa heç bir tapıntıları olmasa, böyük ethimalla bu əsərlərə əsaslanaraq müasir dövrümüzün insanları və malik olduqları texnoloji imkanlar haqqında çox fərqli şərhlər verə bilər və təsvirlər canlandıra bilərlər.

Xalqların təkamülü iddiası, göründüyü kimi, heç bir elmi dəlilə əsaslanmayan xəyali hekayələrdən ibarətdir. Və bu hekayələrin əsası insanın guya meymunabənzər bir zehnə sahib olduğu yanlışlığını müdafiə edən elmdən kənar nəzər nöqtəsidir. Harvard Universitetinin təkamülçü antropoloqu Uilyam Hovels (William Howells) bu həqiqətlə bağlı belə etiraf etmişdir:

*Təkamül nəzəriyyəsi orqanizmlə bağlı olmayan, lakin davranışla bağlı olan digər sualları doğurur. Bunlar fəlsəfə ilə bağlıdır, [elmi] həqiqətləri tapmaq çox çətindir. Davranış kəllə sümüyü kimi daşlaşa bilməz və ya daşdan alətlər kimi günümüzə qədər gəlib çatmaz və belə olan halda, bizdə [qədim dövrlərdə] nələrin baş verdiyinə dair çox az işarələr var, ehtimalların sınaqdan keçirilməsi isə imkansızdır.*

(William Howells, Getting Here: The Story of Human Evolution, Compass Press, Washington, DC.,1993, sf 229)

Bundan başqa, son vaxtlarda sosial alimlərin böyük əksəriyyəti təkamülçü baxışın yanlışlıqlarını qəbul edir. Bu elm adamları sosial təkamül nəzəriyyəsinin aşağıdakı məqamlarda elmlə ziddiyyət təşkil etdiyini deyirlər:

Nəzəriyyə etnik ayrı-seçkiliklə dərindən bağlıdır; müxtəlif xalqlar haqqında qərəzli qiymətləndirmə edir, məsələn, yalnız qərb xalqlarını mədəniləşmiş olaraq dəyərləndirir.

Bütün cəmiyyətlərin eyni yolu, yaxud da eyni vasitələrdən istifadə edərək inkişaf etdiyini və eyni hədəflərə sahib olduğunu irəli sürürlər.

Cəmiyyəti materialist baxışla dəyərləndirirlər.

Tapıntılarla əksər hallarda ziddiyyət təşkil edir. İbtidai şəraitdə yaşayan bir çox xalq müasir olaraq qəbul edilən müxtəlif xalqlardan daha mədəni dəyərlərə sahibdir, yəni sülhsevər və bərabərlik tərəfdarıdır. Bir çoxu qidalanma şərtləri ilə əlaqədar çox sağlam və güclüdür.

## KEÇMİŞİN İZLƏRİ TƏKAMÜLÜN YALAN OLDUĞUNU GÖSTƏRİR

Keçmiş sivilizasiyalara dair tapıntılar təkamül nəzəriyyəsinin "ibtidaidən aliyə doğru" iddialarını təsirsiz edir. Tarixin axınını tədqiq etdiyimiz zaman qarşımıza çıxan həqiqət insanın hər zaman günümüzün insanı ilə eyni zəkaya və yaradıcılığa sahib olmuş olmasıdır. Yüz minlərlə il əvvəl yaşamış insanların ərsəyə gətirdiyi əsərlər və qoyduqları izlər təkamülçü iddialardan tamamilə fərqli mənalar daşıyır. Bu izləri tədqiq etdiyimiz zaman görürük ki,



keçmişdə yaşayan insanlar da zəka və bacarıqlarına uyğun olaraq yaşadıqları hər bir dövrdə yeni kəşflər etmiş, ehtiyaclarını qarşılamış və öz mədəniyyətlərini qurmuşlar.

Göndərilən elçilər çevrəsində yaşadığı millətin böyük dəyişikliklər vasitəsi ilə inkişafına və tərəqqisinə səbəb olmuşlar. Peyğəmbərlər Allahın ilhamı ilə dərin elmi biliyə sahib olmuşlar. Məsələn, Hz. Nuh gəmiqayırma texnologiyasını bilirdi. Quranda olan məlumata əsasən, Hz. Nuhun inşa etdiyi gəminin buxarlı bir gəmi olduğu aydın olur. (Doğrusunu Allah bilir.) Bu məlumata ayədə göstərilən **"...təndir qaynadığı zaman"** ifadəsi ilə diqqət çəkilir.

**Nəhayət, əmrimiz gəldiyi və təndir qaynadığı zaman Biz** *(Nuha)* **dedik: "***(Heyvanların)* **hər növündən bir cüt, barələrində söz keçmiş kəslər istisna olmaqla, öz ailəni və bir də iman gətirənləri gəmiyə mindir." Onunla birlikdə az adam iman gətirmişdi.** (Hud surəsi, 40)

Təndir hal-hazırda müxtəlif regionlarda istifadə edilən bir cür ocaqdır. Qaynamaq (ərəbcə fəvrat feli) fışqıraraq qaynamaq mənasını verir. Hz. Nuhun gəmisinin təndirin qaynaması ilə, yəni ocağın (qazanın) qaynaması ilə hərəkət etməyə hazır vəziyyətə gəldiyi aydın olur. Bundan başqa, Elmalılı Hamdi Yazırın təfsirində Hz. Nuhun gəmisinin **"qazanla işləyən, yəni bir cür buxarlı gəmi"** olduğu izah edilir:

*Tennur: lüğətdə elə bir qapalı ocaq, sobadır ki, türk dilində "təndir" kimi istifadə edilir. Qaynamaq (fəvrat) kəliməsi də güclü və şiddətlə qaynamaq və fışqırmaq deməkdir... Yəni gəmi yelkənli bir gəmi deyil, qazanla işləyən bir paroxodun xüsusiyyətlərinə malikdir.*

Hz. Süleyman dövründə də bu müqəddəs peyğəmbər vəsiləsi ilə elm, incəsənət və texnologiyada çox əhəmiyyətli irəliləyişlər olmuşdur. Məsələn, Quranda Hz. Süleyman dövründə təyyarə kimi sürətli nəqliyyat vasitələrindən istifadəyə işarə edilir:

**Səhər bir aylıq məsafəni qət edən, günortadan sonra** *(yenə)* **bir aylıq məsafəni qət edən küləyi də Süleymana** *(ram etdik)***...** (Səba surəsi, 12)

Bu ayəti-kərimdə olduqca uzaq məsafələrə Hz. Süleyman dövründə qısa müddətə çata bildiyinə diqqət çəkilir. Bu, günümüzdəki təyyarə texnologiyasına bənzəyən bir texnologiyadan istifadə etməklə küləklə hərəkət edən vasitələrə işarət edir. (Doğrusunu Allah bilir.) Bundan başqa,

Quranda Hz. Süleyman dövründə qəsrlər, heykəllər, hovuzlara bənzər çanaqlar və yerindən tərpənməyən qazanlar düzəldildiyi xəbər verilir.

*(Cinlər)* **onun üçün istədiyi qəsrlər, heykəllər, hovuzlara bənzər çanaqlar və yerindən tərpənməyən nəhəng qazanlar düzəldirdilər. Ey Davud nəsli! şükür edin! Qullarımdan şükür edəni azdır.** (Səba surəsi, 13)

Bu ayədən Hz. Süleymanın çox mütərəqqi inşaat və memarlıq texnologiyasından istifadə etdiyi başa düşülür.

Quran ayəsində hz. Süleymanın əmrində bina ustaları və dalğıcların olduğu bildirilmişdir:

**Həmçinin şeytanlardan olan müxtəlif bənnaları, dalğıcları**

(Sad surəsi, 37)

Dalğıc cinlərin Hz. Süleymanın əmrində olması o dövrdə dəniz altındakı sərvətlərdən istifadə edilməsinə işarədir. Dəniz altındakı neft, qızıl kimi qiymətli mədənlərin çıxarılaraq işlənilməsi və insanlar üçün faydalı və yararlı şəklə salınması üçün çox yüksək texnologiya lazımdır. Hz. Süleymanın dövründə bu texnologiyadan istifadə edildiyinə diqqət yönəldilir.

Başqa bir Quran ayəsində isə hz. Süleymanın mis qaynağını sel kimi istifadə etdiyi xəbər verilmişdir (Səba surəsi, 12). Ərimiş misin istifadəsi ilə Hz. Süleyman dövründə elektrik enerjisindən istifadə edilən yüksək texnologiyanın varlığına işarə edilir. Bildiyimiz kimi, mis cərəyan və temperaturu yaxşı keçirən metallardan biridir və bu xassəsinə görə, elektrik sənayesinin əsasını təşkil edir. Ayədə verilən "sel kimi axıtdıq" ifadəsi ilə güman olunur ki, Hz. Süleyman dövründə yüksək miqdarda istehsal olunan elektrikin texnologiyada bir çox sahələrdə istifadə edildiyinə diqqət çəkilir. (Doğrusunu Allah bilir.)

Quran surələrində hz. Davudun da dəmiri işlətdiyi və zireh sənətini çox yaxşı bildiyi məlum olur. Ayələrdə bu cür xəbər verilir:

**...Biz dəmiri onun üçün yumşaltdıq.** *(Sonra buyurduq:)* **"Geniş zirehlər düzəlt və halqaları toxuduqda ölçüyə riayət et. Yaxşı işlər görün! Mən, həqiqətən də, sizin nə etdiyinizi görürəm."** (Səba surəsi, 10-11)

Quranda Hz. Zülqərneynin iki dağ arasına dövrün cəmiyyəti tərəfindən aşıla bilməsi və yarılması mümkün olmayan bir sədd inşa etdiyi xəbər verilir. Ayədə bildirildiyinə görə, Hz. Zülqərneyn bu səddi inşa edərkən dəmir kütlələrdən və əridilmiş misdən istifadə etmişdir:

**"Mənə dəmir parçaları gətirin!" Nəhayət, dağın iki yamacı arasını** *(dəmir parçaları ilə)* **doldurduqda: "Körükləyin!"– dedi.** *(Dəmir)* **közərən kimi: "Gətirin mənə, onun üstünə ərimiş mis töküm!"– dedi.** (Kəhf surəsi, 96)

Bu məlumat Hz. Zülqərneynin dəmirbeton texnologiyasından faydalandığına işarə edir. İnşaat sektorunda istifadə edilən ən möhkəm material dəmirdir. Binaların və ya körpü, bənd kimi memarlıq əsərlərinin möhkəmliyinin artırılması üçün mütləq dəmirdən istifadə edilməlidir. Ayədən belə aydın olur ki, Hz. Zülqərneyn də dəmirləri uc-uca gətirmiş və üzərinə tökülən material ilə möhkəm bir dəmir-beton struktur inşa etmişdir. (Doğrusunu Allah bilir.)

Mərkəzi Amerikanın qədim sivilizasiyalarının yazılarında isə bəyaz

geyimdə, hündürboy, saqqallı bir şəxsdən bəhs edilir. Bu yazılarda qısa bir müddət ərzində tək İlah inancının yayıldığı və incəsənət və elmdə ani bir inkişafın meydana gəldiyi bildirilir.

Qədim Misir cəmiyyətinə Hz. Yaqub, Hz. Yusuf, Hz. Musa, Hz. Harun kimi bir çox peyğəmbər göndərilmişdir. Misir mədəniyyətinin incəsənət və elmdə müəyyən dövrlərdə yaşadığı sürətli inkişafa bu elçilərin və onlara inanan insanların böyük təsiri olmuş ola bilər.

Quranı və Peyğəmbərimizin (s) sünnəsinə riayət edən müsəlman alimlər də astronomiya, riyaziyyat, həndəsə, tibb kimi elmi sahələrdə çox əhəmiyyətli kəşflər həyata keçirmişlər. Bu məlumatların vəsiləsi ilə elmdə və ictimai həyatda böyük dəyişikliklər və çox əhəmiyyətli irəliləyişlər olmuşdur. Bu müsəlman elm adamları və tədqiqatlarından bəziləri belədir:

**Əbdüllətif əl-Bağdadi** anatomiyaya aid tədqiqatları ilə tanınır. Alt çənə və döş sümüyü kimi orqanizmdəki bir çox sümüyün anatomiyası haqqında keçmişdə buraxılmış səhvləri düzəltmişdir. Bağdadinin "Əl-ifadə vəl-etibar" adlı əsəri 1788-ci ildə tərtib edilərək latın, alman və fransız dillərinə tərcümə edilmişdir. "Makalatün fil-havas" adlı əsəri isə beş duyğu orqanının tədqiqindən bəhs edir.

**İbn Sina** bir çox xəstəliklərin müalicə üsullarını açıqlamışdır. Ən məşhur əsəri olan "Əl-qanun fit-tibb" ərəbcə yazılmış və 12-ci əsrdə latın dilinə tərcümə edilərək Avropa universitetlərində 17-ci əsrə qədər əsas dərslik kimi qəbul edilmiş və oxunmuşdur. "Əl-qanun fit-Tibb"də bəhs olunan tibbi biliklərin böyük əksəriyyəti bu gün belə öz aktuallığını qoruyub saxlamışdır.

**Zəkəriyyə Qəzvini** Aristoteldən bəri davam edən beyin və ürəklə bağlı bir çox səhv fikriləri darmadağın etmişdir. Ürək və beyinlə bağlı məlumatları bu gün bizdə olan məlumatlara olduqca yaxındır.

Zəkəriyyə Qəzvini, Həmdullah Müstəvli əl-Qəzvini (1281-1350) və İbnün-Nəfisin anatomiyaya aid tədqiqatları müasir tibb elminin əsasını formalaşdırmışdır.

Əli bin İsanın üç cildlik göz xəstəliklərinə dair yazdığı "Təzkirətül-kəhhalin fil-ayn və əmraziha" adlı əsərinin birinci cildi tamamilə gözün anatomiyasına həsr edilərək çox dəyərli məlumatları əks etdirir. Bu əsər daha sonralar latın və alman dillərinə tərcümə edilmişdir.

**Biruni** Qalileydən 600 il əvvəl dünyanın dövr etdiyini sübut etmiş, Nyutondan 700 il əvvəl yer kürəsinin səthini hesablamışdır.

**Əli Quşçu** ayın fazaları haqqında əhəmiyyəti böyük olan tədqiqatlar aparmış, mövzu ilə əlaqədar bir kitab çıxarmışdı. Ay haqqındakı tədqiqatları özündən sonrakı dövrlərdə yaşayanlar üçün istiqamət vermişdir.

**Sabit Bin Kurra** Nyutondan əsrlər əvvəl diferensial hesabı kəşf etmişdir.

**Bəttaninin** apardığı astronomik müşahidələrin doğruluğu özündən sonrakı alimləri heyran qoymuşdur. 533 ulduzu müşahidə etmiş, Günəşin Yerdən ən uzaq olduğu məsafəni düzgün şəkildə hesablamışdır. Triqonometriya haqqında apardığı tədqiqatlar və hesablamalarla riyaziyyat sahəsində öncüllərdən olmuşdur.

**Əbul Vəfa** isə triqonometriyaya sekans və kosekans terminlərini qazandırmışdır.

**Xarəzmi** ilk cəbr kitabını yazmışdır.

**Məğribi** "Tühfətül-ada" adlı kitabında üçbucaq, dördbucaq, dairə və digər həndəsi fiqurların səthinin ölçülərini tapmaq üçün metodlar göstərmişdir.

**İbni-Heysəm** optik elmin qurucusudur. Rocer Bakon və Kepler onun əsərlərindən faydalanmış, Qaliley də onun əsərlərindən faydalanaraq teleskopu kəşf etmişdir.

**Kindi** isə Eynşteyndən 1100 il əvvəl nisbi fizika və nisbilik nəzəriyyəsini ortaya atmışdır.

**Paster**'dən təxminən 400 il əvvəl yaşayan **Ağşəmsəddin** mikrobları ilk olaraq tanıdan italyan həkimi Frakastorodan təxminən 100 il əvvəl mikrobların varlığından bəhs etmişdir.

**Əli bin Abbas əl-Məcusi** 10-cu əsrdə yazdığı "Kamil əs-Sina`a ət-Tibbiyyə" kitabı ilə tibb elminin öncülü olmuş, əsəri bir çox xəstəliyin müalicəsində əsas istinad mənbəyi kimi qəbul edilmişdir.

**İbni Cəssar** cüzamın səbəb və müalicə üsullarını izah etmişdir.

Burada sadəcə bir neçəsinə yer verilən müsəlman alimləri Quranı və Peyğəmbərimizin (s) yolunu izləyərək müasir elmin təməlini təşkil edəcək kəşflər etmişlər.

Göründüyü kimi, tarixdə bir çox millət göndərilən elçilər vasitəsi ilə incəsənət, tibb, texnologiya və elm sahələrində inkişafı təmin etmişlər. Peyğəmbərlərə itaət etməklə, bu mübarək insanların təşviq və tövsiyələri ilə peyğəmbərlərdən öyrəndikləri məlumatları təkmilləşdirmiş və bunları sonrakı nəsillərə də ötürmüşlər. Bundan başqa, tarix boyu vaxtaşırı haqq dindən uzaqlaşaraq batil inancları gücləndirən cəmiyyətlər belə, mötəbər elçilərin təbliğləri ilə yenidən tək İlah inancına dönmüşlər.

Keçmiş dövrlərə aid tapıntılara bu cür ön mühakimə etmədən baxıldıqda insanlıq tarixinin düzgün və aydın şəkildə başa düşülməsi mümkün olur.

Bundan başqa, daha öncə də bildirdiyimiz kimi, hazırkı dövrdə olduğu kimi, tarixin, demək olar ki, hər dövründə inkişaf etmiş və geridə qalan sivilizasiyalar eyni dövr içərisində mövcud olmuşlar. Necə ki, günümüzdə bir tərəfdə kosmos texnologiyası mövcud olduğu halda, digər tərəfdə dünyanın müxtəlif yerlərində insanlar ibtidai şəraitdə öz həyatlarına davam edirsə, keçmişdə də bir tərəfdə möhtəşəm Misir sivilizasiyası var ikən, digər tərəfdə olduqca geridə qalmış mədəniyyətlərə sahib olan cəmiyyətlər mövcud olmuşdur. Son dərəcə mükəmməl şəhərləri inşa edən, mütərəqqi texnologiyaya sahib olmaları qoyduqları izlərdən aydın olan Mayyalar Veneranın orbitini hesablayıb, Yupiterin peyklərini kəşf edərkən, eyni dövrdə Avropanın bir çox yerlərində insanlar dünyanın Günəş sisteminin mərkəzində olduğuna inanırdılar. Misirlilər müvəffəqiyyətlə beyin əməliyyatları apararkən dünyanın başqa yerlərində insanlar xəstəliklərin guya pis ruhların təsiri ilə əmələ gəldiyini hesab edirdilər. Şumerlər hüquq

sistemi, ədəbiyyat, incəsənət anlayışları, astronomiya aid bilikləri ilə Mesopotamiyada köklü bir mədəniyyət qurarkən dünyanın bir başqa yerində hələ yazıdan istifadə etməyən cəmiyyətlər var idi. Bir sözlə, necə ki, günümüzdə sadəcə inkişaf etmiş sivilizasiyalar yaşamırsa, keçmiş də sadəcə geridə qalmış sivilizasiyaların var olduğu bir dövr deyildi.

Kitabın buraya qədər olan hissələrində tarixin fərqli dövrlərinə aid dəlilləri və bundan yüz minlərlə və yaxud on minlərlə il əvvəl yaşamış insanların mədəniyyətlərinin örnəklərini araşdırdıq. Daha yaxın dövrlərə baxdığımızda isə yenə insanın hər zaman insan olduğu həqiqətinin dəlillərindən biri ilə qarşılaşırıq. Qarşımızda guya meymunluqdan yenicə qurtulmuş ibtidai insanlar deyil, minlərlə ildən bəri davam edən bir sivilizasiyanın övladları olan mədəni insanlar vardır.

20-ci əsrdə inkişaf edən texnologiya vasitəsi ilə arxeoloji araşdırmalar xeyli sürətlənmiş və bu sürətlə birlikdə bəşər tarixinin əsl üzünə aid əhəmiyyətli dəlillər torpağın altından bir-bir toplanmağa başlamışdır. Beləliklə, minlərlə il əvvəl Misirdə, Mərkəzi Amerikada, Mesopotamiyada və digər bölgələrdə yaşanan həyatın bir çox tərəfdən günümüzlə paralellik ifadə etdiyi ortaya çıxmışdır.

## BƏŞƏR TARİXİNİN HEYRANEDİCİ ƏSƏRLƏRİ: MEQALİTLƏR

Meqalit böyük daş bloklardan ibarət olan əsərlərə verilən addır. Bu əsərlər müxtəlif məqsədlərlə inşa edilmişdir. Bəşər tarixinə baxdıqda keçmişdən günümüzə qədər bir çox meqalitin qaldığı müşahidə edilir. Bu əsərlərin ən heyrətamiz xüsusiyyətlərindən biri bəzilərinin bir tondan daha ağır olan daş blokların adıçəkilən əsərlərin inşasında necə istifadə edilmələridir. Bu nəhəng daşlar hansı yolla tikinti sahəsinə gətirilmiş, hansı texnikadan istifadə edilərək qaldırılmışdır? Həmin dövrün insanları bunları necə üst-üstə qoyaraq bu əsərləri inşa etmişlər? Ümumilikdə, daşların uzaq məsafədən daşınması ilə inşa edilən meqalitlər bir növ inşaat və mühəndislik möcüzəsi kimi dəyərləndirilir. Bu cür əsərləri meydana gətirən insanların olduqca mütərəqqi bir texnologiyaya sahib olmaları açıq görünür.

Bu əsərlərin meydana gətirilməsi üçün, əvvəlcə, onlar planlaşdırılmış olmalı idi, bu planın da tikintidə işləyəcək bütün insanlara düzgün və dəqiqliklə bildirilməsi zəruridir. Plan qurularkən, əsərin haraya inşa ediləcəyini göstərən texniki çertyojlar çəkilməlidir. Bundan əlavə, həmin texniki çertyojlardakı hesablamalar xətasız olmalıdır, belə ki, hesablamada ən kiçik bir xəta əsərin inşasını imkansız hala gətirə bilərdi. Bütün bunlarla bərabər, inşaatın həyata keçirilə bilməsi üçün təşkilatçılıq da qüsursuz olmalıdır. İşçilərin uyğunlaşdırılmasının təmin edilməsi, ehtiyaclarının ödənməsi (nahar, istirahət və s.) inşaatın lazım olduğu kimi getməsi və nəticələnməsi üçün mühüm ünsürlərdir.

Bu əsərləri inşa edən insanların təxmin ediləndən də artıq biliyə və texnologiyaya sahib olduqları açıq-aydın görünür. Kitabın əvvəlki səhifələrində də qeyd etdiyimiz kimi, sivilizasiya hər zaman tərəqqi etmir,

bəzən tənəzzül edir. Hətta bir çox hallarda, mütərəqqi və tənəzzül etmiş sivilizasiyalar eyni tarixi dövrdə dünyanın müxtəlif yerlərində eyni anda mövcud ola bilər.



**Piramidaların hansı inşaat texnikası istifadə edilərək tikildikləri bugün də tam olaraq bilinmir. Dövrümüzün texnologiyası ilə insanların istehsalını başa düşməkdə çətinlik çəkdiyi bu nəhəng əsərləri bundan təxminən 2500 il əvvəl insanlar böyük bacarıqla inşa ediblər.**

Sözügedən meqalitləri inşa edən insanların da mütərəqqi bir sivilizasiyada yaşamış olmaları -arxeoloji və tarixi faktların əks etdirdiyi kimi- olduqca yüksək ehtimaldır. Belə ki, ərsəyə gətirdikləri əsərlər mürəkkəb riyazi və həndəsi biliklərə sahib olduqlarını, dərəli-təpəli ərazilərdə sabit nöqtələri ölçərək onların üzərində əsərlər tikə biləcək texniki biliyə yiyələndiklərini, coğrafi mövqeləri müəyyən etmək üçün cihazlardan (kompas kimi) istifadə etdiklərini, lazım olduğu halda, kilometrlərlə uzaq məsafələrdən inşaat üçün lazım olan alətləri daşıya bildiklərini göstərir. Bütün bunları bir neçə ibtidai alətlərdən və sadəcə insan qüvvəsindən istifadə edərək yerinə yetirmədikləri açıq-aydındır. Bundan başqa, günümüzün tədqiqatçıları və arxeoloqları tərəfindən aparılan bir çox sınaq təkamül nəzəriyyəsinin irəli sürdüyü şərtlərlə bu əsərlərin inşa edilməsinin qeyri-mümkün olduğunu müəyyən etmişdir. Təkamülçülərin irəli sürdüyü xəyali

şəraiti hazırkı dövrdə düzəldərək bunlara oxşar əsərlər inşa etməyə cəhd edən tədqiqatçılar böyük uğursuzluğa düçar olublar. Qeyd edilən tədqiqatçılar nəinki buna bənzər quruluşları inşa etmək, hətta bu tikilinin əsas tikinti materialı olan daşları bir yerdən digərinə daşımaqda çətinliklərlə qarşılaşmışlar. Bu da bir daha göstərir ki, bu dövrün insanları təkamülçülərin irəli sürdüyü kimi geridə qalmış bir həyat tərzi keçirmirdilər. İncəsənətdən zövq alır, memarlığa əsaslı şəkildə yiyələnməklə inşaat texnologiyalarından ustalıqla istifadə edir, astronomik araşdırmalar aparırdılar.




Keçmişdəki sivilizasiyalardan geriyə çox zaman daş blokların, kütləvi daş tikililərin və yaxud da yüz minlərlə il əvvəldən sadəcə bir sıra daş alətlərin qalmış olması isə son dərəcə adi bir hadisədir. Bir sıra daş abidələrə və əsərlərə baxaraq dövrün insanlarının sadəcə daşdan istifadə edərək işləyə bilən, texnologiyadan uzaq və geridə qalmış sivilizasiyalar olduğunu irəli sürmək isə inandırıcı deyil. Bunlar müxtəlif doqmaların təsiri ilə edilən şərh olmaqdan başqa heç bir elmi məna ifadə etmir. Bundan əvvəl də vurğuladığımız və bir çox qabaqcıl təkamülçülər tərəfindən də qəbul edildiyi kimi, əldə edilən tapıntılar icma həyatı barədə bizə dəqiq məlumat verə bilməz. Lakin bu tapıntılar ön mühakimələrin mənfi təsirindən qurtularaq dəyərləndirilərsə, həqiqətə daha yaxın şərhlər edilə bilər. Yüz minlərlə il əvvələ aid bir cəmiyyətdən geriyə onlar taxtadan olan möhtəşəm villalarda yaşasa da, bünövrəsi şüşə məmulatından olan villalar tiksələr də, həmçinin ən gözəl daxili dekorasiya materiallarından istifadə etsələr də, bunlardan yüz min illər boyu məruz qalacağı külək, yağış, zəlzələ, sellərlə aşınma nəticəsində dəqiq dəlillər qalmayacağı açıq-aydındır. Taxtanın, şüşənin, misin, tuncun və digər müxtəlif materialların təbii şəraitdə aşınması ən çox 100-200 il çəkir. Yəni aradan keçən 150-200 il sonra evinizin beton və ya taxtadan olan divarı aşınıb gedəcək, içindəkilərdən isə geriyə çox az iz qalacaq. Zəlzələyə, selə və ya fırtınaya məruz qaldığı zaman isə geriyə qalan izlər tamamilə yox olacaq. Geriyə ancaq aşınması çox daha uzun müddət sürən blok daş parçalar qalacaq. Bununla da kiçik parçalara ayrılan daşdan olan əşyalar ovxalanıb gedəcəkdir. Dolayısilə, ancaq bu daş bloklara əsaslanaraq həmin dövrdə yaşamış cəmiyyətlərin gündəlik həyatı, sosial münasibəti, inancı, zövqü və incəsənət haqqında anlayışı barədə şərhlərin yəqinlik ifadə etməsi qeyri-mümkündür.

Halbuki, təkamülçülər mümkün olmayanı etməyə çalışır, bəzi tapıntıları

xəyali şərhlərlə bəzəyib müxtəlif ssenarilər icad edirlər. Həqiqətlərdən yayındıraraq hekayələr qoşmaq, əslində, bəzi təkamülçülər tərəfindən də birbaşa tənqid edilən haldır. Hətta belə yanaşmaya belə bir ad da verilib: "Elə -belə yazılmış nağıllar". Bu ad təkamülçü paleontoloq Stefan Cey Quldun ingilis yazıçısı və şair Redyard Kiplinq (1865-1936) tərəfindən 1902-ci ildə nəşr edilən eyni adlı kitabına tənqidindən irəli gəlir. Kiplinq uşaqlar üçün hekayələrini topladığı bu kitabında canlıların müxtəlif orqanlarının necə əmələ gəldiyinə dair xəyal gücünə əsaslanan təkamül nağılları yazmışdır. Məsələn, Kiplinq filin xortumu barədə hekayəsində bunları yazırdı:

*Günlərin bir günü, bir fil balası anasına lazımı qədər yaxın yerdə deyildi. Çayın parlaq suyunu gördü və maraqla çayın kənarına gəldi və ətrafa boylanmağa başladı. Suyun üzərində çıxıntı kimi bir qabarıqlıq var idi və bunun nə olduğunu bilmək istəyən fil balası daha yaxından baxmaq üçün suya tərəf əyildi. Birdən birə o çıxıntı yuxarı tullandı və balaca filin burnundan tutdu. [O, timsah idi.] ... Sonra fil balası oturaraq özünü arxaya çəkməyə başladı, çəkdi, çəkdi və burnu getdikcə uzanmağa başladı. Və timsah çırpınaraq sahilə doğru çıxdı və quyruğunun zərbəsi ilə suyu süd kimi ağappaq etdi; timsah da [filin burnunu] çəkdi, çəkdi və çəkməyə davam etdi.*

(http://www.boop.org/jan/justso/elephant.htm)




Rudyard Kiplingin Just So Stories
"Belə hekayələr" adlı kitabı.

Quld da bəzi təkamülçü alimləri ədəbiyyatı yuxarıdakı bu hekayə ilə bir xeyli bənzərlik təşkil edən və heç nəyin sübutu olmayan elə-belə yazılmış nağıllarla doldurmaqla tənqid etmişdir. Eyni vəziyyət təkamül nəzəriyyəsi ilə xalqların inkişafını açıqlamağa çalışanlar üçün də təsirlidir. Kiplinqin nağılları kimi, təkamülçü sosial alimlərin elə-belə nağılları da sadəcə xəyal gücünə əsaslanır. Və guya əvvəllər sadəcə bir sıra xırıltılı səslər çıxaran, işlənməmiş daş alətlərdən istifadə edə bilən, mağaralarda yaşayan, ovçuluq

və yığıcılıqla məşğul olaraq həyatlarını təmin edən, sonra isə inkişaf etdikcə əkinçiliklə məşğul olmağa başlayan, bundan sonra isə digər mədənlərdən istifadə etməyə başlayan, daha sonra getdikcə zehni inkişaf edərək cəmiyyətlər şəklində yaşayıb sosial münasibətlər quran insanlıq tarixi də suyun kənarında xortumu uzanan filin nağılından fərqli deyil.

Bu elmdən kənar olan anlayışı Quld belə ifadə edir:

*Elm adamları bu nağılların uydurma olduğunu bilir; təəssüflər olsun ki, bunlar peşəkar ədəbiyyatda artıqlaması ilə ciddi və real qəbul edilirdilər. Daha sonralar bunlar [elmi] həqiqətlər halına salınır, milli ədəbiyyata daxil olurlar.* (Stephen Jay Gould, Introduction, in Björn Kurtén, Dance of the Tiger: A Novel of the Ice Age (New York: Random House, 1980), XVII-XVIII)

Quld bundan başqa, bu hekayələrin təkamül nəzəriyyəsi baxımından heç bir şeyin dəlili olmadığını bu sözləri ilə qeyd etmişdir:

*Təkamülə uğrayan təbiət tarixinin elə-belə yazılmış hekayələr ənənəsindəki bu nağıllar heç nəyin dəlili, sübutu deyil. Lakin bunların səbəb olduğu ağırlıq və buna bənzər bir çox vəziyyət mənim mərhələli inkişaf fikrimə (gradualism) olan inamımı uzun müddət əvvəl öldürdü. Daha yaradıcı zehniyyət bunları xilas edə bilər, lakin sadəcə mahir abstrakt fəlsəfi görüşlərlə xilas edilən anlayışlar mənim üçün çox şeyi ifadə etmir.*
(Gould S.J., "The Return of the Hopeful Monster," in "The Panda's Thumb: More Reflections in Natural History," [1980], Penguin: London , 1990, reprint, sf.158)

## ORTA ŞƏRQİN ƏN QƏDİM BƏZƏK ƏŞYALARI TAPILDI

30 sentyabr 2006-cı il tarixində nəşr olunan bir xəbərdə Suriyanın şimalında tədqiqatlar aparan bir qrup arxeoloqun e.ə. 9-cu əsrdən qalmış daş və sümükdən hazırlanmış əşyalar tapdığı açıqlandı. (Associated Press, 30 Eylül 2006) Həmçinin, bu əşyaların tapıldığı binanın divarlarında qırmızı, qara və ağ rənglər istifadə edilərək çəkilmiş həndəsi fiqurlara və bir buğa rəsminə də rast gəlinmişdi.

Bu xəbər "təbiətin təkamülü" hekayəsində olduğu kimi, bəşər tarixinin də təkamül mərhələsi keçirdiyini iddia edən alimlərin yanıldıqlarını sübut etmək üçün çox əhəmiyyət daşıyır. Darvinizmə kor-koranə sadiq qalan bəzi tarixçilər "Daş dövrü" adlandırdıqları bir dövrün olduğunu iddia edirlər. Bu dövrdə yaşayan insanların ən ibtidai üsullarla qab-qacaq düzəldib, heyvan saxlayaraq və bitki toplayaraq sivilizasiyadan uzaq yaşadıqlarını fərz edirlər. Halbuki qazıntılarda əldə edilən antik tapıntılar təkamülçü ön mühakimələr bir kənara buraxılaraq ağılla qiymətləndirildikdə ortaya başqa bir mənzərə çıxır. E.ə. 9-cu əsrdə daş və sümüyün oyularaq müxtəlif alətlər və bəzək əşyaları düzəldilməsi, rəngli boyalar istifadə edilərək divarlara rəsimlər çəkilməsi bu dövrdə heç də təkamülçülərin iddia etdikləri kimi ibtidai bir həyatın yaşanmadığını sübut edir. Bu insanlar da bizim kimi qablarda yemək yeyirdi, yatmağa çarpayıları, içində yaşadıqları evləri, yemək bişirdikləri mətbəxləri, ehtiyaclarını ödəyəcək hər cür vəsaitləri, heyvanları var idi.

O dövrdə yaşayan insanlar da bizim kimi sənətdən, estetikadan zövq alan, şəxsi zövqləri, inancları, ailə həyatları olan insanlardı. Evlərinin divarlarına

çəkdikləri rəsimlər də sənətdən, estetikadan xoşlandıqlarını, hətta bunu şəxsi zövqə çevirdiklərini göstərir. Düzəltdikləri sənət əsərləri adilikdən çox uzaq, əmək verilmiş əsərlərdir. Bu insanlar divarın üstünə kömür parçası ilə adi rəsim çəkmək yerinə, təbii maddələri bir-birinə qarışdıraraq əldə etdikləri müxtəlif rənglərdəki boyaları istifadə edərək minlərlə il solmadan qala bilən rəngli rəsimlər çəkmişdilər. Həmin dövrdə daş və ya sümük yontularaq düzəldilən əşyalar da mükəmməl bir əmək məhsuludur. Burada bir məqama da diqqət çəkmək lazımdır: Təkamülçü tarix anlayışında o dövrlərdə metal vasitə olmadığı, daş dövründəki insanların sərt və kəskin uclu çaxmaq daşı istifadə etdikləri iddia edilir. Halbuki qazıntılarda əldə edilən nümunələrdəki mükəmməlikdə bir əmək məhsulu ancaq metal vasitə istifadə edilərək hazırlana bilər. Daşı daşa sürtərək yemək qabı düzəlmək və ya sümüyü daşla yontaraq mükəmməl ölçülü, hamar bəzək əşyası əldə etmək mümkün deyil.


INTERNATIONAL Herald Tribune | AFRICA & MIDDLE EAST

HOME | BUSINESS | TECH | TRAVEL | STYLE | CULTURE | HEALTH/SCI | SPORTS

TODAY IN AFRICA & MIDDLE EAST
The painful cost of a small victory for white farmers in Zimbabwe
Iraq bomber targets Gaza airstrike protest
Ghana vote peaceful in presidential runoff

LANGUAGE TOOLS

YOUR VIEWS
Send a letter to the editor

ARTICLE TOOLS
PRINT PAGE
EMAIL ARTICLE
Save to Del.icio.us

Neolithic temple discovered in northern Syria

The Associated Press

Published: September 30, 2006

DAMASCUS, Syria A team of Syrian and French archaeologists has discovered a Neolithic temple in northern Syria that could be the oldest in the Middle East, Syria's official news agency reported Saturday.

The discovery of the temple, dating to the ninth century B.C. during the Neolithic Age, was made by a joint Syrian-French archaeological team at Jaadet al-Maghara on the Euphrates river some 450 kilometers (270 miles) north of Damascus, the agency said. It did not say when the temple was unearthed.

Objects made of stone and bone instruments were found in the large temple, whose walls bore geometric designs and a drawing of a bull's head in vivid red, black and white colors — further evidence that bulls where worshipped in that period, the report said.

The agency quoted Syria's minister of culture, Riyad Neisan Agha, as saying that "this is a unique discovery that could lead to re-reading culture."

(dam-jp-lf)

Məşhur arxeoloq Klaus Schmidt daşı daşla yontaraq bir nəticə əldə edilməyəcəyini sübut edən bir tədqiqat aparmışdır. Bu tədqiqatda bir qrup işçi əllərində daşlarla e.ə. 9000-ci ildə yaşamış daş ustaları kimi sərt bir yerdə deşik açmağa cəhd ediblər. Daşı oymağa çalışan işçilərin 2 saat boyu dayanmadan davam edən çalışmaları nəticəsində ortaya sadəcə naməlum bir xət çıxmışdır. Bu sadə təcrübə belə açıq sübut edir ki, qədim dövrün insanları təkamülçü alimlərin irəli sürdüyü kimi, ibtidai şərtlərdə yaşamırdılar, əksinə



inkişaf etmiş imkanlara sahib idilər.

Təkamülçü alimlər **ibtidai bir insan modelini** insanların zehinlərinə yerləşdirməyə çalışırlar. Halbuki qaranlıq bir mağarada heyvan dərisinə bürünərək oturan, danışmaq bacarığı olmayan yarı insan, yarı meymun canlılar yalnız təkamülçülərin xəyal məhsuludur. Təkamülçülərin iddia etdikləri növdə heyvan-insan arası canlılar **tarixdə heç vaxt mövcud olmayıblar. "Tarixin təkamülü"**deyə **bir şey heç vaxt reallaşmayıb.** Allah insanı ağlı və ruhu ilə üstün bir varlıq olaraq yaratmışdır. Arxeoloji qazıntılar da bizə tarixin hər dövründə insanın ağıl və ruha sahib olduğunu və bu xüsusiyyətlərin nəticəsi olaraq da yaşadığı dövrün şərtləri içərisində həmişə mədəni həyat tərzi keçirdiklərini göstərir.

## NYUQREYNC (NEWGRANGE)

E.ə. 3200 il əvvəl inşa edilməsi qəbul edilən Nyuqreync Dublin yaxınlığında bir məqbərədir. Hələ Misir sivilizasiyasının meydana gəlmədiyi, Babil və ya Krit mədəniyyətinin yaranmadığı dövrdə Nyuqreync var idi. Bu dövrdə dünyanın məşhur daş tikililərindən biri olan Stounhenc (Stonehenge) hələ inşa edilməmişdi. Aparılan araşdırmalar Nyuqreyncin sadəcə bir məzar olmadığını göstərir, bu məqbərəni inşa edən insanların çox şaxəli astronomiya biliklərə yiyələndiklərini göstərir. Nyuqreyncin astronomik xüsusiyyətlərinə keçməzdən əvvəl, inşaat xüsusiyyətləri barədə danışmaq faydalı olardı. Belə ki, Nyuqreynci inşa edən insanların vurğulanması gərəkən mühəndislik texnikaları və memarlığa aid bilikləri mövcud idi.

Nyuqreync bir çox arxeoloq tərəfindən texniki möcüzə olaraq adlandırılır. Məsələn, tikilinin üzərindəki qübbə başdan sona mühəndislik



**Dünyanın ən məşhur daş abidələrindən biri olan Newgrange 93 meqalitdən ibarətdir.**

xariqəsidir. Alt hissəsi ağır, üst hissələri yüngül olan monolit daşlar üst-üstə elə qoyulmuşdur ki, hər üstdə yerləşən daş altdakından bir az çölə çıxıntı əmələ gətirir. Bu şəkildə tikilinin üstündə mərkəz hissəsində 6 metr yüksəkliyində 6 bucaqlı bir baca meydana gəlmişdir. Bacanın sonunda istənilən zaman açılıb bağlanan bir qapaq daş var.

Bu nəhəng tikilinin, mühəndisliyi mükəmməl bilən, hesabı yaxşı bilən, düzgün planlaşdırma bacarığına sahib olan, yük daşınmasını həyata keçirən və praktiki inşaat biliklərindən məharətlə istifadə edən insanlar tərəfindən inşa edildiyi açıq-aşkar görünür. Təkamülçülərin iddialarına görə, belə bir tikilinin necə inşa edilməsi izah edilə bilməz. Belə ki, təkamülçülərin həqiqətdən uzaq şərhlərinə əsasən, həmin dövrün insanları geridə qalmış və ibtidai şəraitə sahibdir. Lakin belə bir nəhəng bir tikilinin ibtidai şərtlərdə, mühəndislik və inşaat bilikləri olmadan insanlar tərəfindən inşa edilmiş olması imkansızdır.



**Şəkildə Newgrangedən bir hissə görünür. Newgrangein tikintisində istifadə olunan daş blokların necə daşındığı, tikintinin hansı texnikalarla hazırlandığı dövrümüzdə hələ tam olaraq anlaşılmamışdır.**

Tikilinin astronomik xüsusiyyətləri də heyrət doğurur. Bu nəhəng məqbərə elə tikilmişdi ki, Gün dönümü günlərində tikilinin içində olduqca heyrətamiz bir işıq oyunu meydana gəlir. Qış gün dönümü vaxtı, yəni ilin ən qısa günündə günəşin doğmasından bir az sonra gün işığı birbaşa Nyuqreyncin məzar otağına düşür. Bundan sonra müxtəlif koridor qapılarına və nəhəng daşlara düşür və işıqlandırmağa davam edir və ən son olaraq arxa divara qədər çatır. Və bu əsnada mükəmməl bir işıq oyunu meydana gəlir. Diqqəti cəlb edən bir hal ondan ibarətdir ki, işıq tikilinin daxilinə koridorlardan deyil, koridor qapısının üstündən üzərində məxsusi olaraq düzəldilmiş dar dəlikdən girir. Yerləşdirilən bütün blok daşlar da işığı əks etdirə biləcək bucaq altındadır. Məhz belə işıq oyununu möhtəşəm edən ünsürlərdən biri də budur.

Dolayısilə, bu nəhəng tikilini inşa edənlərin mühəndislik bilikləri ilə yanaşı, gün dönümlərini və Günəşin hərəkətini hesablayacaq dərəcədə astronomiya elminə sahib olduqları meydana çıxır.

Nyuqreync Britaniyada qədim dövrlərdən geriyə qalan bir çox daş tikilidən sadəcə biridir. Bu tikiliyə baxaraq edilməli şərh sözügedən tikilinin dərin biliklərə sahib olan insanlar tərəfindən mütərəqqi inşaat texnikası və vasitələrdən istifadə edilərək tikilmiş olmasıdır. Dövrün insanlarının necə həyat tərzi keçirdiklərinə dair edilməli şərh isə belə bir tikilini inşa edə biləcək insanların yaşadıqları şəraitin də komfortlu və mütərəqqi ola bilməsidir. Astronomiya bilikləri kosmosu müşahidə edə bilmək texnologiyasına və müşahidələrini düzgün şəkildə başa düşəcək bilik irsinə sahib olduqlarını işarə edir. Kosmosu müşahidə edərək əldə etdikləri nəticələri düzgün izah edə bilən insanların gündəlik həyatları da bu cür biliklərə uyğun olaraq mədəni olmalıdır. Bəlkə də son dərəcə komfortlu evlərdə yaşayan, baxımlı bağları olan, yaxşı xəstəxanalarda müalicə alma imkanına sahib olan, kommersiya fəaliyyəti ilə məşğul olan, incəsənətə, ədəbiyyata əhəmiyyət verən, çox şaxəli mədəni irsə sahib olan bu cəmiyyətdən geriyə sadəcə bu daş tikili qalmışdır. Bunların hamısı arxeoloji tapıntılar və tarixi məlumatlara əsaslanaraq bu daş tikili və bu daş tikilini inşa edənlər haqqında edilə biləcək real şərhlərdir. Lakin təkamülçülər sadəcə materialist qəliblər içərisində düşünməyə vərdiş etdiklərinə görə, ağıla və elmə uyğun bu şərhlərin əvəzinə müəyyən doqmaların məhsulu olan hekayələri danışırlar. Lakin bu hekayələr heç vaxt dəqiq bir həqiqəti ifadə edə bilməz.

## STOUNHENC (STONEHENGE)

Stounhenc dairə şəklində yerləşdirilmiş, böyük daş bloklardan təşkil olunan bir tikilidir. Təqribən 4.5 metr hündürlüyündə, hər biri təqribən 25 ton ağırlığında təxminən 30 ədəd daş blokun bir yerə yığılmasından əmələ gəlmişdir. İngiltərədə yerləşən bu tikili tədqiqatçıların marağına səbəb olmuşdur. Quruluşu və inşaat məqsədi haqqında bir çox nəzəriyyələr irəli sürülmüşdür. Burada vurğulanmalı məsələ həmin nəzəriyyələrin hansının doğru olub - olmaması deyil. Vacib olan bu tikilinin təkamül nəzəriyyəsinin

bəşər tarixini izah etmək üçün irəli sürdüyü iddiaları əsassız edən misallardan biri olmasıdır.



**Stounhenc (Stonehenge) taxta bir binanın təməli olaraq düzəldilmiş ola bilər. Bunun üstündə qurulacaq taxta bir bina küləkdən və fırtınadan təsirlənməz. Binanın sadəcə təməlləri qala bilər. Necə və nə şəkildə tikildiyi hələ də müzakirə edilən Stounhencin alimlər tərəfindən ortaya çıxarılan başqa bir xüsusiyyəti də astronomiya ilə olan əlaqəsidir. Əldə edilən tapıntılar bu tikintini inşa edənlərin mühəndislik məlumatları ilə yanaşı, astronomiya məlumatlarının da olduğunu göstərir.**

Aparılan tədqiqatlar Stounhencin üç inşaat mərhələsində meydana gəldiyini irəli sürürlər. Bir çox qaynağa əsasən, Stounhencin ən qədim dövrü e.ə. 2800 ilinə təsadüf edir. Yəni Stounhencin yaşı 5000 il bundan əvvələ qədər aid edilir. Tarixi qaynaqlar birinci inşaat ərəfəsində ərazidə nəhəng daşlardan kiçik bir dairənin inşa edildiyini və bu dairədən kənarda bir topuq daşı yerləşdirildiyini irəli sürür. Daha sonra nəhəng daşlardan daha bir dairə inşa edilmiş, bundan sonra da dairədə iç hissədə “mavi daş” adlı daş bloklar yerləşdirilmişdir.

Bu tikilinin ən diqqətçəkən tərəflərindən biri burada istifadə edilən mavi daşlardır. Belə ki, Stounhencin yaxınında hər hansı bir mavi daş qaynağı yoxdur. Aparılan araşdırmalar, bu daşların Prescelly dağlarından tikilinin olduğu yerə gətirildiyini irəli sürmüşdür. Burada isə yenə də qeyri-adi halla rastlaşırıq. Belə ki, adı çəkilən mavi daş mənbələri Stounhencdən təqribən 380 km (quru yolu ilə) aralıdadır. Əgər dövrün insanları təkamülçü hekayələrdə izah edildiyi kimi, ibtidai şərtlərdə yaşayan, əllərindəki tək material ağac linklər, ağac kötüyündən düzəldilmiş sallar və daş baltalar olan insanlar olsaydı, tonlarla ağırlığındakı bu daşlar Stounhencin olduğu əraziyə necə gətiriləcəkdi? Məhz bu, təkamülçülərin xəyal məhsulu ssenariləri ilə cavablandırılması mümkün olmayan bir sualdır.

Bir qrup tədqiqatçı həmin dövrün şərtlərini canlandıraraq mavi daşları Stounhencə qədər daşımağa çalışmışlar. Bunun üçün ağac linklərdən istifadə etmişlər, üç sandalı bir-birinə bağlayaraq böyüklüyü eyni olan daşların yerləşəcəyi sal meydana gətirmişlər, uzun taxtalardan (şüvül) istifadə edərək

salı çay boyunca üzü yuxarı daşımağa çalışmışlar, daha sonra da qaba üsullarla hazırlanmış təkərlər üzərində daşları təpəyə doğru çıxarmaq üçün səy göstərmişlər. Lakin bütün bunlar nəticəsiz qaldı. Bu, mavi daşların Stounhencin olduğu yerə necə daşındığını anlaya bilmək üçün həyata keçirilən sınaqlardan sadəcə biridir. Daha bir çox sınaq keçirilmiş və dövrün insanlarının hansı nəqliyyat vasitələrindən istifadə etdiyini anlamağa çalışmışlar. Lakin təkamülçü ön mühakimələri baxımından aparılan bu araşdırmalar nəticə əldə etməkdən həmişə uzaq olublar. Çünki bütün bu sınaqlar Stounhencin inşa edildiyi dövrdə yaşayanların sadəcə daş və ağac kimi işlənməmiş materiallardan istifadə etdikləri və geridə qalmış sivilizasiyalarının mövcud olduğu yanlışlığı əsas götürülərək həyata keçirilir.

Burada bir məsələnin də üstündə durmaq lazımdır. Qeyd edilən sınaqlar aparılarkən gəmi tərsanələrində düzəldilən müxtəlif modellərdən yararlanır, təkmilləşmiş fabriklərdə istehsal edilən burazlardan istifadə edilir, təfsilatlı şəkildə hesablamalar və planlaşdırılma aparılır. Yəni günümüzün texnologiyasının imkanlarından faydalanmışlar. Buna baxmayaraq, nəticə əldə edilə bilmir. Bundan təxminən 5000 il əvvəl yaşayan insanlar isə tonlarla ağırlığındakı bu daşları daşımış, coğrafi mövqelərini hesablayaraq bir dairə şəklində düzmüşlər. Bütün bunları daş baltalar, kötükdən düzəldilmiş sallar, ağacdan inşa edilmiş linklər vasitəsi ilə etmədikləri açıq aydın bilinir. Stounhencə və digər bir çox meqalit, bəlkə də, bizim belə təxmin edə bilməyəcəyimiz bir texnologiyadan istifadə edərək inşa edilmişdir.

## TİUANAKO (TIAHUANACO) ŞƏHƏRİNDƏKİ HEYRƏTAMİZ QALIQLAR

Boliviya ərazisində And dağları üzərində Boliviya ilə Peru arasında dəniz səviyyəsindən təxminən 4 min metr yüksəklikdə yerləşən Tiuanako şəhəri görənləri heyrətə salacaq bir çox tapıntılarla doludur. Bu ərazi Cənubi Amerikanın arxeoloji möcüzələrindən biri olaraq qəbul edilir. Tiuanakoda olan ən heyrətamiz tapıntılardan biri gecə-gündüz bərabərlikləri, fəsilləri, ayın hər saatdakı vəziyyətini və hərəkətlərini göstərən təqvimdir. Bu təqvim adı keçən ərazidə yaşayan insanların çox mütərəqqi sivilizasiyaya sahib olduqlarını göstərən dəlillərdəndir. Tiuanakodakı digər heyrətamiz əsərlər isə bəziləri çəkisi 100 tona çatan daş bloklardan ibarət tikililərdir.

"Reader's Digest" Tiuanako şəhərindəki məqbərələr və daş qalıntıları haqqında *"... Günümüzün ən ixtisaslaşmış mühəndisləri hələ də bu qədər böyük qaya parçalarını kəsərək daşımaqla bir şəhəri abadlaşdıra biləcəklərinə dair suala cavab verə bilmir. Nəhəng bloklar sanki bir metal qəlibdən istifadə edilərək kəsilmiş kimidir..."* şərhini etmişdir.

(Simone Waisbard, in The World's Last Mysteries, (2nd edition) p. 138, Reader's Digest, 1978)

Məsələn, bu şəhərdə divarlar 100 ton ağırlığındakı qumdaşı blokları üzərinə 60 tonluq başqa bloklar qoyularaq inşa edilmişdir. Bu divarların inşa edilməsi üçün böyük ustalıq tələb edən karxanaçılıqdan istifadə edilmişdir. Böyük ölçülərdə olan kvadrat daşlar 10 ton ağırlığındakı daş bloklarda

2.5 metr uzunluğunda dəliklər açılmışdır. Tapıntıların müxtəlif yerlərində 1.8 metr uzunluğunda və yarım metr enində su kanalları var. Bu kanalların ölçüləri hazırkı dövrdə rast gəlinməyən dəqiqlikdədir. Bu insanların, -təkamülçü yalanlarda irəli sürüldüyü kimi -texnoloji imkanlar olmadan- belə əsərləri meydana gətirmiş olmaları mümkün deyil. Belə ki, təkamülçülərin irəli sürdüyü guya ibtidai şəraitdə bu əsərlərdən tək birinin belə meydana gəlməsi üçün bir insanın ömründən daha uzun bir müddət lazımdır. Belə vəziyyətdə Tiuanakonun meydana gəlməsi yüzlərlə il çəkərdi ki, bu da təkamül nəzəriyyəsinin doğru olmadığını göstərir.



**Tiahuanaco şəhərindəki daş abidələrdən bir nümunə. Buradakı tonlarla ağırlıqdakı daşların polad kəndir və krana bənzər tikinti vasitələri istifadə edilmədən daşınması mümkün deyil.**

Tiuanakoda ən diqqəti cəlb edən tikililərdən biri də "Günəş qapısı"dır. Monolit daşdan meydana gətirilən bu əsərin hündürlüyü 3, eni isə 5 metrdir. Ağırlığının təxminən 10 ton olduğu təxmin edilir. Qapının üzəri müxtəlif cizgilərlə bəzədilmişdi. Bu bölgədə yaşayanların Günəş qapısını hansı üsuldan istifadə edərək inşa etdikləri hələ də izah edilə bilməmişdir. Bu cür möhtəşəm qapının inşasında hansı texnologiyadan istifadə edilmişdir?



**Ağırlığının təxminən 10 ton olduğu fərz edilən Günəş qapısının təkamülçülərin iddia etdiyi kimi, texnoloji imkanları olmayan bir cəmiyyət tərəfindən inşa edilməsi qeyri-mümkündür. Bu abidələr təkamülçülərin bəşər tarixinin ibtidaidən aliyə doğru təkamülləşdiyi iddiasını etibarsız edir.**

10 ton ağırlığında qayalar, daş mədənlərindən necə çıxarılmış, haradan, hansı texnika ilə daşınmışlar? Bütün bu işlər görülərkən təkamülçülərin iddia etdiyi kimi, sadə vasitələr və materiallardan istifadə olunmadığı açıq-aşkar görünür. Tiuanakonun salındığı ərazinin coğrafi şəraitini nəzərə alındıqda vəziyyət daha da heyrətamiz olur. Şəhər normal məskunlaşmış ərazilərdən kilometrlərlə uzaqda və təxminən 4000 metr yüksəklikdə qurulmuşdur.

Şəhərin yerləşdiyi yüksək yaylada atmosfer təzyiqinin dəniz səviyyəsindən təxminən yarı-yarıya düşməsi, oksigen faizinin də qat-qat azalması səbəbi ilə insan qüvvəsini tələb edən işləri görmək daha da çətin olur.

Bütün bu materiallar dünyanın bir çox yerlərində olduğu kimi, burada da keçmişdə olduqca inkişaf etmiş sivilizasiyaların yaşadığını, dolayısilə, bəşər tarixinin inkişafa doğru irəlilədiyi iddiasının təsirsiz olduğunu göstərir.

**ON BİR MİN İL ƏVVƏL GÖBƏKLİ TƏPƏDƏ YAŞAYAN DAŞ USTALARI**



**Yan tərəfdə soldakı şəkillərdə görünən daşişləmə sənəti bundan 11 min il əvvəl yaşamış insanlara aiddir. Bu şəkillər, üzərində işləyən ustaların sənət zövqündən xəbər verir. Bu sənətkarlar o dövrdə müxtəlif metal alətlər istifadə edərək bu daşları yontublar. Bir insanın, əlinə iki daş alıb və bu daşları bir-birinə sürtərək şəkillərdə görünən mənzərəni yaratması mümkün deyil. Bu incə sənət əsəri ancaq yeyə, şin, rəndə kimi dövrümüzdə də daşişləmədə istifadə olunan metal alətlərin köməyi ilə hazırlana bilər. Alt tərəfdə, sağdakı şəkil də dövrümüzdə daşişləmə ilə məşğul olan bir şəxsi göstərir. 11 min il əvvəl yaşamış sənətkarlar da ancaq buna bənzər üsullar istifadə edərək bu sənət əsərlərini meydana gətirə bilərdilər.**

## İNKALARIN 20 MİN TON AĞIRLIĞINDAKI NƏHƏNG TİKİNTİ DAŞLARI

Peruda Cuzco şəhəri yaxınlığında tapılan antik Sacsahuamán şəhərində inkalar tərəfindən inşa edilmiş bir divar tapılıb. Divar fərqli böyüklükdə və formalardakı daş blokların istifadə edilməsi ilə tikilib. Bu daş bloklar tonlarla ağırlığındadır və bunlar yan-yana o qədər nizamlı yerləşdirilmişdirlər ki, bu gün də blokların arasına bir parça kağız salmaq mümkün deyil. Özü də divarların heç bir nöqtəsində suvaq və ya sement kimi maddələr yoxdur. Bloklar böyük bir ustalıqla bir araya gətirilmişdir. Bu dərəcə böyük daş blokların necə bir-birlərinə yerləşə biləcək şəkildə kəsilib forma verildikləri dövrümüzün texnologiyası ilə də anlaşılmamışdır.

Tədqiqatlar zamanı çox təəccüblü bir faktda da üzə çıxmışdır: Belə ki divarın inşasında istifadə edilən daş bloklardan biri 5 mərtəbəli bir ev böyüklüyündə idi. Təxminən 20.000 ton ağırlığında olan bu daş bloku Sacsahuamánın qurucularının necə hərəkət etdirməyi bacardıqları hələ də məlum deyil. Dövrümüzün müasir tikinti maşınları ilə belə bir ağırlığı qaldırmaq mümkün deyil. Bugün dünyanın ən böyük kranı belə bu dərəcə ağır bir yükü qaldırmaqda çətinlik çəkəcək. Bu da bizə inkalar dövründə



bugün təxmin edə bilməyəcəyimiz üstün bir texnologiyanın istifadə edilə biləcəyini göstərir.

Memarlıqda nəhəg daşlar istifadə etmək xüsusi bacarıq tələb edir. Bütün bu materiallar dünyanın bir çox yerlərində olduğu kimi, burada da keçmişdə olduqca inkişaf etmiş sivilizasiyaların yaşadığını, beləliklə də, bəşər tarixinin inkişafa doğru irəlilədiyi iddiasının təsirsiz olduğunu göstərir.



**Lüksordakı sıralanmış sütunlar III Amenhotep tərəfindən tikdirilmişdir, Tutanxamon tərəfindən dekorasiya etdirilmişdir.**

On minlərlə ton ağırlığında olan daşlardan istifadə etməklə meydana gələn tikililər hazırkı dövrümüzdə hələ də heyranlıq yaradır. Bu cür nəhəng daşlardan istifadə edərək inşaat işlərini görmək üçün polad burazları olan qaldırıcı kranlar kimi inkişaf etmiş inşaat maşınlarına ehtiyac var. Təkamülçülərin iddia etdiyi kimi taxta kötüklər, iri kranlar, tez qırılan mis

materiallarla bu daşların mədənlərdən çıxarılması, daşınması, yerləşdirilməsi, işlənməsi mümkün deyil. Ortadakı kiçik şəkildə Ramzesin nəhəng heykəlinin baş hissəsinin yalnız polad burazlı böyük kranlarla daşına bildiyi görünür.

Yupiter məbədi adlandırılan bu tikintinin inşasında da nəhəng daş bloklar istifadə edilmişdir. Balaca şəkildə qırmızı ilə işarələnən blok daş dayaq divarında istifadə edilən üç böyük blokdan biridir. Bu üç blok daşın hər birinin yüksəkliyi təxminən 4.5 metr, genişliyi təxminən 3.5 metr və uzunluğu da təxminən 19 metrdir. Üç daşın təxmini ağırlığı 800 tona yaxındır. Belə böyük ağırlığın mədəndən çıxarılıb daşınması, istifadə edilən tikinti vasitələrinin təkmilləşmiş olduğunun bir göstəricisidir.


BAALBEK YUPİTER MƏBƏDİ

## TƏKAMÜLÇÜLƏRİN AÇIQLAYA BİLMƏDİYİ OBELİSKLƏR

Keçmiş mədəniyyətlərdən dövrümüzə qalan heyrətli izlərdən biri də obelisklərdir. Təxminən 20 metr uzunluğunda, tonlarla ağırlıqda olan bu daşların mədənlərdən çıxarılmaları, daşınmaları, üzərlərinin işlənməsi və olduqları yerlərə yerləşdirilmələri üçün üstün bir texnologiya istifadə edilməlidir. Məlum olan ən böyük obelisklərdən biri e.ə. 1400-cü illərdə Karnakada (Misirdə) tikilmiş obeliskdir. 29.5 metr hündürlüyündə, 1.62 metr genişliyində və 325 ton ağırlığındadır. Bu irilikdə və ağırlıqdakı daşın tək blok şəklində mədəndən çıxarılması da, olduğu yerə daşınması da ustalıq, texniki məlumat və texniki struktur tələb edir. Bunun üçün mis və bürünc kimi asan əyilib bükülən, tez qırılan alətlərin istifadə edilməsi mümkün deyil, sadəcə dəmir və poladdan hazırlanmış alətlərin istifadə edilməsi ilə belə

tikinti hasil ola bilər. Bu da təkamülçülərin həmin dövrdə hələ dəmirin istifadə edilmədiyi, bir çox metalın tanınmadığı iddiasını yalanlayır.



**Şəkildə obeliskin təpə nöqtəsində olduğu güman edilən qisim bu daşların ildırımötürən kimi istifadə edildiyinə işarə edir.**

**Şəkildə (ilk şəkil) Asuvan yaxınlığındakı qranit ocağında bitirilmədən qalmış obelisk görünür. Digərlərinin iki qatı olan bu obelisk 41.75 metr uzunluğunda və təxminən 1168 tondur. Belə nəhəng bir tikilinin mədəndən çıxarılıb daşınması üçün inkişaf etmiş texnologiya istifadə edilməlidir.**

## PUMA PUNKUDA TƏKAMÜLÜ YALANLAYAN TAPINTILAR



Puma Punkudakı piramida qalıqlarını meydana gətirən daşların böyüklüyü görənləri heyrətləndirir. Piramidanın ən alt pillələlərini təşkil edən bloklardan biri 60×50 metr genişliyində və təxminən 447 ton ağırlığındadır. İstifadə edilən digər daşların da ağırlıqları 100-200 ton arasında dəyişir. Bu nəhəng daşların təkamülçülərin önə sürdüyü kimi kötüklər üzərində qalın iplərlə çəkilərək daşındığını iddia etmə məntiqli bir izah deyil.

Təkamülçü arxeologiyanın Puma Punkudakı açıqlamadığı tapıntılardan biri də bir çox blok daşın birləşmə nöqtəsində tapılan izlərdir. Bu izlər metal məngənə izini xatırladır. Əvvəllər fərz edilirdi ki, T şəklindəki bu izlər isti qəliblərin daş blokların üzərinə qoyulması ilə hazırlanmışdır. Ancaq daha sonra elektron mikroskopla edilən müşahidələr ərimiş metal izlərini ortaya çıxarmışdır. Spektroqrafik müşahidələr isə bu izlərin 2.05% arsen, 95.15% polad, 0.26% dəmir, 0.84% silikon və 1.70% nikel qarışığından ibarət bir maddənin izləri oluduğunu göstərmişdir. Bütün bunlar keçmiş cəmiyyətlərin tikinti sənətində inkişaf etmiş vəsaitlər istifadə etdiklərinin dəlilidir.

(Graham Hancock, Heaven's Mirror, Three River Press, New York, 1998, s. 304)







**Puma Punkuda tez-tez rast gəlinən metal məngənə izi**

**Ollantaytambodakı blok daşlarda görülən metal məngənə izi**

**Kambociya, Angkor Watdakı daş abidələrdəki məngənə izi**

## İNCƏSƏNƏT BAXIMINDAN VƏ ELMİ CƏHƏTDƏN MÖHTƏŞƏM SİVİLİZASİYA: QƏDİM MİSİR

Qədim Misir bəşəriyyətin minlərlə il əvvəl qurduğu incəsənət baxımından və elmi cəhətdən ən güclü sivilizasiyalardan biridir. Qədim misirlilər ibtidai bir cəmiyyətin davamı olmayacaq qədər çox şaxəli bir təcrübəyə və elmi bazaya malik idilər. Bütpərəst azğın bir dinə mənsub olan misirlilər arasında hz. Nuh dövründən, hz. İbrahim dövründən gələn sənətkarlığa aid biliklərə sahib olan ustalar vardı. Bu yəhudi ustalar keçmiş peyğəmbərlər dövründən öyrəndikləri bilikləri tətbiq edirdilər.



**Misirlilərin mumyalama texnikaları, olduqca inkişaf etmiş tibb bilgisinə sahib olduqlarını göstərən nümunələrdən biridir.**

Hazırkı dövrdə dünyanın bir çox yerində misirlilərin çatdığı mədəniyyət səviyyəsinə insanlar müvəffəq ola bilməmişlər. Məsələn, bu gün Afrikanın müxtəlif yerlərində, Cənubi Amerikanın bəzi şəhər kənarlarında, Asiyanın müxtəlif yerlərində, Misir də daxil olmaqla, bir çox bölgədə, insanlar keçmişdəki mədəniyyət səviyyəsindən çox geridə qalmış həyat tərzi keçirir. Tibb, anatomiya başda olmaqla, şəhərsalmada (şəhərlərin planlaşdırılması), memarlıqda, incəsənətdə, toxuculuqda irəli gedən Misir mədəniyyəti buğun olduqca təqdir olunaraq heyrətlə elm adamları tərəfindən tədqiq edilir.

# TİBBİN BAŞLANĞICI QƏDİM MİSİRDƏ

Qədim Misirdə tibbin yüksəldiyi səviyyə olduqca heyrətamizdir. Qazıntılar zamanı əldə edilən tapıntılar arxeoloqlardan əlavə, tarixçilərin də heyrətinə səbəb olmuşdur. Belə ki, heç bir tarixçi e.ə. 3000-ci illərdə yaşanan qədim sivilizasiyadan bu cür inkişaf etmiş bir texnologiya gözləmirdi. X-şüalarından istifadə edilməklə mumiyalar üzərində aparılan tədqiqatlar nəticəsində Qədim Misirdə beyin əməliyyatlarının həyata keçirildiyi məlum olmuşdur. (Moustafa Gadalla, Historical Deception: The Untold Story of Ancient Egypt, Basted Publishing, Erie, Pa.USA, 1996, sf.295) Bundan əlavə, həmin əməliyyatlar peşəkar metodlardan istifadə edilməklə həyata keçirilmişdi. Cərrahi əməliyyat keçirmiş mumiyaların kəllə sümükləri tədqiq edildiyində əməliyyat yerlərinin qüsursuz qaydada kəsilmiş olduğu görünür. Hətta bu insanların əməliyyatdan sonra yaşadıqlarını sübut edən bitişmiş kəllə sümüklərinə rast gəlinmişdir.

(Interview with Dr.Zaki Hawass, Director of the Pyramids, http://www.pbs.org/wgbh/nova/pyramid/excavation/hawass.html)



Digər bir misal isə bəzi dərmanlarla bağlıdır. 19-cu əsrdə olduqca sürətli irəliləyişi müşahidə edən eksperimental elm nəticəsində tibb sahəsində ən böyük yüksəlişlər oldu. Antibiotikin kəşfi də bu əsrdəki tərəqqilərdən biridir. Əslində, bunlara "kəşf edildi" demək səhv olardı, belə ki, bu texnikanın böyük hissəsi Qədim Misirdə onsuzda istifadə edilirdi. (Moustafa Gadalla, Historical Deception: The Untold Story of Ancient Egypt, Basted Publishing, Erie, Pa.USA, 1996, sf.296)

Misirlilərin tibb və anatomiya sahəsində nə qədər inkişaf etdiklərini göstərən ən başlıca əsərlərdən biri də, şübhəsiz ki, özlərindən sonra qalan mumiyalardır.

Cansız bədənin minlərlə il çürümədən saxlana bilməsini təmin edən mumiyalama prosesi, əslində, olduqca mürəkkəb bir prosesdir. Bu mövzuda misirlilərin istifadə etdiyi texnika qısa olaraq belədir. İlk olaraq ölünün daxili orqanları çıxarılır, burundan beyin alınır, cəsəd sterilizasiya edilir və natron adlı maddə ilə sarılır və 40 gün gözlənilir. (Natron - soda, natri bikarbonat və



Misir fironu Tutanxamonun cəsədi biri digərinin içərisinə yerləşdirilmiş iki tabut içərisində mühafizə edilirdi.

natri xlorla natri sulfatın qarışığından alınan bir maddədir). Daha sonra bu maddə cəsəddən çıxarılır, qol və ayaqlar kimi bədənin birləşmə yerləri palçıq və ya qumla sarılırdı. Sonra cəsəd kitrəyə (qətran) batırılmış kətanla, qoxulu bir növ sarı saqqız və darçınla sarılırdı. Bir növ məlhəmin bədənə sürtülməsindən sonra da nazik bir kətan türlə örtülürdü.

(www.trms.ga.net/~jtucker/lessons/ss/ancegypt.html)

Misirlilər mumiyalama texnikalarını sadəcə insanlarda deyil, müxtəlif heyvanlarda da təcrübədən keçirmişlər. Qədim Misirdə tibbin olduqca inkişaf etmiş olması əldə olunan arxeoloji tapıntılardan və xüsusən mumiyalama texnikasından açıq şəkildə görünür. Bundan başqa unutmamalıyıq ki, bədənin formasını pozmadan, ölünün bütün daxili orqanlarını çıxardaraq mumiyalamaları bu işi görən insanların hər orqanın yerini biləcək qədər anatomiya biliyinə sahib olduqlarını göstərir.

Mumiyalamadan başqa misirlilər tərəfindən 5000 il əvvəl istifadə edilmiş bir çox tibbi texnika və alət də aparılan araşdırmalar nəticəsində gün işığına çıxarılmışdır. Bu mövzu ilə əlaqədar bir çox təfsilat saya bilərik:

- Misirdə tiblə maraqlanan rahiblər məbədlərdə müxtəlif xəstəlikləri müalicə edirdilər. Misirli həkimlər hazırkı dövrümüzdəki kimi müxtəlif sahələrdə ixtisaslaşmışdılar. Hər həkimin özünə aid sahəsi var idi. Göz həkimlərindən tutmuş diş həkimlərinə qədər hər sahədə ixtisaslaşmış həkimlər xidmət göstərirdilər.
- Misirdə həkimlər dövlətin nəzarətində idi. Əgər bir həkimin xəstəsi sağalmazsa və yaxud ölərsə, dövlət bu xətanın səbəblərini araşdırır və həkimin müalicə metodunun qaydalara uyğun olub-olmadığını aydınlaşdırırdı. Müalicə müddətində bir etinasızlıq göstərilmişsə, belə vəziyyət müəyyən edilir və həkimə qanunlar çərçivəsində cəza verilirdi.
- Məbədlərin hər biri dərmanların hazırlandığı və saxlanıldığı tam təchizatlı bir laboratoriyaya sahib idi.
- Məlum olan ilk əczaçılıq praktikası bandaj və kompresdən istifadənin nümunələrinə Misirdə rast gəlinmişdir. Smit Papirusunda kətan parçadan

düzəldilən yapışqan sarğı lentlərindən yaraları bağlamaq üçün hansı formada istifadə edildiyindən bəhs edilir. Kətan parça, bundan əlavə də, bandaj üçün də münasib bir material idi.



**Smith papirusu – Bu papirusda antik misirlilərin kətandan hazırlanmış yara və sarğı lentləri istifadə etdikləri izah olunur.**

- Arxeoloji tapıntılarda Misirdə mövcud olan bütün tibbi praktikaya aid təfsilatlı bir mənzərə əldə edilmişdir. Bununla bərabər, hər biri öz sahəsində ixtisaslaşmış 100-dən çox həkimin adı və ünvanı da tapılmışdır.
- Bundan başqa, Kom Ombodakı başqa bir məbəd divarında relyeflərdə bir cərrahi alət qutusunun şəkli çəkilmişdir. Bu qutu böyük metal bir qayçı, cərrahi bıçaqlar, yiyələr, kateter, qaşıqlar, kiçik ölçülü qarmaqlar və pinsetlər vardı.
- Mövcud texnika kəmiyyət və növ müxtəlifliyi baxımından çox zəngin idi. Sınıqlar, çatlar tam olaraq oturdurulur, sınıqlar üçün taxtalardan istifadə edilir və yaralar tikişlə bağlanırdı. Mumiyaların çoxunda olduqca müvəffəqiyyətlə müalicə edilmiş sınıqlara rast gəlmək mümkündür.
- Mumiyalarda hər hansı bir cərrahi tikiş izinə rast gəlinməməsinə baxmayaraq, yara tikilməsi ilə bağlı Smit Papirusunda (bu papirus tamamən tibbə aiddir) on üç istinad mövcuddur. Bu misirlilərin estetik tikiş qoymağı da bacardıqlarına işarə edir. Yaraların tikişi üçün kətan ipdən istifadə edilirdi. İynələr isə çox güman ki, misdən idi..
- Misirli həkimlər steril yara ilə infeksiya düşmüş yaraları ayırd edə bilirdilər. İnfeksiya düşmüş yaraların təmizlənməsində keçi yağı, küknar yağı və əzilmiş noxuddan ibarət bir qarışıqdan istifadə edirdilər.
- Penisillin və antibiotikin tapılması olduqca yenidir. Lakin Qədim misirlilər bu cür müalicələrin ilk orqanik versiyalarından istifadə edirdilər. Bundan başqa, misirlilər antibiotikin müxtəlif növlərini bilirdilər.

Müəyyən növdən olan xəstəliklərə uyğun reseptlər yazırdılar.

(Afet İnan, Eski Mısır Tarihi ve Medeniyet, Türk Tarih Kurumu Basımevi, Ankara: 1956, sf.318)

Göründüyü kimi, Misir mədəniyyəti tibb sahəsində olduqca əhəmiyyətli

addımlar atmış, müalicə üsullarını inkişaf etdirmiş, ixtisaslı həkimlər yetişdirmişdi. Aparılan qazıntılarda, tibb sahəsində əldə edilən bu cür tərəqqidən əlavə, misirlilərin şəhərsalma və memarlıq kimi sahələrə maraq saldıqları ortaya çıxmışdı.

## QƏDİM MİSİRDƏ İNKİŞAF ETMİŞ METALLURGİYA

Metallurgiya ən geniş mənada lazımı xam maddələrdən istifadə edilərək metal və ərintilərin hazırlanması, saflaşdırılması, formaya salınması və qorunmasından ibarət elm və texnologiya sahəsidir. Qədim Misir sivilizasiyası tədqiq edildiyində bundan təxminən 3000-3500 il əvvəl misirlilərin, əsasən, qızıl, mis, dəmir olmaqla, müxtəlif mədən və metalların çıxarılması və işlənməsi sahəsində peşəkar olduqları görünür. Metallurgiyanın inkişaf etmiş olması qədim misirlilərin filizlərin tapılması, çıxarılması, emalı sahələrində mütərəqqi bir texnologiyaya və eyni zamanda, inkişaf etmiş kimya elminə sahib olduqları mənasına gəlir.

Aparılan arxeoloji işlər e.ə. 3400-cü illərdə misirlilərin mis mədənləri haqqında müfəssəl işlər gördüklərini və metal ərintilərini meydana gətirdiklərini ortaya qoymuşdur. Dördüncü xanədanlıq dövründə (e.ə 2900-cü illər) mədənlərin araşdırma və istismarının ən yüksək səviyyəli vəzifəli şəxslər tərəfindən müşahidə edildiyi və fironların oğulları tərəfindən nəzarət olunduğu məlumdur.




**(1,2) Qızıl, gümüş ve yarı daşlardan hazırlanmış zirehlər. 3) Zərif naxışlı sandal 4) Sərt qızıldan hazırlanmış uzun uclu kiçik küpə möhkəmliyini və parlaqlığını hələ də qoruyur. (5) Tutankhamun mumyasının boynundakı bu boyunbağının üzərində çox incə qızıl işlənib. Bununla yanaşı, fironun mumyasında 150 ləl-cəvahirat və boyunbağı da tapılmışdır. 6) Qalın qızıl vərəqlə örtülmüş və gümüş vərəqli bir xizəyin üzərində yerləşdirilmiş taxta mühafizə. 7) Tanisdə tapılan qızıl, göy daşı və firuzədən hazırlanmış zireh.**

**Daş-qaşlardakı incəlik professional qızılişləmə vəsaitlərinin istifadə edildiyini göstərir. Lazım olan vəsaitlər olmadan bu dərəcə incə sənət əsəri hazırlana bilməz. Qədim Misirdəki qızılişləmənin keyfiyyətinin və incəliyinin dövrümüzdəkindən heç bir fərqi yoxdur.**

Misdən başqa, qədim misirlilərin daim istifadə etdikləri mədən və metallar arasında dəmir də var idi. Tuncun istehsalı üçün qalay, şüşələrin rənglənməsi üçün isə kobalt işlənirdi. Misirdə tapılmayan metallar isə başda İran olmaqla, digər bölgələrdən gətirilirdi.

Qədim misirlilərin ən çox istifadə etdiyi və dəyər verdikləri metal isə qızıl idi. Misirdə və qədim Misirin sərhədləri çərçivəsində olan bugünkü Sudan Respublikasının müəyyən yerlərində qədim misirlilərə aid olduğu təxmin edilən yüzlərlə qızıl mədənləri tapılmışdır. Apollinopolis yaxınlığındakı bir qızıl mədəninin planının olduğu e.ə. 14-cü əsrə aid bir papirus qədim misirlilərin qızıl mədənləri sahəsində peşəkarlıqlarını ortaya qoyur. Papirusda əks olunan məlumatlara görə, mədən yaxınlığında sayı 1300-dən çox evin sadəcə mədəndə işləyənlərin qalması üçün tikildiyindən bəhs edilir. Qədim Misirdə qızıldan işləmələr və zərgərliyin əhəmiyyəti bu məlumatlardan başa düşülür. Bundan başqa, arxeoloji qazıntılar zamanı tapılan qızıldan düzəldilmiş yüzlərlə məişət və bəzək əşyası da qədim misirlilərin qızıl mədənlərinin çıxarılması və işlənməsi sahəsindəki peşəkarlıqlarının bir göstəricisidir.

Bütün bu məlumatlar qədim misirlilərin mədən yataqlarını kəşf edə biləcək, bu yataqlardan mədəni çıxara biləcək, çıxan metalları emal edə biləcək, hissələrə ayıracaq və yeni metallar düzəldəcək elmi məlumata və texnologiyaya sahib olduqlarını göstərir.

## QƏDİM MİSİRDƏ ŞƏHƏRSALMA VƏ İNFRASTRUKTURUN ROLU

Misirin quru iqlimə malik olması bu gün bizə bu sivilizasiyadan çoxsaylı dəlillər qoymuşdur. Bu məlumatlar qədim Misir şəhərlərinin son dərəcə inkişaf etmiş bir infrastruktura malik olduğunu göstərir.

Qüsursuz infrastrukturun inkişaf etmiş olması bu şəhərləri inşa edənlərin mütərəqqi memarlıq və mühəndislik biliklərinə sahib olduqlarını göstərir. Yer altı yolların çəkilməsində statikanın müəyyən edilməsi, üfüqi tirlərin quraşdırılması lazım olan yerlərin müəyyən edilməsi, hansı dərinlikdə basdırılacağı və yolun uzunluğunun təyin edilməsi, havalandırmanın hansı yerlərdə hansı effekti verəcəyinin hesablanması, təmiz və çirkab sularının bir -birinə qarışmadan nəql edilə bilinməsi kimi bir çox xırdalıqların incə hesablarla düşünülməsi və ən əhəmiyyətlisi isə bu işlərin həyata keçirilməsində heç bir xətaya yol verilməməsi gərəkir. Bütün bu texnikaları misirlilər bilirdilər. Əlimizdə olan məlumatlar bu həqiqəti açıq-aşkar sübut edir.

E.ə. 3000-ci illərdə misirlilərin istifadə etdiyi memarlıq texnikaları və infrastruktur məsələsinə yanaşmaları son dərəcə peşəkar və problemləri həll etməyə meyillidir. Quraq ölkə olan Misir üçün suyun əhəmiyyəti çox böyükdür. Bu səbəbdən də, bu məsələ üzrə də qalıcı həll yollarını tapmışlar. İnfrastrukturla əlaqədar olaraq misirlilərin həyata keçirdikləri ən vacib layihələrdən biri suyu qorumaq üçün inşa etdikləri anbarlardır.

Məsələn, Fayyun vadisində kəşf edilən böyük su anbarı bunlardan biridir. (Afet İnan, Eski Mısır Tarihi ve Medeniyet, Türk Tarih Kurumu Basımevi, Ankara: 1956, sf.87) Qədim Misirdə həyatın müəyyən yerlərdə davamlılığını təmin edə bilmək üçün süni göllər inşa edilmişdi. Bunun sayəsində Nil çayının suyu həmin bu süni göllərdə toplanaraq Misir çöllərində inkişaf etmiş bir sivilizasiya qura bilmişlər. Bugünkü Qahirədən səksən kilometr cənubda yerləşən Moris gölü misirlilər tərəfindən Nil çayının suyunu bir kanal vasitəsi ilə toplamaq məqsədi ilə salınan süni göllərdən biridir. Həmin bu su xəzinələrinin yaxınlıqlarına ev və məbədlər inşa edilmişdi.



Antik misirlilərin inkişaf etmiş mədəniyyətinin ən mühüm göstəricilərindən biri də heç şübhəsiz ki memarlıq və mühəndislik elmləri idi.

Misirlilərin tibb sahəsindəki bilikləri, şəhərsalma və mühəndislik bilikləri və bu biliklərin praktikada tətbiq edilməsi son dərəcə inkişaf etmiş bir sivilizasiyaya sahib olduqlarını göstərən əhəmiyyətli dəlillərdən bir neçəsidir. Bu nəzəri bilik və onların praktikada tətbiq edilməsi təkamülçülərin iddia etdiyi "cəmiyyətlərin ibtidaidən aliyə doğru inkişaf etdikləri" tezisini bir daha yerlə yeksan edir. Günümüzdən təxminən 5000 il əvvəl yaşayan bir cəmiyyət günümüzdəki müxtəlif cəmiyyətlərdən, hətta günümüzdə bu torpaqlarda yaşayan bəzi cəmiyyətlərdən belə daha mütərəqqi sivilizasiya səviyyəsinə sahibdir və bu vəziyyətin təkamüllə izah edilə bilməsi mümkün deyil. Şübhəsiz ki, misirlilərin bu yüksək sivilizasiyada yaşadığı dövrdə dünyanın müxtəlif bölgələrində daha geridə qalmış sivilizasiyalar, daha ibtidai şərtlərdə yaşayan insanlar da mövcud olmuşdur. Lakin bunların heç biri nə daha az insan keyfiyyətlərinə sahibdir, nə də guya meymunabənzər xüsusiyyətlərə. Qədim Misirdə qədim misirlilərlə eyni dövrdə ibtidai şəraitdə yaşayan insanlar da, bundan yüz minlərlə il əvvəl var olmuş insan cəmiyyətləri də, günümüzün insanı da bütün keyfiyyətləri ilə həmişə insan olaraq var olmuşdur. Bəzi cəmiyyətlərin daha mütərəqqi, bəzilərinin isə daha ibtidai şəraitdə yaşamış olması, darvinistlərin iddia etdiyi kimi, onların əsla heyvanlardan meydana gələn bir növ olduğunu və ya birinin digərindən təkmilləşdiyini göstərə bilməz. Bu, elmə, ağıla və məntiqə zidd bir şərhdir.

# QƏDİM MİSİRLİLƏRİN PARÇA SƏNAYESİNDƏKİ UĞURLARI

Qədim Misirdə kətan parça toxuyurdular. E.ə. 2500-cü illərdən qalan parça qalıqlarından aydın olur ki, həmin dövrdə həm iplərin əyrilməsi, həm də toxunuş tərzi baxımından çox keyfiyyətli parçalar istehsal edilmişdir. Lakin hər şeydən vacibi bu parçaların toxunuşundakı xırdalıqlardır. Hazırkı dövrümüzdə texnologiyanın köməkliyi ilə təmin edilmiş maşınlarda istehsal edilə bilən incə ipləri misirlilər e.ə. 2500 tarixlərində istehsal etmiş və kətan iplərdən toxunmuş parçaları, mumiyalama prosesində istifadə etmişlər. Bu parçalardakı incə toxunuş qədim Misiri tədqiq edən alimləri heyrətə salmışdır. Lupa altında sayıla bilən toxunuşdakı sapların incəliyi bu gün maşınla toxunan ipək parçalarla eynidir. (Prof.Dr.Afet İnan, Eski Mısır Tarihi ve Medeniyeti, Türk Tarih Kurumu Yayınları, Ankara, 1956, sf.201) Hazırkı dövrdə belə bu parçaların keyfiyyəti məşhurdur və Misir kətanı indiki dövrdəki ad-sanını e.ə. 2000-ci illərdə yaşamış qədim Misir xalqından almışdır. (J.H.Breasted, Ancient Times, 1916, sf.64)



**Antik Misir dövrünə aid kətan üzərində hazırlanmış şəkillərdən nümunələr.**

# RİYAZİYYATDA MÜTƏRƏQQİ SƏVİYYƏ

Misirdə rəqəmlər çox qədim zamanlardan etibarən istifadə edilirdi. E.ə. 2000-ci ilə aid bir sıra hesab problemlərini açıqlayan papiruslar ələ keçmişdir. Bu sənədlər Kahun, Berlin və Rind papirusları adı ilə tanınır. Həmin sənədlərdə ölçülərin hansı əsaslara görə edilməli olduğu misallarla göstərilmişdir. Misirlilər Pifaqor teoremini, ölçüləri 3-4-5 olan bir üçbucağın dik üçbucaq olduğunu bilir və bundan inşaat hesablamalarında faydalanırdılar. (Moustafa Gadalla, Historical Deception, The Untold Story of Ancient Egypt, Bastet Publishing, Erie, Pa. USA, 1996, sf.311)

Bundan əlavə, misirlilər ulduzlarla planetlər arasında fərqi müəyyən edə bilirdilər. Astronomiya ilə əlaqədar tədqiqatlara çox çətin görülən ulduzları da əlavə etmişdilər.

Digər tərəfdən, misirlilərin həyatı Nilin suyunun səviyyəsinin artıb-azalmasına bağlı olduğuna görə, bu vəziyyəti daim ölçməli və nəzarətdə saxlamalı idilər. Hökmdarlar Nil çayının səviyyəsinin qalxması və aşağı düşməsini qeydə almaq üçün bir "Nilometr" düzəltdirmiş və bu işlə məşğul olmaq üçün məmurlar təyin etmişdi.

(John Baines, Jaromir Baines, Eski Mısır, İletişim Yayınları, İstanbul: 1986, sf.69)



**Rhind papirusu**

# SİRLƏRLƏ DOLU İNŞAAT TEXNOLOGİYASI

Qədim Misirdə inşa edilən və günümüzdə hələ də böyük heyranlıqla izlənən ən möhtəşəm əsərlər əsrarəngiz ehramlardır. Bu ehramlar arasında ən ehtişamlı olan Xeops ehramı indiyə kimi dünya üzərində inşa edilmiş ən böyük daş tikili olaraq qəbul edilir. Bu ehramın necə inşa edildiyi barədə Herodot zamanından bu yana bir çox tarixçi və arxeoloq müxtəlif nəzəriyyə irəli sürmüşdü. Bəziləri bu ehramın tikintisi zamanı qulların istismar edilməsi və rampa texnikasından tutmuş pilləli ehrama qədər bir çox üsulun istifadə edildiyini iddia etmişdir. Bu üsulların gözlərimiz önündə yaranan mənzərəsi belədir:

*Bu ehram qullar tərəfindən tikilmiş olması ehtimal edilərsə, işləyən qulların sayı 240.000 kimi inanılmaz bir rəqəm olmalıdır.*

*Əgər inşaat texnikası olaraq rampa texnikası istifadə edilmiş olsaydı, ehramın tikintisi bitdikdən sonra bu rampanın sökülməsi üçün təxminən 8 il lazım olardı. Danimarkalı bir inşaat mühəndisi Qarde-Hansona görə, bu, olduqca cəfəng bir nəzəriyyə idi. Belə ki, bu rampanın sökülməsindən sonra qalan tikinti tullantılarına rast gəlməli idik. Lakin belə dəlillərə heç bir yerdə rast gəlinməmişdir.* (Moustafa Gadalla, sf.115)

"Historical deception: The Untold story of Ancient Egypt" adlı kitabında Qarde-Hansonun digər nəzəriyyəçilərin əhəmiyyət vermədiyi bəzi məqamları tədqiq etdiyini qeyd edən Mustafa Qadalla mövzunu aşağıdakı kimi davam etdirir:

*Ehramı ziyarət etdiyiniz zaman heyranedici mənzərələri gözünüzün önünə gətirməyə çalışın: 5000 il əvvəlki daş karxanasındakı işçi gündə ehramların inşasında istifadə edilən 330 blok istehsal edir. Suyun səviyyəsinin qalxdığı mövsümdə gündə 4000 blok Nil çayı üzərində daşınır və Qiza yaylasına gətirildiyində isə həmin daşlar yayladan yuxarıya daşınaraq ehramın inşa ediləcəyi yerə çatdırılırdı. Əgər bu şərtlər altında daşınma prosesi həyata keçirilsəydi, dəqiqədə 6.67 blok daşınmalı idi. Bu nəticə irəli sürülən nəzəriyyənin əsassızlığı üçün kafi rəqəmdir.* (Moustafa Gadalla, sf.116)

*Bütün bunlarla bərabər, ehramın bir tərəfinin sahəsi təxminən 2.5 hektar olduğunu hesab etsək, hər bir tərəf təxminən 115 000 üzlük daşı ilə örtülməli idi. Bu daşlar da elə səliqə ilə düzülmüşdür ki, daşlar arasında qoyulan məsafə bir kağızın keçməsinə imkan verməyəcək qədər dardır.*

(Moustafa Gadalla, sf.116)

Bütün bunlar ehramların inşası ilə əlaqədar hazırkı dövrümüzün elm və texnologiyası ilə belə, izah edilə bilmədiyini göstərən məlumatlardan bəziləridir.

# QİZADAKI EHRAMLARLA ƏLAQƏDAR TƏƏCCÜB DOĞURAN MƏLUMATLAR

Qizadakı ehramlarla əlaqədar aparılan bəzi riyazi araşdırmalar qədim misirlilərin çox mütərəqqi riyazi və həndəsi bilikləri olduğunu göstərir. Bu hesablamalara görə, ehramların layihəsini çəkənlər riyazi və həndəsi biliklərdən başqa dünyanın ölçüləri, ekvatoru, oxu və bu oxun bucağı kimi biliklərə malik olmalı idilər. E.ə. təxminən 2500-cü illərdə inşasına başlanan ehramlarla əlaqədar bu məlumatlar ehramların böyük riyaziyyat alimləri Pifaqor, Arximed və Evkliddən 2000 il əvvəl inşa edildiyi nəzərə alınarsa, daha da heyrətamiz olur: - Ehramın bucaqları Nil deltasını iki bərabər hissəyə bölür. - Qizanın üç ehramını aralarında bir Pifaqor üçbucağını təşkil edəcək şəkildə formalaşdırmışlar. Bu üçbucağın tərəflərinin bir-birinə nisbəti 3:4:5-dir. - Ehramın hündürlüyü ilə çevrəsi arasındakı nisbət bir dairənin radiusunun çevrəsi arasındakı nisbətə bərabərdir. - Ehram nəhəng bir günəş saatıdır. Oktyabr ayının ortası ilə mart ayının əvvəli arasında düşən kölgələr mövsümləri və ilin uzunluğunu göstərir. Ehramın üzərini örtən daş lövhələrin uzunluğu bir günün kölgə uzunluğuna bərabərdir. - Ehramın dördbucaqlı şəklində olan oturacaq tərəfinin perimetri 365,342 Misir ölçüsünə (həmin dövrün ölçü vahidi) uyğun gəlir. Bu say indiki zamanda istifadə edilən günəş ilinin günlərinin sayına olduqca yaxındır. (Hal-hazırda günəş ilinin günlərinin sayı 365,224 kimi hesablanmışdır) - Xeops ehramı ilə dünyanın mərkəzi arasındakı məsafə şimal qütbü ilə ehram arasındakı məsafəyə bərabərdir. - Ehramın oturacaq tərəfinin perimetri tikilinin hündürlüyünün iki qatına bölündükdə pi rəqəmi alınır. - Ehramın dörd tərəfinin səthinin ümumi sahəsi ehramın hündürlüyünün kvadratına bərabərdir.



# EHRAMLARI TƏKRAR İNŞA ETMƏYƏ CƏHD OLUNSA...

1978-ci ildə ABŞ-dakı "Indiana Limestone Institute of America Inc." (dünyada əhəngdaşı yataqları sahəsində ən böyük və ən peşəkar qurum) bu gün Xeops ehramı böyüklüyündə bir ehramın inşası tələb olunarsa, bunun üçün insan gücü və materialların ölçüsünü müəyyən etmək üçün tədqiqat aparmışdır. Nəticə olduqca düşündürücüdür; şirkətin səlahiyyətli şəxsləri ehramların tikintisindəki çətinlikləri belə açıqlayırlar:

*Əgər mümkün olan gücü maksimuma çıxarsaq, bu da bugünkü istehsal həcmini üç qat artırmaq deməkdir ki, bu da lazımi qədər əhəngdaşının çıxarılması və daşınması üçün 27 il vaxt tələb edir. Bundan əlavə, bütün bu işlər ABŞ-ın üstün texnologiyası ilə, yəni hidravlik çəkic, elektron kristal ucluqlu mişarlardan istifadə edilərək görülə bilər. Bu cür böyük güc sadəcə əhəngdaşını mədəndən çıxarmaq və onu daşımaq üçün sərf ediləcəkdir. Və buna Xeops ehramının inşası üçün lazım olan laboratoriya testləri və bunun kimi hazırlıq işləri daxil deyil.* (Nova Productions, Who Built the Pyramids, www.pbs.org)



**Xeops piramidası təxminən 2.5 milyon daş blokdan ibarətdir. Gündə on blokun üst-üstə qoyulduğu fərz edilsə - bu işçilərin qeyri-adi bir cəhd göstərmələrini tələb edir- 2.5 milyon daşın 664 ildə yerlərinə qoyulduğu ortaya çıxar. Halbuki həmin piramidanın təxminən 20-30 il ərzində hazırlandığı düşünülür. Bu sadə hesab belə Misir piramidalarının tikilməsində fərz ediləndən daha fərqli və üstün bir texnologiyanın istifadə edildiyini ortaya qoyur.**

Bəs qədim Misirdə bu nəhəng ehramlar necə inşa edilmişdi? Qayalıq terraslar hansı güclə, hansı mexanizmlərlə və hansı texnika ilə düzləşdirilmişdir? Qaya məzarları hansı vasitələrlə qazılmışdır? İnşaat sırasında aydınlatma necə təmin edilmişdir? (ehramların və məzarların divarlarında və tavanlarında hər hansı bir qaralma və his izinə rast gəlinməyib). Daş bloklar daş yataqlarından necə çıxarılmış, müxtəlif formalı

daşların kənarı necə düzləşdirilmişdir? Tonlarla ağırlığı olan bu daşlar necə daşınmış və bir-birilərinə santimetrin mində biri yaxınlığında necə birləşdirilmişdir? Bu sualların sayını artırmaq olar. Bəs bu suallar təkamülçülərin insanlıq tarixi yalanına uyğun olaraq ağıllı və məntiqli bir şəkildə cavablandırıla bilərmi? Əlbəttə ki, xeyr.



**Tutankhamun dövründən bir nümunə. Əsər Qahirədəki Misir muzeyində nümayiş olunur.**

Qədim Misirdə incəsənət, tibb, memarlıq və mədəniyyət ilə təcəssüm olunan nəhəng bir mədəniyyət qurulmuşdur. Misirlilərin özlərindən sonra qoyduqları əsərlər, istifadə etdikləri müalicə üsulları sahib olduqları elmi baza və təcrübənin ən əhəmiyyətli dəlillərindəndir. Bu gün bəzi alimlər tarixin təkamülü iddiasına uyğun olaraq ehramları inşa etməsi olduqca çətin olan Misir əsərlərinin kosmosdan gələnlər tərəfindən meydana gətirildiyini də iddia edirlər.

Əlbəttə ki, "ehramları yadplanetlilər inşa ediblər" iddiası demaqogiya ilə belə izah gətirə bilmədikləri zaman təkamülçülərin sığındıqları son dərəcə ağıl və məntiqdən kənar iddiadır. Hər şeydən əvvəl, buna aid ən kiçik məlumat və ya dəlil belə tapılmamışdır. Təkamülçülər təsadüflərlə və ya xəyali təkamül prosesi ilə açıqlama verə bilmədikləri zaman o dəqiqə "yadplanetlilər"ə sığınırlar. Halbuki, canlı aləmin quruluş vahidini təşkil edən ilk zülalın və hüceyrənin nüvəsindəki DNT-nin təsadüfən cansız maddələrdən meydana gəlməyəcək qədər mürəkkəb və qeyri-adi bir quruluşa sahib olduqlarını anladıqda belə bir gülünc iddia tapdılar: "İlk canlı orqanizmini yadplanetlilər dünyaya qoyub getmişlər". Bəzi təkamülçü alimlər tərəfindən müdafiə edilən bu iddianın mənasızlığı, əlbəttə ki, təkamülçülərin düşdükləri çarəsizliyin göstəricisidir.

Misirdə qurulan mədəniyyət və tarix boyunca qurulan digər bütün sivilizasiyaların hər biri ağıl və iradə sahibi insanlar tərəfindən qurulmuşdur. Bundan əlavə, bunlar çox qədim dövrlərə aid sivilizasiyalardır. Bu gün Misirin e.ə. 3000-ci ilindəki əsərlərini tədqiq edərək heyranlığımızı dilə gətiririk və alimlər və aidiyyəti mütəxəssislər bu əsərlərin necə meydana gətirilmiş ola biləcəyini müzakirə edərək araşdırırlar. Lakin bu məqam da çox vacibdir: Misirdə bu gün izlərinə rast gəlinən 5000 il əvvəlki sivilizasiya, əlbəttə ki, minlərlə ilin təcrübə və elmi bazası hesabına olmuşdur. Yəni bu mədəniyyətin kökləri daha da əvvələ söykənir. Dolayısilə, təkamülçülərin və

tarixin təkamülünə inananların iddia etdikləri kimi, ilk dövrlərdə ibtidai və danışmaq qabiliyyətindən məhrum, sadəcə heyvan ovlayaraq güzəran keçirən yarı heyvan insanlar yox idi. İnsan ilk yaradıldığı gündən bu yana indi insanların sahib olduğu zəka, estetika anlayışı, qavrama, şüur və əxlaq kimi insani keyfiyyətlərə sahib idi.




**1.** **Dövrün mümkün kran modeli.**
**2.** **Bu günkü kran modeli.**

**DÖVRÜN KRAN MODELİ**

**Keçmiş sivilizasiyaların nəhəng daş bloklar istifadə edərək inşa etdikləri binalar dövrümüzün müasir inşaat mexanizmlərinə bənzər mexanizmlərin o dövrlərdə də istifadə edildiyinə işarə edilir. Qızıldan hazırlanmış bu bəzək əşyasının da inşaat mexanizmlərinə olan bənzərliyi diqqət çəkir. Bu parça 1920-ci illərdə Panamada tapılmışdır. Boyunbağı ucu olaraq istifadə edildiyi fərz edilir. Bu və buna bənzər tapıntılar təkamülçülərin keçmiş cəmiyyətlərin tamamilə ibtidai olduqları yönündəki iddialarını yalanlayır. Tarix boyu texnologiyada irəliləyiş və elmi təcrübə hər zaman olmuşdur. Keçmiş cəmiyyətlər də ehtiyaclarına uyğun kəşflər ediblər, cihazlar inkişaf etdiriblər, mexanizmlər istifadə ediblər.**

## KEÇMİŞ SİVİLİZASİYALARIN GÖY QÜBBƏSİNDƏKİ KƏŞFLƏRİ

Keçmiş mədəniyyətlərə aid qalıqlar tədqiq edildikdə havaya qalxmanın bildiyimiz tarixdən çox daha qədimlərə getdiyi aydın olur. Mayyalardan qalan tapıntılarda, Misir ehramlarındakı şəkillərdə, Şumer yazılarında və Yaponiyadakı qazıntılarda müxtəlif təyyarə, planer və helikopterə bənzəyən vasitələrə, həmçinin pilot forması geyinmiş adam heykəllərinə tez-tez rast gəlinir. Bunlardan aydın olduğu qədər, günümüzdən minlərlə il əvvəl də insanlar havaya qalxmış, indiki dövrdə istifadə edilən vasitələrə bənzər vasitələrdən istifadə etmişlər.

Qurani-kərim ayələrində də inkişaf etmiş dövrlərdə havaya qalxma cihazlarından istifadəyə işarə edilir. Bu ayələrdən biri aşağıdakı kimidir:

**Səhər bir aylıq məsafəni qət edən, günortadan sonra** *(yenə)* **bir aylıq məsafəni qət edən küləyi də Süleymana** *(ram etdik)***...** (Səba surəsi, 12)

Bu ayədə Hz. Süleyman dövründə çox uzaq məsafələrə qısa müddət ərzində nəql edilmənin vurğulandığı ehtimal edilir. Belə nəqliyyat günümüzdəki təyyarə texnologiyasına bənzər bir texnologiyadan istifadə edilərək küləklə hərəkət edən vasitələr meydana gətirilməsi ilə həyata




**E.ə 200-ci ildə aid olduğu təxmin edilən taxta planer modeli**



**Abydios məbədinin divarlarında dr. Ruth Hiver tərəfindən aşkar edilən bu şəkillərdəki vəsaitlərin dövrümüzdə də istifadə edilən vertolyot, reaktiv və təyyarə kimi vasitələrlə olan bənzərliyi diqqət çəkicidir.**

keçirilmiş ola bilər. (Doğrusunu Allah bilir) Keçmiş sivilizasiyaların havaya qalxmaqdan yararlandıqlarına işarə edən dəlillərdən biri Misirdə tapılan planer modelidir. 1898-ci ildə arxeoloqlar tərəfindən Saqquaradakı bir məzarın içində tapılan bu planer modelinin e.ə. 2000-ci ilində düzəldilmiş olduğu ortaya çıxarılmışdır. Bundan təxminən 2200 il əvvələ aid bir planer modelinin ortaya çıxarılması, əlbəttə ki, qeyri-adi haldır. Bu, təkamülçü tarix anlayışını kökündən sarsıdan arxeoloji bir kəşfdir. Bəhs edilən modelin texniki xüsusiyyətləri tədqiq edildiyində ortaya bundan da maraqlı mənzərə çıxır. Bu taxta modelin qanadlarının şəkli və nisbətləri günümüzün ən mütərəqqi texnologiyası ilə düzəldilən Konkord təyyarələrində olduğu kimi, sürətdən minimum itki ilə maksimum qaldırıcı qüvvəni təmin edə biləcək formada dizayn edilmişdir. Bu hal qədim misirlilərin mükəmməl aerodinamik biliklərə sahib olduqlarını da göstərir.

(http://www.unsolved-mysteries.net/english/ earchiv/e8archivobj005.htm)

## NAZCADA TAPILAN "BƏRK QIZIL TƏYYARƏ MODELİ"

Keçmiş sivilizasiyaların təyyarə qalıqları təkcə Misirlə məhdudlaşmır. Şəkildəki təyyarə modeli Cənubi Amerikada, Kolumbiyada bir mağarada tapılıb. Bu model hazırda Smithsonian Institution of Washington DC muzeyindədir və 1000 ildən çox yaşı olduğu təxmin edilir.

Bu kiçik heykəlciyin aerodinamik quruluşu, quyruq hissəsindəki çıxıntılı sükan indiki müasir təyyarələrdən fərqlənmir. "The Puzzle of Ancient Man" kitabının müəllifi Donald E. Chittick bu qızıl heykəl haqqında bu şərhləri verir:

Təbii ki, bu ixtira üçün yüksək texnologiyadan başqa başqa izahatlar da vermək olar. Ancaq bütün bu əldəqayırma tapıntılar bir araya gətirildikdə və

onların nə demək istədiyi ortaya çıxanda ortaya bir izahat çıxır: onlar bizə keçmiş sivilizasiyaların yüksək texnologiyaya malik olduğunu göstərir.

(Henry Gee, In Search of Deep Time: Beyond The Fossil Record to A New History of Life, The Free Press, A Division of Simon & Schuster, Inc., 1999, p. 5)











Vera Kruzda tapılan, Eramızın 200-cü ilinə aid olan bu heykəl, tədqiqatçılar tərəfindən bir hoverkrafta, yəni həm quruda, həm də dəniz üzərində hərəkət edə bilən nəqliyyat vasitəsinə bənzədilmişdir. Yanlarındakı qanadlar havanın dairəvi şəkildə hərəkət etməsinə imkan verir, quyruğu sükan rolunu oynayır, avtomobildə egzoz çıxışı və idarəetmə paneli kimi fəaliyyət göstərən bölmə var. Nəqliyyat vasitəsini idarə edən pilotun geyimi də bu oxşarlığı təsdiqləyir.

## "DOGU"LAR MİN İL ƏVVƏL YAŞAMIŞ PİLOTLARDIRMI?

Doguların ölçüləri 7-30 sm arasında dəyişən gil heykəlciklərdir. İndiyə qədər 3000 Dogu heykəli tapılıb və onların eramızdan əvvəl 500-10.000-ci illər arasında hazırlandığı təxmin edilir. Bu tarixlər, bütün qədim sivilizasiyadan, hətta Misir və Şumer sivilizasiyalarından da qədimdir.

Dogular Yaponiyanın ən qədim sivilizasiyası sayılan Jomonlar tərəfindən hazırlanmışdır. Əldə edilən tarixi qeydlərə görə, Jomon xalqı keramikadan istifadə edən ilk sivilizasiyalar olub. (Phillip E. Johnson, Reason in the Balance: The Case Against Naturalism in Science, Law & Education, Downers Grove, Illinois: InterVarsity Press, 1995, p. 62) Kyuşudakı

Fukui mağarasında 12700 illik bir keramika parçası tapılmışdır.

Dogu heykəlləri keçmiş sivilizasiyaların heykəllərindən xeyli fərqlənir. Heykəllər diqqətlə araşdırıldıqda Dogu geyimlərinin çox geniş texniki təchizata malik olduğu görünür. Bu geyimlər 20-ci əsrin birinci rübündə istifadə edilən pilot və ya dalğıc geyimlərinə bənzəyir. Dogu geyimlərindəki zirehdə insanların hərəkət etməsinə imkan verən oynaqlar var. Nəfəs alma bölmələri var. Gözlər xüsusi eynəklərlə qorunur. Çıxarılan əlcəkləri var. Dəbilqələr xüsusilə maraqlıdır; O, dairəvi, hava kanallı, qulaqcıq, nəfəs alma mexanizmi və qoruyucu eynəklərlə dizayn edilmişdir.











20-ci əsrdə istifadə edilən uçuş və dalğıc paltarları ilə oxşarlıqları ilə diqqət çəkən bu heykəlciklər dövrün insanlarının yüksək texnoloji biliklərə malik olduğunu göstərir. Bu məlumat, tarixin təkamül deyilən bir prosesdə irəliləmədiyinin sübutlarından biridir. Quranda Hz. Süleymanın dövründə sivilizasiyanın yüksək səviyyəsinin olduğu bildirilir. Bu dövrdə hava nəqliyyatından istifadə edildiyinə, dəniz altından faydalanıldığına işarə edilməkdədir. (Doğrusunu Allah bilir.) Hz. Süleymana xidmət göstərən

cinlərin dalğıclıq etdiyi ilə əlaqəli ayələr bu şəkildədir:

**Biz də, onun əmri ilə istədiyi yerə sakitcə əsən küləyi ona ram etdik. Həmçinin şeytanlardan olan müxtəlif** *(nəqşlər vuran)* **bənnaları, dalğıcları.**
(Sad surəsi, 36-37)

## İKİ MİN İLLİK ANALOQ KOMPÜTER: TƏKAMÜLÇÜLƏRİN SSENARİSİNİ QARIŞDIRAN KƏŞF

1900-cü ildə Egey dənizinin qərb girişində, Crete və Kythera adaları arasında batmış bir gəmi tapıldı. Gəmi heykəllər, amforalar və müxtəlif qalıqlarla dolu idi. Bu, müasir arxeologiyanın ilk böyük sualtı kəşflərindən biri idi.



**Şəkildə Ege dənizində tapılan dişli çarxları olan bir analoq kompüter olduğu düşünülən parça görülməkdədir.**

Qalıqların əksəriyyətinin, İsadan bir müddət əvvəl yaşamış Yunan sənətçilərinin əsərləri olduğu müəyyən edilib. Lakin onlardan biri; kirəclənmiş, bronze bir əsərin, hansı məqsədlə istifadə edildiyi tam olaraq müəyyən edilə bilmədi. Ancaq illər sonra aparılan araşdırmaların ardından bu naməlum qalığın "heyrətləndirici, mürəkkəb elmi alət" olduğu təsbit edildi.

Maraqlı alət, yavaş — yavaş quruduqca köhnə taxta örtük qalığı və içindəki hissələri çatladı və ortaya dörd dənə düz-üfüqi parça çıxdı. Dişli çarxın daxili hissəsində isə çətinliklə oxunan bir yazı var idi. Alimlər bu alətin dənizçilik vasitəsi olduğunu təsdiqlədilər. Alət haqqında sürəkli yeni fikirlər irəli sürülürdü və heç bir dəqiq nəticəyə gələ bilmirdilər. İnsan əliylə düzəldilmiş bu alət haqqındakı fərziyyələr 1951-ci ildə, Yale Universitetinin professoru Derek de Solla Price-nin araşdırmalarına qədər davam etdi.

Aləti yenidən qurmaq üçün, Price və onun Yunan həmkarları X və Qamma şüalarından istifadə edərək mexanizmi tədqiq etdilər. Mexanizmdə qat-qat, üst-üstə, müxtəlif ölçülərdə dişlilərin olduğunu kəşf etdilər. Mümkün dişli nisbətlərinin uzun hesablamalarından sonra Price heyrətamiz bir nəticəyə gəldi: Qədim Yunan ixtiraçıları Günəşin, Ayın və planetlərin keçmiş, indiki və gələcəkdəki gerçək hərəkətlərini təqlid edən bir mexanizm hazırlamışdılar. Antikythera Mexanizmi 2000 illik bir ANALOQ KOMPÜTER idi. (Temel Britannica, Vol. 16, Ana Yayıncılık, Istanbul: June 1993, p. 203) Bu kəşf təkamülçülərin Ellinizm dövründən əvvəl sadəcə bəsit vasitələr istifadə edildiyi yönündəki iddialarını tamamilə alt-üst edirdi.

# QƏDİM MİSİRDƏ ELEKTRİK VAR İDİMİ?

Denderadakı Xatxor məbədində tapılan bəzi divar rəsmləri qədim Misirlə əlaqədar olduqca maraqlı bir məlumatı üzə çıxarmışdı. Rəsmdə əks olunan fiqurlar qədim misirlilərin elektrik haqqında məlumatlı olması və ondan istifadə etməsi ehtimalını gündəmə gətirmişdi. Bəhs edilən rəsmi diqqətlə tədqiq edildiyində sanki günümüzdəki kimi yüksək voltaj izolyasiyadan həmin dövrdə də istifadə edildiyi görünür:

Lampa formasındakı forma dördbucaqlı bir sütun (bu sütunun izolyator olaraq istifadə edildiyi təxmin edilən və ced sütunu adlandırılan bir sütundur) üstündə dayanır. Şəkildəki formanın günümüzün elektrik lampaları ilə olan bu heyranedici bənzərliyi diqqəti cəlb edir. Volframlı elektrik lampasının ixtiraçısı olan Dr. Kolin G. Fink 1933-cü ildə qədim Misirə aid metal əşyaları tədqiq edərkən misirlilərin bundan təqribən 4300 il əvvəl misi antimon elementi ilə bürüməyi kəşf etmişdilər. Bu cür örtülmə günümüzdə elektrolizlə örtülmə adı verilən üsulla əldə edilən nəticənin eynisinin əldə edildiyi bir üsuldur.



**Denderadaki Hathor məbədinin divarlarındakı bu şəkillərdə görünən fiqurların dövrümüzdə istifadə edilən ampullarla olan bənzərliyi alimləri heyrətə salıb.**

Bu örtük onun 1933-cü ildə kükürddən istifadə edərək sınaqdan keçirdiyi üsuldur. (http://www.pip.com.au/~paceman/ANCIENT%20ELECTRICITY.html) Şəkildə təsvir edilən bu sistemin işıq yayıb-yaymadığı alimlər tərəfindən sınaqdan keçirilmişdir. Avstraliyalı elektrik mühəndisi Volter Qarn relyef üzərində təsvir edilən şəkli xırdalıqları ilə araşdırmış, şəkildəki lampanı, ilanlı teli, lampa patronu, ced sütunu kimi istifadə edilən izolyatorun eynisini düzəltmişdi. Və meydana gələn sistem ətrafı aydınlatmış, yəni işıq saçmışdır. (Yüce Tanrı'nın İzinde, Cep Kitapları, İstanbul, Nisan 1995, sf. 186) Misirdə elektrik enerjisindən istifadə ediləbiləcəyini göstərən dəlillərdən biri də ehramların iç divarlarında heç bir his izinə rast gəlinməməsidir. Əgər təkamülçü arxeoloqların iddia etdiyi kimi, işıqlandırma üçün, məsələn, məşəl və ya buna oxşar materiallardan istifadə edilmiş olsaydı, divarlarda mütləq his olmalı idi. Lakin ehramların ən uzaq dəhlizlərində belə his izi yoxdur. Lazımi işıqlandırma təmin edilmədən inşaatın davam etməsi, bundan da vacibi divarlardakı möhtəşəm rəsmlərin çəkilməsi mümkün deyildir. Bu da Misirdə elektrik enerjisindən istifadə edilmiş olma ehtimalını gücləndirir.




**Misir heroqliflərində tez-tez rast gəlinən cəd sütunu bir növ elektrik vəsaitini xarakterizə edir. Cəd sütunu generator vəzifəsini yerinə yetirir və bu şəkildə aydınlatma təmin edilir.**

**Neçə-neçə şəhərlər olmuşdur ki,** *(əhalisi)* **zülm edərkən Biz onları məhv etdik. İndi onlar özülünə qədər uçulmuşdur. Neçə-neçə tərk edilmiş quyular və neçə-neçə boş qalmış qəsrlər də vardır.** (Həcc surəsi, 45)

# ŞUMER SİVİLİZASİYASI

Darvinist alimlər bəşər tarixinin guya təkamülünü izah edərkən çox vacib bir məsələdə də acizlik nümayiş etdirirlər. Bu da bəşərin universitetlər, xəstəxanalar, dövlətlər qurmasına, musiqi bəstələməsinə, olimpiadalar təşkil etməsinə, kosmosa getməsinə səbəb olan, qısacası, insanı insan edən ən vacib xüsusiyyətlərdən biri olan ağıldır.

Təkamülçülər insan ağlının guya yaşayan ən yaxın qohumu şimpanzelərdən ayrıldıqdan sonrakı dövrdə təkamülə uğrayaraq bugünkü vəziyyətinə gəldiyini iddia edirlər. Ağılın guya təkamülündə var olduğunu iddia etdikləri sıçramaları isə beyində meydana gələn təsadüfi dəyişikliklərə və alətlər düzəltmə bacarığının təkmilləşdirici təsiri ilə əlaqələndirirlər. Bu iddialarını televiziya sənədli filmlərində, jurnal və qəzet yazılarında tez-tez gözlər önünə sərir və ilk olaraq bıçaq, sonra da mizraq düzəltməyi öyrənən meymun adamların hekayəsini danışırlar. Lakin bu təbliğat etibarsızdır. İnsanlara təlqin edilən ssenarilər elmi olaraq qələmə verilmələrinə baxmayaraq, tamamilə elmdən kənardır və yeganə mənbələri darvinist ön mühakimələridir. Və şübhəsiz, ən əhəmiyyətlisi isə insan ağlının maddəyə reduksiya olmadığıdır. Bu həqiqət materializmin təsirsizliyini rəsmiləşdirərək ağılın təkamülü iddialarını kökündən yıxır.

Həqiqətdə ağılın təkamüllə ortaya çıxdığını iddia edən təkamülçülər ibtidai bir ağıl səviyyəsinə sahib olmanın nəyə bənzədiyini şəxsi olaraq təcrübədən keçirmə və guya təkamül prosesindəki şərtləri təkrarlama imkanına sahib deyildi. Təkamülçü nəşrləri ilə tanınan "Nature" jurnalının redaktoru Henry Ci təkamülçü olmasına baxmayaraq, bu cür iddiaların elmdən kənar olduğunu qəbul edir:

*Məsələn, insanın təkamülünün bədənin duruşu, beyin həcmi ilə oddan və alətlərdən istifadə etmə kimi texnoloji uğurlar və dilin meydana gəlməsini təmin edən əl-göz koordinasiyasındakı inkişafla bağlı olaraq inkişaf etdiyi iddia edilir. Lakin belə ssenarilər subyektivdir. Sınaqlarla qəti olaraq yoxlana bilməzlər, belə olduğu halda, elmi deyillər. Ümumiyyətlə, istifadə edilmələri elmi testlərlə deyil, sahiblərinin iddia və nüfuzları ilə əsaslandırılır.* (Henry Gee, In Search of Deep Time: Beyond the Fossil Record to a New History of Life, The Free Press, A Division of Simon & Schuster, Inc., 1999, sf.5)

Bu cür ssenarilərin elmdən kənar olmasından başqa, məntiqi olaraq da əsassızdır. Təkamülçülər sözdə təkamüllə meydana gələn ağıl sayəsində alətlərdən istifadənin ortaya çıxıb inkişaf etdiyini, alətlərdən istifadə sayəsində də ağılın inkişaf etdiyini müdafiə edirlər. Halbuki, belə bir inkişaf ancaq insan ağlı elə mövcud ikən mümkündür. Bu cür izaha görə, ilk olaraq texnologiyanın yoxsa ağılın guya təkamüllə meydana gəldiyi sualı cavabsız qalır.

Darvinizmin ən təsirli tənqidçilərindən Filip Conson bu mövzuda aşağıdakıları yazmışdır:

*Ağılın məhsulu olan bir nəzəriyyə nəzəriyyəni hazırlayan ağılı uyğun bir şəkildə əsla izah edə bilməz. Mütləq doğrunu kəşf edən üstün elmi ağılın*

*hekayəsi ancaq və ancaq ağılı verilmiş istedad kimi qəbul etsəniz, qane edicidir. Ağılı öz icadlarımızın bir məhsulu olaraq izah etməyə çalışdığımız anda, çıxışı olmayan güzgülü bir koridora girmiş oluruq.* (Phillip E. Johnson, Reason in the Balance: The Case Against Naturalism in Science, Law & Education (Downers Grove, Illinois: InterVarsity Press,1995), sf. 62)



FİLİP CONSON

Darvinistlərin insan ağlını izah etməkdə aciz qalmaları bəşəriyyətin mədəni və sosial tarixi haqqında irəli sürdükləri iddiaların da əsassız olduğunu nümayiş etdirir. Eyni zamanda, buraya qədər araşdırdığımız bütün məlumat və tapıntılar da darvinist alimlərin tarixin təkamülü iddiasını tam mənası ilə əsassız edir.

Bəşər tarixi qədim dövrlərdə yaşayanların — təkamülçülərin iddialarının əksinə — təxmin ediləndən qat-qat üstün bir texnologiya və mədəniyyətə sahib olduqlarını göstərən yüzlərlə dəlil və tapıntı ilə doludur. Bunlardan biri də Şumer sivilizasiyasıdır. Şumerlərin özlərindən sonra qoyduqları əsərlər bəşər övladının minlərlə il əvvəl sahib olduğu biliklər toplusunun dəlillərindəndir.

## MÜTƏRƏQQİ BİR SİVİLİZASİYA: ŞUMERLƏR

Mesopotamiya yunan dilində "iki çay arası" mənasını verir. Bu bölgə dünyadakı ən münbit torpaqlardan biridir və bu xüsusiyyətinə görə böyük sivilizasiyaların əmələ gəldiyi bölgə olmuşdur.

Bu torpaqların cənubunda yerləşən və bu gün Küveyt və Şimali Səudiyyə Ərəbistanı kimi tanınan ərazidən çıxan bir qrup insan digər cəmiyyətlərdən fərqli dildə danışır, şəhərlərdə yaşayır, hüquqi idarə üsuluna əsaslanan bir monarxiya ilə idarə edilir və yazıdan istifadə edirdilər. Bu cəmiyyət şumerlərdir. E.ə. 3000-ci ildən etibarən böyük şəhər dövlətləri quraraq getdikcə genişlənmiş, geniş kütlələri nəzarəti altına almışdır.

(Temel Britannica, Cilt 16, Ana Yayıncılık, İstanbul: Haziran 1993, sf.203)




**E.ə 2000-ci illərdə yaxın şərq xalqlarının dünyaya yayılması, Şumerlərin mədəni vilayətləri.**

**Şumerlər e.ə. 3000-ci ildən etibarən böyük şəhər dövlətləri quraraq davamlı genişlənmiş və geniş kütləleri nəzarət altına almışdılar.**

Şumerlər sonrakı dövrlərdə Akkad cəmiyyəti tərəfindən məğlub edilərək nəzarət altına alınmışlar. Lakin akkadlar şumerlərin mədəniyyətini, dinini, incəsənətini, hüquqi sistemini, yazısını, dövlət quruluşunu mənimsəyərək Mesopotamiya mədəniyyətinin davam etməsini təmin etmişlər.

Şumerlər dövründə texnologiyadan incəsənətə, hüquqşünaslıqdan ədəbiyyata qədər bütün sahələrdə əhəmiyyətli yüksəlişlər yaşanmışdır. Şumerlərin mütərəqqi ticarəti və güclü iqtisadiyyatı var idi. Tunc metallurgiyası, təkərli vasitələr, gəmilər, heykəllər və monumental binalar həmin dövrdəki sürətli inkişafın günümüzə gəlib çatan dəlillərindən bir neçəsidir. Bundan əlavə, şumerlərin günümüzə qədər çatmamış bir çox əl işinə sahib olduğu məlumdur. Mesopotamiya şəhərləri üçün vacib ixracat malı olan yun parçaların toxunub boyanması da əlavə sənətkarlıq nümunələrinə misal olaraq verilə bilər.

(Georges Contenau, Everday Life in Babylon and Assyrıa, Edward Arnold Publishers, London, 1964)

Şumerlərin sosial sahədə də inkişaf etmiş bir sistemləri var idi. Şumer dövlətində monarxiya quruluş sistemi mövcud idi. İqtidarda olan rahib-kral dövləti bir sıra bürokratların köməkliyi ilə idarə edilirdi. Köməkçiləri məhsul yığımından sonra məhsulu xalqın arasında paylaşdırır, torpaqları gəzərək onlara nəzarət edirdi. Hər bölgədəki rahib orada yaşayan xalqın məsuliyyətini öz üzərinə götürür və xüsusilə böyük şəhərlərdə qida bölüşdürülməsini diqqətli bir şəkildə təmin edirdi. Rahiblərin bu fəaliyyətləri qeyd edilərək saxlanılırdı.



**Keçmiş cəmiyyətlərin inşa etdikləri köklü mədəniyyətlər darvinistlərin ibtidaidən aliyə doğru irəliləmə müddəasının həqiqəti əks etdirmədiyini göstərir. Şumer mədəniyyəti də bu vəziyyətin nümunələrindən biridir. Yuxarıdakı şəkildə görünən Assur maşınının hərhansı bir çəkici güc olmadan getməsi diqqət çəkicidir. Əsgərlərin geydikləri zirehli geyimlər o dövrdə zireh sənətinin nə qədər inkişaf etdiyini göstərir. Paltarlar tamamilə zirehlə örtülmüşdür və bu sayədə şəxslərin həm rahat hərəkət etmələri mümkün olur, həm də bədənləri qorunur. Maşının çətin müharibə şərtlərinə və zərbəyə davamlı olduğu görünür. Həmçinin, maşının uc qismindən qala qapısı qırmada da istifadə edildiyi anlaşılır. Bu mənada istifadə edilən vasitə və maşının gücü diqqət çəkicidir. (E.ə 2000—e.ə. 612)**

Bundan 5000 il əvvəl yaşamış şumerlərin sosial, incəsənət, elmi və iqtisadi sahəsindəki həyat tərzləri təkamülçülərin irəli sürdükləri guya "ibtidaidən aliyə doğru inkişaf edən insan" modeli ilə tamamilə ziddiyyət təşkil edir. Şumerlərin inşa etmiş olduğu böyük sivilizasiya həm öz dövründə, həm də günümüzdə belə bir çox cəmiyyətlərlə müqayisə edildikdə olduqca inkişaf etmiş bir sivilizasiyadır. Təkamülçülərin iddialarına əsasən, guya meymuna bənzərlikdən bir müddət öncə qurtulmuş, xırıltı çıxarmaqla danışmağa başlaması qısa müddət olan, hələ təzə-təzə sosiallaşmağa başlamış, heyvanları əhliləşdirməyi, əkinçiliklə məşğul olmağı yeni öyrənmiş insanların bu dərəcə inkişaf etmiş bir sivilizasiya inşa etdikləri necə olur ki, izah oluna bilmir. Açıq şəkildə görünür ki, tarixin hər dövründə insan zehni, bacarığı, zövqləri və sosial münasibətləri ilə insan olaraq var olmuşdur. Təkamülçülərin müxtəlif yayın orqanlarında tez-tez gündəmə gətirdikləri tonqal başında oturan, mağaralara sığınan, yonulmamış daşdan alətlər düzəldərək günlərini keçirən yarı meymun, yarı insan şəkilləri isə xəyal məhsulu olmaqdan irəli getməyən, tarixi, arxeoloji və elmi tapıntılarla heç bir halda uyğunlaşmayan hekayələrdən ibarətdir.

## ŞUMERLƏR VƏ ELM

Şumerlər riyaziyyatda say sistemini tətbiq etmişdilər. Günümüzdə istifadə edilən 10 sayına əsaslanan riyazi sistem əvəzinə, 60 sayına əsaslanan riyazi sistemdən istifadə etmişlər. 60 sayı hələ də bəzi hesablamalarda əhəmiyyətli yer tutur, bir saatın 60 dəqiqədən, bir dəqiqənin 60 saniyədən ibarət olması və yaxud dairədə 360 dərəcənin olması kimi... Bu səbəbdəndir ki, həndəsə və cəbrin ilk düsturlarını irəli sürən şumerlərin riyazi bilikləri günümüzdəki riyaziyyatın təməli olaraq qəbul edilir.

Bundan başqa, şumerlər astronomiyada olduqca mütərəqqi səviyyəyə yüksəlmiş, ay, il, gün hesablarını günümüzlə təxminən eyni qaydada etmişlər. 12 aydan ibarət bir təqvimə sahib olan şumerlərin təqvimindən qədim misirlilər, yunanlar və bəzi semit cəmiyyətlər də istifadə etmişdilər. Bu təqvimə görə, bir il qış və yay olmaqla, iki fəsildən ibarətdir. Yay fəsli yazda olan gecə-gündüz bərabərliyində, qış fəsli isə payızda olan gecə-gündüz bərabərliyində başlayırdı.


ZİQQURAT

Şumerlər "Ziqqurat" adlandırdıqları qüllələrdə kosmosu da tədqiq etmişdilər. (S.N.Kramer, Tarih Sümer'de Başlar, Türk Tarih Kurumu Yayınları, Ankara: 1990, sf. 224-231) Günəş və ay tutulmalarını əvvəlcədən müəyyən edə bildikləri müxtəlif qeydlərdə açıq aşkar görünür. Şumerlərin başqa bir astronomik kəşfi də bir




**Şumerlər 12 aydan ibarət bir təqvimə sahib idilər. Həmçinin, bir çox ulduzun xəritəsini də çıxarmışdılar və Merkuri, Venera, Yupiter kimi planetlərin hərəkətlərini də izləyə bilirdilər. Şumerlərin təsbitlərinin doğruluğu dövrümüzdəki tapıntılarla da təsdiqlənir. Şumerlər etdikləri müşahidələrə əsaslanaraq Günəş sistemində 12 planet olduğunu düşünürdülər. Şumerlərin əldə etdiyi bu rəqəmə Günəş və Ay da daxil idi. Şumerlərin 12 planet və ya bəzi mənbələrdə Nibiru olaraq adlandırdıqları bu planet yaxın zamanda bir çox alim tərəfindən varlığı qəbul edilən və X planeti adlandırılan 10-cu planetdir. Yuxarıdakı şəkildə şumerlər Günəş sistemini təsvir ediblər. Şəkildə Günəş ortada yerləşir və planetlər də Günəşin ətrafında fırlanırlar.**



çox ulduz külliyyatının xəritəsini tərtib etmiş olmalarıdır. Günəş və Ayın, bəzən Merkuri, Venera, Mars, Yupiter və Saturnun da hərəkətlərini izləyərək qeydə almışlar. Bundan 5000 il əvvəl şumerlərin kosmosla əlaqədar həyata keçirdikləri elmi hesablamalar bu gün kosmik gəmilərdən göndərilən təsvirlərlə sübuta yetirilir.

Heç şübhə yoxdur ki, bu vəziyyət tarixin təkamülü iddiaları ilə tamamilə ziddiyyət təşkil edir. Günümüzün nəhəng teleskopları, təkmilləşmiş kompyuterlər, hər cür texniki bazaya sahib müşahidə mərkəzləri sayəsində ancaq yeni əldə edilmiş məlumatları bundan 5000 il əvvəl kəşf etmiş bir cəmiyyət mövcud idi. Belə olan vəziyyətdə, təkamülçü alimlər ön mühakimələrini bir kənara qoyub elmi və tarixi kəşflərin onlara göstərdiyi həqiqətlərə uyğun hərəkət etməlidir. Və bu həqiqət darvinistlərin iddia etdikləri kimi, sivilizasiyaların daima ibtidaidən aliyə doğru inkişaf etdiyinin, cəmiyyətlərin və mədəniyyətlərin təkamül keçirdiyi fikrinin elmi və tarixi bir əsası olmadığını göstərir. Sivilizasiyalar quran, musiqi bəstələyən, sənət əsərlərin meydana gətirən, görkəmli binalar inşa edən, kosmosla əlaqədar araşdırmalar aparıb əhəmiyyətli məlumatlar əldə edən, elmi uğurlara imza atan, texnoloji kəşfləri nümayiş etdirən insanın tarixini guya təkamül prosesi ilə izah etməyə çalışmanın özülündə yatan səbəb bir sıra ideoloji məyusluqdur. Alimlərə yaraşan davranış isə ideoloji məyusluğa görə deyil, sınaqlara, kəşflərə, müşahidələrə, qısacası, elmi məlumatların əks etdirdiyi dəlillərə uyğun davranış nümayiş etdirməkdir.

**Göylərin və yerin hökmranlığı Allaha məxsusdur. Allah hər şeyə qadirdir.** (Ali İmran surəsi, 189)

## NƏMRUD LİNZASI

1850-ci ildə arxeoloq Con Layardın (John Layard) kəşfi “Linzanı ilk kim istifadə edib?” sualını gündəmə gətirmişdi. Con Layard indiki İraq ərazisində apardığı qazıntılarda bundan 3000 il əvvələ aid linza formasında bir əşya tapmışdır. Hal-hazırda, İngilis Muzeyinin arxivində olan bu əşya elm dünyasında məlum olan ilk linzanın assuriyalıların dövründə istifadə edildiyini göstərmişdi. Roma Universitetindən professor Ciovanni Pettinato (Giovvani Pettinato) da elm tarixinin müəyyən edilməsi mövzusunda önəmli kəşf kimi müəyyən edilən bu əşyanın assuriyalıların geniş astronomiyaya aid biliklərinin qaynağını bildirdiyini qeyd edir. Assuriyalılar Saturn planetini və planetin ətrafındakı halqaları müəyyən etmiş bir cəmiyyətdir.

(http://news.bbc.co.uk/1/low/sci/tech/380186.stm)

Bu linzanın hansı məqsədlə istifadə edilmiş olduğu, əlbəttə ki, mübahisə edilə bilən bir məsələdir, lakin aşkar bir həqiqət var ki, o da keçmiş

toplumların hamısını təkamülçü alimlərin irəli sürdüyü kimi sadə həyat tərzi keçirməmələridir. Keçmişdəki cəmiyyətlər də elm və texnologiyadan istifadə etmiş, əsaslı sivilizasiyalar qurmuş, inkişaf etmiş həyat tərzi keçirmişlər. Həyat tərzləri haqqında günümüzə olduqca az məlumat gəlib çatmışdır. Lakin gəlib çatan məlumatların demək olar ki, hamısı bu xalqların təkamül keçirmədiyini açıq-aşkar göstərir.

**Allah göyləri və yeri gerçək olaraq yaratmışdır. Həqiqətən, bunda möminlər üçün bir ibrət vardır.** (Ənkəbut surəsi, 44)



**Dövrümüzdən təxminən 3000 il əvvələ aid lupa görüntüsündəki parça "elm tarixinin müəyyən edilməsi mövzusunda mühüm bir tapıntı" olaraq qiymətləndirilir. Elm tarixi insanın ilk ortaya çıxdığı andan etibarən zehni, bacarıqları və zövqləri ilə insan olaraq mövcud olduğunu göstərir.**

## BAĞDAD BATAREYASI

1938-ci ildə alman arxeoloq Vilhelm Könih (Wilhelm Konig) tərəfindən tapılan vaza şəklində bir əşya "Bağdad batareyası" olaraq adlandırılmışdır. Yaxşı, bəs təxminən 2000 illik bir keçmişi olduğu hesablanan bu əşyanın batareya olaraq istifadə edildiyi qənaətinə necə gəlinmişdir? Belə ki, əgər bu əşyanın batareya olaraq istifadə edildiyi doğru olarsa -hansı ki, aparılan araşdırmalar doğru olduğunu göstərir- sivilizasiyanın daima inkişaf etdiyi sübut ediləcək və keçmişdəki cəmiyyətlərin isə geridə qalmış şərtlərdə yaşadığına dair bütün nəzəriyyələr yerlə bir olacaqdır. Ağız hissəsi asfaltla örtülmüş olan bu gil qabın içində misdən bir boru var. Alt hissəsi mis disklə bağlanan bu borunun içərisindəki dəmir borucuq üst hissədəki asfalt qapaq vasitəsi ilə bərkidilmişdir. Borucuq borunun içində heç bir nöqtə ilə təmas etmədən sallanmış vəziyyətdədir.



Qabın bir elektrolitlə doldurulması zamanı isə cərəyan əmələ gətirən bir batareya əldə edilmiş olunur. Məhz bu, elektrokimyəvi reaksiya olaraq bilinən hadisədir və günümüzdə istifadə edilən

batareyaların işləmə mexanizmindən heç də fərqlənmir. Bağdad batareyasını əsas götürərək düzəldilən modellərdə aparılan sınaqlar zamanı 1.5-2 volt arasında enerji əldə edilmişdir.




**Şəkildə 2000 il əvvələ aid "Bağdad batareyası" olaraq adlandırılan bu parça ilə bağlı araşdırmalar bunun o dövrdə müasir batareya kimi istifadə edildiyini sübut edir.**

Belə vəziyyətdə vacib olan daha bir sual gündəmə gəlir: bundan 2000 il əvvəl batareya nə üçün istifadə edilirdi? Ortada bir batareya olduğuna görə, batareya ilə istifadə edilən bir çox cihaz və alətlərin olmasının vacibliyi açıq aşkardır. Və bu vəziyyət bundan 2000 il əvvəl yaşayan insanların bilinən və təxmin ediləndən qat-qat inkişaf etmiş həyat standartlarına sahib olduqlarını bir daha göstərir.

## TARİXİN TƏKAMÜLÜ İDDİALARINI MƏHV EDƏN BAŞQA BİR SİVİLİZASİYA: MAYYALAR

Təkamülçü nəşrlərin hamısında ortaq bir nöqtə var. Bu nəşrlərdə bir canlıya aid bioloji struktur və ya xüsusiyyətin nəyə görə təkamülə uğramış ola biləcəyinə dair xəyali ssenarilər verilir. Diqqəti cəlb edən məqam isə təkamülçülərin xəyal gücü ilə meydana gətirdikləri hekayələrin elmi həqiqət imiş kimi izah edilməsidir. Halbuki, bu nəşrlərdə izah edilənlər darvinist nağıllardan başqa bir şey deyil. Təkamülçülər öz beyinlərində qurduqları

ssenariləri ictimaiyyətə guya elmi sübut kimi təqdim etməyə çalışırdılar. Darvinist nağıllar hər hansı elmi bir dəyər daşımır; təkamülçü iddialar üçün də qəti olaraq sübut təşkil edə bilməz.



**QƏDİM MAYA VİLAYƏTLƏRİNDƏN OLAN UXMALDAKI BİR BİNA QALIĞI**

**Bəzi təkamülçü alimlər mayaların metal əşya istifadə etmədiklərini iddia edirlər. Lakin maya qalıqlarındakı daşların üzərindəki daşişləmənin necə hasil olduğunu açıqlaya bilmirlər. Çox rütubətli bir mühit olan Amazon meşələrinin yüksək bölgələrində metal əşyalar çox qısa müddətdə oksidləşib çürüyürlər. Belə ki, mayaların istifadə etdikləri metal əşyaların izləri dövrümüzə gəlib çatmaya bilər. Amma qalan daş abidələr metalın tanındığını və istifadə edildiyini göstərir. Çünki bu dərəcə incə və təfərrüatlı daşişləmənin sadəcə daş alətlərlə həyata keçirilməsi mümkün deyil.**

Təkamülçü ədəbiyyatda tez-tez rast gəlinən hekayələrdən biri də guya meymunabənzər varlıqların insana çevrilməsi və ilk dövrlərdə guya ibtidai olan insanın da müəyyən bir proses içərisində sosiallaşaraq inkişaf etməsidir. Heç bir elmi sübutu olmadığına baxmayaraq, yarı dik yeridiyi və xırıltılar çıxardığı ehtimal edilən “mağara adamları”nın ailəsi ilə birgə gəzərkən və ya əllərindəki kobud alətlərlə ov edərkən, yaxud da bir ocaq başında oturarkən şəkillərinin çəkildiyi sözdə ibtidai insan canlandırması da bu hekayənin ən məşhur hissəsidir.

“İnanın və belə olduğunu xəyalınıza gətirin” mənasını verən bu canlandırmalar təkamülçülərin insanları konkret həqiqətlərlə deyil, xəyali nağıllarla inandırmağa çalışdıqlarının ən bariz nümunəsidir. Çünki bunlar elmi dəlillərə deyil, sahibinin inancına və ön mühakiməsinə əsaslanan hekayələrdir.



**Əl Mirador, Qvatemalada eradan əvvəlki dövrə aid maya vilayətinin rekonstruksiyası.**



**Daş üzərindəki işləmə mayaların daşişləmə üçün lazım olan texniki struktura malik olduqlarını göstərir. Polad yeyələr, linklər və başqa alətlər olmadan daş üzərində sənət əsərləri yaratmaq demək olar ki, qeyri-mümkündür.**

**Sol Üst: Cichen Itzadaki döyüşçülər məbədi**

**Sol Alt: Kral Hanab Pakalın dövründə tikilmiş məbəd**

**Sağ: Rosalila abidəsinin qərb binasının üst qismi**

Təkamülçülər bu hekayələri danışmağın səhv olduğunu bilə-bilə bunları peşəkar ədəbiyyatda saxlayır, ictimaiyyətə elmi həqiqətlər kimi təqdim etdikdə heç bir maneəyə rast gəlmirlər. Lakin təkamülçülərin tez-tez izah etdiyi bu ssenarilər təkamül nəzəriyyəsinə elmi dəstəyi təşkil edir. Çünki insanın meymunabənzər əcdaddan törədiyi iddiasını müdafiə edən bir ədəd belə elmi tapıntı tapılmamışdır. Eyni şəkildə, cəmiyyətlərin ibtidaidən aliyə doğru təkamül keçirdiyini göstərən heç bir arxeoloji və tarixi tapıntı yoxdur. İnsan var olduğu ilk gündən bəri insandır və hər dövrdə müxtəlif sivilizasiyalar, mədəniyyətlər qurmuşdur. Bu sivilizasiyalardan biri də qoyduğu izlərlə heyranlıq doğuran Mayya sivilizasiyasıdır.

Tarixi mənbələrdə bu ərazilərdə yaşayan insanlar üçün gələn uzun boylu, ağ paltarlı bir adamdan bəhs edilir. Kitabələrdə əks olunan məlumata görə, qısa bir müddətə tək İlah inancının yayıldığı və elmdə, incəsənətdə inkişafın müşahidə edildiyi məlumdur.

**Məgər onlar yer üzündə gəzib dolaşaraq özlərindən öncəkilərin aqibətini görmədilərmi? Onlar bunlardan da güclü idilər. Onlar torpağı şumlayır, yer üzünü bunlardan daha çox abadlaşdırırdılar...** (Rum surəsi, 9)

## PEŞƏKAR RİYAZİYYATÇI OLAN MAYYALAR

E.ə. 1000-ci illərdə Mərkəzi Amerikada, digər sivilizasiyalardan olduqca uzaqda yaşayan mayyalar Misir, yunan və ya Mesopotamiya sivilizasiyaları kimi inkişaf etmiş bir sivilizasiya qurmuşdular. Mayyaların ən vacib xüsusiyyəti isə astronomiya və riyaziyyat kimi elm sahələrində işləmələri və olduqca mürəkkəb yazı dilləri ilə elmə rəhbərlik etmiş olmalarıdır.

Mayyaların zaman, astronomiya və riyaziyyat sahələrindəki bilikləri həmin dövrün qərb dünyasının məlumatından min il irəlidə idi. Məsələn, Yer kürəsinin bir illik dövrü haqqındakı hesabları kompyuter icad edilmədən əvvəl edilən hesablardan daha dəqiq və xətasızdır. Riyaziyyatda sıfır mövhumu avropalı riyaziyyatçıların kəşfindən min il əvvəl mayyalar tərəfindən istifadə edilirdi. Riyaziyyatda çağdaşlarından qat-qat mürəkkəb rəqəm və işarələrdən istifadə etmişlər.

## MAYYA TƏQVİMİ

Mayyaların istifadə etdiyi təqvim də mütərəqqi sivilizasiyanı göstərən dəlillərdən biridir. Mayyalar tərəfindən istifadə edilən "Haab təqvimi" 365 gündən ibarətdir. Bundan başqa, mayyalar bir ilin 365 gündən bir az daha uzun olduğunu da hesablamışlar. Mayyaların apardığı hesablamalara görə, bir il 365.242036 gündən ibarətdir. Günümüzdə istifadə edilən Qreqoryan təqvimi isə 365.2425 gündən ibarətdir. (http://webexhibits.org/calendars/calendar-mayan.html) Göründüyü, kimi iki rəqəm arasında çox kiçik fərq var. Bu da mayyaların riyaziyyat və astronomiya sahəsindəki peşəkarlıqlarını nümayiş etdirən digər bir dəlildir.



| Gün | Sembol | İsim | Gün | Sembol | İsim | Gün | Sembol | İsim | Gün | Sembol | İsim |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 1 | | Imix | 6 | | Cimi | 11 | | Chuen | 16 | | Cib |
| 2 | | Ik | 7 | | Manik | 12 | | Eb | 17 | | Caban |
| 3 | | Akbal | 8 | | Lamat | 13 | | Ben | 18 | | Etznab |
| 4 | | Kan | 9 | | Muluc | 14 | | Ix | 19 | | Cauac |
| 5 | | Chicchan | 10 | | Oc | 15 | | Men | 20 | | Ahau |



**Maya təqvimi dövrümüzdə istifadə edilən 365 günlük Qriqoryan təqvimi ilə demək olar ki, eynidir. Mayalar bir ilin 365 gündən bir az da uzun olduğunu hesablamışdılar.**

**Sağda: Azteklərin daşa həkk etdiklər təqvimləri görünür.**

## MAYYALARIN ASTRONOMİYAYA AİD BİLİKLƏRİ

Mayyalardan günümüzə gələn və “Kodeks” adlandırılan üç kitabda mayyaların həyat tərzinə və astronomiya elminə dair önəmli məlumatlar var. Madrid kodeksi, Paris kodeksi və Drezden kodeksi kimi adlandırılan bu üç kitabdan Drezden kodeksi mayyaların astronomiya haqqında nə qədər geniş məlumata malik olduqlarını göstərməsi baxımından çox əhəmiyyətlidir. Mayyalar olduqca mürəkkəb bir yazı üslubuna malikdir və bu günə qədər Mayya yazısının 5-30% hissəsi oxuna bilmişdir. Bu belə, mayyaların nə qədər mütərəqqi bir elm səviyyəsinə çatdıqlarını göstərmək üçün kifayətdir.



**Venera orbitinin hər 6000 ildə geri alınmasının vacib olduğunu müəyyənləşdirəcək qədər mükəmməl bir astronomiya bilgisi, keçmişdə yaşamış insanların necə bir mədəniyyətə sahib olduqlarını göstərir.**

Məsələn, Drezden kodeksinin 11-ci səhifəsində Venera planetinə dair məlumatlar var. Mayyalar bir Venera ilinin 583.92 gün olaraq hesablamışlar və bu rəqəmi yuvarlayaraq 584 gün olaraq qəbul etmişlər. Bununla birlikdə, minlərlə illik Venera dövrələrini çertyojları ilə ortaya qoymuşlar. Eyni kodeksdə iki səhifə Marsa, dörd səhifə Yupiterə və onun peyklərinə aid məlumatlara, səkkiz səhifə də Ay, Merkuri və Saturna ayrılmışdır. Bu səhifələrdə sözü gedən planetlərin Günəş ətrafındakı dövrləri, bir-biri ilə əlaqələri və Yer ilə əlaqələri kimi olduqca mürəkkəb hesablamalarla müəyyən edilən məlumatları açıqlamışlar.



**Bir çox tədqiqatçı yuxarıda görünən şəkilin mayaların kosmik vasitə istifadə etdiklərini göstərən bir şəkil olduğuna inanırlar.**

Mayyaların astronomiyaya aid məlumatları Veneranın orbitinin hər 6000 ildə bir gün geri çəkilməsinin zəruri olduğunu müəyyən edəcək qədər mükəmməldir. Belə bir məlumat bazası necə əldə edildiyi isə günümüzdə hələ də astroloq, astrofizik və arxeoloqlar tərəfindən müzakirə edilməkdədir. Günümüzdə belə mürəkkəb hesablar kompyuter texnologiyasının köməkliyi ilə həyata keçirilə bilir. Bu günün elm adamları kosmos haqqında məlumatları hər cür texnoloji və elektron cihazlarla təmin edilmiş müşahidə mərkəzlərində və bazalarında əldə edirlər. Mayyalar isə bundan yüzlərlə il əvvəl günümüzün texnologiyası ilə əldə edilən məlumat və hesablamalara sahibdirlər. Bu vəziyyət bir daha cəmiyyətlərin daima guya ibtidaidən mədəniyyətə doğru inkişaf etdikləri tezisini əsassız edir. Tarixdə yaşamış bir çox cəmiyyət müasir cəmiyyətlər qədər, hətta bəzilərindən daha çox yüksək bir mədəniyyət səviyyəsinə sahib idi. Və günümüzdə də keçmişdə yaşamış cəmiyyətlərin səviyyəsinə belə çatmamış gerilikdə yaşayan bir çox xalqlar

mövcuddur. Qısaca olaraq qeyd etmək olar ki, sivilizasiyalar bəzən irəli gedir, bəzən geriləyir, bəzən isə həm yüksək, həm də geri sivilizasiyalar eyni dövr içərisində yaşaya bilər.



**Maya mədəniyyətinə aid yuxarıdakı şəkil maya rəhbərlərindən Pakalın məzarının qapağındadır. Pakalın üzərində oturduğu vasitə bir növ motosikleti xatırladır. Bu mayalar dövründə istifadə edilən o dövrə aid motorlu bir vasitə ola bilər.**

## QƏDİM MAYYA ŞƏHƏRİ OLAN TİKALDAKI YOL ŞƏBƏKƏSİ

Tikal ən qədim Mayya şəhərlərindən biridir. E.ə. 8-ci əsrdə qurulmuşdur. Qalın bir meşəlik ərazidə qurulmuş Tikal şəhərində aparılan arxeoloji qazıntılarda indiyə qədər evlər, saraylar, ehramlar, məbədlər, yığıncaq yerləri aşkar edilmişdir. Bütün bu yerlərin bir-birləri ilə yollar vasitəsi ilə əlaqəli olduğu müşahidə edilmişdir. Hətta təyyarədən çəkilmiş bəzi radar şəkillərində tam bir kanalizasiya sisteminin, təxminən şəhərin hər yerini əhatə edən bir də sulama sistemi olduğu aydın olmuşdur. Nə dəniz, nə də çay kənarında yerləşən Tikalda sulamanın həyata keçirilə bilməsi üçün təxminən on su anbarından istifadə edildiyi aşkarlanmışdır.

Tikaldan meşəyə doğru uzanan beş əsas küçə var. Bunlar arxeoloqlar tərəfindən mərasim yolları və yaxud seramoni küçələri olaraq adlandırılır. Havadan çəkilmiş foto şəkillər isə Mayya şəhərlərinin geniş bir yol şəbəkəsi ilə bir-birilərinə bağlı olduqlarını göstərir. Təxminən 300 km uzunluğundakı bu yollar xırdalıqlarına qədər mühəndislik işlərinin aparıldığını nümayiş etdirən xüsusiyyətə malikdir. Bütün yollar qırılmış qayalardan salınmış və üzəri açıq rəngdə davamlı bir təbəqə ilə örtülmüşdür. Xətkeşlə çəkilmiş kimi

düz bir xətt üzrə salınan bu yolların necə inşa edilmiş olduğu, yollar inşa edilərkən mayyaların istiqaməti necə müəyyən etmiş olmaları, hansı vasitə və materiallardan yararlanmış olduqları cavablandırılması zəruri olan məsələdir. Təkamülçü anlayışa görə, bu suallara ağıllı və məntiqli cavablar verilməsi mümkün deyil. Çünki söhbət mühəndislik xariqəsindən və kilometrlərlə uzunluqdakı yollardan gedir. Kifayət qədər açıqdır ki, bu yollar incə hesabların, ölçmələrin, istiqamətin təyin edilməsinin və lazımi vasitə və materiallardan istifadəsinin əsəridir.



**Darvinistlər heç bir elmi dəlilləri olmamasına baxmayaraq, insanın keçmişdə ibtidai bir canlı olduğunu, ibtidai həyat tərzi keçirdiyini və zaman ərzində zəka səviyyəsinin inkişaf etdiyini önə sürürlər. Arxeoloji tapıntılar isə bu iddiaların etibarsızlığını ortaya qoyur. Məsələn, qədim Maya şəhərlərindən biri olan Tikalda aparılan qazıntı işlərində mühəndislik və planlama möcüzəsi ortaya çıxarılmışdır. Hava fotoqrafları Maya şəhərlərinin geniş bir yol şəbəkəsi ilə bir-birlərinə bağlı olduqlarını göstərir. Bütün bunlar tarixin hər dövründə inkişaf etmiş mədəniyyətlərin mövcud olduğunu göstərir.**

## MAYYALARIN İSTİFADƏ ETDİYİ DİŞLİ ÇARXLAR

Mayyaların yaşadığı ərazilərdə aparılan araşdırmalar onların dişli çarx mexanizminə malik alətlər düzəltdiklərini göstərir.

Mayyaların əhəmiyyətli şəhərlərindən biri olan Kopanda çəkilmiş altdakı foto şəkil bunun dəlillərindən biridir. Dişli çarx mexanizmindən istifadə edən bir cəmiyyət maşınqayırma haqqında biliyə sahib olduğuna görə, qüvvət və hərəkətin qarşılıqlı təsirini bilməli idi.


KOPANDA TAPILAN MAYYA DİŞLİ ÇARXLARI

Bu biliklərə sahib olmayan bir insanın dişli çarx mexanizminin meydana gətirməsi mümkün

deyil. Məsələn, sizdən bu şəkillərə bənzər bir mexanizm düzəltmənizi istəsələr, lazımı təlim görmədən bu mexanizmi düzəltmək və qüsursuz işləməsini təmin etmək qeyri-mümkün olar.

Halbuki, mayyalar bunu bacarırdılar. Bu da mayyaların bilik səviyyəsinin əhəmiyyətli bir göstəricisidir və təkamülçülərin iddia etdiyi kimi, keçmişdə yaşayanların geridə qalmış olmadıqlarının isbatıdır.

Buraya qədər əldə edilən məlumatlarda bizə keçmişdə yaşamış cəmiyyətlərin inkişaf etmiş sivilizasiyalarından bir neçə kiçik misal çəkilir. Bu misallar olduqca vacib bir həqiqəti göstərir. İllərlə təkamülçü zehniyyətlə təlqin edilən keçmişdə yaşamış cəmiyyətlərin geridə qalmış, ibtidai və sadə həyat tərzi sürməsi fikri doğru deyil. Tarixin hər dövründə müxtəlif sivilizasiya səviyyələrində müxtəlif mədəniyyətlərə sahib olan cəmiyyətlər yaşamışdır. Lakin heç biri digərindən təkmilləşməmişdir. Bundan 1000 il əvvəl bəzi geridə qalmış sivilizasiyaların yaşamış olması tarixin təkmilləşdiyini, cəmiyyətlərin ibtidaidən aliyə doğru inkişaf etdiyini göstərən bir vəziyyət deyil. Çünki bundan min il əvvəl bu geri cəmiyyətlərlə bərabər, elm və texnologiyada inkişaf etmiş köklü sivilizasiyalar quran son dərəcə inkişaf etmiş cəmiyyətlər də yaşamışdır. Cəmiyyətlərin inkişaf etməsində mədəniyyətlərin bir-birilərinə olan qarşılıqlı təsiri, mədəniyyətlərin bir-birinə ötürdüyü biliklər bazası, şübhəsiz ki, vacib rol oynayır. Amma bu təkmilləşmə deyil.

Qurani-kərimdə də keçmişdə yaşamış cəmiyyətlərdən misallar verilərkən bunların bəzilərinin inkişaf etmiş bir sivilizasiya qurduqları xəbər verilir:

**Məgər onlar yer üzündə gəzib-dolaşıb özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmədilərmi? Onlar bunlardan daha qüvvətli idilər və yer üzündə daha çox iz qoymuşdular. Allah onları günahlarına görə** *(əzabla)* **yaxaladı və onları Allahdan qoruyan olmadı.** (Ğafır surəsi, 21)

**Məgər onlar yer üzündə gəzib dolaşaraq özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmədilərmi? Onlar bunlardan sayca daha çox, daha qüvvətli idilər və yer üzündə daha çox iz qoymuşdular. Müvəffəq olduqları onlara bir fayda vermədi.** (Ğafır surəsi, 82)

**Neçə-neçə şəhərlər olmuşdur ki,** *(əhalisi)* **zülm edərkən Biz onları məhv etdik. İndi onlar özülünə qədər uçulmuşdur. Neçə-neçə tərk edilmiş quyular və neçə-neçə boş qalmış qəsrlər də vardır.** (Həcc surəsi, 45)

Quranda xəbər verilən bu həqiqətlər arxeoloji tapıntılarla da dəstəklənir. Yer üzərindəki bir çox arxeoloji tapıntı və keçmiş cəmiyyətlərin yaşayış yerləri tədqiq edildikdə, həqiqətən də, bu cəmiyyətlərin əksəriyyətinin günümüzdəki bəzi cəmiyyətlərdən daha inkişaf etmiş bir səviyyədə yaşadıqları və inşaat texnologiyasında, astronomiyada, riyaziyyatda, tibdə çox yüksək səviyyəyə çatdıqları görünür. Bu da darvinistlərin tarixin və cəmiyyətlərin təkamülü nağılını yenə də əsassız edir.



**Məgər onlar yer üzündə gəzib-dolaşıb özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmürlərmi? Onlar ki bunlardan daha qüvvətli idilər. Göylərdə və yerdə Allahdan qaçıb xilas ola biləcək heç bir şey yoxdur. Həqiqətən, O, Biləndir və** *(hər şeyə)* **Qadirdir.** (Fatir surəsi, 44)

## HƏLƏ DƏ AÇIQLANMAYAN NAZCA ŞƏKİLLƏRİ





**45 metr uzunluğunda hörümçək və insan fiquru**

Perunun Liman şəhərindəki Nazca xətləri alimlərin açıqlaya bilmədikləri tapıntılardan biridir. 1939-cu ildə New York Universitetindən Dr. Paul Kosokun həmin bölgəni havadan müşahidə etməsi ilə ortaya çıxan bu xətlər olduqca təəccübləndiricidir. Kilometrlərlə uzanan bu xətlər bəzən bir hava limanını, bəzən müxtəlif quşları, bəzən meymunları, bəzən də hörümçəkləri xatırladır. Xətlərin Perunun bu quru çöl ərazisində kim tərəfindən, nə

məqsədlə və necə çəkildiyi hələ də naməlumdur. Müxtəlif alimlər bu mövzuda fərqli fərziyyələr irəli sürmüş, lakin bu fərziyyələrdən heç biri hələ təsdiqlənməmişdir. Digər tərəfdən kilometrlə uzanan, müəyyən şəkillər yaradan bu xətləri çəkən insanların bəzi alimlər tərəfindən iddia edildiyi kimi ibtidai həyat yaşamadıqları aydındır. Bu insanlar ancaq müəyyən bir yüksəklikdən görünə bilən və nə olduğu anlaşıla bilən şəkilləri qüsursuz bir nizam içində meydana gətirmişdilər. Əlbəttə bu düşündürücü və heyrət doğuran bir vəziyyətdir.







**Solda:** **Böyük kolibri şəkli 140 metr uzunluğunda**
**Sağda:** **Uzunluğu 58 metr, genişliyi 93 metr olan böyük meymun şəkli**
**Altda:** **İt fiquru**




**Əlbəttə tarixi mərhələdə hər sahədə böyük irəliləyişlər olmuş, elm və texnologiyada böyük nailiyyətlər qazanılmışdır. Lakin bu dəyişiklikləri təkamülçülərin və materialistlərin iddia etdiyi kimi "təkamül" mərhələsi olaraq təqdim etmək ağıllı və elmi yanaşma deyil. Mədəniyyət və elmi təcrübə sayəsində texnologiya və elm kimi sahələrdə davamlı bir inkişaf vardır. Lakin dövrümüzdəki insanla minlərlə il əvvəl yaşayan bir insan arasında necə fiziki xüsusiyyətlər baxımından bir fərq yoxdursa, zəka və bacarıq baxımından da bir fərq yoxdur. 20-ci yüzillikdə insanların beyin həcmi və zəkası daha çox inkişaf etdiyi üçün daha üstün bir sivilizasiyaya sahib olduqları düşüncəsi təkamül nəzəriyyəsinin təlqinləri nəticəsində yaranmış yanlış dünyagörüşdür.**

## DİLİN TƏKAMÜLÜ MÜƏMMASI

Tarixin təkamülü hekayəsini izah edərkən təkamülçülərin qarşısına çıxan bir çox vacib problemlər mövcuddur. Bunlardan biri insan şüurunun necə ortaya çıxdığı, digəri isə nitqin ilk olaraq necə meydana gəlməsidir. Bu iki məsələ insanı digər canlılardan ayıran əhəmiyyətli xüsusiyyətlərdir.

İnsanlar danışarkən düşüncələrimizi dil sayəsində nizamlı qəliblərlə və qarşı tərəfin başa düşəcəyi formada mənalı ifadələrlə çatdırırıq. Bütün bunlar son dərəcə özəlləşmiş əzələ hərəkətləri və söz sırasını tələb etdiyi halda, biz bunlara diqqət vermirik. Biz sadəcə danışmaq istəyirik. 100-ə yaxın əzələnin həmahəng şəkildə yığılıb açılaraq səslər, hecalar və sözlər tələffüz etməsi ilə və isim, fel, əvəzlik kimi nitq hissələrinin uyğun sıralanması ilə qarşı tərəfin başa düşəcəyi cümlələr meydana çıxır. Bu qədər mürəkkəb mərhələlərə əsaslanan bacarıqdan istifadə etmək üçün bizim istəməkdən başqa, haradasa heç nə etməməyimiz nitqin bioloji quruluşla məhdudlaşan bir bacarıq olmadığını açıqca göstərir.



**Yer üzündə bir-birindən fərqli dillərdə danışan bir çox fərqli irq vardır və mövcud bütün dillər olduqca mürəkkəbdir. Bu mürəkkəbliyin mərhələləli olaraq necə qazanıldığı təkamülçülərə görə xəyal belə edilə bilməz.**

İnsanın nitq bacarığı təkamül prosesinin xəyalən labüd olması ilə və yaxud xəyali mexanizmləri ilə açıqlanmayan son dərəcə mürəkkəb bacarıqdır. Təkamülçülər uzun müddətli araşdırmalara baxmayaraq, son dərəcə mürəkkəb bir bacarıq olan nitqin sadə heyvani ünsiyyət vasitələrindən təkmilləşdiyi istiqamətindəki iddialara dəlil göstərmək cəhdləri uğursuz olmuşdur. Pensilvaniya Universitetindən David Premakın "İnsan nitqi, təkamül nəzəriyyəsi üçün bir xəcalətdir" (Swisher III, Roger Lewin, Java Man, Abacus, London, 2002, sf. 205) kimi sözləri bu uğursuzluğu açıq-aydın gözlər önünə sərir.

Məşhur dilçi Derek Bikerton bu xəcalətin səbəblərini qısaca belə şərh etmişdir:

*Nitq insandan əvvəlki bir nəsildən gəlmiş ola bilərmi? Xeyr. Heyvanların ünsiyyət vasitələrinə oxşayırmı? Xeyr... Heç bir meymun gərgin təlim keçməsinə baxmayaraq, dilçiliyin qaydalarının əsaslarına yiyələnə bilməmişdir. Sözlər, söz sırası necə meydana gəldi? Bu problem nitqin təkamülünün özəyində qalır.*

(Derek Bickerton, "Babel's Cornerstone," New Scientist (vol. 156, October 4, 1997, sf. 42)

Yer üzərində mövcud olan bütün dillər mürəkkəbdir və bu mürəkkəbliyin mərhələli olaraq necə qazanılmış olması təkamülçülər üçün xəyal belə edilməzdir. Təkamülçü Riçard Dokinzə (Richard Dawkins) görə ən ibtidai qəbilə dilləri də daxil olmaqla, dünyadakı hər dil yüksək dərəcədə mürəkkəbdir:



RİÇARD DOKİNZ

*Bu mövzuda açıq misal nitqdir. Heç kim necə başlandığını bilmir... Semantika, yəni sözlər və mənalarının mənşəyi də eyni dərəcədə müəyyən edilməmişdir... Dünyadakı minlərlə dilin hamısı çox mürəkkəbdir. Bunun mərhələli olaraq inkişaf etdiyini düşünməyə meyilliyəm, lakin belə olmasının zəruriliyi tam olaraq açıq deyil. Bəziləri müəyyən bir yer və müəyyən bir zamanda tək bir zəka tərəfindən icad edildiyini və ani olaraq başlandığını düşünür.*

(Richard Dawkins, Unweaving the Rainbow Boston, Houghton-Miflin Co., 1998, sf. 294)

V.K.Vilkins (W. K. Wilkins) və J. Veykfild (J. Wakefield) adlı iki beyin üzrə təkamülçü tədqiqatçı isə bu mövzu ilə əlaqədar bunları demişdir:

*Dilin təkamülünün mərhələləri ilə əlaqədar dəlil yoxdur. Buna baxmayaraq, alternativ fikirləri qəbul etmək çətindir. Əgər növün özünəməxsus xüsusiyyətləri hissələrə ayrılmış şəkildə təkmilləşmirsə, bu vəziyyəti izah etmək üçün iki yol vardır. Ya hələ kəşf etmədiyimiz bir güc, bəlkə də İlahi bir müdaxilə ilə lazımi formada yerləşdirilmişdir, ya da növlərin inkişafına nisbətən ani bir dəyişikliyin, bəlkə də bir növ öz-özünə əmələ gələn və ya geniş yayılmış mutasiyanın nəticəsidir... Amma belə təsadüfi bir mutasiyanın təsadüfi təbiəti bu iddianı şübhəli edir. Bundan əvvəl müəyyən edildiyi kimi (Pinker və Blum, 1990) dil kimi mürəkkəbə və görünüşə görə vəzifələrinə bu qədər ideal bir şəkildə uyğun bir sistemə yol açacaq mutasiyanın ehtimalı yox deyiləcək qədər aşağıdır.* (Wilkins, W.K. & Wakefield, J., Brain evolution and neurolinguistic preconditions. Behavioral and Brain Sciences 18 (1): 161-226)


NOAM ÇOMSKİ

Dilçi Noam Çomski də nitq qabiliyyətinin mürəkkəbliyi qarşısında düşüncələrini belə ifadə edir:

*Nitqin əmələ gəlməsi ilə əlaqədar bura qədər heç bir söz demədim. Səbəbi isə deyilməli çox az sözün olmasıdır. Kənardan görünən bir neçə səciyyəvi xüsusiyyətdən başqa, nitq böyük ölçüdə bir sirdir.*

(Noam Chomsky, Powers and Prospects, sf.16)

Təkamülçü ön mühakimələrdən asılıb qalmayan insan üçün isə nitq bacarığının qaynağı çox açıqdır. Bu qabiliyyəti insana verən uca Allahdır. Allah insanlara nitqi ilham edir və onları danışdırır. Bu həqiqət bir Quran ayəsində belə xəbər verilir:

**...** *(Dəriləri)* **deyəcək: "Hər şeyi danışdıran Allah bizi danışdırdı. Sizi ilk dəfə O yaratmışdır və siz** *(axırda)* **Ona qaytarılacaqsınız".** (Fussilət surəsi, 21)

Təkamülçülər dilin əsaslandığı bioloji quruluşların mürəkkəbliyini izah edə bilməyəcəkləri kimi, dili mümkün edən şüurun əsasını da izah edə bilmirlər. Maddəyə heç bir şəkildə reduksiya olunmayan insan şüuru və dildəki mürəkkəblik dili üstün bir ağılın yaratdığını göstərir. Bu üstün ağılın sahibi Rəbbimiz olan uca Allahdır.

## HAQQ DİN TARİXİN İLK GÜNÜNDƏN BƏRİ VAR İDİ

Tarixin və cəmiyyətin təkamülə uğraması hiyləsini irəli sürənlərin bir başqa yanlışlığı da cəmiyyətlərin ən vacib dəyəri olan dinin də təkamülə uğraması iddiasıdır. Bu iddia 19-cu əsrdə irəli sürülmüş, materialist və ateistlər tərəfindən coşqunluqla müdafiə edilmiş, lakin bu iddianı dəstəkləyən heç bir arxeoloji dəlil əldə edilmədiyi üçün bir spekulyasiya olaraq qalmışdır.

İnsanlığın daha qədim dövrlərdə guya ibtidai, yəni çoxtanrılı və qəbiləyə məxsus dinlərə inandığı, tək Allaha inanma və əsası bütün insanlara xitab etmək olan haqq dinin -belə ki, bu din ilk insan olan hz. Adəmdən başlayaraq Rəbbimizin bəşəriyyətə vəhy etdiyi haqq dindir- sonradan ortaya çıxdığı iddiasının heç bir əsası yoxdur. Lakin bəzi təkamülçülər bu iddianı həqiqət kimi göstərməyə çalışır, bu hərəkətləri ilə böyük səhvə yol verirlər. Darvinin bioloji təkamül nəzəriyyəsinin yalan olduğu kimi, ondan ilhamlanaraq inkişaf etdirilən dinlərin təkamülü nəzəriyyəsi də bir hiylədir.

## DİNLƏRİN TƏKAMÜLÜ YALANI NECƏ YAYILDI?



ÇARLZ DARVİN

Təqribən yüz əlli il bundan əvvəl Çarlz Darvinin (Charles Darwin) "Növlərin mənşəyi" adlı kitabının hələ ilk nəşri hazırlandığı dövrdə təkamül anlayışı materialist və ateist çevrələrdən dəstək almağa başlamışdı. Dövrün bəzi mütəfəkkirləri insanın ətrafında baş verən bütün proseslərin təkamüllə izah edilə biləcəyini hesab edirdi. Bu yanlışlığa görə, hər şey guya ibtidaidən və sadədən başlayır, daha sonra inkişaf edərək aliyə doğru inkişaf edirdi.

Bu yalan bir çox sahəyə tətbiq edilməyə cəhd göstərilirdi. Məsələn, iqtisadiyyat sahəsində marksizm təkamülə xas bir inkişafın qaçılmaz olduğunu və sonunda bütün millətlərin kommunizmi qəbul edəcəyi iddiasını irəli sürürdü. Bunun sadəcə bir xəyaldan ibarət olduğu və marksizmin irəli sürdüyü iddiaların həqiqətləri əks etdirmədiyi zaman içərisində həyata keçən təcrübələrlə sübuta yetirildi.

Psixologiya sahəsində Freyd (Freud) insanın təkamülə xas olaraq ali bir növ olduğunu, lakin psixoloji olaraq hələ guya ibtidai əcdadlarının sahib olduğu instinktlərlə hərəkət etdiyini deyirdi. Bu böyük yanlışlıq aparılan psixoloji tədqiqatlarla elmi cəhətdən tamamilə yerlə yeksan edildi. Freydizmin əsas fərziyyələrinin demək olar ki, heç bir elmi əsası olmadığı ortaya çıxdı.

Eyni şəkildə sosiologiya, antropologiya, tarix kimi elm sahələrində də təkamül nəzəriyyəsinin təsiri olmuş, lakin son yüz ildə əldə edilən bilik və tapıntılar bu təsirin nə dərəcə yanlış olduğunu göstərmişdir.

Bütün bu təkamülü müdafiə edən nəzəriyyələrin ortaq nöqtəsi isə Allah inancına qarşı olmaqdır. Dinlərin təkamülü yanlışlığı da bu məqsədlə və bu

fəlsəfi əsaslar üzərində irəli sürüldü. Bu yanlışlığın aparıcı müdafiəçilərindən biri olan Herbet Spenserin həqiqətdən uzaq iddialarına görə, bəşəriyyətin ilk dövrlərində heç bir dini inanc yox idi. Guya ilk dinlər isə ölülərə sitayiş etməklə başlamışdı. Dinlərin təkamülü hiyləsini müdafiə edən başqa antropoloqlar daha fərqli hekayələr irəli sürdülər. Bəzilərinə görə, dinin qaynağı animizmə (təbiətə canlılıq aid edilir, onda ruh olduğuna inanc duyulur), bəzilərinə görə isə totemizmə (simvol olaraq seçilən bir insan, qrup və ya əşyaya sitayiş etmə) əsaslanırdı. Başqa bir antropoloq olan E.B Teylora görə, tarixi proses ərzində sıra ilə animizm (təbiətə canlılıq aid etmə), manizm (əcdadlar kultu), politeizm (çoxtanrılıq) və son olaraq da monoteizm (təktanrılıq) yer alır.

**Tarixin hər dövründə Günəşə sitayiş edən insanlar olmuşdur. Bu gün də son dərəcə müasir şəraitdə yaşayan insanlar arasında da günəşə sitayiş kimi batil inanclar davam etməkdədir. Bu hal, sözügedən insanların ibtidai insanlar olduqlarını deyil, azğın inanclara sahib bütpərəstlər olduqlarını göstərməkdədir.**



Halbuki, 19-cu əsrin ateist antropoloqları tərəfindən stol arxasında yazılmış ssenarilərlə ortaya atılan və sonra da daima gündəmdə saxlanılan bu nəzəriyyə yalandan başqa bir şey deyildi. Arxeoloji və tarixi tapıntıların da göstərdiyi kimi, sözü gedən şəxslərin irəli sürdüyü iddiaların əksinə, tarixin ilk günündən bəri Allahın peyğəmbərləri vasitəsi ilə insanlara vəhy etdiyi haqq din var olmuşdur. Lakin demək olar ki, hər dövrdə haqq dinlə birlikdə batil və azğın inanclar da mövcudluğunu davam etdirmişdir. Hazırkı dövrdə də Allahın bir və tək olduğuna iman edən, Rəbbimizin nazil etdiyi dinə tabe olan insanlar olduğu kimi, daşdan, taxtadan düzəldilmiş bütlərə, bir sıra ruhlara, şeytana, müxtəlif heyvanlara, əcdadlarına, Günəşə, Aya, ulduzlara sitayiş etmə yanlışlığına düşən insanlar da vardır. Bundan əlavə, bunların əhəmiyyətli bir hissəsi geridə qalmış deyil, tam əksinə, olduqca müasir şərtlərdə yaşayan insanlardır.

Digər tərəfdən, tarix boyunca Allahın nazil etdiyi haqq dinlərin əmrlərini, tətbiq etdiklərini və əxlaqi dəyərlərini pozmaya çalışan insanlar da olmuşdur. Quranda bəzi insanların bir sıra batil inanc və əməlləri dinə daxil etməyə çalışdığı, dolayısilə, özlərinə göndərilən haqq dini dəyişdirib pozduqları xəbər verilmişdir:

**Vay o şəxslərin halına ki, onlar öz əlləri ilə kitab yazır, sonra da: "Bu, Allahın vəhyidir!" -deyirlər ki, onunla cüzi miqdarda pul əldə edə bilsinlər. Öz əlləri ilə yazdıqlarına görə vay onların halına! Qazandıqları şeyə görə vay onların halına!** (Bəqərə surəsi, 79)

Bu vəziyyət Allahın varlığına və birliyinə inanan və Rəbbimizin bildirdiyi hökmlərinə tabe olan bəzi insanların zaman keçdikcə haqq dindən uzaqlaşıb azğın inanclara, batil hərəkətlərə meyil etmələrinə səbəb olmuşdur. Beləliklə, bir sıra azğın inanc və batil hərəkətlər meydana gəlmişdir. Digər sözlə, bəzi insanların irəli sürdüyü kimi, dinlərin təkamülü deyə bir proses əsla olmamış, lakin haqq dinin müəyyən dövrlərdə insanlar tərəfindən pozulması ilə azğın dinlər ortaya çıxmışdır.

## HAQQ DİNİN TƏHRİF EDİLMƏSİ

20-ci əsrdə dinlərin mənşəyi haqqında ciddi araşdırmalar aparılmağa başlandı. Belə araşdırmaların sayəsində dinlərin təkamülü iddiasının heç bir elmi dəyərinin olmadığı və xəyal məhsulu ssenari olduğu çox keçmədi ki, ortaya çıxdı. Andryu Lanq, (Andrew Lang), Vilhelm Şmit (Wilhelm Schmidt) kimi antropoloqların rəhbərliyi altında dünyadakı dinlərin tədqiqi ilə əldə edilən nəticələr dinlərin təkamül keçirmədiyini, əksinə, bəzən təhrif edildiklərini göstərdi. Şmitin rəhbərliyi ilə nəşr edilən və dinlərin mənşəyi mövzusunu araşdıran "Anthropos" adlı jurnalda bu məlumatlar xırdalıqlarına qədər analiz edildi.

Xüsusən 1900-1935-ci illər arasında aparılan araşdırmalarda dinlərin təkamülü iddialarının tamamilə yalan olduğunun aşkara çıxarılması bir çox antropoloqun təkamülçü fikirlərini tərk etməsinə yol açdı. Lakin bütün bu elmi və tarixi həqiqətlərə baxmayaraq, bəzi radikal ateistlər bu süqut etmiş ssenarini müdafiə etməyə davam etdilər.



**Şəkildə şumerlərin saxta ilahlarından biri olan "ildırım tanrısı" görünür. Bu saxta ilahlar haqq olah tək ilah inancının zaman içində insanlar tərəfindən pozulması ilə ortaya çıxmışdır.**

# MESOPOTAMİYA VƏ MİSİRDƏ ƏLDƏ EDİLƏN ARXEOLOJİ TAPINTILAR



**Şumer yazılarının tərcümə edilməsi ilə ortaya çıxan həqiqət budur ki, Babil inanc sistemində çox sayda saxta ilah mövcud olmuş və insanlar zaman ərzində tək bir ilahın sifətlərini yanlış izah etmişlər.**

Mesopotamiya ovalığı tarixi qaynaqlarda sivilizasiyaların beşiyi olaraq adlandırılır. Mesopotamiya ovalığına çox da uzaq olmayan bir yerdə isə qədim Misir sivilizasiyası var idi.

Bu sivilizasiyalarla əlaqədar aparılan arxeoloji qazıntılarda diqqəti cəlb edən xüsusiyyətlərdən biri bu xalqların dini etiqadına dair əldə edilən tapıntılar idi. Əldə edilən kitabələrdə çoxsaylı saxta ilahların gördüyü işlər izah edilirdi. Daha çox tapıntı əldə etdikcə və tədqiqatçılar bunları oxumaq üçün daha uğurlu vasitələrdən istifadə etdikcə bu sivilizasiyaların inancları ilə əlaqədar bəzi təfsilatlar ortaya çıxmağa başladı. Diqqəti çəkən ən əhəmiyyətli məqam isə bu qövmlərin inandığı batil ilahların hamısından daha vacibi tək bir ilah inancının olması idi. Əldə edilən tarixi qeydlər və tapıntılar tarix boyunca haqq dinin var olduğunu göstərirdi.

Növbəti səhifələrimizdə araşdıracağımız Mesopotamiya, Misir, hind, Avropa mədəniyyətlərindən başqa, astek, ink, mayyalar kimi Amerika mədəniyyətlərinə də tək İlah inancının məlum olduğu, özlərinə haqq dini təbliğ edən xəbərdar edicilərin gəldiyini göstərən dəlillər əldə edilmişdir. Çoxtanrılı inancın içində tək Tanrı inancının gizli olduğunu aşkar edən ilk tədqiqatçılardan biri Oksford Universitetindən Stiven Lenqdon (Stephen Langdon), 1931-ci ildə əldə etdiyi məlumatların elm dünyasına agah edərkən əldə etdiyi məlumatların çox gözlənilməz olduğunu deyirdi, çünki bu tapıntıların daha əvvəlki təkamülçü izahlara tamamilə zidd olduğunu başa düşürdü. Lenqdon tapıntılarını belə şərh edirdi:

Mənim zənnimcə, insanın ən qədim tarixi tək Tanrı inancından (sözdə) çoxlu sayda tanrının və şər qüvvələrin varlığının inancına doğru çox tez bir pozulmanı göstərir...

(Stephen H. Langdon, "Semitic Mytology of All Races", Vol. V, Archaeol. Instit. Amer., 1931, s. XVIII)

Lenqdon 5 il sonra "The Scotsman" adlı jurnalda isə aşağıdakıları yazırdı:

... Bütün dəlillər, qəti olaraq başlanğıcda bir tək Tanrı inancının mövcud olduğunu göstərir. Sami mənşəli xalqların arxeoloji və ədəbi tapıntıları da ən qədim zamanlarda belə tək Tanrı inancının var olduğunu göstərir. Yəhudi

*dininin və digər Sami mənşəli dinlərin totemistik, bütlərə əsaslanan bir mənşəyə malik olması nəzəriyyəsinin tamamilə əsassız olduğu bu gün qəbul edilmişdir.*

(Stephen H. Langdon, The Scotsman, 18 Kasım 1936)



**Babil inanc sistemində Marduk adlandırılan saxta ilah**

Hazırkı dövrümüzdə Tel-Əsmər adlandırılan e.ə. 3000-ci ilə aid bir şumer şəhərində aparılan qazıntılarda da Lenqtonun dediklərini tamamilə təsdiqləyəcək tapıntılar əldə edildi. Qazıntılara rəhbərlik edən Henri Frankfort rəsmi hesabatında belə yazırdı:

*Qazıntılarımız bütün dəyərli tapıntılara, əlavə olaraq, Babil dinləri haqqında bəzi çox vacib həqiqətləri aşkarladı. Bir sosial sistem içində dini dəyərlərin necə yerləşdirilmiş olduğuna ilk dəfə şahid oluruq.*

Bir məbəd və bu məbəddə ibadət etməkdə olan insanların evlərinin qalıqları tapıldı. Bu səbəbdən, ayrı-ayrılıqda bir məna ifadə etməyən tapıntıları bir bütün olaraq qiymətləndirə bilirik.

Məsələn, möhürlərin üzərindəki rəsmlərdə ümumi olaraq ilahlara sitayiş əks olunur. Lakin bu rəsmlərin hamısında həmin məbəddə sadəcə bir Tanrı inancının olduğu görünür. Bu səbəbdən də ən qədim zamandakı Şumer -Akkad etiqad sistemi içərisində bu tək İlahın fərqli xüsusiyyətləri ayrıca ilahlar hesab edildiyi aydın olur.

(H. Frankfort, Third Preliminary Report on Excavations at Tell Asmar (Eshnunna): Quoted by P.J. Wiseman in New Discoveries in Babylonia about Genesis, Marshall, Morgan and Scott, sf. 24.)





**Misir kralı Akheneton tək tanrıya inandığını açıqlamış və bütün bütləri qırdırmışdır. Allaha olan inancını belə dilə gətirmişdir: Tanrı uludur, birdir, təkdir. Ondan başqası yoxdur. Birdir. Odur hər varlığı yaradan. Bir ruhdur Tanrı, görünməyən bir ruh... Başlanğıcda vardı Tanrı. Tək varlıq Odur. Heç bir şey yox ikən O vardı. Hər şeyi O yaratdı...**

Frankfortun tapıntıları çox vacib bir həqiqəti göstərirdi: batil, çoxtanrılı etiqad sisteminin meydana gəlmə forması. Birdən çox ilaha sitayiş azğınlığı dinlərin təkamülü nəzəriyyəsinin iddia etdiyi kimi, insanların təbiət güclərini təmsil edən bəzi şər qüvvələrə sitayiş etmələri ilə meydana gəlməmişdi. Bir və tək olan İlahın fərqli sifətləri insanlar tərəfindən müəyyən müddət ərzində müxtəlif cür şərh edilmişdir və tək İlah etiqadında pozulmalar meydana gəlmişdir. Tək bir İlahın fərqli sifətləri müəyyən müddətdə çoxtanrılıq etiqadına çevrilmişdir.



**Antropoloqların apardıqları araşdırmalar çoxtanrılı batil inancların təktanrılı tovhid inancını daşıyan dinlərin zaman ərzində təhrif edilməsi ilə ortaya çıxdığını göstərir. Bu da təkamülçülərin iddia etdiyi kimi dinlərin təkamülü deyə bir mərhələnin mövcud olmadığının açıq dəlillərindəndir.**

Lenqdonun Şumer lövhələrinin tərcümələrini nəşr etdirməsindən bir müddət əvvəl Fridrix Deliç adlı tədqiqatçı da buna bənzər kəşfə imza atmışdı. Bu tədqiqatçı Babil etiqad sistemi içərisindəki çox saylı ilahın həqiqətdə həmin dövrdə Marduk olaraq adlandırılan tək bir İlahın fərqli xüsusiyyətlərindən irəli gəldiyini aşkar etmişdir. Aparılan araşdırmalar Marduk inancının da haqq olan tək İlah etiqadının zaman içərisində pozulması ilə əmələ gəldiyini göstərirdi.

Marduk adlandırılan tək İlahın müxtəlif adları var idi. Bunlardan bəziləri Ninib (güc sahibi), Nergal (müharibə Tanrısı), Bel (tək İlah), Nebo (xəbər gətirən İlah), Sin (gecəni aydınlaşdıran), Şamaş (ədalət Tanrısı), Addu (yağış Tanrısı) idi. Müəyyən müddət ərzində Mardukun bu xüsusiyyətləri sanki Mardukdan əlaqəsi olmadan güclənmiş kimi müxtəlif tanrılara çevrilmişdi. Eyni şəkildə, Günəş Tanrısı, Ay tanrısı kimi bir çox batil ilahlar xəyal gücünün təsiri ilə yaradılmışdır. Göründüyü kimi, həm Marduk inancı, həm

də bu saxta ilahın digər adları bu inancın, əslində, Allah inancının zaman içərisində bəzi insanlar tərəfindən pozulması ilə ortaya çıxdığını göstərir.

Buna bənzər pozulma izlərini qədim Misirdə də görmək mümkündür. Tədqiqatçılar qədim Misirin, əvvəlcə, təktanrılı bir etiqad sisteminə sahib olduğunu, daha sonra bu təktanrılı etiqadın bəzi insanlar tərəfindən təhrif edilərək Günəşə sitayiş edən sabiliyə çevrildiyini aşkar etmişdilər. Antropoloq M.De Ruj bu barədə aşağıdakıları demişdir:

*Misir dininin əmələ gəlməsi çoxsaylı tanrının ələnərək tək Tanrıya çevrilməsi ilə olmamışdır. Əksinə, Misir dininin tək Allah inancına yaxın olduğu zamanlar bu sivilizasiyanın təsdiq edilən qədim zamanları ilə üst-üstə düşür. Misir dininin son mərhələləri isə bütün Misir dininin ən çox pozulmuş dövrü olmuşdur.* (P. Le Renouf, "Lectures on the Origin and Growth of Religion" as illustrated by the Religion of Ancient Egypt, Williams and Norgate, London, 1897, s. 90)

Antropoloq Sir Flinders Petri də çoxtanrılı batil inancların təktanrılı tövhid inancını daşıyan dinlərin zaman içərisində təhrif edilməsi ilə meydana gəldiyini demişdir. Bundan başqa, bu pozulma prosesi sadəcə keçmişdə yaşamış cəmiyyətlərdə deyil, günümüzdə də müşahidə edilir. Petri belə demişdir:

*Qədim zamanlardakı dinlərdə bir çox sinfə aid edilən tanrılara rast gəlinir. Lakin günümüzdəki bir çox mədəniyyətdə də belə bir yanaşma nümayiş olunur. Məsələn, bir hindu sayları getdikcə artan tanrı və tanrıçalar arasında yaşamaqdan zövq alır... Digərləri isə tanrılara belə sitayiş etməzlər, animistik ruhlara, şeytanlara sitayiş edirlər...*

*Əgər ruhlara sitayiş tək bir İlaha sitayişə qədər gedib çıxan təkamül prosesinin ilk pilləsi olsaydı, belə olan halda, çoxtanrılığın getdikcə təktanrılığa təkmilləşməsinin dəlillərini görməli idik... Bunun tam əksinə, görə bildiyimiz tək Allah inancının hər zaman ilk pillədə olmasıdır...*

*Çoxtanrılı etiqadın ilk əmələ gəlməsinə qədər müşahidə edə bildiyiniz hər yerdə bunun tək Allah inancının bir müxtəlifliyi olduğunu görürük...*

(Sir Flinders Petrie, The Religion of Ancient Egypt, Constable, London, 1908, sf. 3-4)

## HİNDİSTANDA BATİL ÇOXTANRILI İNANCIN MƏNŞƏYİ

Hind mədəniyyəti Yaxın Şərq mədəniyyətləri qədər qədim olmasa da, dünyanın qədim sivilizasiyalarından biri sayılır.

Hindistanda saysız-hesabsız tanrılara tapınan batil inanclar var. Bu batil dinləri araşdıran tədqiqatçılardan biri Endru Lenqdir (Andrew Lang). Lenq uzunmüddətli tədqiqatlar nəticəsində çoxtanrılı dinlərin Yaxın Şərqdə meydana gəlməsinə oxşar prosesin Hindistanda da baş verdiyini üzə çıxarmışdır.

Edvard Makkreydi (Edward McCrady) də hindlilərin “Veda” adlı kitablarını tədqiq edərkən hind mədəniyyətinin erkən dövrlərində tanrıların bir üstün İlahın müxtəlif xüsusiyyətləri kimi şərh edildiyini yazır. (Edward McCrady, Genesis and Pagaan Cosmogonies, Trans. Vict. Instit. 72 (1940), sf.55) Veda kitabındakı ilahilərdə də açıq şəkildə təktanrılı tövhid inancının pozulmasının izlərini görmək mümkündür. Mövzunu təhlil edən tədqiqatçılardan Maks Müller (Max Müller), əvvəlcə, tək İlah inancının olduğunu qəbul edir:

*Vedada tək Allah inancının çoxtanrılı inancdan daha əvvəl olduğunu görürük. Saysız-hesabsız tanrıya dualarında belə, tək və sonsuz Tanrının zikri göyü duman kimi örtmüş bütpərəst anlayışın arasından mavi səmanın görünməsi kimi üzə çıxır.* (Max Muller, History of Sanskrit Literature: Quoted by Samuel Zwemer, sf. 87)

Buradan bir daha məlum olur ki, dinlərin təkamülü baş verməmişdir, əksinə, insanların haqq dinə bəzi batil inanclar əlavə etməsi və ya bəzi əmr və qadağalara etinasız yanaşması ilə dini inanclar zaman ərzində təhrif edilmişdir.



**Batil hindu dini bir çox saxta ilaha malikdir. Ancaq aparılan araşdırmalarda hind mədəniyyətinin erkən dövrlərində tək bir ilah inancının hakim olduğu anlaşılır.**

## AVROPA TARİXİNDƏ DİNLƏRİN TƏHRİF EDİLMƏSİ



**Qədim Yunan batil inancları üzərində araşdırmalar aparan Axel W. Persson "Eradan əvvəlki Yunanıstan" adlı əsərində "İlk başdan bəri mövcud olan tək tanrı inancı daha sonra yunan dini miflərində gördüyümüz saysız-hesabsız tanrı şəxsiyyətlərinə çevrilmişdir." deyir.**

Tarixi Avropa xalqlarının inanclarında da bənzər pozulmanın izini görürük. Məsələn, qədim yunan batil inancları üzərində tədqiqat aparmış (Axel W. Persson) Aksel V. Persson "Tarixdən əvvəlki Yunanıstan" adlı əsərində belə yazır:

*Əvvəl mövcud olan tək Allah inancı daha sonra yunan dini miflərində gördüyümüz çoxsaylı əhəmiyyətsiz tanrı şəxsiyyətlərə çevrilmişdir. Mənim fikrimcə, bu bir çox ilahın varlığı tək və bir olan Allahı tərif edən müxtəlif isimlərin zaman ərzində müxtəlif cür şərh olunmasına bağlıdır.*
(Axel Persson, The Religion of Greece in Prehistoric Times, University of California Press, 1942, sf. 124)

*Eyni pozulmanın izlərini İtaliyada da görmək mümkündür. Arxeoloq Rozenzveyq (Rosenzweig) qədim Etrusk dövrünə uyğun gələn "İkviun lövhələri" (İguine tablets) üzərində apardığı təhlillərdə: "İlahlar ilk olaraq sifətlərin müxtəlif cəhətlər kimi şərh olunması nəticəsində meydana gəlir", - deyir.* (Book review, American Journal of Archaeology, 43 (1939): sf. 170-171)

Qısaca desək, təqribən bir əsr ərzində əldə edilən bütün antropoloji və

arxeoloji tapıntılar tarix boyu xalqların, əvvəlcə, tək Allah inancına sahib olduğunu, ancaq zaman ərzində bu inancın təhrif edildiyini göstərir. Əvvəlcə, hər şeyi yoxdan yaradan, hər şeyi görən və bilən, bütün aləmlərin sahibi olan Allaha inanan xalqlar zaman keçdikcə Rəbbimizin isimlərini ayrı-ayrı ilahlar kimi düşünmüş və birdən çox batil ilaha tapınmağa başlamışlar. Haqq və gerçək din bir və tək ilah olan Allaha ibadət edilən dindir. Çoxtanrılı dinlər isə Rəbbimizin Hz. Adəmdən etibarən insanlara vəhy etdiyi haqq dinin insanlar tərəfindən təhrif edilməsi nəticəsində meydana gəlib.

## ALLAHIN VƏHY ETDİYİ HAQQ DİN

Yer üzündə müxtəlif yerlərdə yaşayan və yaşamış xalqların dini dəyərlərinə və mədəniyyətlərinə nəzər saldıqda ortaq inanca malik olduqlarını görürük. Aralarında mədəni mübadilənin baş verməsinin qeyri-mümkün olduğu xalqların dinlərində mələk, cin və şeytan kimi insanla eyni məkan ölçüsündə yaşamayan varlıqlardan axirət inancına, insanın palçıqdan yaradılmasından tutmuş edilən ibadətlərə qədər bir çox ortaq cəhət var. Məsələn, Nuh tufanı haqqında məlumatlar şumer qaynaqlarından başlayaraq Uels etiqadına, Çin yazılı mənbələrindən antik Litva inanclarına qədər bir çox müxtəlif xalqların mədəni irsində mövcuddur.

Bu həqiqət din əxlaqını bir və tək olan uca İlahın, yəni aləmlərin Rəbbi olan Allahın vəhy etdiyini göstərən dəlillərdən biridir. Dünyanın hər tərəfindəki müxtəlif xalqlar eyni uca məqamdan gələn, bənzəri olmayan bir tək İlahın varlığını xəbər verən dinlərlə tərbiyə ediliblər. Rəbbimiz hər dövrdə üstün etdiyi bəzi seçilmiş qulları vasitəsilə Özünü insanlara tanıtmış və insanlar üçün seçdiyi dini bildirmişdir. Allahın son vəhyi olan Quranda hər qövmün bir doğru yolgöstərən rəhbəri olduğu (Rəd surəsi, 7) xəbər verilmişdir. Başqa ayələrdə isə Allahın hər xalqa xəbərdar edən göndərdiyi belə bildirilir:

**Biz heç bir məmləkəti onu xəbərdar edənlər olmadan məhv etmədik.** *(Xəbərdar edənləri də)* **öyüd-nəsihət vermək üçün** *(göndərdik)*. **Biz əsla zalım deyilik!** (Şüəra surəsi, 208-209)

Bu mübarək elçilər xalqlarına bir və tək olan Allaha iman gətirməyə və qulluq etməyə dəvət etmiş, yaxşılığı əmr edib pislikdən çəkindirmişlər. İnsanlar Rəbbimizin qatında seçilmiş müqəddəs elçilərə və onların miras qoyduğu ilahi kitablara tabe olmaqla xilas ola bilərlər. Rəbbimizin aləmlərə rəhmət olaraq göndərdiyi son peyğəmbər Hz. Muhəmməd (s) və Allahın əbədi olaraq qoruduğu son ilahi kitab Qurani-kərim də bəşəriyyətin ən doğru yol göstəricisidir.

# MÜSƏLMANLARIN TƏKAMÜL NƏZƏRİYYƏSİNƏ QARŞI DİQQƏTLİ OLMASI ÜÇÜN BÖLÜM:

## BƏZİ MÜSƏLMANLAR NƏ ÜÇÜN TƏKAMÜL NƏZƏRİYYƏSİNİ MÜDAFİƏ EDİRLƏR?

Təkamül nəzəriyyəsi dedikdə insanların ağlına müxtəlif fikirlər gəlir. Bəzi insanlar, əsasən də, materialistlər təkamül nəzəriyyəsinin elm tərəfindən sübut edildiyini zənn edirlər. Halbuki bu, qətiyyən doğru deyil. Çünki yüzlərlə elmi dəlil bu nəzəriyyənin əsassızlığını sübut edib. Lakin həmin insanlar yenə də bu nəzəriyyəni kor-koranə müdafiə edir və ona qarşı çıxan heç bir fikri qəbul etmirlər.

İkinci qrupa aid insanların isə təkamül nəzəriyyəsinin iddiaları haqqında məlumatları yoxdur. Onlar darvinist düşüncənin bir əsr yarımdır ki, bəşəriyyətə vurduğu ziyanın fərqində deyillər. Elmi əsassızlığına baxmayaraq, təkamül nəzəriyyəsinin müdafiə edilməsi və insanlara məcburən qəbul etdirilməsi onlar üçün problem deyil. Bununla bağlı baş verən hər şeyə tamamilə göz yumurlar.

Bu insanlar nəzəriyyənin elmi əsasının olmadığını bilsələr də, bu mövzuya əhəmiyyət vermir və əhəmiyyət verənləri də başa düşmürlər. Onlara görə, təkamül nəzəriyyəsinin əsassızlığını anlatmağa, bununla bağlı kitablar nəşr etməyə və ya konfranslar verməyə ehtiyac yoxdur. Çünki bu nəzəriyyənin "köhnəldiyini" və "ortadan qalxdığını" düşünürlər. Halbuki bu insanlar böyük səhvə yol verirlər. Təkamülün köhnə nəzəriyyə olduğu doğrudur, lakin onun saxtakarlığının üzə çıxarılmasının əhəmiyyətsiz olduğunu düşünmək yanlışdır.

Üçüncü qrup isə materialist təlqin və təbliğlər nəticəsində təkamül nəzəriyyəsini elmi həqiqət zənn edən və bu nəzəriyyə ilə Allaha iman arasında özlərinə "orta yol" seçən bəzi inanclı insanlardır. Bu insanlar darvinizmin canlıların mənşəyi haqqındakı ssenarisini tam qəbul edir, lakin bu ssenarinin Allahın iradəsi daxilində olduğunu bildirərək təkamül nəzəriyyəsi ilə inanc arasında "əlaqə" yaratmağa çalışırlar.

Lakin bu üç baxış da yanlışdır. Bu nəzəriyyəni nə elmi həqiqət kimi göstərmək, nə əhəmiyyətsiz qəbul etmək, nə də "dinə uyğunlaşdırmağa" çalışmaq doğru deyil. Çünki təkamül nəzəriyyəsi ideoloji arxa planı olan, ateizmi möhkəmləndirmək və dayaq yaratmaq məqsədi ilə ortaya atılan, materialist düşüncəli insanlar tərəfindən dəstəklənən və din əxlaqına uyğun olmayan düşüncədir. Materialist fəlsəfəyə əsaslanır və dünyadakı hadisələri də materialist fikirlərlə izah edir. Çarlz Darvin tərəfindən ortaya atılandan etibarən bəşəriyyətə istismar, qarşıdurmalar, müharibələr və degenerasiyadan başqa heç bir şey qazandırmayıb. Buna görə də məsələnin vacibliyini yaxşı dərk etmək və bu batil düşüncəyə qarşı fikri mübarizə aparmaq lazımdır.

Bu bölümdə təkamül nəzəriyyəsi çox fərqli formada izah ediləcək və bu

nəzəriyyəni müdafiə edən bəzi inanclı insanların səhvlərinə cavab veriləcəkdir. Bu bölüm təkamül nəzəriyyəsi ilə yaradılış arasında guya bəzi ortaq məqamlar tapmağa, hətta Qurandan təkamül nəzəriyyəsinə dəlil göstərməyə çalışan bəzi müsəlmanlara cavab vermək məqsədi ilə hazırlanmışdır. Buradakı məqsədimiz isə təkamül nəzəriyyəsini doğru hesab edən müsəlmanlara qalib gəlmək deyil, bu nəzəriyyəyə yanaşmalarının səhv olduğunu izah edərək onlara bu mövzuda ideoloji yardım etmək və doğru düşüncə tərzinə yiyələnmələrinə səbəb olmaqdır.

Bu bölümdə üzərində dayanacağımız digər mövzu isə heç bir elmi əsası olmayan darvinizmin, əslində, dinə qarşı çıxan nəzəriyyə olmasıdır. Qısası, bu bölümdə müsəlmanların bu nəzəriyyəni ciddiyə almamalarının, əhəmiyyətsiz görmələrinin və bu nəzəriyyə ilə fikri mübarizə aparmağı lazımsız hesab etmələrinin zərərlərinə diqqət çəkəcəyik.

İnanclı insan təkamül nəzəriyyəsi kimi İslam dini ilə ziddiyyət təşkil edən nəzəriyyəni müdafiə etməkdən çəkinməlidir. Bəlkə də, bunun səbəbi bu nəzəriyyənin indiyə qədər bəşəriyyətə gətirdiyi bəlalardan, din əxlaqına qarşı olan insanların ona sahib çıxmalarından və yaradılış gerçəyini inkar etdiyindən xəbərsiz olmalarıdır. Lakin müsəlman haqqında məlumatı olmayan bir şeyin arxasınca getməkdən çəkinməlidir. Çünki bu, Allahın iman gətirənlərə əmridir. Quranda belə buyurulmuşdur:

**Haqqında məlumatın olmadığı bir işin dalınca getmə.**
**Çünki qulaq, göz və ürək – bunların hamısı** *(sahibinin əməlləri)*
**barəsində sorğu-sual olunacaqdır.** (İsra surəsi, 36)

Nümunəvi müsəlman isə bir mövzunu səmimiyyətlə araşdırmalı, öyrənməli və buna əsasən davranmalıdır:

**Sözsüz ki, bizlərdən müsəlmanlar da var,** *(doğru yoldan)* **sapanlar da.**
**Müsəlman olan şəxslər doğru yol tutanlardır.** (Cin surəsi, 14)

Təkamülçü müsəlmanlar da yuxarıdakı ayələrdə bildirildiyi kimi, təkamül nəzəriyyəsi haqqında diqqətlə düşünüb ətraflı araşdırma aparmalı və vicdanlarının səsinə qulaq asaraq qərar verməlidirlər.

İnsanlar tarix boyunca kainatın və canlıların mənşəyi haqqında düşünmüş və bununla bağlı müxtəlif fikirlər irəli sürmüşlər. Bu fikirləri iki yerə ayıra bilərik: kainatı materialist düşüncə ilə izah etməyə çalışanlar və Allahın bütün kainatı yoxdan var etdiyini, yəni yaradılış həqiqətini görənlər.

Yuxarıda təkamül nəzəriyyəsinin materialist fəlsəfəyə əsaslanaraq irəli sürüldüyünü qeyd etmişdik. Materialist düşüncə kainatı təşkil edən maddənin var olan yeganə varlıq olduğunu iddia edir. Bu batil inanca əsasən, maddə sonsuzdan bəri vardır və maddəyə hakim olan başqa güc yoxdur. Materialistlər kainatın təsadüfən yarandığını, canlı aləmin də zamanla təsadüf nəticəsində cansız maddələrdən təkamül keçirərək əmələ gəldiyini qəbul edirlər. Bu yanlış düşüncəyə əsasən yer üzündəki bütün canlılar təbii təbiət hadisələri və təsadüflər nəticəsində ortaya çıxmışdır.

Başqa sözlə desək, materialist fəlsəfə canlıların yaranmasını təkamül

nəzəriyyəsi ilə izah etməyə çalışır. Təkamül nəzəriyyəsi ilə materialist fəlsəfə bir-birini tamamlayan iki fikir sistemidir. Qədim Yunanıstanda ortaya çıxan bu birlik 19-cu əsrin ibtidai elm düşüncəsi çərçivəsində yenidən gündəmə gətirilmişdir. Təkamül nəzəriyyəsi materializmə dəstək verdiyi üçün elmi olub-olmadığına baxmadan materialistlər tərəfindən dərhal qəbul edilmişdir.

Təkamül nəzəriyyəsinin qarşısında isə yaradılış gerçəyi var. Elmi kəşflərin də müəyyən etdiyi kimi, maddə sonsuzdan bəri mövcud olmayıb və özbaşına da deyil. Allah maddəni yoxdan yaratmışdır. Canlılar da Allahın yaratması ilə var olmuşdur. Kainatdakı və canlılardakı mükəmməl nizam və tarazlıq bu həqiqətin açıq dəlilidir.

İnsanların ağıl və müşahidə ilə dərk edəcəyi yaradılış gerçəyi tarixin əvvəlindən bu yana din yolu ilə insanlara öyrədilmişdir. Bütün ilahi dinlər Allahın kainatı yoxdan "Ol" əmri ilə yaratdığını və kainatdakı qüsursuz proseslərin Allahın üstün yaratma gücünün dəlili olduğunu bildirmişdir. Bu həqiqət Quranın bir çox ayələrində də qeyd edilir. Allah **"Göyləri və yeri icad edən Odur. O, bir işi yaratmaq istədikdə ona ancaq: "Ol!" – deyər, o da olar."** (Bəqərə surəsi, 117) ayəsi ilə yoxdan və möcüzəvi şəkildə yaratdığını bildirmişdir. "Ənam" surəsində isə belə buyurulur:

**Göyləri və yeri haqq olaraq xəlq edən Odur. O: “Ol!” – dediyi gün** *(hər şey)* **olar. Onun Sözü haqdır. Sur üfürüləcəyi gün hökm** *(yalnız)* **Ona məxsus olacaqdır. Qeybi və aşkarı Bilən də Odur. O, Müdrikdir,** *(hər şeydən)* **Xəbərdardır.** (Ənam surəsi, 73)

Müasir elm materialist-təkamülçü iddiaların əsassızlığını, yaradılış gerçəyini və təsadüfə qətiyyən yer olmadığını bizə göstərir. Göyün, yerin və bütün canlı varlıqların araşdırılması ilə ortaya çıxan hər incəlik Allahın sonsuz gücünün dəlilidir.

Materializmlə Allah inancı arasındakı fikri müxtəliflik dinlə dinsizlik arasındakı ən əsas fərqdir. Allah Quranda inkar edənlər haqqında **"Bəlkə, onlar öz-özünə yaranıblar? Yaxud onlar yaradanlardır?"** (Tur surəsi, 35) deyə buyuraraq, onların yaradılış qarşısındakı batil iddialarına diqqət çəkir. İnkar edənlər tarix boyunca kainatın və insanların "yaradılmadığı" yalanını irəli sürmüş və bu mənasız iddianı doğru göstərmək üçün müxtəlif üsullar axtarmışlar. 19-cu əsrdə isə Darvinin nəzəriyyəsi ilə bu mövzuda böyük irəliləyiş əldə etdilər.

Bir müsəlman bu mövzuda fikri “uyğunluq” axtara bilməz. Əlbəttə ki, insanlar istədikləri kimi düşünə, istədikləri nəzəriyyəyə də inana bilərlər. Lakin Allahı və yaradılışı inkar etmək məqsədi ilə ortaya atılan nəzəriyyə ilə həmfikir olmaq mümkün deyil. Bu, tamamilə yersiz cəhddir.

Belə cəhdin müsəlmanlara zərər verəcəyini bilən təkamülçülər dindarları bunun üçün səy göstərməyə məcbur edirlər.

## TƏKAMÜLÇÜ YARADILIŞ DÜŞÜNCƏSİ DARVİNİSTLƏR TƏRƏFİNDƏN TƏŞVİQ EDİLİR

Təkamül nəzəriyyəsini kor-koranə müdafiə edən alimlər elm sahəsində əldə edilən yeniliklər qarşısında hər gün daha da çıxılmaz vəziyyətə düşürlər. Çünki hər yeni kəşf nəzəriyyələrinin əleyhinə olur və yaradılışı təsdiq edir. Buna görə də təkamüllə bağlı kitablarda elmi faktlar deyil, demaqogiya üstünlük təşkil edir. Hətta tanınmış təkamülçü elmi jurnallar da bu nəzəriyyənin düşdüyü vəziyyəti etiraf etməyə məcbur olur. Elmi müzakirələr yaradılışı müdafiə edən alimlərin qələbəsi ilə yekunlaşır və təkamülçülərin çarəsizliyinə bütün dünya şahid olur.

Məhz bu məqamda digər saxtakarlıq nümunəsi olan təkamüllə yaradılış yalanı materialistlərin imdadına çatdı. Təkamülçülər inanclı insanların dəstəyini almaq və onların bu nəzəriyyəyə qarşı apardıqları fikri mübarizəni zəiflətmək üçün təkamüllə yaradılış yalanını dəstəkləyərək fərqli üsulu sınaqdan keçirirlər. Özləri Allaha inanmadıqları, təsadüfü ilahlaşdırdıqları (Allahı tənzih edirik), yaradılışa tamamilə qarşı olduqları halda, nəzəriyyələrinin daha tez qəbul ediləcəyini düşündükləri üçün bəziləri Allahın canlıları təkamüllə yaratdığı yalanına qarşı səs çıxartmır, hətta çox vaxt bu fikrə dəstək olurlar. Lakin bu ancaq taktikadır. Təkamülçülər dinə və yaradılışa tamamilə qarşıdırlar. Hətta yaradılış gerçəyinin cəmiyyət tərəfindən qəbul edilməməsi üçün lazım gələrsə, təkamül nəzəriyyəsi ilə yaradılış arasında uyğunluq varmış kimi göstərə bilərlər. Çünki bununla yaradılışı müdafiə edənlərin gücünü qıracaqlarını düşünürlər.

Bu zaman Allahın bütün kainatın Yaradıcısı olduğuna iman gətirib, elmin ortaya qoyduğu həqiqətlərə göz yumaraq təkamül nəzəriyyəsinə dəstək olmaq, üstəlik Qurandakı açıq-aydın izahlara baxmayaraq, təkamülün Qurana uyğun olduğunu iddia etmək çox böyük xətadır. İnanclı insanlar bu yolla materialist fəlsəfəyə dəstək olduqlarının fərqinə varmalı və bundan əl çəkməlidirlər.

## "TƏKAMÜLÜ İNKAR ETMƏK ELMİ İNKAR ETMƏKDİR" YALANI

Hazırda bütün canlıların təkamül nəticəsində meydana gəldiyini müdafiə edən müsəlmanların sayı həddindən çoxdur. Bunun səbəbi isə bu insanların bilgi əskikliyi, yanlış fikirləri və xüsusilə elmi mövzulardakı bəzi səhv məlumatlarıdır. Bunlardan ən başlıcası isə təkamül nəzəriyyəsinin elmi və sübut edilmiş həqiqət olduğu yalanıdır.

Bu insanlar bilməlidirlər ki, təkamül nəzəriyyəsi müasir elm qarşısında bütün gücünü itirmişdir. Həm molekulyar, həm bioloji, həm də paleontologiya sahələrində aparılan tədqiqatlar canlıların təkamül prosesi nəticəsində əmələ gəldiyi iddiasını yerlə bir etmişdir. Elmi faktlara baxmayaraq, təkamül nəzəriyyəsinin bu qədər gündəmdə qalmasının səbəbi isə təkamülçülərin demaqoqluğu, gətirdikləri yanlış nümunələr, sözlərdən istifadə edərək insanların gözünü boyamağa və saxtakarlıqlarla xalqı

aldatmağa çalışmalarıdır. Təkamülçülərin qəsdən xalqın başa düşmədiyi elmi terminləri tez-tez işlətdikləri söhbət və yazıları araşdırsaq, nəzəriyyənin lehinə olan heç bir dəlil irəli sürmədiklərini görərik.

Darvinist nəşrləri diqqətlə incələsək, bunu görmək mümkündür. Heç vaxt dəqiq elmi dəlillərə əsaslanan izahları olmur. Təkamül nəzəriyyəsinin əsas çətinlikləri bir neçə cümlə ilə ötüşdürülür. Təbiət tarixi haqqında da bir çox hekayələr yazılır. İlk canlının cansız maddədən necə əmələ gəldiyi, fosil qeydlərindəki çatışmazlıqlar, canlılardakı kompleks sistemlər kimi əsas mövzuların üzərində heç durmurlar. Çünki açıqlayacaqları hər şey məqsədlərinə qarşı olacaq və nəzəriyyələrinin saxtakarlığını göz önünə sərəcəkdir.




Belə ki, nəzəriyyənin banisi Çarlz Darvin canlılardakı kompleks sistemlərdən biri olan gözü düşündükdə nəzəriyyəsindəki çatışmazlığı görmüş və "gözü düşünmək məni nəzəriyyəmdən soyutdu", – deyə etiraf etmişdir. Darvin kimi hazırki təkamülçü alimlər də kompleks sistemlərin təkamül nəzəriyyəsini çıxılmaz vəziyyətə saldığını bilirlər. Lakin bunları dilə gətirmək əvəzinə, demaqoqluq etməyi, elmi dəlillər əvəzinə ssenarilər yazaraq özlərini üstün göstərməyə çalışmağı və müxtəlif yalanlarla təkamül nəzəriyyəsinə elmi don geyindirərək insanlara zorla qəbul etdirməyi üstün tuturlar.

Bütün bunları təkamülçülərlə yaradılışı müdafiə edən insanların qarşılaşdığı müzakirələrdə, təkamülçü məqalələrdə və ya sənədli filmlərdə görmək mümkündür. Onsuz da təkamülçülərin elmi dəlillərə dayanaraq ağıllı davranmaq kimi dərdləri yoxdur. Onlar üçün əsas olan cəmiyyəti təkamülün elmi həqiqət olduğuna inandırmaq, bunun üçün də gözdən pərdə asan "elmilik" yaratmaqdır.

Təkamülçü müsəlmanlar da bu nəzəriyyənin saxta elmi görünüşündən təsirlənirlər. Xüsusilə də darvinistlərin istifadə etdikləri "təkamül nəzəriyyəsinə inanmayan doqmatikdir", "təkamül nəzəriyyəsinə inanmayan elmdən uzaqdır" kimi əsassız şüarlarından narahat olur və inanclarından çəkinirlər. Aktual olmayan bilgilərin, təkamülün təbliğat vasitəsi olan əsərlərin təsiri altında qalıb təkamülün canlıların əmələ gəlməsini izah edən yeganə nəzəriyyə olduğunu zənn edirlər. Elm dünyasındakı yenilikləri, təkamül nəzəriyyəsindəki ziddiyyətləri və bu nəzəriyyənin bütün iddialarının qüvvədən düşdüyünü bilmədiklərinə görə, dinlə təkamülü uyğunlaşdırmağa çalışırlar.

Əslində isə, təkamül və yaradılış bir-birinin əksidir. Təkamül nəzəriyyəsinin əsassızlığının sübut edilməsi nəticəsində yaradılışın gerçək olduğu qəbul edilir.

Buna görə də təkamül nəzəriyyəsi ilə bağlı müzakirələr materialistlər üçün "mübarizə yeri" hesab edilir. Mövzu ilə bağlı müzakirələri elmi yanaşma deyil, birbaşa ideoloji mübarizə olaraq görürlər. Yaradılışı müdafiə edənlərin qarşısını almaq üçün hər cür üsula əl atırlar.

Təkamül nəzəriyyəsini müdafiə edən müsəlmanlar bu fikri mübarizənin fərqinə varmalıdırlar. Darvinizm hər hansı elmi fakt deyil, insanlara Allahı inkar etdirmək üçün ortaya atılan və müdafiə edilən fikir sistemidir. Bir müsəlmanın heç bir elmi əsası olmayan nəzəriyyəni təbliğatlara aldanaraq mənimsəməsi qəbuledilməzdir.

## TƏKAMÜLÇÜLƏRİN ÇOXLUĞUNDAN TƏSİRLƏNMƏLRİ

Təkamülçülərin insanları öz tərəflərinə çəkmək üçün istifadə etdikləri təbliğ üsullarından biri də **"nəzəriyyə bütün elm dünyası tərəfindən qəbul edilir"** yalanıdır. Başqa sözlə desək, təkamülçülər ətrafdakı insanlara özlərinin hər zaman çoxluq təşkil etdiklərini və çoxluğun hər zaman doğru olduğunu təlqin edirlər. "Bu qədər insanın təkamülü müdafiə etdiyinə, universitetlərdə əksəriyyətin təkamülə inandığına görə nəzəriyyə doğrudur" məntiqi ilə cəmiyyət, həmçinin inanclı insanlar üzərində psixoloji təzyiq yaratmağa çalışırlar.


PROF. ARDA DENKEL

Təkamülçülərin bu yalnış təbliğat üsulu təkamülçü olan Boğaziçi Universitetinin keçmiş fəlsəfə professoru mərhum Arda Denkel tərəfindən belə izah edilmişdir:

***"Təkamül nəzəriyyəsini bir çox tanınmış insanların və təşkilatların təkamülü mənimsəməsimi sübut edəcək?*** *Yoxsa məhkəmə qərarları ilə doğruluğu sübuta yetiriləcək? Doğruluğu təmin edən şey hörmətli və vəzifəli şəxslər tərəfindən doğru hesab edilməkdirmi? Bir tarixi faktı xatırlatmaq istəyirəm. Qalileo Qaliley dövrünün bütün hörmətli insanlarına, hüquqşünaslarına və xüsusilə də alimlərinə təkbaşına qarşı çıxıb, doğru olanı söyləyib müdafiə etmirdimi? İnkvizisiya məhkəmələrinin digər fəaliyyətləri də ortaya buna bənzər mənzərələr qoymadımı?* ***Cəmiyyətdə hörmətli və vəzifəli insanları tərəfinə çəkmək nə doğruluq, nə də birbaşa elmiliklə əlaqəli bir şeydir".***

(Arda Denkel, Cumhuriyet Bilim Teknik Eki, 27 Şubat 1999, s.15)

Arda Denkelin də diqqət çəkdiyi kimi, bir nəzəriyyənin əksəriyyət tərəfindən qəbul edilməsi onun doğruluğuna dəlil deyil. Elm tarixi öncə azlıq, daha sonra isə hər kəs tərəfindən qəbul edilən həqiqətlərlə doludur.

Məsələnin digər tərəfi isə odur ki, bu gün təkamül nəzəriyyəsi hesab edildiyi qədər "bütün elm dünyası tərəfindən qəbul edilən nəzəriyyə" deyil. Son 20-30 il ərzində təkamül nəzəriyyəsini qəbul etməyən elm xadimlərinin sayı sürətlə artır. Əksəriyyəti kainatdakı və canlılardakı qüsursuzluğu görərək darvinizm doqmasından özlərini xilas edirlər. Bu elm xadimlərinin

təkamülün əsassızlığını ortaya qoyan saysız-hesabsız araşdırmaları var. Hər biri əsasən Avropa və Amerika olmaqla dünyanın müxtəlif ölkələrindəki tanınmış universitetlərə mənsub olan bu insanlar biologiya, biokimya, mikrobiologiya, anatomiya, paleontologiya kimi elm sahələrində ixtisaslaşmış akademiklərdir. Qısası, elm dünyasının əksəriyyətinin təkamülə inandığına dair fikir irəli sürmək çox yanlışdır.




**YARADILIŞ FAKTINI QƏBUL EDƏN ALİMLƏRDƏN BƏZİLƏRİ (Soldan sağa):**

**Harvard Universitetinin Astronomiya və Elm Tarixi Professoru Owen Gingerich,**

**Almaniyanın Max-Planck-Gesellschaft Universitetinin Fizika Professoru Carl Friedrich von Weizsacker,**

**Oregon Dövlət Universitetinin Kimya Professoru, Prof. Dr. Donald Chittick,**

**Oksford Universitetinin Fizika Professoru, Prof. Robert Matthews,**

**Lehigh Universitetinin Biologiya Professoru Michael J. Behe,**

**Vaşinqton Universitetinin Anatomiya Professoru David Menton.**

Lakin yenə də yuxarıda qeyd etdiyimiz kimi, təkamülçülər çoxluq təşkil etsələr belə bunun bir mənası yoxdur. Çoxluğun mənimsədiyi anlayışı "mütləq doğrudur" deyə qəbul etmək doğru deyil. Bu həqiqət təkamül nəzəriyyəsini qəbul edən müsəlmanlar tərəfindən də bilinməlidir. Quranda bildirildiyi kimi, tarixdəki bir çox inkarçı qövmlər Allahı və dinini inkar etmək üçün özlərinin çoxluq təşkil etdiklərini söyləyərək insanları doğru yoldan döndərməyə çalışmışlar.

Allah bu batil düşüncəyə qarşı iman gətirənləri xəbərdar etmiş və çoxluğa tabe olmanın insanları yoldan azdıracağını belə bildirmişdir:

**Əgər sən yer üzündə olanların əksəriyyətinə itaət etsən, onlar səni Allah yolundan azdırarlar. Onlar ancaq zənnə qapılır və ancaq yalan uydururlar.** (Ənam surəsi, 116)

# TƏKAMÜLÇÜ MÜSƏLMANLARIN GÖRMƏDİKLƏRİ HƏQİQƏTLƏR

Əvvəlki hissədə bəzi müsəlmanların təkamülçülərin təlqinləri altında qaldıqlarına və elmi yeniliklərdən xəbərdar olmadıqlarına görə təkamül nəzəriyyəsini doğru zənn etdiklərindən bəhs etdik. Məhz bu bilgi əksikliyi həmin insanların nəzəriyyə ilə bağlı bir çox həqiqətləri görməmələrinə səbəb olur. Təkamül nəzəriyyəsinin bütpərəst inanc olduğunu, təsadüfləri və təbiət hadisələrini ilahlaşdırdığını (Allahı tənzih edirik), nəzəriyyənin banisi olan Çarlz Darvinin dinsiz şəxsiyyətini, bu nəzəriyyənin səbəb olduğu zülmü, qarşıdurmaları, müharibə və digər bəlaları görməzlikdən gəlirlər.

Bu hissədə təkamülçü müsəlmanları görmədikləri həqiqətlər üzərində dayanacağıq və materialist-ateist düşüncəyə dəstək olan bütpərəst inancı müdafiə etməkdən əl çəkməyə dəvət edirik.

## TƏKAMÜL DÜŞÜNCƏSİ QƏDİM YUNANISTANDAN GƏLƏN BÜTPƏRƏST İNANCDIR

Təkamül nəzəriyyəsi elmi həqiqət deyil, bütpərəst inancdır. Eramızdan əvvəl Misir, Babil və Şumer kimi yaşamış xalqların batil dinlərində rast gəlinən təkamül fikri sonradan qədim yunan cəmiyyətindəki filosoflara keçmişdir. Bütpərəst şumerlərin yazılarında yaradılışı inkar edən və canlıların pilləli şəkildə əmələ gəldiyini iddia edən fikirlərə rast gəlmək mümkündür. Şumerlərə görə, canlı aləm cansız su xaosundan özbaşına əmələ gəlmişdir.



**Thalesin su üzərində üzən düz dünya fikrini əks etdirən bir rəsm. Şəkildə yer üzündəki dörd əsas elementdən ikisi sayılan hava və od göstərilir.**

Misirlilər də batil dinlərinə əsaslanaraq "ilan, qurbağa, soxulcan və sıçanların daşan Nil çayının palçığından əmələ gəldiyinə" inanırdılar. Şumerlər kimi misirlilər də bir Yaradıcının varlığını inkar edir və "canlıların təsadüfən palçıqdan" əmələ gəldiyini düşünürdülər.

Miletli yunan filosoflarından Empedokl, Anaksimander və Falesin ən əsas iddiaları da ilk canlının hava, od və su kimi cansız maddələrdən öz-özünə əmələ gəlməsi idi. Bu batil inanca əsasən ilk canlılar suda qəfildən əmələ gəlmiş, daha sonra bu canlılardan bəziləri suyu tərk etmiş və quruya uyğunlaşaraq orada yaşamağa başlamışdılar. Miletli filosof Fales də bütün həyatın mənşəyinin "su" olduğuna inanırdı. Sudan yola çıxaraq bitkilərin və heyvanların, sonda isə insanın əmələ gəldiyini söyləyirdi. (David Skjaerlund, Philosophical Origins of Evolution, http://www.forerunner.com/forerunner/x0742-philosopcial-origin.html) Anaksimender

"insan balıqdan çıxmışdır", – deyir və digər filosoflar kimi heyvanların sudan çıxdığını bildirirdi. (Mehmet Bayraktar, "İslamda Evrimci Yaratılış Teorisi", Kitabiyat Basımevi, Ankara 2001, II. Baskı, s. 15) Xüsusilə də Anaksimenderin "Təbiət" adlı klassik şeiri təkamül nəzəriyyəsinin izah edildiyi ilk yazılı əsərdir. O, bu şeirində heyvanların günəş işığı ilə buxarlaşan palçıqdan əmələ gəldiyini yazmışdı. Anaksimenderə görə, ilk canlılar tikanlı, pullu qabıqlı idilər və dənizdə yaşayırdılar. Guya bu balığa bənzəyən məxluqlar daha sonra dəyişiklik keçirmiş, quruya keçərək pulcuqlarını tökmüş və insana çevrilmişdilər. (http://buglady.clc.uc.edu/biology /bio106/earlymod.htm) Anaksimenderin bu məntiqsiz fərziyyəsi hazırkı təkamül nəzəriyyəsinin əsasını təşkil etdiyini düşünə bilərik. Çünki Darvinin təkamül nəzəriyyəsi ilə Anaksimenderin fikirləri bir-birinə çox bənzəyir.

Empedokl isə özündən əvvəlki yanlış fikirləri birləşdirib su, od, hava və torpağı əsas elementlər olaraq mənimsəmişdi. Bu elementlərin bir yerə gələrək orqanizmi əmələ gətirdiyini düşünürdü. İnsanın bitkidən əmələ gəldiyinə və bu prosesin təsadüfən baş verdiyinə inanırdı. (David Skjaerlund, Philosophical Origins of Evolution, http://www.forerunner.com/ forerunner/x0742-philosopcial- origin.html) Beləcə təkamül nəzəriyyəsinin əsasını təşkil edən "təsadüf" anlayışı da dilə gətirildi.

Eyni dövrdə yaşamış Heraklit də başqa bir fikir irəli sürərək "kainatın müntəzəm şəkildə dəyişdiyini, buna görə də kainatın əvvəlindəki əfsanəvi prosesləri mühakimə etməyin mənasız olduğunu" və onun başlanğıcı və sonu olmadığını, yalnızca var olduğunu (http://buglady.clc.uc.edu/biology /bio106/ earlymod.htm) bildirmişdir. Qısası, təkamül nəzəriyyəsinin əsasını təşkil edən materialist inanc qədim Yunanıstanda da eynilə vardı.



**Empedokl kimi bəzi filosoflar dünyanın dörd ünsürdən ibarət olduğunu iddia edirdilər: torpaq, od, hava və su. 17-ci əsrə aid bu illüstrasiyada, dörd elementin günəş ətrafında yaratdığı dairələr simvollaşdırılır.**

Öz-özünə əmələ gəlmə yalanı başda Aristotel (Ərəstun) olmaqla bir çox yunan filosofları tərəfindən dəstəklənirdi. Bu batil inanca görə, heyvanlar, xüsusilə də bəzi qurdlar, böcəklər və bitkilər döllənmə və ya oxşar çoxalma formasına ehtiyac duymadan təbiətdə öz-özünə əmələ gəlirdilər. Tədqiqatlarını Aristotelin təbiət elmləri ilə bağlı fikirlərinə əsaslandıran Marqut belə demişdir:

*"Aristotel başqa açıqlama verə bilmədiyi hadisələrin izahı üçün 'spontan' əmələ gəlməni (cansız maddələrin bir yerə gələrək qəfildən canlı*

*varlıq əmələ gətirmələri) qəbul etdiyi ölçüdə yer üzündə həyatın mənşəyi ilə məşğul olmuşdur".* (Mehmet Bayraktar, "İslamda Evrimci Yaratılış Teorisi, s. 13)

Diqqətlə baxsaq, görərik ki, keçmiş dövrlərdəki təkamülçü elm xadimləri ilə müasir təkamülçülərin fikirləri arasında çox böyük oxşarlıq var. Kainatın başlanğıc və sonunun olmadığını bildirən materialist düşüncənin və canlıların təsadüfən əmələ gəldiyini iddia edən təkamül fikrinin mənşəyini bütpərəst şumer mədəniyyətində və ya materialist yunan mütəfəkkirlərində tapmaq mümkündür. Canlı aləmin sudan və ibtidai palçıq adlanan qarışıqdan təsadüfən əmələ gəldiyi, hətta canlıların yaranmasında yeganə təsirin təsadüflər olduğu yalanı bu iki inancın əsasını təşkil edir.

Bəzi müsəlmanların da dəstək olduqları təkamül nəzəriyyəsinin mənşəyi bu qədər qədim dövrə gedib çıxan batil anlayışdır. Materialist düşüncə ilə ortaya atılmışdır və bütpərəst inancları özündə ehtiva edir.



YUNAN FİLOSOFU ARİSTOTEL

Əslində, təkamül yalnızca şumerlərdə və ya yunan mütəfəkkirlərində rast gəlinən batil inanc deyil. Məlumdur ki, mənbəyi qədim Yunanıstan olmaqla yanaşı, hazırki konfutsiçilik, taoizm kimi bütün batil dinlərin əsasını təkamül inancı təşkil edir. Bu da onu sübut edir ki, təkamül nəzəriyyəsi İslam inancına tamamilə zidd və batil anlayışdır.

Tarixi faktlara baxmayaraq, təkamülü müdafiə edən və "yaradılışçı təkamül nəzəriyyəsi"nin Quran ayələri ilə dəstəkləndiyini iddia edən təkamülçü müsəlmanlar bu fikrin mənbəyini də İslam dünyasına bağlamaq istəyirlər. Bu iddiaya əsasən, ilk təkamül fikri müsəlman mütəfəkkirlərdən çıxmış və onların əsərlərinin xarici dillərə tərcümə edilməsi qərb ölkələrində təkamül düşüncəsini əmələ gətirmişdir.

Halbuki yunan mütəfəkkirlərinin təkamülə aid fikirlərindən verilən bir neçə nümunə belə təkamül nəzəriyyəsinin qədim bütpərəst cəmiyyətlərdən gələn ibtidai inanc olduğunu açıqca göstərir.

Həm elmi, həm də tarixi faktlara əsaslanan həqiqətlər bu qədər aşkar ikən, materializm üzərində qurulmuş təkamül fərziyyəsini müsəlmanlara aid etməyə çalışmaq çox böyük xətadır.



HERAKLİT

# TƏKAMÜL NƏZƏRİYYƏSİNİN TƏSADÜF İDDİASI YARADILIŞ GERÇƏYİ İLƏ ZİDDİYYƏT TƏŞKİL EDİR


PROF. FRED HOYL

Təkamül nəzəriyyəsinin yaradılışla ziddiyyət təşkil etmədiyini irəli sürənlərin görmədikləri çox vacib bir məqam var: həmin insanlar darvinizmin əsas iddiasının "canlılar bir-birilərindən təkamül keçirərək əmələ gəldiyi" tezisi olduğunu düşünürlər. Halbuki təkamülçülərin əsas iddiaları bu deyil. Əvvəl də qeyd etdiyimiz kimi, onlar "canlı aləmin təsadüfən, şüursuz mexanizmlərlə əmələ gəldiyini" iddia edirlər. Elmə zidd olan bu iddialarına əsasən, yer üzündəki canlılar "bir Yaradıcı olmadan, cansız maddədən özbaşına" əmələ gəlmişdir.

Bu iddia bir Yaradıcının varlığını ən başdan inkar edir. Buna görə də bu nəzəriyyə inanclı insanlar tərəfindən qətiyyən qəbul edilə bilməz. Lakin bəzi müsəlmanlar bunun fərqində olmadıqlarına görə "Allah canlıları bir-birindən təkamül keçirərək yarada bilər" fikrini əsas alaraq təkamülü müdafiə etməyi yanlış hesab etmirlər.

Lakin burada çox böyük təhlükəni görməzlikdən gəlirlər. Unudulmamalıdır ki, tamamilə yanlış olmasına baxmayaraq, "təkamüllə dini uyğunlaşdırmağa" çalışmaqla bu fikrə dəstək verirlər. Təkamülçülər isə fikirlərini cəmiyyətə daha rahat qəbul etdirmək üçün bu vəziyyətə göz yumurlar.

Mövzuya saleh müsəlman kimi baxdıqda və Quran ayələrinə əsasən düşündükdə görürük ki, əsasını "təsadüf" inancının təşkil etdiyi nəzəriyyə ilə İslam dini arasında ortaq məqam yoxdur. Təkamül nəzəriyyəsi təsadüfləri, zamanı və cansız maddələri ilahlaşdıraraq gücsüz, şüursuz varlıq və məfhumlara yaratma gücü verir (Allahı tənzih edirik). Bir müsəlman bu cür bütpərəst inanca əsaslanan nəzəriyyəyə qətiyyən sahib çıxmamalıdır. İnanclı insan tək Yaradıcı olan Allahın hər şeyi yoxdan var etdiyinə iman gətirdiyi üçün buna zidd olan hər cür fikir və inanca qarşı elm və ağılla mübarizə aparmalıdır.

Təkamül nəzəriyyəsi materializmin bir hissəsidir. Materializmin batil iddiasına görə, kainatın əvvəli və sonu, yəni Yaradıcısı yoxdur. Din əxlaqına uyğun olmayan bu ideologiyaya əsasən, kainat: qalaktikalar, ulduzlar, planetlər, günəş, digər kosmik cisimlər, onların sahib olduğu qüsursuz sistemlər və bütün bunların bir-biriləri ilə olan mükəmməl uyğunluğu tamamilə təsadüflərin nəticəsidir. Həmçinin canlı aləmin əsas elementi olan ilk zülal və ilk canlı hüceyrə də təsadüflərin təsiri ilə özbaşına əmələ gəlmişdir. Yer üzündəki, dənizlərdəki və göylərdəki canlıların bədənlərindəki qüsursuzluq da təsadüflərin əsəridir. Öz bədənləri başda olmaqla yaradılışa aid dəlillər hər yerə yayıldığı halda, təkamülçülər bu

həqiqəti görməzliyə vurur və bütün bu mükəmməllikləri başıboş təsadüflərə və şüursuz proseslərə aid edirlər. Əvvəl də qeyd etdiyimiz kimi, təkamülçülərin əsas xüsusiyyəti təsadüfləri ilahlaşdırmaları və Allahın varlığını inkar etmələridir. Lakin kiminsə Allahın varlığını və böyüklüyünü qəbul etməməsi heç nəyi dəyişmir. Allahın sonsuz elmi və bənzərsiz sənəti yaratdığı hər şeydə özünü büruzə verir.



**Təkamülçülərin, həyatın təsadüflər nəticəsində cansız maddələrdən özbaşına meydana gəldiyini iddia etmələri, ABŞ-dakı Azadlıq heykəlinin, dənizə düşən ildırımlar nəticəsində təsadüfən birləşən qum və çınqıllardan əmələ gəldiyini iddia etmək qədər ağılsızlıq və məntiqsizlikdir.**

Belə ki, 21-ci əsrdə əldə olunan elmi nailiyyətlər də təkamülçülərin "canlı aləm təsadüfən və təbii hadisələrlə öz-özünə əmələ gəldi" iddiasını qəti şəkildə rədd edir. Canlılardakı qüsursuzluq onu göstərir ki, onları üstün ağıl

və bilgi sahibi olan Allah yaratmışdır. Ən sadə quruluşlu hesab edilən canlıların belə mürəkkəb kompleksliyə sahib olmaları təkamülü müdafiə edənləri çıxılmaz vəziyyətə salır. Hətta təkamülçülərin özləri də bu həqiqəti tez-tez etiraf edirlər. Məsələn, ingilis riyaziyyatçı və astronom prof. Fred Hoyl təkamülçü olmasına baxmayaraq, canlıların təsadüfən əmələ gəlməsinin mümkün olmadığını belə etiraf edir:

*"Hər şeydən əvvəl canlıların təsadüfən əmələ gəlməsi ehtimalı o qədər azdır ki, bu iddianı qəbul etmək məntiqsizdir ".*

(Fred Hoyle-Chandra Wickramasinghe, Evolution From Space, London: J.M. Dent and Company, 1981, s. 141)

Təkamülçü Pier Paul Qras isə təsadüflərin yaratma gücünün olmasına inanmağın xəyalpərəstlik olduğunu belə ifadə edir:

*"Darvinizmə əsasən, tək bir bitki, tək bir heyvan tam lazım olan formada minlərlə faydalı təsadüflərə məruz qalmalıdır. Yəni möcüzələr adiləşməli və inanılmaz dərəcədə qeyri-mümkün hadisələr asanlıqla həyata keçməlidir. Xəyal qurmağı qadağan edən qanun yoxdur, lakin elm bu işə daxil edilməməlidir".* (Pierre-Paul Grassé, Evolution of Living Organisms, Academic Press, New York, 1977 s. 103)

Bu sözlər təkamülçülərin ideologiyaları naminə düşdükləri vəziyyətin bariz nümunəsidir. Çünki nəzəriyyələrinin çıxılmaz vəziyyətə düşdüyünü və elmdən kənar olduğunu gördükləri halda, yalnızca ideologiyarı naminə təkamül nəzəriyyəsindən əl çəkmirlər. Fred Hoyl digər açıqlamasında təkamülçülərin "təsadüfə" inanmalarının səbəbini belə izah edir:

*"Əslində, həyatın ağıl sahibi bir varlıq tərəfindən yaradıldığı o qədər aşkardır ki, bu həqiqətin nə üçün hər kəs tərəfindən qəbul edilmədiyi insana maraqlı gəlir. Bunun səbəbi elmi deyil, psixolojidir".*

(Fred Hoyle, Chandra Wickramasinghe, Evolution from Space, s. 130)



**Təkamülçülər ilk canlı hüceyrənin ibtidai dünya şəraitində, cansız maddələrdən, təbii hadisələrin təsadüfi təsirləriylə özbaşına əmələ gəldiyi kimi ağıl və elm xarici bir fikri müdafiə edirlər. Ancaq bu iddia, müasir elmin tapıntıları ilə heç bir şəkildə uzlaşmamaqdadır.**

Əvvəl də qeyd etdiyimiz kimi, Fred Hoylun psixoloji dediyi səbəb təkamülçülərin yaradılışı inkar etməyə çalışmalarıdır. Bütün bu dəlillər bəzi müsəlmanların təkamül nəzəriyyəsinin Allahı inkar etmək üçün müdafiə edilən fikir olduğunu görmələri üçün kifayətdir.




**Hüceyrədəki Mükəmməl Yaradılış Təsadüf İddiasını Puça Çıxarır**

**Həyatı meydana gətirən tək bir hüceyrə belə son dərəcə mürəkkəb bir quruluşa malikdir. Yuxarıdakı şəkildə hüceyrəni meydana gətirən hissələrin sadəcə bir qismi görülməkdədir. Bütün bu hissələrin arasında son dərəcə mürəkkəb və mükəmməl planlı bir nizamlama vardır. Belə bir quruluşun təsadüfən meydana gəldiyini iddia etmək, ağla, məntiqə və elmi tapıntılara qəti olaraq ziddir.**

## TƏBİİ SEÇMƏ VƏ MUTASİYALARIN TƏKAMÜLLƏŞDİRİCİ BİR GÜCÜ YOXDUR

Təkamülçü müsəlmanlar təkamül nəzəriyyəsinin əsas iddialarının belə elm qarşısında bütün gücünü itirdiyini görmürlər. Təkamül nəzəriyyəsi elə ilk canlının əmələ gəlməsi mərhələsində çətin vəziyyətə düşür.

Nəzəriyyə iddia edir ki, təbiətdəki 1,5 milyona yaxın canlı növü şüursuz təbiət hadisələri nəticəsində ortaya çıxmışdır. Təkamülçülərə görə, əvvəlcə cansız maddənin içində kimyəvi reaksiyalarla canlı hüceyrə əmələ gəlmişdir. *(Qeyd edək ki, belə bir şeyin baş verə bilməyəcəyini göstərən bir çox faktlar var. Tədqiqatçılar ibtidai dünya atmosferində mövcud olan qazlarla və eyni şəraiti əmələ gətirərək apardıqları təcrübələrdə canlıların ən kiçik elementini belə əldə edə bilməyiblər.)* Canlı orqanizmin əmələ gəlməsi müasir texlonogiya və elm sayəsində şüurlu müdaxilələrə baxmayaraq, mümkün olmadığı halda, kor təsadüflərin bunu bacardığını iddia etmək, əlbəttə ki, ağıl və məntiqə sığmır.




**Təbii seleksiyaya görə, güclü və yaşadığı ətraf mühitə uyğunlaşa bilən canlılar həyatda qalırlar, digərləri isə məhv olurlar. Təkamülçülər isə təbii seçmənin canlıları təkamül etdirdiyini və yeni növlər meydana gətirdiyini iddia edirlər. Halbuki təbii seçmənin belə bir nəticəsi yoxdur və bu iddianı təsdiq edən bir dənə də olsun dəlil yoxdur.**

Təkamülçülərə görə, bu ilk hüceyrə ilə başlayan həyat getdikcə daha da təkmilləşmiş və çeşidlənmişdir; guya bakteriyalarla başlayan "təkamül prosesi" ən sonda insanı əmələ gətirmişdir. Qısası, bu ağılsız və məntiqsiz iddiaya əsasən, təbiətdəki bir sıra şüursuz mexanizmlər canlıları müntəzəm olaraq inkişaf etdirməlidir. Məsələn, bir bakteriyada təqribən 2000 müxtəlif zülalın genetik məlumatı var. İnsanda isə təqribən 30 mindir. Yəni şüursuz mexanizm minlərlə yeni zülalın genetik məlumatını müəyyən zaman ərzində əmələ gətirməlidir.

Təkamül iddiası budur. Bəs, həqiqətən də, təbiətdə canlıların genetik məlumatını formalaşdıran mexanizm varmı?

Bu gün təkamül nəzəriyyəsi olaraq adlandırdığımız neo-darvinizm iki xəyali mexanizm irəli sürür: təbii seçmə və mutasiya.

Təbii seçmə "təbii yolla seçilmək" deməkdir. Yəni həyat mübarizəsi içində güclü olanlar və təbii şəraitə uyğunlaşanlar həyatda qalır, digərləri isə yox olurlar. Məsələn, bir bölgədə hava şəraitinin dəyişərək temperaturun azalması o bölgədə yaşayan heyvan populyasiyaları içində aşağı temperatura qarşı dözümsüz olan fərdlərin məhv olmasına səbəb olur.

Uzun müddət soyuğa dözümlü olan fərdlər həyatda qalır və populyasiyanın hamısı bunlardan əmələ gəlir. Yaxud vaşaqların təhdidi altında yaşayan dovşanlardan ətrafa daha çox uyğunlaşanlar və ya ən sürətlə qaçanlar həyatda qalır və xüsusiyyətlərini sonrakı nəsilə ötürürlər. Lakin diqqət etsək, görərik ki, burada yeni xüsusiyyət qazanılmır və mövcud canlılar başqa növə çevrilmir. Qısası, təbii seçmə mexanizmi təkamülü inkişaf yaratma xüsusiyyətinə sahib deyil.



**İnsanın tək bir DNT molekulunda təxminən 1000 kitabı dolduracaq qədər məlumat var. Tədqiqatlara görə, bu nəhəng ensiklopediya təxminən 3 milyard hərfdən ibarətdir. DNT-dəki qüsursuz yaradılış, Allahın sonsuz güc və qüdrətinin dəlillərindən biridir.**

Bu halda təkamülçülərin əlində yalnızca mutasiya qalır. Təkamül nəzəriyyəsinin qəbul edilməsi üçün mutasiyalar canlıların genetik məlumatını inkişaf etdirməlidir.



**Təbii seleksiyaya görə, güclü və yaşadığı ətraf mühitə uyğunlaşa bilən canlılar həyatda qalırlar, digərləri isə məhv olurlar. Təkamülçülər isə təbii seçmənin canlıları təkamül etdirdiyini və yeni növlər meydana gətirdiyini iddia edirlər. Halbuki təbii seçmənin belə bir nəticəsi yoxdur və bu iddianı təsdiq edən bir dənə də olsun dəlil yoxdur.**

Mutasiya canlıların genlərindəki radiasiya kimi xarici təsirlər və ya DNT-dəki transkripsiya xətaları nəticəsində meydana gələn dəyişiklikdir. Əlbəttə ki, mutasiyalar dəyişikliyə səbəb olur, lakin bu dəyişikliklər heç vaxt faydalı olmur, hər zaman mənfi xüsusiyyətlidir. Başqa sözlə desək, mutasiya canlıları inkişaf etdirmir, əksinə hər zaman ziyan vurur. Bu günə qədər orqanizmə faydalı olan hər hansı mutasiya müəyyən edilməyib. Yəni darvinistlərin iddiasına görə, mutasiya bədənin hər yerində simmetrik və bir-birinə uyğun dəyişikliklər əmələ gətirməlidir. Məsələn, təsadüfi mutasiyalarla sağ tərəfdə qulaq əmələ gəldisə, sol tərəfdə də təsadüfi mutasiyalar eyni simmetriyada, eyni şəkildə eşidən, eyni xüsusiyyətlərə sahib ikinci qulağı da əmələ gətirməlidir. Zindan, çəkic və üzəngi sümüklərinin hər biri eyni formada, mükəmməl və bərabər şəkildə meydana gəlməlidir. Eyni vəziyyət ürəyə də aiddir. Darvinistlərin iddiasına əsasən, mutasiyalar mütləq bütün qapaqcıq və qulaqcıqları eyni formada,

səhvsiz, tam yerində və eyni anda meydana gətirməlidir. Bu proses bədənin hər bir orqanında eyni şəkildə baş verməlidir.

Əks halda böyük ziddiyyətlər olmalı və bir qulağı tərs, bir dişi fərqli, bir gözü alnında, digəri isə burnunda olan qəribə formalar yaranar. Canlı aləmdə isə bu cür uyğunsuzluq yoxdur. Darvinistlərin iddiasına görə, mutasiyalar hər şeyi simmetrik və uyğun formada meydana gətirməlidir. Lakin 99%-i zərərli, 1%-i isə təsirsiz olan mutasiyaların faydalı olması; düşünülmüş, uyğun və simmetrik orqanları eyni anda əmələ gətirməsi mümkün deyil. Qısası, mutasiyalar qüsursuz quruluşa sanki tüfənglə atəş açmağa bənzəyir. Sağlam bir şeyin üstünə atəş açmaq onu tamamilə məhv edər. Yalnızca birinin təsirsiz qalması və ya bədəndəki bir infeksiyanı yandıraraq sağaltması heç nəyi dəyişmir. Onsuz da orqanizm ona dəyən 99 güllə ilə məhv olmuşdur.

20-ci əsrdə ən çox inkişaf edən elm sahələrindən biri də genetikadır. Canlılarda müşahidə olunan genetik xəstəliklərin müasir elmlə araşdırılması nəticəsində məlum oldu ki, mutasiyalar təkamülçülərin iddia etdikləri kimi, təkamülə fayda verən bioloji dəyişikliklər deyil. Xüsusilə də genetika elminin inkişafı ilə mutasiyalar nəticəsində əmələ gələn 4500-ə yaxın genetik xəstəlik aşkar olunmuşdur. Əvvəllər "irsi" olduğu zənn edilən bir çox xəstəliklərin artıq müxtəlif növ mutasiyalar nəticəsində əmələ gəldiyi məlumdur.

Mutasiyalar irsi baxımdan faydalı olması üçün mütləq çoxalma orqanlarında (kişilərdə sperm hüceyrələri, qadınlarda isə yumurta) baş verməlidir. Yalnızca bu cür baş verən genetik dəyişiklik sonrakı nəslə ötürülə bilər. Bir çox genetik xəstəliyin səbəbi də bu hüceyrələrdə baş verən dəyişikliklərdir. Bədənin qaraciyər və beyin kimi digər orqanlarında baş verən mutasiyalar isə sonrakı nəslə ötürülə bilməz. Bu cür genetik dəyişikliklərə "somatik mutasiyalar" deyilir. Bir çox xərçəng növlərinin səbəbi də hüceyrə DNT-sində baş verən bu proseslərdir.



**Təsadüfi mutasiyalar insanlara və digər bütün canlılara həmişə zərər verirlər. Şəkillərdə görülən Çernobıl qəzasının nəticələri, mutasiyaların təsirlərini görmək baxımından ibrət vericidir.**

Mutasiyaların canlılara vurduğu ziyanlara ən yaxşı nümunələrdən biri xərçəng xəstəliyidir. "Kanserogen" adlanan kimyəvi maddələr və ultrabənövşəyi şüalar əslində, "mutagen", yəni mutasiya yaradan amillərdir. Son illərdə, xüsusilə xərçəngin yaranmasına təsir edən "onkoloji" və "şiş yaranmasının qarşısını alan" genlərin kəşfindən sonra xərçəngi əmələ gətirən mutasiyaların mexanizmi aydın oldu. Bəhs edilən bu iki gen hüceyrələrin çoxalması və bədənin özünü yeniləməsi üçün lazımdır. Ancaq bunlardan birinin mutasiyalarla zərər görməsi nəticəsində hüceyrələr nizamsız böyüyür və xərçəng əmələ gəlməyə başlayır. Bu vəziyyəti bir avtomobilin qaz pedalının kilidlənməsi və ya əyləcin sıradan çıxmasına bənzədə bilərik. Hər iki halda da avtomobilin qəza törətməsi labüddür. Eyni şəkildə nəzarətsiz hüceyrə artımı da əvvəlcə xərçəngə, sonra isə ölümə səbəb olur. Bu genlər mutasiyalar nəticəsində doğuşdan xətalı olduqda, məsələn, retinoblastoma adlı xəstəlik nəticəsində körpələr qısa müddətdə həyatlarını itirirlər.

Mutasiyaların canlılara vurduğu ziyanlar bununla bitmir. Bu günə qədər müşahidə edilən bütün mutasiyalar əksər hallarda zərərli, bəzən isə təsirsiz olur. Buna baxmayaraq, təkamülçülər, həmçinin təkamülçü müsəlmanlar hələ də mutasiyaları təkamül mexanizmi kimi göstərməyə çalışırlar. Əgər təkamülçülərin iddia etdikləri kimi növlər bir-birindən təkamül keçirsə idi, milyonlarla faydalı mutasiyalar çoxalma hüceyrələrində ard-arda baş verməli idi.

Bu gün inkişaf edən elm milyonlarla zərərli mutasiyaların səbəb olduğu xəstəliyi aşkar etdiyi halda, təkamülçü alimlərin genetik məlumatı artıran heç bir mutasiya nümunəsi verməmələri, əlbəttə ki, təkamül nəzəriyyəsini böyük çətinliyə salır. 35 cilddən ibarət olan "of Traite de Zoologie" ensiklopediyasının redaktoru və Fransa Elm Akademiyasının keçmiş sədri olan təkamülçü Pier Paul Qras mutasiyaları "**yazılmış mətnin kopyalanması zamanı edilən hərf səhvlər**"inə bənzətmişdir. Hər bir hərf səhvi kimi mutasiyalar da yeni məlumat yaratmır, əksinə mövcud məlumatı pozurlar. Qras bu həqiqəti belə izah etmişdir:

*Mutasiyalar müəyyən zaman ərzində çox nizamsız şəkildə əmələ gəlirlər. Bir-birilərini tamamlayan xüsusiyyətləri yoxdur və bir-birilərinin ardınca gələn nəsillər üzərində müəyyən istiqamətə doğru toplanmış (getdikcə artan) təsirləri olmur. Mövcud olan quruluşu dəyişdirirlər, lakin bunu tamamilə nizamsız şəkildə edirlər. Bir canlının bədənində çox kiçik də olsa, nizamsızlıq yarandıqda bunun nəticəsi ölüm olur... Həyat faktoru ilə anarxiya (nizamsızlıq) arasında heç bir qanunauyğunluq yoxdur.*

(Pierre-Paul Grassé, Evolution of Living Organisms, s. 97)

Məhz buna görə də mutasiyalar Qrasın da dediyi kimi, "nə qədər çox olsa da, təkamülü əmələ gətirməzlər". Mutasiyaların bu təsirini zəlzələlərə bənzədə bilərik. Zəlzələlər bir şəhəri inkişaf etdirmir, ancaq onu məhv edir. Mutasiyalar da hər zaman mənfi dəyişikliklərə səbəb olur. Buna görə də təkamülçülərin mutasiyalara əsaslanan iddiası da tamamilə əsassızdır.

# FOSİL TƏDQİQATLARI YARADILIŞ HƏQİQƏTİNİ TƏSDİQ EDİR

Əvvəlki bölmədə də qısaca bildirdiyimiz kimi, elmi tərəqqi təbii seçmə və mutasiyanın heç bir təsir gücünün olmadığını sübut edib. Təkamül prosesi olmadığına görə keçmişdə də təkamül baş verə bilməzdi. Amma təkamülçülər bu iddialarından əl çəkmir və bütün canlıların yüz milyonlarla illik uzun dövr ərzində mərhələ-mərhələ bir-birlərindən törədiklərini iddia etməyə davam edirlər. Təkamülçülər burada da yanılırlar. Əgər iddia etdikləri fikir doğru olsa idi, bu qədər uzun müddət ərzində saysız-hesabsız ara keçid formaları olmalı və biz bu fosil qalıqlarına rast gəlməli idik.

Təkamülçülərin iddialarının məntiqsizliyini bütün nümunələrdə görmək mümkündür. Məsələn, balıqların yaranmasını misal gətirək. Təkamülçülər balıqların təkamül keçirərək dənizulduzu və ya dəniz soxulcanı kimi onurğasız dəniz canlılarından yarandığını iddia edirlər. Əgər belədirsə, bu iki fərqli canlı qrupu arasında mərhələ-mərhələ təkamül keçirmiş çoxlu sayda "ara keçid formaları" olmalıdır. Halbuki dövrümüzdə keçmişdə yaşamış balıqların və dəniz ulduzlarının hər birinə aid on minlərlə fosil tapılmasına baxmayaraq, təkamülçülərin bu iddiasını təsdiq edən **tək bir ara keçid forması** belə tapılmamışdır. Ara keçid formalarının olmaması isə açıq-aşkar "təkamülün heç bir zaman baş vermədiyini"göstərir.



**Bir qasırğa bir şəhəri necə inkişaf etdirməz və o şəhərə yalnız dağıntılar gətirərsə, təsadüfi mutasiyalar da canlıları inkişaf etdirməz, onlara ancaq zərər, xəstəlik və əlillik gətirər.**

Təkamülçülər bu həqiqəti bilmələrinə baxmayaraq, demaqoqluq edərək və saxta fosillərdən istifadə edərək insanları təkamül ssenarisinə inandırmağa çalışırlar. Halbuki Darvin belə öz dövründə fosil qalıqlarının nəzəriyyəsini təsdiq etmədiyini bilirdi. Kitabının "Nəzəriyyənin çətinlikləri" başlıqlı bölməsində bu həqiqəti belə ifadə edirdi:

*Əgər, həqiqətən, növlər digər növlərdən tədricən törəyibsə, nə üçün saysız-hesabsız ara keçid formalarına rast gəlmirik? Nə üçün bütün təbiət qarmaqarışıq vəziyyətdə deyil, tamamlanmış və yerli-yerindədir? Saysız-hesabsız ara keçid formaları olmalıdır, bəs nə üçün yer üzünün bu qədər*

*çoxsaylı təbəqəsində onları tapa bilmirik.... Nə üçün hər geoloji forma və hər təbəqə belə formalarla dolu deyil? Geologiya yaxşı dərəcələndirilmiş proses üzə çıxarmır və bəlkə də, bu mənim nəzəriyyəmə qarşı irəli sürüləcək ən böyük etiraz olacaq.* (Charles Darwin, The Origin of Species, 1. b., s.172)

Darvin gələcəkdə fosil qalıqlarının çoxalacağını və mövcud olmayan ara keçid formalarının da tapılacağını ümid edirdi. Amma bu xəyalı heç vaxt gerçəkləşmədi. Dövrümüzdə təkamülçülərin də artıq belə ümidləri qalmayıb. Çünki özlərinin də etiraf etdiyi kimi, fosil qalıqları olduqca çoxdur və bizə həyatın tarixini göstərəcək qədərdir. Lund Universitetindən isveçli təkamülçü botanik prof. N. Heribert Nilson fosil qalıqları barədə bunları deyir:

*"Təkamülü sübut etmək üçün 40 ildən çox davam edən təşəbbüslərim, nəhayət, uğursuzluqla nəticələndi... Fosil materialı hazırda o qədər tamdır ki, yeni siniflər yaradılmışdır və ara keçid formalarının tapılmaması material əskikliyi ilə açıqlana bilinməyəcək vəziyyətdədir.* ***(Fosil qalıqlarındakı) boşluqlar gerçəkdir, əsla tamamlana bilməyəcək".***

(Prof. N. Heribert Nilsson, Lund University, Sweden Famous botanist and evolutionist, As quoted in: The Earth Before Man, s. 51, http://www.netcentro.co.uk/steveb /penkhull/create3.htm)



**Təkamülçülər, məsələn, bir dəniz ulduzunun milyonlarla il ərzində tədricən inkişaf edərək balığa çevrildiyini iddia edərlər. Bu iddiaya görə, dəniz ulduzu ilə balıq arasında çoxlu "ara-keçid forması" olmalıdır. Ancaq bu günə qədər heç bir ara keçid formasına aid bircə dənə də olsun fosil tapılmamışdır. Fosil qeydlərində dəniz ulduzları və balıqlar var, amma bu ikisi arasında heç bir ara forma yoxdur.**

Qlazqo Universitetindən paleontoloq prof. T. Nevil Corc isə fosil qalıqlarının olduqca çox olmasına baxmayaraq, axtarılan ara keçid formalarının hələ tapılmamasını belə ifadə etmişdir:

*"Fosil qalıqlarının (təkamülə aid olan) əskikliyini ortadan qaldırmaq üçün hər hansı açıqlama etmək artıq mümkün deyil. Çünki əlimizdəki fosil qalıqları olduqca çoxdur və yeni kəşflərlə yeni növlərin tapılması qeyri-mümkün görünür...* ***Hər cür kəşfə baxmayaraq, fosil qalıqları hələ də (növlər arası) boşluqlardan yaranmağa davam edir" .***

(T. Neville George, "Fossils in Evolutionary Perspective", Science Progress, cilt 48, Ocak 1960, s. 1- 3)



**Təkamülçülərin iddia etdikləri ara keçid formalarına aid fosillərin heç birinə fosil qeydlərində rast gəlinməmişdir. Tarix boyu balıqlar həmişə balıq kimi, quşlar da quş kimi, insanlar da insan kimi mövcud olublar.**

"Təkamülçülər fosil qalıqlarının təkamülü təkzib etməsi ilə yanaşı, yaradılış həqiqətinə elmi dəlil olduğunu da etiraf edirlər. Məsələn, təkamülçü paleontoloq Mark Çarneçki belə etiraf edir:

*"Nəzəriyyəni (təkamülü) sübut etmənin qarşısındakı ən böyük maneə hər zaman fosil qalıqları olmuşdur... Bu qalıqlar heç vaxt Darvinin mövcud olduğunu iddia etdiyi ara keçid formalarının izlərini ortaya qoymayıb. Növlər bir anda ortaya çıxırlar və yenə bir anda yox olurlar və bu gözlənilməyən vəziyyət* ***növlərin Tanrı tərəfindən yaradıldığını müdafiə edən yaradılışçı arqumentə dəstəkdir".***

(Mark Czarnecki, "The Revival of the Creationist Crusade", MacLean's, 19 Ocak 1981, s. 56)

Gördüyümüz kimi, təkamülçülər ara keçid formaları mövzusunda da uğursuzluğa düçar olublar. Darvinizm iddiasının irəli sürüldüyü 19-cu əsrdən etibarən bütün dünyada aparılan qazıntı işləri və tədqiqatlarda təxminən 300 milyon fosil əldə edilmiş, amma tək bir "ara keçid forması"na belə rast gəlinməmişdir. Əldə edilən tapıntılar təkamülçüləri məyus edir, çünki onlar canlıların yer üzərində birdən-birə, əksiksiz və qüsursuz olaraq ortaya çıxdıqlarını göstərir.

Amma təkamülçü alimlər ara keçid formalarının heç vaxt mövcud olmadığını çox yaxşı bilmələrinə baxmayaraq, nəzəriyyələrini müdafiə etməkdən əsla əl çəkmirlər. Bunun üçün əllərindəki bəzi fosillər haqqında ön mühakimə yürütməyə çalışırlar. Dünya şöhrətli "Nature" jurnalının redaktoru Henri Ci "Geoloji zaman axtarışında" (In search of deep time) adlı əsərində təkamülçü alimlərin fosil barədə şərhlərinin "nə dərəcədə elmi" olduğunu belə etiraf edir:




**Henri Geenin "In Search of Deep Time" adlı kitabı**

*"Əcdad-nəvə əlaqələrinə bağlı insan təkamülü sxemi tamamilə gerçəklərə zidd insan icadıdır və insanların ön mühakimələrinə görə formalaşmışdır... Bir qrup fosilin qohumluq zənciri yaratdığını demək test edilən elmi fərziyyə deyil, gecə nağılları ilə eyni dəyərə malik iddiadır, əyləndirici və hətta bəlkə yönləndiricidir, amma elmi deyil".*

(Henry Gee, "In Search of Deep Time", New York, The Free Press, 1999, s. 116-117)

Buna görə bəzi inanclı insanlar təkamülçülərin elmilik maskası altında etdikləri bu cür saxtakarlıqlarına aldanmamalıdırlar. "Alim olduqlarına görə, mütləq doğru söz deyərlər" demək və bu səbəbdən təkamülçülərin hər dediklərinə inanmaq, şübhəsiz ki, böyük xəta olar. Çünki təkamülçü alimlər ideologiyaları uğrunda gerçəkləri gizlətməkdən, elmi məlumatları təhrif etməkdən, hətta saxta dəlillər düzəltməkdən çəkinmirlər. Darvinizmin tarixi belə nümunələrlə doludur.

Darvinin nəzəriyyəsinə ümumi olaraq baxıldıqda belə əsassızlığı, çürük əsaslar üzərinə qurulduğu dərhal anlaşılar. Daha dərin araşdırıldıqda isə vəziyyət daha da aydınlaşır.

Təkamülçülərin iddialarının tam əksinə, bütün kainatda, yer üzərindəki canlı-cansız bütün varlıqların xüsusiyyətlərində çox mükəmməl nizam və ağılla qarşılaşırıq. Bu da hər şeyin bir Yaradıcısı olduğunun, yəni canlı-cansız bütün varlıqları Allahın yoxdan var etdiyinin dəlilidir. Təkamülçü alimlər isə bunu qəbul etmədikləri üçün bu gerçəyə qarşı naümidcəsinə mübarizə aparırlar. Materializmə olan güclü bağlılıqları səbəbindən sanki bir ölünü yaşatmağa çalışırlar.

Bütün bunlar bizi belə nəticəyə gətirir: darvinizm insanları ağıldan, elmdən və gerçəklərdən uzaqlaşdırır, onları ağılsızlığa aparır. “Ağılsızlıq” bu vəziyyətə tam uyğun gəlir. Çünki təkamülə inanan insanlar ağılın və elmin göstərdiyi yolla getməyib, Darvinin yaşadığı 1800-cü illərdən qalma xürafələrə aldanır, axırda isə təsadüflərin ilahlıq edə biləcəyinə inanırlar. Halbuki yaradılış dəlilləri bütün kainatı əhatə edib. Bunu anlamaq üçün göyə, dənizlərə, heyvanlara, bitkilərə və onların malik olduqları qüsursuz mexanizmlərdən yalnız birinə baxmaq yetərlidir. Bütün bunların təsadüflərin əsəri olduğunu demək ağıla, məntiq və elmə zidd olar. Hər kəs Allahın böyüklüyünü və ucalığını təqdir etməli və Allaha təslim olmalıdır.

## İSLAMDA TƏKAMÜL OLDUĞUNU İDDİA EDƏNLƏR 300 MİLYON FOSİLİN TƏKAMÜLÜ ALT-ÜST ETDİYİNİ BİLMİRLƏR

Bəzi müsəlmanlar 1940-50-ci illərdən qalma məlumatlarla təkamülün elm tərəfindən dəstəklənən nəzəriyyə olduğunu zənn edirlər. *"Müsəlmanlar Darvindən əvvəl təkamülü bilirdilər"* kimi aciz və qəribə məntiq irəli sürərək təkamülü İslamla əlaqələndirməyə çalışırlar. Bu məntiq ciddi bilgisizliyin nəticəsidir.

Birincisi, təkamül saxtakarlığı ilk dəfə Darvinlə ortaya çıxmış düşüncə deyil. Tarix boyu bütün materialistlər canlıların daşdan, torpaqdan öz-özünə yarandığını və canlıların guya bir-birindən törədiyini iddia edirlər. Təkamül minlərlə il əvvələ dayanan bütpərəst inancdır. Şumerlər də, qədim misirlilər də təkamülə inanan və təkamülü müdafiə edən cəmiyyətlər olublar. Məsələn, misirlilər canlıların Nilin palçıqlı sularından öz-özünə çıxdıqlarını düşünürdülər. Beləliklə, *"təkamül Darvindən əvvəl də bilinirdi, müsəlmanlar da təkamülü bilirdilər"* deməyin heç bir mənası yoxdur. Müsəlmanlar da, ilk

yəhudilər də, ilk xristiyanlar da, şumerlər də, misirlilər də təkamülün dinsizliyin mənbəyi olduğunu, əlbəttə, bilirdilər. Amma bu gün də olduğu kimi, o dövrdə də ağıl və vicdan sahibi insanlar təkamülün saxtakarlıq olduğunu açıqca görə bilirdilər, bəzi insanlar da materialist və ateist təfəkkürə sahib olduqları üçün bu saxtakarlığı müdafiə edirdilər.

İkincisi, canlıların mərhələ-mərhələ bir-birlərindən törəyərək yarandıqları iddiası elmi olaraq heç bir dəlillə təsdiqlənməyib. Əgər canlılar Darvinin və ya keçmişdə yaşamış təkamülçülərin iddia etdiyi kimi, bir-birindən törəmiş olsa idi, bu, fosil qalıqlarında açıqca görülməli idi. Bu günə qədər aparılan qazıntı işlərində 300 milyona yaxın fosil əldə edilmişdir. Amma bunların içində bir canlının digərinə çevrildiyini, canlıların guya ortaq əcdada sahib olduğunu göstərən tək bir fosil belə yoxdur. 300 milyon fosilin hər biri istisnasız olaraq canlıların sahib olduqları bütün xüsusiyyətləri ilə anidən ortaya çıxdıqlarını, yəni yaradıldıqlarını və yüz milyonlarla il boyu heç dəyişmədiklərini, yəni təkamül keçirmədiklərini göstərir. 150 il boyunca dünyanın hər tərəfi dəlik-deşik edilib tək bir ara keçid forması tapılmayıb. Hətta Darvin belə ara keçid fosili tapılmasa, nəzəriyyəsinin çökəcəyini bildirib. Yəni ortada bircə faktiki tapıntı belə yoxdursa, nağıllar danışmağın, "əcdadlarımız mikrob imiş", "quşların əcdadı tapıldı", "əcdadlarımız xurma imiş" kimi başlıqlarla ictimaiyyəti aldatmağa çalışmağın heç bir mənası yoxdur.

## "ƏCDADLARIMIZ XURMA İMİŞ" YALANI

Bəzi insanlar İbn Miskəveyh kimi İslam ölkələrində yaşamış şəxslərin təkamül yalanlarını gündəmə gətirərək guya İslamla təkamülü əlaqələndirməyə çalışırlar. Keçmişdə müsəlman cəmiyyətlər içərisində təkamül yalanını müdafiə etmiş insanların olması doğrudur. İbn Miskəveyh də bu insanlardan biridir. İnsanların əcdadının xurma ağacı olduğunu iddia edən İbn Miskəveyh türk milləti haqqında da inanılmaz yalanlar iddia edirdi. Bunu da unutmamaq lazımdır ki, bir yalanı müdafiə edən şəxsin hansı millətdən, hansı inancdan olduğu mühüm deyil. Bu şəxsin inancı və ya milləti bəhs edilən iddianın yalan olduğu gerçəyini dəyişdirmir.

Bütün digər canlılar kimi bitkilər də milyonlarla il boyunca dəyişməyib. İlk bitki fosilləri Daş kömür dövrünə, yəni təxminən 350 milyon il əvvələ aiddir və bu dövrə aid bitkilər bugünkü bitkilərlə eynidir. İbn Miskəveyhin əcdadımız olduğunu iddia etdiyi xurma yarpağının isə Təbaşir dövrünə (146-65 milyon il) aid fosil nümunələri tapılır. Bu bitki təxminən 140 milyon il boyunca heç bir dəyişikliyə məruz qalmamışdır. Zaman keçdikcə qolları və ayaqları yaranmamış, insana çevrilməmişdir. "Əcdadlarımız mikrob idi", "əcdadlarımız soxulcan idi", "əcdadlarımız xurma idi" kimi zaman-zaman gündəmə gətirilən bu cür iddialar elmi inkişafların və dəlillərin çox yaxşı fərqində olan insanları yalnızca güldürür. Tək bir ara keçid fosilinin belə olmamasına və canlıların dəyişmədiyinin 300 milyon fosillə sübut edilməsinə baxmayaraq, bu cür iddiaların fərqli formalarda gündəmə gətirilməsi

darvinistlərin 150 il boyu davam etdirdikləri yalanın bir hissəsidir. Amma artıq insanlar bu hiylələrə inanmırlar.

Təkamül iddialarının Darvin dövründən əvvəl də mövcud olduğu fikri doğrudur. Amma darvinizm İbn Miskəveyh adlı şəxsin yaşadığı dövrdən daha əvvəl Şumer və Misir dövründən qalan bütpərəst dindir. Bu iddiaya ciddi şəkildə sahib çıxan tək insan İbn Miskəveyh deyildi, irqçi və faşist məntiqə sahib Firon da bu fikri güclü müdafiə edirdi.

Darvinizm fikrini Firona və şumerlərə şeytan təlqin etmişdi. İbn Miskəveyh isə bu fikri onlardan götürmüşdü. Firon dövründən qalma bu dinsiz inanc çox qədim təşkilat olan masonluğun təsiri ilə yayılmış və insanlar özlərini alim kimi tanıtmış şəxslər tərəfindən yönləndirilmişlər. Bu şəxslər İslamı qəbul etmiş kimi göstərilmiş, "məşhur İslam alimi" görüntüsündə tanıdılmış və insanları Allah inancından uzaqlaşdırmaq üçün güclü darvinizm təbliğatı aparmışlar. İbn Miskəveyh də masonların idarəçiliyindəki bu azğın zehniyyətdəki şəxslərdən biridir və eyni zamanda, masondur. Türkləri və zənciləri aşağı meymun irqi olaraq görən və nəcib türk millətinə dil uzatmağa çalışan bu şəxs millətimizə nifrətini bu sözlərlə ifadə etmişdir:

*"...Nəhayət, nəfsin onun üzərindəki təsiri gücləndikcə qavrama və ayırd etmə gücləri sayəsində verilən təlimi də alır. İnsanlıq mərtəbəsinə olduqca yaxın olan bu mərtəbə bəhimiyyət (heyvanilik) mərtəbəsidir. Şimal və cənubda, Yerin ən uzaq bölgəsində və onun ətrafında məskunlaşan TÜRK və ZƏNCİLƏR bu qəbildəndir. ONLAR İLƏ BƏHS ETDİYİMİZ HEYVANİLİYİN SON MƏRTƏBƏSİ ARASINDA BÖYÜK BİR FƏRQ YOXDUR. Onlar öz xeyirlərinə olanları ANLAYACAQ VƏZİYYƏTDƏ DEYİLLƏR. Özləri ortaya hikmət qoya bilmədikləri kimi, qonşu millətlərinkini də qəbul etməzlər. Buna görə VƏZİYYƏTLƏRİ ÇOX PİS VƏ HƏYAT SƏVİYYƏLƏRİ AŞAĞIDIR. Qibtə ediləcək heç nələri olmadığı kimi, HEYVANLARIN İSTİFADƏ EDİLDİYİ İŞ YERLƏRİNDƏ QUL KİMİ İSTİFADƏ OLUNMAQDAN BAŞQA İŞƏ DƏ YARAMIRLAR..."*

Bu sözlər vətənpərvər və nəcib türk millətinə yönləndirilmiş olduqca iyrənc sözlərdir. Bəzi ilahiyyatçılarımızın tərifləyib, fikirlərinə dəyər verdiklərini söylədikləri bu şəxs 600 il boyunca 3 qitəyə hakim olmuş qədirbilən türk millətini öz ağlınca heyvanlara bənzətmiş və onları "heyvanların istifadə edildiyi iş yerlərində istifadə olunacaq qul" kimi qələmə verərək həddini aşmışdır. (Nəcib türk millətini tənzih edirik) Türk millətinin alicənablığı və üstünlüyü açıq-aşkar ortadadır. Millətimizə aşağı irq, qul deyən, zənciləri insan kimi görməyən bu zehniyyət Firon dövrünün bütpərəst inancından qalır. Masonların təsiri ilə daha da yayılan bu iyrənc məntiq darvinizm fikrinin əsasını qoymuşdur. Eyni fikirdə olan Darvin də soylu türk millətini öz bəsit ağlınca "aşağı irq" olaraq görürdü:

*"Təbii seçməyə əsaslanan mübarizənin mədəniyyətin yayılmasına sizin düşündüyünüzdən daha çox fayda verdiyini və verməyə davam etdiyini göstərə bilərəm. Düşünün ki, bir neçə əsr əvvəl Avropa TÜRKLƏR*

*TƏRƏFİNDƏN İŞĞAL EDİLDİKDƏ Avropa millətləri necə təhlükədə qalmışdı. Bu gün Avropanın TÜRKLƏR TƏRƏFİNDƏN İŞĞALI bizə necə də gülünc gəlir.*

*Avropa irqləri olaraq tanınan mədəni irqlər həyat mübarizəsində türklərə qarşı güclü qalibiyyət qazanmışdılar. Dünyanın yaxın gələcəyinə baxdıqda çoxlu sayda AŞAĞI İRQLƏRİN mədəniləşmiş yüksək irqlər tərəfindən yox ediləcəyini görürəm.” (Francis Darwin, The Life and Letters of Charles Darwin, Vol. I, 1888. New York: D. Appleton and Company, s. 285-286)*

## DARVİNİN ZƏNCİLƏRƏ BAXIŞ TƏRZİ FİRON DÖVRÜNDƏKİ MƏNTİQLƏ EYNİDİR

*"Bəlkə də, əsrlər boyu davam etməyəcək qədər yaxın gələcəkdə mədəni insan irqləri vəhşi irqləri tamamilə yer üzündən siləcək və onların yerinə keçəcəklər. Digər tərəfdən, insanabənzər meymunlar da ... şübhəsiz, yox ediləcəklər. Beləcə, insan ilə ən yaxın qohumları arasındakı boşluq daha da genişlənəcək. Beləliklə, ortada indiki avropalı irqlərdən belə daha mədəni olan irqlər və İNDİKİ ZƏNCİLƏRDƏN, YERLİ AVSTRALİYALILARDAN VƏ QORİLLALARDAN belə daha geridə qalan əntər növündən olan meymunlar qalacaqlar.” (Charles Darwin, The Descent of Man, 2-ci nəşr, New York, A L. Burt Co., 1874, s. 178)*

Bir qisim insanların “alim” deyərək hörmət etdikləri, fikirlərinə dəyər verdikləri şəxslər məhz bu zehniyyətdə olan insanlardır. Vəziyyət belə olduğu halda, bütün bunları görməzlikdən gəlmək və “alimdir, hörmət edilməlidir” məntiqi ilə hərəkət etmək olduqca təhlükəlidir. Hər “alim” adına sahib insana da hörmət edilməlidir deyə bir qayda yoxdur. Şeytanın təsirində olan bir çox insanlar irəli sürdükləri fikirlərlə tarixə adlarını yazdırmış, amma bəşəriyyətə hər zaman zülm gətirmişlər. Marks, Lenin, Stalin - bunların hamısı guya alimdirlər. Terrorist liderlərin də bir qismi alim dərəcəsində bilgiyə sahibdirlər. Mason professorlar da alimdirlər. Əgər alimlərə mütləq hörmət edilməlidirsə, onda bu insanlara da hörmət edilməlidir. Ancaq bir insana hörmət edilməsi üçün onun “alim” adına malik olması yetərli deyil.

Bir şəxs ancaq insan kimi davranırsa, müsəlman kimi yaşayır və müsəlman kimi danışırsa, alimdir. İnsanlara qarşı nifrət doludursa, insanların bir qismini meymun kimi görürsə, faşist və irqçi baxış tərzinə sahibdirsə, bu cür insana alim deyilməyəcəyi aydındır.

İnsanlar yaradılışı isbat edən 300 milyon fosilin mövcudluğundan xəbərdardırlar. Tək bir ara keçid fosili belə olmadığını bilirlər. Nəinki tək bir insanın, hətta insanın hüceyrəsindəki tək bir zülalın belə təsadüfən meydana gələ bilməyəcəyini anlayıblar. Canlıların Rəbbimizin “Ol” əmri ilə yoxdan yaradıldıqlarını elmi dəlillərlə, açıq sübutlarla görüblər. Allahın varlığını açıqca inkar edən darvinizm adlı bu azğın bütpərəst din cəmiyyət tərəfindən artıq qəbul edilmir. Cəmiyyətimizdə zorla qəbul etdirilməyə çalışılan “Allah insanları təkamüllə yaratdı” fikri darvinizmin 21-ci əsrdəki çöküşünün ardınca tərəfdar tapa bilmək üçün masonların ortaya atdığı yeni bir yalandır. Qurandakı izahlara tamamilə zidd olan, elmi dəlillərlə qəti şəkildə təkzib edilən, tək bir ara keçid fosili ilə belə təsdiq olunmayan bu yalan iddianın

tələsinə artıq insanlar düşmürlər.

## ÇARLZ DARVİNİN DİNDAR OLDUĞU YALANI




**Darvinist tarixçi Gertrude Himmelfarbın "Darwin and Darwinian Revolution" (Darvin və Darvinçi İnqilab) adlı kitabı.**

Təkamül nəzəriyyəsini müdafiə edən inanclı insanların böyük əksəriyyəti Darvinin dinə qarşı olmadığını, hətta dindar olduğunu iddia edirlər. Şübhəsiz ki, bu böyük yalandır. Çünki Darvin Allaha və dinə qarşı olduğunu açıqca ifadə etmiş şəxsdir.

Darvin gənclik illərində Allahın varlığına inanmasına baxmayaraq, getdikcə inancını itirmiş və orta yaşlarından etibarən ateist olaraq yaşamışdır. Amma başda həyat yoldaşı olmaqla yaxın qohumlarını və digər inanclı insanlara əks getməmək üçün bu fikirlərini açıqlamaqdan çəkinmişdir. Darvinist tarixçi Qertrud Himelfarbın "Darvin və darvinist inqilab" (Darwin and Darwinian Revolution) adlı kitabında "**Darvinin inancsızlığının nə dərəcə olduğu** onun dərc olunan nə fəaliyyətlərində, nə də avtobioqrafiyasında görülə bilər, bu detallar yalnızca onun **avtobioqrafiyasının orijinal versiyasında var"** (Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, Elephant Paperbacks, Chicago, 1962, s. 384) deyə bildirilir.

Yenə də Himelfarbın kitabında Darvinin oğlu Frensiz Darvinin "Çarlz Darvinin həyatı və məktubları" (The Life and Letters of Charles Darwin) adlı kitabı nəşr etdirəcəyi ərəfədə Darvinin həyat yoldaşı Emma buna qarşı çıxaraq onun ölümündən sonra qalmaqalların yaranmasına izin verməmək istəməmişdir. Emma Darvin kitabdan dinsizliklə bağlı açıq ifadə olunan fikirləri çıxarması ilə bağlı oğlunu sərt tənbeh etmişdir. Ailəsi bu ifadələrin Darvini bütün dünyanın gözündə alçaldacağını düşünərək buna qarşı çıxmışdır. (Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 383)

Neodarvinizmin qurucularından bioloq Erns Mayra görə isə, "Darvinin 1836-1839-cu illərdə Maltusun yazılarını oxumamışdan əvvəl inancını itirdiyi açıq-aşkardır. Dərc etdirdiyi yazılarında dostlarını və həyat yoldaşını incitməmək üçün daha çox Allahın varlığına inanan üslubdan istifadə etmişdir. Amma **qeyd dəftərlərindəki ifadələrinin çoxu materialist inanca sahib olduğunu göstərir".**

(Mayr, Ernst, "Darwin and Natural Selection," American Scientist, vol.65 (May/June, 1977) s. 323)

Darvin ailəsinin reaksiyasını nəzərə aldığı üçün həyatı boyunca dini mövzulardakı fikirlərini gizli saxlamışdır. Əslində, bu gizliliyin səbəbini özü şəxsən belə açıqlamışdır:

*"İllər əvvəl bir dostum əgər İngiltərədə elmi inkişaf etdirmək istəyirəmsə, mənə işlərimdə din mövzusuna yer verməməyi şiddətlə tövsiyə etdi və bu,*

*məni iki məsələnin bir-biri ilə ortaq əlaqəsi barədə düşünməməli olduğuma inandırdı. Əgər gələcəkdə dünyanın nə qədər liberal olacağını təxmin edə bilsə idim, bəlkə də, fərqli davranardım."*

(Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 383)

Sonuncu cümləsindən də aydın olduğu kimi, Darvin mənfi reaksiya almayacağını bilsə idi, bəlkə də, bu qədər ehtiyatlı davranmazdı. Ancaq mənfi reaksiyaya məruz qalmamaq üçün əsil fikirlərini olduqca gizli saxlamağı üstün tutmuşdur. Hətta Karl Maks "Kapital" (Das Kapital) adlı əsərini Darvinə həsr etmək istədikdə də Darvin ateist fikirlər əsasında yazılaraq ona həsr edilmiş bir kitabın onun ailə üzvlərinə narahatlıq verəcəyini söyləmişdi və Marksın bu təklifini qəbul etməmişdir. (Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 383) Ancaq Darvin fikirlərə və inanclara qarşı olan azğın düşüncə tərzini qohumuna söylədiyi bu sözlərlə belə bildirmişdir:

*"Bütün insan duyğularına heyvanlarda izi davam etdirilə bilən bir mikrob olaraq baxıram".* (Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 384)

Davamında isə din və Allah haqqında belə yalan fikir söyləmişdir:

*"Uşaqların zehninə yeridilən Allah inancına dair israrlı təlqinlərin onların hələ tam inkişaf etməmiş beyinlərində güclü və bəlkə də, irsi olaraq qalıcı təsir yaratma ehtimalı görməzlikdən gəlinməməlidir. Çünki necə ki bir meymunun ilana qarşı instinktiv kin və qorxuya qalib gəlməsi çətindirsə, Allah inanclarını beyinlərindən çıxarmaq da o qədər çətin olacaq".*

(Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 385)

Göründüyü kimi, Darvin həm uşaqlara Allah inancının öyrədilməsinə qarşı çıxmış, həm də onların inanclarından uzaqlaşdırılmalı olduqlarını müdafiə etmişdir. Əlbəttə, bu, Darvinin ən böyük xətalarından biri idi. Allaha iman gətirmək və din əxlaqını lazımınca yaşamaq həm insanların, həm də cəmiyyətlərin hüzur və xoşbəxtliyi üçün şərtdir. Bu həm dünyada, həm də axirətdə insanların xilas olmaları üçün çox böyük gözəllikdir. Darvinin iddia etdiyi kimi, insanların Allaha imandan və din əxlaqını yaşamaqdan uzaqlaşmaları isə olduqca təhlükəlidir. Tarix bu gerçəyin nümunələri ilə doludur.

Darvinin din əleyhinə olan fikirləri dövrümüzün təkamülçülərinə miras qalmışdır. Darvin uşaqların təhsilində Allahı tanımalarına fürsət vermək istəmədiyi kimi, bugünkü təkamülçülər də məktəblərdə yaradılışdan bəhs edilməsinə qarşı çıxırlar. Bir çox ölkələrdə tədris planından "yaradılış" mövzusunun çıxarılması üçün ciddi şəkildə lobbiçilik fəaliyyəti ilə məşğuldurlar.

## DARVİNİN İNANCSIZLIĞI VƏ BUNU GİZLƏTMƏ CƏHDİ

Darvinin həyatına baxdığımız zaman gənclik illərində bu dərəcə inancsız olmadığını görürük. Özü o dövrlə bağlı bir məktubunda belə deyir:

*"Əvvəlcə mən də (baxmayaraq ki, məndə din duyğusunun yaxşı inkişaf etdiyini düşünmürdüm) başqaları kimi Tanrının varlığına və ruhun ölümsüzlüyünə inanmışdım".*

(Francis Darwin, Charles Darwin'in Yaşamı ve Mektupları, Düşün Yayıncılık, İstanbul 1996, s. 80)

"Darvin və darvinist inqilab" (Darwin and Darwinian Revolution) adlı kitabda Qertrud Himmelfarb onun bu vəziyyətini bir nümunə ilə belə izah edir:

*"... Bir çox insanların hiss etdikləri dərin inanc və duyğular onları Allahın varlığına inandıra bilməzdi. Öz-özünə bir vaxtlar bu cür duyğuları olduğunu etiraf edirdi: Ehtişamlı Brazilya meşələrində olan bir insanda "tənəffüs edən bədəndən başqa bir varlıq da mövcud olmalıdır". fikrinə sahib idi.* ***Amma sonra ən möhtəşəm mənzərələr belə onda bu düşüncələri yarada bilmədi".*** (Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 384)

Bu nümunədə də göründüyü kimi, Darvin gənclik illərində daha vicdanlı idi və vicdanının səsini dinləyərək Allahın varlığını dərk edirdi. Ancaq daha sonra bu açıq-aşkar gerçəyi görə bilməyəcək vəziyyətə gəldi. Darvin bir ifadəsində öz inancsızlığını belə ifadə edir:

*"...Beləcə, inancsızlıq yavaş-yavaş məni bürüdü və nəhayət, tamamlandı".* (Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 381)

Həmin kitabda Darvinin atasının oğlunun evləndiyi ərəfədə ona inancı ilə bağlı şübhələrini həyat yoldaşından gizlətməsini tövsiyə etdiyi də yazılır. Amma həyat yoldaşı Emma onun inancının azaldığını lap əvvəldən bilirdi. Darvinin "İnsanın törəməsi" (Descent of Man) adlı kitabı çap olunduqda Emma Darvin kitabın içindəki din əleyhinə olan fikirlərlə bağlı qızına bu cür etiraf etmişdi:

*"...Allah inancını özündən uzaqlaşdırdığı üçün ondan çox nifrət edəcəyəm".*

(Gertrude Himmerfarb, Darwin and the Darwinian Revolution, s. 382)



ÇARLZ DARVİNİN HƏYAT YOLDAŞI EMMA DARVİN

Darvin din haqqındakı əsil düşüncələrini isə belə bildirmişdi:

*"Növlərin mənşəyi" kitabını yazdığım vaxtdan etibarən dini inanclarım yavaş-yavaş və artıq bir neçə mərhələlərdən sonra olduqca zəiflədi.*

(Francis Darwin, "The Life and Letters of Charles Darwin", D. Appleton and Co., 1896, Chapter 1.VIII., Religion)

Darvin, eyni zamanda, insanların inanclı olmalarına da qəribə baxır və guya ibtidai heyvanlardan təkamül keçirərək yaranan insanın inancına da güvənə bilməyəcəyi kimi yalan məntiq irəli sürürdü:

"Ən aşağı heyvanların sahib olduğu qədər bir beyindən əmələ gəlmiş və bu cür nəticələrə gələn inanclı bir insanın fikirlərinə nə qədər etibar edilə bilər?" (Francis Darwin, Charles Darwin'in Yaşamı ve Mektupları, s. 275)

Əlbəttə, Darvin bu mövzuda da yanılırdı. Dövrümüzdə bütün elmi dəlillərin də açıq şəkildə göstərdiyi kimi, insanın Darvinin iddia etdiyi kimi, heyvanlardan təkamül keçirərək yaranması fikri qətiyyən doğru deyil. İnsan ilk yarandığı gündən bəri insandır. Ağıla, zəkaya, qavrama və mühakiməetmə qabiliyyətinə sahibdir. Allaha iman da ağıla və qavrama qabiliyyətinə sahib olan hər kəsin ətrafında gördüyü dəlillərdən çox asanlıqla qənaət gətirəcəyi tək rasional və gerçək nəticədir.



ÇARLZ DARVİN

**Darvin bəzi məktublarında və tərcümeyi-halında dinsiz olduğunu açıqlamışdı.**

Çarlz Darvinin Allahın varlığını qəbul etməməsinin əsas səbəbi isə təkəbbürü idi. Bunu aşağıda qeyd edilən ifadələrində görmək mümkündür:

*"Hər şeyə gücü çatan və hər şeyi bilən bir Allahın hər əmri verdiyi və hər şeyi bildiyi qəbul edilməlidir. Səmimi deyim, mən bunu qəbul edə bilmirəm".*

(Francis Darwin, Charles Darwin'in Yaşamı ve Mektupları, s. 275)

Öz həyat hekayəsinə əlavə etdiyi qısa əlyazmasında isə bunları deyirdi:

*"Hansısa böyük bir günah etmişəmsə belə, bunun üçün peşmançılıq çəkmirəm".* (Francis Darwin, Charles Darwin'in Yaşamı ve Mektupları, s. 373)

Darvinin buraya qədər qeyd etdiyimiz Allahın varlığını və dini inkar edən ifadələri, əslində, bəsit ateist məntiqidir. İnkar edənlərin vicdanları qəbul etdiyi halda, təkəbbürləri səbəbindən Allahı inkar etdikləri bir ayədə belə xəbər verilir:

**Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları inkar etdilər. Gör fəsad törədənlərin aqibəti necə oldu!** (Nəml surəsi, 14)

Burada diqqətçəkən əsas məqam budur: Çarlz Darvinin ateistliyi nəzəriyyəsinin formalaşmasındakı ən böyük amil olmuşdur. İnsanlara canlıların yaradılmadığını inandırmağa çalışdığı üçün bütün müşahidələrini və təsbitlərini, əldə etdiyi məlumatları təhrif edərək danışmışdır. "Növlərin mənşəyi" kitabı oxunduğu zaman Darvinin qarşısına çıxan bütün yaradılış dəlillərini (məsələn, canlıların mürəkkəb quruluşu, fosil qalıqlarındakı "birdən meydana gəlmə" hadisəsini, canlılardakı təbii fərqliliyin hüdudlarını göstərən dəlilləri) daima inkar etməyə çalışdığı, inkar edə bilmədikdə isə "bəlkə, nə vaxtsa, bu məsələ həll olunar" düşüncəsi ilə gələcəyə ümid etdiyi açıqca görülür. Əgər neytral fikirli alim olsa idi, belə israr etməzdi. İstifadə etdiyi üslub və metod Darvinin ateist olduğunu, hətta bunun nəzəriyyəsinin əsasını təşkil etdiyini göstərir.

150 ildir ki, ateistlərin Darvini müdafiə etmələrinin, dinsiz ideologiyalarının da darvinizmə əsaslanmasının səbəbi Darvinin inancsızlığına dair tam qənaət gətirmələridir. Vəziyyət belə olduğu halda, Darvinin ateistliyi açıq gerçək ikən hələ də bəzi müsəlmanların Darvinin dindar olduğunu və ya dinə qarşı olmadığını deyib, onun nəzəriyyəsini müdafiə etmələri, onu və onun kimi düşünənləri dəstəkləmələri və beləcə, ateistlərlə eyni mövqedə olmaları çox böyük xətadır. Məhz buna görə

müsəlmanlar bu böyük yanılmadan ən qısa zamanda xilas olmalıdırlar.

## DARVİNİZM BƏŞƏRİYYƏTİ FƏRQLİ BƏLALARA SÜRÜKLƏMİŞDİR

Öncəki səhifələrdə bəzi müsəlmanların darvinizmi elmi gerçək kimi göstərib, bu nəzəriyyənin əsil üzünü görməzlikdən gəldiklərindən bəhs etmişdik. Halbuki 20-ci əsrdə faşizm və kommunizm kimi iki qanlı ideologiyanı guya elmi yöndən dəstəkləyən darvinizmin əsil üzü düşünüləndən daha çox qaranlıqdır.



Məlum olduğu kimi, ötən əsr bu iki ideologiyanın həyata keçirildiyi, kommunist inqilabların və faşizm zərbələrinin baş verdiyi, buna görə də toqquşmaların, ixtilafların, vətəndaş müharibələrinin olduğu, dünyanın iki fərqli qütbə bölündüyü, dünya tarixinin, bəlkə də, ən qanlı əsri olmuşdur. Bu qanlı tarixə imza atanlar isə Lenin, Stalin, Mao, Pol Pot, Hitler, Mussolini, Franko kimi zalım diktatorlar olmuşdur. Təkcə kommunist rejimlərin hakim olduğu ölkələrin xalqlarına tətbiq olunan zülm nəticəsində 120 milyondan çox insan həyatını itirmişdir. Baş verən iki böyük dünya müharibəsində isə 65 milyon insan dünyasını dəyişmişdir. Xüsusilə Hitlerin işğalları ilə başlayan ikinci dünya müharibəsi insanlara böyük zərərlər vurmuşdur.

20-ci əsrdəki bu böyük siyasi, iqtisadi və əxlaqi degenerasiyanın əsasında isə darvinizm dayanır. Bu əsrə damğasını vuran iki qanlı ideologiya da darvinizmdən qaynaqlanan sistemlərdir. Bu ideologiyaların əsas təməlinə baxdıqda darvinist təsir açıqca görünür.

## KOMMUNİZM - FAŞİZM VƏ DARVİNİZM

Darvinizm kommunizm üçün elə böyük əhəmiyyət kəsb edirdi ki, Engels Darvinin kitabı nəşr etdirilən kimi Marksa belə yazmışdı: **"Hazırda Darvinin kitabını oxuyuram və o, tək kəlmə ilə möhtəşəm biridir".**

(Conway Zirkle, Evolution, Marxian Biology and the Social Scene, Philadelphia; the University of Pennsylvania Press, 1959, s. 527)

Kommunizmin qurucuları Marks və Engels darvinizmi mənimsədiklərini öz əsərlərində açıq şəkildə bildiriblər. Marks "Kapital" (Das Kaptial) adlı əsərini Darvinə həsr edərək ona olan rəğbətini göstərmişdi. Kitabın almanca nəşrində əl yazısı ilə belə yazmışdı: **"Çarlz Darvinə əsil pərəstişkarı olan Karl Maksdan".**


G.V. PLEXANOV

Rus kommunizminin lideri Georgi Valentinoviç Plexanov isə **"Marksizm darvinizmin sosial elmlərə tətbiqidir"** demişdir. (Robert M. Young, DARWINIAN EVOLUTION AND HUMAN HISTORY, Radio talk given in an Open University course on Darwin to Einstein: Historical Studies on Science and Belief, 1980)

Hitlerin ən əsas istinad mənbəyi olan irqçi alman tarixçi Henrix fon Troyçke də **"Xalqlar ancaq Darvinin həyat mübarizəsinə bənzər şiddətli rəqabətlə inkişaf edə bilərlər..."** (Alaeddin Şenel, Irk ve Irkçılık Düşüncesi, Ankara: Bilim ve Sanat Yayınları, 1993, s. 62) şəklində bildirdiyi yanlış fikrini ifadə edərkən nasional-sosializminin kökündəki şiddət ünsürünün təməlinin haradan gəldiyinə işarə etmişdir. Belə ki, nasist Almaniyasının qurucusu Hitlerin özü də darvinistdir. Darvinin ortaya atdığı "həyat mübarizəsi" yalanından ilhamlanaraq kitabının adını "Mənim mübarizəm" (Mein Kampf) qoymuşdur. Hitler 1933-cü ildəki Nürenberq konfransında **"yüksək irqin aşağı irqləri idarə etdiyini, bunun təbiətin qanunu olduğunu və guya yeganə məntiqli gerçək olduğu"** iddiasını irəli sürür. (Carl Cohen, Communism, Fascism and Democracy, New York: Random House Publishing, 1967, s.408-409) Bu cümlə də onun Darvindən necə təsirləndiyini göstərir.


LENİN


STALİN


MAO


MUSSOLİNİ


FRANKO


HİTLER

İtaliyan faşizminin lideri Mussolini də darvinizmi dünyagörüşü olaraq mənimsəmiş, müsəlman ölkəsi olan Həbəşistanı işğal etməsini darvinist məntiqlərlə məqbul göstərməyə çalışmışdır. Dövrün digər diktatoru olan Franko da həm fikirlərində, həm də fəaliyyətlərində darvinist ideologiyanı mənimsədiyini göstərmişdir.

Darvin öz yanlış məntiqinə görə, həyatın guya mübarizə yeri olduğunu, bu mübarizədə yalnız güclü olanların qalib gələ biləcəklərini, zəif olanların isə bu mübarizədə uduzmağa məhkum olduqlarını söyləmişdi. Bu fikri ilə zorakılığa, şiddətə, mübarizələrə, müharibələrə, qətliamlara yol açmışdır. İstər öz ölkələrindəki əhaliyə, istərsə də işğal etdikləri digər ölkələrin xalqlarına zülm edən diktatorlar darvinizmdən ilham almış və darvinist təlimləri ciddi şəkildə mənimsəmişlər. Onların azğın inanclarına görə, zəifləri əzmək və onları yox etmək təbiətin qanunudur. Guya heyvandan təkamül keçirən insanlara dəyər verməyin mənası yoxdur.

Məhz buna görə də darvinizm bəşəriyyət üçün çox böyük təhlükədir. Darvinizmə adi nəzəriyyə kimi baxanlar, bəlkə də, bu nəzəriyyədən heç bir zərər görməyiblər. Amma unutmamalı olduqları gerçək var: yaxın keçmişdə yüz milyonlarla insan bu ideologiyanın zülmünə məruz qalmışdır.

## DARVİNİST DÜŞÜNCƏNİ MÜDAFİƏ ETMƏK KOMMUNİZMİN YAILMASINI ASANLAŞDIRIR

Kommunizm din əxlaqına düşmən ideologiyadır, bunu istər əsaslandığı materialist fəlsəfə, istərsə də irəli sürdüyü tarixi məlumatları nəzərdən keçirərək görmək mümkündür. Belə ki, Allahın varlığının inkar edilməsi bu fəlsəfənin başlanğıc nöqtəsidir. Kommunizm azğın fikirlərinə görə dini "idarəedici təbəqələr arasındakı vasitə" kimi görür və nəzərdə tutduğu kommunist xalq üçün dinin yox edilməsini şərt qoşur.

Buna görə də bütün kommunist rejimlər dinə düşmən olmuşdur. Dini dəyərləri dağıtmış, ibadətgahları yox etmiş və xalqa ibadət etməyi qadağan etmişlər. Sovet Rusiyası, Qırmızı Çin, Kamboca, Bolqarıstan, Albaniya kimi ölkələrdə hakim olan kommunist rejimlərdə dinə qarşı siyasət tətbiq olunmuşdur ki, bu da həmin yerlərdə bir çox kütlə qətliamlarının törədilməsinə gətirib çıxarmışdır.

Marksist ideologiyada hakim olan din düşmənçiliyində darvinizmin çox böyük təsiri var. Darvin marksizmin dinsizliyinə guya elmi əsas qazandırmışdır. Buna görə də Marks və Engels Darvinə təşəkkürlərini bildirmişdilər. Engelsin Darvinə etdiyi təriflər diqqət çəkir:



Marks "Kapital" kitabını Darvinə ithaf etmək istəmişdi.

Darvin bütün canlı orqanizmlərin, bitkilərin, heyvanların və insanın milyonlarla il boyu baş verən təkamül prosesi nəticəsində yarandığını sübut

edərək metafizik təbiət fikrinə ən ağır zərbəni vurdu.

(Marx-Engels, Seçme Yapıtlar 3, Sol Yayınları, s. 156)

Engelsin təkamül prosesini müdafiə etməsi böyük xəta idi. Çünki Darvin nəzəriyyəsi heç bir elmi dəlilə əsaslanmır, bəzi ön mühakimə və fərziyyələrə əsaslanan şəxsi düşüncələri ifadə edir. Belə ki, elm inkişaf etdikcə Darvinin irəli sürdüyü bu fikirlərin heç birinin doğru olmadığı bir-bir ortaya çıxdı. Zaman keçdikcə əldə edilən hər məlumat və hər dəlil materialistlərin ümid etdiyi kimi, təkamül nəzəriyyəsini deyil, yaradılış həqiqətini bir daha sübut etdi.

Marks və Engelsin iddia etdiyi dialektik materialist fəlsəfədə ziddiyyət var idi, buna görə də bu fəlsəfəni müdafiə edənlər kainatın ziddiyyətlər arasındakı daimi zidd qanunla işlədiyini iddia edirdilər. Bu, eynən Darvinin təbiətdə mövcud olduğunu iddia etdiyi həyat mübarizəsi kimi idi. Darvinizm bütün bəşəriyyət tarixini ziddiyyət meydanı olaraq görən və yeni ziddiyyətlər üçün zəmin hazırlayan kommunist ideologiyanın ən böyük dayağı oldu.



**Kommunizmin Fikir Atalarından Biri Fridrix Engels**

Təkamülçü F.C. Darlinqton vəhşətin təkamül nəzəriyyəsinə inanmağın təbii nəticəsi olduğunu belə bildirir:

*"İlk olaraq, eqoistlik və vəhşilik içimizdə olan təbii şeydir, ən qədim əcdadlarımızdan bizə miras qalmışdır... Buna görə də vəhşilik insanlar üçün normaldır; təkamülün bir növüdür".* (P.J.Darlington, Evolution for Naturalists, s. 243)

Təkamülçülərin bu iddiası eynilə digər iddiaları kimi yanlışdır. İnsan ağlı, vicdanı və mühakiməsi ilə nəyin yaxşı, nəyin pis olduğunu bilir. Eqoistlik, nankorluq, kin, nifrət, düşmənçilik kimi mənfi duyğuları bildiyi kimi, bu pisliklərdən necə uzaqlaşacağını da bilir.

Marksistlər ideologiyalarını insanlara qəbul etdirmək üçün onlara, əsasən, darvinizm təlimi verirlər. Xüsusilə də Darvinin yalanlarından biri olan "Şiddət və qarşıdurma dəyişilməz təbiət qanunudur" prinsipinə çox əhəmiyyət verirlər. Buna görə dünyada kommunizmi ideologiya olaraq mənimsəyən bütün terror təşkilatları təlim düşərgələrində hərbiçilərə aylarla kommunizm, dialektik materializm və darvinizm təlimi verir. Darvinin nəzəriyyəsi kommunizmin təsiri altında olan bu insanlara, əslində, heyvan olduqları və heyvanlar yaşamaq uğrunda necə mübarizə aparırlarsa, özlərinin də o cür davranmalı olduqları yalanını təlqin edir. Bu səbəbdən bir çox gənclər rahatlıqla cinayət edə bilən, uşaqları və hətta körpələri amansızcasına güllələyə bilən cinayətkarlar olurlar.

Beləcə, kommunist ideologiya 20-ci əsrdə bir çox ölkələrdə partizan mübarizələrinə, qanlı terror hadisələrinə və vətəndaş müharibələrinə səbəb

olmuşdur. Bu baxımdan darvinizmə qarşı fikri mübarizə çox vacibdir. Əgər darvinizmin əsassızlığı ortaya çıxsa və darvinizm çöksə, bu fəlsəyə əsaslanan marksist fəlsəfələr də yox olacaq. Darvinizmin kommunist ideologiya üzərində çox mühüm təsiri var və ona edilən hər cür yardım kommunizmə edilir. Xüsusilə də bəzi müsəlmanların etdiyi kimi, darvinizmi məqbul göstərməyə çalışmaq, onun guya dinə uyğun olduğunu, Allahın canlıları təkamül ilə yaratdığını (əsla doğru olmadığı halda) iddia etmək kommunizmi də məqbul göstərməyə çalışmaq deməkdir. Həmçinin kommunistlər din və darvinizmin bir-birinə zidd olduğunu çox yaxşı bilirlər. Amma darvinizmi və kommunizmi daha geniş yaya bilmək üçün buna səssiz qalırlar. Əsas olan ilk addım olaraq darvinizmə bir qapı aça bilməkdir. Sonrakı mərhələdə kommunizmin yayılması daha rahat olacaq. Bir çox darvinistlərin təkamüllə yaradılışa inanan inanclı kütlələrə tamaşaçı qalmasının səbəbi budur.


ROBERT ŞAPİRO

Halbuki kommunistlərin təkamül inancları ideologiyalarına olan kor-koranə bağlılıqlarından qaynaqlanır. Məsələn, təkamülçü kimya professoru və DNT mütəxəssisi Robert Şapiro təkamül nəzəriyyəsinin əsas iddiası olan "cansız maddələrin özbaşına DNT və ya RNT-ni yaratdıqları" iddiasının heç bir elmə əsaslanmadığını belə açıqlayır:

Bizi sadə kimyəvi maddələrdən ibarət birləşmədən ilk təsirli biopolimerə (DNT və ya RNT-ə) daşıyan təkamül prinsipinə ehtiyac var. Bu prinsip "kimyəvi təkamül" və ya "maddənin özbaşına əmələ gətirməsi" adlandırılır, amma heç bir zaman geniş təsvir edilməmiş və ya mövcudluğu sübut edilməmişdir. Bu cür prinsipin mövcudluğuna **dialektik materializmə olan bağlılığa görə inanılır.**

(Robert Shapiro, Origins: A Sceptics Guide to the Creation of Life on Earth, Summit Books, New York, 1986. s. 207)

Şapironun açıqca ifadə etdiyi kimi, təkamül nəzəriyyəsinin israrla müdafiə edilməsinin əsasında materialist fəlsəfəyə olan doqmatik bağlılıq dayanır. Bu isə bizə təkamül nəzəriyyəsinə ediləcək hansısa yardımın birbaşa materialist fəlsəfəni dəstəkləmək olduğunu göstərir. Bir cəmiyyətdə materialist fəlsəfənin yayılması isə istər-istəməz kommunist ideologiyaya zəmin hazırlayır. Bu əlaqə kommunist ideologiyanın darvinizmdən qaynaqlandığını açıq şəkildə ortaya qoyur.

Təkamül nəzəriyyəsini dəstəkləyən müsəlmanlar bu gerçək üzərində düşünməlidirlər. 19-cu əsrdən etibarən hər zaman dinin ən qatı düşmənləri olan kommunistlərlə eyni düşüncəyə malik olmaq, həm də kommunizmin guya elmi təməli olan bir fikri müdafiə etmək, əlbəttə, hər bir müsəlmanın çəkinməli olduğu haldır. Kommunizmin, əslində, çökmədiyini, bu gün dünyanın bir çox ölkələrində gizli şəkildə yenidən yayıldığını və dünyanı təhdid etmək üçün əlverişli şərait axtarıldığını düşünsək, bu mövzunun əhəmiyyəti bir daha anlaşılar.

# DARVİN TÜRK MİLLƏTİNƏ AŞAĞI İRQ KİMİ BAXIR

Darvinizmi açıqlamağımızın əsas səbəblərindən biri də bu nəzəriyyədə türk milləti haqqında bəzi böhtanların uydurulmasıdır. O dövrdə İngiltərə Osmanlı imperiyasını parçalamaq planları qurarkən siyasi manevrlərlə yanaşı, "psixoloji müharibə" üsullarından da istifadə etmişdi. Bir çox şərhçinin ortaq qənaəti ilə "İngiltərə imperializminin" elmi "məruzəçisi" olan Darvin bu psixoloji müharibədə mühüm rol oynayırdı. Nəcib türk millətini öz ağlınca "aşağı irq" olaraq göstərən Darvin artıq bunu bir məqsədə çevirmişdi. Darvin tarixdə çox mühüm rol oynamış, şanlı keçmişə sahib olan müsəlman türk milləti haqqında belə deyirdi:

*Təbii seçməyə əsaslanan mübarizənin mədəniyyətin inkişafına sizin düşündüyünüzdən daha çox faydalı olduğunu və olacağını sübut edə bilərəm. Bir neçə əsr əvvəl Avropa türklər tərəfindən işğal edildikdə Avropa millətlərinin necə böyük risk altında qaldığını düşünün. Amma artıq bu gün Avropanın türklər tərəfindən işğalı bizə necə də gülünc gəlir.* ***Avropa irqləri olaraq tanınan mədəni irqlər həyat mübarizəsində türk barbarlığına qalib gəlmişdir.*** *Dünyanın yaxın gələcəyinə baxdığım zaman* ***bu cür aşağı irqlərin çoxunun mədəniləşmiş yüksək irqlər tərəfindən yox ediləcəyini görürəm.***

(Francis Darwin, The Life and Letters of Charles Darwin, Vol. I, 1888, New York D. Appleton and Company, s.285-286)

Əlbəttə ki, Darvinin millətimiz haqqında dediyi bu iyrənc sözləri qəbul etmək qeyri-mümkündür. Bu çirkin təbliğatın təsirində olan millətlər və ya insanlar da millətimizə qarşı təcavüzkarlıq etmişlər. Bu vəziyyət indi də davam edir. Bəzi Qərb ölkələrində hakim olan türk düşmənçiliyinin əsasında Darvinin türkləri aşağı irq kimi görməsi dayanır. Belə ki, son dövrlərdə bunun kimi bir çox hadisələr baş vermişdir.

Almaniyada neonasistlərin dəfələrlə təşkil etdikləri amansız hücumlarda bir çox vətəndaşlarımız həyatını itirmiş, əksəriyyəti isə yaralanmışdır. Bəhs edilən neonasist qrupları Darvinin təkamül nəzəriyyəsini əsas ideologiyaları kimi qəbul edir və Darvinin türklər haqqındakı yalan sözlərini əsas mənbə kimi istinad edirlər. Bu faşist təşkilatların internet səhifələrində Darvinin yuxarıdakı izahına tez-tez rast gəlmək mümkündür. Belə vəziyyətdə bu nəzəriyyəyə (hətta elm tərəfindən də rədd edildiyi halda) elmi həqiqət kimi baxmaq, onun dinlə əlaqələndirmək, Quranda bu barədə heç bir dəlil olmamasına baxmayaraq, Allahın canlıları təkamüllə yaratdığını iddia etmək millətimizə endirilmiş çox böyük zərbə olar. Bu cür anlayış yuxarıda qeyd etdiyimiz kimi, irqçi cərəyanların da sürətlə artmasına imkan yaradar.

Həmçinin darvinizm irqçi hücumlara zəmin hazırlamaqla yanaşı, eyni zamanda, hər cür separatçı, dağıdıcı fəaliyyətlərə də imkan yaradır. "Həyatın mübarizə meydanı olduğu" yalanı bir ölkənin vətəndaşlarının mehriban, sülh içində yaşamaları əvəzinə, parçalanmalarına, ölmələrinə və öldürmələrinə zəmin hazırlayır.

Halbuki hər şeyi Allahın yaratdığını, Allahın insana Öz ruhundan üfürdüyünü, dünyanın sülh və dostluq yeri olduğunu, bütün insanların bərabər hüquqlara malik olduğunu bilən, dünyada etdiyi hər şeyin axirətdə qarşılığını alacağını dərk edən bir insanın şiddətə yönəlməsi, cinayət

törətməsi mümkün deyil. Bunu yalnız təsadüfən yarandığını, heç bir məsuliyyət daşımadığını, öldükdən sonra da hesab verməyəcəyini düşünən, dünyanın mübarizə meydanı olduğuna inanan insanlar edə bilərlər.

Buna görə də inanclı insanlar darvinizmi düşünmədən müdafiə etmək əvəzinə, əvvəlcə vicdanları ilə düşünməli, elmin qəbul etmədiyi bu nəzəriyyəni müdafiə etməyin nələrə səbəb olacağını bilməlidirlər. Darvinizmin istər dünyadakı bütün insanlara, istərsə də nəcib türk millətinə vurduğu zərərlər açıq-akar görünür. Bununla yanaşı, darvinizmin insanlara gətirdiyi bəlalar, sıxıntılar və xaosu da uzun illər boyunca hər kəs görmüşdür. Darvinizmin insanları xürafələrə, ağılsızlıqlara və məntiqsizliklərə aparması və onları səmimiyyətsizliyə sövq etməsi də bu nəzəriyyənin təhlükəli görülməsi üçün kifayətdir.

## QURAN AYƏLƏRİ İLƏ TƏKAMÜLƏ DƏLİL GƏTİRMƏYƏ ÇALIŞANLARIN SƏHVİ

İnanclı insan üçün əsas yol göstərici Quran və Peyğəmbərimizin (s) sünnətidir. Allah Quranda canlıların da, kainatın da yaradılışı barəsində bir çox ayə endirib. Ancaq bu ayələrdə təkamüllə yaradılış olduğu barədə heç bir məlumat, hətta işarə belə yoxdur. Başqa sözlə, canlıların bir-birindən törədiyinə, aralarında təkamül yolu ilə əlaqə qurulduğuna dəlil olan ayə olmadığını açıq-aşkar görürük. Quranda (əvvəlki hissələrdə də qeyd etdiyimiz kimi) canlıların və kainatın Allahın "Ol" əmri ilə möcüzəvi şəkildə yaradıldığı bildirilir. Elmi kəşflərin də təkamülü yalanladığını nəzərə alsaq, görərik ki, Quran elmlə paraleldir.

Ancaq buna baxmayaraq, darvinizmi müdafiə edən bəzi müsəlmanlar mənası aydın olan ayələri yanlış təfsir edir, həqiqi mənasından başqa mənalar da əlavə edirlər. Təkamülü müdafiə etmək və Qurandan dəlil göstərmək üçün bəzi ayələrin mənasını dəyişib öz istəklərinə uyğun şəkildə şərh edirlər. Bu isə çox təhlükəli vəziyyətdir. Allah bu cür insanlar haqqında ayədə belə deyir:

**Onlardan elə bir dəstə də vardır ki, oxuduqlarını Kitabdan hesab edəsiniz deyə Kitabı oxuyarkən dillərini əyib bükürlər. Halbuki bu, Kitabdan deyildir. Onlar: "Bu, Allah qatındandır!"– deyirlər. Halbuki o, Allah qatından deyildir. Onlar bilə-bilə Allaha qarşı yalan danışırlar.** (Ali-İmran surəsi, 78)

Gördüyümüz kimi, ayələri şüurlu şəkildə, mənasını dəyişərək şərh etmək Quranda Allaha qarşı yalan danışmaq kimi qiymətləndirilir. Səmimi müsəlman Allaha qarşı belə yanlış etməkdən qorxar. Beləliklə, Quranda bildirilən bir mövzuda, xüsusən də Quranı bilən insanların zənlə yalan danışması, yanlış tərəfə dəstək olması, şübhəsiz ki, vicdansızlıqdır.

Əlbəttə ki, dinlə təkamülün eyni olduğunu iddia edən hər kəs üçün bunu demək olmaz. Çünki çoxu dediklərinin mənasını bilmədən, düşünmədən, ya da təkamülün, əslində, necə təhlükəli olduğunun şüurunda olmadan belə yanlış edir.

Hər kəs Allah adına danışaraq, guya ayələri dəlil göstərərək insanları Quran haqqında yanlış istiqamətləndirən iddialar irəli sürməyin məsuliyyətini götürməkdən çəkinməlidir. Belələri mövzunun ciddiliyi üzərində yenidən düşünməli və hesabını axirətdə verə bilməyəcəkləri yanlışlar etməməlidirlər. Belə insanlar özləri ilə yanaşı, fikirlərini oxuyanların da yanılmasına səbəb olurlar. Bu da bir insan üçün mənəvi baxımdan çətin yükdür.

Əslində, problemin əsl mənbəyi budur: təkamülü müdafiə edən bəzi müsəlmanlar bu nəzəriyyəni elmi cəhətdən doğru zənn edir. Ona görə də düşünürlər ki, Quran da təkamülü təsdiq edir. Bu məqsədlə təkamül nəzəriyyəsini məcburi şəkildə Qurana uyğunlaşdırmağa çalışırlar. Qurana bütövlükdə baxdıqda, ya da dəlil hesab edilən Quran ayələri əvvəlki və sonrakı ayələrlə bərabər oxunduqda deyilənlərin etibarsız olduğunu görürük.

Bu hissədə təkamüllə Quran ayələrini yanlış şərh edən müsəlman təkamülçülərin hansı ayələri öz ağıllarınca təkamülə dəlil göstərdiklərini açıqlayacağıq. Həmçinin bu insanların iddialarını yenə Quranla cavablandıracaq, mötəbər mənbə kimi qəbul edilən İslam alimlərimizin təfsirləri ilə müqayisə edəcəyik.

Unudulmamalı bir həqiqət var: Quran Allahın endirdiyi şəkildə, hansısa dindənkənar fikir və fəlsəfənin təsirinə məruz qalmadan, tam səmimi qəlblə oxunub, o şəkildə açıqlanmalıdır. Açıqlayan şəxslər də Allahdan qorxaraq vicdanla hərəkət etməlidir. Bu məntiqlə oxunduqda Quranda təkamüllə yaradılış mənasına gələn heç bir bilginin olmadığı, əksinə Allahın sadəcə “Ol” deməsi ilə varlıqları və canlıları yaratdığı görünəcək.

Əgər Hz. Adəmdən əvvəl yarı meymun, yarı insan canlılar yaşasa idilər, (belə bir şey yoxdur) Allah bunu bizə Quranda açıq-aşkar bildirərdi. Quranın anlaşıqlı olması və asanlıqla başa düşülməsi təkamüllə yaradılış iddiasının gerçək olmadığını göstərir.

## 1 - Cİ XƏTA:
## İNSANIN “TƏKAMÜL MƏRHƏLƏLƏRİ” İLƏ YARADILDIĞI XƏTASI

**Necə olub ki, siz Allahın böyüklüyünü layiqincə uca tutmursunuz? Axı O sizi mərhələlərlə yaratdı.** (Nuh surəsi, 13-14)

Təkamüllə yaradılış müdafiəçilərinin ayədə keçən "mərhələlərlə" ifadəsini "təkamül mərhələlərindən keçirərək" kimi tərcümə etməsi bu insanların şəxsi fikirləridir və İslam alimləri tərəfindən doğru qəbul edilmir.

"Ətvar" sözü "mərhələ, hal, vəziyyət" mənasındakı "tavru" kəlməsinin cəm formasıdır və Quranda bu şəkildə başqa ayədə keçmir. İslam alimlərinin bu ayə ilə bağlı təfsirləri də bu ayədə təkamül nəzəriyyəsi ilə bağlı ifadə olmadığını təsdiq edir.

Məsələn, Əlmalılı Muhamməd Həmdi Yazır bu ayəni "Halbuki O sizi mərhələ-mərhələ bir çox hallardan keçirərək yaradıb" kimi tərcümə edib. Ayənin təfsirində isə bu mərhələləri "təkamül mərtəbələri" şəklində ifadə edib. Ancaq burada "təkamül mərtəbələri" ifadəsi ilə nəzərdə tutulan mənanın insanın fərqli canlı növündən yarandığını irəli sürən təkamül

nəzəriyyəsi ilə heç bir əlaqəsi yoxdur. Belə ki, təfsirin ardında bu mərhələlərin nədən ibarət olduğu belə ifadə edilir:

"...Əbus-Səudun şərhinə görə; əvvəl ünsürlər, sonra qidalar, sonra qarışıqlar, sonra sperma, sonra embrion, sonra ət parçası, sonra sümük və ət halında, sonra da tam fərqli bir yaradılışla şəkil vermişdir. **"Yaradanların ən gözəli olan Allah nə qədər xeyirxahdır."** (Muminun surəsi, 14) Bunları edən o gözəl Yaradıcı ucaldılmağa və hörmətə layiq deyil mi? O sizi başqa şəkildə və yaradılışla yüksəldə bilməzmi? Yaxud əzib yox edərək şiddətli əzaba sala bilməz mi? Siz niyə bunları düşünmürsünüz?"

Əlmalılının yuxarıdakı ifadələrindən də aydın olduğu kimi, bu ayədə keçən mərhələlər insanın sperma olaraq çatdığı ana bətnində əvvəl embrion, sonra ət parçası, sonra sümük və ət halında inkişaf edib, sonra da insan kimi dünyaya gəlişidir.

İmam Təbərinin təfsirində də "Nuh" surəsinin 14-cü ayəsi, "Halbuki O sizi mərhələlərdən keçirərək yaratmışdır" şəklində tərcümə edilmiş və "Əvvəl sperma halında idilər, sonra sizi qan laxtasına, ondan sonra da bir parça ət parçasına çevirib yaratdı" şəklində açıqlanmışdır.

(İmam Taberi, Taberi Tefsiri, Tercüme Mehmet Keskin, Ümit Yayıncılık, 6.Cilt, s.2631)

Ömər Nəsuhi Bilmən isə ayəni, "Sizi, şübhəsiz, müxtəlif dərəcələrlə yaratmışdır" şəklində tərcümə edərək belə təfsir edib:

Xaaliq-i Kərim (sizi şübhəsiz, müxtəlif dərəcələrdə) müxtəlif surətlərdə (yaratmışdır). Siz başlanğıcda bir nütfə idiniz, sonra qan, ət parçası, sümük sahibi oldunuz, sonra da insan kimi bədən sahəsinə atıldınız. Bütün bu hadisələr, fəza hadisələri, inqilablar bir Xaaliq-i Hakimin varlığına, qüdrət və əzəmətinə aşkar dəlil deyilmi? Nə üçün siz öz yaradılışınızı heç düşünmürsünüz!"

(Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, Bilmen Yayınevi, İstanbul, 8.cilt, s. 3851)

Gördüyümüz kimi, İslam alimləri "Nuh" surəsinin 14-cü ayəsini eyni şəkildə şərh edib, sperm halından insan halına çevrilmə arasındakı mərhələlər olduğunu vurğulayıblar. Deməli, Quran ayələri digər ayələrdəki təfsirlərə əsaslanaraq şərh edilməlidir. Çünki Allah başqa ayələrdə insanın yaradılış mərhələlərini ana bətnindəki mərhələlər kimi izah edir. Beləliklə, "ətvarən" sözünün də eyni mənanı verdiyini açıq-aşkar görürük. Bu sözü təkamüllə əlaqələndirib insanın mənşəyinin başqa canlı növündən olduğunu irəli sürmək yanlışdır.

## 2 - Cİ XƏTA:
## QURANDA TƏKAMÜL PROSESİNƏ DƏLİL OLMASI XƏTASI

**İnsanın elə bir dövrü olub keçmişdir ki, o, xatırlanmağa layiq bir şey olmamışdır!** (İnsan surəsi, 1)

İnsanların təkamülə dəlil kimi irəli sürdüyü digər ayə isə yuxarıdakıdır. "Özü yad edilməyə dəyər bir şey deyilkən" ifadəsini insanın insan olmadan əvvəlki halı kimi açıqlayırlar. Halbuki ilk iddia kimi, bu da yanlışdır.

Altından xətt çəkilən ifadənin ərəbcəsi belədir:

**"ləm yekun şəy'ən məzkurən"**

*Ləm yekun : deyildi*
*Şəy'ən : bir şey*
*Məzkurən : zikredilən, adı keçən*

Bu ifadəni təkamül yolu ilə yaradılışa dəlil göstərmək məntiqsiz hərəkətdir. Belə ki, bu ayə İslam alimləri tərəfindən təkamül prosesi kimi ifadə edilmir. Məsələn, Əlmalılı Hamdi Yazır bu ayədəki zaman ifadəsini belə təfsir edir:

"Başlanğıcda ilk maddələr olan ünsürlər və minerallar, sonra onlardan mərhələ-mərhələ yaradılıb orta maddələri olan bitki mənşəli, heyvani qidalar "palçıq şirəsi" (Muminun surəsi, 12), sonra onlardan süzülən yaxın maddəsi olan məniyə doğru yavaş-yavaş mərhələ və dərəcələr içində gələn bir şey olmuş, ancaq "insan" deyə yad edilən bir şey olmamışdı. Həqiqətdə insanın hər bir fərdi kimi cinsi də əzəli deyil, sonradan olmadır. Həm zamanın başlanğıcından, aləmin yaradılışından çox sonralar mövcud olmuşdur".

(Elmalılı Hamdi Yazır, http:// www.kuranikerim.com/telmalili /insan-dehr.htm)

Ömər Nəsuhi Bilmən isə ayəni belə təfsir edir:

Bu ayələr göstərir ki, Allah insanları heç bir şey deyilkən bir qətrə sudan eşidən və görən yaradıb…

İnsan növü başlanğıcda heç mövcud deyildi, bir müddət sonra bir qətrə sudan, torpaqdan və palçıqdan təsvir edilmiş cəsəd halına gəlib. Həmin insan o vaxt məlum deyildi, onun nə adda və nə üçün yaradıldığını göy və yer əhli bilmirdi. Sonra özünə ruh bilgisi verilməyə başlandı".

(Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 8.cilt, s. 3915)

İmam Təbəri isə ayəni, "İnsanın (Adəmin) üzərindən elə bir zaman keçib ki, o əsnada o, şanı və üstünlüyü olan bir şey belə deyildi. O yalnız yapışqan palçıq və dəyişən bir palçıq idi" şəklində təfsir edir.

(İmam Taberi, Taberi Tefsiri, 6.Cilt, s.2684)

Buna görə də ayədə keçən və zaman bildirən sözdən təkamülə dəlil kimi istifadə etmək yanlışdır.

## 3- CÜ XƏTA:
### SUDAN YARATMANIN TƏKAMÜLLƏ YARADILIŞA DƏLİL OLMASI XƏTASI

**İnsanı qarışdırılmış nütfədən yaradaraq onu sınaqdan keçirmək məqsədilə eşidən və görən etdik.** (İnsan surəsi, 2)

Təkamüllə yaradılışı müdafiə edənlər bir çox ayədə keçən "insanın sudan yaradıldığı" kimi ifadələri öz iddialarına guya dəlil kimi göstərməyə çalışırlar. Sudan bütün canlıların yarandığını iddia edirlər.

Halbuki insanın sudan yaradıldığının ifadə edildiyi ayələr də İslam alimləri və təfsirçilər tərəfindən həmişə spermadan yaradılış kimi açıqlanılıb. Məsələn, Əlmalılı Muhamməd Həmdi Yazır "İnsan" surəsinin 2-ci ayəsini belə təfsir edir:

"... Bu şəkildə bir nütfədən yaradıldı. Raqibin açıqladığı kimi, nütfə saf suya deyilir. Kişinin suyuna da nütfə deyilir. Nütfə ilə məni sinonim kimi

sayılır. Lakin "Qiyamət" surəsinin sonunda da keçdiyi kimi, Quranda "Tökülən nütfədən bu nütfə" (Qiyamət surəsi, 37) buyurularaq nütfənin nütfədən bir parça olduğu ifadə edilmişdir. Səhih-i Müslimdə rəvayət olunduğu kimi, "Suyun hamısından uşaq olmaz" hədisində də bir bütünün hər hissəsi nəzərdə tutularaq "bir suyun hər bir parçasından" buyrulmamış, bir hissəsi nəzərdə tutularaq "suyun hamısından" buyrulmuş olmasından uşağın meydana gəldiyi o suyun, suyun cəmi olan bütün məni deyil, onun bir hissəsindən ibarət olduğu deyildiyinə görə, nütfə mənidən bir cüz olan saf toxumun adı olduğu başa düşülür". (Elmalılı Hamdi Yazır, http:// www.kuranikerim.com/telmalili /insan-dehr.htm)

İbni Təbəri isə bu ayəni; "... Adəmin nəslini kişinin və qadının bir-birinə qarışan döl sularından yaratdıq" şəklində təfsir edir. (İmam Taberi, Taberi Tefsiri, 6.Cilt, s.2684)

Ömər Nəsuhi Bilmən təfsirində isə ayə belə açıqlanır:

"... (Şübhə yox ki, Biz insanı qarışıq bir nütfədən yaratdıq) Kişi ilə qadının bir-birinə qarışan sularından vücudə gətirdik. Bəli ... İnsanlar bir müddət nütfə, yəni duru, saf su halında və bir müddətdə " ələqə" yəni uyuşmuş qan halında və bir müddətdə muzqa, yəni kiçik ət parçası halında olublar. Daha sonra da sümük kəsilib ətlə bürünmüş, bərhəyat (yaşayan) hala gəliblər... (Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 8.cilt, s. 3915)

Gördüyümüz kimi, insanın qarışıq bir damla sudan yaradılmasının təkamül nəzəriyyəsinin suyun içində təsadüflər nəticəsində yaranan bir hüceyrədən mərhələ-mərhələ insanın yaranması iddiası ilə əlaqəsi yoxdur. Bütün böyük müfəssirlərin açıqladığı kimi, bu ayədə də insanın ana qarnındakı yaradılışına diqqət çəkilir.

Başqa ayəyə də diqqət yetirsək, deyilənlərin yanlış olduğunu görərik. Ayədə belə buyurulur:

**Ey insanlar! Yenidən diriləcəyinizə şübhə edirsinizsə,** *(bilin ki,)* **həqiqətən də, Biz sizi torpaqdan, sonra nütfədən, sonra laxtalanmış qandan, daha sonra tam bir şəklə salınmış və ya salınmamış bir parça ətdən yaratdıq ki,** *(qüdrətimizi)* **sizə bəyan edək. Bətnlərdə istədiyimizi müəyyən bir vaxt ərzində saxlayırıq. Sonra sizi** *(oradan)* **uşaq kimi çıxardırıq ki, yetkinlik çağına yetişəsiniz. Sizdən kimisi** *(yetkinlik yaşına çatmamış)* **vəfat edir, kimisi də ömrünün ən rəzalətli dövrünə çatdırılır ki,** *(vaxtilə)* **bildiyi şeyləri unutsun. Sən yer üzünü cansız görürsən. Biz ona yağmur endirdiyimiz zaman o, hərəkətə gəlib qabarır və cürbəcür gözəl bitkilər bitirir.** (Həcc surəsi, 5)

Ayədə insanın yaradılış mərhələlərindən bəhs edilir. Birinci mərhələ olan torpaq insandakı əsas mineralları və elementləri təşkil edən xammaddədir. İkinci mərhələ isə bu elementlərin ana qarnındakı yumurtanı dölləmək üçün lazımi quruluşa və genetik məlumata sahib spermalardan ibarət olan və Quranda qarışıq su kimi təsvir edilən mənidə birləşməsidir. Qısası, insanın əsas xammadəsi torpaqdır. Torpağın özü isə bir damla mənidə o insanı yaradacaq şəkildə toplanıb. Ayədə bu "su" mərhələsindən dərhal sonra insanın ana bətnindəki inkişaf mərhələsi müəyyən edilib. Halbuki təkamül nəzəriyyəsi canlı aləmin guya öz - özünə suda başlamasından insanın

yaranması arasında milyonlarla fərziyyəvi mərhələ (ilk hüceyrə, tək hüceyrəlilər, çox hüceyrəlilər, onurğasızlar, onurğalılar, sürünənlər, məməlilər, primatlar və s. bunların saysız ara keçidləri kimi) olduğunu güman edir. Ayədəki sıralamada isə qətiyyən bunun vurğulanmadığı göz önündədir.

İnsanın və digər canlıların sudan yaradıldığını bildirən digər ayələrdə də təkamülə aid heç bir işarə yoxdur. Bununla bağlı bəzi ayələr aşağıdakılardır:

**Məgər kafirlər göylərlə yer bir olduğu zaman Bizim onları bir-birindən araladığımızı, hər bir canlını sudan yaratdığımızı görmürlərmi? Yenədəmi inanmırlar?** (Ənbiya surəsi, 30)

**Allah hər bir canlını sudan yaratmışdır. Onlardan bəzisi qarnı üstə sürünür, bəzisi iki ayaq üstündə gəzir, bəzisi də dörd ayaq üstündə gəzir. Allah istədiyini yaradır. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.** (Nur surəsi, 45)

Aşağıdakı ayələrdə isə "bir damla suyun məni olduğu" açıq-aşkar bildirilir:

**O,** *(insanlardan və heyvanlardan)* **biri erkək və bir də dişi olmaqla iki cüt yaratdı – axıdılan bir nütfədən (min nutfetin iza tumna).** Təkrar diriltmək də Ona aiddir. (Nəcm surəsi, 45-47)

*Min : dan, dən*
*Nutfətin : Nütfə, bir damla*
*iza : -dığı zaman*
*tumna : mənini axıtmaq*

**Məgər o,** *(kişi)* **toxumundan axıdılan bir damla nütfə deyildimi? (nutfətən min məniyyin yumna)** (Qiyamət surəsi, 37)

*Nutfətən : nütfə, bir damla su*
*min : dan, dən*
*Məniyyin : məni*
*Yumna : atılıb tökülən*

**Qoy insan nədən yaradıldığına bir baxsın! O, süzülüb tökülən bir mayedən yaradılmışdır. (Hulika min main dafikın) Bu** *(maye)* **bel və köks sümükləri arasından çıxır.** (Tariq surəsi, 5-7)

*Hulika : yaradıldı*
*Min : dan, dən*
*Main : su*
*Dafikın : Birdən boşalan, tökülən, dəfələrlə axıdan, axıdılan.*

Bəzi təfsirçilər bu ayələrdəki “canlıların sudan yaranması” ifadəsində təkamül nəzəriyyəsinə işarə olduğunu zənn edirlər. Halbuki bu çox yanlışdır. Əvvəlcə də bildirdiyimiz kimi, ayələrdə canlıların sudan yaradıldığı bildirilərək canlıların əsas maddəsinin su olduğu xəbər verilir. Belə ki, müasir biologiyada ortaya qoyulur ki, su dünyadakı hər canlının bədəninin ən əsas ünsürüdür. İnsan bədəninin təxminən 70% - i sudur. Hər canlı

bədənindəki su sayəsində hüceyrədaxili, hüceyrələrarası və toxumalararası əlaqəni təmin edir. Su olmadan canlılar olmaz.

## 4-CÜ XƏTA:
## ƏVVƏLCƏ TORPAQDAN, SONRA İSƏ SUDAN YARADILMAĞIN TƏKAMÜLLƏ YARADILIŞA YARADILIŞA İŞARƏ EDİLDİYİ XƏTASI

**...Səni torpaqdan, sonra nütfədən yaratmış, daha sonra səni kişi qiyafəsinə salmış** *(Rəbbini)* **inkarmı edirsən?** (Kəhf surəsi, 37)

İmam Təbəri bu ayəni belə izah edir:

"**Atan Adəmi torpaqdan yaradan, sonra səni bir kişinin spermasından meydana gətirən,** daha sonra səni insan şəklinə salan Allahı inkar edirsən? Sənə bütün bunları verən və səni bu hala gətirən Allah sən ölüb torpağa qarışdıqdan sonra səni yenidən yeni bir məxluq olaraq yaratdı ".

(İmam Taberi, Taberi Tefsiri, 3.Cilt, s.1268)

Ömər Nəsuhi Bilmən isə həmin ayəni bu cür təfsir edir:

...Sənin əsilin və yaradılışının səbəbi olan Həzrəti Adəmi (torpaqdan) yaradan, sonra da səni (nütfədən) vücudunun yaradılmasındakı ən əsas maddə olan bir parça mənidən (yaradan, sonra da səni kişi cildinə salan) səni tam insan olaraq vücuda yerləşdirən Xaliqi-Kərimi (inkarmı edirsən), çünki axirət həyatını inkar etmək Onun zühuruna gələcəyini xəbər verən və buna qadir olan Allah Təalanı inkar etmək deməkdir...

(Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 4.cilt, s. 1958)

Yuxarıdakı təfsirlərdə də göründüyü kimi, "Kəhf" surəsinin 37-ci ayəsinin və insanın sudan yaradıldığının izah olunduğu digər ayələrin təkamüllə yaradılışa guya dəlil olaraq göstərilməsi yalnızca şəxsi fikirlərdir. Bu ayələrin belə mənaları yoxdur. Ayədə qeyd edilən "torpaqdan yaradılma" Hz. Adəmin yaradılışını, sudan yaradılıb insan şəklinə düşmə isə spermadan yaradılmanı izah edir. Aşağıdakı ayədə də Allahın məhz palçıqdan birbaşa insan yaratdığına işarə edilir. Hz. Adəmin yaradılışından bəhs edilən bu ayədə də bir mərhələdən bəhs edilir:

**Bir zaman Rəbbin mələklərə dedi: "Mən başqa şəklə düşmüş qara palçıqdan,** *(toxunduqda saxsı kimi)* **səs çıxaran quru gildən insan yaradacağam! Mən ona biçim verib Öz ruhumdan üfürdüyüm zaman siz ona səcdə edin!"** (Hicr surəsi, 28-29)

Quranda bildirilən yaradılış mərhələləri diqqətlə oxunsa və bu mərhələlərə diqqət edilsə, təkamüllə yaradılma izahının yanlış olduğu dərhal anlaşılar.

Quranda Hz. Adəmin təkamüllə mərhələ-mərhələ yaradılmadığını açıq şəkildə ifadə edən bir çox ayələr var. Bu ayələrin birində belə buyurulur:

**Həqiqətən, Allah yanında İsanın məsəli Adəmin məsəli kimidir.** *(Allah)* **onu torpaqdan yaratdı, sonra isə ona "Ol!"– dedi, o da oldu.** (Ali-İmran surəsi, 59)

Yuxarıdakı ayədə Allah Hz. Adəm ilə Hz. İsanın eyni şəkildə yaradıldıqlarını bildirir. Əvvəlcə də vurğuladığımız kimi, Hz. Adəm atası

olmadan, torpaqdan və Allahın "Ol" deməsi ilə yaradılmışdır. Hz. İsa da eynilə o cür, yəni atası olmadan, Allahın diləməsi və "Ol" əmri ilə yaradılmışdır. Ayələrdə Hz. Məryəmə Hz. İsanın lütf edilməsi belə açıqlanır:

**Və** *(ibadət vaxtı)* **onlardan** *(gizlənmək üçün)* **pərdə tutmuşdu. Biz Öz Ruhumuzu** *(Cəbraili)* **onun yanına göndərdik. O, Məryəmin qarşısında tam insan surətində peyda oldu.** *(Məryəm)* **dedi: "Mən səndən ər-Rəhmana sığınıram! Əgər müttəqisənsə,** *(mənə toxunma)***".** *(Mələk)* **dedi: "Mən sənə ancaq pak bir oğlan bəxş etmək üçün Rəbbinin elçisiyəm".** *(Məryəm)* **dedi: "Mənə bir insan toxunmadığı və özüm də zinakar olmadığım halda, necə mənim övladım ola bilər?"** *(Mələk)* **dedi: "Elədir, lakin Rəbbin buyurdu: "Bu, Mənim üçün asandır. Biz onu insanlar üçün bir möcüzə və Öz tərəfimizdən bir mərhəmət edəcəyik.** *(Bu,)* **hökmü verilmiş bir işdir."** (Məryəm surəsi, 17-21)

Torpaqdan və sudan yaradılmanın bildirildiyi digər ayələrdə də əvvəlki bölmədə də açıqladığımız kimi, insanın təkamül mərhələləri deyil, insanın yaradılışının ana bətninə düşməzdən öncə və doğulduqdan sonrakı mərhələləri izah edilir:

**Ey insanlar! Yenidən diriləcəyinizə şübhə edirsinizsə,** *(bilin ki,)* **həqiqətən də, <u>Biz sizi torpaqdan, sonra nütfədən, sonra laxtalanmış qandan, daha sonra tam bir şəklə salınmış və ya salınmamış bir parça ətdən yaratdıq ki,</u>** *(qüdrətimizi)* **<u>sizə bəyan edək. Bətnlərdə istədiyimizi müəyyən bir vaxt ərzində saxlayırıq. Sonra sizi</u>** *(oradan)* **<u>uşaq kimi çıxardırıq ki, yetkinlik çağına yetişəsiniz</u>. Sizdən kimisi** *(yetkinlik yaşına çatmamış)* **vəfat edir, kimisi də ömrünün ən rəzalətli dövrünə çatdırılır ki,** *(vaxtilə)* **bildiyi şeyləri unutsun. Sən yer üzünü cansız görürsən. Biz ona yağmur endirdiyimiz zaman o, hərəkətə gəlib qabarır və cürbəcür gözəl bitkilər bitirir.** (Həcc surəsi, 5)

**Sizi torpaqdan, sonra nütfədən, sonra laxtalanmış qandan yaradan, sonra sizi böyüyüb yetkinlik yaşına çatasınız, daha sonra da qocalasınız deyə uşaq olaraq** *(ana bətnindən)* **çıxardan Odur. Hərçənd ki, içərinizdə** *(qocalmamışdan)* **əvvəl öldürülənlər də var.** *(Bu ona görədir)* **ki, müəyyən olunmuş vaxta yetişəsiniz və bəlkə, düşünüb daşınasınız.** (Ğafir surəsi, 67)

**Axıdılan bir nütfədən.** (Nəcm surəsi, 46)

## 5-Cİ XƏTA:
### İLK İNSANIN MƏRHƏLƏ - MƏRHƏLƏ YARADILDIĞI XƏTASI

**Bir zaman sənin Rəbbin mələklərə belə demişdi: "Mən <u>palçıqdan bir insan yaradacağam.</u>** (Sad surəsi, 71)

Təkamüllə yaradılma ilə bağlı digər yanılma isə yenə ayədə keçən bir ifadənin yanlış şərh olunması nəticəsində ortaya çıxır. Ayədə altından xətt çəkilən ifadə "palçıqdan bir insan yaradıram" kimi tərcümə edilib və burada guya təkamül prosesi ilə yavaş-yavaş yaradılışa işarə edildiyi iddia edilir. Ancaq ayənin ərəbcəsi bu cür tərcümənin şəxsi izah və təhrif olduğunu açıq şəkildə ortaya qoyur:

**İnni halikun beşeren min tın. = Mən palçıqdan bir insan yaradanam.**

Bu ayədə "yaradıram" ifadəsindən istifadə olunmayıb. Ayənin davamında "Mən ona surət verib Öz ruhumdan üfürdüyüm zaman ona səcdə edin!" deyə bildirilir və buradan da "yaratma" feilinin bir anda olub bitdiyi anlaşılır.

Belə ki, İslam alimləri də bu ayəni "yaradıram" kimi tərcümə etməyiblər. Məsələn, Süleyman Ataş təfsirində ayəni belə açıqlayıb:

**"Bir zaman sənin Rəbbin mələklərə belə demişdi: "Mən palçıqdan bir insan yaradacağam."**

Allah palçıqdan bir insan yaradacağını mələklərə söyləmiş, palçığı insan şəklində düzəltmiş və ona Öz ruhundan üfürdükdən sonra mələklərə insana səcdə etmələrini əmr etmişdir. Bütün mələklər səcdə etmiş, yalnız cinlərdən olan İblis özünün atəşdən yaradıldığını, palçıqdan yaradılan insandan daha üstün olduğunu iddia edərək insanların ilk atasına səcdə etməmişdir".

İbn Təbəri də həmin ayəni "Mən palçıqdan bir insan yaradacağam" kimi tərcümə etmiş və ayəni bu cür təfsir etmişdir:

" ...Bir zamanlar Rəbbin mələklərə: Mən palçıqdan bir insan yaradacağam – buyurmuşdu ... Onun yaradılışını tamamladığım, surətini düzəltdiyim, ruhumdan ona üfürdüyüm zaman ona səcdə edin".

(İmam Taberi, Taberi Tefsiri, 4.Cilt, s.1991)

Təkamüllə yaradılmanı müdafiə edənlərin insanın mərhələ-mərhələ yaradıldığı ilə bağlı iddialarını dəstəkləmək məqsədi ilə istifadə etdikləri digər bir ayə isə belədir:

**Hansı ki, yaratdığı hər şeyi gözəl biçimdə yaratmış, insanı ilk olaraq palçıqdan xəlq etmişdir.** (Səcdə surəsi, 7)

Bu şəxslərin yanlış şərhlərinə görə, altı xətli olan ifadə bir mərhələyə, guya təkamül prosesinə işarə edir. Halbuki burada hansısa bir prosesə işarə edilmir. Allahın yoxdan yaratması kitab boyunca vurğuladığımız kimi, bir çox ayədə geniş izah olunur və heç birində insanın mərhələlərlə yaradıldığı ilə bağlı məna yoxdur. Aşağıdakı ayələrdə də Allahın hər an bir yaratmada olduğu vurğulanır:

**Məxluqatı əvvəldən yaradan, sonra onu yenidən diriltdən, sizə göydən və yerdən ruzi verən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var?" De: "Əgər doğru deyirsinizsə, dəlilinizi gətirin".** (Nəml surəsi, 64)

**Məgər onlar Allahın yaradılmışları əvvəlcə necə xəlq etdiyini, sonra da onları yenidən təkrarladığını görmürlərmi? Həqiqətən, bu, Allah üçün asandır.** (Ənkəbut surəsi, 19)

**Allah məxluqatı əvvəlcə** *(heçdən)* **yaradır,** *(öldürdükdən)* **sonra onu** *(yenidən)* **dirildir. Bundan sonra isə siz Ona qaytarılacaqsınız.** (Rum surəsi, 11)

Allah kainatdakı hər şeyi anbaan yaradır və bu, təkamül deməк deyil. Bu da digər iddialar kimi yalandır və Quranda bu iddianın heç bir əsası olmadığı açıq şəkildə anlaşılır. Həmçinin Ömər Nəsuhi Bilmən də bu ayəni *"..."O Xaliqi-Hakim torpaqdan, sudan Hz. Adəmi yaratdı".* (Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 6.cilt s. 2763) İmam Təbəri isə *"...Adəmin yaradılmasını*

*palçıqdan başlatmışdı"* (İmam Taberi, Taberi Tefsiri, 4.Cilt, s.1796) kimi təfsir edir.

Aşağıdakı ayədəki altından xətt çəkilmiş ifadələr də bəzi müsəlman təkamülçülər tərəfindən guya təkamül prosesinə işarə kimi izah olunur:

**Ey insan! Səni öz səxavətli Rəbbinə qarşı qoyan nədir?**
**O ki, səni yaradıb kamilləşdirdi və sənə gözəl bir surət verdi.**
**Səni istədiyi şəklə saldı.** (İnfitar surəsi, 6-8)

Halbuki bu ayələrdə bildirilən ardıcıllığı təkamül prosesi kimi göstərməyə çalışmaq olduqca yanlışdır. Belə ki, Əlmalılı Həmdi Yazır da təfsirində bu ayəni belə açıqlayır:

**O Rəbbin ki, səni yaratdı.** Burada yaratma ifadəsinin bədən və bədən üzvlərini düzəltmə, ölçülü etmə, forma vermə və hissələri birləşdirib əmələ gətirməmişdən əvvəl yaratmaq mənasında olduğu aydındır. Yenə də məlumdur ki, hər nemətin əsası olan var olma insanlara edilən ilk ilahi lütf və mərhəmətdir.

**Sonra da sənin bədənini və bədən üzvlərini düzəltdi.** "Səni torpaqdan, sonra nütfədən yaratmış, daha sonra səni insan şəklinə salmışdır." (Kəhf surəsi, 37) buyurulduğu və daha bir çox ayələrdə bildirildiyi kimi, yaradılışını mərhələlərdən keçirərək ruh üfürüləcək insanlıq səviyyəsinə gətirdi. Bədənini, orqanlarını yaratdı, qüvvət verdi və sənə simmetriya və ölçü verdi. Burada kökü "adl" və "ta'dil" sözlərindən gələn iki qiraət var. İkisi də eyni mənada olan bu sözlər uyğunlaşdırmaq, normal vəziyyətə gətirmək mənalarında olduğuna görə bir az əvvəl qeyd olunan "nizamlama"nın mükəmməlləşdirildiyini ifadə etmək üçün bir neçə formada təfsir edilmişdir.

Mukatildən rəvayət edildiyinə görə, göz, qulaq, əl, ayaq kimi cüt üzvlərin uyğunluğu və detalları anatomiyadan da məlum olduğu kimi, bədənin hər tərəfdən mütənasib və düzgün olduğunu bildirir və bu, ***"Biz onun barmaq uclarını bərpa etməyə qadirik"*** (Qiyamət surəsi, 4) ayəsində də ifadə edilir. Amma burada insanlığın xüsusiyyətini ifadə edən etibar və dəyər açıq deyildir. (Elmalılı Hamdi Yazır, http:// www.kuranikerim.com/telmalili /infitar.htm)

Əbu Əli əl-Farisinin yazdığına görə, "sənə ölçü verdi" demək bu mənaların hamısını ifadə edərək **"Sənə ən gözəl surət verdi və beləcə, sənə ağıl, fikir və qüdrəti qəbul edəcək qabiliyyəti verib, səni digər canlı və bitkilərə hakim etdi. Səni dünyada heç bir canlının çata bilməyəcəyi yetkinlik səviyyəsinə gətirdi" deyə təfsir edilmişdir** və bu, **"Mən ona biçim verib Öz ruhumdan üfürdüyüm zaman."** (Hicr surəsi, 29) və **"Onları yaratdıqlarımızın çoxundan xeyli üstün elədik"** (İsra surəsi, 70) mənalarına uyğundur. Bütün bunlar Allahın lütfü və mərhəmətidir.

(Elmalılı Hamdi Yazır, http:// www.kuranikerim.com/telmalili /infitar.htm)

Ömər Nəsuhi Bilmən də həmin ayəni belə təfsir edir:

Bəli (O), Kərim Rəbbin ki, səni Adəmdən yaratdı, sənə faydalı, bir-birinə mütənasib orqanlar verdi. Bütün orqanlarına bir ölçü verdi, bədən quruluşuna, qamətinə gözəl müvazinət verdi.

(Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 8.cilt, s. 3983)

İmam Təbəri də "İnfitar" surəsinin 7-ci ayəsində insanın nizamlı şəkildə

yaradıldığına işarə edildiyini ifadə edir:

"Ey insan, O Rəbb ki, səni yaratmış, yaradılışını düzgün formada etmiş, səni sağlam, düzgün, doğru şəkildə meydana gətirmişdir. (Yəni səni boyu normal, düzgün nisbətdə, ən gözəl şəkildə tam insan olaraq yaratmışdır) Allah gözəl və ya çirkin olsun, səni dilədiyi kimi meydana gətirmişdir".

(İmam Taberi, Taberi Tefsiri, 6.Cilt, s.2748)

Yuxarıdakı açıqlamalardan da göründüyü kimi, ayələrdəki ifadələr olduqca açıq və aydındır. Allahın insanı sağlam, düzgün formada və tam yaratdığı bildirilir. Belə ki, buna bənzər ifadələr bir çox ayələrdə də vardır. Məsələn,"Səcdə" surəsində belə buyurulur:

**Sonra onu düzəldib müəyyən şəklə salmış və ona Öz ruhundan üfürmüş, sizə qulaqlar, gözlər və ürək vermişdir. Siz necə də az şükür edirsiniz?** (Səcdə surəsi, 9)

Bu ayədə əvvəlcə yaradılma ifadəsindən istifadə edilmiş, daha sonra da göz, qulaq və ürək verdiyi bildirilmişdir. Beləliklə, ayədə bu mərhələlərin hər birinin eyni anda olduğu, yəni insanın göz, qulaq və qəlbi ilə birlikdə bir anda yaradıldığı xəbər verilir. Bu ayələrin insanın təkamüllə yaradılmasına işarə etdiyini iddia etmək isə olduqca yanlışdır. Belə ki, bu ayə də bütün İslam alimləri tərəfindən eyni cür təfsir edilir. Məsələn, İmam Təbəri belə açıqlayır:

"...Sonra insanı tam canlı olaraq düzgün şəkildə meydana gətirmiş, ondan sonra da ona ruhundan üfürmüş, beləcə, o, danışan canlı olmuşdur... Səsləri eşitməyimiz üçün qulaqlar, insanları görə bilməyimiz üçün gözlər, yaxşını və pisi tanıya bilməyimiz üçün ürəklər vermişdir ki, bu lütfünə görə Ona şükür edəsiniz..." (İmam Taberi, Taberi Tefsiri, 4.Cilt, s.1796)

Ömər Nəsuhi Bilmən isə ayəni "O Xaliqi Kərim yaratmağa başladığı bütün insan nəslinin hər birini yaratdı, onun bədənini ana rəhmində ikən tamamladı və ona Öz ruhundan üfürdü, yəni ona həyat verdi, yaşama gücü verdi... O Xaliqi Kərim (sizin üçün eşitməyi) elə faydalı bir nemət etdi ki, onun sayəsində söylənilən sözləri, gözəl səsləri eşidir, dinləyirsiniz və sizin üçün (gözləri, könülləri yaratdı) gözlərinizlə ətrafınızdakı hər şeyi görürsünüz, könüllərinizlə yaxşı, pis olanları qavrayır və təqdir edə bilirsiniz. Bunların hər biri nə böyük İlahi lütfdür." (Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, s. 2764) şəklində izah etmişdir.

## 6 - CI XƏTA:
### HZ.. ADƏMİN İLK İNSAN OLMADIĞI XƏTASI

Təkamüllə yaradılış yanılması ilə bağlı irəli sürülən iddialardan biri isə Hz. Adəmin ilk insan olmadığı, hətta insan olmadığıdır (Hz. Adəmi tənzih edirik). Bu əsassız iddiaya guya dəlil olaraq aşağıdakı ayəni göstərirlər:

**Sənin Rəbbin mələklərə: "Mən yer üzündə bir canişin bərqərar edəcəyəm!" – dedikdə, onlar: "Biz Səni həmd-səna ilə tərifədiyimiz və Səni müqəddəs tutduğumuz halda, Sən orada fəsad törədib qan salacaq bir kəsmi yerləşdirəcəksən?"– söylədilər. O dedi: "Şübhəsiz ki, Mən sizin bilmədiklərinizi bilirəm!" .** (Bəqərə surəsi, 30)

Bu iddianı müdafiə edənlər ayədə keçən "canişin bərqərar edəcəyəm" şəklindəki ifadədə ərəbcə keçən "cəələ" feilini "təyin etmək" kimi açıqlayırlar. Yəni Hz. Adəmin ilk insan olmadığını, bir çox insanın arasından canişin olaraq "təyin edildiyi"ni iddia edirlər. Halbuki "cəələ" kəlməsinin Quranda istifadə olunan çox müxtəlif mənaları vardır. Bunlar belədir:

Cəələ: Yaratmaq, icad etmək, çevirmək, etmək, qoymaq, qılmaq

Quranda "cəələ" feilinin keçdiyi digər ayələrdən bəzi nümunələr belədir:

**Allah sizi tək bir nəfsdən yaratdı (cəələ). Sonra ondan zövcəsini yaratdı. O sizdən ötrü səkkiz cüt heyvan endirdi…** (Zümər surəsi, 6)

**De:"Sizi yaradan, sizə qulaq, göz və ürək verən (cəələ) Odur. Necə də az şükür edirsiniz!"** (Mülk surəsi, 23)

**Ayı bir nur, günəşi də çıraq etmişdir (cəələ).** (Nuh surəsi, 16)

**Allah yeri sizin üçün xalı etdi (cəələ).** (Nuh surəsi, 19)

Yuxarıdakı ayələrdə də göründüyü kimi, "cəələ" kəlməsi Quranda çox fərqli mənalarda istifadə edilmişdir. Həmçinin bir çox ayələrdə də Hz. Adəmin torpaqdan yaradıldığı bildirilir. Hz. Adəmin digər insanların arasından seçilmədiyi, xüsusi və fərqli yaradılışa sahib olduğu bu ayələrdən də anlaşılır.

Quranda Hz. Adəmin ilk insan olduğu haqqında verilən digər vacib məlumat da etdiyi səhvə görə özünün və yoldaşının cənnətdən çıxarılmasıdır. Ayələrdə belə bildirilir:

**Ey Adəm oğulları! Şeytan, əcdadınızın ayıb yerlərini özlərinə göstərmək məqsədilə** *(aldadaraq)* **libaslarını soyundurub cənnətdən çıxartdığı kimi, sizi də aldatmasın. Şübhəsiz ki, o və onun nəsli sizləri sizin onları görə bilmədiyiniz yerlərdən görürlər. Həqiqətən, Biz, şeytanları iman gətirməyənlərin dostları etdik.** (Əraf surəsi, 27)

**Biz dedik: "Ey Adəm! Sən zövcənlə birlikdə cənnətdə sakin ol və orada rahatlıqla nemətlərimizdən istədiyiniz yerdə yeyin** *(için)*, **təkcə bu ağaca yaxınlaşmayın! Yoxsa zalımlardan olarsınız". Şeytan isə** *(ağaca yaxınlaşdırmaqla)* **onları aldadıb olduqları yerdən çıxartdı. Biz dedik: "Bir-birinizə düşmən olaraq aşağı enin! Yerdə sizin üçün müəyyən** *(olunmuş)* **vaxtadək məskən və gün-güzəran vardır".** (Bəqərə surəsi, 35-36)

Ayələrdə bildirilən ifadələr çox açıqdır. Allah Hz. Adəmi torpaqdan yaratmışdır. Hz. Adəm xüsusi yaradılışa sahibdir və bu xüsusi yaradılış onun əvvəlcə cənnətdə olmasından, daha sonra oradan çıxarılmasından bir daha anlaşılır. Amma təkamül saxtakarlığına inanan bəzi müsəlmanlar açıq-aşkar bu gerçəkləri görməzlikdən gəlir və ayələrdə keçən "cənnət" kəlməsinin axirətdəki cənnəti deyil, dünyadakı gözəl məkanları ifadə etdiyinə dair yanlış fikirlər irəli sürürlər. Halbuki Hz. Adəmin yaradıldığı cənnətin bir çox xüsusiyyəti Quranda bildirilir. Orada mələklər və şeytan var. Mələklər Allahla danışırlar. Ayələrdəki ifadələr bu qədər açıq olduğu halda, Quran əxlaqına uyğun olmayan izahlarla təkamül nəzəriyyəsinə dəlil axtarmağa çalışmaq çox yanlışdır.

Bütün insanların Hz. Adəmdən gəldiyini, yəni Hz. Adəmin ilk insan olduğunu xəbər verən bir çox ayələrdən ikisi belədir:

**Bir zaman Rəbbin Adəm oğullarının bellərindən onların törəmələrini çıxarmış və: "Mən sizin Rəbbiniz deyiləmmi?"** *(–deyə)* **onları özlərinin əleyhinə şahid tutmuşdu. Onlar: "Bəli, biz şahid olduq!"– demişdilər.** *(Bu ona görədir)* **ki, siz Qiyamət günü: "Biz bundan xəbərsiz idik!"– deməyəsiniz. Yaxud: "Atalarımız bizdən əvvəl** *(Allaha)* **şərik qoşmuş, biz də onlardan sonra gələn bir nəsil olmuşuq. Məgər Sən bizi batilə uyanların etdikləri əməllərə görə məhv edəcəksən?"– deməyəsiniz.** (Əraf surəsi, 172-173)

Qısası, Hz. Adəm ilk insandır və Allahın ilk elçisidir. Bu haqda olan ayələr olduqca açıqdır və heç bir izaha ehtiyac yoxdur. İnsanların etməli olduqları tək şey Quran ayələrini səmimi qəlblə, vicdanlarının səsini dinləyərək və ixlasla oxumaqdır. Allah bu niyyətlə ayələrini oxuyan qullarına mütləq doğru olanı göstərəcəkdir.

## 7 - Cİ XƏTA:
### QURANDA KEÇƏN "ƏCDADLARIMIZ" İFADƏSİNİN TƏKAMÜL KEÇİRMİŞ ƏCDADLARA İŞARƏ ETMƏSİ XƏTASI

Təkamül nəzəsiyyəsinə aldanmış bəzi müsəlmanların Quranda iddialarına dəlil kimi göstərməyə çalışdıqları digər bir ifadə isə bir çox ayələrdə bildirilən "əcdadlarımız" kəlməsidir. Təkamülçülərin yanlış təfsirinə görə, bu ifadədə guya insanın ibtidai əcdadlarına işarə edilir. Bu yanlış təfsiri açıqlamağa çalışarkən kəlmənin Quranda cəm şəkildə istifadə edildiyini dəlil kimi göstərirlər. Bu ayələrdən bəziləri belədir:

*(Musa)* **dedi: "O sizin də, ulu babalarınızın da Rəbbidir!"** (Şüəra surəsi, 26)

**Ondan başqa** *(ibadətə layiq olan)* **məbud yoxdur. O həm dirildir, həm də öldürür. O həm sizin Rəbbiniz, həm də əcdadlarınızın Rəbbidir.** (Duxan surəsi, 8)

Ancaq bu, Quran əxlaqına uyğun olmayan iddiadır. Çünki bu kəlmə ayələrdə bir çox hallarda cəm şəklində işlədilir və bunu təkamüllə açıqlamaq üçün heç bir əsas yoxdur.

Quranda bu ifadənin keçdiyi başqa bir çox ayələr də var. Məsələn, "Bəqərə" surəsinin 133-cü ayəsində "ataların" kəlməsi işlənib. Buradakı "atalar" heç bir şəkildə təkamül prosesini izah etmir, insanların əvvəlki nəsillərini ifadə edir. Həmçinin "keçmişdəki atalar" ifadəsində də keçmiş nəsillərdən bəhs edilir. Bu ifadənin içində təkamülü izah edən tək bir söz belə keçmir:

**Yoxsa siz Yaquba ölüm gəldikdə** *(onun)* **yanında idiniz? O zaman o, öz oğullarına dedi: "Məndən sonra nəyə ibadət edəcəksiniz?" Onlar dedilər: "Sənin İlahına, <u>atalarının – İbrahimin, İsmailin və İshaqın</u> İlahı olan tək İlaha ibadət edəcəyik. Biz yalnız Ona təslim olanlarıq!"** (Bəqərə surəsi, 133)

# 8 - Cİ XƏTA:
## İNSANIN YARADILIŞ FORMASI İLƏ BAĞLI XƏTA

**Allah sizi torpaqdan bir bitki kimi bitirmişdir. Sonra O sizi ora qaytaracaq və yenidən çıxardacaqdır.** (Nuh surəsi, 17-18)

Bu ayə təkamüllə yaradılış iddiasını müdafiə edən bəzi müsəlmanların guya dəlil olaraq istifadə etdikləri ayədir. Ayədə bildirilən **"torpaqdan bir bitki kimi bitirdik"** ifadəsi təkamülçülər tərəfindən inorqanik təkamülə dəlil kimi istifadə olunur. Halbuki bu ifadə bir çox tərcümə və təfsirlərdə işarə edildiyi kimi, ilk insanın torpaqdan yaradılmasını ifadə edir və "torpaqdan başlamaqla cinsinizi yaratdı" mənasında bildirilir. Belə ki, Əlmalılı Həmdi Yazırın təfsirində də bu cür bildirilir:

"Ayədə iki məqam var: Birincisi, sizi ərzdə yaratdı demək atanızı ərzdə yaratdı deməkdir, yəni ilk torpaqdan onu yaratmaqla cinsinizi yaratdı. Digəri, hamınızı ərzdə yaratdı mənasındadır, çünki Allah bizi nütfələrdən, nütfəni qidalardan, qidanı bitkidən, bitkini də ərzdən yaradır".

(Elmalılı Hamdi Yazır, http:// www.kuranikerim.com/telmalili /nuh.htm)

Ömər Nəsuhi Bilmən "Nuh" surəsinin 17-ci və 18-ci ayələrini belə təfsir edir:

"Ey insanlar! Bunu düşündünüzmü ki: Allah Təala (sizi yerdən ot kimi bitirmişdir). Yəni: "Sizin ilk atanız olan Hz. Adəmi torpaqdan yaratmışdır, yaxud sizin əsil maddəniz olan nütfələri yer üzündəki bitkilər və qida maddələri vasitəsilə bədəninizə yerləşdirmişdir. Beləcə, insanlar böyüyüb, inkişaf edib həyatı yaşamağa başlamışlar. (Sonra) da ey insanlar! O Xaliqi Əzim sizi oraya qaytaracaqdır. Yəni: siz öldükdən sonra yenidən torpağa atılacaqsınız, yenə torpaq olacaqsınız. (və) Sonra da qəbirlərdən sizi çıxaracaqdır. Hamınız Qiyamət günü toplaşacaqsınız. Bütün bunlar bir həqiqətdir". (Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 8. cilt s. 3851)

Təbərinin təfsirində isə ayə belə izah olunur:

"...Allah sizi torpaqdan yaratmışdır. Yoxdan var edib meydana gətirmişdir... Sonra sizi təkrar əvvəlki halınıza, yəni torpağa çevirir. Yaradılmazdan əvvəlki vəziyyətinizə qaytarılacaqsınız. Dilədiyi zaman sizi yerdən diri olaraq çıxarar." (İmam Taberi, Taberi Tefsiri, 6.Cilt, s. 2632)

İslam alimlərimizin təfsirlərində də göründüyü kimi, bu ayəni təkamüllə yaradılış saxtakarlığına əsas olaraq göstərmək qeyri-mümkündür.

Həmçinin " inorqanik təkamül" adı ilə irəli sürülən iddianın da heç bir elmi əsası yoxdur. Cansız maddələrin bir araya gələrək canlı əmələ gətirdikləri iddiası heç bir təcrübə ya da müşahidələrlə təsdiq olunmamış, elmə zidd iddiadır. Tam əksinə, fransız bioloq Pasterin 19-cu əsrin sonlarında elmi olaraq ortaya çıxartdığı gerçək, canlıların yalnızca canlılardan yarana biləcəyi gerçəyidir. Bu gerçək canlıların tamamilə şüurlu olaraq yaradıldığını, yəni bütün canlıları Yaradanın Allah olduğunu bir daha göstərir.

# 9 - CU XƏTA:
## QURANDA TƏBİİ SEÇMƏYƏ İŞARƏ EDİLMƏSİ BARƏDƏ XƏTA

Təkamül nəzəriyyəsinin ən təməl iddialarından biri təbii seçmənin (seleksiyanın) təkamülə səbəb olması yalanıdır. Öncəki səhifələrdə də vurğuladığımız kimi, təbii seçmə təbiətdə güclü olanların sağ qalıb, zəif olanların zamanla sıradan çıxmasını müdafiə edir.

Dövrümüzdəki elm təbii seleksiyanın təkamülləşdirici gücünün olmadığını, yəni bu mexanizmin növlərin inkişafını və yeni növlərin meydana gətirmədiyini aşkar etmişdir. Ancaq görməzlikdən gəldikləri bu elmi gerçəklər təkamül prosesi ilə yaradılma yalanını müdafiə edən bəzi müsəlmanlar tərəfindən də göz ardı edilir. Bəzi müsəlmanlar da bu doqmatik darvinist fikri müdafiə edir, hətta Qurandan bu mövzuya dəlil gətirməyə çalışırlar. Onların dəlil kimi göstərdikləri bir ayə belədir:

**Rəbbin istədiyini yaradır və** *(istədiyini də peyğəmbər)* **seçir. Onların isə seçməyə haqqı yoxdur. Allah pakdır, müqəddəsdir və onların qoşduqları şəriklərdən ucadır.** (Qəsəs surəsi, 68)

Bu ayədə Allahın hidayət verdiyi insanları və elçi təyin etdiyi peyğəmbərləri Özünün seçdiyi açıqlanr. Ayənin təbii seçməyə işarə etdiyini iddia etmək olduqca yanlış izahdır.

İslam alimləri də bu ayələri yuxarıda ifadə etdiyimiz şəkildə izah edirlər. Məsələn, İmam Təbəri ayəni bu şəkildə təfsir edir:

"Rəbbin qullarından dilədiyini yaradar, onlardan istədiyini də iman və doğru yola yönəltmək üçün seçər. Onların seçim haqqı yoxdur. Onlar üçün istədikləri işi etmə variantı yoxdur ..." (İmam Taberi, Taberi Tefsiri, 4.Cilt, s.1701)

Böyük təfsirçi Ömər Nəsuhi Bilmən isə həmin ayəni bu şəkildə açıqlayır:

"Bu mübarək ayələrdə Allah Təalanın halikiyətini, istədiyini iltizam və ixtiyar edəcəyini (seçəcəyini), elm və qüdrətini, vəhdaniyət-i sübhaniyəsini, həmd və sənaya istihkakını, hökm-i ilahisini və huzur-mənəvisinə bütün qullarının cəlb ediləcəklərini bəyan buyurur. Belə ki, heç kim o Xaliq-i Hakimin bir şeyi ixtiyar və iltizam buyurmasına mane ola bilməz. O qulların ixtiyarları bilavasitə müəssir deyil, Allah Təala onların ixtiyar və iltizam edəcəkləri şeyləri yaratmağa haşa məcbur deyil... Cənab-ı Haqq insanların rəy və ixtiyarlarına görə göndərməz, ancaq öz ixtiyari ilahisinə görə göndərər. Xeyir və səlahın nəsürətlə, nə vasitə ilə təzahür edəcəyini ancaq o Xaliq-i Kərim bilir. Heç bir şey o Xaliq-i Əzimə şərik ola bilməz və onun ixtiyarı əzəlisinə müxalif bir şeyi meydana gətirə bilməz və heç kimsənin ixtiyarı o Məbudu qədimin çox uca olan iradəsinə, ixtiyarına Muzahim, müxalif ola bilməz. (Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 5. cilt, s. 2622)

Əlmalılı Hamdi Yazar isə eyni ayəni bu şəkildə təfsir edir:

"Rəbbin nəyi diləsə, yaradar və seçər. Yəni istədiyini yaradar və yaratdıqlarından istədiyini də seçib bəyənər. Peyğəmbərlik şəfaət kimi yüksək işlərə aparar. Onların seçmə haqqı yoxdur. Buna görə də onların Allahdan başqa şəriklər və şəfaətçi seçməyə və müəyyən etməyə haqqları yoxdur". (Elmalılı Hamdi Yazır, http:// www.kuranikerim.com/telmalili /kasas.htm)

Bəzi müsəlmanların təbii seçmə mövzusuna öz ağıllarına görə Qurandan dəlil gətirdikləri ikinci ayə "Fatir" surəsinin 1-ci ayəsidir. Ayədə belə buyrulur:

**Göyləri və yeri Yaradan, mələkləri iki, üç və dörd qanadlı elçilər edən Allaha həmd olsun! O, xəlq etdiklərindən istədiyini artırır. Həqiqətən, Allah hər şeyə qadirdir.** (Fatir surəsi, 1)

Təkamül nəzəriyyəsinə inanan bəzi müsəlmanlar ayədə keçən altından xətt çəkilmiş ifadəni də guya təkamülə dəlil göstərirlər. Halbuki bu ayədəki ifadədən belə bir məna çıxarılması Qurana uyğun olmadığı kimi, ağıl və məntiqlə də ziddiyyət təşkil edir. Çünki ayədə mələklərin xüsusi yaradılışı izah edilir. Belə ki, İmam Təbəri təfsirində bu ifadəni "Dilədiyi mələyin qanad sayını dilədiyi miqdarda çoxaldır. Bu artırmağı bütün məxluqatından da edə bilər. Yaratma və əmr Ona aiddir" şəklində şərh edir. (İmam Taberi, Taberi Tefsiri, 4.Cilt, s. 1877) Ömər Nəsuhi Bilmən də bu ayəni İmam Təbəri ilə eyni şəkildə açıqlayır və "O, elə bir Xaliqi-Kərimdir ki, mələkləri daha neçə qanadlara, qüvvələrə sahib edər" (Ömer Nasuhi Bilmen, Kuran'ı Kerim'in Türkçe Meali Alisi ve Tefsiri, 6. cilt, s. 2882) deyir.

## 10 - CU XƏTA:
## QURANDAN MUTASİYAYA DƏLİL GƏTİRMƏ XƏTASI

Təkamül yalanına inanan bəzi müsəlmanlar təbii seçmə mövzusunda olduğu kimi, mutasiya mövzusunda da Quran ayələrini yanlış şərh edir və fərqli mənalar çıxarırlar.

Mutasiya kimi heç bir təkamülləşdirici təsiri müşahidə edilməmiş, əksinə, canlıları yalnız korlayan təbii mexanizmin təkamül nəzəriyyəsinə dəlil hesab edilməsi böyük xətadır. Burada mövzumuz baxımından mühüm olan məsələ isə mutasiyanı təkamül mexanizmi olaraq qəbul edən müsəlman təkamülçülərin bu yanılmaya Qurandan öz ağıllarına görə dəlil gətirməyə çalışmalarıdır. Onlar bəzi ayələri əsil mənalarından tamamilə fərqli təhrif edərək izah edirlər. Həmin ayələrdə belə buyurulur:

**Əgər istəsə idik, onları yerlərindəcə elə eybəcər hala salardıq ki, nə irəli gedə, nə də geri qayıda bilərdilər.** (Yasin surəsi, 67)

**Siz artıq içərinizdən şənbə günü həddi aşanları tanıyırsınız. Biz də onlara: "Mənfur meymunlar olun!" – dedik.** (Bəqərə surəsi, 65)

**Özlərinə qoyulan qadağanı pozduqları zaman Biz onlara: "Mənfur meymunlar olun!" – dedik.** (Əraf surəsi, 166)

**De: "Allah yanında cəza etibarilə bundan daha pisini sizə xəbər verimmi?** *(Bu,)* **Allahın lənətlədiyi, ona qəzəbləndiyi, özlərini də meymunlara və donuzlara döndərdiyi şəxslər və tağuta ibadət edənlərdir. Onlar,** *(axirətdə)* **yeri daha pis olan və doğru yoldan daha çox azanlardır!"** (Maidə surəsi, 60)

*(Musa)* **əsasını** *(yerə)* **atdı və o, dərhal açıq-aşkar bir ilan oldu.**
(Əraf surəsi, 107)

Əgər bir insan "təkamül nəzəriyyəsinin lehinə məcburi də olsa, Qurandan bəzi dəlillər gətirməliyəm" kimi düşünmürsə, yuxarıdakı ayələri mutasiyaya dəlil olaraq şərh etməsi qətiyyən mümkün deyil.

İlk üç ayədə Allahın möcüzəvi şəkildə canlıların bədənlərini dəyişdirəcəyindən bəhs edilmişdir. Dördüncü ayədə isə bəhs edilən əşya (əsa) canlı belə deyil, bu səbəbdən mutasiyaya məruz qalması kimi fikir əsla irəli sürülə bilməz. Bir sıra müsəlmanların bu kimi ayələrdən öz ağıllarına görə təkamül nəzəriyyəsinə dəlil gətirmələri "yaradılışçı təkamül" yanlışlığının nə qədər məntiqsiz və Quran əxlaqına uyğun olmayan fikir olduğunu göstərir.

## 11 - XƏTA:
### QURANDA MEYMUNLARLA İNSANLAR ARASINDA SOY YAXINLIĞININ OLDUĞU BARƏDƏ XƏTA

Bu mövzuda bəzi insanlar tərəfindən yanlış şərh olunan ayələrdən biri də Allahın keçmişdə bir qrup yəhudini meymuna çevirməsi ilə bağlıdır. Ayələr belədir:

**Siz artıq içərinizdən şənbə günü həddi aşanları tanıyırsınız. Biz də onlara: "Mənfur meymunlar olun!"– dedik. Biz bunu onlarla** *(bir dövrdə)* **olanlar və onlardan sonra gələnlər üçün ibrət, müttəqilər üçün isə öyüd-nəsihət etdik.** (Bəqərə surəsi, 65-66)

Bu ayələrdə təkamül nəzəriyyəsi ilə bağlı heç bir mənanın olmadığı aşkardır. Bunun bir neçə müxtəlif səbəbi var:

**1)** Ayədə nəzərdə tutulan cəza, böyük ehtimalla, mənəvi mənadadır. Yəni həmin yəhudilərin fiziki mənada deyil, xarakter cəhətdən meymuna bənzədilməsi nəzərdə tutula bilər. (Doğrusunu Allah bilir.)

**2)** Əgər nəzərdə tutulan cəza fiziki mənada reallaşmış olsa belə, bu, təbiət qanunlarının xaricində reallaşan möcüzə ola bilər. Burada Allahın diləməsi ilə bir anda möcüzəvi çevrilmə, yəni şüurlu yaradılışı görmək olur. Təkamül nəzəriyyəsində isə növlərin milyonlarla illik zaman intervallarında təsadüfən, yavaş-yavaş, pilləli olaraq bir-birlərinə çevrildikləri barədə ağıl və elmdənkənar fikirlər irəli sürülür. Bu səbəbdən Quranda bildirilən bu hadisə ilə təkamülün müdafiə etdiyi ssenarinin bir-biri ilə heç bir əlaqəsi yoxdur. Belə ki, bu ayənin davamındakı ayədə "Bunu həm çağdaşlarına, həm sonra gələcək nəsillərə “ibrətverici cəza”, təqva sahibləri üçün də “öyüd-nəsihət etdik" şəklində buyurulur. Bu, həmin insanların mənfur meymunlara çevrilmələrindən sonra gələcək nəsillərə "ibrət olmaları" məqsədilə möcüzəvi olaraq baş verdiyinə işarə edir. (Doğrusunu Allah bilir.)

**3)** Ayədə nəzərdə tutulan cəza tarixdə bir dəfə, yəni məhdud sayda insan üçün reallaşmışdır. Lakin təkamül nəzəriyyəsi bütün insanların meymunlarla qohum olduqlarını iddia edən ağıl və məntiqdən uzaq ssenari irəli sürür.

**4)** Ayədə insanların meymuna çevrilməsindən bəhs edilir. Halbuki təkamül nəzəriyyəsinin iddiası əksinədir, yəni meymundan insana.

**5)** Quranda "Maidə" surəsinin 60-cı ayəsində də Allahın qəzəbləndiyi

azğın bir camaatın meymunlara və donuzlara çevrildiyi xəbər verilir. Ayə belədir:

**De: "Allah yanında cəza etibarilə bundan daha pisini sizə xəbər verimmi?** *(Bu,)* **Allahın lənətlədiyi, ona qəzəbləndiyi, özlərini də meymunlara və donuzlara döndərdiyi şəxslər və tağuta ibadət edənlərdir. Onlar** *(axirətdə)* **yeri daha pis olan və doğru yoldan daha çox azanlardır!"** (Maidə surəsi, 60)

Təkamül yolu ilə yaradılışı müdafiə edənlərin yanlış məntiqinə görə, o zaman yuxarıdakı ayəyə baxsaq, insanların yalnız meymunla deyil, donuzla da arasında təkamül bağı var. Halbuki təkamülçülərin donuzla insan arasında hər hansı əlaqə iddiaları yoxdur.

Buraya qədər də aydın olduğu kimi, Quranın bəzi ayələrində təkamül nəzəriyyəsinə dair bəzi işarələrin olduğu iddiası həm Quranla, həm də təkamül nəzəriyyəsinin öz iddiaları ilə ziddiyyət təşkil edir.

# DARVİNİSTLƏR NƏLƏRİ DÜŞÜNMÜRLƏR?

- Darvinistlər mutasiyaların canlıları inkişaf etdirdiyini, onlara yeni orqanlar və xüsusiyyətlər qatdığını iddia etmənin, zəlzələlərin bir şəhəri müasirləşdirdiyini iddia etmək qədər məntiqsiz olduğunu, genetik məlumatı artıran faydalı mutasiyaların heç reallaşmadığını və əsla reallaşa bilməyəcəyini düşünmürlər.
- Darvinistlər gözyaşlarında olan "lilozim" fermentinin bir çox bakteriya növünü parçalaya bilmə və mikrobları öldürmə xüsusiyyəti sayəsində gözləri müxtəlif xəstəliklərdən qoruduqlarını, lizozim maddəsinin binaların təmizliyində istifadə edilən dezenfektan maddələrdən belə daha təsirli olduğunu, amma buna baxmayaraq bu maddənin insan gözünə zərər vermədiyini, bunun Allahın bütün insanlar üçün yaratdığı bir nemət olduğunu düşünmürlər.
- Darvinistlər canlılığın cansız maddələrdən təsadüfən meydana gəldiyini iddia edərkən, 19-cu əsrdə Luis Pasterin "Həyat ancaq həyatdan gəlir" dissertasiyasını isbat etdiyini, cansız maddələrin həyat meydana gətirə bildikləri iddiasını elmi olaraq çürütdüyünü düşünmürlər.
- Darvinistlər insan bədənindəki funksiyaların tam lazım olduğu müddətdə yerinə yetirilməsinin fermentlərin yardımı ilə olduğunu, bu vəzifələri şüursuz atomlardan ibarət olan fermentlərin öz başına öyrənə bilməyəcəklərini düşünmürlər.
- Darvinistlər "elm adamlarının etdikləri təcrübələr, həyatın kimyəvi reaksiyalarla öz-özünə başlaya biləcəyini göstərmişdir" deyə iddia edirlər, ancaq bunu göstərən tək bir təcrübənin belə olmadığını, üstəlik elmin, bunun nəzəri səviyyədə belə mümkün olmadığını isbat etdiyini düşünmürlər.
- Nüvədəki 46 xromosomun hər biri, bir insan ilə əlaqədar bütün məlumatları daşıyan genlərə malikdir. Darvinistlər, insan vücudunda olan bütün orqanların, hüceyrələrdə yer alan genlərin tərif etdiyi bir plan çərçivəsində tikildiklərini, məsələn, vücudda dəriyə 2.559, beyinə 29.930, gözə 1.794, tüpürcək vəzisinə 186, ürəyə 6.216, sinəyə 4.001, ağciyərə 11.581 gen tərəfindən nəzarət edildiyini düşünmürlər.
- Darvinistlər DNT-də hər hansı bir pillədəki, məsələn, 1 milyard 719 milyon 348 min 632-ci pillədəki bir hərfin səhv kodlaşdırılması kimi bir səhvin belə, hüceyrə üçün, başqa sözlə insan üçün qorxunc nəticələrə yol aça biləcəyini və bu kodlaşdırmanın təsadüflərlə açıqlanmasının qeyri-mümkün olduğunu düşünmürlər.
- Güclü olan həyatda qalır iddiasında olan Darvinistlər, düşmənlərinə qarşı son dərəcə yırtıcı ola bilən aslanların balalarına qarşı niyə son dərəcə şəfqətli olduqlarını düşünmürlər.

- Darvinistlər bir dinozavrın ağcaqanadı yaxalamağa çalışarkən qanadlandığını iddia etsələr də, ağcaqanadın onsuz da mükəmməl bir qanad və uçuş sisteminə sahib olaraq saniyədə 1000 dəfə qanad çırpan varlıq olduğunu düşünmürlər.
- Darvinistlər ağacların, heç bir nasos və ya hidrofor sistemi olmadan ehtiyacları olan suyu metrlərlə uzunluqdakı ən uc budaqlarda olan yarpaqlara qədər çatdıra bilmələrini təsadüflərlə açıqlana bilməyəcəyini düşünmürlər.
- Darvinistlər millimetrin 100-də biri böyüklüyündəki hüceyrələrimizin içindəki "mitokondri" deyilən enerji stansiyasının, bir neftayırma zavodundan ya da bir hidroelektrik stansiyasından daha kompleks olduğunu düşünmürlər.
- Darvinistlər şüursuz təsadüflər nəticəsində meydana gəldiyini iddia etdikləri, insan bədənindəki 100 trilyon hüceyrənin hər birində mövcud olan DNT molekullarının tək bir dənəsində bir milyon ensiklopediya səhifəsini dolduracaq məlumatın olduğunu düşünmürlər.
- Darvinistlər hər şeyin maddədən ibarət olduğunu söyləyərkən DNT-nin ehtiva etdiyi "məlumat"ın maddə olmadığını düşünmürlər.
- Darvinistlər tək bir yumurta hüceyrəsinin bölünərək, bir-birindən fərqli saysız hüceyrəni meydana gətirdiyini, bu hüceyrələr arasında mükəmməl bir ünsiyyət və əməkdaşlığın var olduğunu və bunun elm adamlarının dərk edə bilmədiyi hadisələrdən biri olduğunu düşünmürlər.
- Darvinistlər palçıqlı bir suyun içində təsadüfən əmələ gəldiyini iddia etdikləri zülalın necə meydana gəldiyini, ikinci bir zülalın da əmələ gələrək necə onunla birləşdiyini, üçüncünün də bunlara necə əlavə olunduğunu və bu qeyri-mümkün sistemin bu şəkildə necə davam etdiyini və ən sonunda bütün bunların bir araya gələrək təsadüfən bir hüceyrə halına gəlib canlanmasının mümkün olmadığını düşünmürlər.
- Darvinistlər yer üzündəki bütün canlıların xüsusiyyətlərini, "Ana təbiət" adını verdikləri xəyali bir güc tərəfindən əldə etdiklərini iddia edərkən, əslində ilahlaşdırdıqları "Ana təbiət"-in daş, torpaq, çəmən, ağac və çiçəklərdən meydana gəldiyini, ağılsız və şüursuz olduğunu düşünmürlər.
- Darvinistlər instinkt olaraq adlandırdıqları canlılardakı ağıllı davranışların və fədakarlıq xüsusiyyətlərinin təsadüfən ortaya çıxdığını iddia edərkən, bu instinkt anlayışının canlılarda ilk olaraq necə meydana gəldiyi, necə istiqamətləndirildiyi və nəsillər boyunca necə davam etdiyini izah edə bilmədiklərini düşünmürlər.
- Darvinistlər quşların daha az enerji xərcləmək üçün "V" şəklində uçmalarının, kor təsadüflərlə açıqlana bilməyəcəyini düşünmürlər.

